

*Azərbaycan Respublikasının Prezidenti*

# İLHAM ƏLİYEVİN

***"Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında"***

***12 yanvar 2004-cü il tarixli sərəncamına əsasən nəşr olunur***







*Nizami Gəncəvinin anadan olmasının 870 illik yubileyi münasibəti ilə Gəncə Şəhər İcra Hakimiyyətinin tövsiyəsi ilə çap olunur*



NİZAMİ GƏNCƏVİ

# İSKƏNDƏRNAMƏ



"ADİLOĞLU"
Bakı - 2011

Tərcümə edəni: *Abdulla ŞAİQ, Mikayıl RZAQULUZADƏ*

İzahların müəllifi: *Əkrəm CƏFƏR*

Ön sözün müəllifi: *Qəzənfər ƏLİYEV, Zümrüd QULUZADƏ*

Elmi redaktor: *Xəlil YUSİFLİ*
*filologiya elmləri doktoru, professor*

Nizami Gənjəvi.
*«İskəndərnamə»*, "ADİLOĞLU" nəşriyyatı, Bakı 2011, ??? səh

*Nizami Gəncəvi yaradıcılığının ən yüksək zirvəsi və Şərq poeziyasının ən parlaq incisi sayılan "İskəndərnamə" "Xəmsə"nin beşinci kitabıdır. Dahi şair yaradıcılığının əzəmətli yekunu olan bu son əsərində ömrü boyu arzuladığı, həyatda görmək istədiyi ideal cəmiyyəti təsvir etmişdir.*

*"Şərəfnamə"də İskəndərin elm və siyasət aləmindəki böyük nailiyyətləri göstərilir; onun tərbiyəsindən, təhsilindən, hökmdarlığından, yürüşlərindən və ümumiyyətlə, onun böyük şan-şöhrətə çatmasından bəhs olunur.*

*"İqbalnamə" əsəri Nizami Gəncəvi yaradıcılığının ən yüksək zirvəsi və Şərq poeziyasının ən parlaq incisi hesab olunan "İskəndərnamə"nin ikinci hissəsidir. İskəndərin kamil insan, alim və ağıllı, müdrik bir filosof kimi təsvir olunduğu bu hissədə Nizami ictimai, fəlsəfi düşüncələrə üstünlük vermiş, insan ağlının təntənəsindən bəhs etmiş, eləcə də insan və təbiət, yaradılış və dünya, həyat və ölüm, elm və din kimi məsələlərlə bağlı dövrün ən qabaqcıl görüşlərini əks etdirmişdir.*

*"İqbalnamə" "Şərəfnamə" ilə bir yerdə bütöv əzəmətli əsər olan "İskəndənamə"nin bir-biri ilə sıx bağlı iki budağıdır.*

İSBN 5 – 8066 – 1638 – 8

4722110018
121 - 2011 qrifli nəşr



# QƏHRƏMANLİQ DASTANİ

Dahi Azərbaycan şairi və mütəfəkkiri Nizami Gəncəvinin bütün dünyada şöhrət tapmış ölməz "Xəmsə"si, "İskəndərnamə" poeması ilə bitir. Bu son əsərində böyük söz ustasının məfkurəsi, bədii qayəsi, şair təxəyyülü özünün ən yüksək zirvəsinə çatmışdır.

Nizami bu əsəri yazmağa başlayarkən altmış yaşını ötmüş, sözün ən geniş mənasında, hərtərəfli və dərin həyat təcrübəsi əldə etmişdi. Şair keçdiyi yaradıcılıq yoluna nəzər salaraq hiss edirdi ki, "İskəndərnamə" onun əvvəlki əsərlərində söylədiyi fikirlərin, əks etdirdiyi ümidlərin yekunu olmalıdır. Bunu biz "Şərəfnamə"nin giriş fəsillərində aşkar duyuruq. Doğrudan da, Nizami mütərəqqi ideallarını və müqəddəs arzularını məhz bu son poeması ilə bağlayır və deyir:

Dastanı sevənlər, şeiri duyanlar
Nəğmələr dinləməz bir çox zaman var.
Yazmalı elə bir uğurlu dastan,
Onda bir incəlik duysun oxuyan.
Bildim bu naxışı bəyənər dostlar,
Verdim bu dastanı yazmağa qərar.

Nizaminin sonuncu poemasının əsas mövzusunu bir sıra Şərq xalqlarının yazılı və şifahı ədəbiyyatında geniş yayılmış Makedoniyalı İskəndər (Aleksandr) dastanı təşkil edir. Onu da qeyd etmək lazımdır ki, qədim İran ədəbı ənənələrində bir amansız fateh, Əxəmənilər sülaləsinin qatı düşməni kimi təcəssüm Olunan İskəndər surəti Nizami dövründə bir çox yazılı abidələrdə ədalətli hakim, elmə, biliyə yüksək qiymət verən, ümumiyyətlə, müsbət qəhrəman kimi təsvir olunurdu. Mənbələrdə İskəndərin sociyyəsinin belə dəyişməsinin bir səbəbini də islam dini kitablarında onun peyğəmbər dərəcəsinə qaldırılması olmuşdur.

Dahi şair həmişə olduğu kimi, "İskəndərnamə" poeması üzərində işləyərkən bir sıra tarixi mənbələri ciddi surətdə öyrənmiş, onların içindən özünün ideya bədii qayəsinə uyğun olan məlumatları seçmiş və ustad qələmi ilə nəzmə çəkmişdir.

Üzərində işlədiyi mənbələr haqqında şair özü belə söyləyir:

İskəndər haqqında heç bir əsərdə
Məlumat görmədim yığcam bir yerdə.
Sözlərlə dolmuşdu xəzinə içi,
Ancaq hər nüsxədə dağınıq inci.
Hər köhnə nüsxədən əsas alaraq,
Onu öz şeirimlə bəzədim ancaq.
Ən qədim tarixi əsərlərdən mən,
Yəhudi, nəsrani, pəhləvilərdən
Ən incə sözləri alıma saldım,
Qabığı ataraq, məğzini aldım.
Müxtəlif dillərdən yazdığım sözlər,
Bunlardan doğuldu yığdığım əsər.
Saydığım dilləri ətraflı bilən
Saxlar öz dilini mənə töhmətdən.

Göründüyü kimi, şair ərəb və fars dilində olan mənbələrlə yanaşı, yəhudi, nəsrani (xristian) və pəhləvi mənbələrini araşdırdığını xatırladır. Doğrudan da, İskəndər əhvalatı barəsində bu mənbələrdə çoxlu məlumat olduğu bu gün elm aləminə bəllidir. Məsələn, "İskəndərnamə"də təsvir olunan bəzi hadisələrin əksini biz talmud rəvayətlərində və qədim yəhudi (ibrani) dilində olan ayrı-ayrı İskəndər haqqımda anonim kitablarda görə bilirik.

Nəsrani mənbələri dedikdə, Nizami, şübhəsiz, yunan dilində olan tarix kitablarını, ilk növbədə, "Saxta Kallisfen"i nəzərdə tuturdu. Məlum olduğu üzrə, yunan dilində Makedoniyalı İskəndər haqqında olan ilk roman uzun illər onun şəxsi həkimi Kallisfenin adına yazılırdı. Lakin əsərin eramızın birinci əsrində meydana gətirildiyi məlum olduqda həmin roman "Saxta Kallisfen" adını aldı. Məhz bu əsər XV əsrə qədər siryani, yəhudi, pəhləvi dillərinə tərcümə edilmişdi ki, Nizami də bu tərcümələrin bəzilərindən istifadə edə bilərdi.

Nizaminin istifadə etdiyi mənbələrdən biri də pəhləvi dilində yazılmış, sonralar isə ərəb istilası (VIII-IX əsrlər) vaxtı məhv edilmiş "Xvatak-namak"lar ("Xudayamə") olmuşdu. Bu salnamələrin epik xarakter daşıyan hissələri ərəb dilinə çevrilmiş, tarixə və xüsusilə "ədəb" janrına mənsub olan ərəb dilli kitablarda özünə yer tapmışdır. "Yeni tarix abidələri" dedikdə şair, heç şübhəsiz, bu növ əsərləri nəzərdə tuturdu.

Doğrudan da, bu gün biz pəhləvi mənbələri - "Karnatnoki-Arrakşiri-Papakan", "Namakı-Tansar", "Artak-Viraz-namak" ilə yanaşı, İskəndər





Urmik (ər-Rumi) haqqında geniş məlumatları Həmzə İsfahani, əd-Dinəvəri ət-Təbəri və başqa ərəb tarixçilərinin məşhur əsərlərində müşahidə edirik.

Ət-Təbəri özünün iri həcmli "Tarix" əsərində İskəndər haqqında rəvayətlərə daha geniş yer verir və tez-tez özündən əvvəlki mənbələrə, xüsusilə Hişam ibn Məhəmmədə istinad edir ki, bu da İskəndər haqqında rəsmi məlumatlarla yanaşı, "Qərb və Şərq fatehi"ni xoşa gələn tərzdə təsvir edən rəvayətlərin də yayılmasına dəlalət edir.

Nizaminin "İskəndərnamə"sində təsvir olunmuş hadisələrin çox qısa məzmununu bir sıra incəlikləri ilə bərabər biz ət-Təbərinin salnaməsində görürük. Lakin bu heç də o demək deyildir ki, Nizami öz poemasını yazarkən bir çox epizodları ət-Təbəri salnaməsindən olduğu kimi iqtibas etmişdir. Əksinə, Nizami özü əsərin fəsillərin giriş hissəsində dəfələrlə qeyd edir ki, onun məqsədi daha çox deyilməyənləri ehya etməkdir. Bunu biz Nizaminin fars-tacik şeirinin böyük nümayəndəsi Firdovsiyə olan münasibətində daha aydın hiss edirik. "İskəndərnamə"də oxuyuruq:

Köhnə söz ustası, o Tuslu şair
Söz gəlinlərini bəzədi bir-bir.
Düzdü dastanlara çox inci, gövhər,
Yenə də qaldı çox bakirə sözlər.
Yazsaydı tarixdə bütün olanı,
Çox uzun sürərdi onun dastanı.

Ümumbəşəri mütərəqqi ideyalar tərənnümçüsü Nizami "Şuubilik" (İran və Orta Asiya xalqları arasında IX-X əsrlərdə yayılmış, ərəb hakimiyyətinə qarşı mübarizə bayrağına çevrilmiş cərəyan) tərəfdarı və aludəçisi olan "Şahnamə" müəllifinin İskəndər haqqındakı rəvayətlərə olan qərəzli münasibətini duymaya bilməzdi. Məhz buna görə, Nizami yuxarıda gətirdiyimiz beytlərdən sonra bilavasitə Firdovsinin bu qərəzli münasibətinə işarə edərək:

Sevmədiklərinə etmədi hörmət,
Bəyəndiklərinə göstərdi rəğbət, -

yazır və həmin fəsli aşağıdakı fikirlərlə tamamlayır:

Nizami bu sapa düzərkən gövhər
Qələmdən silindi qələm görənlər.
Hansı bir incini keçirdi ələ,
Onları çəkdi öz söz çəkisiylə.

Uğurla ucaltdı "Şərəfnamə"nı,
Köhnəni bununla eylədi yeni.

Nizami Firdovsinin əsərilə yaxından tanış idi və bunu şair özü dəfələrlə "Xosrov və Şirin", "Yeddi gözəl" və "İskəndərnamə"də xatırladır, ona öz ehtiramını xüsusilə qeyd edir. Bununla yanaşı, Azərbaycan şairi "özündən əvvəlkiləri təkrar etmək onun yaradıcılığına xas olan cəhət deyildir" söyləyərək, özünün bu sahədə novator olduğunu qeyd edir.

Bunu da xatırlatmaq lazımdır ki, Nizaminin novatorluğu heç də mənbələr üzərində işləməklə, onların içindən tez ideya-bədii qayəsinə uyğun məlumatlar çıxarması ilə məhdudlaşmır. Şair öz əsərinin yüksək sənət nümunəsi olduğunu bilir və səmimi hisslərlə (fəxr xatirinə yox!)

"İskəndərnamə"nin gizli sirlərlə dolu olduğunu bəyan edir:

Belə bir dəyərli gövhərlə, dostlar,
Bir gövhər sevənə ehtiyacım var.
İstərəm eylə bir kamil dinləyən,
Şairlik sirrini öyrənsin məndən!

Şairin bu əsərdə izlədiyi ən mühum qayə həqiqətdir - insan həqiqəti. Doğruluq, həqiqət müəllifə görə "İskəndərnamə"nin səciyyəvi cəhətidir. O deyir:

Doğrular yanında varmıdır bundan
Daha xoş simalı, sevimli dastan?
Başqa dastanları arasan bir az,
Millətlər yanında doğru sayılmaz.

Doğrudan da, insan həqiqəti, daha geniş mənada deyilərsə, bəşər həqiqəti "İskəndərnamə" müəllifinin diqqət mərkəzində dayanır. Böyük şair və mütəfəkkir faydalandığı tarixi və eləcə də digər mənbələrə bu baxımdan yanaşmışdır.

"İskəndərnamə" poemasının yazılma tarixinin dəqiq müəyyənlik qazanmaması bir sıra çətinliklər törədir. Məsələ burasındadır ki, şairin özü də

"Xəmsə"yə daxil olan əvvəlki əsərlərindən fərqli olaraq, "İskəndərnamə"nin yazılma tarixini göstərməmişdir. Əsərin iri həcmi (iyirmi min misradan çox) və mürəkkəb quruluşu bizi şairin poema üzərində uzun müddət işləməsi qənaətinə gətirir. Hər halda "İskəndərnamə" (197-ci ildən ("Xəmsə"nin dördüncü hissəsi olan "Yeddi gözəl" poemasının yazılış tarixidir) sonra





yazılmışdır. Nizami "Şərəfnamə"nin giriş hissəsində əvvəlki dörd əsərini sadalayır və deyir ki:

İndi söz mülkündə büsat qururam,
İskəndər dövründən təbil vururam.

"Şərəfnamə" əsəri Nüsrətəddin Əbu Bəkr Bişkinə (1191-1210) həsr olunmuşdur. "İskəndərnamə"nin ikinci hissəsində ("İqbalnamə") isə Məlik İzzəddinin adı çəkilir. Əgər I İzzəddin Məsud nəzərdə tutulursa o, 1180-1193-cü illərdə hökmranlıq etmişdir. Deməli, həmin İzzəddin əsərin yazılmasından dörd il əvvəl ölmüşdür. Söhbət II İzzəddin Məsuddan gedirsə, o da 1211-ci ildə, yəni Nİzaminin qəbul olunmuş ölüm tarixindən iki il sonra hakimiyyətə gəlmişdir.

Bu xronoloji qarma-qarışıqlıq "İqbalnamə"nin son hissələrinin guya şairin ölümündən sonra başqaları tərəfindən tamamlanması barəsində fikrin meydana gəlməsinə səbəb olmuşdur. Bu fikir bizə görə əsassızdır.

Bir növ təəccüb doğuran ikinci məsələ əsərin quruluşu ilə bağlıdır, məlumdur ki, "İskəndərnamə" iki hissədən ibarətdir. Bunu əsərin bizim dövrə gəlib çatmış əlyazmaları aydın göstərir. Lakin Nizami "Şərəfnamə"nin giriş hissəsində İskəndəri üç cəhətdən, yəni fateh, hakim və peyğəmbər kimi səciyyələndirəcəyini iqrar edir:

Öncə söz açaram padşahlığından,
Cahangirliyini edərəm elan.
Hikmətlə bəzəkli söz yazaram mən,
Köhnə tarixləri təzələrəm mən.
Döyərəm qapını peyğəmbərliyə,
Tanrı da bəyənmiş, peyğəmbər, - deyə.

Sonra Nizami əsərin üç hissədən ibarət olduğunu aydın şəkildə söyləyir:

Üç qapı tikdim, üç xəzinə demək,
Çəkdim hər qapıda ayrıca əmək.
Üç qapı ya bu üç inciylə yenə
Tökərəm dünyaya ağır xəzinə.

Burada qapı (dər) ərəbcə "bab"ın (qapı, fəsil) tərcüməsidir. Bəzi ədəbi mənbələrdə əsərin ikinci hissəsinə "Xirədnamə" (əql, hikmət kitabı) adı da

verildiyinə təsadüf edirik (Məsələn, 1852-ci il "Bibliotеka İndika" silsiləsindən çap olunan ikinci hissə məhz belə adlandırılmışdır).

Bu mübhəm məsələnin dəqiq həlli üçün əlimizdə olan faktlar heç də kafi deyildir. Ona görə də hər cür fərziyyədən imtina etməyə məcburuq. Hər halda əsərin bu gün əlimizdə olan mətnində İskəndər surəti fateh, hakim, fəlsəfə və imanla qarışıq din carçısı kimi öz səciyyəsini tapmışdır. Yaxın Şərq, o cümlədən Azərbaycan ədəbiyyatında geniş yayılmış janr ənənələrinə riayət edərək, Nizami əsərin baş qəhrəmanı olan İskəndəri anadan olduğu gündən təsvirə başlayır. Məlumdur ki, İskəndərin milli mənşəyi barədə iki rəvayət var.

Bu adı rəvayətlərin birində İskəndərin sadəcə bir tərki-dünya oğlu olması və Makedoniya hakimi Feyləqus (Filipp) tərəfindən oğulluğa götürülməsi, digərində isə onun İran şahı Daranın oğlu olması təsdiq edilir. Nizami hər iki rəvayət haqqında məlumat verir, lakin o təsdiq edir ki, İskəndər Feyləqusun oğludur.

Beləliklə, İskəndərin İran taxtının varisi olması məqsədilə quraşdırılan rəvayəti Azərbaycan şairi rədd edir. Əslində Nizami İskəndərin rumlu olduğunu tarixi həqiqətə sadiq qalmaq naminə təsvir edir; İskəndər Nizaminin sevdiyi, onun arzu və amallarını ifadə edən bir bədii surət, ədəbi qəhrəmandır.

Bütün yaradıcılığı boyu onu daim düşündürmüş ictimai həyat həqiqətlərini aramış olan böyük mütəfəkkir şair insan və cəmiyyət münasibətlərini öz fəlsəfi konsepsiyası əsasında aydınlaşdırmağa cəhd etmiş, bu ictimai problemlərlə bağlı olan suallara isə İskəndər vasitəsilə cavab tapmaq istəmişdir.

Hələ ilk iri həcmli əsəri olan "Sirlər xəzinəsi"ndən başlayaraq, Nizami feodal cəmiyyətində müşahidə etdiyi ictimai və mənəvi nöqsanları ifşa edərək, onları hansı yollarla aradan qaldırmaq mümkün olacağı haqqında düşünmüşdür. Dövrünə görədir ki, Nizami həmişə öz əsərlərinin bədii qüdrəti və ideya məzmunu ilə feodal hakimlərə təsir göstərmək və onları ədalətə çağırmaq, bir sözlə, onları "yaxşılaşdırmaq" istəmişdir. "Xosrov və Şirin", "Yeddi gözəl" poemalarında da ideya istiqamətinin məhz bu hədəfə yönəldiyini biz asanlıqla görür və duyuruq.

Bu baxımdan İskəndər bir müsbət qəhrəman kimi şairin yaratdığı bu tipli surətlərdən çox yuxarıda durur. Nizami bir fateh olan qəhrəmanının müsbət cəhətlərini daha bariz şəkildə verməyə çalışmışdır.

Əsərin "Şərəfnamə" hissəsində görürük ki, İskəndərin müharibələr aparmaqda məqsədi hər yerdə ədaləti bərpa etməklə yanaşı, bu ölkələrdə yayılmış biliklərə sahib olmaqdır. Məsələn, İran şahənşahlığı məğlubiyyətə uğrayandan sonra İskəndər atəşpərəstlərin hikmətlə dolu kitablarını yunan dilinə çevirməyə fərman verir. İskəndəri biz bu yürüşlər ərzində həmişə məşhur yunan alimləri





arasında görürük. O, Dərbənd qalasını yolkəsən quldurlardan xilas etdikdən sonra Dağıstanda yerləşən, vaxtilə İran şahlarının yay istirahət sarayı olan Sərir qalasına gedir, Keyxosrovun məqbərəsinin sirlərini öyrənmək istəyir.

Doğrudur, Makedoniyalı İskəndər haqqında yaranmış tarixi və əsatiri mənbələrdə (məsələn, yəhudi dilində olan romanda) onu qədim padşahlardan olan Altınüsün məqbərəsində görürük. Nizami İskəndəri o vaxtkı oxuculara daha yaxın və tanış olan Keyxosrov məqbərəsinə getməyə məcbur edir. Şair öz qəhrəmanına bilici Bəlinasın diliylə başa salır ki, dünyada taxt-tac, şöhrət və dövlət hamısı müvəqqətidir, yaxşı ad isə daimidir. İnsan çalışmalıdır ki, özündən sonra yaxşı ad qoyub getsin, buna isə ancaq yaxşı əməllərlə nail olmaq mümkündür. Padşahlar taxtına gəlincə:

Faydasız olan bu taxt nəyə gərək?
Üstündə başqası ömür sürəcək
Faydasız bu taxta uyma, saxtadır,
Yerimiz taxt deyil, quru taxtadır.
Bu qızıl baxt deyil, versəniz fikir,
Ayağa vurulmuş ağır kündədir.
Bir taxt ki əbədi yer deyil sana,
Onu ta dirisən parçalasana!

Bu beytlər şairin bütün ömrü boyu inam bəslədiyi "ədalətli şah", "ideal hökmdar" konsepsiyasında dönüş əmələ gəldiyinə dəlalət edir.

Humanist sənətkar tədricən "ədalətli" hakimlərin də bəşər cəmiyyətinə insanların həmişə arzulamış olduğu səadəti gətirə biləcəyi fikrindən əl çəkməyə başlayır və əsərin ikinci hissəsini təşkil edən "İqbalnamə"də İskəndəri azad cəmiyyət münasibətlərinin hökm sürdüyü xoşbəxtlər ölkəsinə gətirir və bununla da təsdiq edir ki, bəşər cəmiyyətinin səadət dolu gələcəyi ədalətli şah konsepsiyası ilə deyil, ancaq maddi və mənəvi azadlıq ideyaları ilə bağlıdır.

Şairin bu "sosial utopiyası", onun təsvir etdiyi azad cəmiyyət haqqında görüşləri o zamankı dünya ədəbiyyatında misilsiz bir hadisə idi.

"İskəndərnamə" əsərində şairin yüksək vətənpərvərlik hissləri də öz əksini tapmışdır. Bu vətənpərvərlik ideyalarının ən bariz təmsilçisi şairin dərin sevgi duyğuları ilə yaratdığı Bərdə hakimi Nüşabə surətidir. Nüşabə "Xosrov və Şirin" poemasında rast gəldiyimiz Məhinbanu surətinin davamıdır. Maraqlı burasıdır ki, Nizami İskəndəri öz doğma yurdu Azərbaycana gətirmək üçün bilərəkdən tarixi anaxronizmə yol verir.

Bərdə hakimi Nüşabə eyni zamanda şairin "ədalətli hökmdar" haqqında

görüşlərinin də ifadəçisidir. Nüşabənin müdrik bir hakim olmasını eşidən fateh özü adi elçi sifətilə Bərdə hakiminin sarayına gedir. Lakin İskəndərin adi elçi qayda-qanunları xilafına etdiyi hərəkətlər Nüşabənin nəzərindən yayınmır. Onu artıq tanımışlar. İskəndərin fütuhatının şöhrətini eşitmiş olan ağıllı qadın onun rəsmini öz xəzinəsində saxlayırdı. Amansız fateh insan əqlinin gücü qarşısında aciz qalır və Nüşabənin ölkəsi fəth olunmur.

Nuşabə İskəndərin qarşısında süfrə açır və onu cavahiratla doldurur. İskəndər əlbəttə anlayır ki, var-dövlət uğrunda çalışmaq faydasız işdir. O deyir:

Sənin xonçandakı bu daş-qaş daşır,
Bu danlaq, bu töhmət kimə yaraşır?
Süfrəyə cavahir saçmaq nə gərək?!
Gövhərdən qaçmağı mənə öyrətmək?!
Eşq olsun bu fikri sağlam qadına,
Mərdliyin yolunu öyrədir mənə.
Ey uzaqgörən qız, gəl məni dinlə,
Qızıl sikkəsini nəsihətinlə;
Ataram bir kərə torpaqlara mən,
Qızıla torpaqdır təbii mədən.

Nizaminin vətənpərvərlik duyğularını doğma Azərbaycanın təbiət lövhələrinin təsvirində, xüsusilə Bərdəyə həsr olunmuş parçada hiss edirik. Şair qeyd edir ki, Bərdə vaxtilə qədim mədəniyyət və elm ocağı olmuş, öz təbiətinin gözəllikləri ilə bütün Yaxın Şərqdə tanınmışdır. Həmin hissləri o öz doğma diyarı olan qədim Gəncə haqqında da söyləyir, özünün qırılmaz tellərlə Gəncəyə bağlılığını bildirir. Nizami böyük iftixar hissilə deyir ki, onun müqəddəs sirlərlə dolu şeirləri aşkar olaraq Buxaraya aparılarsa da, Gəncə torpağından olduğunu zövq əhli bilir. Böyük humanist şair olan Nizaminin dərin vətənpərvərlik duyğuları onun beynəlmiləlçi görüşləri ilə sıx bağlıdır. Nizami xalqlar dostluğu və sülh ideyalarının carçısıdır. Onun əsərlərində, eləcə də "Şərəfnamə"sində yunanlıların və ərəblərin, gürcülərin, rusların, çinlilərin və hindlilərin, Dağıstan və İran xalqlarının həyatından, adət və ənənələrindən hörmətlə danışılır. Şairin məqsədi öz həmvətənlərinin həmin xalqların tarixi keçmişi və yaxud ona müasir olan həyat tərzilə yaxından tanış etmək olmuşdur. Bu nəcib vəzifənin öhdəsindən dahi şairimiz böyük ustalıqla gələ bilmişdir. "Şərəfnamə" qəhrəmanlıq dastanıdır. Təbiidir ki, biz bu əsərdə çoxlu döyüş səhnələrinə təsadüf edirik. Şairin müharibələrə olan münasibəti





onun beynəlmiləlçilik görüşlərilə üzvi surətdə bağlıdır. Nizami müharibələri insan cəmiyyəti üçün fəlakət sayırdı. Böyük mütəfəkkir şair ədalətli və ədalətsiz müharibələri bir-birindən seçməyi bacarmışdır. O, "bir ovuc torpaq" üstündə insanları qırğına verən feodal hökmdarları öz bədii söz sənətinin gücüylə ifşa edirdi.

"Şərəfnamə"də müharibələri təsvir edərkən Nizami ilk növbədə dövrün feodal hakimlərinin ölkələri viranlığa döndərən ədalətsiz, mənasız döyüşlərini nəzərdə tuturdu. Məhz buna görədir ki, şair ("İskəndərnamə"nin giriş hissəsində dəfələrlə işarə vurur ki, bu əsərə uzaq keçmişdən bəhs edən sadəcə əfsanə kimi baxılmamalıdır.

Nizami öz dövrünün qabaqcıl fikir sahiblərini həyəcana gətirən bir sıra mühüm və aktual problemləri bu son əsərində əks etdirməyi öz qarşısına qoymuş və həmin istəyinə də yüksək bədii səviyyədə nail ola bilmişdir.

Nəhayət, bir neçə kəlmə də hazırda əsərin oxuculara təqdim olunan Azərbaycan dilinə tərcüməsi haqqında qeyd etmək istərdik. Böyük şairimizin başqa əsərlərindən fərqli olaraq "Şərəfnamə" görkəmli Azərbaycan şairi və ədibi Abdulla Şaiq tərəfindən bilavasitə orijinaldan tərcümə olunmuşdur. Şübhəsiz, müəyyən bədii xüsusiyyətləri ilə yanaşı Abdulla Şaiqin tərcüməsi orijinal mətnə məna və obrazlar baxımından öz uyğunluğu ilə yüksək dərəcədə fərqlənir.

*Qəzənfər Əliyev*

Ey tanrı, dünyaya sənsən padşah,
Biz kiçik bəndəyik, sən böyük allah.
Tək sənə sığınır hər yüksək, alçaq,
Hər varlıq yoxluqdur, sən varsan ancaq.
Yuxarı, aşağı - hər gözə çarpan
Nə varsa, onları sənsən yaradan.
Sənsən hər biliyi bizə öyrədən,
Torpağın köksündə qələm işlədən.
Sənin varlığına tapınca bürhan,
Ağıl ilk inandı sənə, yaradan.
Sən ağlın gözünü işıqlandırdın,
Sən doğru yollarda çıraq yandırdın.
Göyləri sən qurdun, ucaltdın, allah,
Ona yer üzünü etdin güzərgah[1].
Sənsən bu aləmdə bir damcı sudan
Günəşdən işıqlı gövhər yaradan[2].
Gövhəri lütfünlə etdin aşikar,
Sərrafın əlinə sən verdin açar.
Daşların bağrına düzdün gövhəri,
Rənglərlə boyadın hər bir cövhəri.
Buludlar yağdırmaz, sən deməsən: "Yağ!"
Sən "bitir!" deməsən, bitirməz torpaq.
Özün də kimsədən kömək almadan
Yaratdın nə gözəl, səfalı cahan.
İstidən, soyuqdan, qurudan, yaşdan
Yoğurub yaratdın gözəl bir cahan.
Nə gözəl naxışlar vurdun xilqətə,
Ağıllar heyrandır bu məharətə.
Bu sirri mühəndis axtarır hər an,
Bilməyir ən əvvəl başladın hardan.
Uca sənətini seyr edirik biz,
Yeməkdir, yatmaqdır yalnız işimiz.
Hər nəyi bəzədin, var etdin yoxdan
Onlara ehtiyac duymadın bir an.
Sən elə qurdun ki, yerin işini,
Göyün, ulduzların bu gərdişini,
Göyə ucalsa da düşüncə, fikir,

Bu kəməndən başı çıxa bilməyir.
Sən vardın varlıqlar olmayan zaman,
Onlar yox olacaq, sən qalacaqsan.
Sən düzdün göylərə şux ulduzları,
İnsanla bəzədin hər bir diyarı.
Fələyi uca bir hasara aldın,
O yerdə idrakı kəməndə saldın[3].
Elə bir tağ vurdun daşsız, dirəksiz,
Düşüncə o yerə yol tapmaz, şəksiz.
Zatına düşüncə, ağıl əl atmaz,
Böyük qüdrətinə qüdrəti çatmaz.
Sənin varlığındır o laməkandan
İdrak elçisini hər an daşlayan[4].
Dağınıq deyilsən ki, birləşəsən,
Artıq da deyilsən, əskiləsən sən.
Xəyal da, nəzər də yolunda məhrum,
Nə qədər axtarsa deyilsən məlum.
Ey tanrı, sən hansı başı ucaltsan,
Əyə bilməyəcək onu bir insan.
Qəhrinlə hər kimin əysən boynunu,
Kimsənin köməyi dikəltməz onu.
Biz sənə bəndəyik, sənindir fərman,
Hər kömək səndədir, sənsən əl tutan.
Fildə, qarışqada zəiflik, qüvvət
Sənin əmrindədir, ey ulu qüdrət.
Sənin qüdrətindən qüvvət alınca
İlahı məhv edər zəif qarınca.
Yollardan tüstünü qaldırsan əgər,
Bir çıbın Nəmrudun beynini yeyər[5].
İstəsən əzilsin düşmənin beli,
Quşlarla qırarsan əshabi-fili6.
Gah kiçik nütfəyə qoydun qızıl tac,
Gah xırda çərdəkdən yaratdın ağac[7].
Gah Xəlil alırsan bütxanələrdən,
Gah dost yaradırsan biganələrdən[8].
Qiymətli cəvahir doğan bir evdən
Əbutalibi də çıxaran sənsən[9].
Kimdə var cəsarət, qorxundan sənin





Təslimdən başqa bir kəlam söyləsin?
Yanına yol tapmaz məxluqun əli,
Gizlin bir xəzinə sevməz məşəli.
Əsrarın hər zaman qalmaqçın gizlin
Bağlarsan dilini əsrar bilənin.
Sən məni yaratdın qara torpaqdan,
Sən verdin işıqlı ürək, təmiz can.
Aludə olsam da məndə yox təqsir,
Torpağın peşəsi aludəlikdir.
Günahdan qaçsaydı bu üzüqara,
Bəs kim yol tapardı bağışlanmağa?
Olmasaydı mənim günahım hərgah,
Sənə kim deyərdi: "Ey qəfur allah!"
Gecələr, gündüzlər, hər axşam, səhər
Qəlbimdə, dilimdə bir sənsən əzbər.
Yuxuya getməzdən əvvəl, hər gecə
Mübarək adını çəkərəm öncə.
Gecələr yuxudan qalxınca başım,
Anaram səni, hey axar göz yaşım.
Sənə üz çevirrəm hər səhər erkən,
Gecə də, gündüz də pənahım sənsən.
Hər zaman köməyə çağırram səni,
Qapından ümidsiz qaytarma məni.
Ey tanrı, dərdimə sən eylə əlac,
Bu möhtac kəslərə olmayım möhtac.
Hər zaman bəndəlik yoluyla gedən,
Zatına könüldən pərəstiş edən
Olsun bu dünyada xəzinənlə şad,
Qiyamət günündə əzabdan azad.
İnsanı dünyaya sənsən gətirən,
Öldürən də sənsən, dirildən də sən.
Əldə nə hesabım, nə kitabım var,
Yalnız sən bilirsən nə hesabım var.
Yaxşının, yamanın açarı sənsən,
Yaxşılıq səndəndir, yamanlıq məndən.
Bağışla bir suçum varsa, ey allah,
Məndəndir yamanlıq, məndəndir günah.
Nə ki ilk naxışın sərgüzəşti var

Səndəndir, son söz də sənə qayıdar.
Kəsərli ayəni öyrətmək səndən,
Şeytanın gözünü tikməksə məndən[10].
Adın mehribanlıq etsə bir qədər,
Mənimlə oynaya bilərmi divlər?[11]
Yararmı söz açmaq səninlə məndən.
"Sən" demək, sonra da söyləmək ki, "mən".
Ya qayğı içində, ya sakit, aram,
Nə cür yaratdınsa, o cür yaşaram.
Ey tanrı, ümidim bunadır ancaq,
Bu köhnə dəzgahdan düşərsəm uzaq,[12]
Elə ki, pozular tərkibim mənim,
Dəyişər qurduğun tərtibim mənim.
Əsdikcə tozumu dağıdar yellər,
Pak olan canımı görməz bir nəfər,
Halımı arayıb, edəndə heyrət,
Varıma yox deyə, edərkən töhmət,
Sən yoxdan əlinə ver elə açar,
Bilsin ki, bu yatan ölməmiş, yaşar.
Sənin varlığına bu gücsüz əlil
Göstərmiş nə qədər tutarlı dəlil.
Ölürsəm, bunu sən hamıya bildir:
"Bədəni yatmışsa, canı diridir".
Elə bir mətanət qızışdır məndə,
Şad ürəklə gəlim sənə gələndə.
Mənimlə qapıya qədərdir dostlar,
Məzara girdimmi, düşməndir onlar.
Tərk edər məni bu gözüm, qulağım,
Bədəndən ayrılar əlim, ayağım.
Ey tanrı, mənimlə yalnız sən varsan,
Əliboş qaytarma məni qapından.
Qapında üzümü sürtərəm yerə,
Bir tacla əvəz ver bu səcdələrə.
Bu başı qapından əsirgəmədim,
Sən ona qılınc yox, tac ver, ey rəbbim.
Əzəldən verdiyin hökmlər sönməz,
Yazdığın silinməz, qələmin dönməz.
Hökmündə hazıram canla-başla mən,
Təsəlli tapıram yalvarışla mən.





Sən dedin: dar gündə köməkçi mənəm,
Hər dilək istəsən, qəbul edənəm.
Sənsən acizlərə hər zaman pənah,
Mən də bir acizəm, kömək ol, allah.
Tək sənin işindir bəndəpərvərlik,
Mənim vəzifəmdir etmək bəndəlik.
Qırdı varlığımı, əzdi bu fələk,
Bütün şənliyimi sovurdu külək.
Tək sənsən qurtaran bu sınıqlıqdan,
Qırsan da yenə sən verirsən dərman.
Zülmətin qəlbindən üzümə yol aç,
Fəzilət ayından yoluma nur saç.
Məni yol kəsəndən sən özün qurtar,
Elə et, üstümə gülməsin əğyar.
Əvvəl şükrə çatdır, sonra dövlətə,
Əvvəl səbrə çatdır, sonra zillətə.
Səbrimi tükədən bəlaları sən
Uzaq et, ey tanrı, sən ki adilsən.
Məni hər bəlaya etsən mübtəla,
Əvvəlcə səbr ver, sonradan bəla.
Qırsan da, salamət qoysan da, ancaq
Tələbin bir ovuc tozdur, ya torpaq.
Çürüyüb toz kimi dağılsa bədən,
Yenə əl çəkmərəm bəndəliyimdən.
Düşsəm hər bucağa səni anaram,
Səni mən hər yerdə tanrı sanaram.
Bütün varlıqların heçlikdir sonu,
Tək sənə biçilmiş varlığın donu.
Kim səni, arasa əlində açar,
Əli boşa çıxar, dolanar naçar.
Kim sənə gözünlə baxarsa əgər
Ömrü vərəq kimi yellərə verər.
Səni tapmaq olur səninlə ancaq,
Boşdur hər qapıda yüyən parlatmaq.
Mənzili göz tanır buraya qədər,
Buradan keçdikdə taparsan xətər.
Varımı, yoxumu tapşırdım sənə,
Hesabım aydındır o xalq edənə.

## MİNACAT

Kimsəm yox, ey bizə böyüklük verən,
Pənahım da sənsən, köməyim də sən.
Çıl-çılpaq gəlmişəm, ey pərvərdigar,
Hər şeyim sənindir, mənim nəyim var?
Sən verdin mənə bir işıqlı çıraq,
Onu hər küləkdən özün et iraq.
Əkməyə sən verdin sağlam bir qüvvət,
Mənə əkdiyimdən ayır bir qismət.
Təpələr ucadır, sellər çağlayan,
Çevirmə yüyəni bəxtin yolundan.
Məni bu sellərdən sən elə qurtar,
Körpünü qırmasın bu daşqın çaylar.
Gəlmişəm qapına, üzümdür qara,
Bağışla, ey tanrı, yaxma odlara.
Üzümü ağ elə sən, ey yaradan,
Ümidsiz qaytarma uca qapından.
Torpaqdan yoğurub yaratdın məni,
Təmiz, natəmizdən etdin bədəni.
Tiynətcə yaxşıyam, yamanamsa mən,
Bu nəqşi sən mənə vurdun əzəldən.
Biz aciz bəndəyik, sənsən yaradan,
Sənin qüvvətinlə yaşayır insan.
Yaranmış hər bir şey baxıb görənə
Yaradandan verir xəbəri yenə.
Mən sənə ağlımla salıram nəzər,
Yolunu görməmək olarmı məgər.
Hər bir yaranmışın sənsən mənası,
O ancaq məxluqdur, sənsən ustası.
Ağıl nəzərindən keçən hər surət
Deyilmi nəqqaşı göstərən höccət?
Arada məsafə olduqca uzaq,
Səni tək səninlə mümkündür tapmaq.
Yerlərdə, göylərdə qoyulan əsas
Ağıl ölçüsündən kənara çıxmaz.
Bələdçi olmağa cəhd edər xəyal,
Əndazədən kənar yol tapmaz hər hal.





Yaramaz payədən kənara çıxmaq,
Həddsizin sonuna qoyulmaz ayaq.
Kainat hüdudu başa yetincə,
O səmtə yol tapmaz aciz düşüncə.
Düşüncə bu qədər yol tapar ancaq,
Sən başqa bir şeysən, hüduddan uzaq.
Ey tanrım, umuram, öz hikmətinlə
İşıq yol açarsan məsləhətinlə.
Qarşıma elə bir yol çıxar, bunları
Mən nicat tapım ki, razı qalasan.
Başqa bir çarəm yox, təslimən ancaq,
Qəzadan olurmu boyun qaçırmaq?
Etdiyim duadan yazaram bir xətt,
Üstündə möhrünü qoysun Məhəmməd.
Həm də dörd xəlifə şəhadətiylə,
Yüzlərcə eşq olsun dördünə belə.
Qanlını qurtaran xətt sənəd kimi,
Qolumda qalar bir bazubənd kimi.
Başlarkən qılınctək kəsən məhkəmən,
Məhşərlə qiyamət qarşı gəlirkən,
Hər kəsin boynunda nameyi-əmal,
Mən də bu naməni çıxarram dərhal,
Göstərrəm, insafla hökm verənsən,
Bununla hökm ver, çün hakim sənsən.
Ümidim sənədir, ey ulu tanrı,
Qapından ümidsiz qaytarma barı.
Atımı həddimdən uzaq salmışam,
Yolunda mən yarı yolda qalmışam.
Taxtımı qapında düşür, yaradan,
Məni azdırma öz doğru yolundan.
Səndən yol göstərmək, məndən aramaq,
Mən cana gəlmişəm, sən can ver ancaq.
Sevdiyin ayinlə, ey pərvərdigar,
Sən mənsiz bəzədin mənə bir bazar.
Bu zinət naxşını salma rövnəqdən,
Mənə öz xəznəndən bir pay ayır sən.
Bu zəif varlıqdan nədir istəyin?
Elə bil əvvəldən yoxmuş bu miskin.

Sən əziz tutmusan, yandırma məni,
Nəzərin məndəykən qovma bəndəni.
Sən verdin mənə bu uca rütbəni,
Sən də bu zindandan gəl qurtar məni.
İndi ki vermişsən böyüklük, ad-san,
Kömək ol mənə, ey adil yaradan.
Hər kimin başına qoydunsa külah,
Salma toz-torpağa, əziz tut, allah.
Qapının sirdaşı olan bir qəlbi
Qoyma hər qapıda dilənsin, rəbbi.
Sən mənim işimi alma nəzərə,
İşimə əncam çək ədlinə görə.
Nizami bu uca dərgahda ancaq
Ulu Mustafanı şəfi tutacaq.

## SONUNCU PEYĞƏMBƏRİN TƏRİFİ

Seçilmiş elçidir ulu tanrıdan,
Möhkəm hökmləri xalqa çatdıran,
Qiymətli tacıdır azadələrin,
Ən dəyərlisidir bütün bəşərin.
Əzəldən əbədə bütün yaranmış,
Məhəmməd adından almışdır naxış.
Əqlin qanadına tək odur çıraq,
Varlığa işığı o verir ancaq.
Zamindir qaraya, ağa bu rəhbər[13],
Şəfaət edəndir qopunca məhşər.
Kölgəli ağaclar din saçan bağda
Budağı göydədir, kökü torpaqda.
Ziyarətgahıdır peyğəmbərlərin,
Nemət verənidir bütün bəşərin.
Bu yanar çırağa vermədən işıq
Dünyada bir işıq yox idi artıq.
Xalını qaraldır Əbbasilərin,





Gözünə nur saçır şəmmasilərin[14],
Dodağı İsadan daha möcüzkar[15],
Zülmətin suyutək geyinmiş paltar[16].
Göy - ona dünyada dörd tağı quran,
Yer - ona fələkdə beş növbət vuran[17].
Odur öz ağlına eləyən təkyə,
Ayı barmağıyla bölən ikiyə[18].
Ona bac verəndir bütün Rum və Rey,
Xərac göndərəndir Kəsra ilə Key.
Yağdıran buluddur o səmapeykər,
Bir əlində qılınc, birində gövhər.
Gövhərlə dünyaya vurmuşdur bəzək,
Qılıncı din üçün çağırmış kömək.
Padşahlar qılıncı çəkdiyi zaman
Baş bədəndən düşər, tac isə başdan.
Bu isə əzməyə verərsə qərar,
Qılıncı çəkmədən tökülər başlar.
Hər iki dünyadan bir don tikərək,
Onlardan düzəltmiş yeganə bəzək.
O donu geyərkən pak vücuduna,
Bir qarış az gəldi uca boyuna[19].
Tanrı xəlq etdiyi qamətə gərək
Vurulsun tanrının qurduğu bəzək.
Bağlı qapıların odur açarı,
Onun adı aşmış hər bir hasarı.
Dəvətə genişlik o vermiş yenə,
Daşlar da şahiddir möcüzəsinə[20].
Əli boş, bu dərviş geyimli soltan
Qulamlıq alandır, şahlığı satan.
O gecə meraca at səyirdərək
Fələyin donuna vurdu min bəzək.
Gecə - meracının çətrindən sayə,
Göy - o nərdivandan kiçik bir payə.

## PEYĞƏMBƏRİN MERACİ

Göy gecə məclisi qızışdırmışdı,
İşıqdan gecənin gözü qamaşdı[21].
O yeddi fələyə o yeddi ülkər
Çin ipəklərinə düzmüş dürr, gövhər[22].
Cənnət keşikçisi huri, pərilər
Hər köşkə vurmuşdu yaraşıq, zivər.
Bu taxtın soltanı olan Məhəmməd,
Keçən elçilərdən odur vəliəhd.
Müşkünü saçaraq "Beytiəqsayə"
Məkkədən ucaldı ərşi-əlayə.
Cismini qurtardı dünya bəndindən,
Etdi ərş əhlinin qəlbində məskən.
Yetmiş yollu yurddan köçünü vurdu,
Çadırı yeddinci fələkdə qurdu[23].
Doqquz hücrəsini bir an buraxdı,
Göyün doqquzuncu tağına qalxdı[24].
Yeddinci əflakə çapdığı zaman
Dışarı atıldı dördkünc daxmadan[25].
Altında şimşəktək şığıyan Büraq,
Günəşə qərq olmuş yəhərlə yaraq.
Ərəb səmasında bir Süheyl çapdı,
Yəmən gönü ondan yeni rəng tapdı[26].
Dırnağı inciydi, quyruğu ipək,
İpəyin üstündə oynar incitək.
Göbəyi müşk, ceyran deyildi, bişəkk,
Bir düzüm inciydi ceyran dişitək.
Yüyəni xəyalə gələndən yumşaq,
Yürüşü oxdan da kəskin və qıvraq.
Ən kəskin, ən mətin xəyal şahpəri
Ondan yetmiş addım qalırdı geri.
Aləmlər aşmaqda bir firiştəsən,
Aləmlər çəkirsən öz arxanda sən.
Gecə otlağından, sərxoş olaraq
Ay kimi gəlmişdi əldə şəbçıraq[27].
Elə bir sür ətli addımlar atar;
Hərəkət edincə mənzilə çatar.
Ən kəskin nəzərlə uçar yan-yana,





Nəzəri alırdı ayaq altına.
Məhəmməd peyğəmbər atı çapırdı,
O səyyar dənizdən toz qoparırdı[28].
Özü yol bələdi, atı yeriyən,
Bu ata, o şaha olsun yüz əhsən.
Evindən qapıya qalxdığı zaman
Əlindən təzə don geydi asiman.
Onunla qaranlıq göy oldu gülzar,
Ondan nur alırdı sönük ulduzlar.
Pak olan bu təmiz pərdədə gərək
Vücuddan cismani tozları silmək.
Çatdı hər dənizə yeddi ülkərdə,
Yeddi yol yuyundu o dənizlərdə[29].
Cismindən verdi hər ulduza maya,
Yuxu beşiyini buraxdı aya.
Ütarid ulduza verdi qələmi,
Əlinə qələmi alarmı ümmi?[30]
Cismani şəhvəti Nahidə verdi,
Şükr üçün kükəni Xurşidə verdi.
Mərrixə buraxdı qəzəb və acıq,
Acıq burda getməz irəli artıq.
Müştəri ulduza kibri buraxdı,
Üzüyə ən parlaq yeni qaş taxdı.
Ünsürü Keyvana tərəf ataraq,
Özüylə pak gövhər götürdü ancaq.
Hər mənzil başında bəxşiş verərək
Qaldı varlığından yalnız bir ürək.
Nəbilər hörmətlə baş əydi ona,
Əl çəkdi yəhərin saf qurcuğuna.
At sürdü yollardan, dağlardan keçdi
Bir sıra təpəni bir anda biçdi.
Yanında qasiddi Xızr ilə Musa,
Atının önündə gedirdi İsa.
Bir nəfəs alınca, kirpik vurunca,
Yaxud bir göz açıb dərhal yumunca
Göyün günbədini aşdı arada,
Yerləri, göyləri qoydu arxada.
Elə bir sür ətlə parlatdı yüyən,
Ətrafdan olmadı tozunu görən.

Onun bu yürüşdə atdığı oxdan
Fələk neçə ox da geriydi çoxdan.
O uzaq göylərdə nurani adı
Ruhani kəslərə nur bağışladı.
Cığırsız bir yola, artıq yol saldı,
Həm atı yoruldu, həm yükü qaldı.
O yolda qol-qanad tökdü Cəbrail,
Qorxudan durmayıb qaçdı İsrafil.
Rəfrəfdən keçərək bir neçə fərsəng
Gördü o pərdədə müxtəlif ahəng.
Sidrədən ərşin pak səqfinə qədər
İsmətdən bir kilim döşədi dilbər.
Ərş divangahını sürətlə keçdi,
Dərcin də yolunu bir anda biçdi[31].
Çatdı son nöqtəyə cəhət diyarı,
Bitdi o nöqtədə dövran pərgarı.
Yer oğlu göylərdə hey at oynatdı,
Yerləri, göyləri arxaya atdı.
Mücərrəd dolanmaq çatdı bir yerə,
Cismani varlığı itdi bilmərrə.
Yoxluq yollarında edərkən cövlan
Büsbütün ayrıldı öz varlığından.
Ruhani dairə gərdişlərində
Başıyla ayağı düşdü bir bəndə.
Çatdı altı, üstü olmayan yerə,
Çünki altı, üstü bilməz dairə.
Siyasət pərdəsi atıldı birdən,
Hücrə təmizləndi biganələrdən.
O yerdə ki, idrak tapmayır məkan,
Salam Məhəmməddən, qəbul tanrıdan
Ağızdan çıxmayan səsi eşitdi,
Görünməz simanı ziyarət etdi[32].
Elə pak göründü o sahibcəlal,
Nə cəhət nəzərə çarpdı, nə xəyal.
Vücudu nərgiztək bir gözə döndü,
Bir kirpik qırpımdan tanrıya çöndü.
Yoxsa bu bağdakı sırf nərgiz olan
Gözünə bir sürmə çəkmiş "mazağ"dan.
Keçdi bir dost kimi süfrə səmtinə,





Yedi, pay ayırdı öz ümmətinə.
Ürəyi allahın nuriylə doldu,
Bir yetim, bax, necə padişah oldu.
Dünyaya qayıtdı çöhrəsi parlaq,
Hər elmə, hikmətə vaqif olaraq.
O yolu tez getdi, tez döndü yenə,
Bu sür ət heç kəsin sığmaz fikrinə.
Şimşəktək şığıdı eylə sür ətlə,
Dönərkən yatağı istiydi hələ.
O gecə adi bir gecə deyildi,
O bir gecəydimi, yaxud bir ildi?
Bəs bizim ruhumuz məgər bir anda
Dolaşa bilmirmi bu asimanda?
Ruhumuzdan zərif olan bu insan
Bir anda aləmi seyr etdi, inan.
Gözəldir, səpərək can gövhərini,
Tərifə başlasam dörd yavərini.
Dörd gövhər satan var, dörd gövhər alan[33],
Artıq-əskiyinə qarışmaz satan.
Əlinin eşqində sabitqədəməm,
Ömər sevgisindən uzaq deyiləm.
Hər iki nur ilə nurlanır dımaq:
Əbubəkr bir şamdır, Osman bir çıraq.
Bu dərviş sifətli dörd böyük soltan,
Dünyaya olmuş dörd təkbir oxuyan[34].
Nəbilər önündə gedənə alqış,
Üzrləri qəbul edənə alqış.
Sənsən yaranışda birinci xilqət,
Dövranın sonunda sonuncu ayət.
Hər iki aləmə mübarək sənsən,
Sənə bir tay varsa, o da tək sənsən.
Sənsən xəzinələr qıflına açar,
Yaxşını, yamanı edən aşikar.
Ən gözəl günündə "ümmətim" deyə,
Şəfaət edirsən suçlu bəndəyə.
Bir ovuc torpağam mən dərgahında,
Artıq bir şikaram şikargahında.
Nizamı tutmuşdur Gəncədə məkan,
O, məhrum olmasın salamlarından.

# ŞƏRƏFNAMƏNİ YAZMAQ HAQQİNDA

Gecə gündüz kimi bəzək vurmuşdu,
Səhər duasına erkən durmuşdu.
Yer üzü məhtabdan açmışdı çətir,
Sanki yer nafından səpirdi ətir.
Bazarlar olmuşdu səs-küydən uzaq,
Zınqırov səsindən dincəlmiş qulaq[35].
Keşikçi dalmışdı şirin yuxuya,
Dan yeri başını salmışdı suya[36].
Dünyanın işindən çəkib əl-ayaq,
Fikir zəncirində olmuşdum dustaq.
Gözlərim örtülü, könlüm ayıqdı,
Aramaq işində zehnim sayıqdı.
Deyirdim ki, qurum eylə bir tələ,
Ən gözəl bir şikar keçirim ələ.
Baş qoydum dəlitək qəm boğa-boğa
Maral sağrısından yumşaq yastığa.
Gah başım dizimin üstündə dalğın,
Yer - başım altında, göy - ayağımın[37].
Dayanmaz varlığım rəqs edər bütün,
Başım kürsü olmuş ayağım üçün.
Düşüncəm yol ölçüb etsə də cövlan,
Cismim böyrü üstə tozlara qəltan.
Tənimi bir yana buraxdım artıq,
Canı can çölünə götürdüm azıq.
Gah gizlin lövhədən ibrətlər aldım,
Gah keçmiş sühüfdən hikmətlər aldım.
Şam kimi od düşmüş mənim bağıma,
Bağım döndü mənim odlu dağıma.
Günəş qarşısında əriyəntək mum,
O mumla gözümdən çəkildi yuxum[38].
Cadugər məndənmi öyrənmiş, nədir,
Gözlərdən yuxunu mum ilə çəkir.
O müdhiş keçidlər başında bu an
Pak olan əqlim də uçdu başımdan.
Daldım xoş yuxuya coşarkən damaq,





Gözümdə canlandı səfalı bir bağ.
O rəngin bağçadan dərirdim xurma,
Verirdim kim çıxsa mənim qarşıma.
O xurmadərən ki durdu yuxudan,
Dimağı atəşdi, ağzı bir ümman.
Müəzzin başlarkən birinci qunut
Ki: "Sübhanə həyyəlləzi layəmut"[39].
Məndən də ucaldı bir acı nalə,
Özümü unutdum, daldım xəyalə.
Uğurlu bir səhər doğunca fələk,
Yenidən canlandım səhər yelitək.
Gecələr nur saçan şamı yaxaraq,
Fikrimdən şam kimi yanırdım ancaq.
Başladı ürək, dil: "Şer yaz" deyə,
Harut, Zöhrə kimi cadugərliyə[40].
Yetişər, bu qədər işsiz qalmayım,
Şerə ən yeni bir üsul arayım.
Yeni nəğmələrlə başlayım kəlam,
Keçmişlər ruhuna göndərim salam.
Bir çıraq yandırım bir pərvanədən,
Bir ağac bəzəyim kiçik danədən.
Bu barlı ağacdan kim meyvə dərsə,
Söyləsin xoşbəxtdir bu bağdan kimsə[41].
Ancaq bir şərtim var: bir para dəcəl
Qonşunun malına uzatmasın əl[42].
Tutaq ki, huşyarlar padişahıyam,
Dürr, gövhər satanlar şahənşahıyam.
Xalq başaq yığandır, mən əkinçiyəm,
Kirəçi deyiləm, ev sahibiyəm.
Bu bazarda necə büsat açım mən,
Arxayın deyiləm yol kəsənlərdən.
Varmı bu bazarda bir dükan açan,
Varına dörd yandan dəyməsin ziyan?
Damcı oğrusundan qorxarmı dəniz?
Buludum yağdırar ondan çox, şəksiz[43].
Ay işığı qədər olsa yüz çıraq,
Yenə günəş ona vuracaqdır dağ[44].

## HEKAYƏT

Eşitdim, bir yoxsul ciyər qaniylə
Köhnə bir əşrəfi keçirdi ələ.
Ona söyləmişdi varlı kimsələr:
"Zəri - zər, xəzinə - xəzinə çəkər".
Sürətlə üz qoydu bazar səmtinə.
Köhnə əşrəfiylə tapsın xəzinə.
Bir sərraf dükanı gördü çox geniş,
Bir yerdə bu qədər qızıl görməmiş.
Bir yığın qızıl var günəşdən parlaq,
Hər yan əşrəfidir bir neçə qalaq.
Xəzinə xülyası beyninə batdı,
Qızılı xəzinə üstünə atdı.
Əlindən uçunca dəyərli varı,
Yüyürdü qalanmış qızıla sarı.
Qızılı atmaqdan oldu peşiman,
Birə yüz almağa tapmadı imkan.
Qızılı atınca qəm çökdü gözə,
Nə üçün bir qızıl qarışdı yüzə?
Fəryada başladı "qızılım" deyə,
Yalvardı cəvahir satan kişiyə:
- Bu ömrüm uzunu hey çalışaraq,
Əlimə bir qızıl keçirdim ancaq.
Mənə söyləmişdi axmaq bir nəfər:
"Zəri - zər, xəzinə - xəzinə çəkər".
Həmin bu qızıllı dükana çatdım,
Qızılı qızılın üstünə atdım.
Atdım ki, əşrəfi çəksin xəzinə,
Çox qızıl onu da çəkdi özünə.
Gülərək o sərraf, o azad insan,
Söz açdı qızılın qarışmasından:
- Çox gedə bilərmi azın üstünə?
Yüz getməz, bir gedər yüzün üstünə.
Kim ki sərvətimi çapmaq istəyir,
Yolumda bu məsəl bir keşikçidir.
Dəyirman bu qədər hay-küy qoparır,
Muzdurdur, ununu divan aparır.





Oğrudan əlmüzdüm budur nəhayət:
"Oğrudur" deməyə etməz cəsarət.
Baxsana, yol kəsər quldur-qaralar,
Dünyanı ki, qara rəng ilə boyar.
Gündüzlər "Göz gözdən utanır" deyə,
Talanı, qarəti qoyar gecəyə.
Ancaq söz quldurü şəfəq sökərkən,
Qələmi yontaraq müşkin söyüddən
Fikrimi qapırlar, könlüm əmindir,
Buxaraya getsə o, Gəncənindir.
Gizlində mətaha çıxmaz müştəri,
Oğurluq bir malın olmaz dəyəri.
Ayıblar açığa çıxdığı zaman
Əlin də, qəlbin də dərdlənir bundan.
Oğurluq maldan səs çıxmazsa, bişəkk,
O malı dargalar aparmış demək.
Göz yumdum bu işə, çünki ruzigar
Hər yaxşı-yamanı edər aşikar.
Dövranın çəkisi çəkər hər işi,
Çəkiyə girməmiş qalmaz bir kişi.

## ÖZ HALİNA VƏ ZƏMANƏNİN GEDİŞİNƏ DAİR

O gülgün şərabdan, saqi, ver nişan,
Ver mənə sərxoşlar içən dərmandan.
O acı dərmanla məst olum bu gün,
Özümü unudum bəlkə büsbütün.
Nizami, yetər bu şöhrət qazanmaq,
Qocaldın, gəncliyi daha gəl burax.
Qızmış aslan kimi pəncə aç, artıq
Özünə tülkütək verme yaraşıq.
Eşitdim, rəng sevən bir rus tülküsü
Özünə verərmiş bir gəlin süsü,
Qopunca toz, külək, yağış, boran,
Tükünü çıxarmaz o gün yuvadan.
Qucaqlar deşiyin bir bucağını,
Acından yalar öz əl-ayağını
Sorar öz qanını dəri altından,

O dəri becərər, başqa kəslər can.
Elə ki, əcəli yetişər birdən,
Dərisi canına kəsilər düşmən.
Dərinin eşqinə edərlər şikar,
Bəslənmiş dərisi başından çıxar.
Dünyada bir büsat qurmaq nə mümkün,
Bu yurddan çarəsiz köçərsən bir gün.
Özünə yaraşıq verməyən heyvan
Təmahkar kəslərdən görməz bir ziyan.
Yeddi rəng pərdədən qurtul birtəhər,
Güzgü pas altında çirkin görünər.
Qurduğun cadular yetişər, burax,
Kimsəyə cadutək tor atma nahaq.
Al kükürd deyilsən, ağ ləl deyilsən,
Arayan ümidsiz qayıtsın səndən.
İnsansan, insana qatış hər zaman,
İnsanla yaşayar hər zaman insan.
Əlçatmaz xəzinə olsan da, ancaq
Çox belə xəzinə gizləmiş torpaq.
Ağacdan uzaqsa meyvə qoparan,
Fərqi yox, o xurma versin ya tikan.
Həyat yox, gəncliyi alınca xəzan,
Gənclik qalmayınca qalmasın cahan.
Gənclikdir insana gözəllik verən,
Gözəllik sönərsə qəlb olurmu şən?
Sümüyün çürüyüb, süst olsa arxan,
Mərdlikdən, hünərdən qurma bir dastan.
O gün ki, gəncliyin qüruru sönər,
İş görməz daha bu cəsarət, hünər.
Bağ, bağça gözəldir, şəndir gülüstan
Sərv ilə lalələr güldüyü zaman.
Elə ki, bağlara boz xəzan girər,
Bülbül öz yerini qarğaya verər.
Bağbanlar qəlbini dərdü qəm yaxar,
Uca budaqlardan düşər yarpaqlar.
Bostanlar pozular, reyhanlar qalmaz,
Bağın açarını soruşan olmaz.
Durma, gəl naləyə, ey qoca bülbül,





Al güllər saraldı, tutuldu könül.
Ucaboy sərvlər oldu ikiqat,
Bağban da kölgədən çəkildi heyhat.
Əlliyə çatınca dəyişir əhval,
Dəyişir yaşayış, dəyişir hər hal.
Baş, ağır yüklərdən daşa vuruldu,
Bu dar keçidlərdə dəvəm yoruldu,
Qollarım titrəyir qədəh tutarkən,
Ayağım büdrəyir qalxıb durarkən,
Vücudum laciverd rəng aldı artıq,
Qırmızı güllərim saraldı artıq.
Yollarda qaldı bu yürüyən atım,
Baş düşdü yastığa, söndü həyatım.
Çövkanlar atdığım yel ayaqlı at
Yüz çövkan vursan da tərpənməz, heyhat.
İtdi meyxanada şənlik açarı[45],
Tövbələr çulğadı bu ruzigarı.
Dağlara buludlar ağ kafur saçdı,
Ac torpaq ağzını kafurçün açdı.
Gah könül köçməyə tərpəniş edir,
Gah başım yuxuya pərəstiş edir.
Qulağım eşitmir gəlin qəmzəsi,
Qədəh boş, kəsildi saqinin səsi.
Qulaq eşitməkdən, baş kefdən qaldı,
Köç vaxtı yaxındır, ömrüm azaldı.
Bu zaman bir bucaq xoşdur saraydan,
Oyuncaq əlini uzadar dövran[46].
Gecə şam nə qədər şən-şən gülümsər,
Pərvanə seyri də o qədər sürər.
Otaq boş qalınca işıqlı şamdan
Qalmaz pərvanədən daha bir nişan.
Uşaqlıq və gənclik dövrü çatınca,
Özümü göstərdim düşgün bir qoca.
İndi bu dərd ilə göstərsəm şənlik,
Qocaya uyarmı bu gənclik, mənlik?
Düşmüşəm bir çürük çöp kimi bağda,
Gecələr şam kimi parlar bucaqda.
Atəşli böcəklər gecələr parlar.

Qaranlıq gecədə nurdan dəm vurar.
Özümdə görsəydim qüvvət və dayaq,
Tapardım sevimli, sakit bir bucaq.
Yenidən rahət bir ömür sürərdim,
Dünyanı şadlığa girov verərdim.
Yetişdi başa bu gənclik günləri.
Məşriqdən ağardı daha dan yeri[47].
Dincəlmək fikriylə nə tədbir töküm,
Azalsın bir qədər zəhmətim, yüküm?
Başına tac ilə kim vursa bəzək,
Əmgəyi ağ deyil, müşk olsun gərək[48].
Yeddi göy pərgarı etmədən cövlan,
Ömrümün xəttini parçalamadan
Vursun barmaqlarım mizrabıma dəm,
Öz varlıq səsimi saxlayım möhkəm.
Hər incə sözə bir füsun bağlayım,
Qoyduğum əsərə bir gün ağlayım.
Keçərsə körpüdən bu gılan atım,
İnanma Gilana bir də qayıdım[49].
Bu yerdə mən kimi yatanlar çoxdur,
Onları xatırə salan ki, yoxdur.
Təzə kəklik, yad et məni ürəkdən
Məzarım yanından ötüb keçərkən,
Üstümdə görərsən göyərmiş otlar,
Baş daşım uçulmuş, çökmüşdür məzar.
Qəbrimin tozunu sovurmuş yellər,
Dostlardan anan yox məni bir nəfər.
Qəbrim şüşəsinə əl qoyan zaman
O pak gövhərimi heç olmasa an[50].
Uzaqdan sən mənə göz yaşı töksən,
Mən sənə parlaq nur saçaram göydən.
Duadan bir dilək istəsən əgər,
Mən amin deyərəm, qəbulə keçər.
Salam ver, hörmətlə məndən salam al,
Gəl qəbrim üstünə, edim istiqbal.
Hər zaman diriyəm sənin kimi mən,
Mən cana gələrəm sən cana gəlsən.
Bu yerdə sanma yar-yoldaşsız məni,





Məni görməsən də, görürəm səni.
Bu ölənlər ilə, gəl, danış barı,
Unutma, yada sal bu yatanları.
Qəbrimə gələrkən qədəhi doldur.
Nizami yatdığı yerə qədəh vur.
Ey uğurlu Xızır, sanma ki, mənim
Bu meydən içilən meydir məqsədim.
O meydə özümü unudum dedim,
Özümü unudub məclis bəzədim.
Mey dalğınlıqdandır, səbuh xumardan,
Mənə pak şərabı və'd etmiş yazdan.
O böyük tanrıya aydındır bu iş,
Ömrümdə dilimə şərab dəyməmiş.
Bu dilim, dodağım görmüş isə cam,
Olsun Nizamiyə hər halal-haram.

## ÖZ NƏFSİNƏ ÖYÜD VƏ NƏSİHƏT

Ey saqi, yuxumu başımdan uçur,
Aşiqəm, camı saf mey ilə doldur.
Bir mey ki, suyu saf, axan gümüşdür,
Onu hər dörd məzhəb halal görmüşdür[51].
Ey könül, böyüklük almadan ələ
Böyüklər yerində oturma hələ.
Dünyada böyüklük tapmaq istəsən,
Al ələ qələmi, yaz böyüklərdən.
Dindirən olmasa danışma hədər,
Kəsəri yavaş vur, sınmasın gövhər.
Sormadan kim sözə başlasa, bişəkk,
Sözünü küləyə sovurmuş, demək.
Gözsüzə yaramaz göstərmək çıraq,
Görməyən bir gözə nə piltə, nə yağ?
Söyləmək o zaman verər mənfəət
Aləmə səs sala, qazana şöhrət.
Sözünə almasan layiqli cavab,
Dəyərli sözləri eləmə xarab.
Boş söz söyləməkdən saxla özünü,

Ağzına qıfıl vur, yandır sözünü.
Sən ki zövq alırsan yemək, yatmaqdan,
Nə deyim sənə, ey qulaqsız insan.
Bu gözəl sənətim məlumun deyil,
Nə də ki, qapımda vurulan təbil.
Ən ağır qiymətli mətahlarım var,
İstəyən olmasa, etməm aşikar.
İnciyə sədəftək göz yummuş alan,
Bu kasad bazara çıxarmı satan.
Belə bir dəyərli gövhərlə, dostlar,
Bir gövhər sevənə ehtiyacım var.
Müəllimim mənə açan sirləri
İstərəm danışım, dinləsin biri.
Ondakı almazla qazım mədəni,
Canına bağlayım can gövhərini.
Belə alver geniş dünyada çox var,
Biri inci alar, o biri satar.
O hansı könüldür kədər almasın?
O hansı kəmənddir qarşılanmasın?
Xəzinə üstündə yatmışdır ilan,
Gözətçilik deyil məqsədi, inan.
Xurmanın ağacı olmazsa uca,
Uşaqlar çox ziyan verər ağaca.
Yolu gözətçiylə olar qorumaq,
Ədsə gül içində saxlanar ancaq.
Tınətim olduqca yumşaqdır, bundan
Tarlama hər yandan yetişər ziyan.
Sərt təbiətilə başqa adamlar
Özünü əyridən, oğrudan saxlar.
Uşağı yolundan qaçırmaq üçün
Üzü zənci kimi qaraltmaq neçin?
Hansı bir səfərə görsəm hazırlıq,
Xoş təbiətimi alaram azıq.
Bəzənmiş ruhun bu təbiətimlə,
Mən belə yaşadım, öləram belə.
Hər kəsi mədhlə etdim sərəfraz,
İndi də özümdən söyləyim bir az.
Nə qədər şair var, söz var, şer var,





Dünyada onlardan mənəm yadigar.
Mənimlə canlandı, söz tapdı qüvvət,
Yenə də mənimlə edər qiyamət.
Mən söz gülşəninin sərv ağacıyam,
Sərv ağacı kimi xidmətdə varam.
Həsudun əlçatmaz fələyi mənəm,
Başçıyam hamıya, ayaq öpənəm.
Kim mənə kin etsə düşmən olaraq,
Bərcistək oxum var, atmaram ancaq[51].
Zöhrətək çəkiyə qoyaram dirhəm[51].
Bəxşişə nə çəki, seltək tökərəm.
Dərdliyə gülmərəm şimşək kimi mən,
Canıma od düşər öz şimşəyimdən.
Tikana gül kimi saçaram ətir,
Hər yara ney kimi məni inlədir.
Ürəyim odmudur, nədir ki, yanır,
Tikanı yedikcə hey alovlanır.
Mənəm dərya kimi hər eybi yuyan,
Deyiləm güzgütək göstərən nöqsan.
Elə mal verərəm istəyən şəxsə,
Zəhmətə düşməyim geri verərsə.
Arpanı göstərsəm buğda verərəm,
Arpanı buğdatək satan deyiləm.
Günəşəm, ön, arxam birdir, fərqi yox,
Azdır aldatmağım, işığımsa çox.
Kimsənin dalınca deməram yaman,
Utanım üz-üzə gəldiyim zaman.
Yamanlar sözünü almaram dilə,
Peşiman edərəm mükafat ilə.
Düşmənə kinli söz deməram, inan,
O sözlə özümə olaram düşman.
Pisdən yaxşılıqla qorunmaq mümkün,
Dünyada yaxşılıq hər şeyə üstün.
Yaxşılığım üçün hər bir diyardan
Salamdır hey gəlir namıdarlardan.
Yaxşılıqla atsam mən bu dəzgahı,
Olaram yaxşılar ziyarətgahı.
Bir dirhəm verənə inci ataram,

Dikbaşlıq edənə qürur sataram.
Bucağa girmədim hünərsizlikdən,
Dünya yeldir, narınc qorxar küləkdən.
Dünya şahlarından, bax, hansı biri
Tapmışdır mən kimi incə şairi?
Bağçada, söyləyin, hansı qızılgül
Görmüşdür mən kimi xoş səsli bülbül?
Mənəm hər bilikdə dəftər bəzəyən,
Hər incə nüktədə qələm işlədən.
Bilikdən dünyada nur alaram mən,
Mənəm hər bilikdə başlıca bir fənn.
İstəsəm, hər kəsi mən güldürərəm,
Bəzən də gözlərdən gülab çəkərəm.
Hər kimi buludtək ağlatsam, yəqin,
Günəştək güldürrəm, qoymaram qəmgin.
Şer dövlətindən əldə var kəsər,
O, bəzən ağladar, bəzən güldürər.
İstəsəm, mümkündür bu zöhdü atmaq,
Hər bir yığıncaqda məclis parlatmaq,
Neyləyim, ağacım bitmişdir yandan,
Tərpətsəm kökünə yetişər ziyan.
Hər çillə qırx gündür, xəlvəti mindır,
Bu yerdən məclisə girmək çətindir[34].
Daşqın sel gəlirkən ağıllı kəslər
Reydən Buxaraya eyləməz səfər.
Bu kəskin küləkdən budur məsləhət,
Gül kimi pərdədə eyləyə xəlvət.
Az balədçilik et xalqa, dur kənar,
Humay az görünsə humayun olar.
Yatmaqdan, çapmaqdan başım dönərkən,
Başqa bir çarəm yox, gərəkdir ki, mən
Hər sözdən yaradım incə bir çiçək,
O gülə ağlayım dərdli bülbültək.
Görsəydim özümdən gözəl bir gülşən,
Al, sarı gülünü dərməzdimmi mən?
Hazıram budumdan kabab yeməyə,
Günəştək getməyim dilənçiliyə[35].
Sımurğtək çəkilim xəlvət bucağa.





Şerimdən nəşələr verim qulağa.
Məndən bu dünyanı aldı qəm, kədər,
Mənimçün rahətdir xəlvət guşələr.
Göy kimi qapıma qıfıl vuraraq,
Oldum xalqdan uzaq, dünyadan uzaq.
Bilmirəm nə sayaq keçir bu cahan,
Dünyada nə vardır yaxşı-yamandan?
Mən ölü olsam da, ən mərd kəsəm,
Karvanda gedərəm, karvansız şəxsəm[36].
Min könül dərdilə nəfəs alıram,
Yatmayım deyə hey zəngi çalıram.
Elə dost varmıdır, qızğın ürəklə
Əziz tutsun məni canından belə?
Vəfasız kəslərdən çəkərək ayaq,
Öz kimsəm özümü gördüm mən ancaq.
Aşiqlər yanında olsa da yaman,
Özümü sevməyim yaxşıdır ondan.
Ruzı gəlməyirsə yadlar eşqindən,
Ruzini o böyük tanrıdır verən.
Daha ehtiyacım qalmasın xalqa.
Məni incitməsin qapıçı, darğa.
Elə bir ixtiyar olsaydı məndə,
Qoymazdım bəndəyə möhtac bir bəndə.
Tilsimli torpaqda qandan qorxaraq
Cızıqdan qırağa qoymaram ayaq.
Elə bir tilsimdə yaşarmı insan,
Olsun qanlı cızıq ona bir zindan.
Xalq ilə söhbəti, ülfəti atdım,
Dünyada dinclıklə dövlət yaratdım.
Nəfsin noxtasını bərk tutdum qırx gün,
Qırx günün içində hazır olur gün[37].
Çünki dörd balışda görmədim səbat,
Dörd divar içində keçirdim həyat[38].
Hər arpa ki, atdım bu dəyirmana,
Bir inci yaratdım gövhər alana.
Eşq olsun, söz düzən böyük şairlər
Kiçik bir arpadan yaradır gövhər.
Saralmış çöhrəmdə quruyan yaşdan

Çəkdim divarıma palçıqlı saman.
Vücudum burada arpayla yaşar,
Ürəyim orada xəzinə saçar.
Dünyada boşuna keçmədi ömrüm,
Yeməkdən, içməkdən başqa iş gördüm.
Hər gecə biliyə qapı açmadan
Başımı yasdığa qoymadım bir an.
Qəlbim qadın deyil, çaxmaqdır, çaxmaq,
Məryəmtək boyludur, bakirdir ancaq,
Kişiyə getməyə nə ehtiyac var,
Onun öz daşından öz odu çıxar[59],
Bu bakir sözləri düşüncə ilə
Olduqca çətindir gətirmək ələ.
Bakir söz tapınca yontulur ürək.
Hər kəsin işimi incə söz demək?
Çoxları saxsını incitək dələr,
Hamamda özünə səsi xoş gələr.
Sən lakin bir geniş səhranı düşün
Ki, səsdən yırtılır boğaz büsbütün.
Şahlar sikkəsinə qızıl vururkən,
Elə var, qırılsa qırılmayasan
Yəhudi misləri qəlp qızıl etdi,
Bu işdən dükanı qarətə getdi.
Hər meyvə yeyilməz əncir adına,
Zübeydə deyilməz hər dul qadına.
İki hindli görsə hind ölkəsindən,
Biri darğa olar, biri yolkəsən.
Mən təmizlədim bu gümüş suyunu,
Ayırdım torpağın tozundan onu.
Xurmatək dəyməzsə, onu bil yəqin,
Açmaram üzünü söz gəlininin.
Dəyməmiş bir meyvə gördüyün zaman
Ağacı tərpətsən, deyərlər kalsan.
Kal əncir əzməklə əldə yumşalır,
Yedikdə boğazı dərhal qan alır.
Budaqda vaxtında gülərsə çiçək,
Ağacın meyvəsi bol olur, bişəkk.
Çınqıllıq, kol-kosluq olursa torpaq,





Yaramaz onda şən bir bina qurmaq.
Vüqarla vuraram başa bu işi,
Vüqarsız bir işi görərmi kişi?
Taxıldan bir fayda gəlirsə ələ,
Əkinçi əkinə başlar həvəslə.
Taxılın azalsa qədri, qiyməti,
Əkinçi buraxar işi, zəhməti.
Dastanı sevənlər, şeri duyanlar
Nəğmələr dinləmir bir çox zaman var.
Yazmalı elə bir uğurlu dastan,
Onda bir incəlik duysun oxuyan.
Bildim ki, bu naxşı bəyənər dostlar,
Verdim bu dastanı yazmağa qərar.
Doğrular yanında varmıdır bundan
Daha xoş simalı, sevimli dastan?
Başqa dastanları arasan bir az,
Millətlər yanında doğru sayılmaz.
Kəskin qələmlərlə ciddi yazılan
Bu dastanda yoxdur azacıq yalan.
Kəskin qələmlərin gücüylə bu gün
Başqa dastanlara olmuşdur üstün.
Şahanə şərabla dolmuş badəsi,
Aldanmış "Şahların Şərəfnaməsi".
Köhnə söz ustası, o tuslu şair
Söz gəlinlərini bəzədi bir-bir.
Düzdü dastanlara çox inci, gövhər,
Yenə də qaldı çox bakirə sözlər.
Yazsaydı tarixdə bütün olanı,
Çox uzun sürərdi onun dastanı.
Sevmədiklərinə etmədi hörmət,
Bəyəndiklərinə göstərdi rəğbət.
Dostlara o paydan ayırdı bir az,
Halvanı təklikdə yemək yaramaz.
Nizami bu sapa düzərkən gövhər,
Qələmdən silindi qələm görənlər[60]
Hansı bir incini keçirdi ələ,
Onları çəkdi öz söz çəkısıylə.
Uğurla ucaltdı "Şərəfnamə"ni,
Köhnəni bununla eylədi yeni

## XİZRİN NİZAMİYƏ TƏLİMİ

Ey saqi, amandır, ver gülgün şərab,
Eylə mən sərxoşu o meylə xərab!
O xərabəlikdə qoparım fəğan,
Xərabat əhlini səsləyim burdan.
Cismanı qulaqla duya bilməyən
Bir sirri mənə Xızr öyrətdi dünən.
Ey tədbirlərimə xas bəndə olan,
Söz qədəhlərimdən dadımlıq alan,
Süsəntək bəndəlik ilini atan,
Dirilik suyundan rütubət tutan,
Eşitdim şahları nəzmə çəkərək,
Sözlər yaradırsan axıcı sutək.
Dəyərsiz sözlərdən uzaq ol bir az,
Əyri pərdələrdə çalğı çalınmaz.
Ən incə sözlər tap, olasan dilbər,
Görüncə bəyənsin söz bəyənənlər.
Şübhəsiz xoşdur hər sınaqlı şəxsə:
Ən çirkin bir üzü görməkdən isə
Əjdahalar hücum etsinlər ona,
Ya müdhiş bir nəhəng çəksin kamına.
Keçmişlər deyəni eləmə təkrar,
İnciyə, bax, iki dəlik açmazlar.
Ancaq sözü sözə bağlamaq üçün,
Bəzən, nə eybi var, təkrar da mümkün.
Ən yeni ustasan sən bu sənətdə,
Köhnələr izində getmə, əlbəttə.
Səndə ki bakir söz xəzinəsi var,
Dul sözə əl atmaq nəyinə yarar?
Darılma: "Bu ovu vurmadım" deyə,
Vaxtında ona da tək sənsən yiyə.
Asan yaradılmaz daşda cəvahir,
Onu daşdan almaq asan deyildir.
Hər şey parça-parça olunca belə,
Bərk yerdən çıxar çox çətinlik ilə.
Cəvahir asudə tapılmaz, bişəkk,





Hər gümüş butada sallansın gərək.
Quruda, dənizdə kim çəksə zəhmət,
Balıqdan dürr alar, öküzdən sərvət[61].
Gümüş küp, ya qızıl bir teşt istəsən,
İraq torpağından uzaq getmə sən[62].
Reydən Cənd, Dehistan, Xarəzmə qədər
Yoxdur sel izindən başqa bir əsər.
Buxaralı, gilək, kürd və xəzərli
Bir parça çörəyi tutmuş dörd əlli.
Başqa ot göyərməz Mazandaranda,
Tikanlı qanqallar göyərir onda.
Tək iki şey çıxar Mazandarandan:
Biri div, o biri divqılıq insan.
Yaşasın qəlb açan sevimli İraq,
Ondan şerin səsi ucalmış ancaq.
Ətirli çiçəklər atınca Hicab,
O güldən İraqda çəkilir gülab.
Ey sənət qasidi, məsləhət budur,
Dünyanı yel kimi dolaşma, otur.
Cavahir yonmağa al kəskin kəsər,
Söz gəlinlərinə saç noğul, şəkər.
Gövhər qaz İskəndər mədənlərindən,
Gövhəri İskəndər alacaq səndən.
Gövhərə müştəri çıxar cahandar,
Dünyada tezliklə diləyin parlar.
Qapına qiymətlə gəlsə müştəri,
Buraxma, sat ona, qaytarma geri.
Dənizlər soltanı alsa bir gövhər,
Hər daşa bir gəmi cavahir verər.
Xəzinə gizlətmə belə dənizdən,
Ondan dürr alaraq, cavahir ver sən.
Ol doğru miyançı, düzəlsin hər iş,
Ortada nə kabab yansın, nə də şiş.
Xızrın sözlərini eşidincə mən,
Beynimdə bir xəyal doğdu yenidən.
Qəlbimdə yer tutdu, qəbuldur, deyə,
Ürəkdən doğan söz yatar ürəyə.
Mənə bu saf öyüd əsər edincə,

İnciyə dil açdım incədən-incə.
Yaratmaq fikriylə yeni "Şahnamə",
Açdım hər şivədən böyük həngamə.
O heyrət verici əfsanələrdən
Şahların adına qitə çəkirkən
Zehnimdə hər güzgü parlatdımsa mən
İskəndər xəyalı keçdi önümdən.
Boş baxma sən buna, uca şəhriyar
Həm qılınc vurandır, həm də tacidar.
Xalq ona taxt-tac sahibi deyir,
Ölkələr fəth böyük cahangir.
Vəziri həkim bir şəxs olduğundan
Ona da hikmətdən yazıldı fərman.
Baxanlar görüncə onu dinpərvər,
Ona da peyğəmbər adı verdilər.
Bilənlər əkdiyi üç toxumdan mən
Bir ağac əkərəm həm uca, həm şən[63].
Öncə söz açaram padşahlığından,
Cahangirliyini edərəm elan.
Hikmətlə bəzəkli söz yazaram mən,
Köhnə tarixləri təzələrəm mən.
Döyərəm qapını peyğəmbərliyə,
Tanrı da bəyənmiş "peyğəmbər" deyə.
Üç qapı tikdim, üç xəzinə demək,
Çəkdim hər qapıda ayrıca əmək[64].
Üç qapı, ya bu üç inciylə yenə
Tökərəm dünyaya ağır xəzinə.
Vuraram elə rəng, elə bir zivər,
Bütün ölkələrdən işığı gələr.
Dəftərlər topladım incidən parlaq,
Heyifdir üstünə çöksün toz, torpaq.
Bir dövlət sarayı göstərin barı,
Vurum divarına bu naxışları.
Bu naxışlarımla durduqca dövran,
Qurtarın onu bu dünya tozundan.
Şerimlə yaradım elə bir dastan,
Əbədi həyata yaratsın imkan.
Adını naməmlə edərəm uca,





Adıyla yaşayım dünya durunca.
Bu taxtdan sazlayım elə oturaq,
Onunçun olsun bir əbədi otaq.
Adına bağlayım elə naxışlar,
Dövran dövr etdikcə qalsın bərqərar.
Zehnindən silməsin onu bu fələk,
Yumasın, pozmasın yağış və külək.
Bu şərtlə dünyada tutunca aram,
Başımı günəşə, aya ucaltsam,
Mənə də qurulsun elə bir dəsgah,
Başım ölçüsündə verilsin külah.
İşığı günəşdən mümkündür almaq,
Bu işdən kölgənin yolu çox uzaq.
Qarğaya göyərçin olarmı şikar,
Bu ovu padşahın əl quşu ovlar.
Nizami işidir incə söz düzmək,
İncilər yaratmaq ona yarar tək.
Vurar bu naməyə elə naxışlar,
Bu naxış hər qəlbə işıq bağışlar.
Dostların qəlbinə nur damar ondan,
Düşmənin gözündən qaçsın hər zaman.
Bülbültək ötsə də düşmənin səsi,
Qəlbini dələn bir oxdur tənəsi.
Mən bu dastanıma vurarkən bəzək,
Öz ulu tanrımdan istədim kömək.
Versin dastanıma əzizlik, şöhrət,
Əziz tutanlara göstərin şəfqət.
Açsın bu namənə elə qol-qanad,
O faldan doğsun ən uğurlu həyat.
Ürəkdən sevinsin hər bir oxuyan,
Zövq alsın fikrimi dərindən duyan.
Hər qəlbi qırığa yeni can olsun.
Hər ağır dərdliyə əl tutan olsun.
Hər xəstə ürəyə göstərsin şəfqət,
Hər bağlı qapını açsın bu sən ət.
Oxumaq istərsə aciz bir nəfər,
Haqq olsun ona bu diləkdə rəhbər.
Əlinə alsa hər ümidsiz kimsə,

Hər dilək, hər ümid gülsün o şəxsə.
Hər dilək istədim, verdi, çox şükür,
Öz uca tanrıma etdim təşəkkür.
Bu namə mübarək olacaq, bışəkk.
Şahın məclisində olsa mübarək[65].

## NÜSRƏTƏDDİN ƏBUBƏKR PADŞAHİN TƏRİFİ

Yaquta bənzəyən suyu, saqi, dur,
Bu yaqut yağdıran qədəhə doludur.
Bu saxsı cama mey həyat axıdır,
Onun reyhanının öz torpağıdır[66].
Ey uca günəş, dur, bayrağını aç,
Ey xuraman bulud, müşkün atır saç.
Gurla, ey ildırım, şahın təblitək,
Dan dodağı kimi gül, gül, ey şimşək.
Sən də saf qətrəni yağdır, ey bulud,
Ey sədəf, qətrəni qucağında tut.
Ey inci, üzə çıx söz dənizindən,
Sultanın tacında get elə məskən[67].
Şah ki, yüksəlməni eyləyir arzu,
Sənə şanlı tacdır yolunun tozu.
İskəndər qurduğu dövlət, əzəmət,
Ona verilmişdir indi o şövkət.
Yerlərə, göylərə odur can verən,
Böyük cahangirdir, düşmən devirən.
Məğribdə mərdlikdə hökmü rəvandır,
Məşriqdə hünərlə o qədərxandır.
Cahan pəhləvandır, Nüsrətəddindir,
Hökmü düşmənlərə qılınc təkindir.
Düşmən son düşünən, ürəyində kin,
İstiqbal görəndir, ləqəbi Bışkin[68].
Qılınc sahibidir, tac verən şahdır,
Üç növbət vurandır, beşə pənahdır[69].
Atını Rüstəmlər üstünə sürər,
Həm taxtı bəzəyər, həm də tac verər.
Adətdir, dünyanın ulu şahları
Xəznəyə dəmirdən vurar açarı.





Bunun tək qılıncdan xəzinəsi var,
Dəmirdir xəznəsi, qızıldır açar.
Fərattək səmimi bir dostluğu var,
Nil kimi düşməni gizlində boğar[70].
Günəşə salsa o öz kölgəsini,
Suyuyla söndürər od çeşməsini.
Bir nəzər salsa o yeni hilalə,
Bədirlənib o da yetər kəmalə.
Onun bəxşişini sayan bir nəfər
Nə qədər ömrü var ona şükr edər.
Ona şükr etməklə nemətı artar,
Belə nemət verən, söylə, harda var?
Fələktək hər kəslə girsə meydana,
Atar qalxanını torpaqtək suya[71].
Döyüşdə buluddur, elə ki, kükrər
Dağların başını qılıncla sökər.
Meydanda açdığı hünərlər ki, var,
Nə Rüstəm göstərmiş, nə İsfəndiyar.
Bəxtiyar bir həyat başladı yerdə
Bu günəş anadan doğan səhərdə.
Altında ağ atı keçsə hər yerdən
Ayağı dəydiyi yer olur gülşən.
Hansı bir qalədə parlatmış yüyən,
Düyümü açmışdır pərgar xəttindən.
Hər şəhrə hünərlə qələbə çalmış,
Qarun sərvətini əlinə almış[72].
Bayrağı qələyə sancdığı zaman
Bəyinin başını asmış qaladan.
Hamıda insanlıq bir təbiətdir,
Bu başqa insandır, başqa xilqətdir.
Bildiyim ən adlı, sanlı kimsələr
Bu insanlığına təşəkkür edər.
Geniş ehsanı var, uca şövkətı,
Aldanmış dünyanın vəlinemətı.
Dirilsə bir ölü, qalxsa məzardan,
Şəhəri, bazarı tutar həyəcan.
Min ölü dirilsə ədalətilə,
Düşmənin ürəyi düzəlməz hələ.
İsatək nə qədər ölü diriltdi,
Bu gözəl əxlaqla xalqı qul etdi.

Gövhər mədənitək dağılan dünya
Bu günəşlə tapdı həyat və ziya.
Yer cəhənnəm idi - nə iş, nə tarla,
Bir cənnət olmuşdu bu gənc baharla.
Hər yeni nemətdən dağıdır xalqa,
Neməti çay kimi axıdır xalqa.
Yaxşılıq ardınca getsə hər zaman
Yaxşının adını unutmaz cahan.
Demirəm dənizdir uca şövkətin,
Bir mədən qədər var ağır qiymətin.
Şahın da sarayı günəş kimidir,
Məşriqdən məğribə uzatmış kəndir.
Cənnəti tutmuşsa tuba ağacı,
Hər budaq olmuşsa bir qəsrin tacı,
Ehsanı Şərq ilə Qərbə kök salmış,
Hər ev süfrəsindən bir nemət almış.
Adı Keyxosrovla olmuş bərabər,
Nəsəbi ucadır Keyqubad qədər.
Atını hansı bir səhraya çapmış,
Hər qanqal ətəyi əşrəfi tapmış.
Yer, xəzinəsindən bir çuval tikmiş,
Xeyri zər toplamış, yasəmən gümüş[73].
Hansı xəzinəni açıb axtarsan,
Onun sikkəsindən tapılar nişan.
Tac ilə başını ucaltmış fələk,
Başında bu tacı olsun mübarək.
Dünyanın Xızrısan, İskəndərisən,
Həm mülkün, həm həyat suyun var, əhsən.
Fəth etdin İskəndər kimi dünyanı,
Xızrtək doğrultdun yoldan azanı.
Hər şeyin ucadır uca adıntək,
Yalnız bir şeyin yox - tayın yox demək.
Aslanlar ovuna çıxdığın zaman
Bir oxla edərsən iki ov nişan.
Fillərlə döyüşdə atınca kəmənd,
Qənnucun şahını edərsən filbənd[74].
Şir gur ovlayanda sən olsan orda,
Nə ki şir, ovlarsan Bəhram Guru da.
Kim əyməz başını, əmr etsən: "Əyil!"
Hansı dövlətdir ki, əlində deyil?





Sən at oynadarkən, məğrur boyunlar
Yəhər qayışıtək yumşalar onlar.
İki şəxs əmindir, sən qəhr edərkən:
Bir sənə qul olan, bir boyun əyən.
Düşmən üzr istəsə sən bağışlarsan,
Bu mətin əhdinə qul olmuş dövran.
Dünyanın başına döndü ruzigar,
Altı şahdan qalmış altı yadigar.
Kəyümərs padşahdan tacıdır nişan,
Cəmşiddən bir qılınc, taxt Fəridundan,
Camı Keyxosrovdan qalmış yadigar,
Ulduzlar sirrini edər aşikar.
Ən parlaq bir güzgü, şəffaf bir gövhər
Quraraq, yadigar qoymuş İskəndər.
Ləldən düzülən o parlaq üzük,
Süleyman möhrüylə çil-çıraq üzük.
Saydığım altı şey məxsusdur sana,
Adında altı hərf şahiddir buna[75].
Səndə bundan başqa altı xislət var,
Bunlarla olarsan daim bəxtiyar.
Birinci - açıqdır xəzinən hər an,
İstəməsələr də edərsən ehsan.
İkinci - kərəmin hesaba gəlməz,
Haqqını bilәndən almazsan əvəz.
Üçüncü - şəfqətlə alarsan ürək,
Hər zaman məzluma edərsən kömək.
Dördüncü - taxmısan göylərə bayraq,
Bir ordu yenərsən təklikdə ancaq.
Beşinci - günahkar olsa peşiman,
Suçundan keçərsən onun hər zaman.
Altıncı - mətindir verdiyin qərar,
Unudan deyilsən, gözəl vəfan var.
Bəzəyindir sənin bu altı cəhət,
Səndən ayrılmasın bu altı xislət.
İki tərlan gərək ölkə qurmaqda,
Xəzinə yığmaqda, şikar vurmaqda.
İki ilan gərək sənə, onlardan:
Biri dövlət, biri xəzinə qoruyan.

## PADŞAHA XİTAB

Yeddi göy altında, ey dünya şahı,
Beşinci ölkənin sənsən pənahı[76]
Əmrində bu qədər ölkə, şəhər var,
Qapında sütundur saraylı şahlar.
Hər gecə göylərdə dolanar qəmər,
Sənin çırağına gəlib yağ tökər.
Günəş də başında tacı, hər səhər
Taxtının önündə köləlik edər.
Sənə bu şahlığı bəxş edən kimsə
Vermişdir ürəyin nə istəmişsə.
Şahlıq et, verilmiş sənə ölkələr,
Kömək ol, xalqlara ədalət göstər.
Çibin qanadını qırmasın tərlan,
Fil də qarışqaya verməsin ziyan.
Allaha min şükür, min şükür, əlbət,
Şahda yazdığımdan çoxdur ədalət.
Şahdan bir diləyim var mənim ancaq,
Mənim dastanıma nəzər salaraq,
Sönük bir əfsanə verərsə artıq,
Üstünə nə kölgə salsın, nə işıq.
Rast gəlsə dalğalı incə, gövhərə,
Başımı ucaltsın uca göylərə.
Bu "Şərəfnamə"də dünya sirrindən
Çox xəznə açarı gizlətmişəm mən.
Hər kimin əlində olsa bu açar,
Bir çox xəzinələr, tilsimlər açar,
O gizli xəznəni aça bilməsə,
Verər qızıl açar şənlik o şəxsə[77].
Bilirsən, bu yarım yonulmuş gövhər
Qoynunda gizlətmiş nə xəzinələr?
Bu gövhər yonmağım səninlə şəndir,
Afərin deməyim sənə səndəndir.
Ağıl ki, göyləri endirər yerə,
Afərin söylər bu afərinlərə.
Şahdan alınmışdır belə bir əmr:
"Adıma bir naxış bağla, ey şair!"





Şahın sözlərindən ilham alaraq,
Ağıla, şüura bərk sarılaraq,
Vurum bu gəlinə elə yaraşıq,
Şahın məclisini bürüsün işıq!
Ona bu şux gəlin olsun bir kəniz,
Məclisdə, dünyada tutulsun əziz.
Dünyanı parladan çıraq nə qədər
Yaxını, uzağı nurilə bəzər.
Dünyanı parlatsın şahın gül bağı,
Gündüz məşəl olsun, gecə çırağı.
Ağzı qarğa kimi cırılsın gərək,
Yansın düşmən dili çıraq dilitək.
Uca dövlət kimi qonsun eyvana,
Nizami afərin oxusun sana.

## DASTANIN XÜLASƏSİ VƏ İSKƏNDƏRİN CAHANGİRLİK TARİXİ

Saqi, gəl ruhumu şənlədən mey ver!
Xumarı atmağa səhərkən hey ver!
Bu səhər şərabı kövsərə dəyər,
Halaldır içsəm o məhşərə qədər.
Yaxşıyla, yamanla dolmuş ruzigar,
O yaxşı-yamandan boynunda çox var.
Hər gecə, gündüz bu niligun pərdə
Min fitnə, min oyun açar hər yerdə.
Məndən də bir oyun baş versə, inan,
Onu da doğurmuş bu köhnə dövran.
Xəyaltək incəldim çərx hiyləsindən,
Necə oynamayım xəyal ilə mən?
İstəyim: pərdəni bütün boşaltmaq,
Bir cadu xəyalı işlətmək ancaq.
Bir xəyal yaradım bu naxışdan mən,
Gəlməsin cadugər, canbaz əlindən.
Mən elə başladım bu şux dastanı,
Coşdurar sazımın səsi dünyanı.
Ən doğru sözlər ki, oyadır maraq,
Tarixdən onları bir-bir alaraq

Düzdüm dastanıma, əsər yaratdım,
Ağla sığmayanı büsbütün atdım.
Seçdim hər düzümdən bir inci, gövhər,
Vurdum bu gərdəyə yaraşıq, zivər.
Bərk təməl üstündə qurdum bir bina
Ki, ziyan dəyməsin divarlarına.
Təqdimi, təxiri tutmayın nöqsan,
Nöqsana məcburdur hər tarix yazan.
Bu Çin ipəyinin naxış evində
Maninin fırçası düşmüşdür bəndə[78].
Dastanı düzərkən fikrim açıqdı,
Söz səlis olsa da, yol dolaşıqdı.
İskəndər haqqında heç bir əsərdə
Məlumat görmədim yığcam bir yerdə.
Sözlərlə dolmuşdu xəzinə içi,
Ancaq hər nüsxə bir dağınıq inci.
Hər köhnə nüsxədən əsas alaraq,
Onu öz şerimlə bəzədim ancaq.
Ən qədim tarixi əsərlərdən mən,
Yəhudi, nəsrani, pəhləvilərdən
Ən incə sözləri əlimə saldım,
Qabığı ataraq, məğzini aldım.
Muxtəlif dillərdən yığdım çox sözlər,
Bunlardan düzüldü yazdığım əsər.
Saydığım dilləri ətraflı bilən
Saxlar öz dilini mənə töhmətdən.
Hansı bir pərdədə doğru söz gördüm,
O sözün telini şerimlə hördüm.
Bu işdə həqiqət arasan bir az,
Nəzmdə həqiqət aramaq olmaz.
Şerimdən atsaydım bəzəkli donu,
Azacıq zəhmətlə yazsaydım onu,
Bu böyük fatehin sərgüzəştindən
Bir vərəq yazmaqla bitirərdim mən.
Dünyanı dolaşan böyük İskəndər
Yorulmaq bilmədən edirdi səfər.
Dünyanı dolaşıb dörd yanı gəzdi,
Bilmədiyi mülkü fəth eyləməzdi.





Hansı bir dövlətə verdi nəhayət,
Kəyan adətinə göstərdi hörmət.
Yalnız zərdüştlüyü qəbul etməmiş,
Başqa adətlərə etdi pərəstiş.
Dünyada ilk əvvəl o zinət qurdu,
Yunanda sikkəni qızıldan vurdu.
İskəndər əmrilə vermiş hər zərgər,
Qızılın suyuyla gümüşə zivər.
Farscadan hər əsər keçmiş əlinə,
Tərcümə etdirmiş yunan dilinə.
Qapıda üç növbət təbil vurdurmaq
İskəndər dövründən qalmışdır ancaq.
Ulduz güzgüsüylə o böyük qeysər
Qaranlıq içindən çıxardı gövhər[79].
Sildi şurişləri köhnə dünyadan.
Taxt aldı, tac aldı qoca Daradan.
Hindin sövdasını, rus səfrasını
Silərək parlatdı şən dünyasını.
Rəyi bir güzgüdür çinlilər üçün.
Odur Keyxosrovun taxtına üstün.
Ömründən keçirkən tam iyirmi il
Şahlığa ucadan vurdurdu təbil.
İyirmi yeddiyə çatınca yaşı
Peyğəmbər olaraq, ucaldı başı.
İskəndər o gün ki peyğəmbər oldu,
Onun tarixinə naxış vuruldu.
Dinə yol göstərən bir hikmət oldu,
Dünyada mübarək bir dövlət oldu.
Din üçün etdi çox dəlillər icad,
Bu dünya üzünü elədi abad.
Dünyanı gəzərkən döndü hər yana,
Elədi çox böyük şəhərlər bina.
Hinddən başlayaraq Yunana qədər -
Hər yerdə tikdirdi böyük şəhərlər.
Səmərqənd şəhrinə o verdi zivər,
Cəndi də tikdirmiş böyük İskəndər.
Həri də yadigar qalmışdır ondan,
Varmıdır belə bir məmləkət quran?

Dərbəndi deyirlər İskəndər qurdu,
Əqliylə o şəhrə böyük səd vurdu.
Bulqar şəhrini o etdi bərqərar,
O şəhrin adıdır əslində Bün-qar[80].
Bağlayıb dağları biri-birinə,
Yəcuc hasarını o çəkdi yenə.
Çox bina salmışdır bunlardan başqa,
Onları saymaqla çatmaz ki, başa.
Pak olan o vücud, ulu tacidar
Yerləri təqsimə verincə qərar,
Dünyaya gəlmədən əvvəl xaçpərəst,
Çəkdi bu dünyada xaç kimi bir xətt[81].
Həmin bu dördbucaq ətləsi xətlə
Həndəsi ölçünü keçirdi ələ[82].
Dörd bucaq üstünə bir də artırdı,
Bu doqquz fələyə, beş növbət vurdu[83]
Bir mıxı uzanmış Şimali qütbə,
Bir kökü uzanıb getmiş Cənubə.
İpinin bir ucu Məşriqə çatmış,
O biri Məğribə qol-qanad atmış.
Dünyada bu endə, uzunda böylə,
Uca bir barigah kimdə var, söylə.
O gün ki, istədi gəzsin dünyanı,
Ölçməyə başladı əvvəl hər yanı.
Hər bir məsahətdən, mərhələlərdən
Qalmadı bir qarış yer ölçülməyən.
Bu işdə hesabsız yerölçən vardı,
Yüzlərcə katiblər ölçüb yazardı.
Uzun iplər ilə ölçüldü çöllər,
Hesaba alındı bütün mənzillər.
Aldığı quruda o saray qurdu,
Mənzil-mənzil yolu ölçüyə vurdu.
Mavi dənizdən də edərkən səfər,
Onu da ölçüyə vurdu İskəndər.
Dənizdə yol ölçən iki gəmi var,
Uzun bir ip ilə bağlanmış onlar.
Birisi yerində salardı ləngər,
O biri ip boyu irəli gedər.





Sonra yol gedənə ləngər salaraq
Ləngərli gəmiyə taxardı ayaq.
Gah onu, gah bunu belə sürürdü,
Qorxmadan dənizi yarıb ölçürdü.
Belə bir yol ilə bu mühəndislər
Ölçürdü sahildən sahilə qədər.
Dünyadan kədəri şah silə-silə
Ölçüyə aldı bu həndəsə ilə.
Yerləri, yolları bu İskəndərin
Öz tədbir ölçüsü etmişdir təyin.
O, rübi-məskunu etdi aşikar[84],
Yoxsa bu yerlərə başqa kim çatar?
İskəndər hər yerə atını çapdı,
O yerlər şənləndi, səadət tapdı.
Dağlara, çöllərə tapdı min çarə,
Ölümün əlində qaldı biçarə.
Tarixdə nə varsa İskəndər şahdan,-
Yalnız bunlar oldu işə yarayan.
Artıq mən nə yazsam bu şən dastanda,
Az-çox, artıq-əskik olacaq onda.
Hər tarix şer ilə alsa yaraşıq,
Şübhəsiz, olacaq bir az dolaşıq.
Çünki incəlikdir işim, sənətim,
Haqlıyam, bu işdə çıxsa qələtim.
Doğru görmədiyim sözlərdən qaçdım,
Ondan üz çevirib başqa yol açdım.
Düzdüm bu tarixdən elə bir dastan,
Könlündə bir sevinc duysun oxuyan.
Çox incəlik gəzsən, axtarsan, yəni
Yalana aparar sözün yüyəni.
Yazdığım sözlərə verməsəm zivər,
Yenilik verməz o köhnə nəğmələr.
Qələmə gərəkdir elə söz almaq,
Şüurdan, ağıldan olmasın uzaq.
Parlaq inci kimi düzülən sözlər
Ağıla sığmazsa yalana bənzər.
Doğruya azacıq bənzəyən yalan
Yaxşıdır yalana bənzər doğrudan.

Nizami, yubanma, yoldaşlar getdi,
Sən qaldın, qəm qaldı, sirdaşlar getdi.
Yeddi ölkə şahı - getdi İskəndər,
İskəndər qalmadı, qalmaz bir nəfər.
Bu çayın başında tək içmə şərab,
Köhnə dostlarını sən axtarıb tap.
Gəlsələr, nuş olsun, əldə qədəh tut,
Nizami, yoxsa bu hesabı unut.

## BU ƏSƏRİN YAZILMASININ SƏBƏBİ

Aç dehqan küpünü, sən ey saqi, dur,
Badəmə şəkərdən şirin mey doldur.
Vermə o meydan ki, din etmiş haram,
Bir mey ver ki, ondan din olmuş tamam.
Ey bağban, şənlik qur, qəm-qüssədən qaç,
Bağına gül gəldi, dur qapını aç.
Nizami şəhərdən gəlmişdir bağa,
İpəkdən bəzək vur bostana, tağa.
Bənövşə zülfündən bükümləri at,
O sərxoş nərgizi yuxudan oyat.
Qönçənin dodağı hələ süd qoxur,
Qızılgül ağzından ona ətir vur.
Qoy sərvin qaməti göyə yüksəlsin,
Qumruya xəbər ver, bahardır, gəlsin.
Müjdə ver, nəğməyə başlasın bülbül,
Beşiyində gəldi meyxanayə gül.
Sula çöl-çəməni, uçsun toz, qubar,
Laciverd rəngini yuduqca parlar.
Lalənin qəlbində coşan qan artır,
Torpaqla ört onu, qanını yatır.
Nəstərən saçından ağ tükləri at,
Bidmişk kölgəsilə telini qaralt.
Gülnar dodağını bulaşdır meyə,
Xeyri gül torpağı zərlə bəzəyə.
Səmənə salam ver ərğəvan güldən,
Suvar bağ-çəməni, canlansın gülşən.





O körpə güllərə göstər məhəbbət,
Nazını çəkərək eyləmə qəflət.
Mən kimi sövdası aşıb-daşandan
Salam ver gülzara girdiyin zaman.
Hava çox ılıqdır, gözəldir bostan,
Dostların qəlbi də xoşlanır bundan.
Vermişdir ağaclar bağa yüz bəzək,
Parlaq bir çıraqdır hər gül, hər çiçək.
Ey bağban, xəbər ver o susan quşa:
Ötərək başlasın yeni uçuşa.
Bahardır, bir daha nalə etsin çəng,
Gətirsin qəlbimi rəqsə o ahəng.
O dilbər zülfündən bir zəncir yarat,
Zənciri yenidən, gəl, boynuma at.
Gözəl dəstələr tut yaşıl reyhandan,
Saç sərvin başına, şənlənsin hər an.
Bahar çiçəyindən dağıt arxlara,
Gümüşə bənzəyir ağ çiçəkpara.
Hər gölün, çeşmənin ətəklərinə
Süsəndən ipək bir xalça sal yenə.
Şahanə məclisdə sən, ey saqi, dur,
Şahanə bir meylə badəmi doldur.
Dur, saqi, alışdım şərab içməyə,
Atəşdən yanıram, ver bu təşnəyə.
O köhnə dostları yad edim bu gün,
Qalmamış bir nəfər, köçmüşdür bütün.
Bu dövran da gedər, qalmaz o bizə,
Gələnlər içərlər xatirəmizə.
Bostanın belə bir gözəl çağında
Oturdum uca bir sərv ayağında.
Çinar kölgəsindən, gül qoxusundan
İlham aldı bülbül, başladı dastan.
Bir gəlin gül üçün sallandı bağa,
Gül üzü bənzərdi işıq - çırağa.
Saçları tökülmüş topuğa qədər,
Üzü gül səpərdi, dodağı şəkər.
Şehli gül üzündən kam verdi mənə,
İçi meylə dolu cam verdi mənə.

Dedi: "Al, qəlbində nə varsa unut,
Padişah eşqinə əldə qədəh tut."
Oturdum sınanmış kəslərlə hər an,
Böyüklər adından yazdım bir dastan.
Beynimin, qanımın çeşmələrindən
Bu qədər incə söz sıxıb süzdüm mən.
Doymadım, ilhamım yenə də qaynar,
Qılıncım kəskindir, hələ gücüm var.
Nə qədər dəyərli xəzinə qurdum,
Hər birində yeni nüktələr vurdum.
Yorulmaq bilmədən gündüz və gecə
"Məxzənül əsrar"ı yazdım əvvəlcə.
İncəlik, şirinlik yığaraq ondan,
"Xosrov və Şirin"çin düzdüm bir dastan.
Sonra başqa yerdə çadırı vurdum,
"Leyli və Məcnun"un eşqini qurdum.
Bitirdim dastanı, bir nəş ə tapdım,
Atımı "Həft peykər" üstünə çapdım.
İndi söz mülkündə büsat quraram,
İskəndər dövründən təbil vuraram.
Yazaram mən onun şan-şövkətindən,
Taxtının, tacının əzəmətindən.
Ölüb getmişsə də, dirildim onu,
Verim axtardığı həyat suyunu.
İskəndər bir böyük yol təqib etdi,
Dirilik suyunun dalınca getdi.
Əbədi qalmaqçın həyat suyundan,
Çox gəzdi, dolaşdı heç yorulmadan.
Dirilik suyunun olmadı sonu,
Ancaq indi tapdı həyat suyunu[85].
Sözlər padşahının bir məsəli var:
Nə gözəl söyləmiş: "Axtaran tapar."
Nizami, içərkən mey İskəndərlə,
Bəxtiyar olmaqçın ədəbi gözlə!
Xızır bu süfrəndə olmuş həmsüfrən,
Yetmiş yeddi suda ağzını yu sən![86]





## DASTANIN BAŞLANĞICI

Saqi, dur, gətir o həyat suyunu!
İskəndər şövkətli şaha ver onu.
Şahın dövlətini öpsün o badən,
Odur İskəndərin irsini yeyən.
Şahnamə yazanlar saçaraq bilik,
Vermiş söz nəzminə belə yenilik:
Yunan ölkəsinin padşahlarından
Vardı bir gənc dövlət, böyük hökmüran,
Şöhrətli şah idi, adı Feyləqus,
İtaət edərdi ona rum və rus.
Yunanıstan idi onun məskəni,
Makedoniyaydı doğma vətəni.
Qanunlar qoyardı yeni və parlaq,
Ulu babasıydı Eys ibn-İshaq.
Ədalət o qədər yaxınmış ona,
Qurdları bağlarmış qoyun buduna.
Zülmün boğazını elə sıxmışdı,
Dara həsədindən rəqib çıxmışdı.
Üstün olmaq üçün qılıncı, tacı,
Bir elçi göndərdi, alsın xəracı.
Ağıl sahibiydi rumlu hökmüran,
Xəracı göndərdi, olmadı düşman.
Taleyi yar olan məsud kimsəyə
Kim cəsarət edər, düşmənəm deyə?
Bəxşişlər göndərdi böyük dərbara,
Düşmənlik yolundan əl çəkdi Dara-
Rum şahı oldu bu bəxşişdən çox şən,
Mumunu qorudu yanar atəşdən[87].
İskəndər başlarkən fəthə hər yeri,
Döndü birdən-birə çərxin işləri.
Daraya nə dövlət qoydu, nə dövran,
Süngüsü keçirdi çaxmaq daşından.
Bu dastan haqqında rəvayət çoxdur,
Hər kəsi dinlərəm, inadım yoxdur.
Belə nəql edir bu vəqəni rumlar:
Bir qadın var imiş çox yoxsul, dindar,

İkicanlı idi, tapmadı çarə,
Yurdundan, ərindən düşdü avarə.
Doğmağın zamanı yetişdi artıq,
Kəsdi taqətini ikicanlılıq.
Doğarkən can verdi bir xərabədə,
Ölürkən körpəni andı yenə də:
"Məndən sonra səni kim bəsləyəcək?
Hansı bir canavar səni yeyəcək?"
O zənn etməyirdi ki, pərvərdigar
Bir zaman edəcək onu tacidar.
Nə qədər xəzinə güləcək ona,
İqbal qonacaqdır şən qucağına.
Həsrətlər içində qadın verdi can,
Köməksiz uşağa yar oldu yəzdan.
Şüurla, hünərlə işlətdi qafa,
Dünyanı fəth etdi o Qafdan-Qafa.
Feyləqus çıxarkən ov üçün düzə,
Qadın ölən yerlə gəldi üz-üzə.
Gördü bir qadındır yurdsuz, yuvasız,
Başının üstündə bir körpə yalqız.
Sorur barmağını o körpə uşaq,
Ana həsrətiylə dişləyir barmaq.
Nökərlərə əmr verdi tacidar,
Qadının dəfninə məşğul oldular.
Kimsəsiz körpəni götürdü yoldan,
Daldı bu heyrətli işə bir zaman,
Böyütdü, bəslədi, verdi tərbiyə,
Vəliəhd eylədi "Oğlumdur" deyə.
Zərdüştilərdə var başqa rəvayət,
Verir İskəndəri Daraya nisbət.
Yurdum tarixləri mən bir-birinə,
Baxdım Firdovsinin öz əsərinə.
Hər iki rəvayət məncə pozuqdur,
Uydurma sözlərdir, həqiqət yoxdur.
Doğrusu budur ki, bilir hər diyar,
Feyləqus oğludur böyük tacidar.
Bunlarda həqiqət görmədim bir az,
Tarixçi bunları qələmə almaz.





Ən yaxşı bir qoca rəvayət edir,
O köhnə şahlardan hekayət edir:
Feyləqus qəsrində bir gözəl varmış,
Bəzəkli gəlintək azad yaşarmış.
Baxışı can alan, qaməti büland,
Qaşları kamandı, saçları kəmənd.
Sanki bir sərv imiş, yetirmiş çəmən,
Telləri bənövşə, çöhrəsi səmən.
Camalı parlaq bir günəşdən təmiz,
O süzgün gözləri qəmzəli nərgiz!
Qıvrıcıq saçları qara bir ənbər,
Saray bu dilbərlə olmuş müəttər.
Rum şahı vurulmuş ayüzlü qıza,
Dilinin əzbəri parlaq ulduza.
Bir gecə bağrına basdı hökmüran,
Şahın xurmasından bar verdi fidan.
Neysan buludundan sədəf tutdu bar,
Ən parlaq bir inci oldu aşikar.
Keçdi bu vəqədən doqquz ay ancaq,
Ananın bətnində tərpəndi uşaq.
Padşah əmr etdi ki, münəccimlər
Baxıb ulduzlara versinlər xəbər.
Bir xəbər versinlər bu gizlin işdən,
Rahatlıq versinlər bu tərpənişdən.
Bilikli münəccim başladı işə,
Baxdılar fələkdə olan gərdişə.
Göyləri seyr üçün məclis düzəltdi,
Ulduz tərəzisi ortaya gəldi,
Taleyi göründü Əsəd bürcündən[58],
Düşmənlər kor oldu onun gücündən.
Günəş yaxınlaşdı o gün Həmələ,
Gedirdi elmdən çatsın əmələ[59].
Ütarid və Covza qonmuş bir yerə,
Sovrda məskən etmiş Ay ilə Zöhrə.
Qövsi də Müştəri bəzəmiş gözəl,
Mizanın bürcündə oynardı Zühəl.
Altıncı xanəni tutmuşdu Bəhram,
Xidmət göstərməyə olmuşdu qulam.

Taleyi göründü nurdan da parlaq,
Nə deyim, o yaman gözlərdən iraq.
Belə xoş fal ilə dünyaya gəldi,
O bağda belə bir fidan yüksəldi.
Təqvimdən bəxtini təyin etdilər,
Qoyuldu uşağın adı İskəndər.
Bu yeddi ülkərdən oldu aşikar,
Açarı verəcək ona ruzigar.
Münəccim tale dən verincə xəbər,
Feyləqus şükr etdi, silindi kədər.
Bəxtiyar çocuğa etdi məhəbbət,
Taxtına oturdu, payladı xələt.
Artıq yol vermədi qəmə, kədərə,
Cəvahir payladı istəyənlərə.
O müşk ətirlinin güləndə baxtı
Meyi də, müşkü də seltək axıtdı.
O sərvin budağı başlandı nazla,
Turactək səkərək səsləndi nazla.
Meydan axtarırdı beşikdə ikən,
Yəhərə atıldı öz beşiyindən.
Dayədən istədi ox ilə kaman,
Kağızı, ipəyi hey aldı nişan.
Böyüdü, öyrəndi qılınc vurmağı,
Qızmış aslanlara qarşı durmağı.
At minmək zövqündən ləzzət alınca
Düşdü şəhriyarlıq, şahlıq dalınca.

## İSKƏNDƏRİN TƏLİM ALMASI

Ey saqi, reyhandan çəkilmiş mey ver,
Cənnəti yad etdim, dur, peyapey ver!
Abad olsun gəmim o badələrdən,
Cənnətə düşərəm qərq olsam da mən.
Nə qədər məsuddur şən həyat quran,
Tamah süfrəsindən az bir şey uman,
Malı olsa belə, kifayət qədər,
Yenə iş adamı çalışar, işlər.
Naz-nemət içində rahatlıq tapar,





Tələsməz, atını astadan çapar.
Nə həddindən artıq paylar malını,
Nə də xəsisliklə pozar halını.
Çətinlik çox xəsis olmaqdan doğar,
Qapını qırsanız hədsiz odun var.
Çox yaşa, ömürdən faydalan özün,
Çalış özgəyə də ziyan dəyməsin.
Tarixin yığılmış tumarlığından
Keçmişi belə nəql edir bir dehqan:
Elə ki, Feyləqus təzə gəlintək
Vurdu bu dünyanın mülkünə bəzək.
Ağıllı övladla ata fəxr edər,
Çünki mübarəkdir seçilmiş gövhər.
Dünyada ataya varmıdır, gerçək,
Ağıllı oğuldan başqa bir istək.
Oturtdu öyrənsin ədəblə hünər,
Günəş eylər daşı qiymətli gövhər.
Niqumaş alimdi, biliklə dolu,
Alimin oğluydu həkim Ərəstu.
Təlim işlərində çəkdi çox əmək,
Hikmətlər öyrətdi ona sevərək.
Şahanə tərbiyə, hünər, nəzakət
Ağıla nur verir, ürəyə qüvvət.
Hər əqlə sığışan hünər, bilikdən
Bir məna çıxarır mənanı bilən.
Ulduzlar bəzəyən kimi göyləri
Bəzədi pak olan yeni gövhəri.
Çatdırdı onu hər gizlin biliyə,
Hansı bir gənc almış belə tərbiyə?
Şahzadə illərlə çox çalışdı, çox,
Qulağı elm aldı, başqa heç nə yox.
Öz ağlı, zəkası olunca rəhbər,
Tapırdı ən incə, mənalı sözlər.
Hər incə mənanı edərkən bəyan,
Sözləri su kimi olurdu rəvan.
Həmdərsi Ərəstu, bir qardaş deyə,
Ürəkdən bağlıydı bu şahzadəyə.
Ərəstu aldıqca bilik atadan,

Ona öyrədirdi hər an, hər zaman.
Yəqindı bılıklı həkim ustadə
Tacıdar olacaq bir gün şahzadə.
Onun təlıminə verdı çox diqqət,
Kışını şad edər qorunsa sərvət.
Bəxtını oxudu parlaq alnından,
Verdı oğluna da ondan bır ünvan[80].
Tale xıdmətındə duran zamanda,
Söz qaşı möhrünü vuran zamanda
Oğlunu tapşırdı gənc şahzadəyə,
And verdı, söz aldı: "Peyman ver, - deyir,
Məktəbdən meydana sən at sürərkən,
Şahanə başını göydə görərkən,
Başını əyərkən köhnə dünyanın,
Hər səmtə gedərkən hökmün, fərmanın,
Taxtını tacınla məsud edərsən,
Xərac göndərərlər yeddi kışvərdən.
Dünyaya şövkətlə verərsən fərman,
Padışah olarsan uzun bır zaman.
Bu dərsı, təlımı tut xatırındə,
Qızıla, gümüşə çox olma bəndə!
O zaman oğlumdan götürmə nəzər,
Haqqıma, sözümə bır hörmət göstər.
Onunla et çətın ışdə məşvərət,
Qılıncdan kəskındır gözəl məsləhət.
Səndə dövlət vardır, onda da hünər,
Hünərlə dövlət bır çəkıyə girər.
Hər yerdə hünərə verılmış qiymət,
O yerdə gün-gündən ucalmış dövlət.
Hər yerdə şərəflı bır dövlət vardır,
Ucalar fikrındən ucalanlardır.
Ayda öz taxtını qurmaq ıstəyən,
Gərəkdır yüksəlsın bu pılləlлərdən".
Şahzadə söz verdı öz ustadına:
"Hər əmrın qəbuldur, - söylədi ona, -
Taxtımla, tacımla olsam padışah,
Ərəstu vəzırım olacaq, bıllah!
Sözündən, fikrindən dönməz İskəndər,





Onun hər əmrınə bağlaram kəmər."
Elə ki, taleyi oldu ona yar,
İskəndər sözündə qaldı bərqərar.
Ustadı bılirdi: bir gün bu uşaq
Dünya şahlarına fərman yazacaq.
Bir şəkil çəkdi o, həndəsi hərfdən,
Qalibi, məğlubu etdı müəyyən.
Dedı: "Al, bır qəza üz versə sana,
Hərfi say, həm düşmən, həm öz adına.
Adın dairədə qalsa müzəffər,
Əmin ol bəxtınə, sənındır zəfər.
Bu sayda üstünlük göstərsə düşman,
O qalıb kişidən çəkın hər zaman."
İskəndər qocadan o şəkli aldı,
Bu faydalı ışdən sevıncə daldı.
Yazanda həndəsi hərfi İskəndər,
Hər zaman zəfərdən tutardı xəbər.
Əqliylə bəxtiyar yaşardı hər an,
Onun hər elmındən qaynardı qazan.
Tədbırli, bilicı olmaqla yenə
Baş əydi bilicı şəxsin fikrinə.
Alımlər sözünü tutaraq getdı,
Əqliylə özünü bəxtıyar etdı.
Ustadın oğlu da alım bır kəsdı,
Onunla həm yaşıd, həm də həmdərsdı.
Şahzadə daıma ona mehrıban,
O da şahzadədən ayrılmaz bır an.
Ərəstu razılıq verməzsə ışə,
İskəndər bır quş da taxmazdı şışə.
O tədbır vermədən tutmazdı bır ış.
Hər ışdə alardı ondan göstərış.
Bu çarxın pərgarı döndü çox zaman.
Dünya çox seyr etdı dağdan, səhradan.
Feyləqus dünyanı tərk etdı daha,
Taxtını tapşırdı gənc padışaha.
Gəl, qorx bu dünyanın fitnə, felındən.
Qurtar öz canını onun əlindən.
Ağacdır, dörd kökü, altı böyrü var,

Çoxunu boğmuşdur bu qorxulu dar[92].
Şiddətli küləklər qopduğu zaman
Düşər yarpağımız bir-bir ağacdan.
Bu bağda əbədi yaşamaz bir kəs,
Hər gələn burada çəkər bir nəfəs.
Yetişər bu bağda hər gün bir nobər,
Birisi gəlirkən o biri gedər.
Dünyadan gedərsən istər-istəməz,
Bu tədbir, bu təlaş bir şeyə dəyməz.
Bu dünya mülkündə yox belə bazar
Varını özülə alsın tamahkar.
Dünya salmış tora, çünki borclusan,
Borcunu tez ol ver, qurtul bu tordan.
Nalbəndlə palançı eşşəyə bir gün:
- Nal, palan pulunu ver,- dedi,- bütün,
Topal ayağından, yağır dalından
Nalını, palanı atdı o heyvan.
Eşşək öz borcundan olunca azad,
Olduqca dincəldi, qəlbi oldu şad.
Sən də, ey tozlara bulaşmış insan,
Borcunu ver, qurtul bu toz-torpaqdan.

## İSKƏNDƏRİN TAXTA ÇIXMASI

Ey saqi, dur məni qurtar mənlikdən,
İşıqlı badəndən işıqlanım mən.
Bir mey ki, dağıdar qəmi, kədəri,
Sağaldar mumyatək bu xəstələri.
Əlində tərəzi mahir söz ölçən
Saxta əşrəfini saldı rövnəqdən[93].
Saxta olduğunu artıq bilincə,
Elə bir sikkəni vermədim xərcə.
Hər hərfin üstünə barmaq bassam mən,
Tapılmaz üstündə qələm işlədən[94].
Elə ki, gücləndi arxam və adım,
Kimsənin hərfinə barmaq basmadım.
Yamanlıq görmədi məndən bir insan,





Mənim də düşmənim vardır hər zaman.
Tutduğum yol deyil, zəhər içməkdir,
Hünər aramaqdır, eybi örtməkdir.
Düzlükdə əvvəldən göstərdim hünər,
Qələmi düz atdım sonuna qədər.
Elə bir dabbaqlıq etdim bu günə,
Mətanət göstərsin hər ağır günə[95].
O böyük tanrıdan budur diləyim:
Bir an da bu doğru yoldan dönməyim.
Sizə nəql etdiyim həmin rəvayət
Usta bir naqqaşın işidir əlbət.
Elə ki, Rum şahı taxta oturdu,
Dünyaya mum kimi bir naxış vurdu,
Bütün ölkələrə ədli səs-saldı,
Rum taxtı onunla yeni rəng aldı.
Atadan gördüyü rəsmı, ayini
Seçərək saxladı bəyəndiyini.
Köhnə adətləri möhkəm saxladı,
Keçmiş qanunları bərk qucaqladı.
Daraya xəracı verirdi yenə,
Ölkədə hakimdi köhnə ən ənə.
Feyləqus əmrində olan hər diyar
Onun da əmrinə boyun qoydular.
Dostluqda atadan daha da mətin,
Düşmənin məhvində qılıncı kəskin.
İgidlər qorxardı: "Güclüdür", deyə,
Onunla girməzdi bir tərəziyə.
Onda ki, qolunun gücün yoxlardı,
Aslan qulağına düyün vurardı.
Əlində nə qədər süst olsa kaman,
Bir oxa bir nəfər edərdi qurban.
Maral, ceyran ovlar həddindən kənar,
Ovlaqda aslanı edərdi şikar.
Hər mərdə, igidə o üstün gəldi,
Bilici kəslərdən daha yüksəldi.
Xətti, gül üzünə xoş qələm vurdu,
Rəna bir müşkdən xoş cədvəl qurdu.
O müşkin cədvəli xəttinə fələk

Həbəş səvadından vurmuşdu bəzək.
Gördü ki, əlində acizdir cahan,
Cahangir olmağa oxudu meydan.
Ağılı, qüvvəti güldü baxtına,
Bunlarla oturdu şahlıq taxtına.
Hər işdə istərkən qazansın şöhrət,
Fələk də qoluna verərdi qüvvət.
O yaşıl sərv ilə Rumun torpağı
Reyhantək bəzədi, şənləndi bağı[96].
Hər evdə bir surət çəkildi ondan,
Hər ölkə adına düzdü bir dastan.
Gah açdı sirrini əncümənlərdə,
Gah ulduz sirrindən götürdü pərdə.
Gizlində bilənlər yoluyla getdi,
Zahirdə gənclərlə içib keyf etdi.
İnsanın fikrinə sığmayan qədər
Hamıya yaxşılıq etdi İskəndər.
Kimsənin qəlbini o incitməzdi,
Ədalət xəttindən uzaq getməzdi.
Bütün tacirlərdən o, bac almadı,
Ölkədə kimsədən xərac almadı.
Dehqan vergisinə çəkərək qələm,
Sərmayəsizlərdən almadı dirhəm.
Zər saçdı hər yeri abad edərək,
Qırdı tikanları, əkdi gül-çiçək.
Ələnə keçirdi bütün dünyanı,
Ətri tutdu Misrı, Həbəşistanı.
İki açıq əli günəşə bənzər,
Biri qılınc vurar, biri tac verər.
İki gözlü gərək bütün çəkilər,
Birində daş olar, birində gövhər.
Hər işdə taleyə rəğbət göstərir,
Qızılla qızıldır, dəmirlə dəmir.
Ədli, səxavəti cahanı sardı,
Hər kəs Rum mülkünə həsəd apardı.
Ərəstu vəzirdi uca dərgaha,
Hər yaxşı-yamanda məhrəmdi şaha.
Tökdü İskəndərə hər işdə tədbir,





Az zaman keçmədən oldu cahangir.
Elə padşahla, belə vəzirlə
Bu dünya intizam almazmı belə?
Dünyanı fəth etdi bacarıq, hikmət,
Vəzirin rəyindən qazandı şövkət.
Məlikşah da, Mahmud da Nuşirəvan,
Dünya şahlarından bac-xərac alan,
Öz vəzirlərindən öyüd aldılar,
Onunla dünyaya zəfər çaldılar.
Bizim şahımız da düşmənə bu gün
Vəzirin rəyilə olmuşdur üstün.
Bizim ayağımız süst olsa hərgah,
Zərər yox, ancaq ki, süst olmasın şah.
Padşahın ayağı sürüşsə artıq,
Çıxar məmləkətdə bir qarışıqlıq.
Yaman göz şah ilə başlarsa oyun
Divlər fitnə ilə olar qolboyun.
Dünya bir məzlumdur, şah dada çatan,
Məzlum bir adilə möhtacdır hər an.
Dünyaya sultandır, işıqlı çıraq,
Yaman nəzərlərdən olsun o uzaq.

## ZƏNCİ QOŞUNUNUN GƏLMƏSİNDƏN İSKƏNDƏRİN XƏBƏRDAR OLMASI

Ey saqi, ver könül açan bir şərbət,
Dərdim var, getdikcə etmədə şiddət.
Olsun bu ürəyim o şərbətlə şad,
Məni dərd-qəmdən eyləsin azad.
Gəldi qurd ağzından sübhün nəfəsi,
Keşikçi itinin kəsildi səsi[97].
Xoruzlar çırpındı, çaldı qol-qanad,
Təbillər səsindən canlandı həyat.
O dadlı yuxudan oyandım yenə,
Sarıldım cavahir düzmək fikrinə.
Cavahir istəyən qazar mədəni,
Gövhər ümidilə sökər bədəni.

Bir ləli zəhmətlə gətirər ələ,
Çarpışar daşların daş ürəyilə.
Nə sandın, ey asan eşidən insan,
Dinlənilməz zəngin kəlmələr asan.
Bağda çox olsaydı əncir yeyən quş,
Ağaclar əncirdən qalardı bomboş.
Bu ipək pərdəni nəqş edən insan
Belə nəql etmişdir öz ustadından:
Elə ki, fələyin çırağı səhər
Dünyanı nuriylə etdi münəvvər,
Günəş əlvan şəfəq saçdı hər yana,
Gəlintək oturdu qızıl taxtına.
İskəndər qədimki ayində durdu,
Eyvanda şövkətli bir məclis qurdu.
Qol-qola tutaraq gözəl qulamlar
Taxtının yanında tutdular qərar.
Gah Kəyan adına qaldırır qədəh,
Gah gövhər saçaraq edirdi fərəh.
Bir nur çeşməsiydi, oturmuşdu şən,
Aman səsi gəldi uzaq ellərdən.
Məclisdə padşaha etdilər məlum:
"Amana gəlmişdir bir yığın məzlum.
Kömək istəyirlər Rum sultanından,
Deyirlər: Misrə çox dar oldu cahan.
Zəncilər axınla gəlmiş bu səfər,
Dolaşmaq çətindir, tutmayır çöllər.
Ordularla dolmuş bu böyük cahan,
Çöllərdə hakımdir qorxu, həyəcan.
Hamısı çöllüdür, qətrandan qara,
Çöllərin otu da çatmaz onlara.
Uşaq təbiətli hər yaşlı kosa
Şən həyat keçirir çirkin də olsa.
Nə bir utancaq üzləri vardır,
Nə də sevgi saçan gözləri vardır.
Bunlar insan yeyər, ilantək sancar,
Misrin buna qarşı nə qüvvəti var?
Köməyə çatmazsa böyük tacidar,





Qarətə gedəcək o zəngin diyar.
Misir, Rum, Əfrəncə olar tarmar,
Mum kimi əriyər o odlu dağlar.
Bu haqsız axından pərakəndəyik,
Şah, fərman sizindir, bizlər bəndəyik."
O dinin pənahı, adil hökmdar
Bildi ki, Zəncidə hədsiz qoşun var.
O hədsiz ordudan qorxdu hökmüran,
Qorxusuz olurmu ağıllı insan?
İskəndər vəziri tez dəvət etdi.
Onunla ətraflı məsləhət etdi.
Ağıllı, bilikli, hünərli vəzir
Müzəffər olmağa tökdü bir tədbir:
"Qalx, - dedi, - bəxtini sına, zamandır,
Belə əjdahanı məhv etmək şandır.
Zəfərlər yaratsa ordunun əli,
Daha möhkəm olur şahlıq təməli.
Misir də, Zənci də olur sənə ram,
Mərdlikdə alarsan yenilməz bir nam.
Ölkədən silinsə azğın düşmənlər,
Xainlər kor olar, dostların gülər."
Rəhbərin əmriylə o gənc hökmüran
Bayrağı ucaltdı Makedoniyadan.
Topladı süngülü, qılınclı əsgər,
Qılınc şəfəq atdı buluda qədər.
Dənizdən quruya çıxınca ordu,
Tərpəndi, bir daha Misirdə durdu.
Misir xalqı ilə silahlı əskər
Bu işi uğurlu bir fal bildilər.
Padişah əmr etdi, Nil sahilindən
Keçərək, çöllərdə tutsunlar məskən.
Yedəkli at ilə axsın meydana,
Döyüşdə verməsin aman düşmana.
İgidlər düzüldü yola hər nə var,
Zəncinin kininə bel bağladılar.
O coşğun ordunu görüncə zənci,
Gözündə qaraldı dünya sevinci.

Ordular çıxınca qarşı-qarşıya,
Üzlərdən büsbütün silindi Həya.
O polad mıxralı atlar nalından
Kökündən titrədi o köhnə cahan.
Meydandan o qədər ucaldı nərə,
Sanki göy saraldı, töküldü yerə.
Coşdu toppuz, yağdı mancanaq daşı,
Əyildi öküzün, balığın başı98.
İnsanlar bağırır, kişnəyir atlar,
Dünyanın gözü kor, qulaqları kar.
Bu səs-küy elə bir qiyamət açdı,
Vəhşilər qorxaraq çöllərdən qaçdı.
Döyüşə başlarkən hər iki əsgər,
Divləri sarsıtdı ucadan səslər.
Elə yerdə idi bu döyüş, inan,
Qubar gətirirdi adam yanğından.
Kükürdün tozutək qupquru çöllər
Cəhənnəm kimiydi, yanırdı ciyər.
Sərin su yox idi ağudan başqa,
Bir də günəşdəki yanğıdan başqa.
Baxırdı əjdaha kimi hər mağar,
O yerdə hər fitnə açmışdı bazar.
Orda ki, yaşayır qulyabanılar,
Yaşayıb, hər yerə soxulur onlar.
Ləli yer öküzü udduğu zaman
Pusqudan sıçradı qapqara aslan[99].
Gecənin zülməti dünyanı sardı,
Aslanın dişitək ulduz ağardı.
Gecənin göbəyi yayırdı ətir,
İşıqdan dünyaya açmışdı çətir.
Düşməni tanıyan növbətçi əskər
Yollara çıxaraq keşik çəkdilər.
Ulduzlar yer-yerdən doğmuşdu parlaq,
Xalq oldu zəhmətdən, kədərdən uzaq.
Qaranlıq çökücə Rum və Zəngibar
Vuruşdan yorulub axşamladılar.





## İSKƏNDƏRİN ZƏNGİBAR ŞAHINA XƏBƏR GÖNDƏRMƏSİ

Ver, saqi, Rum üzlü, gülgün şərabdan,
Təbim zənci kimi şəndir bu zaman.
Mənimlə bu qorxu bilməyən pələng
Olmasın Rum, zənci kimi iki rəng[100].
Aldadan yol oldu bu uzaq yollar,
Yeddinci fələkdə ancaq işıq var[101].
Bu yolda mələk də azar yolunu.
Çünki bir div gedər, qayıdar onu.
Bu çarsubazarda qapan işlədən
Bir arpa almasa çəkməz iki dən.
Çalışar, hər yandan oğurlar bir az,
Ondan da qaparlar işi olsa saz.
Dönə-dönə alar qoca dehqandan,
Divana göndərər o batman-batman.
Məndən uzaq olsun bu cürə dostlar,
El məni bu sözdə üzürlü tutar.
Əxlaqca yabançı bu dostları, bil,
İkiüzlülərdə arama bir dil.
Tülkünün deşiyi ikidir əlbət,
Birisi tamahdır, birisi şəhvət.
Bir əqrəb kimidir, olsa da huşyar,
Nə qulaq, nə də göz deşikləri var.
Bu gizlin əsrarı təsvir edənlər,
Dehqan tarixindən vermişdir xəbər.
Çin şahı atına qoyarkən yəhər
Zəncinin nalına od vurdu göylər[102].
Günəşi pusqudan fələk sıçratdı,
Ulduzlar üzüyü əlindən atdı[103].
Bu dünya ordular yıxan ərlərdən
Bir məclis bəzədi ulduz kimi şən.
Dəvəni zəngindən, fil güzgüsündən
Sədəf şəvə doğdu inci doğurkən[104].
Fil təpiklərindən yer öküzünün
Sümüyü qırılıb məhv oldu bütün.

Şah Kəyan rəsmini edərək yeni,
Doldurdu təblinin səsi ölkəni.
Qurdu Rum rəsmiylə elə bir ordu,
Sanki möhrü muma bir naxış vurdu.
Bir rumlu var idi olduqca insan,
Natiqdi, bir neçə dildə danışan.
Alimdi hər fikri, sözü qurmaqda,
Mahirdi ox atıb, qılınc vurmaqda.
Söhbəti tutımı kəməndə salmış,
Özü Tutiyanuş adını almış.
O qədər kəskindi sözü, hünəri,
Özünə çəkərdi dinləyənləri.
Sarayda nədimdi, həm də arabir
Ay, günəş sirrindən söhbətlər edir.
Yanına çağırdı onu İskəndər,
Elçilik edərək aparsın xəbər.
Əmr etdi, hərəkət etsin durmadan,
Zənci sərdarına yetirsin fərman.
Kəskin qılıncını anlatsın ona,
Qayıtsın bəlkə öz doğru yoluna.
Zənciyə anlatsın, göstərsin tədbir,
Atəşi gördükcə yumşalar dəmir.
Gül üzlü, o şümşad boylu hünərvər
Rumludan zənciyə apardı xəbər:
"Təxti var, tacı var bəxtitək parlaq,
Qılıncın gücüylə ucaltmış sancaq.
Şövkətli, qüvvətli, həm də sərkəşdir,
Bəzən də acığı yanar atəşdir.
Maral buynuzuna göndən zeh çəkər,
Qarışqa başını dırnağa tikər.
Onunla müdara eylə, ey salar,
Ağlayıb üzr istə, get ona yalvar.
İnan ki, bu atəş olsa şöləvər,
Sönməz, üzərinə dəniz töksələr.
Dostluqla yaxınlaş, kinindən çəkil.
Onunla düşmənlik faydalı deyil.
Kin ilə, sülh ilə sınanmış cahan,
Sülhündən xeyr almış, kinindən ziyan".
Bu fikri qaralar şahı eşitcək





Dəhşətdən qıvrıldı qara ilantək.
Kininin atəşi beynini yaxdı,
Şimşəkli buludtək gurladı, çaxdı.
Acıqlı əmr etdi: Tutiyanuşu
Kəssinlər, bədəndən ayrılsın huşu.
Div kimi qapdılar o pəhləvanı,
Necə ki, kəhrəba qapar samanı.
Qızıl teşt içində kəsildi başı,
Al qana bulaşdı şahın sirdaşı.
Qızıl teşt qan ilə dolduğu zaman
Zənci şah su kimi içdi o qandan.
Onunla gedənlər gözlərində yaş
İskəndər yanına qayıtdı birbaş.
Həsrətlə döndülər şahın yanına,
Bu qanlı xəbəri verdilər ona.
O gözəl rumlunun zənci şahından
Gördüyü dəhşəti etdilər bəyan.
İskəndər o şümşad rəngli sərv üçün
Atəşdə ox kimi yandı ki, neçin
Elə bir suçsuzun töküldü qanı?
And içdi məhv etsin azğın düşmanı.
Çatınca qoşuna bu dəhşətli iş,
Rumlular qorxaraq etdilər təşviş.
Bu işdən zəncinin dişi ağardı,
Rumlunun qəlbini bir qorxu sardı.
Gecənin dişləri örtülməlidir,
Ancaq ölən zaman o gülməlidir.
İskəndər susaraq üç gün, üç gecə,
Kinini söndürdü parlaq düşüncə.
Dağların üstünü alınca duman,
Quşlar bu ahəngə düzdü bir dastan.
Göylərin Harunu keşik çəkərək,
Belinə asmışdı saysız qızıl zəng[100].
Keşikçi zəng çalıb səsləndi birdən:
"Yaşasın tacıdar, qəhr olsun düşmən!"
Dışarı çıxaraq kəşfiyyat qolu
Növbətlə qarovul güdərdi yolu.
Ertəsi günü bu səbirsiz dövran
Göstərdi günəşi dağ arxasından.

Nay, təbil gurladı şah qapısından,
Zənglərin səsindən titrədi cahan.
Təbilçi sür atla qalın xam göndən
Gecənin ağzına vurdu bir yüyən.
Coşaraq inləyir neyin nəfəsi,
Nağara əl çalır, yüksəlir səsi[107].
Ordunun çəkisi elədikcə meyl,
Bu gözdən o gözə axıdırdı sel.
Süngülər kaftanı dələrək hər an
Çıxırdı göbəyin tam ortasından.
Qılınc, ox yağarkən şaraqhaşaraq
Parça-parça oldu geyim və qalpaq.
Qılıncın dəhşətlə çalhaçalından
Buludun qəlbində su olurdu qan.
Üz-üzə gəlincə hər iki ordu
Elə bil iki qoç üz-üzə durdu.
İgidlər döyüşdü uzun bir zaman.
Meydana sel kimi axıtdılar qan.
Rumları zəncilər əzdiyi zaman
Sankı bir maralı ovlardı aslan.
Rumlara zəncilər verdi tələfat,
Hər yeri bürüdü dəhşətli heyhat.
Zəncinin etdiyi Tutiyanuşə
Rumları salmışdı böyük təşvişə.
Kasaya doldurmuş günahsız qanı,
Su kimi başına çəkmiş kasanı.
Zəncilər oynayan qorxunc oyundan
Qorxaraq, rumlara daraldı meydan.
İskəndər bildi rum, zəncidən ürkmüş,
Əskərin qəlbinə bir qorxu çökmüş.
Meydanda əskərə üz versə qorxu,
Cəza bir iş verməz, dağılar ordu.
Çağırdı bilikli böyük vəziri,
Gizlincə anlatdı ona bu sirri:
"Müzəffər ordumuz olmuş pərişan,
Bir qılınc yemədən doymuş savaşdan.
Döyüşə qəhrəman bir ordu gərək,
Bir atlı od olsa, verməz bir kömək.
Elçinin qanını içərkən düşman
Əskərim məhv olur can qorxusundan.
Orduda apardın qorxu izi var,
Qorxaq kimsələrdən, söylə, nə çıxar?
Meydanda düşməndən qorxarsa ordu,
Su gətir, zəfərdən əllərini yu.
Zəncilər hər yanda meydan sulayır,
Qızmış fillər kimi hey baş bulayır.
Yaratmaq gərəkdir elə bir dastan,
Zəncinin ordusu məhv olsun ondan.
Ortaya elə bir sağlam fikir at,
Bizə bu qorxudan versin bir nicat".
Sınanmış, ağıllı, hünərli vəzir
Azacıq düşündü, tökdü bir tədbir:
"Sərvərim, kamalın olsun sənə yar,
Zəfər dostun olsun, düşmənlərin xar.
Üzünü çevirsən dağ-daşa belə,
Fələkdən səadət alasan ələ.
Dünyanın pənahı ulu yaradan
Pənahın olsun, ey böyük hökmüran.
Qaralar zəhərli ilandır, ilan,
Bir divdir, şeytandır, deyil bir insan.
Yeri var rumlular etsə qorxaqlıq,
Zəncilər nəhəngdir, rumlular balıq.
Qan içmək olduqca qorxulu bir iş,
İnsanı yeməksə ondan da müdhiş.
Onlardan bir həya gözləsən, inan,
Bizə söyləməzlər ağıllı insan.
Meydanı düşmənə versək bu sayaq,
Zəncilər göylərə sovurar torpaq.
Rumlardan qorxsaydı vəhşi zəncilər
Elçinin sözləri edərdi əsər.
Elçi nə edəydi o vəhşilərə,
Elçi yeyən desək yetər bir kərə.
Düşünmək gərəkdir elə bir fikir,
İnsanı yeməkçin olsun bir tədbir.
Yollardan bir neçə zənci tutaraq
Onları dərgahda eylədi dustaq.
Sən otur yerində acıq, təmkinlə,
Onları torpağa yıxsınlar kinlə.

Birinin başını dərhal üzsünlər,
"Yemək bişsin" deyə mətbəxə göndər.
Zəncilər dililə hökm et durmadan:
"Bu başı al, bişir, yesin hökmüran!"
Gizlində aşpaza başqa tövr anlat:
"Bu başı güm yerə, torpaqlara qat!"
Qara qoyun başın bişirsin bir az,
Sümüksüz hüzura gətirsin aşpaz,
Bişməmiş dərini hiddətlə, kinlə
Tez götür, parçala, çeynə dişinlə:
Çağır ki: "Beynini gətirin görək,
Olmazmış belə bir ləzzətli yemək.
Bilsəydim ki, zənci ətindən təam
Edərmiş vücudlu belə sapsağlam,
Rum əsirlərini bəsləməzdim mən,
Hər zaman yeyərdim zənci ətindən.
Bilsin o adamcıl, müdhiş canavar,
Ondan iti dişli insan yeyən var."
Bununla sönər o kin saçan ocaq,
Dəmiri dəmirlə olar yumşaltmaq.
Həyata keçirsək bu tədbiri biz,
O güclü qolları yenərik şəksiz.
Qurdluqda mümkündür qurtulmaq qurddan,
Cəhlə qarşı verər cəhalət ziyan."
İskəndər əmr etdi: rum əsgərləri
Gizlində dolaşsın düşmən yerləri.
Yollardan keçərkən məğrur zəncilər
Əsir götürsünlər bir neçə nəfər.
Əmrinə igidlər baş əydi bir-bir,
Zəncidən aldılar bir neçə əsir.
Döndülər şah olan xeyməyə sarı,
Təslim eylədilər o düşmanları.
Əsirlər hüzura gəldiyi zaman
Üzləri qaraydı, başları al qan.
Padişah yerindən tez kükrəyərək
Şikar arxasınca düşən aslantək
Əmr etdi, birini dərhal qapdılar,
Başını dağ kimi vurub çapdılar.
Verdilər mətbəxə ki, al bu başı,





Padşaha hazırla bir zənci aşı.
Aşpaza başqa tövr anlatdı bunu,
Nə sayaq oynasın müdhiş oyunu.
O biri zəncilər qorxaraq durmuş,
Bu qanlı adətdən boynunu burmuş.
Padişah əmr etdi: açılsın süfrə,
Hər çeşid yeməkdən düzülsün yerə.
Qoyunun pörtülmüş ətindən aşpaz
Süfrəyə düzdükcə keyfi oldu saz.
Ceyran dərisini yırtantək aslan
Dişiylə didərək başı hökmüran,
Başını oynadıb ləzzətlə yedi,
"Ox, belə bir yemək yeməmişəm - dedi.
Nə qədər dadlıymış zəncinin əti,
Verməz başqa ətlər böylə ləzzəti.
Zəncinin ətindən kabab yaxşıdır,
Yanında qırmızı şərab yaxşıdır.
Tək zənci budundan yeyərəm kabab,
Dadlıdır, duzludur, xoş gəlir şərab".
Zəncilər önündə qoyun başından
Zənci başı deyib yedi hökmüran.
Müdhiş əjdahanı görüncə belə
O qara ilanlar dağıldı çölə.
Ordunun içinə döndü zəncilər,
O qara günlərdən verdilər xəbər:
- Əjdaha yeyənmiş bu insanxəyal.
Nəhəngdir, bizlərə verdi çox zaval.
Elə bir ləzzətlə yeyir zəncini,
Sanki zənci yeyir badam içini.
Bir zənci başını keçirsə ələ,
Qoyunun başıtək yeyir ləzzətlə.
Zəncinin qəlbinə çökmüşdü qorxu,
"Biz ipək sanırdıq, cod palazmış bu!"
Alovlu şölələr get-gedə söndü,
Qızğın atəşlərə soyuq göründü.
Ertəsi günü quş qanad açınca,
Fələyin başından duman uçunca,
Gecəyə bağırdı xoruz hiddətlə,
Təbillər gurladı, coşdu şiddətlə.

Şeypurlar kin ilə gurlar, elə bil
Məhşərdir, surunu çalır İsrafil.
O öküzquyruğu şeypurlar ötdü,
Göydəki Öküzün partladı ödü.
Coşdu qurd gönündən olan nağara,
Dünyanın beynini gətirdi zara.
İgidlər köksündə çırpınan ürək
Dərindən inlədi türkün nayıtək.
Yer dımağındakı odlu zərbələr
Çırağın beynində şöləyə bənzər.
"Çəkil, çəkil" deyə o polad oxlar
Fillərin belində tuturdu qərar.
Hər polad qılıncdan parladı şimşək
Buludlu gecədə axan ulduztək,
Qalxaraq yerindən hər iki ordu
Başqa bir təhrdə yenə səf qurdu.
Sankı iki bulud baş-başa qoşdu,
İki od dənizi köpürdü, coşdu.
Rumlarla zəncilər hərbə girərək
Qarışdı iki rəng alan qabantək.
Quş kimi atların polad nalından
Yer oldu igidlər qanıyla əlvan.
Qol qıran oxların vıyıltısından
Kimsədə nə bədən qalmışdı, nə can.
Qılınc güzgüsündən şəfəqlər axdı,
Bu şəfəq günəşdən daha parlaqdı.
Rumlular elə bir bayraq ucaltdı,
Yerə ox, göylərə kəməndlər atdı.
Cəbhənin qəlbində durmuş İskəndər,
Sağ-solu bəzəkli bir alay əskər.
Qarşıda zəncilər kin ilə durdu,
Çıxardı Bisütun kimi bir ordu.
Qocaman fillərin ağır səfləri
Elə bil uzanır bir dağ kəməri.
Oqıq kimi gözlər, süngü kirpiklər,
Dəmirdi xortumdan quyruğa qədər.
Hər filin belinə taxt qoyulmuş ac,
Üstündə bir zənci, başında bir tac[109].
Meydanda bir nərə vuranda filə





Atəşi canına salır vəlvələ.
O qədər fil gəldi, dolaraq meydan
Hər tərəf qaraldı fil ayağından.
Fillərin yanınca gedən piyada
Hər yerdə yüz fili salırdı bəndə[110].
Meydanın ayini bitincə, artıq
Ürəkdən silindi sevgi, insanlıq.
Zəracə adlı bir qara pəhləvan
Ortaya atıldı, oxudu meydan.
Fil kimi kükrədi toppuz əlində,
Bir tutar qoymadı fillər belində.
Bir qara ilandı qurddan füsunkar,
Qabarıq, şişkin bir böyük başı var.
Geniş ağzı sanki qara bir qazan,
Baxanın ağarır gözü qorxudan.
Dəmir cövhərindən küpdür bu qaya,
İçinə tökülmüş qapqara boya.
Sinəsi bir polad qalxandan qurma,
O div gövdəsini hələ heç sorma.
Gördünmü başında qotaz bir bayraq?
Bu zənci bayrağın eyniydi ancaq
Mahcası bənzərsə çevrilmiş tasa,
Gözləriydi içi qan dolu kasa.
Zənci çox öyündü: "Mən bir sərkəşəm,
Tüstünün altında yanan atəşəm.
Polad çeynəyən fil, Zəracə mənəm,
Fillərin belində şərab içənəm.
Qədəhi vurunca sərxoş olaraq
Filləri zərbəmlə edərəm çolaq.
Meydanda əl atsam kəskin qılınca
Dağları edərəm mən parça-parça.
Qarşıma çıxarsa qızmış bir aslan,
Şimşəkli buludam, qoparram tufan.
Coşarsam, atından salaram Nili,
Bu rüxüm piyada buraxar fili[111].
Silahım göyərmiş aslan canından,
Mənim öz vücudum silahdır, inan
Ürəyim almazdır, vücudum dəmir,
Bu almaz, bu dəmir mənimçün nədir?

Başımı qürurla qaldırsam əgər,
Etmərəm atəşdən, dənizdən həzər.
Yırtaram böyrünü hər pəhləvanın,
Bağrını çeynədim kinli düşmanın.
Qan tökmək peşəmdir, əjdər bədənəm.
Tək qatil deyiləm, adamyeyənəm,
Dünyada kimsədən utanmaram mən,
Utanmaq nə gərək hərbə girərkən?
İgidi hünərdən qoyar utanmaq,
Eşşəyi ram edən palandır ancaq.
Hər zənci mən kimi güldüyü zaman
Gülər almaz dişli qara bir aslan".
Rəcəzi bitincə tərpəndi duman,
Xəznədə qıvrıldı sanki bir ilan[112].
Rumlardan bir igid girişdi işə,
Özünü birinci atdı atəşə.
Ürəyi çırpındı od söndürməyə,
Döndü atəş görən bir pərvanəyə.
O sınaqlı zənci bir hərbə ilə
Başını qopardı zərbə ilə.
Başqa bir pəhləvan çıxdı savaşa,
Bu dövran onu da vurdu bir daşa.
Beləcə rumlardan yetmiş pəhləvan
Zərəcə əlində keçdi qılıncdan.
Kimsədə qalmadı cəsarət, hünər,
O qızmış zənciyə olsun bərabər,
Yerindən oynayıb dərdə düşdü Rum,
Sanki qızğın kürə əridirdi mum.
Ordunu əzincə qara pəhləvan
Rumlardan olmadı qarşıya çıxan.
O fələk şövkətli, igidlər yenən
Mərkəzdən ox kimi atıldı birdən.
Döyüşçün vücudu yarağa batdı,
Zənci öldürməyə süngü oynatdı.
Belində gövhərlə bəzənmiş kəmər,
Başında polad bir qalxan - cilvəgər.
Əynində zirehi mavi, qıvrıcıq,
Düyümü zəncinin saçından artıq.
Yəməni qılınca içirmiş zəhər,





Boynundan sallanmış belinə qədər.
Kəməndi tamğacılı qaşına bənzər,
Çaçların qurduğu yay kimi çənbər[113],
İpək bir çul salmış kəhər atına,
O, fil gövdəsiylə çapdı meydana.
Cilovu süratlə atdı yəhərə,
Hücuma keçirkən çəkdi bir nərə.
Necə bir kəkliyə şığıyar tərlan,
Dünyaya al günəş doğar ucadan,
Elə bir süratlə sərkəş, filbədən
Düşmənin üstünə atıldı birdən
Bağırdı: "Ey qara qarğa, ol sayıq,
Qarşında şahindir, sakit ol artıq.
Noxtanı çəkməsən yoldan kənara,
Dünyanı edərəm üzündən qara.
Üz-gözün onunçun qaradır, inan,
Qarşımda qaçarsan kəskin qılıncdan.
Gəl, getmə, qızardım qara üzünü,
Saçından qıvrıcıq edim özünü.
Güzgütək parlayan qılınc pas tutur,
Güzgüyəm, məndən hər zənci yas tutur.
"Ağlıq" ağlıq alır xəstə gözlərdən,
Qılıncım qızartı alar üzlərdən.
"Mən divəm - deyirdin, - xörəyim adam",
Məni ye ki, divdən lətif adamam.
Qılınc oynatmağı sizdə yox bilən,
İndi gəl, qüvvətli qolumdan öyrən!
Yerindən tərpənmə, çox gəlmə yaxın,
Yoxsa ki, başını öpər ayağın.
Mən ərəb huşlu bir Rum sərvəriyəm,
Zənci öldürən bir sübhün nuriyəm[114].
Fil kəskin qolumdan bir qılınc yesə,
Filban Nil küpünə atar əlbəsə[115].
Daşlar oxlarımdan halqa geyəndə
Qulağına halqa taxarsan sən də"
Sözləri bitincə qalxdı yəhərə,
Cilovu buraxdı, çəkdi bir nərə.
Sərxoş aslan kimi elədi həmlə,
Aslanca bir toppuz almışdı ələ.

Toppuzu vurdu şah elə qüvvətlə,
Elburus dağına düşdü zəlzələ.
Poladın açdığı dərin yaradan
Qalmadı abinus ağacında can[116].
Qol, boyun, ayaq və köks, gövdə, baş
Girdi bir-birinə, oldu xurdü xaş.
Zəracə həyatdan olunca rahət,
Meydana atıldı başqa bir heybət,
Xurma ağacından uca pəhləvan,
Elə bir ağacdan qorxardı bağban.
Hücuma keçincə o kinli qara,
Padşaha buraxdı odlu bir yara.
Zirehə təsiri olmadı, zənci
Buludtək bağırdı, uçdu sevinci.
O qara buluda qızdı hökmüran,
Çəkdi ağ nəhəngi qara qınından[117].
Hücum eləyəntək aslan ceyrana
Bir zərbə endirdi o pəhləvana.
Xurma ağacının uçdu kəlləsi,
Ağacdan düşdü bir zənci gövdəsi.
Çıxdı bir başqası "Aslanam" deyə,
Özünü o zənci durdu öyməyə:
"Bir qara buludam, zənci dağından,
Qılıncım yağdırır əjdaha, aslan.
Bu ağır dağların çəkisi mənəm,
Qapqara zənciyəm, bir filbədənəm.
Başından biçərəm qocaman fili,
İçimə çəkərəm o daşqın Nili.
Zəhərli dəmirim kimi dişləsə
Qaradan biçərəm ona əlbəsə.
İskəndər gördü bu hədyan danışan
Nafini müşk ilə yoğurdu qandan.
Qılıncı qaldırdı uca boyuna,
Başından bir zərbə endirdi ona.
Ondan da müdhiş bir qara hiddətlə
Atıldı qarşıya çox cəsarətlə.
Padşahın qılıncı çıxdı birinci.
Toz, torpaq içində fırlandı zənci.
Meydana atıldı başqa bir qara,





Onun da gözünü yumdu bir yara.
Qorxaq zəncilərdən heç bircə nəfər
Döyüşə çıxmadı axşama qədər.
Şan, zəfər olunca şahın yoldaşı
Döndü ordugaha, ucaldı başı.
Günəşin gül rəngli donu dönərkən
Mavi bir rəng aldı Nilin küpündən.
Alaca göylərə keşik çəkənlər
Alamtıl gecəyə aydınlıq ələr.
Keşikçi adəti üzrə ayıqdı,
Ulduzu sayandan daha sayıqdı.
Zənci qarovulu, Rum qarovulu
Keşikdə dayanıb güdərdi yolu.
Günəş, dan sökərkən gülümsəyərək
Neylufər günbədə vurunca bəzək,
Zərnişan xeymədən çıxdı İskəndər,
Hərb üçün meydana çıxardı əskər.
Bir məhmiz vurdu o sərkəş tərlana,
O, suyu od kimi sürdü meydana.
Mərkəzi aldı öz əlinə, sonra
Cinahı tapşırdı pəhləvanları.
Sağ-sola dəm dəmirdən çəkdi bir hasar,
Möhkəm bir təməldə düzüldü dağlar.
Zəncilər, həbəşlər hey ordu-ordu
Əlində qılınc, ox meydanda durdu.
Cəbhənin qəlbində durmuş zəncilər,
Sağında həbəşlər, solunda bərbər.
Boru gurlayınca şah qapısından,
Zəncilər zəng çaldı, qızışdı meydan.
Qaramtıl bir bulud gurlayıb çıxdı,
Qılıncın şimşəyə göylərə axdı.
Ordular qopardı elə bir nərə
Dəhşətli bir qorxu çökdü divlərə.
Toz, torpaq boğurdu saf boğazları,
Qorxudan bənizlər oldu sapsarı.
Qılıncdan, toppuzdan, süngüdən, oxdan
Sülh aradan çıxıb getmişdi çoxdan.
Polad qalxanların toqquşmasından
Göylərə çökmüşdü qorxu, həyəcan.

Torpağın beynini yerdən oynatdı,
Yer dağın məğzini başından atdı.
Nağara gurlayır ildırım kimi,
Qalalar uçulur sıldırım kimi.
Uzağa səs salır naylar, elə bil
Məhşərdir, çalınır suri-İsrafil.
Yer zindan olunca gürzə, əmuda,
Köhüldən toz kimi uçdu buluda.
O polad dimdikli uçan oxlardan
Daşların bağrına düyümlədi qan.
Kirpikdən ox atır əyriqaş kaman,
Zirch məməsindən süd sağır hər an.
Kəməndlər qıvrılır düyümlənərək,
Sarılır boyuna qara ilantək.
Hindli bir oyunçu kimi qılınclar
Havada oynayıb mayallaq vurar.
Süngülərdən çıxan o mövzun səsə
Atlar da uyaraq gəlmişdi rəqsə.
Arı nəştəritək dəmir oxlardan
Daşların üzündən axırdı al qan.
Yerlər xəstələndi yaralılardan,
Yorğun ahlar saçdı göylərə duman.
Laciverd rəngində olan bir dağtək
Şah verdi cəbhənin qəlbinə bəzək.
O qılınc oynadan sərt qulaq zəngi
Bağırdı, elə bil zəncinin zəngi,
Kin dodaqlarında köpüklənərək
Ağzını açmışdı bağa tasıtək.
Canlanan mərkəzlər qalxdı ayağa,
Durdular meydanda at oynatmağa.
Hünər göstərməyə coşarkən mənlik
Baş verdi zirəklik, dəlilik, şənlik.
Rumları yarışda yendi zəncilər,
Bunlar çox müdhişdi, onlar çox dilbər.
İskəndər darıldı bu qorxunc işə,
"İncələr yaramaz qızğın döyüşə".
Düşündü: "Mən özüm olaram aslan,
Ayırram özümü bu qorxaqlardan.
İndi ki, qorxmuşdur qoşunun qəlbi,





Mən özüm aparam gərək bu hərbi".
Dan yeri ağardı, şəfəq sökəncə
Sürətlə çəkildi qaranlıq gecə.
Şahın zərbəsiylə bir neçə qara
İt kimi gəbərdi alınca yara.
Şahın hünərini belə görənlər
Kəskin qılıncından etdilər həzər.
Meydanda özünü şah yalqız gördü,
Atını düşmənin qəlbinə sürdü.
Bu dünya Pələngər şaha oldu təng,
Düşündü: "Dənizdən çıxmış bu nəhəng".
Öz adamlarına dedi: "Bu şikar
Toruma düşərsə, qurtuluşmu var?"
Şahanə bir silah tərtib elədi,
Qılıncla qalxanı tərkib elədi.
Kərgədan gönündən geyindi köynək,
Qızıldan vurulmuş ona çox bəzək.
Güzgü, ya xam gümüş kimi parladı,
Başında poladdan dəbilqə vardı.
Qılıncı maralın gözütək parlar,
Qarınca qanadı kimi cövhərdar.
Atıldı, cür ətlə girdi meydana,
Ürəklə kim hücum edər aslana?
Bağırdı: "Ey şikar arayan aslan,
Özünə güvənmə, oxuma meydan.
Getmə, gəl vuruşaq, görək kim kimi
Meydanda basacaq bir aslan kimi?
Görərsən kimdədir ucalıq, zəfər,
Kimə yar olacaq səadət, hünər?.."
Zəncinin sözündən coşdu İskəndər,
Qan vurdu başına, qovruldu ciyər.
Qarşıda kin ilə coşarkən düşman
Rəqibin qəlbində cuşə gəldi qan.
İskəndər bağırdı: "Güvənmə boş-boş,
İgidlər önündə öyünmə, sərxoş!
Söz açma mənə bu qəhrəmanlıqdan,
Kölgəsindən qorxan, ey sərsəm, nadan!
Qorx aslan yenəndən aslansan əgər,
İgidlər yenənə göstərmə hünər.

Tərpədə bilməsən ağır gövdəni,
Məhvinə çalışmaq məhv edər səni!
Aslanın böyrünə əl çəkmək üçün
Üstün olmalıdır aslana gücün.
Şahınlıq göstərən, ey zəif sərçə,
Özünü məhv üçün işlətmə pəncə!
Xoşdur, gəl dolaşaq; məhəkdir meydan,
Kimdədir üstünlük, edək imtahan!
İgidlər yenənə bu tənə abəs,
Yenilər hər zaman tənə vuran kəs."
Padşahın sözündən o kükrəyərək
Yerindən tərpəndi qara tüstütək.
Şahın üzərinə qılıncı çəkdi,
Buluda ildırım nə edəcəkdi?
Padşahın tükləri qılınca döndü,
O çirkin sıfətdən qəlbi doyundu.
Acıqla bir qılınc vurdu İskəndər,
O polad qalxana etmədi əsər.
Çox süngü oynatdı şah ilə qara,
Süngüdən heç biri almadı yara.
Qaranlıq çökəncə, çəkilincə gün
Döyüşdə heç biri olmadı üstün.
Zənci bu döyüşdən darıldı ona,
Dedi: "Gün çəkildi dağın ardına,
Davanı tərk edək, gecədir daha,
Bu qanlı vədəmiz qalsın sabaha.
Elə ki, ağarar qaranlıq gecə,
Dan atıb günəşli səhər gəlincə,
Oxuyum sənə mən elə bir meydan,
İlan yuvasını satın alasan.
Bu şərtlə: ordunu çəkərkən səhər
Qarşımda ol səhər kimi cilvəgər."
Bu sözlər bitincə döndü cəbhədən,
Şah dedi: "Razıyam bu şərtlərə mən."
Razılıq verincə qısa möhlətə,
Meydandan döndülər istirahətə.





# İSKƏNDƏRİN ZƏNGİBAR ŞAHINI MƏĞLUB ETMƏSİ

Elə ki, dan atdı, o parlaq günəş
Dənizin suyundan qaldırdı atəş
Meydanda rum, zənci təbil döyərək,
Ağ, qara qarışdı şətrənc zəritək
Qırqovul rumlular, qarğa zəncilər
Tərlanın iki rəng köksünə bənzər.
Zəncilər gecəydi, rumlular çıraq,
Rumlular qarğanın gözüydü ancaq[11]
Bir qara buluda büründü cahan,
Gözündən axıtdı dənizlərə qan.
Başlardan aşan bir daşqın sel oldu,
Biri susuz qaldı, biri boğuldu.
İskəndər meydanda bir at oynatdı,
Ox kimi düşmənin gözünə batdı.
Qızışdı cəbhədə döyüş bazarı,
Qalxdı asimana yerin tozları
Geydi xam ipəkdən dar gözlü kaftan,
Özünü qorudu oxdan, qılıncdan
Ən parlaq bir zireh geyindi göz-göz,
Çeşmətək qamaşır ona baxan göz.
Bir süngü götürdü düz otuz qulac,
Varlığı ciyərin qanına möhtac.
Boynundan həmayil bir qılınc taxdı,
Şəfəqi günəşdən daha parlaqdı.
Başında dəbilqə Çin poladından,
Gövhərlər ondakı gövhərə heyran.
Belinə asdı bir zəhərli kəsər,
İlantək sancaraq tökərdi zəhər.
Bir ata oturdu, nə at, bir dağtək,
Görüşü sevimli, yerişi qəşəng.
Atını çaparaq hərbə yüyürdü,
Düşmən söz verdiyi yerə at sürdü.
Qarşıya çıxmadı miskin pələnglər,
Fikir dənizinə salmışdı ləngər
Hiyləylə göndərdi başqa iyrənci,

Şah gövhərlərini qapsın o zənci.
Şah böldü xəncərlə onu tən yarı,
Zəncinin qırıldı həyat damarı.
Dağ kimi bir qara div oynatdı at,
Baxanın gözündən çəkildi həyat.
Bu div də o zənci yeyəndən yedi,
Çoxunun başını torpaq çeynədi.
Müdhiş bir qara div ona yönəldi,
Qıvrılmış ilantək cünbüşə gəldi.
O divə Rum şahı vurdu bir xəncər,
Tüstüsü ucaldı göylərə qədər.
Atıldı ondan da müdhiş həbəşi,
Qan içən aslandan o daha vəhşi.
Ona da içirdi ölüm suyunu,
Zəmanə oynadı keçmiş oyunu.
O qızmış aslandan hamı qorxaraq
Heç biri meydana basmadı ayaq.
Rum şahı at sürdü, kinlə bağırdı,
O qaçan düşməni hərbə çağırdı.
Pələngər görüncə bu cəsarəti
Bir yara almadan söndü qüvvəti.
Atını oynatdı istər-istəməz,
Meydana atıldı dinməz-söyləməz.
At sürdü o igid şahlığa doğru,
Bəxt onu çəkirdi xarlığa doğru.
Çox qılınc endirdi girincə hərbə,
Qeysərə bir əsər etmədi zərbə.
Aslan qüvvətiylə coşdu hökmüran,
Sankı bir ceyrana sarıldı aslan.
Dünyanın pənahı tanrını andı,
Şanlı bir zəfərə artıq inandı.
Dəhşətlə hücuma keçdi şəhriyar,
Mərkəzi nöqtədə sıxıldı pərgar.
Atəşli kin ilə hey vurdu ata,
Güldü şimşək kimi qara buluda.
On düyüm mızrağı elə bərk çaxdı,
Qan onun döşündən su kimi axdı.
Düşmənin gəmisi dağıldı yeksər,





Pələngər məhv oldu, qaldı tək ləbər.
Atından əmr etdi igid hökmüran:
Əskərlər hücuma keçsin durmadan.
Ordu hər tərəfdən bürüdü düzü,
Qatdı bir-birinə gecə-gündüzü.
Oxların inləyən qorxunc səsindən
İpəkli geyimlər kəsildi kəfən.
Qılıncın, qalxanın şaqqıltısından
Aya baş vururdu buxarla duman.
Qızdıqca günəşdən qalxırdı şölə,
Təndirtək yaxırdı öz atəşilə.
Döyüş dəhşətindən sərsəmdi başlar,
İşıqdan dünya da qaçırdı naçar.
Baxdıqca zəncidir düşmüş yollara,
Olmuş göy yanında yer üzü qara.
Əqiqlər şəvədən qalamış ocaq,
Zəncilər od tutub, kül qalmış ancaq[119].
Şəvə yüngül oldu, ağırdı gövhər,
Gövhərə sərraf da çox qiymət verər.
Yasəmən bidmişkə etmişdi təsir,
Qarğalar ağ şahin əlində əsir[120].
Heyrət baxışlara, ürəyə axmış,
Əqlin mərkəzini bombaş buraxmış.
Çovuşlar verdikcə ürək arxadan
Ceyranlar qorxmadan ovladı aslan.
Yer-göy titrəyirdi hay-küy səsindən
Göylər də "ho" deyə səslər fələkdən.
Getdikcə coşurdu hər iki yağı,
Yazıldı birinə ölüm yarpağı.
Biləyi güclüyə zəfər oldu yar,
Zəncilər məcburən məğlub oldular.
Hər yana at çapdı müzəffər əskər,
Zənci öldürməyə bağladı kəmər.
Qılınc oynatdıqca böyük şəhriyar
Zəncinin bazarı oldu tarımar.
Zəncilər çalınca təslim borusu
Şənliyə başladı zəfər ordusu.
Göylərə ucaldı şahın bayrağı,

Yollardan büsbütün çəkildi yağı.
Mərhəmət buludu qopardı tufan,
Zəncinin pasını sildi qılıncdan.
Bayrağın altında durmuş hökmdar
Əynində bənövşə rəngində paltar,
Boynunda bir noxta, ayaqda zəncir,
Hər aslan çəkirdi bir nəhəng əsir.
Bayrağın altına yığdılar nə var,
İskəndər əmr etdi kəsilsin başlar.
Bir zənci qalmadı, boşaldı çöl, dağ,
Qalanlar quzğunlar yemiydi ancaq.
Barama qurdutək divbədən fillər
Qarınca ayağı altında inlər.
İnsanın yükünü çəkən hər hammal
Ya çıraq daşıyır, yaxud ipək mal[12].
Zillətə düşüncə amansız düşman,
Həbəşlər padşahdan dilədi aman.
Həbəşə nisbəti olanlar o gün
Padşahın əmriylə qurtuldu bütün.
Zəhərli qılıncdan tapdılar aman,
Şah bağışlayaraq vermədi ziyan,
Əmr etdi həbəşə vuruldu damğa,
O gündən həbəşlər quldur bu dağa.
O qızğın damğadan nurlandı həbəş,
Dağ ilə çırağı parladar atəş.
Padşaha o qədər verdilər qarət,
Hüzura sığmadı böyük qənimət.
Şah gördü verilən qarət hədsizdir,
Səhraya gövhərdən axan dənizdir.
Gövhərli cam, qızıl, toppuz bir yana,
Xalvarla müşk, ənbər axır meydana.
Saf mədən qızıldan, incidən nə var
Dolmuşdu meşindən iri çuvallar.
Sığmayır o gümüş, kafur çöllərə,
O kafur gümüşdən doldu dağ, dərə.
Yüklənmiş fillərdi - qaya gövdəli,
Cins ərəb atları - tovuz cilvəli.
Bərbərdən, nobidən gözəl əsirlər





Önündə Müştəri və Ay diz çökər.
Daş-qaşla işlənmiş qumaşlar, çullar,
Zürafə gönündən hədsiz xalı var.
Səhrada doluydu hər cürə sərvət,
Xəznəyə gövhərdən vurmuşdu zinət.
Şah şanlı zəfərlə dolğun qarətdən
Şənlənib qurtuldu qəmdən, zillətdən.
Bir dünya cəmdəyə ibrətlə baxdı,
Güldüsə, qəlbindən gizlin qan axdı.
Ki, neçin döyüşdə bu qədər insan
Məhv oldu zəhərli oxdan, qılıncdan?
Yanlışdır hər suçu bunlarda görmək,
Özümdə görmək də xətadır, gerçək.
Fələyin işi baş vurmaqdır ancaq,
Qəzadan olurmu boyun qaçırmaq?
Lacivərd örtülü günəş kimi sən
Başını qaçırma lacivərd göydən.
Göy üzü geyərkən lacivərd paltar,
Hər kəsə lacivərd paltar hazırlar[13].
Bu pozuq pərdədə oxuma nəğmə,
Bu duzlu torpaqdan arama çeşmə.
Kim bilir, yığıntı, bu torpaq belə
Yoğrulmuş nə qədər ürək qanılə?
Görən göz yoxdur, yox, hər yan bir məzar,
Ya maral, ya ceyran gönüdür onlar.

## İSKƏNDƏRİN MİSİRDƏN RUMA QAYITMASI

Dur, saqi, şərab ver ki, sərxoş olum!
Noğul ver, şərabla bir az xoş olum!
Elə bir şərab ver, könlümü açsın,
Girsəm cəhənnəmə od məndən qaçsın.
O meyvəli ağac olsun bəxtiyar,
Sərin kölgəsində dincəlmək olar.
Həm cana rahatlıq verər kölgəsi,
Həm bəzər süfrəni dadlı meyvəsi.
Dolğun bar verərkən elə bir nihal
Daim qalsın cavan, tapmasın zaval.

Bar verən belə bir ağacı gerçək
Rəvamı baltanın ağzına vermək?
Qış getdi, yenə də ilk bahar gəldi,
Çaylar sahilindən otlar yüksəldi.
Yenidən yamyaşıl geydi hər budaq,
Bənövşə hər müşkə ənbər qataraq,
Nərgiz də yığmaqçın haman ətirdən
Kafurtək başını qaldırdı yerdən.
Xəzinə qapısın açaraq mən də
Bir bayraq ucaltdım yaşıl çəməndə.
Yaşıllıq hatifi o gizli dilbər,
Şairlər ona şer ilhamı deyər,
Sehirli səs ilə bağırdı: Oyan!
Yaz xəzinə saçan xatiratından!
Nə yerdə zəncini əzmiş İskəndər,
Nə yerdə atına qoymuşdur yəhər?
Bu köhnə dastanı nəql edən dehqan
Keçmişi bu sayaq etmişdir bəyan:
Şaha yar olunca o böyük zəfər,
Güldü nar gülütək, açıldı güllər.
Xəzinə ağzını açdı hökmüdar,
Payladı, varlandı bütün qoşunlar.
Vuruşma yerində bir həftə qaldı,
Şərabdan çöhrələr qızıl rəng aldı.
Külək fərraş kimi, yağış səqqatək
Yolları süpürüb suvardı qəşəng.
Yollardan silindi bütün toz-torpaq,
Yol tozsuz olanda bəzənir ancaq.
Toz-torpaq yollarda yatınca yenə,
İskəndər atıldı yəhər üstünə.
"Yol verin!" deyərək coşdu təbillər,
Bayraqlar ucaldı Pərvinə qədər.
Əfrəncə dənizi, Nil sahilləri
Koç təblı səsindən oldu sərsəri.
Coşduqca dəvələr zənginin səsi
Doldu boş səslərlə beyin kürəsi.





Yollarda qumrullar səs-küy salaraq,
Cıngıraq səsindən tutuldu qulaq.
Çöllərdə axırdı o qədər əskər,
Yox idi sayını bilən bir nəfər.
Kəkliktək oynayan atı İskəndər
Minərək, dalınca tərpəndi əskər.
Bir qədər yol getdi, ordu, şəhriyar,
Ovadan geniş bir çölə çıxdılar.
Al-sarı bayraqlar vardı o qədər,
Dış-dış şəklə düşdü lacivərd göylər.
Çöllərdən dağ kimi keçir qənimət,
Yüklənmiş dəvələr çəkirdi zəhmət.
Qədərsiz cavahir yüklənmiş filə,
Yüz yerdən körpülər salınmış Nilə.
Güldü hökmüranın üzü, göz-qaşı,
Fərəhdən göylərə ucaldı başı.
Xalqa hörmət etdi girərkən Mısrə,
Şəhrə nizam verdi adəti üzrə.
Dəniz sahilində endi oradan,
O yerdə şövkətlə qaldı bir zaman.
Bayrağı nə yerə sancdı tacidar,
O yerdə abadlıq oldu bərqərar.
Sərvətlə, fərmanla uzun bir müddət
Saldı Rum rəsmilə bir çox imarət.
Qumlara qum kimi sərvət səpərək
Abadlıq yolunda çəkdi bir əmək.
Dəniz sahilində böyük İskəndər
Təzə bahar kimi qurdu bir şəhər.
Bir cənnət kimiydi - işıqlı, abad,
Hər yerdə bazarı, bağçası gülşad.
Şəhəri İskəndər tikibdir deyə
Adını qoydular "İskəndəriyyə".
Şah bina etdiyi bu gözəl şəhər
Bağdada bərabər, Mısrə bərabər.
Yunana dönməyə artıq əzm etdi.
Gəldiyi yollardan dönərək getdi.

Dənizdən keçincə Ruma dönərək,
Dünyalar əlində olmuşdu mumtək.
Hər zaman o muma etdikdə rəğbət,
Hər nə istəsəydi edərdi əlbət.
Yunanlar "afərin" dedilər ona,
Cavahir saçdılar gövhər saçına.
Padşahda görüncə böyüklük, mənlik,
Şəhərlər bəzəndi, quruldu şənlik.
Mütrüblər oxudu, qızıl saçıldı,
Xəyalə gəlməyən məclis açıldı.
Düşməni yenən şah güvəndi baxta,
Şahanə baxtıyla oturdu taxta.
Bəxtiyar dövlətin uca baxtından
Ən gözəl şənliklər qurdu hökmüran.
Zəncidən aldığı sərvətdən, maldan
Çəkisiz hədiyyə alırdı hər yan.
Dövran Rum şahına verincə dövlət,
Hər şaha göndərdi o maldan qismət.
Elə ki, Daraya yetişdi növbət,
Dəvə karvanına yükləndi sərvət.
Yoldakı yüklərin çoxu qızıldı,
Buxaraya qədər karvan düzüldü.
Mərdliklə iş gördü, tədbirlər etdi,
Köhnə ənənələr yoluyla getdi.
Dəyərli mallardan saçdı bir qədər,
Dünyada görməmiş onu bir nəfər.
Hər cür gözəl şeylər, cəvahiratlar,
Növbənöv ətirlər, ipəklər, atlar.
Saf qızıldan başqa, xalis mötəbər,
Bir xalvar müşk ilə bir sandıq ənbər,
Bir xırman ərinmiş saf gümüş lay-lay
Bir otaq saf kafur, düzülmüş tay-tay,
Ud yüklü dəvələr ucaldı dağdan,
Hər yükün təxminən vəzni yüz batman.
Bir çox gözəl qılınc, cəvahirnigar,
Zürafə dərisi kimi xalılar,





Xidmətə yarayan vücudu sağlam
Gülçöhrə kənizlər, həm igid qulam.
Fil sümüklərindən naxışlı taxtlar,
Gövhərlə işlənmiş qədərsiz tac var.
Uca fil gövdəli bir alay əsir,
Qolunda, boynunda düyümlü zəncir.
Bir çox dəvə yükü, kəsik qulaqlar,
Saman təpilmiş baş bir neçə xalvar.
Yüzlərcə döyüşən, dağ heykəlli fil,
Çarpışma zamanı ən coşğun bir Nil.
Bu əntiq şeylərlə uca İskəndər
Bir elçi göndərdi mətin, mötəbər.
Daraya gətirdi qasid naməni,
Çəkdi hüzuruna o xəzinəni.
Dara bu bəxşişdən olmadı dilşad,
Qorxdu, həsəd etdi qəlbini bərbad.
Bu qədər xəzinə, bu qədər sərvət
Heyrət doğururdu, etmirdi rahət.
Bir cavab göndərdi yersiz olaraq,
İçində kin odu alovlanaraq.
Cavabı götürüb elçilər getdi,
İskəndəri bundan xəbərdar etdi.
Bu işdən darıldı ona İskəndər,
Qəlbinə yükləndi gizlin bir kədər.
Çaldığı zəfərdən alaraq təmkin
Daraya yenə də bəsləmədi kin.
Rumların Zənciyə çaldığı zəfər,
Dünyaya yayıldı bu şanlı xəbər.
Qasidlər gəlirdi hər padişahdan,
Təbrik edirdi bu zəfəri cahan.
Tənənin qapısı bağlandı artıq,
Rumların qəlbini sardı bir şadlıq.
Acizlərə dövran olsa mehriban
Qarınca oxuyar ilana meydan.
Çox danə görərsən bu dəyirmanda,
Növbətlə üyüdür onu hər bəndə[17]

# İSKƏNDƏRİN OVDA XOŞ FAL VURMASI

Ey saqı, mübarək şərabdan doldur,
Mənə ver, igidlər dərmanı odur!
O mey bir halvadır dərdlilər üçün,
Onu atəş deyil, bəsləmişdir gün.
Dünyada axtaran adamlar hədsiz,
Biri inci arar, birisi dəniz.
Dünyada görmürəm elə bir nəfər
Öyrədən insana o salsın nəzər.
Mən kimi bülbülə gərəkdir ancaq
Qulaq tutanlardan çəkilsin uzaq.
Oxuyum nəğməmi, saz çalım həzin,
Dincəlim dərdindən çayın, dənizin.
Arabir çıxarkən bağdan dışarı,
Əlimdə çıraqtək narınc sapsarı,
Orda görməyirəm elə bir ayıq,
Mən kimə verim bu narıncı artıq?
Qaçıram dostlardan yenə bir yana,
Qaçıram yenidən haman bostana.
Seyr edim könlümü açan bağçanı,
Onunla şənlənsin könlümün canı.
Sözün dəsgahına şəkər səpənlər
Keçmiş möbidlərdən belə nəql edər:
Zənci döyüşündən olunca azad
Dincəldi tacidar, qəlbi oldu şad.
Meyl etdi bir zaman istirahətə,
Əlinə mey aldı, daldı işrətə.
Vaxtını keyfə sərf elədi bütün,
Nəş əli çalğılar dinlədi hər gün.
Xanəndə, gülgün mey, saqı, kamança
Ondan ayrılmadı gecə yatınca.
Dünyadan kam almaq onun muradı,
Heç kəs ondan gözəl həyat qurmadı.
Dünyanı şənlədən böyük İskəndər
Gecəni şənliklə edərdi səhər.
Filosoflar ilə edər məsləhət,
Dünyaya ədlindən verərdi qismət.





Ərəstu qədəhə, Əflatun cama
Təzə mey tökürdü qan dama-dama.
Şanlı bir zəfərlə dönmüşdü qeysər,
Xanəndə oxuyur yeni nəğmələr:
"Ey dövlət pənahı, gənc olsun baxtın!
Əbədi yaşasın bu tacın, taxtın!
Həyatın olduqca əlinə cam al,
Qədəhi al ələ, şərab iç, kam al!
Ərğəvan şərabdan bir büsat başla!
Şənlik qur, gəncliyə murad bağışla!
Gənclik var olduqca, iqbalın kömək,
Çalğı, mey məclisi qurasan gərək!
Qılınc meydanını qoydun bir yola,
Cam üsuliylə də məclis hazırla!
Fələk də bəndəndir, sənə yox zaval!
Qaranı tutdun da, qalmasın ağlıq.
Alaca görünmək verər yaraşıq.
Bayrağı göyə vur, cahan səninndir!
Dövlətə sarıl ki, hər yan səninndir!"
Misrin köməyindən, zənci hərbindən
Şahın qolu gücü, çöhrəsi də şən.
Zəfəri çox asan sanıb dururdu,
Xorasan mülkündən xərac umurdu.
Çıxmadı Şam ilə Rumdan bir nəfər,
Onunla çəkidə olsun bərabər.
Daraya bir daha vermədi xərac,
Əmr etdi qayıtsın göndərdiyi bac.
Coşurdu gəncliyin qızğın günləri,
Fəth etmək istərdi bütün kişvəri.
Xoş baxdı İranın igidlərinə,
Hazırlıq başladı İran fəthinə.
Adətdir, ağac boy atdığı zaman
Başqa ağaclara yetirər ziyan.
Gözəl gün seçərək şikara qoşdu,
Həm nəşəsi xoşdu, həm də gün xoşdu.
Çöllərdən keçərkən uca hökmüdar
Dağlarda, düzlərdə edirdi şikar.
Fələyi andırır möhtəşəm başı,

Gah çölü gəzirdi, gah da dağ-daşı.
Bir dağa təsadüf etdi şəhriyar,
O dağda var idi hər çeşid şikar.
Gördü iki kəklik qonmuş bir daşa,
Kəklik kəklik ilə girmiş savaşa.
Bu onun başını deşər, dimdiklər,
O bunun döşünü caynaqla dələr.
İskəndər at sürdü onlara sarı,
Nəzərdən keçirtdi iki şikarı.
Bir hesab götürdü bu çarpışmadan,
Onlardan gözünü almadı bir an.
Kəkliklər çarpışır elə hiddətlə,
Qorxmayır padşahı görərkən belə.
Şah düşüb heyrətə, aradı tədbir:
"Quşların başında bu sövda nədir?"
Birini fal vurdu uca adına,
Bəxtinin falını bağladı ona.
O biri kəkliyə ad qoydu Dara,
Nəticə almaqçın baxdı onlara.
Quşların vuruşu elədi şiddət,
Kin ilə çarpışdı uzun bir müddət.
İskəndər falını daşıyan kəklik
Daranı enərək göstərdi mərdlik.
İskəndər görüncə belə şən halı,
Zəfərə yozdu bu uğurlu falı.
Qalib kəklik qanad çaldı xuraman,
Əzilən kəkliyin uçdu yanından,
Qayaya qonmağa tapmamış macal
Kəkliyin üstünü aldı bir qartal.
Üzərək başını öldürdü quşu,
Pərişan oldu şah, dağıldı huşu.
Fal olan kəkliyin şən uçmasından
Qəlbindən silindi qorxu və duman.
Bildi ki, taleyi ona yar olar,
Daranı əzərək bəxtiyar olar.
Lakin bəxtəvərlik çox uzun sürməz,
O da bu dövrandan bir vəfa görməz.
Eşitdim, o yerdə uca dağ vardı,





Onda göy şövkətli qövsi tağ vardı.
O dağdan hər kimsə bir dilək istər,
Sirrindən haman dağ verərdi xəbər.
O sirli qayadan ucalar bir səs,
Sanki öz bəxtilə görüşər hər kəs.
Bilici bir kəsə dedi hökmüran:
Bir xəbər soruşsan o uca dağdan
Nə qədər qan axar - soruşsun onu,
Nə olur padşahın bəxtinin sonu.
O dağdan soruşdu fal üçün gedən:
"Nə olur nəticə, bir xəbər ver sən
Dünyanı alacaq böyük İskəndər?
Daranı əzərək çalacaq zəfər?"
Səsləndi əsrarlı qaya aşikar,
Söylənən sözləri eylədi təkrar.
O faldan qeysərin coşdu ürəyi,
Fal onun dağ kimi oldu köməyi.
Kədəri silindi, çox şən göründü,
O dağdan, təpədən saraya döndü.
Çəmən ortasında uca sərvtək
Oturdu məclisdə tədbir tökərək.
Gələcək işindən söz açdı qeysər,
Sülhmü ya savaşmı çox fayda verər?
"Dünyalar pənahı olsa pənahım
Fələyə ucalar qızıl külahım.
Bu şələm yeyənə xəracmı verməli?
Alçaqlıq deyilmi bu iş, nə demək!
Daraya nə üçün getsin xəracım?
Ovdan əskikmidir, xəzinəm, tacım?
Onda tac, məndə də kəskin qılınc var,
Qılıncla alınır bütün bu taclar.
Üstümə gətirsə qoşun hər yandan,
Mənə də köməkdir o böyük yezdan.
Tanrının köməyi mənə təsəlli,
Ordumsa həmrəydir, hər kəsə bəlli.
Birlikdən yaranıb zəfər döyüşdə,
Dostların birliyi gərək bu işdə.
İki qəlb bir olsa dağı parçalar,

Böyük bir kütləni edər tarmar.
Bəxtimin gücüylə qərar verdim mən,
Təxt alım, tac alım zalım düşməndən.
Daraya əlaltı olmaq nə demək?
Nə üçün Daraya xərac göndərmək?
İgidlər, söyləyin, fikriniz nədir?
Bu döyüş haqqında göstərin tədbir.
Daramı haqlıdır, söyləyin, artıq?
Şərh edin, vardırsa burda qaranlıq!"
Bu işin sonunu duyan hər nəfər
Yenidən baş əyib şaha dedilər:
"Nə qədər seyr edir ulduzlar, göylər,
Onlarla həmahəng olur dörd gövhər,
Vücudun dünyaya olsun bir çıraq,
Olsun şahın üzü aydan da parlaq.
Səndədir biliyin qüvvəti, səndə,
Xilqətin bəxtiyar şövkəti səndə.
Hara sahib olsan sən, ey tacidar,
Saçdığın toxumlar versin gözəl bar.
İndi ki, istərsən bizdən məsləhət,
Biz yeri gəldikcə verərik əlbət.
Şübhəsiz, çarpışma olacaq tez-gec,
Ancaq bu döyüşdə tələsmə sən heç.
Sən otur, qoy Dara hərb açsın sana,
Qılıncın o zaman qalxsın düşmana.
Sənə ancaq qılınc oynatmaq yetər,
Düşmənin qılıncı və başı gedər.
Bir maral aslanla çıxdı meydana,
Özü yer təmizlər zəif qurbana.
İşrətdir Daranın işi, oyunu,
Üstünə gəlməkdə qan çəkir onu.
Ordu bəsləməkdə artıqsan ondan,
Zəifdən alınır xərac hər zaman.
Sənin şəbxununu zəncilər bilir,
Onun seyrəngahı hərəmxanədir.
O bir kin bəsləyir, sən din bəslərsən,
Sən bir firiştəsən, o bir Əhrimən.
Sən qılınc vuransan, o qədəh tutan,





O taxt üstündədir, sən bir atlısan.
Sən qüvvət ölçənsən, o qızıl çəkən,
Sən adil, o isə zalım, qan tökən.
O şaşqın sərxoşdur, sən isə ayıq,
O yamanlıq edər, sən hey yaxşılıq.
Arasan ölkəni, bütün ordunu,
Bir nəfər tapılmaz ki, sevsin onu.
Etdiyi zülümlər hey yana-yana
Bir qıtlıq salacaq öz bazarına.
Səndəki nəvaziş, uca tərbiyə
Adını ucaldar yeddinci göyə.
Haqsızlıq haqq ilə olursa düşman,
Haqq tutar yerini, haqsız peşiman.
Hər zaman öz ayıq baxtından yapış,
Vuruşlarda yüksəl, taxtından yapış.
Bağlanma bu fikrə, düşünmə belə,
Dövlət mülk ilədir, nüsrət mal ilə.
İnsana baş olmaq insanlıq istər,
Yoxsa hər bir adam insandır - bəşər.
Böyüklük eyləsək hər kəsə asan,
Ancaq baş olacaq şəfqətli insan.
Heyvanlar onunçün sevir aslanı,
O, qonaq sevəndir şikar zamanı.
Qıfılı zəncirlə saxlanan vardan,
Onu yəqin et ki, xoşlanmaz cahan.
Səadət o zaman yar olar sana,
Ondan aldığını verəsən buna.
İnsanla yaşayan mərddir, kişidir,
Kimsəni sevməmək namərd işidir.
Xəmiri yoğrulmuş olan kimsəyə
Bir çörək kim verməz "borc olsun" deyə?
Rəhmin var, igidlik yaraşar sana,
Xəzinə, əjdaha qalsın düşmana.
Düşmən çox gurultu, sən şimşək rəftar,
Sən gövhər saçansan, o xəzinədar.
Aslandan güclüydü rəhmətlik atan,
Lakin qılıncını çəkməzdi qından.
Sən elə aslansan çarpışan zaman

Qılıncından olar daşın bağrı qan.
Gördünmü zəncilər nə sayaq coşdu,
Kinli divlər kimi üstünə qoşdu.
Sənin qılıncına etdi sərgəşlik,
Başını çeynədi qılınc və təpik.
O seldən dağ kimi üz çevirmədin,
Səni bu damcı da qorxutmaz yəqin.
Filləri budayan qızmış bir aslan
Qorxarmı ən aciz körpə ceyrandan?
Qızmış bir aslana neylər bir maral?
Qarışqa ilana verərmi zaval?
İti caynaq qartal edərkən şikar
Körpə quşlar ilə kef üçün oynar.
Ulduzlar bəxtinlə dostdur, bu bəlli,
Yolunun tozudur bu torpaq əhli.
Dünyanı fəth etmək qismətdir sana.
Hər fayda sənədir, ziyan düşmana.
Sənə məxsus olan bu mübarək fal
Düşmənə verməzmi böyük bir zaval?
Ulduzlarla fallar göstərir bütün,
Bu qanlı döyüşdə olarsan üstün.
Həndəsi hərflər, cizgili xətlər
Bildirir səninndir şanlı bir zəfər.
Zənci padşahı Pələngər, şəksiz,
Güclü pəhləvandı, coşğun bir dəniz.
Qaliblə məğluba bir fal vurarkən
O məğlub göründü, qalib idin sən.
İndi ki, uğurlu çıxmışdır falın,
Bundan da doğacaq mübarək halın."
Hər yerdən görüncə həmiyyət, zəfər[124],
Fatehlik fikrinə düşdü İskəndər.
Əlinə alırkən qılınc, ya qədəh
"Uğurdur" deyərək tapırdı fərəh.
Hər işdə xeyrə yaz falı, ey filan,
Mübarək fal olur xeyrə yozulan.
Yaman fal vurma ki, doğar yaman hal,
Bir kimsə vurmasın əsla yaman fal...





# İSKƏNDƏRİN GÜZGÜ QAYIRMASI

Dur, saqi, əl uzat süzülmüş lələ!
Könlümdən bulanlıq dərdi təmizlə!
O parlaq ləldən ki, reyhanlı bağ
Asar qəndilindən işıqlı çıraq.
Mübarək olursa səhərdən günün
Fikrində yaxşılıq olacaq üstün.
Onunla dəyərli ayinlər qurar,
Dövlətçin yaranır gözəl yadigar.
Öz məsud bəxtiylə yaşar qol-qola,
Ulduza fal vurar bəxtiyarlıqla.
Ümidin sönməsin dünya olsa dar,
Hər qara buluddan ağ yağış yağar.
İmdad qapısını daim qoy açıq
Ki, şirinlik alsın bir çox acılıq.
Ömrünü ümidsiz keçirmə bir an,
Qurtuluş verəndir böyük yaradan.
Ümidsiz qaş çatma, aç bir gözünü,
Zəfər güzgüsündə gör öz üzünü.
Bu rum qumaşına bəzək çəkənlər
Bu dastan başına müşk, ənbər səpər.
İskəndər dünyaya olunca açar
Qılıncından güzgü oldu aşikar.
Bəzənmək istərkən dünya gəlini
Güzgüyə uzatdı dilək əlini.
Keçmişdə güzgüdən yox idi əsər,
Güzgünü yaratdı böyük İskəndər.
Başlanınca güzgü qayırmaq işi
Qəlibə tökdülər qızıl, gümüşü.
Nə əməl etdilər vermədi səmər,
Onda üzlərini düz görmədilər.
Sonra əl atdılar hər cür gövhərə,
Hər biri göstərdi başqa mənzərə.
Elə ki, təcrübə dəmirə çatdı,
Gövhər üzərində naxış yaratdı.
Dəmirçi sənətkar rəssam olaraq
Seyqəllə dəmiri elədi parlaq.
Düzdüyü gövhərdə o rəssam artıq

Gördü hər surəti təbii, açıq.
Öncə bir şəkildə onu qurdular,.
Olmadı düzgün bir surət aşikar.
Güzgü enli olsa enlənir surət,
Uzun olsa, surət uzanır əlbət.
Dördbucaq göstərir qarışıq xəyal,
Müsəddəs göstərir bambaşqa bir hal.
Elə ki, dəyirmi düzəldi, inan,
Əsla seçilmədi xəyalla insan.
Hansı bir tərəfə çevrilsə güzgü
Göstərdi necə var, eynilə, düzgün.
Həndəsi yol ilə qara dəmirdən
Güzgünü İskəndər parlatdı birdən.
Sən də bu güzgüyə baxdığın zaman
İskəndər dövründən xəbər alarsan.
Gördüyü seyqəldən rəngini atdı,
Qapqara bir dəmir şəfəq yaratdı.
İlk dəfə güzgüyə baxdı İskəndər,
Bir əzəmət aldı gövhərdən gövhər.
Güzgüdə görüncə qeysər özünü
Güzgünün şadlıqdan öpdü üzünü.
Gəlinlər bu rəsmə ehtiram üçün
Güzgünü öpərlər baxarkən hər gün.

## DARA ELÇİSİNİN İSKƏNDƏRİN YANINA GƏLMƏSİ

Dur, saqi, o güzgü camı ver yenə,
Əlimdə tutum bir qədəh yerinə!
Keyxosrov ayinli olum o camdan,
Onunla gözümdə parlasın cahan.
Çəkinək sitəmdən, gəl zülmü ataq,
Ədl ilə mümkündür bundan qurtulmaq.
Dünyaya bağlama könül, yağıdır,
Həm quldur, həm qorxunc div yatağıdır.
Dünya damcı versə, bir qədəh çalır,
Öz köhnə borcunu bir yerdə alır.





Yağış damcı-damcı buluddan yağar,
Böyük çay olunca dənizə axar.
Nəyin var şən-şən ye, sevin bu günə,
Qoyma bir dirhəmi dirhəm üstünə.
Elə bil bir nəhəng bizə yan alınış,
Yemədiklərini əlinə salmış.
Qarun da yığmışdı böyük bir sərvət,
Bax, necə torpağa girdi nəhayət.
Qızıldan bir saray tikdirdi Şəddad,
Ölərkən almadı qəsrindən murad.
Bu bağda bir ağac bitməmiş rahət
Ki, balta dəyməyib, qalsın səlamət.
Şahların taxtına bəzək verənlər
Belə nəql edir ki, böyük İskəndər
Bir gün dincəlirdi ürəyi çox şən,
Uzaqdı dünyanın həvəslərindən.
Saf, duru şərabla şahlıq camını
Doldurur, boşaldır, alır kamını.
Hikmət sahibləri gəlmiş yanına,
Ağıl da, tədbir də köməkdi ona.
Yüz nəğmə başladı çox sədalı çəng,
Hər nazik nöqtədən söz aldı ahəng.
Şah içdiyi camın hər damcısından
Mühəndis əkirdi gözəl bir fidan[125].
Parlayan saf şərab şimşəkdən nişan,
Qədəh şəkər saçan, şərab qəlbaçan.
Çalğıdan, şərabdan, incə nəğmədən
Yarım sərxoş idi içən, dinləyən.
Qədəhin göz yaşı, çalğının səsi
Axıdır pərdədən bir qan çeşməsi.
O şirin mizrabın hər yarasından -
Quru pərdələrdən axır seltək qan.
O məclis cənnətdən daha bəzəkli,
Mayısdan daha şux, daha çiçəkli.
Məclisin başında böyük İskəndər
Göydə bədirlənmiş bir aya bənzər.
Daradan bir elçi gəldi bu zaman,
Ürəkli, daşqınlı, dilli, qəhrəman.

Şahpərəstlər kimi göstərdi hörmət,
Onu və Daranı öydü nəhayət.
Adlı qəhrəmana etdi çox səna,
Daranın əmrini yetirdi ona.
Öncə öz şahından salam yetirdi,
Köhnəlmiş xəracı dilə gətirdi:
"Neçin şah əsirgər gövhəri, tacı,
Çoxdandır verməyir bizim xəracı?
Məndə bir acizlik görmüşmü? Nədən
Başını qaçırmış pərgar xəttindən?
Köhnə adətləri atsa boynundan,
Sərkəşlik edərsə, çəkəcək ziyan".
İskəndər alovlu şimşəktək çaxdı,
Qəlbinin atəşi dilini yaxdı.
Əyildi qaşının kaman guşəsi,
Qorxudan elçinin söndü nəfəsi.
Elə ki, eşitdi bu kinli sözü,
Dımağı odlandı, parladı gözü.
Acığı dilinə edincə əsər,
Söylədi qasidə yaramaz sözlər.
Şahın gözlərindən qəzəb yağırdı,
Qasidə dediyi sözlər ağırdı.
Düşüncəsi, ağlı sağlam olan kəs
Lüzumsuz sözləri söyləməz əbəs.
Qızışanda dili səbr etsə bir az
Tutduğu işindən peşiman olmaz.
Min-min sərrast sözə tapsa da zəfər,
Susmaq söyləməkdən çox fayda verər.
Nə gözəl söyləmiş qoca bir ərən:
"Dil ətdən yaranmış, qılınc dəmirdən".
Sözünün mülkünə olmaz hökmüran
Dilinə gələni söyləyən insan.
Kəyana mənsub ən qoca bir nəfər
Həmin hadisəni belə nəql edər:
Qiymətli qılıncdan, gövhərdən, tacdan
Daranın xəracı getdiyi zaman,
Dəyərli gövhərlər içində, hətta,





Varmış bir təbii, qızıl yumurta.
O incə naxışlı şahanə büsat
Verərdi görənə təzə bir nişat.
Dilini o qasid edincə polad,
Köhnəlmiş xəracı eləyincə yad,
Bağırdı: "Möhkəmdir başımdakı tac,
Qızmış bir aslandan alınmaz xərac.
Başqa bir ayinə girmişdir cahan,
Qalmamış o qızıl yumurta doğan.
O köhnə büsatı bu dövran sildi,
Keçmiş ayinlərə qələm çəkildi.
Hər zaman cəvahir çıxarmı daşdan?
Dünya gah sülh istər, gah vuruş, gah qan.
Bu qədər qürurla çəkmə boş nəfəs,
Qılıncla cavab ver, danışma əbəs.
Yetməzmi qılıncım qan dama-dama
Taxtını çəkməmiş mənim altıma?
Mənim də var ikən qılıncım, taxtım,
Lakin bu dünyanı sənə buraxdım.
O qədər səndə var cəlal, təmtəraq,
Mənə də belə bir guşəni burax.
O yerə yetirmə "gücüm var" deyə,
Səninlə çarpışım pəncə-pəncəyə.
Ataraq hörməti, rəsmi, həyanı
Kinimlə coşdurum qəlbimdə qanı.
Şah eşitmədimi edərkən savaş
Qopardım zəncidən mən nə qədər baş?
Bir at çapmağımla getdim mən hara,
Atdım dikbaşları toz-torpaqlara.
Bir şah ki, şahlara verir taxt və tac
Miskinlər kimi heç verirmi xərac?
Məndən Misri istə, istəmə gövhər,
Misir qızılıtək sözə ver zivər.
Bax, sərvət, dövlətim qalxmış nə yerə,
Tələb et məndən öz rütbənə görə.
Qaldırma fitnəni, coşdurma kini,
Gəl, viran eləmə İran mülkünü!
Çatmışdır əlinə böyük məmləkət,

Şükr elə, yetməzmi bu qədər dövlət?
Zamanın meylini gəl dolandırma,
Bu fikrə qələm çək, su bulandırma.
İstəmə verilməz şeyi, padişah!
Rəftar et, necə ki, edir iki şah".
Qasid eşidincə bu sərt xəbəri
Zehnindən silindi bütün sözləri.
Dərgaha üz qoydu dərdlə, möhnətlə,
Atəşli şimşəkdən daha sürətlə.
Elə ki, açıldı qasidin dili,
İkiqat büküldü o sərvin beli.
Bu ağır cavabı eşitdi Dara,
Bağrını dəldi ən kinli bir yara.
"Kimdir o sikkəsiz, cəsarət etsin,
Dara sikkəsilə rəqabət etsin?"
Kinindən o andı bir neçə dastan,
Saraldı eşidən kəslər qorxudan.
Zəhərli gülüşlə dolaraq kinə,
Dedi: "Bax bu azğın çərxin işinə,
Bu zülüm deyilmi edir fələklər?
Daraya kükrəyir miskin İskəndər.
Qaf dağı olsa da, gözünü silsin,
O kimdir mənimlə çarpışa bilsin?
Bir tərlan yanında bir çibin nədir?
Coşqun bir dənizdən kiçik qətrədir."
Başqa bir qasidi göndərdi Dara,
Kin ilə gözünü dikdi yollara.
Qasidə tapşırdı bir top, bir çövkan,
Bir çuval küncüd də verdi ərməğan[176].
Hədiyyə sirrini öyrətdi ona,
Sevindi qurduğu incə oyuna.
Daranın verdiyi tapşırıqları
Bilərək, üz qoydu Yunana sarı.
İskəndər qəsrinə basınca ayaq
Atəşdə mum kimi şölə saçaraq,
Ədablə qeysərə baş əydi öncə.
Pərəstiş və ayın başa gəlincə





Söz düyümlərini sürətlə üzdü,
Söylənən sözlərdən bir inci düzdü:
"Canlara hakimdir fərman verənlər,
Buyruq qullarıdır göndərilənlər.
Şövkətli padişah versə hər əmr,
İtaət eyləmək bir vəzifədir".
İskəndər bildi ki, bu üzr istəyən
Ağır bir fərmanla gəlmiş yerindən.
Acıqlı gülərək dedi: "Ərz qıl!"
Qasidin dilindən açıldı qıfıl.
Qasidin Daradan gətirdiyi mal
İskəndər önündə qoyuldu dərhal.
Elə ki, mətahı ortaya saçdı,
Daranın əmrindən qasid söz açdı.
Başladı çövkandan, topdan əvvəlcə
"Uşaqsan, sənə top olsun əyləncə,
İstəyin mənimlə çarpışmaq olsa,
Qəlbinə boş yerə sıxıntı dolsa,
Küncüdü saraya səpərək durdu,
Qarşına çıxarram bundan çox ordu".
Dünyanı sarsıdan böyük İskəndər
Gördü bu fallarda şanlı bir zəfər.
Bir məsəl çəkdi ki, qaçdığı zaman
Hər şeyi qarşına çəkər bu çövkan.
Onunçun göndərmiş Dara çövkanı
Özümə çəkim bu köhnə dünyanı.
Yuvarlaq bu topu hər heyətşünas
Yerin kürəsiylə eyləmiş qiyas.
Şəhriyar onunçun göndərmiş bunu,
Çövkanla qazanım onun topunu.
Daranın fikrini bilincə salar
Kinini küncüddə etdi aşikar.
Küncüdü dağıtdı evə, eşiyə,
Quşları səslədi, dənləsin deyə.
Darıya daraşdı saray quşları,
Qalmadı bu yerdə bir dənə darı.
Bu cavabda elə qatı məna var,

Küncüdün yağını sıxıb çıxarar.
Küncüddən çox olsa Dara qoşunu,
Mənim də quşlarım dənləyər onu.
Üzərlik doldurdu kiçik çuvala,
Qasidə verincə dedi: "Çıx yola[127],
Dara küncüd qədər çıxarsa ordu,
Mənim də ordumun qədəri, bax, bu!"
Qasid İskəndərdən eşidib bunu,
Yüklədi ulağa ağır yükünü-
Daraya Yunandan gətirdi cavab,
Bu ağır cavaba kim gətirər tab?
Daranın cavabdan qızardı gözü,
Çünki çox güclüydü düşmənin sözü.
Ədavət bağladı hiddətlənərək,
İranın xalqından istədi kömək:
Çin, Xorəzm, Ğəzneyn, Qur mahallarından,
Yer dəmir kəsildi heyvan nalından.
Bir ordu düzəltdi Qaf dağı qədər,
Hamısı daş, dəmir çeynəyən əjdər.
Bu böyük orduya san verən zaman,
San verən qalmışdı bu işdə heyran.
Döyüşkən ərlər ki, at oynadırdı,
Təxminən doqquz yüz minə çatırdı.
Böyük şəhriyarın böyük ordusu
Bir coşğun dənizdi, yoxdu qorxusu.
Kin ilə Yunana doğru yol açdı,
Keçdiyi yerlərdə bayquş ulaşdı.
Axdı dəniz kimi Ermənistana,
Gülək də çatmadı onun tozuna.
Ölkələr aşırdı Yunana qədər,
Qurular titrədi, coşdu dənizlər.
O dikbaş atların polad nalından
Çöllərdə otlardan qalmadı nişan.
Günəş də düşsəydi şahın ardına
Qalardı gəzdiyi yerlər virana.





# DARANIN İSKƏNDƏRLƏ MÜHARİBƏYƏ QOŞUN ÇIXARMASI

Ver, saqi, ruh verən parlaq şərabdan,
Ondan işıqlansın qəlbim hər zaman.
Mən onu içərsəm verər səadət,
O məni yeyərsə doğar fəlakət[128].
Ayıqlıq nə böyük dövlətmiş, bilsən
Əliboş olmamaq dünya nəqdindən.
Dünyada o şəxsin ucalar başı
Çox sayıq davranır hər işə qarşı.
Şüurla ölçər bu həyat yolunu,
Oğrudan qoruyar öz var-yoxunu.
Bir şey ki, işini edəcək asan
Yükündən götürüb atma heç zaman.
Əskiklik versə də atma kürkünü,
Səni qar, soyuqdan saxlar qış günü.
Gədikdə bir eşşək öldü soyuqdan,
Çulsuz çıxmış idi o tənbəl heyvan.
Keçən padşahları öyrənmiş bir pir
Soruşan kimsəyə belə nəql edir:
Dara ordu çəkdi Ermənistana,
Sanki bir qiyamət çökdü hər yana.
İskəndər bu işdən tutmadı xəbər,
Qarşıya çıxarsın qızğın bir məhşər.
Məzlumlar axaraq gəldi hər yandan.
Dedilər: "Coşğun sel qoparır tufan"
Daranın ordusu edərkən səfər
Polad geyimlərdən qaraldı yerlər.
Bir casus söylədi: "Düşmən sərxoşdur,
Durduğu yerlərdə qafil olmuşdur.
İskəndər bir basqın etsə qəflətən
Bir anda çıxarar onu mülkündən".
İskəndər gülərək söylədi cavab:
"Gizlində qalmağı sevməz afitab.
Yararmı döyüşdə böyük İskəndər
Adı quldur kimi qazana zəfər?"
Başqa bir casus da belə dəm vurdu:

"Düşmənin gətirir hədsiz bir ordu.
Qoşun işlərini mükəmməl bilən
Ancaq saya bilər onu təxminən".
Ən qısa bir cavab verdi İskəndər:
"Bir qılınc yüz öküz bağrını dələr.
Acıqlı canavar - o kinli heyvan
Qorxarmı qoyunun çox olmasından?"
Uca şəhriyarın mətin sözləri
İnandırdı buna hər bir əskəri.
Get-gedə böyüdü bu qızğın xəbər,
Ölkəyə yaxındır o qorxunc əjdər.
İskəndər bildi ki, o bir buludtək
Gələcək, qılıncı saçacaq şımşək.
Bütün ölkələrə göndərdi xəbər:
"Durmadan dərgaha yığılsın əskər!"
Rumdan, Əfrəncədən, Misirdən, Rusdan
Bir ordu bəzədi gəlindən rəqsan.
Ordu toplanınca uca İskəndər
Əmr etdi sayından verilsin xəbər.
Sayçılar məlumat verdi padşaha:
Altı yüz min əskər gəlmiş dərgaha.
Hər yandan yığışıb gəlincə ordu
Çalğısız, içkisiz bir məclis qurdu.
Aqillər yığılıb uca dərgaha
Verdilər diqqətlə qulaq padşaha.
İskəndər söz açdı bütün işlərdən,
Daranın açdığı o döyüşlərdən:
"Şübhə yox,- dedi,- o, adlı tacıdar
Bizimlə döyüşə vermişdir qərar.
Hərb üçün, sülh üçün fikriniz nədir?
Düşmən çox yaxındır, göstərin tədbir.
Çıxmasa bu kəskin qılınc qınından,
Bizə kişi deməz bir nəfər insan.
Tac-taxt alarsam qoca Daradan
Zalım adlanaram bununla da mən.
Qıymaram çıxsın öz mülkündən Dara,
Yamanlıq etmərəm mən Kəyanlara.
Çünki qorxuram bu əməlim bu gün





Düşməni çıxarsın bizlərə üstün.
Bu yolda düzgün bir tədbir göstərin,
Sonunda işimiz olmasın çətin.
Düşünüb söyləyin sağlam bir fikir,
Bu döyüş haqqında fikriniz nədir?
Bilikli, şüurlu, ayıq, hünərvər
Başçılar diqqətlə çox dinlədilər.
Hörmətlə hamısı dil tökdü ona,
Padşaha etdilər çox dua, səna:
"Uğurlar doğsun bu yaşıl ağaca,
Kökləri möhkəmdir, adısa uca.
Taxtınla, tacınla dünya qurulsun,
Qapında düşmənin başı tac olsun.
Doğrudur tamamən şah buyuranlar,
Bir də biz onları edəkmi təkrar?
Ömrindən dönmərik, sözün fərmandır,
Padşahın yolunda canlar qurbandır.
İndi ki, sorursan, ey dana, zəki,
Bizim fikrimizə belə gəlir ki,
Kinli bir ürəyə kin dolan zaman
Keçdiyi yollarda göyərər tikan.
Sən də kin odunu eylə şöləvər,
Kin yaxan bir atəş tikan təmizlər.
O, qoca söyüddür, sən gənc sənubər,
Söyüdlə sənubər olmaz bərabər.
yenidən abad et bu köhnə bağı,
Torpaqdan təmizlə köhnə alağı.
Bu təzə dövlətin al qumaşından
Gəlintək bəzənsin o köhnə cahan.
Şübhəsiz zalımdır amansız düşmən,
Xalq boyun qaçırır onun zülmündən.
Elə bir düşməndən niyə qorxursan,
Evinin içi də özünə düşman
Zülmün ayınına birdən çək qələm,
Xalqının qəlbindən silinsin ələm.
Düşməndən məmləkət doymuşdur cana,
Atıl üzərinə mərdi-mərdana.
İsti təndir artıq çörək istər, dur,

Atının başına odlu yüyən vur.
Baş qoyarıq hara sən ayaq qoysan,
Bizdə yox əmrindən boyun qaçıran,
Sənin istəyini kim poza bilər?
Əmrindən çıxmağa kimdə var hünər?"
Sözləri bununla bitirdi: "Ancaq
Sən bu qan tökməyə qoyma ilk ayaq,
Kəyanın taxtına göstər sən hörmət,
Öncə qan tökməyə gəl etmə cürət"
Hamının fikrini şah öyrənərək,
Bildi sərkərdələr edəcək kömək.
Doğrular sözünü tutaraq getdi,
Ordu yetirməyə o gün əmr etdi.
Dövr edən günlərdən seçərək bir gün,
Uğurlu taleyi olurkən üstün
Mübarək fal ilə andı səfəri,
Orduya verildi hərəkət əmri.
Kəməri belində kin ilə sıxdı,
Parlayan yüyəni aydan işıqdı.
Qızmış aslan kimi etdi tacidar
Qılıncı dünyanın fəthinə açar.
Neştərli arıydı qaynaşan ordu,
Arı pöhrəsindən artıq idi bu.
Firidun padşahdan yadigar qalan
O uca Dirəfşi tanırdı çoxdan.
O uğurlu bayraq düzələn zaman
Nazlardı dostunu bu qoca dövran.
Bayrağı "Dirəfşi-Gavə"dən yüksək
Çəkdi mahlıcına göy rəngli ipək.
Tam əlli arşındı uca sütunu.
Zinət öz qoynunda bəsləmiş onu.
İpəyin üstündə müdhiş əjdaha,
Baxanlar qorxudan baxmaz bir daha.
Qıvrıcıq qara bir qotaz başında,
Sanki bir buluddur dağın qaşında.
Bir qara qartaldı, qanadı nurdan,
Görürdü onu hər uzaqdan baxan.
Tərpəndi əjdaha heybət əskərlər,





Başında əjdaha peykər İskəndər.
Dünya bu şurişdən dəhşət alaraq,
Nə üçün? - Bir ovuc torpaqçün ancaq!
Hiyləgər dünyaya aldanma, burax,
Qurdu aslanlıqla olur bağlamaq.
Qapaqlı xonça bil köhnə dünyanı,
Gah halva yedirir, gah ciyər qanı.
Yer çuxur, göy isə uca və parlaq,
Biri qan teştidir, o biri torpaq.
Hər teştin üstündə yazılmış çoxdan
Siyavuş qanıtək bir çoxlu dastan.
Bir məhsul verər bu dünyanın bağı,
Al qana batırır bütün torpağı.
Bu teştə kimsənin girməz naləsi,
Köməyə buraxmaz bu yol heç kəsi.
İndi ki, fəryada yetişməz bir kəs,
Kömək istəyənlər çıxarmasın səs.
Səsinə pərdənlə çək mətin hasar,
Sakit bir yaşayış eylə ixtiyar.

## DARANIN SƏRKƏRDƏLƏRİ İLƏ MƏSLƏHƏTİ

Dur, tövbə yandıran odu al, saqi,
Başıma o meylə atəş sal, saqi!
Xoşdur bu məclisdə parlasın günəş,
Şam kimi başımda yansın bu atəş.
Aqillər kam alır yaxşılıqlardan,
Tanrı köməyinə sığınır hər an.
Ədalət mülkündən kim üz çevirsə,
Ona aqil deməz ağıllı kimsə.
İnsana bu ağıl gözəl qonşudur,
Heyif ki, pislərlə oturur, durur.
Ağılsız kəslərlə oturub duran
Ağıldan, şüurdan deməsin dastan.
Koxanın əlindən olanlar azad
Bu kənddə ev tikib düzəldər abad.
Sən də bu yükünü boynundan atsan
Qorxmazsan hər alçaq boyun vurandan

Ancaq öz varınla ol coşğun ümman,
Götür öz faydanı öz varlığından.
Özünə ölüncə özün ol qonaq,
Ağac ol, özündən doğur qol-budaq.
Yedi özgə malın barama qurdu,
Nazildi barmaqtək, yediyin qusdu.
Ən qoca bir möbid rəvayət edir,
Ağıllı kəslərə hekayət edir:
Rum şahı gedirdi böyük şövkətlə,
Qılıncla, qoşunla, varla, dövlətlə.
Hər yerə yayıldı bu qızğın xəbər:
Rum elindən gəlir qorxunc bir əjdər.
Daranın məhvinə hazırlanaraq
Hər çeşid silahla qaldırmış bayraq.
Bu xəbər bayramtək sardı hər yanı,
Çünki yaxmış idi Dara dünyanı.
Bir sözlə, məmləkət, əhali, ölkə
Zalımın əlindən gəlmişdi təngə.
Daraya hər ölkə bəslərdi nifrət,
İskəndərə isə məhəbbət, hörmət.
Bu işdən Daraya verdilər xəbər,
Dənizdən dalğatək keçdi İskəndər.
Sınaqlı kəsləri çağırdı Dara,
Ağıllı başlardan istədi çara.
Nə sayaq girişsin düşmənlə hərbə,
Düşmənə nə sayaq çalsın qələbə?
Nə tədbir göstərir qoca rəhbərlər?
Döyüşdə basılsın rumlu İskəndər.
Görmüşdür enərkən düşmən ordunu,
Döyüşün taleyi qorxutdu onu.
Dərdinə bir çarə demədi bir kəs,
Kimsədən çıxmadı bu barədə səs.
O məclis bilirdi: Dara sərkəşdir,
Yaxmaqda amansız, qızğın atəşdir.
Kimsənin sözünü tutmaz, dinləməz,
Onunçun durmuşdur dinməz-söyləməz.
Məclisdə vardı bir adlı pəhləvan,
Həsəbı, nəsəbı, Zəngə-Şaviran,





Adı Fəribərzdi, gövdəsi bir dağ,
Vücudu poladdı, qolu bir çomaq.
Məclisə çağrılmış bu igid kişi
Gözəlcə bilirdi bütün keçmişi.
Daranın taxtına etdi çox səna:
"Uğurlu məclisin yar olsun sana,
Dünyada hər zaman anılsın adın,
Fələk dövr etdikcə gülsün muradın.
Keçmişdə eşitdim ulu babamdan,
Nəsihət yolunda etmişdi bəyan.
Keyxosrov dünyadan edərkən səfər
Cavahir camından vermişdi xəbər[129].
Yaxın bir zamanda dövlətin taxtı
Alçalar və sönər ulduzu, baxtı,
Rum elindən çıxar müdhiş bir sərkəş,
Hər atəşgədəyə vurar bir atəş.
Bu İran büsbütün mal olar ona,
Qürurla oturar Kəyan taxtına.
Durmaz bir ölkədə, cahan fəth edər,
Bir zaman özü də məhv olub gedər.
Həmən şəxs olmasın rumlu İskəndər?
Bu düşmən olursa, ondan et həzər.
Adını buza yaz, bizim torpağa
Qoyma bu düşməni ayaq basmağa.
Ondan bu ölkəmiz görməsin ziyan,
Xəzinə yolunda yoxsul verər can.
Bir hiylə qurmalı, itaət etsin,
Yalnız Rum mülkünə qənaət etsin.
Xoş hiylə acıqdan xoşdur hər zaman,
Su səpmək yaxşıdır atəş yaxmaqdan.
Hər zaman qolunun gücünü yoxla,
Tərəzi gözünü bərabər saxla.
Elə iş görmə ki, doğsun sənə kin,
Dəmirə tez təsir etsin sükahın[130].
Aslanlıq heybəti getsə aslandan
Başını bir qatır əzər o zaman.
Dünyanı namusla olur saxlamaq,
Onunla ucalır dövlət və bayraq.

Baş qoşma onunla, iş keçər, gedər,
Dara rütbəsilə böyüklük edər.
Qızıl öz vəznının versə arpaya
Qızıl qiymətiylə çıxar ortaya[131].
Çox zaman yırtıcı qızğın bir aslan
Torpağa sərilir incə tikandan.
Əqrəblə bağlasan düşmən kimi kin,
Baxma çox ucadan, olma çox əmin.
Neştərli çibindən gəl qorun sən də,
Nəmruda əmr etdi: "Mənə ol bəndə!"
O şəxsə ram olmuş dünya əzəldən,
Döyüşdə mərdliyi vermənmiş əldən.
Tox ilə ac kabab yesə bir yerdə,
Tox adam kababdan düşəcək dərdə[132].
Hətta öz qadının, övladın olsa,
Parçalar, ortaqlı paltarın varsa.
Oğlunun boyuna gəlsə paltarın,
Məhəbbət gözləmə, gedəcək varın.
Olduqca boy atsa yeni bir fidan,
Sərv ondan, şübhəsiz, görəcək ziyan.
Yaramaz böyüklər sözündən qaçmaq,
Ağıllı sözlərə çevirmə yarpaq!
Dünyanı təcrübə etdikcə bir-bir,
Söylənən bu sözlər bilərsən nədir!
Nəsihət eşitsə çarə arayan
Dərdinə bir açar tapar hər zaman".
Daranın ağıllı pirin sözündən
Heyrətli şımşəklər çaxdı gözündən.
Ancaq söndürmədi o, qızğın kini,
Çox alçaq göründü sülhün ayını.
Qocanın sözündən sarsıldı bir an,
Torpaqda qıvrıldı sankı bir ilan.
Qaşları çatıldı, heyrətə gəldi,
Qəlbində kin coşdu, gözü bərəldi.
Aslan kimi baxdı qocaya birbaş,
Qorxudan vəznini itirərdi daş:
"Kövrək bir dəmirçi gördün məndə sən?
Ondakı poladı bəyəndin nədən?





Qüvvətli söz açma hey nədir bu Rum!
Odlu dağ yolunu bağlamaz bu mum.
Şahinlər güllənsə, kəkliklər coşsa,
Şahinlər şahını batmazmı yasa?
O kimdir hərb üçün bağlayım kəmər,
Min kəmərbəstəm var ondan mötəbər.
O miskin qorxağın gördüyü hünər
Aslana naz edən ceyrana bənzər.
Şahların tacında qızıl tacam mən,
Namərdəm, qorxsam bir rumlu miskindən!
O, qafil yuxudan ayılan zaman
Şişə çəkmiş olar ətini aslan.
Yumurta ağırdır, bərklik var onda,
Ancaq tab gətirməz çəkic altında.
Bunu kim bilərdi, dünənki uşaq
Böyüklə bəd rəftar edən olacaq?
Birinci qədəhdə qanar o dəni
Mənim şövkətimi, həm öz səhvini.
Mənə ar deyilmi belə sürünmək,
Miskinlər yanında aciz görünmək?
Zəhərlər içinə qərq olsam, inan,
Nəhəng qurbağadan diləmməz aman.
Harada görünmüş aciz bir yunan
Belə bir gəmini çıxarsın sudan?![133]
Günəşin taxtını çevirə bilməz,
Cəmşidin yerini o verə bilməz.
İranı yıxmağa ucaltsın bayraq,
Keyxosrov taxtını bacarmaz çalmaq.
Kəyan şövkətini gərəkdir bilsin,
Qədəminə görə irəliləsin.
Nə itdir o qorxaq tülkü, saymadan
Qızmış bir aslana yetirsin ziyan?!
Aslan artığını tülküdür yeyən,
Bulud ağlamasa gülərmi çəmən?
Əliboş adamlar olarmı maldar?
Hansı bir ayaqla qaçar çolaqlar?
Məndədir, bilirsən, həm şövkət, həm şan
Kim deyər acizəm rumlu uşaqdan?

Sərxoş qulamlara döydürrəm onu,
Çobanlarım qırar onun qolunu.
Bir aslan köpəkdən qorxarsa, bişəkk,
Ona şıllaq atar qoca bir eşşək.
Qartal bir çibini sansa əjdaha
Qalxmasın düşdüyü yerdən bir daha.
Qoca bir tülküdən qorxarsa aslan,
Beynini oxla, dəl, heç vermə aman!
Yaxında gücümü bildirrəm ona,
Ataram başını ayaq altına.
Kimdir bu bac verən rumlu İskəndər,
Uca tacidarla olsun bərabər?
Kəyan taxtı olmuş mənə müyəssər,
Başımda tacım var, belimdə kəmər.
Heç kəsdə hünər yox eyləsin cür ət-,
Babamın yurdunu almağa niyyət.
Kəyanın külahı Kəyana yarar,
Bu xəzin içinə sığarmı rumlar?
Bəhmən nəslindənəm, Keyxosrov babam,
Namərdəm arxasız rumludan qorxsam.
Bir babam Ruyintən İsfəndiyardır,
Bu taxt ondan mənə bir yadigardır.
Dönməzsə fikrindən keçmiş yoluna
Qaranlıq olar bu işıq - gün ona.
Girsə dənizimə gəmisi əgər,
Başını ayağım altında görər.
Cavabım acıdır, acı dənizdən
Ataram torpaqdan dənizlərə mən.
Elə sel axıdım qanlı buluddan,
Əli də günəşə çatmasın bir an.
Kin, inad edən bir kəndlidən, ancaq
Sülhlə yox, ölümlə xoşdur qurtulmaq!
Eşşəyə yəhər yox, yaraşır palan,
Yükünü onunla daşıyar aslan.
Mən ucaltmışam bu ovun boynunu,
Yenə mən salaram kəməndə onu.
Ey başı çürümüş qoca pəhləvan,
Daraya belə xor baxışdan utan.
Olmaz söz atını belə oynatmaq,





Qocaman bir dağı kəməndlə tutmaq.
Səhrada çırağı yaxmaq nə gərək,
Sınanmış fələyə şahlıq öyrətmək?
Gövşəmə, çıxma öz həddindən kənar,
Hər çeşid gövhərin başqa yeri var.
Hər kəsin əyninə uymasa donu,
Demək, özgələrdən almışdır onu.
Qocalıq yerindən oynatmış səni,
Çürütmüş fikrini, yemiş beynini.
Arxana yorğunluq çökmüşdür, ey pir,
Nizə yox, sənə bir əsa gərəkdir.
Qocalanda ağıl olar pərişan,
Bütün bilikləri çıxar yadından.
Qocaya yalnız bu iki şey yarar,
Birisi ibadət, birisi məzar.
Dünyanı burax bu igid gənclərə
Qocaldın, ortadan çəkil bir kərə!
Bir zəif-qocadan umulmaz pənah,
Nə kömək edəcək qırıq bir silah?
Orduya igidlik yaraşır. Qoca
Sülhə bir yol arar döyüş qızınca.
Hər söz öz-yerində olur çox gözəl,
Çünki nar bar verməz vaxtından əvvəl
Hər vaxtsız banlayan xoruzun gərək
Durmadan başını bıçaqla kəsmək.
Dilini bağla ki, əldə qalsın baş,
Dil quru olarsa, boğaz olmaz yaş[144].
Qan ilə islanmış dilsiz bir başdan,
Şübhə yox, yaxşıdır başsız bir insan[145].
Dilini ağzında saxla daima,
Yersiz heç bir zaman nəfəs çıxarma
Dil dimaq evində otursun gərək,
Bəxtiyar yaşasın, gülsün hər dilək
Düzlükdə ad almış çəkinin dili,
Milindən bir yana əyilməz beli.
Milindən azacıq aşağı ensə,
Enər baş aşağı bir az tərpənsə
Elə söz vardır ki, yaramaz demək,
Başqa bir dil ilə söyləmək gərək

Onu incə-incə söylərkən bir-bir
Ondan hər eşidən alar bir təsir.
Xüsusən şahlara sözü yonaraq,
Ölçərək deməli, həm də çox yumşaq".
Daranın acığı edincə tüğyan,
Qoca üzr istədi, oldu peşiman.
Padşahlar işində qaynaşır qorxu,
Kimsənin şahlarla tutmaz dostluğu.
Kini cuşa gəlsə, acıqlansa şah,
Rəhm etməz, oğlu da olsa o hərgah.
Padşahın tinəti atəşdir, ancaq
Yanğına yaxşıdır uzaqdan baxmaq.
Padşaha o zaman öyüd bar verər,
Yolunu qürurdan, kindən təmizlər.
Padşaha nəsihət verən bir insan,
Toxumu şor yerdə səpmiş o nadan.
Daraya dəyərli nəsihət verən
Bildi ki, şah qızmış nəsihətindən.
Sözünə başqa bir cərəyan verdi,
Dadlı bir dil ilə şahı dindirdi:
"Şübhə yox, dünyada bir sənsən Dara,
Düşmənin nəyi var, səndədir dara!
İskəndər kimdir ki, atını çapsın,
Daranın başından külahı qapsın?
Sənə bu külahı tikmiş yaradan,
Ulduzdur sənə bu çırağı yaxan.
Dağın qapısına çıxarsa kəsək
Daş ilə əzilər quru torpaqtək.
Atsa qabaq kolu uca qol-qanad,
Çinara tay ola bilərmi, heyhat!
Qabaq suyu içib doyduğu zaman
Kəndirlə aşağı enər ağacdan.
O da bir qabaqdır başı ucalmış,
Boynuna otlardan bir kəndir salmış.
Otlardan toxunmuş ip də qırılar,
Dolçası qırılıb quyuda qalar.
Günəş məşəlindən işıqlansa bağ
Pərvanə yerinə can verər çıraq.
Aciz, topal tülkü döyüş günündə





Nə iş görə bilər aslan önündə?
Qaşında düyümü iki yana vur,
Kamanın düyümü yanlardan xoşdur.
Dünyanı tədbirlə əlinə gətir,
Bu işdə tələsmək nəyə gərəkdir?
Bir çıraq salmazsa qızğın alovlar,
Nə özü, nə də ki, pərvanə yanar.
Od təndir içində, xəmirsə gəlmiş,
Çörəkdən ağıza çox yol deyilmiş.
Hər bəndin açarı səbrdir, inan,
Səbrli kimsələr olmaz peşiman.
Ziyandır uduzmaq belə şahmatı,
Çapdırmaq nə gərək "fil" ilə "atı"
Mizraba barmaqlar hələ yatmadan,
Çox çalğı qırılmış ağır yaradan.
Sən şahsan, səndədir şövkət, təmtəraq,
Belə bir hesabı kimdən aramaq?
Daraya hörmətçin qoca pəhləvan
Söylədi bir neçə dəyərli dastan.
Daranın ürəyi, beyni atəşdi,
Bu dadlı söhbətlər gözündə heçdi.
Acığı, atəşi sönmədi yenə,
Od vurmaq istədi sözün məğzinə.
Dara katibinə əmr etdi belə:
"Müşk ilə ipəyi, durma, al ələ".
Katibi sür ətlə qələmi götürdü,
Dara deyənləri yazıb bitirdi.
O, şəvə qələmi oynatdı şən-şən,
Manini, "Ərjəng"i saldı qiymətdən.
Bir məktub yazdı ki, olduqca dilbər,
Məzmunu cənnətin bağçası qədər.
Sözləri polad bir qılıncdan kəskin,
Lisanı, üslubu incə və mətin.
Katib o qiymətli məktubu yazdı,
Dara imza atdı, möhrünü basdı.
Daradan şahlara məktub aparan
Oldu İskəndərin yanına rəvan.
Məktubu verincə, açdı sür ətlə,
Katibə oxutdu başqa diqqətlə.

## DARANIN İSKƏNDƏRƏ MƏKTUBU

"İnsanı biliklə daim ucaldan
Ən adil, ən böyük tanrı adından.
Elə bir tanrı ki, əl tutar, bəslər,
Tək ona sığınar çarəsiz kəslər.
İşıqlı ulduzu göydə parladır,
Bu qara torpaqdan insan yaradır.
Hər işdə bilikli, güclü, bacaran,
Müstəhəqq olanın keçir suçundan.
Hər ruha ondadır hərarət, işıq,
Hər əqlə o verir qüvvət, yaraşıq.
Birinə dövranı tutur elə təng,
Təknədə tapmayır bir parça çörək.
Birinə dağ kimi xəzinə verər,
Çəkidə dağ olmaz ona bərabər,
Nə yoxsul suçundan çəkmiş bir ziyan,
Nə hünər göstərmiş xəzinə tapan.
Nə istərsə onun əlindən gəlir,
Yaratmaq, öldürmək onunçun birdir.
Hökmündən olurmu qurtarmaq yaxa?
Bir hakim tapılmaz ona tay çıxa.
Olsun haqq salamı elə bəndəyə
Acizlik göstərir aciz kimsəyə.
Nə fayda nakəsə demək afərin,
Sanar afərini böyük bir nifrin.
Düşmənin olsa qan içən zülmkar,
Nəzakət göstərsən acizlik sanar.
Xoş məsəl vurmuşdur igid bir kimsə:
"Əlaltı olma bir əlaltı şəxsə."
Sən, ey xam fikirli, sınaqsız uşaq,
Aslanla çarpışma, inadı burax,
Mənimlə döyüşdə zor pəncən hanı?
Köməyin, qoşunun, sərkərdən hanı?
Səndə əqrəb, ilan xasiyyəti var,
Nəhənglə döyüşə yoxsa kim çıxar?
Əjdaha qılıncım məhv edər səni,
Gəl burax bu ilan təbiətini!





Üstünə qılıncla kükrəsəm, yəqin,
Ya ölüm, ya qaçmaq olar qismətin.
And olsun atəşə, "Avest"ə, "Zənd"ə,
And olsun günəşə, göy çənbərində,
And olsun yəzdana, uca behiştə,
Əhrimən düşməni olan Zərdüştə.
Rumdan və Yunandan qoymaram əsər,
Başına yağdırram atəş, müxtəsər.
Rumlular sərasər geysə də dəmir,
Atəşgədəmizdə mum, dəmir birdir.
Nə çıxar rumludan, rum əsgərindən,
Atların nalında məhv olar ölkən.
Əgər Rum üstünə çəksəm ordular,
Tozundan günəşin gözü kor olar.
Ey Rumun ağası, budur məsləhət:
Daraya edəsən zənciətək xidmət.
Xalvarla çıxarsan geyimlə qalpaq.
Bir oxa dayanmaz, inadı burax.
Qarətçi ordunun oxundan məgər
Yemədin, üstümə çəkirsən ləşgər?
Varmıdır Daraya verəcək başın?
Mənimlə keçin, bu fikrindən daşın.
yayı qır, oxundan çıxar yeləyi,
Zirehi qatla, gey zərif ipəyi.
Yoxsa qulağını buran zaman mən,
Bilirsən ki, heçsən, heçdən də heçsən!
Qorx ürək çeynəyən oxumdan mənim!
Sevinmə bu dovşan yuxumdan mənim!
Hər yatan dovşana xor baxma, zinhar!
Tərpənsə yerindən ox kimi uçar.
Bacarram səninlə edim xoş rəftar,
Həddini aşanı döyməmək olar.
Lakin bir məsəl var: "Şah olsa zəlil,
Quyudur məskəni, yer üzü deyil"
Vergi ver, kini sil, qoy işə qədəm,
Köhnə ayinlərə, gəl, çəkmə qələm.
Hər il nə gərəkdir yeni kürk tikmək,
Noxtayla bir yerdə satılır eşşək.

Köhnə xanədana rəxnə vurma gəl,
Bununla açarsan başına əngəl!
Məcbur etmə məni qalxım yerimdən,
Mən böyük bir filəm, sən bir çibinsən!
Sevin ki, haq sənə vermiş dövlət, var,
Aslan pəncəsindən alınmaz şikar!
Bir qarğa kəkliktək səkdi bir zaman,
Öz yerişi belə çıxdı yadından.
Məclis qur, ulduzlar nur verdi yerə,
Firiştə qapını açmış göylərə[136].
Keyxosrovun tacı səadət arar,
Bilmirəm kım kimin başından qapar?
Bu köhnə zəmanə kimə olar yar?
Ulduzlar kim ilə olar vəfadar?
Bu göyə atdığın tozdan, torpaqdan
Mənə yox, özünə yetişər ziyan.
Baş mənəm, başqalar mənə əl-ayaq,
Nə gərək başını boş yerə qırmaq?
Öz sillən toxunar öz yanağına,
Baltanı vurarsan öz ayağına.
Gənclik qüruruyla şaşmaq əbəsdir,
Qəmənlə boynunu qaşıma, bəsdir!
Qılıncım tək sənə açmamış oyun,
Saysız dik başlardan qoparmış boyun.
Mənimlə munisdir şahların baxtı,
Cəmşidin əklili, Kavusun taxtı.
Bərkliyi çəkməklə dəmir, poladam,
Ruyintəndir mənim şöhrətli babam.
Yağışdan qorxarmı qocaman qurdlar?
Onların ipək yox, dəri kürkü var.
Bəxtiyar kimsənin alınmaz baxtı,
Satın almaq olmaz tac ilə taxtın.
İsfəndiyar köçmüş dünyadan əgər,
Nəsəbin yetişər Bəhmənə qədər.
Bəhmən də şahlığı atdığı zaman
Dünyaya mən oldum böyük hökmüran.
Məndədir Bəhmənin aslan ürəyi,





Həm İsfəndiyarın polad biləyi.
Onlardan yadigar bu gün mənəm, mən!
Zorda İsfəndiyar, ürəkdə Bəhmən!
Kəyan nəslindənəm, mən yenilmərəm
Başqalar əlaltı, tək əsil mənəm!
Böyük səhv etmisən məni ölçərkən,
Bəhmən qüvvətiylə ölçməmişsən sən.
Babamın mülkünün sahibiyəm mən,
Gəl öz sahibinə üsyan etmə sən.
Tutduğun işlərdən tez ol peşiman,
Düşün ki, bir fayda verməz sonradan!
Çox igid olsan da, qızışma ancaq.
Aslanın izinə, gəl basma ayaq!
Gəl etmə qabalıt, həlim ol, yumşal!
Oynatma yerimdən, öz yerində qal!
Yurdunu talaram, kim tərpətsən,
Ölkələr verərəm bir rica etsən.
Dağ kimi ağıram, mətanətliyəm,
Hökmümdə amansız, həm də qətiyəm.
Sən məni-tərpətmə, tərpənər dünya,
Bir kərə demişəm, dedim bir daha!"
Dara məktubunu şaha oxuyan
Kəskin sözlərini edincə bəyan,
İskəndər əmr etdi: "Oynasın əlin!
Ona bir cavab yaz bundan da kəskin."
Katibi qələmlə göstərdi hünər,
Məktubu bəzədi hər çeşid gövhər.
Yazdı bu məktubu elə sənətlə,
Fələklər əlini öpdü hörmətlə.
Dəyərli məktubun başı qapandı,
Naməni alaraq qasid yollandı.
Daranın katibi məktubu açdı,
Hər rəngin nüktədən yüz gövhər saçdı.
Oxuyub gördü ki, gövhərdir hər söz,
Düzdüyü dürlərdən ayrılmayır göz

# DARANIN MƏKTUBUNA İSKƏNDƏRİN CAVABI

"Anaram tanrını, haq qüdrətini,
Torpaqdan yaradır hər göyərtini,
Bu uca göylərə ülviyyət saçan,
Ağıllı kimsənin gözünü açan,
Dünyanı yaradan hər şeydən qəni,
Kimsəsiz kimsənin kömək edəni,
Dünyaya insanla verdi yaraşıq,
Göyləri yerlərə bağladı artıq.
Suyun qılıncına yer oldu qılaf,
Günəş çeşməsitək parlatdı şəffaf.
Bəndəlikdən uzaq o pərvərdigar,
Onda nə pozulmaq, nə qocalmaq var.
Ona şahiddir hər gözə görünən,
Varlıqlar hissədir onun mülkündən.
Hər varlıq isbata möhkəm bir dəlil,
Dünyada bir şeyə o möhtac deyil.
Bir şeyi yaratmaq istərsən, əlbət,
Sənə də, mənə də gərəkdir alət.
O hər şey yaradır, lakin alətsiz,
İdraka bu ağlın gücü yox hərgiz.
Hər ağıl tanrıdan öyrənir bilik,
Ürəklər tilsimdir, edər bəndəlik.
Hökmü, hikmətiylə doludur cahan,
Hökmdə aşkardır, hikmətdə nihan.
Bu sadə səhradan uçuşan ruhlar
Ondan gəlmiş, yenə ona qayıdar.
Hər qəlbə, hər gözə ondandır işıq,
Mənə də, sənə də o verdi şahlıq.
Hər varlıq, hər yoxluq onun hökmündə,
O ulu tanrıdır, bir kiçik bəndə.
Bəxşişi bol olan bu pərvərdigar
Əcəbmi məni də etsə tacidar?
Söylə, ey şəhriyar, ey bəxtı uca,
Anandan çatdınmı bu taxta, taca?
Sənə də şahlığı vermiş yaradan,
Hər verən şeylərə baxma ucadan,





Nemətə xor baxmaq olmaz, tacidar!
Xor baxan bəndəni sevməz bir dindar.
Dünyada sərxoş da, huşyar da olsan,
Əmrindən boynunu qaçırma bir an.
Pənahım olursa o pərvərdigar,
Əcəbmi məni də etsə tacidar?
Böyüklük etməyi bacarram mən də,
Qılınc oynadaram aslan önündə.
Qılıncla təxtü tac ala bilərəm,
Ayı da kəməndə sala bilərəm.
Cəmşid tarixini oxu bir daha,
O ayı gör necə uddu əjdaha[17].
Haman əjdahaya sonra Fəridun
Əjdaha gücüylə açdı nə oyun?![18]
And olsun yer-göyü quran tanrıya,
Ki, ondan bu yer-göy almışdır maya.
Tanrıdan bir kimsə tutmasa xəbər,
Deməli, yox başında şüurdan əsər.
And olsun keçmişin rəhbərlərinə,
Bizim dinimizin peyğəmbərinə,
And olsun İbrahim qoyan sühufə,
O dinçin tanrıya şükür min dəfə.
O İran xalqına əl taparsam mən,
Silərəm Zərdüştün dinini yerdən.
Nə atəş qoyaram, nə atəşgədə,
Odlar da şölədən yanar bu dərdə.
Bu közəl mərasim, bu ayin, bu yol
Ulu babalardan qalmış, əmin ol!
Bu müşkün qoxusu duyulmamaqçün
Onu çör-çöp ilə gizlətmək neçin?
Xurma ağacına kəməndi atan,
Əlbəttə, yeyəcək xurmanı asan.
O külün bostanda başı yüksəlir
Ki, gözəl rəngi var, həm saçır ətir.
Bilsə ki, mərdliyi, qol qüvvəti var,
O zaman başını maral dik tutar.
Aslanlar içində odur ən vəhşi,
Pəncəsi itidir, kəskindir dişi.

Bir maral budu var, iki ac aslan.
Kababı kim yeyər? Ən güclü olan!
İki fil xortumu çarpışır, demək,
Bunlardan ən güclü üstün gələcək.
Mən meydan əriyəm, sən də bir kişi,
Meydanda seçilir hər mərdin işi.
Bu yoldan o zaman çəkərəm yüyən,
Ya külah qaparam, ya ölərəm mən.
Sandın səndən başqa yoxdur bir nəfər,
Ancaq bir sənsənmiş dünyada sərvər?!
Hər yarpaq altında təlaş edən var,
Hər mənzil başına bir yol gedən var.
Bu müdhiş ilanla şətrənc oynama,
Qarşı çıx, hiyləylə bunca qaynama!
Öz mülkümdəm mənə iqta göstərmə,
Süheylə baratı Yəməndən vermə![139]
Qoyuna verilməz dələmə suyu,
Onda öz qanı var, görəcək bunu.
Qürurla bu qədər olma gərdənkəş,
Torpaqdan yarandın, deyilsən atəş.
Gəl burax bu kini, islaha yanaş,
Qalaydan pozulur almaz kimi daş.
Bir qab şərabın var, saxla can-başla,
Sındırarsan onu, çarpışma daşla.
Unutma, neft ilə doludur cahan,
Söyüdü qoru bu odlu tufandan.
Xoş keçdi, ələ al nuş ilə eyşi,
Xəracla cahanda şəxsin nə işi!
Biri yoxsuldan bağ əsirgəməmiş,
O biri verməmiş bağından yemiş.
Get, elə bir ov tap zəifdir məndən,
Yağ çıxmaz sənə bu aslan böyründən.
Heç mümkün deyilsə meyvəni dərmək,
Budaqdan asılmaq nəyinə gərək.
O zaman arzuna yetişərsən sən,
Körpü sala bilsən böyük dənizdən.
Bir düşün, bu qədər qürur nə gərək!
Başlayırsan əbəs baş tutmaz dilək.





Bax, gənclik nə yola çəkdi Bəhməni,
Qorx bu əjdahadan ki, dişlər səni!
Yolunu div vurar İsfəndiyartək,
Rüstəmlə döyüşə çıxasan gərək!
Divlərlə oturub dursa Süleyman,
Qalmaz barmağında üzüyü, inan![140]
Çalış bu dünyada səhv eyləmə sən,
Çox bizim kimilər yanmış səhvindən.
Özünə verdiyin hesab düz deyil,
Bu yanlış oyunu uduzdun, çəkil!
Nədir bu xam xəyal, bu xam tərpəniş?
Simurğu toruna kim sala bilmiş?
Zəncidən deyilsən daha adamcıl,
Bərbərdən igidmi çıxdın sən, ayıl!
Kin ilə döyüşə başlayınca mən
Nə qədər qan tökdüm zənci, bərbərdən.
Qayıt bu kinindən artıq, yetişər,
İnsanı incitməz azad kişilər.
Öncə sən bağladın kin mənə qarşı,
İlk səndən göründü ilanın başı.
Ordunu sazladın qan içsin deyə,
Üstümə gəlirsən basqın etməyə.
Ölkəmə salırsan min fitnə, min kin,
Atamın mülkünü almaqdır fikrin.
Mənə də gərəkdir yığaraq əskər
Belimə bağlayım hərb üçün kəmər,
Ordumla bu dərin dənizdən aşmaq,
Qılıncımla bir qan dənizi açmaq.
Sanma mən sərxoşam, sən ayıq, huşyar,
Mənim də başımda ağlım, huşum var.
Taleyin gününü edibsə parlaq,
Mən də xoşbəxtlikdən deyiləm uzaq.
Sənə iş vermişsə köhnə ruzigar,
O işdə mənim də məharətim var.
Sənə tacın yardır, mənə qılınc yar,
Səndə tac vardırsa, məndə qılınc var!
Güvənmə taxtına sən, ey tacidar!

Hər taxtın önündə bir də tabut var.
Güvənmə ki, dağlar çəkmiş daş hasar,
Elə zənn etmə ki, qırılmaz daşlar.
Döyüş zamanında işlərkən əllər
Dağlardan toz qopar, titrər təməllər.
Bu dünya mülkünün gəlincə sonu
Asanca mənimsər axtaran onu.
Çıxarkən bir sənlik, mənlik ortaya,
Ah, necə doymasın cana bu dünya?![141]
Bilirəm, bax, budur fikrinin canı:
Tutmaz bir tərəzi iki batmanı[142].
Məni öz daşınla gəl çəkmə daha,
Bəhməni bununçun vurdu əjdaha[143].
Cavabda daş, dəniz atsan ortaya,
Dağ kimi daşımı ataram suya[144].
Mən də zirehpuşam, qılınc oynatsan,
Sülhə də razıyam, sülhə əl atsan.
Gövhərdən, qılıncdan, nəyin var, çıxar,
Mənim də bunlarda məharətim var."
Elə ki, məktubu Dara dinlədi,
Dimağı alışdı, kinlə inlədi.
Durmadan topladı qədərsiz əskər,
Daradan qalmadı geri İskəndər.
Ortaya çıxardı güclü bir ordu,
Silahdan onlara yaraşıq vurdu.
Dara anladı ki, qızmış əjdaha
Aslanın izini buraxmaz daha.
Elə bir şövkətlə qalxdı yerindən,
Dağlar da sarsıldı öz təməlindən.
Nəhayət, gəldilər qarşı-qarşıya,
Kinin qapısını açmışdı dünya.
Cəzirə ki, Musil adlı ölkədir,
Səfalı bir yerdir, xoş düşərgədir, -
Bu yerdə toqquşdu iki tacidar,
Dəhşətdən, vəhşətdən titrədi dağlar.
Çarpışan şahlardan əsər axtarsan,
İndi də o yerdə sümük taparsan.





## DARANIN İSKƏNDƏRLƏ MÜHARİBƏSİ

Ey saqi, şərabın ağzını dur aç,
Vaxtı boş keçirmə, qədəhə mey saç!
Xüsusi mey ilə xərab et bir an,
Qurtarım canımı bu xərabatdan.
Bu mavi göylər ki, daim seyr edər
Bu günəş, bu ay ki, dolaşıb gedər
Bunları sanma bir oyun-oyuncaq,
Sərsəri deyildir bu geniş afaq.
Pərdədə hər telin vəzifəsi var.
Bizə bu hikmətlər deyil aşikar.
Kim bilir ki, sabah nələr olacaq?
Kim sönüb gedəcək, kim sağ qalacaq?
Kimin paltarını atarlar çölə,
Kim qoyar başına tac gülə-gülə.
Yaxşıdan, yamandan xəbər verənlər
Pak, təmiz şahlardan belə nəql edər:
Çin şahı səhərə nəfəs verərkən
Ulduzu günəşə dəyişdi Ədən[145].
Toqquşma yerinə yetişdi ordu,
Qaf kimi düz iki pərgarda durdu.
Yollara töküldü dəmirdən tikan[146].
Şeypurlar coşduqca qopdu həyəcan.
Üz-üzə gəlirdi hər iki ordu,
Nə ürəkdə dinclik, nə gözdə uyğu.
Hər iki tərəfdə ordu qaynaşır,
Qaynaşma ayağa, ələ dolaşır.
Üz-üzə durdular döyüş yerində,
Döyüşə cəsarət yox heç birində.
Hamı düşünürdü bəlkə sülh olsun,
Qılınclar qınında sakit otursun.
Gənclikdən, qürurdan hər iki sərkəş
Birisi su idi, birisi atəş.
Nəhayət, şəfqətdən kin etdi zühur,
Yandı hər ürəkdə kinli bir qürur.
Elə ki, qaynadı kinli bir hiddət,
Ürəkdən büsbütün silindi şəfqət,

Davullar gurlarkən dəhşət verərək,
Təblin dodağından öpürdü fələk[147].
Sərxoş fillər ilə qızışdı meydan.
Güzgü sınıb düşdü filin alnından.
Şeypurlar qoparır aslan nərəsi,
Dimağı doyurur nayın nəfəsi.
Türk payı qopardı elə bir şivən
İgidlər coşaraq qopdu yerindən.
Zinclərin sədası elə müdhişdi,
Bəzəkli günbədi dəlib keçmişdi.
Meydanı bürüdü qanlı vurhavur,
Döyüşdən igidlər getdikcə coşur.
Sanki bir məhşərdir, yer, göy dağılır,
İsrafil şiddətlə surunu çalır.
Göylərin yolunu tutdu toz, torpaq,
Sağlığın yüyəni əllərdən uzaq.
O qədər toz qonmuş tərkə, yəhərə,
Yer göyə dönmüşdü, göy isə yerə[148].
Cıyəri yandırır atəşli səda,
Boğulur kəməndin halqaları da.
Nəfəslər göydə bir buluddur guya,
Qılınc şöləsindən yanırdı dünya.
Qılınc oynadırdı torpaqla, qanla,
Havanın dimağı dolurdu canla.
İran tacidarı səhərdən durdu,
Sazladı olduqca mükəmməl ordu.
Öncə sağ qanada bəzəklər saçdı,
Əjdaha qılınclar ağzını açdı.
Sonra da sol qolu nizama saldı,
Cəbhəyə poladdan bir dağ ucaldı.
Bir mərkəz dikəltdi cinahın gözü,
Qapandı günəşin və ayın üzü.
Bu mərkəz poladdan tökülmüş bir dağ,
Sığınan kəslərə dəmir bir sığnaq.
O yanda Rum şahı qurdu ordunu,
Sanki bal arısı şan etdi mumu.
Silah istəyənə payladı silah,
Kömək istəyənə payladı pənah.





Sağ-solu bəzədi qılınc və qalxan.
Necə ki, canlanır çəmən buluddan.
Dağtək möhkəmlətdi önü, arxanı,
Göydə səyyarətək qurdu meydanı.
Elə ki, hər tərəf sazladı ordu,
İgidlər döyüşə çox hazır durdu.
Qılınclar boyunla oynarkən artıq,
Dünyanın gözündən çəkildi işıq.
Çuxurlar qan ilə dolub daşaraq,
Qırmızı kükürdtək qızardı torpaq.
Əyri qılıncların əjdahasından
Əjdaha yuvası olmuşdu meydan.
Oxların nəhəngi yay pusqusundan
Bir yerdə durmayır, şığıyır hər an.
Qıvrım kəmənd olmuş bir ilan yenə,
Ağzını açmışdır tutsun xəzinə.
Coşduqca fillərin sərxoş nərəsi,
Tıxandı ərlərin kəskin nəfəsi.
Qılınclar o qədər boyun üzdülər,
Qalmadı boynunu dik tutan bir ər.
Ata öz oğluna bəslər ədavət,
Oğul da ataya etməz məhəbbət.
Az qaldı bayrağı qərq eyləsin qan,
Nicat çadırını yığdı dünyadan.
Yaylarda o qədər dartıldı oxlar,
Yay çəkən əllərdə kəsildi qabar.
Döyüşdən o qədər qızışdı meydan,
Qığılcım sıçradı at nallarından.
Ordu mərkəzində Daranın qəlbi
Darıldı bir aslan ürəyi kimi.
Kükrəyir, dağıdır sağ və solunu,
Hər yana işlədir Bəhmən qolunu.
Sarsılmaz qolunu atsa hər yana,
Düşür düşmən başı ayaq altına.
Hər cana çatırsa verməyir aman,
Hər başa vurursa qoparır haman.
Rumların qədərsiz töküldü qanı,
Torpağa sərildi min pəhləvanı.

Bu yanda qılıncla igid İskəndər
Qaldırdı dünyada qanlı bir məhşər.
İki əl qan tökər, çalışır, durmaz,
Hər əldə bir qılınc - kəsərli almaz.
İki əl qılıncı elə əridir
Düşmən öz canına hayıf deməyir.
Bir qılınc vurunca hər fil başına,
Salardı başını ayaq altına.
Kinini dənizə töksəydi, şəksiz,
Hər yana atəşlər saçardı dəniz.
Ağzından sankı bir aslan od saçır,
Aslan qarşısından madyanlar qaçır.
Daraya dedilər: "Bu qızmış aslan
Çox adlı igidi saldı atından.
Padşahın qəlbinə kin dolsun gərək,
Belə filgövdədən qurtulsun gərək.
Orduya əmr ver, dolaraq kinə
Hər yandan yürüşlə axsın üstünə".
Bu fikri Dara da gördü məsləhət,
Ordular dənizək etsin hərəkət,
Hamısı sel kimi bir səmtə axsın,
İskəndər üstünə cilov buraxsın.
Daranın əmriylə ordu yer-yerdən
Qaynayıb irəli atıldı birdən.
Cilovlar parladı edərkən həmlə,
Qılınca sarıldı iki əliylə.
İskəndər görüncə elə divanı
Atdı düşmən kimi şərmi, həyanı,
Əmr etdi yerindən tərpənsin dəniz,
Hər kəs öz canını tutmasın əziz.
Düşmənin yolunu tutsun hər yandan,
Keçirsin qılıncdan, verməsin aman.
Qarınca, çibintək qaynadı meydan,
Girdi bir-birinə hər iki cahan.
O qədər ki, qılınc, ox yağdırdı qol,
Qarınca tapmadı keçməyə bir yol.
Gilə arısıtək çəkdilər neştər,
Göylərdə oxları oxa tikdilər.





İskəndərsə haman qorxulu anda
Bir kötüktək möhkəm durdu meydanda.
Bir igid yanaşdı o filpeykərə,
Əl atdı Əhrimən kimi xəncərə,
Dərindən bir yara açdı pəhləvan,
O gənc sərv titrədi müdhiş yaradan.
Zirehi dələrək kaftandan keçdi,
İşə bax, ipəyi polad nə biçdi.
Parlayan günəşin qolu dönmədi,
O qüvvət altında bir an inlədi,
Ağrıdan azacıq dincəldi canı,
Qılıncla torpağa sərdi düşmanı.
Düşmənin gücünü ölçmək istərkən
Bundan təkan yedi qorxusuz düşmən.
Düşündü meydandan çəksin yüyəni,
Nizədən dincəlsin yorğun bədəni.
yenidən bəxt ilə olaraq həmdəm,
Durdu öz yerində möhkəmdən möhkəm.
Bu falda bir zəfər, səadət gördü,
Qolunda düşməndən çox qüvvət gördü.
Bütün qüvvətini alaraq ələ
Döyüşə qalxdı öz həmçəkisilə.
Həmlədən-həmləyə keçirdi ordu,
Su deyil, sanki qan içirdi ordu.
Döyüşdə sınanmış iranlı birdən
Rumların yolunu kəsdi hər yerdən.
Meydanda zəiflik göstərdi rumlar,
Onları edirdi əcəl giriftar.
Yenidən mərdliklə namusa doldu,
Dağ kimi yerindən tərpənməz oldu.
Himmətlə tutdular əldə bayrağı,
Qənimət almasın amansız yağı.
Zənci öz tacına düzüncə gövhər
Çin şahı taxtından düşdü dərbədər[1]
Gecənin köksündən ay doğdu parlaq
Şəfəqli güzgütək işıq saçaraq.
Bir çöldə yığıldı hər iki ordu,
Hər iki cəbhəni düşmənlik yordu.

Döyüşdən əl çəkib döndülər geri,
Yudular yaranı; tozu, qan-təri.
Hamını almışdı kədər, düşüncə
Nə zühur edəcək şəfəq sönüncə?
Saf, təmiz portağal o səhər erkən
Bir dəstə gül kimi güldü üfüqdən.
Üz-üzə dayandı hər iki ordu.
Pəhləvanlar qalxıb şıkargah qurdu
Qılınc, ox, kamanla uzun bir zaman
Qol gücü göstərdi uca asiman.
Yorulan ordunun saraldı rəngi,
Əl cılov itirdi, ayaq üzəngi.
Daranın iki baş sərdarı vardı,
Üzdə dost, ürəkdən çox kin tutardı.
Daranın kinindən yorulmuşdular.
Ortada bir ürək inciklıyı var.
Şahı öldürməkçın oldular əlbir,
Kin ilə oturub tökdülər tədbir.
Bəzəmək istərkən qanlı bir bazar
Gedib İskəndərə sığındı onlar:
"Daranın bizə çox etimadı var,
Tək bizə inanır qoca tacıdar.
Zülmündən yanaraq etmişik tədbir,
Öldürmək fikrində olmuşuq əlbir.
Biz sabah bir həmlə edərik, bəlkə
Zülmdən qurtulsun bu məzlum ölkə.
Yerində möhkəm dur, dayan bu gecə,
Düşmənin bu səhər dönəcək heçə.
Bu səhər bayraqla çıxarkən hərbə
Qılıncdan yeyəcək böyrü bir zərbə.
Ancaq sən doğru qal bu şərtimizə,
Xəzinə ağzını geniş aç bizə!
Hər birimizi sən varlandırasan,
Qulluğumuz üçün qızıl saçasan."
Bu iki xainə rumlu hökmüran
Söz verdi, onlarla bağladı peyman.
Lakin inanmadı buna İskəndər:
Daranı öldürə bilsin xainlər.





Ancaq düşmənindən qurtulmaq üçün
Hər kəs üçün çarə aramaq mümkün.
Bu zülmü ədalət gördü hökmüran,
Gəldi xatirinə köhnə bir dastan:
"Dovşanını hər bir yerin, - məsəl var,
Yenə də o yerin tazısı tutar."
Şahını öldürmək istəyən kəslər
Ağıllı kimsədən alınca xəbər,
İskəndərdən güclü pul almaq üçün
Həm də ki, Daradan qurtulmaq üçün,
Şahın nemətini unutdu onlar,
Onu öldürməyə verdilər qərar.
Günəş yaqutunu oğru çalınca
Bu dünya düşmüşdü yaqut dalınca
Məhtabı tutaraq dedilər: "Oğru,
Günəşdən gövhəri oğurlamış bu."[17]
İki dağ kimi səf çəkmişdi ordu,
Çarpışma hər iki cəbhəni yordu.
Döndülər o künü vurunca başa,
Hazırlıq görüldü gələn savaşa.

## DARANIN SƏRKƏRDƏLƏRİ TƏRƏFİNDƏN ÖLDÜRÜLMƏSİ

Ey saqi, dur, məndən bu mənliyi at!
Gəl, üzüm suyundan cahanı parlat!
Bir şərab ver, məni mənzilə salsın,
Çox könül alan var, o, kədər alsın.
Qalana cənnətdir dünyanın halı,
Tələsən adamın oddadır nalı.
Bu bəzəkli bağda iki qapı var,
Yoxdur heç birində qıfıl, bənd, açar.
Birindən gir, bağı görüncə dolaş,
O biri qapıdan çıxıb uzaqlaş.
Ağlın var, gül ilə olma həmnişin,
Çünki qalmağından deyilsən əmin.
Bu anı xoş keçir, hər şeydən vaz keç,
Gələcək və keçmiş çünki heçdir, heç.

Dünyaya gəlmədik zövqə, işrətə,
İşimiz qatlanmaq ağır zəhmətə.
Eşşəyi toylara kimdir çağıran,
Çağrılır su, odun bitdiyi zaman.
Bu gözəl dastanı yazan ravilər
Doğrular dilindən belə nəql edər:
Elə ki, gündüzün atəşi söndü,
Fələklər tüstüdən dona büründü.
Ay doğub yaraşıq verdi gecəyə,
Gözəldir aydınlıq düşsə kölgəyə.
Hər iki ordunun sabaha qədər
Kəşfiyyat qolları keşik çəkdilər.
Onların səsindən bir dəyirmantək
Bilməzdi burclar nədir dincəlmək.
"Cəbhədə dincəlim" deyə yatanlar
Fillər nərəsindən diksinib qalxar.
Vücudu zəhmətdən yorulmuş insan
Gözünü açardı yatdığı zaman.
Yalvarır, yaxarır hər iki əsgər:
Bitməsin bu gecə, olmasın səhər,
Bir qədər geciksin, uzansın zaman.
Bəlkə gec açılsın döyüşə meydan.
Unudub kinini iki tacıdar
Bəlkə sübh etməyə versinlər qərar.
Al günəş tacını qoyduğu zaman,
Elə ki, ayrıldı qaralıq ağdan,
İskəndər və Dara gəldi meydana.
Ürəklə düşsünlər dostluq ardına.
Şəfqətlə, hörmətlə edib barışıq,
Xeyirli işə qol qoysunlar artıq.
Bu işdə istədi tədbir və çara,
Kımsədən düz cavab almadı Dara.
Sülh üçün bir nəfər olmadı rəhbər,
Dedilər: bu işi qılınc həll edər.
İranlı rumludan acizdir məgər?
Onlar bu savaşda qazanmaz zəfər.
Səhərki döyüşlə qızışar meydan,
Rumludan salamat qoymarıq bir can".





Daranı aldatdı belə sözlərlə,
Birisi hiyləylə, biri hünərlə.
Daranın düşməni iki sərkərdə
Buna səy edirdi hər an, hər yerdə.
İskəndər düşündü nə tədbir qursun
Ki, Dara önündə dağ kimi dursun.
O iki sərdarı tutdu nəzərdə,
Öz igidliyinə güvəndi bir də.
Rum əsgərlərinə dedi İskəndər:
"Bu qatı mərkəzdə olunca səhər
Ər kimi çalışmaq, çarpışmaq gərək,
Canı dişə yığıb igidlik etmək.
Bu dünya bizimdir çalsaq qələbə,
Daranın olacaq yeyərsək zərbə.
Deyirlər insana gizlidir məhşər,
O məhşər görünər bizə bu səhər".
Hər iki ordu bu düşüncələrlə
Gecəni keçirdi dərin kədərlə.
Dünyaya pəncərə açınca ziya
Bambaşqa bir oyun başladı dünya.
Bir ovuc qığılcım oldu bir atəş,
Bir kornac kimiydi parlayan günəş.
Dağ kimi tərpəndi hər iki ordu,
Dünyanın ürəyi titrəyib durdu.
Firidun və Bəhmən nəvəsi əjdər
Yuxudan səhərlə qalxdı bərabər.
Ordunu sazladı, düzəltdi meydan,
Parladı ox, kaman, qılınc və qalxan.
Yüzlərcə polad dağ dikəltdi onda,
Xəzinə dayandı onun altında.
Sağ qolun işləri bitdikdən sonra
Sol qolu çevirdi polad hasara.
Cinahlar kök atdı yerə havadan,
Yer kimi çarmıxa çəkildi meydan.
Mərkəzdə durmuşdu cahan günəşi,
Başının üstündə Kəyan dirəfşi.
Dünyanı yandıran qılıncı məgər
Bu günçün saxlardı böyük İskəndər!

Yağdıran buludtək meydan dopdolu,
Yaydan ox yağırdı, qılıncdan dolu.
Ordunun qolları göyə dayandı,
Atların dırnağı qana boyandı.
Ən seçmə igidlər ordudan bir-bir
Sağ-sola keçməyə alırdı əmr.
Əmrlə inamsız kəslər hər yerdən
Tərpənib, sol qolda tutdular məskən.
Kimin ki, əmindi sədaqətində
Saxladı mərkəzdə - öz xidmətində.
Onları ordunun qəlbinə aldı,
Tökmə bir dağ kimi göyə ucaldı.
Qopunca nərələr iki ordudan,
Qıyamət qopmuş zənn etdi asiman.
Təbillər gurlayıb verdi səs-səsə,
Qanlı əjdahalar başladı rəqsə.
Kərənay səsindən tutuldu qulaq,
Qorxudan titrədi bütün əl-ayaq.
Filə minənlərin bağırtısından
Nildəki nəhənglər qopardı fəğan.
Şeypurun səsindən qopdu ürəklər,
Bağırlar yarıldı, düşdü göbəklər.
İçi boş təbillər coşduqca coşar.
Zülmətlər içindən atılır oxlar,
Düşmənin köksünə nizələr sancar,
Zirehdə, geyimdə pəncərə açar.
O qədər yaylım ox yağdı hər yandan
Bulud yağmurunu atdı başından.
İndi o yaylım ox düşsə zəminə
Bulud qan yağdırar yağış yerinə,
Naylardan qopan o müdhiş gurultu
Eşidən kimsəyə verirdi qorxu.
Qarışıq səslərlə hayqırdıqca can
Çaxmaq daşından da çıxarırdı qan.
İki qan dənizi çalxandı birdən,
Atəş dalğaları yüksəldi yerdən.
Bürüdü hər yeri tufan atəşi,
Ucalan toz-torpaq tutdu günəşi.





Yayların bir daha qaşı çatıldı,
Oxlar ilan kimi coşub atıldı.
Civətək parlayan polad qılıncdan
Civətək qaçırdı hər yerdə insan.
Gövdələr əridən polad ox ilə
Dağların gövdəsi titrədi belə.
Nizələr ucundan dövr edən fələk
Seyrindən qalaraq oldu topaltək.
Toppuzlar o qədər çaxmışdı təpik
Yerin cəmdəyində qalmadı gəmik.
O qədər sancılmış boğazlara ox,
Artıq boğazlarda nəfəs yolu yox.
Ox oxun içinə girmiş tikantək,
Qalxandan bəzənib yer gülüstantək.
Qaçanlar üzünə qıyamət qopmuş,
Nə yol var qaçmağa, nə də qurtuluş.
Atlılar ataraq sonuncu oxu,
Atmışdır kamanı, oxu, oxluğu.
Bir sallaxxanadır qanlı bucaqlar,
Cəmdəklə yan-yana ucalmış dağlar.
Yalnız öz canının hayında hər kəs,
Ölən yoldaşını yada gətirməz.
Meydanda yox idi matəm saxlayan,
Nə bir qara geyən, nə bir ağlayan.
Hər sözü ustası gözəl toxuyur:
"El ilə qara gün bayramdır, toydur"
Əcəl pəncəsində ölsə bir nəfər
Gözündən yaş tökər ona bir şəhər.
Bütün bir şəhərçin saxlayaraq yas
Ondan uzaqlara kimsə ağlamaz.
İnsan cəmdəyilə dolmuşdur sağ-sol,
Döyüşçülər üçün qapanmışdı yol.
O qan Dəcləsini günəş almışdı,
Suya neylufərtək qayıq salmışdı.
Həmin vuruşmada böyük İskəndər
Günəş çeşməsində saçmışdı zəfər.
Daranın qılıncı saldıqca şölə
Qızırdı daşların ürəyi belə.

Elə ki soxuldu ordu orduya
Məhşəri gözüylə gördü bu dünya.
Dava meydanına yayıldı əsgər,
Daranın canına var idi xətər.
Ordular döyüşə girdiyi zaman
Olduqca genəldi darısqal meydan.
Yanında kimsə yox, yalnızdı Dara,
Onunla etməyir kimsə müdara.
İki sərxoş sərdar fil kimi coşdu,
Filbədən Daranın üstünə qoşdu, -
Böyründən bir yara vurdular ona,
Laləzar oldu yer, boyandı qana.
Tacıdar yıxıldı dərin yaradan,
Sankı bir qiyamət kəsildi cahan.
Bir ağac yıxıldı Kəyan bağından
Yaralı bədəni qanına qəltan.
Dərdə tab gətirməz incə olanlar,
Yel ilə çırağın nə dostluğu var?
O iki qantökən, o iki xain
Qaçdılar yanına tez İskəndərin.
Dedilər: "Atəşə yaxdıq düşmanı,
Taleyin uğrunda töküldü qanı.
İşini bitirdik, vurduq bir yara,
Gözündə cahanı eylədik qara.
İstərsən gözünlə gəl gör bu halı.
Qanıyla boyansın atının nalı.
Hünərlə öldürdük sizin düşməni,
İndi sən yerinə yetir və dəni.
Bizə vəd etmişdin ağır xəzinə,
Doğru qal, vəfa et indi əhdinə."
İskəndər bildi ki, bu iki sərdar
Şah qanı tökməyə olmuş həvəskar.
Verdiyi peymana oldu peşiman
Həyadan bir şölə çıxdı canından.
Adamın yaşıdı ölən zamanda
Həyat ümidindən iz qalmaz onda.
Dedi: "Harda batmış qana tacıdar,
Kəyan dövlətini bəzəyən sərdar?"





Hər iki qantökən düşərək önə,
Yol göstərdilər öz azğın zülmünə.
Daranın düşdüyü yerə gəldilər,
Yanında dostlardan yoxdu bir nəfər.
Vücudu bulaşmış torpağa, qana,
O Kəyan külahı düşmüş bir yana.
Olmuş qarıncaya Süleyman əsir,
Tikanlı bir arı bir fili yeyir.
Bəhmənin qoluna sarılmış ilan,
Düşmüş İsfəndiyar tunc çardağından[1].
Firidun baharı, Cəmin bağçası
Xəzana uğramış, başlanmış yası.
Keyqubad nəslinin vücudunu, bax,
Gör necə dağıdır yel yarpaq-yarpaq.
İskəndər tələsik endi atından,
Daranın önündə durdu pərişan.
Əmr etdi o xain sərkərdələri,
Xaricə meyl edən iki rəhbəri
Möhkəm saxlasınlar, sonra İskəndər
Yerindən tərpəndi üzündə kədər.
Sürətlə yanaşdı xəstəyə sarı,
Kəyan geyimindən açdı bağları.
Başını şahanə dizinə qoydu,
Gecəni işıqlı gündüzə qoydu.
Yuxudan gözünü açdığı zaman
Dedi: "Qalx bu qara qanlı torpaqdan!
Burax ki, solmada qurtuluş bağım
Qaralmaq üzrədir işıq - çırağım,
Böyrümü, bax, necə yırtmış bu dövran!
Bağrımın altında böyrümdür punhan
Pəhləvan, ey başım üstünə gələn!
Qoru öz böyrünü mənim böyrümdən.
Bu böyrüm buludtək sökülsə belə,
Qılıncın acısı getməmiş hələ.
Padşahlar başını burax, qaldırma,
Bu dövran qırmışdır məni, sən qırma!
O hansı əldir ki, uzanır mənə,
Kəyanın tacıyla oynayır yenə.

Əl saxla, qarşında Daradır duran,
Günəşdən aydındır bu, deyil pünhan.
Günəşim saralıb düşüncə dərdə,
Üzümə çəkərsən laciverd pərdə,
Sərvi başaşağı görmə şərməndə,
Elə bir padişah, belə bir bəndə!
Xəstəyəm, zəhmətdən qıl məni azad,
Haqqın rəhmətiylə məni eylə yad.
Dünyanın taxtında mənəm tacidar,
Yerimdən tərpətsən məni, yer sarsar.
Dadlı bir yuxum var, toxunma, burax,
Odumu göy alsın, suyumu torpaq!
Taxtından çevirmə yatan bir başı,
İnlətmə, bu dünya tökər göz yaşı!
Əcəlim yetişmək üzrədir, dayan!
Məni öz halıma burax bir zaman!
Fikrin tac çalmaqsa mənim başımdan,
Azacıq aman ver, qoy çıxsın bu can!
Bu dünya mülkündən açınca kəmər
Başım da, tacım da getsə, yox zərər".
İskəndər ağladı: "Aman, tacidar,
Nökərin İskəndər mənəm, şəhriyar!
İstəməzdim görüm torpaqda səni,
Öz qanına qəltan olan bədəni.
Nə etmək, bir işdir olmuş dünyada
Təəssüf verərmi bu işdə fayda?
Başını yenidən qaldırsan əgər,
Kiçiklik edərdi sənə İskəndər.
Heyhat, mən qocaman dənizlər aşdım,
Köksümə qədər al qana bulaşdım.
Təəssüf, azmadım bu yollarda mən,
Atımın dırnağı qopmadı nədən?
Bu ağır günləri görməyəydim mən,
Ah, eşitməyəydim Dara inlərkən.
And olsun hər qəlbi bilən sərrafa,
Daraya ürəkdən istərəm şəfa.
Bir şüşə daş ilə qırılsa naçar,
Çarə qapısına tapılmaz açar.





Əfsus, İsfəndiyar nəslindən sənsiz
Mülkün yadigarı sən idin yalnız.
Nə olur, mənə də ölüm qoşaydı,
İskəndər və Dara qucaqlaşaydı.
Nə etmək, istəklə gəlməyir əcəl,
Məzara girilməz ölümdən əvvəl.
Padşahın bir tükü gözümdə, inan,
Daha qiymətlidir yüzlərcə tacdan.
Bu dərin yaraya bilsəydim çara,
Edərdim, sağalsın deyə bu yara.
Nəyə lazım bu taxt, bu tac, bu şöhrət,
Darasız qaldı bu möhtəşəm dövlət.
Mən bu taxta, taca ağlayaram qan,
Ayırmış Daranı təxtü tacından.
Yox olsun dünyadan elə gülüstan,
Bağbanı xəstədir, acı tikandan.
Daranı öldürən dünyaya nifrət,
Gündüzkən öldürür, verməyir fürsət.
Bir çarə etməyə imkan yox məndə,
Bu gənc sərvə gərək ağlayanı mən də.
Anlat ki, istəyin, tədbirin nədir?
Qorxunuz kimdəndir, ümid kimdədir?
Söylə ki, hər sözün mənə bir fərman,
İtaət etməyə bağlaram peyman".
Dara hiss edincə bu dost nələsi,
Açdı gözlərini, şahanə səsi
Şəfqətlə ucaldı: "Ey uca baxtım,
Tək sənə yaraşır bu tacım, taxtım.
Sorma bir ölüyə mən indi nəyəm?
Xəzanə tutulmuş ölgün çiçəyəm!
Hər kəsin şərbəti buzla duruldu,
Mənim şərbətimsə yalnız buz oldu.
Varlığım qərq olmuş qan dənizinə,
İçərim susuzdan alışır yenə.
Buluddan şığıyan bir şimşəyəm mən,
Dodağım qurudur, suludur bədən.
Bu kuzə yanından sınıqsa bir az,
Mumla, yapışqanla sağaltmaq olmaz.

Bu dünya eyləyir qarət hər yeri,
Birisi gətirir, alır o biri.
Nə bu gün yaşayan bu gün əmindir
Nə köçüb qurtulan, heyhat, çətindir!
Gör mənim günümü, haqqa doğru qal,
Qorx belə bir gündən, məndən ibrət al!
Sözlərimi anıb dinləsən məni,
Mənim kimi etməz bu fələk səni.
Bəhməndən mən igid deyiləm daha,
Bir aman vermədi ona əjdaha.
Ya da igidəmmi İsfəndiyardan?
Dünya zərbəsindən qurtarmadı can.
Nəslimə əzəldən ölümdür qismət.
Öldürən bu əmrə verir şəhadət.
Olsun yeni taxtın qoy səninçin xoş,
Mənimsə balıncım qalacaqdır boş.
Mənimçin ağlamaq lazım gəlirkən
Sorursan qəlbimin istəyini sən.
Könlümdə sevimli üç istəyim var:
Üçü də şahanə bəxtinə yarar:
Birinci - günahsız ölümə görə
Rəftar etməlisən ədalət üzrə.
İkinci - sən Kəyan taxtını alsan
Ona heç bir zaman yetirmə ziyan.
Bu kinin toxmunu İranda əkmə,
Kəyanın nəslinə xətimə çəkmə!
Üçüncü - toxunma hərəmxanəmə,
Saxla hörmətini, təhqir eyləmə!
Rövşənək qızımdır, olduqca göyçək,
Əlimdə bəslənmiş bu gözəl mələk.
Öz süfrə yoldaşın etməklə ucalt,
Süfrəyə incilər verir şən həyat,
Könlünü çevirmə Rövşənəyimdən,
Təbii, işıqla günəş olur şən"[153].
İskəndər söz verdi, Dara qaş çatdı,
Söz verən qalxarkən söyləyən yatdı.
Gecənin gözünə qaranlıq axdı,
Bağdadı Kaxsız və Kərxsiz buraxdı[154].





Kəyanın ağacı düşdü meyvədən,
Oldu İsfəndiyar zirehi kəfən.
Dünyadan al günəş qanad çəkincə
Yaqut içdi, şəvə daldı sevincə[155].
Böyük Dara üçün böyük İskəndər
Ağladı axşamdan sabaha qədər.
Özünə ağlardı görürkən onu,
Bilirdi belə bir ölümdür sonu.
Əbləq atlı səhər gəlib üfüqdən
Axuru çəməndə yerləşdirirkən
İskəndər əmr etdi: Daranı artıq,
Daxmaya qoymaqçın olsun hazırlıq!
Günbədi daş qala, taxtı qızıldan
Qayrıldı ona bir müəyyən məkan.
Türbəsi bitincə bitdi hər zəhmət,
Dara zəhmətindən oldular rahət.
Bədən qəfəsində nə qədər can var,
Elə bir igidə hörmət var, şan var.
Bədəndən çıxınca dəyərli cövhər,
Ona öz qadını arxa çevirər.
Qorxunc bir küləkdən sönərsə çıraq,
Nə fərqi, köşk olsun yeri, ya torpaq.
Göydə ol, yerdə ol, fərqi yox bunun,
Torpaqsan, yenə də torpaqdır sonun.
Şor sudan torpağa düşərsə balıq,
Ölüncə qarınca yemidir artıq.
Dünya keçidinin qaydası budur,
Gəldinsə dayanma, köçmək doğrudur.
Birini ucaldar, atar ortaya,
Birinə "məclisdən qalx" deyər dünya.
Göy günbəz altında gəl qurma busat,
Kəhrəba qələdə yaramaz nişat![156]
Üzünü kəhrəba kimi saraldar,
Əlbəsən laciverd bir rəngə çalar[157].
Aslanlar şəhrinə düşən bir ceyran
Qorxunc bir ölümü gözlər hər zaman.
Köçməyə quş kimi qanad aç göyə,
Şərabla məst olma "şən yerdir" deyə.

İldırımtək şığı, bu dünyanı yax,
Ancaq bu dünyada durma, ol uzaq!
Pərvanə, səməndər "od" deyə gedər,
Birisi yorğalar, biri iməklər.
Arpanın yerinə çöp yedi eşşək,
Öldü sahibi də eşşək öləntək.
Bir dövlət şahıdır, ya şah dövləti,
Bir zəhmət yoludur və yol zəhməti.
Kim bilir bu köhnə, bu qoca dünya
Nələr gizlətmişdir mağarasında.
Köhnə bir çuvaldır bu qat-qat torpaq,
Xəzinə sevməyir səs-küy qoparmaq.
Hər yeni kisədə qızıl səs verər,
Yeni küp dolduqca xoş nəfəs verər.
Kim bilir bu divlər yurduna dövran
Nə tarix yazmışdır yaxşı, yamandan?
Nə aqil kəslərlə oynamış oyun?
Nə dikbaş kəslərdən qoparmış boyun?
Bu fələk səninlə deyildir canbir,
Tikdiyi libaslar iki rənglidir.
Gah səni firiştə kimi yüksəldir,
Gah bağlar qolunu divlərlə əlbir.
Səni bir çörəklə anmaz gecələr,
Bir qoğal bağışlar göyə hər səhər.
Bu yeddi dəyirman başında neçin
Boynunu bükürsən bir arpa üçün?
Xızrtək belə bir ruzini gəl at,
Süd, xurma nə gərək, var abi-həyat!
Bu vəhşi, yırtıcı, divxislət insan
Səmimi dost deyil, uzaq ol ondan!
Hər maral ovçunun zülmündən qaçar,
Yırtıcı vəhşidir hələ insanlar.
Çöldə şux bir ceyran düşməyir ələ,
İnsandan sığınır dağa, kol-kolə.
Aslan ki, ormanda etmişdir məskən,
Qorxaraq gizlənmiş insan şərindən.
İnsanda insanlıq öləndən bəri
İtmiş insanlığın parlaq gövhəri.





İnsanlıq nəqşini oxusan bir-bir,
Bilərsən bugünkü insanlıq nədir.
Bəbəyin qapağı neçin qaradır?
İnsanlıq ölmüşdür, matəm saxlayır.
Nizami, susmağa adət et, ancaq,
Deyilməz sözləri danışma, burax!
Sən də kəs səsini, danışma daha,
Yat, ya da pambıqla qulağın tıxa!
Laciverd fələkdən ibrət al barı,
Al ilə aldır bu, sarıyla sarı.
Yüz rəngə boyanar gecələr baxsan,
Bahartək gündüzə qurar gülüstan.
Günəşdən bir çeşmə doğunca səhər,
O da bir çeşmənin rənginə girər.

## İSKƏNDƏRİN İRAN BAŞÇILARI İLƏ ƏHD-PEYMAN BAĞLAMASI

O meynə qanını, ey saqi, tez dur,
Od almış xəz kimi beynimə doldur!
Etsin mey özümü unudan kimi,
İki məğz yaratsın mənə dan kimi!
Ey dövlət, hardasan, məni sevindir,
Mehdi qapısında taxtını endir.
Mehdi hüzuruna endiyin zaman
Bir salam gətir o, uca dərgahdan.
Bu dövlət onunçün sənə vermiş baxt
Ki, səndən yaraşıq tapsın tacü taxt.
Səninlə insanın üzü parıldar,
Bu dünya tikməmiş sən kimi paltar.
Tanrının adıyla doğan peykərsən,
Gövhərlər içində vahid gövhərsən.
Əlinə cilovu tapşırmaq olar,
Bizdəndir hər zəfər, sən mərdanə dur!
Göstər ki, hardadır qapın, bazarın
Ki, olum hər zaman mən talabkarın.
Bilirəm, ey dövlət, tutmuşam soraq,

Qapındır şəhriyar qapısı ancaq.
Hər yerdə olsan da edərəm xidmət,
Hər zaman bəslərəm səmimi hörmət.
Odur ki, söyləyir ağıllı bir ər:
- Bu gövhər satana dövlətdir gövhər.
Doğrudur, belə bir gövhəri ələ
Keçirmək mümkündür yalnız dövlətlə.
İskəndərdə vardı ağıl və tədbir,
Dövlətin gücüylə oldu cahangir.
Ona olmasaydı rəhbər dövlət, baxt,
Olmazdı düşmənə qalib heç bir vaxt.
Dövlətə pərəstiş edən bir nəfər
Dövlət pərgarını belə nəqş edər:
Yaranın ulduzu olunca nihan
İskəndərə qaldı bütün bu cahan.
Daraya mal olan təzə və köhnə,
Heç saya gəlməyən dolğun xəzinə.
Taparaq onları araşdırdılar,
Dənizdən dənizə quraşdırdılar.
O qədər tacü taxt və çadır vardı,
Onlara ölçülər, çəkilər dardı.
O qədər gövhər var, hesabdar belə
Nə barmaqla sayar, nə də ürəklə.
Tabaqlar, sinilər, büllurlu, zərrin,
Nalları söküldü yük çəkənlərin.
Cins ərəb atları - yəhəri qızıl,
Xəta qulamları - kəməri qızıl.
Qədərsiz şahanə paltar və qumaş,
Minlərcə lök dəvə, yükləri daş-qaş.
Paltarın, silahın sayı yox, sayan
Hesaba vurmağa tapmadı imkan.
Misalı olmayan əntiq-bahalı
Şeylər var xüsusi xəzinə malı.
Xəznədə nə qədər qızıl-gümüş var,
İskəndər adına sikkə vurdular.
O qədər xəzinə keçdi əlinə,
Oldu gövhər kimi yanan xəzinə.
Gövhərlə parladı qara ürəklər,





Şəbçıraq kəlməsi bundanmış məgər?!
İşıqdan xəzinə xoşlanmaz deyə,
Zülmətdə gedilir hər xəzinəyə.
Neçin həs xəzinə tapanın üzü
Günəştək parlaqdır şadlıqdan gözü?
Torpaqsan, gərəkdir olsun xəzinən.
Sərvətsiz torpağı olarmı sevən?
Kişiyə sərvətdir verən yüksəliş.
Dünyada onunla doğrulur hər iş.
Qızıl bir meyvədir, zəfəran saçar,
Zəfəran kimi də qəlbini açar.
Məğribdə yaşayan hər qara zənci
O sarı qızıldan tapmış sevinci.
İskəndər gördü ki, bunca xəzinə
Zəhmətsiz olaraq keçdi əlinə.
Dərgaha ən sadiq hər bir nəfərə,
Böyüyə, kiçiyə, yoxsul kəslərə
Var-dövlət verərək bəxtiyar etdi.
Dünyaya özünü hökmdar etdi.
İrana qasidlər edərək rəvan,
Dedi ki, dönməsin kimsə qapımdan
İstəsən ki, başın qalsın salamat,
Qapımda baş əyib elə itaət.
Bəxşişə, şəfqətə hüdud olmayan
Bu yerdə hər kişi tapar dövlət, şan.
İran başçıları axdı hər yerdən
Bu xeyirli işdən ürəkləri şən.
Şəhriyar qəlbindən tutdular xəbər.
Sözündə mətindir böyük İskəndər.
Elliklə yollara çıxdılar daha,
Sevinclə axdılar uca dərgaha.
Bu gəliş xoş gəldi şaha, onlara,
Ordunun pənahı pəhləvanlara.
Peymanlar bağlandı, söz verdi gerçək
Kimsənin rütbəsi əksilməyəcək.
Xəzinə açıldı xalqın üzünə,
Verdi hər birinə gövhər, xəzinə.
Hər kimin nə qədər vardı sərvəti,

İkiqat çoxaldı varı, dövləti.
Hər şəxsin işini aşikar etdi,
Yatanı oyatdı, bəxtiyar etdi.
İranlı o açıq əli görüncə
İtaət edərək daldı sevincə.
Alnını sürtərək torpağa, yerə,
Külahı ucaltdı uca göylərə.
Dedilər: "Eşq olsun, şəhriyar, sənə,
Hər zaman yar olsun ruzigar sənə!
Haqqındır Cəmşidin taxtı, xəracı,
Öpər ayağını şahların tacı.
Yeni şahımızsan, getdi o gedən,
Şah nədir? Bizlərə Keyxosrov sənsən!
Kim boyun qaçırar sənin əmrindən?
Çəkmənin altıdır bu baş, bu bədən."
Şah gördü bir neçə xoş tədbir daha,
İranlı itaət elədi şaha.
O ulduz şövkətli bəzmə hər yerdən,
Yığıncaq toplandı yeddi kişvərdən.
Əmr etdi: qılınc, teşt gəlsin meydana!
Qanlılar çəkilsin taxt ayağına!
Başını dik tutan iki sərvəri,
Boynuna həmayıl keçirənləri
Qəhr ilə boyayıb al-əlvan qana,
Kəndirdən həmayıl vursun boynuna.
Onlara verilən böyük və dələr,
Qızıl, gümüş, inci, cavahir, gövhər
Məclisə töküldü xəzinəsindən,
Şah baş qaçırmadı öz vədəsindən.
Sonra da ölümlə eylədi təhqir.
Tez dara çəkdirdi boynunda kəndir.
Ordunun içində carçı çəkdi car:
"Daranın qatili bunlardır, bunlar!
Hər xain işlərsə belə xəyanət
İşinin cəzası budur nəhayət.
Ağanı öldürən bəndəni, zinhar,
Hansı bir ağıllı kimsə bağışlar?"
Bu halı görüncə şəhərli, ordu





İskəndər adlına təhsin oxudu.
Adil olduğunu yəqin etdilər.
Əmrinə yer-göydən bağlandı kəmər.
Yığıldı məclisə ağıllı kəslər.
Ordan uzaq olsun bəd, yaman gözlər.
Üz-üzə səf çəkdi hər iki ordu,
Oturan kimsələr ayağa durdu.
Sıx kəmər bağlamış kəmərbəstələr,
Kəmərlər sanki bir halqadan keçər.
Padişah yürütdü elə siyasət,
Hər candan qaldı bir qurumuş surət.
Sanki bir surətdən bəzənmiş divar.
Ruh uçmuş, yalnız bir quru cəsəd var.
İranı, Daranı yenən İskəndər
Məclisdə şam kimi oldu cilvəgər.
Dəyərli kəslərə hər gün yanaşdı,
Hər kəsin ağlınca bir söhbət açdı.
İgid Fəribərzı tez dəvət etdi,
Çox hörmət göstərdi, məhəbbət etdi.
"Ey qoca pəhləvan, - söylədi ona, -
Başın kölgə salmış öz ayağına[illegible]
Dünyada illərcə ömür sürdün sən.
Bixəbər deyilsən dünya işindən.
Gördün ki, zülmdür Dara ayını,
Mən kimi suçsuzla bağlarkən kini
Dünyanın sirrini bilirkən, neçin
Daradan öyüdü sən əsirgədin?
Gənclik hər kişini coşduran zaman
Qocanın susması deyilmi nöqsan?"
Şahın hiddətini görüb dinləyən
Yağlı bir dil ilə söz açdı birdən.
Təzimdən belini əydi kamantək,
Saralıb sifəti lap zəfərantək.
Sözlə silahlandı, yayı açaraq,
Qutudan oxları bir bir saçaraq,
Öncə İskəndəri çox öydü belə:
"Qol-boyun olsun şah öz diləyilə!
Dünyanın sərvəri olsun kamikar,

Ömründən kam alsın uca şəhriyar!
Gənc başın sevinclə ucalsın hər an,
Çəkmənin altında sürünsün düşman.
Bu qoca nəsihət etdi nə qədər,
O kinli qəlbinə etmədi əsər.
Ona çox göstərdi işıqlı çıraq,
Bunlar da vermədi bir fayda ancaq.
Tacü taxt verdiyi zaman İskəndər
Tədbirsiz bir Dara nə edə bilər?
Bir başı ucaltmaq istərsə dövran
Kəməndə düşəcək boyun ucaldan.
Bir qoca eşşəkdən yıxıldı hinddə,
Ölənin oğluysa varlandı Çində.
Sel gəlib bir arxı pozarsa əgər,
Su axıb başqa bir çaya tökülər.
Sənə xəzinələr verərkən dövran
İncimə düşmənin yoxsulluğundan.
Azadə bir şahsan, hələ gənc ikən
Çalğını, qədəhi buraxma əldən.
İstəyə gəncliklə mümkündür çatmaq,
Qocalıq gəldimi, axtar bir bucaq.
Qocalıq çağında çərxin inadı
Cəmşidə, Zöhhaka nələr qurmadı?
Padşaha qocalıq gəldimi, bişəkk,
Pərəstiş edənlər üz döndərəcək.
Əsrarı duyandır, seçər hər zaman
Yaxşını yamandan, dostu düşmandan.
Görüncə insanı tanıyandır bu,
Hər kəsin qəlbinə çökəcək qorxu.
Yıxmağa birlikdə edərlər tədbir,
Deyərlər mənfəət verən deyildir.
Alət olmaq üçün istəklərinə
Gənc bir şah qoyarlar onun yerinə.
Onunçun Keyxosrov, həm də Keyqubad
Şahlığı etmədi qocalıqda yad.
Şahlığı başqa bir şaha tərk etdi.
Əlbürzün yolunu tutaraq getdi.
Yeməkdən, içməkdən nəşə aldılar.





Zəhərli qılıncı salım qaldılar".
Şah gördü Kəyandan yadigar olan
Yaxşını, yamanı seçir hər zaman.
Yaxşını, yamanı seçir, ayıqdır,
Döyüşdə sınanmış, sözü açıqdır.
İskəndər bir daha sordu o pirdən:
"Düşməni döyüşdə nə şeydir yenən?
Nə şeydir ordunu mətin saxlayan?
Nə şeydir ordunu qorxuya salan?"
Davada sınanmış qoca namidar
Dedi: "O pəhləvan olur bəxtiyar
Ki, səntək padşahın ordusundadır,
Səninlə özünü bir ordu sanır,
Uca fərmanınla bu zəif torpaq
Səninçin bir möhkəm qələ quracaq
Eşitdim bir keçmiş döyüşçüdən mən:
Ürək qüvvətlidir can qüvvətindən.
Şahım, ordu çəkmək cəsarət istər,
Heç aciz qalarmı igid hünərvər?
Ordunu meydana çəkərkən gərək
Padişah ummasın ondan bir kömək.
Mətanət sənindir, kömək tanrıdan,
Bunlardır ordunu mətin saxlayan.
Düşməni yenərkən unutma bunu:
Bağlama düşmənin qaçmaq yolunu.
Ümidin qırılsa, ürəkdən çalış,
Mərdin qulağını buran olmamış.
Uğurlu zamanda zəfər gözləyən
Düşmən qorxusunu silsin könüldən.
Zal oğlu söyləmiş mərd Fəraməzə
- Könlünü qırma, sal Əlbürzə lərzə.
Bəhmənə söyləmiş həm İsfəndiyar
- Qəlbini qırmayan bir ordu qırar.
Çünki öz qəlbini qırmışdı Dara.
Qanını qorxaqlıq tökdü daşlara.
Qorxulu ürəklə meydana girdi,
Lakin qorxusunu o gizlədirdi.
Qəlbinə bir işıq salmadı dövlət,

Oldu bu döyüşdə torpağa qismət."
İskəndər yenidən soruşdu ondan:
"Ey illər yaşamış qoca pəhləvan,
Eşitdim, Zal oğlu atın belində
Tək həmlə edərmiş dava çölündə.
Özünü orduya vurduğu zaman
Qaçardı ordular qarşı durmadan.
Səbəb nə, kəskin bir qılıncdan belə
Qorxaraq bir ordu dağılır çölə?"
Gözəlcə bir cavab verdi pəhləvan:
"Söylərkən dilimiz dönər çox zaman[162].
Doğrudur, Rüstəmin qurduğu tədbir
Ən igid ərləri dənlərdi bir-bir,
Başçılar düşüncə qara torpağa
Ordu da qorxaraq başlar qaçmağa.
Kim ki təkbaşına bir ordu yenər.
Belə bir tədbirlə qazanar zəfər.
Doğrusu inanmaz buna bir insan,
Böyük ordu qaçsın tək bir atlıdan."
İskəndər yenə də soruşdu ondan:
"Bu sirri aç mənə, qoca pəhləvan,
Neçin Fəramərzi öldürdü Bəhmən?
Qanına boyadı o mərdi nədən?
Etməsin deyə bu ocağa zərər,
Nəsihət vermədi neçin möbidlər?"
Belə cavab verdi sınaqlı kişi:
"Bəhmən əjdahatək gördü bu işi.
Azdırdı yolundan fələk Bəhməni,
Əjdahanın ağzı oldu vətəni.
Ağaca baltanı vurdu pəhləvan.
Ayrıldı tacından, qızıl taxtından.
Ayağı batmışdı bu qədər qana.
Səadət gülməzdi belə insana".
Necə ki, küləkdən bir yarpaq titrər,
Bu sözdən titrədi, əsdi İskəndər.
"Bu körpü asanca keçilməz" dedi.
Daranın qanından dəhşətə gəldi.
Gövhər xəznəsindən qoca pəhləvan





İstədi bəndləri açsın durmadan.
Anlatsın dünyanın bu gedişindən.
Cahangirə layiq hər bir işindən.
Padşahı bir qədər öydükdən sonra,
Pəhləvan ərz etdi o tacidara:
"Bu dünyanın mülkü bənzər bir bağa,
Əlini bərk vurma kövrək budağa.
Bu təzə tarixdən köhnəyə qədər
Kim qalmışdır versin doğru bir xəbər?
Ham Rüstəmi-Zal, Simürğ ilə Sam,
Firiduni-Fərhəng, o Cəmşid və cam?
Yer yedi, keçmədi çox zaman belə,
Yeməkdən qarnı, bax, doymamış hələ.
Köçdülər, bu növbət yetəcək bizə,
Zəncirtək bağlıyıq bir-birimizə.
Dörd tağ altında beş növbət nə gərək?
Şeşdərsiz olurmu bu doqquz fələk?[163]
Bu dünya sənindir, ol ona dayaq.
Düşmənlər yatarkən oyaq ol, oyaq!
Başını qorxusuz dünyadan qoru,
Çəkin o kəsdən ki, bilməyir qorxu,
Uzaq ol bir yol ki, ziyan gətirir,
Bulaşıq bir yola güman gətirir.
Diləkçin kim köynək geysə tərsinə,
Duayla avanda çevirər yenə[164].
Səni də tərs olan hər əyri yoldan,
Dua et, düz yola qaytarsın yəzdan.
Qəlbini çalmasın bu mal, bu dövlət,
Azı bir zillətdir, çoxu fəlakət.
Ağıllı kimsə yol göstərmiş sana,
Malını bənzətmiş candakı qana.
Zəiflik çoxalar qan olanda az,
Qan çox olan zaman tutular boğaz.
Hər yerdə ki, dövlət, sərvət artmışdır,
Üstündə qara bir ilan yatmışdır.
Bəzəkli göylərin tağına bax sən,
Sütunları boşdur vardan, dövlətdən.
Bir tağın altında yaşayıb, anla,

Cüft olmaq gərəkmı qara ilanla?
Bihudə bəndləri qır qəlbdən, yetər,
Sitəmkar deyilsən, ədalət göstər.
Daranın zülmünü gəl sil zehnindən,
Çünki o Daraydı, sən İskəndərsən.
Bax, nə məhsul verdi Daraya cahan,
Elə etmə, sən də görərsən ondan.
Nə etdi ki, sənə ram oldu cahan,
Taleyin ondadır, ayrılma ondan!"
Qocanın sözündən şah çiçəkləndi,
"Uğurlu bir faldır" deyə şənləndi.
Qocanın sözünü saydı bir xidmət,
Ona bağışladı çox böyük sərvət.
İran başçıları xidmətdə durdu[165],
Onun daşlarıyla tərəzi qurdu.
Uzaqdan gələnlər şən dərgahına,
Şahanə məclisə etdilər səna.
Bu dərgahda əgər söndü bir çıraq,
Yerində bir günəş doğdu ən parlaq.
Gün gəldi, bir gecə getdisə bizdən,
Bir çiçək soldusa, güldü bir gülşən.
Birisi arpaca qızıl itirdi,
Ararkən xəzinə ələ gətirdi.
Geniş bir qəlb ilə dəniz şövkətli
Hamıya göründü çox mərhəmətli.
Padşahı görüncə rəiyyətpərvər,
Daranın zülmündən nə demədilər.
İstidə, soyuqda Dara dövründə
Bir ağ gün görmədi kimsə ömründə.
Birliyi ölkədən elə ayırdı,
"İt də yiyəsini tanımayırdı".
Yaxşılar qəlbində doğdu qorxu, kin,
Kimsə öz canından olmadı əmin.
Zülümdən qurtaran dedi hər yanda:
"Mürüvvət rumlarda, mərdlik Yunanda".
Bu qədər ordunun içində ancaq
İki sərkərdəyə şah inanaraq,
Zalım olanlara verdi güc, qüvvət,





Nəhayət, qolunu qırdı təbiət.
Böyüklük verdi kim kiçiksə ona,
Özü də büründü alçaq bir dona.
Padişah sayılmaz elə bir kimsə
Tanrının xalqına əziyyət versə.
Fəlakət verir hər dəyərli şəxsə,
Böyüklük, riyasət verir nakəsə.
Alçaqlıq becərən şahmı sayılır?
Alçaqlıq başqadır, şahlıq başqadır.
Ölkədə qalmadı bəxşiş, səxavət,
Şəhərlər bir gün də olmadı rahət.
Xəzinə qıfılından asıldı ismət,
Yaralar qəlbi kin, zülüm, ədavət.
Ölkədə tərk oldu sənət, sənətkar.
Heyhat, bundan böyük fəlakətmi var?
Sənətkar əl çəkmiş öz sənətindən,
Başqa bir sənətə yapışmış cəbrən.
Pəhləvanlıq edər çöldən gələnlər,
Çöldə şahzadələr qarovul çəkər.
Əkinçi əl qatmış ordu işinə
Əskərlər başlamış əkin-biçinə.
Hər kəs sənətində olmasa azad,
Dünya bu gedişlə olurmu abad?
Çünki bundan əvvəl yatmışdı Dara,
Dünyanın ulduzu geymişdi qara.
Bu gün ən bəxtiyar padşahımız var,
Bu zülüm nə qədər, nə qədər yaşar?
Bu sözdən həyəcan aldı tacidar,
Xalqa belə xəbər verdi carçılar:
"Sənətkar getməsə öz sənətinə,
Yaxşı iş görsə də suçludur yenə.
Əkinçi öküzdən kömək istəsən,
Tarladan, kotandan dilək istəsin.
Ordu işlərinə qayıtsın əskər,
Şəhər işlərinə getməli şəhər.
Yalnız öz işinə getsin hər kişi,
Bərk tutsun əvvəldən bildiyi işi."
Çağırdı hər sənət atan kişini,

Tapşırdı onlara köhnə işini.
Hər kəsin işini çıxardı üzə,
Bir dünya parlatdı, gəlməsin gözə!
Qurtardı dünyanı xarabalıkdan,
Dövründə bu dünya oldu bir gülşən,
Onun hökmü ilə dövr etdi cahan,
Dünyanı saxlayar ağıllı insan.

## İSKƏNDƏRİN İRAN ATƏŞKƏDƏLƏRİNİ DAĞITMASI

Nəşədən, bu coşğun şənlikdən, saqi,
Dur, şərbət hazırla aşiqsayağı!
Füsunlu şərbəti susuza ver sən,
Susuzlar dönərmi meydən, şərbətdən?
Şahanə məclisdə, ey sınaqlı pir,
Odda yandırmağa üzərlik gətir!
Bəd nəzərlər baxır, işlə məşğulam,
Yaman gözlərdən də yaman qorxuram.
Könlüm üzərliktək yanarsa əgər,
Üstümə düşərmi, söylə, bəd nəzər?
Yolkəsən qorxusu Həddən ziyada,
Xoşbəxtdir bilməyən bunu dünyada.
Bu necə həyatdır, hər yanı qorxu,
Hər tərəf fəlakət, hər tərəf cadu.
Ayaq bu pillədən uzaq qoyulsun,
Bu qanlı qazana qapaq qoyulsun.
Köhnə dastanları rəvayət edən
Belə nəql eləyir uzaq keçmişdən:
Diniylə atəşə çöküncə dehqan,
Həm atəş söndü, həm ona inanan[166],
İrana əmr etdi böyük İskəndər:
Atəşpərəstlikdən etsinlər həzər,
Üz çevirsinlər qoy köhnə ayinə,
Pərəstiş etsinlər Xosrov dininə.
Muğların paltarı oda qalansın,
Bu atəşkədələr atəşdə yansın.
İranda adətdir keçmişdən bəri:





Atəşkədə idi alimlər yeri.
Orda saxlanardı sərvət, xəzinə,
Düşməsin başqa bir şəxsin əlinə.
Hər sonsuz varlı da, "savabdır" deyə,
Malını qoyardı atəşkədəyə.
Ölkələr düşmüşkən dərmansız dərdə,
Bir xəzinə idi hər atəşkədə.
Onları kökündən yıxdı İskəndər
Xəzinə axıtdı bir dəniz qədər.
Hər atəşkədənin keçsə yanından,
Yıxaraq xəzinə yığırdı ondan.
Muğlarda belə bir azar da vardı,
Hər ilin başında bir qız alardı
Novruz ilə Səddə bayramlarında[167]
Ayinlər yenidən olurdu bərpa.
Ər üzü görməmiş gəlinlər, qızlar
Evindən sevinclə dışarı çıxar
Əllər al xınalı, üzlər bəzəkli
Hər yandan gəlirdi coşğun ürəkli.
Önündə al şərab hər üzü lalə
Muğlarla üz-üzə vurar piyalə.
Atəşdən, möbidin əfsunlarından,
Tüstüdən don geyər uca asiman.
İşləri keyə, işrət, şux dilbər idi,
Ölkə başdan-başa əfsunkər idi.
Sehirdən başqa bir çıraq yandırmaz,
Əfsanədən başqa bir bilik qanmaz
Hər bir qıvrım saçlı, gəlişi gözəl
Ayaq yerə döyər, şappıldadar əl,
Əlində sərv kimi güldən bir dəstə,
Sərvi də bənzərdi çiçəkpərəstə.
Hər il qızlar bu gün axır hər yandan,
Verirlər bu geniş işrətə meydan.
Hər kəs ayrı-ayrı məclis qurardu.
Hər məclis olurdu yüz fitnə yurdu.
Sözündə çox möhkəm durdu İskəndər,
Dünyadan silindi belə fitnələr.
Bircə padişahdan taxt alır şövkət,

Çox olsa pozulur möhkəm bir dövlət.
Yüz şah olmaqdansa xoşdur bir nəfər,
Yağış çox yağarsa ziyanlıq verər.
Ağıllı İskəndər vermişdi fərman:
Muğların ayini qalxsın ortadan.
İsmətli, örtülü hər gəlin, hər qız
Üzünü ərinə göstərsin yalnız.
Fitnəni, hiyləni qovdu hər yerdən,
Muğları dağıtdı meyxanələrdən.
Dünyadan sildi hər bulanıq dini,
Saxladı ən doğru dini-ayini.
İranda əmriylə söndü hər yerdə
Həm köhnə zərdüştlük, həm atəşkədə.
Dövlətli məcuslar "adətdir" deyə,
Xəzinə vermədi atəşkədəyə.
Üzü nur çiçəyi, hər nazlı gözəl
Atəş gülşənindən artıq çəkdi əl.
Atəş ayinini qaldırınca şah,
Hər atəşpərəstdən göyə çıxdı ah.
İskəndər əmr etdi: - Bu ölkə - torpaq
Tanrıya pərəstiş eyləsin ancaq.
Sığınsın hamısı ulu tanrıya,
Çevirsin arxa bu günəşə, aya.
Elə ki, İranı ovcunda gördü,
O geniş meydanda atını sürdü.
Zəfərlə qol-boyun oldu tacidar,
Nə gözəl söyləmiş incə sənətkar:
Sən yeni bir qanun hökmüncə məndən
Başqa rəmz eşitmək arzu etsən,
Qulağından çıxar köhnə pambığı,
Aç yeni qumaşla dolu sandığı.
Ağıllı kəslərdən bilsən nə qədər
Bu yolda eşitdim dəyərli sözlər.
Əlimə hər çeşid tarix topladım,
Gözümdən hərfi də mən buraxmadım.
Hər yırtıq vərəqdən toz silə-silə,
O dağınıq xəznəni topladım belə.
Bu gizli əsrarlı kimyalərdən





Yaratdım ən incə, gözəl bir məxzən.
O farsca söyləyən bilikli qoca
Belə nəql eləyir tarix boyunca:
Daranın taxtını alınca ələ
Musildən tərpəndi öz ordusiylə.
Zöhrətək Babildən parladı öncə,
Harutu kəsləri təmizləyincə[108],
Əmr etdi möbidlər yandıran odu
Durmadan hünərlə söndürsün ordu.
Zəndin əfsunları atılsın suya,
Alınsın yaxud bir dəftərxanaya.
İbrahim dinini doğru yol bildi,
Atəş tüstüsünü dillərdən sildi.
Aqillər məsləhət gördülər ona:
Oradan tərpənsin Azərbaycana.
Gəlirkən hər yerdə ki, atəş gördü,
Zəndi məhv eylədi, odu söndürdü.
O yerdə ki, alov çıxırdı daşdan,
Məcuslar deyirdi "Özündən yanan."
Yüzlərlə xidmətçi taxmış zər, zivər
Pərəstiş etməyə bağlamış kəmər.
Əmr etdi, o köhnə atəşlər sönsün,
Bir anda kömürə və külə dönsün.
Hirbüdün oduna soyuq su tökdü,
Çox hirbüd belini ikiqat bükdü[109].
Elə ki, o yerdə atəşlər söndü,
İsfahana tərəf İskəndər döndü.
O gözəl, ruh verən abad şəhərdə,
Ürəyi sevinclər saçan o yerdə
İskəndər oldu bir çiçəkli gülşən,
Düşdü kam ardına ürəyi çox şən.
Orda bir saray var incə naxışlı,
Bahar bağçasından nazlı baxışlı,
Məcuslar rəsmiylə Zərdüşt ayini
Ora toplamışdı bir çox gəlini.
Hər gözə bir afət, hər qəlbə düşmən,
İnsan heyran qalır onu görərkən.
O cadunun adı Azər Humayun.

Sam nəslindən idi nəsəbı onun.
Bir əfsun edincə o gözəl afət
Ürəkdən səbr alır, bədəndən taqət,
Haruttək Zöhrənin canını alar,
Yüzlərcə Harutun qəlbini ovlar.
İskəndər əmr etdi təxir etməmək,
Bu ev də kökündən dağılsın gərək.
Cadu qız sür ətlə qalxdı yerindən,
Qurdu bir əjdaha öz peykərindən.
Odlu əjdahanı yaxından görən
Qorudu özünü yanan atəşdən.
Qorxudan yıxılıb duran kimsələr
Çaparaq, padşaha verdilər xəbər:
"Atəşdə qorxunc bir əjdaha vardır,
Fişəngtək ağzından atəş savırır.
Hər igid keçirsə onun yanından,
Öldürür ya udur, verməyir aman."
Bu gizlin sirridən şah fikrə daldı,
Vəzirdən belə bir məsləhət aldı:
- Bu gizli əsrarı Bəlinas bilir,
Tilsimə tanışdır, tökər bir tədbir.
Bəlinası tapdı, sordu İskəndər:
"Bu cadu nə ilə əslinə dönər?"
Dedi: "Əjdahanı, böyük tacidar,
Yalnız bir əfsunçu edər aşikar.
Bu sirri açmağa olsa buyruğun
Başını kəməndə salaram onun".
Dedi: "Hiyləgərdir bu qəlbi qara.
Mümkünsə, durma, et bu işə çara."
Bəlinas getdi tez atəşkədəyə,
Gördü bir əjdaha baş çəkmiş göyə.
Əjdaha görüncə gəlir Bəlinas,
Bildi ki, şüşəni qıracaq almas[170].
Mın oyun çıxardı o sahir cadu,
Yüz insan aldadan Hiylələr qurdu.
Onların təsiri olmadı, yenə
Çarəsiz qayıtdı köhnə sehrinə.
Cadunun əfsunu etməsə əsər,





Əfsunçu yenə öz sehrinə dönər.
Bəlinas hünərlər göstərdi o gün,
Cadunun sehrini bağladı bütün.
İnsana taleyi güldüyü zaman
Cadugər də yaxa qurtarmaz ondan.
Atdı əjdahanın üstünə "əsdab"
Su önündə atəş gətirərmi tab?
Bağladı qolunu bir hiylə ilə,
Başa çıxdı qızın qurduğu hiylə.
Qız gördü Bəlinas hünərlər saçdı,
Cadu hiyləsindən düyümü açdı.
Torpağa düşərək qopardı fəğan,
Padşahın ədlindən dilədi aman.
Bəlinas görüncə o ay üzünü,
Bir sevda xülyası tutdu gözünü.
Gözəl cadugərə o verdi aman,
Xilas etdi onu ovsunçulardan
Əmr elədi, dərhal od yandırdılar,
Atəşkədə yandı - oldu tarü mar.
O pəri üzlünü götürdü şaha,
Dedi: "Bax, bu aydır qara əjdaha.
Ağıllı qadınlar biliklər qurmuş,
Çarxın qulağını əfsunla burmuş
Quyunu çıxarır yerin təkindən,
Ayı yerə salar öz fələyindən.
Zühəlin üzündən qaranı atar,
Hər qara telindən çəkər bir hasar
Sevimli gözəldir, yox ona bədəl,
Pəri də doğmamış belə bir gözəl.
Müşk ilə saçının ucunu burmuş,
Günəşin boynunu kəməndə vurmuş.
Sənin taleyinlə kəsdim yolunu,
Ayırdım şöhrətdən, hörmətdən onu.
Qız qaldı çarəsiz, dilədi aman,
Məni, padişahım, ayırma bundan.
Şaha xoş gəlirsə bu göyərçinim,
Olsun həm xanımım, həm bacım mənim."
Sevimli üzünü gördü İskəndər,

Bəzəkli bir aydır, o pəri dilbər.
Söylədi: "Bu sənin haqqındır, yalnız
Sənin qədəhindən mey içsin bu qız.
Sevsən də rənginə aldanma əlbət,
Onun hiyləsindən eləmə qəflət.
Kəhrəba olsa da əqrəb quyruğu,
Yenə də əqrəbdir, zəhərlidir bu."
Bəlinas təşəkkür edərək ona,
Üzünü sürtərək yolun tozuna,
"Qadınımdır" deyə, evinə aldı.
O gözəl çoxunun qəlbini çaldı.
O qızdan çox cadu öyrənmişdi bu,
Onunçun deyildi "Bəlinas-cadu".
Əfsunçu, münəccim, kim olursan ol,
Ölümə bağlaya bilərsənmi yol?

## İSKƏNDƏRİN İSFAHANDA DARANIN QIZI RÖVŞƏNƏYİ ALMASI

O cənnət suyundan, ey saqi, tez dur,
Atəşlə yoğrulmuş qədəhi doldur!
Əlimi çıxarma o sudan, oddan,
O su və atəşlə mənəm islanan.
Boranlı qışlarda odur bəxtiyar.
Qarşıda manqalı, quşu, meyi var,
Elə bir nar məmə keçirə ələ,
Bağçada narlara salır vəlvələ.
Bahara çatınca nar fidanından
Nar suyu axtarar, nar alar ondan.
Bir zaman dərindən nəzər salınca,
Görər hər budaqda gülür yüz qonça.
Cənnətdən bir guşə kəsilmiş cahan,
Nəşələr, sevinclər saçmada hər yan.
Əlində gözəlin saçları yenə
Sallana-sallana çıxar çəmənə.
Şəkər çeşməsini çiçəklə bəzər,
Dünyada bir zaman şadlıqla gəzər.





Şahlar dəftərini yazan ustalar
Tarix beşiyini belə yırğalar:
İsfahan şəhrində sakin oldu şah,
Başından göylərə ucaldı külah.
İki gün nəşəyə daldı İskəndər,
Dara mişkusundan tutunca xəbər[1].
Kəyan ayiniylə xələtlər saçdı,
Düz yeddi xəzinə ağzını açdı.
Rumun, Misrin, Çinin qumaşlarından
Dəyərli zinətlər yığdı hökmüran.
Şahlara yaraşan dəyərli paltar
Vücudu təzələr, ürəyi oxşar.
Zər ilə işlənmiş qumaşlar, xəzlər
Geyənə istilik, məhəbbət verər.
Çox boyun bağları - xalis gövhərdən,
Bundan başqa hədsiz zərdən, zivərdən,
Möhrü açılmamış müşk ilə ənbər,
Ən incə dəridən nəfis geyimlər, -
Şahın mişkusuna göndərdi dərhal.
Matəm paltarları dönüb oldu al.
Firuzəni mərcanı rənginə saldı,
Matəm laciyərdi qızıl rəng aldı.
Vurdu qara daşa qızıldan zivər,
Məhəkdə qızılı sınamaq istər.
Dara şəbistanı matəmi atdı,
Bənövşə yerinə al gül yaratdı.
O bağa nəşəli yaraşıq verdi,
Sevimli çöhrəyə bir işıq verdi.
Üç, dörd gün səbr ilə oldu çox dəmsaz,
O bahar qönçəsi açılsın bir az.
Gəlinlər bəzəyə alışıb dursun,
Başına ən incə bəzəklər vursun,
Sevgini ürəkdən alsın dimağa.
Üzünü çevirsin işıq - çırağa.
Bildi ki, matəmdən qalmamışdır iz,
Yengini matəmdən elədi təmiz.

Ağıllı vəzirə dedi: "Durma, get,
Addımı, dilini, bacar, geniş et!
Mişkuya gedərək məndən ver xəbər,
Gəlmiş bir iş üçün bura İskəndər.
O Dara nəsəbli, ayüzlünü mən
Görməklə şadlanım, qəlbim olsun şən.
Şux şəbistanına çəkərəm hasar.
Əmrimlə ucalar kənizlər, qızlar.
Qızıldan şahanə bir təxti-rəvan,
Bəzəyi firuzə, inci və mərcan,
Götür o nazənin müşkin dilbərə.
Göy xuraman olub ensin yerlərə.
Yel qanadlı atlar, zərnişan yəhər
Apar, minsin onu qəlbən sevənlər".
Bilici vəzirə şah verdi tədbir,
O əmri yerinə yetirdi vəzir.
Daranın xüsusi evinə getdi,
Evdə olanlarla xoş rəftar etdi.
Dara sarayına getdiyi zaman
Sanki bulaq axır cənnət bağından.
Huriylə dopdolu bir cənnət gördü,
Aldandı, aldadan yüz afət gördü.
Alma üzlü qızla oynayar, gülər.
Sanki alma ilə oynar bir nəfər.
Padşahdan öncə bir salam söylədi.
Yaşınan kəslərə pəyam söylədi:
"Şahanə müşkuya şahdan nur axsın.
Ortadan ikilik büsbütün qalxsın.
Bir xəta işlədi azğın zamana,
Uzatdı əlini bu xanimana.
Ortada böyük bir itki var, bəlli,
Bu işdə olmamış padşahın əli.
Nəhayət, məndə bir belə arzu var
Ki, ümidsiz ondan olsun ümidvar.
Bu evdə xoşbəxtlik quracaqdır şah,
Öz böyüklüyündə duracaqdır şah.





Daranın fərmanı öz zəkasılə,
Gəlibdir qohumluq təmənnasılə.
Şövkətli padşahın istəyi budur:
İsmət pərdəsində parlayan o nur
Olsun şəhriyarın işıq ülkəri,
Tacının Rövşənək olsun gövhəri.
Gözləri nurlansın bu işıq üzdən,
Köşkünü bu güldən etsin bir gülşən.
Bu işə Darayla bağlamış peyman,
Ay üçün göndərmiş bir təxti-rəvan.
Yalnız bu məqsədlə uca tacidar
At çapmış, bu yerdə tutmuşdur qərar.
Bir qıfıl vurmuş hər söyləyən dilə,
Şah özü gəlmişdir bu məqsəd ilə.
Mindirin taxta o pəri peykəri,
İşi tez bitirin, durmayın geri!"
Elçiyə tərcüman belə söylədi:
"Şahın kölgəsində yaşa əbədi!
Bu evə uca şah nəslindən yarar,
Yel ilə gələni yel də sovurar.
Qızıldan yazılsın gərək bu sözlər:
"Çarvadar əkəni dəvəçi biçər."[1]
Taxtının guşəsi bir tacdır bizə,
Taxtının ayağı meracdır bizə.
Kənizək alsa da, alsın, biz nəyik,
Qadın edəcəksə, etsin, bəndəyik.
Əmrindən boynunu qaçıran kimdir?
Hər əmri bir qızıl açar kimidir.
Bu işi edərsə uca tacidar,
Rövşənək başını göyə ucaldar.
Padşaha varmağa qəlbimizdir şən,
Dünyaya gəlmişik şahlar nəslindən.
Hər zaman istəsə böyük şəhriyar,
Birləşmək istəyi tutunca qərar,
Ayını yerinə yetirib daha,
Şadlıqla gələrik uca dərgaha."

Saraya döndü bu xəbərlə vəzir,
Qərarı padşaha anlatdı bir-bir.
Şahın sevincindən parladı üzü,
İnsanı ovlarmış insanın sözü.
Hər cavab qulaqda qoparsa qubar,
Dinləyən ürəkdə kədər doğurar.
Taleyi ona yar olan zamanda,
Baxışlar vüsala dolan zamanda
Atalar rəsmiylə uca tacidar
Eylədi özünə Rövşənəyi yar.
Kəyan rəsminə də riayət etdi,
Ürəkdən çox hörmət, məhəbbət etdi,
Şənlənsin deyə bu ömrünün bağı
Kəbinə yazıldı İran torpağı.
Əmr etdi: çırmənsin iş bacaranlar,
Bəzənsin, düzənsin hər küçə, bazar
Rum ilə Xarəzmin ipəkləriylə,
Ölkələr bəzənsin bəzəkləriylə.
Padşahın istəyi kimi İsfahan
İpəklə, gövhərlə bəzəndi əlvan.
Qapılar, bacalar, damlar, küçələr
Gözəl xalçalardan aldılar zivər.
Bayraqlar dikəldi uca göylərə,
Bu dünya aldı bir başqa mənzərə.
Hər küçə başında çadır quruldu,
İşlərin gedişi başqa tövr oldu.
Hər çarsu başında mütrüblər oynar,
Oturmuş xanəndə, çalğı çalanlar.
Çalğıdan hərarət gəlincə uca,
Düşməni ud kimi salırdı oda.
Zindərud nəhrindən Xuzanə qədər
Çalğının səsindən canlandı yerlər.
Şərab bir çay kimi axıb gedirdi,
Mamişan dodağı onu dişlərdi.
İsfahan gülləri ətir saçırdı,
Tərazın müşki də ağız açırdı.





Toya al çiçəklər səpirdi şəfəq,
Şəkərdən ay, günəş doldurmuş təbəq.
Sanki bir saraydır tikmiş şəkərdən,
Bir günbəd ucaltmış al çiçəklərdən.
Dəbdəbə, şövkətdən coşmuşdu hər yan,
Ətrafa can verir çalan, oxuyan.
Qaraltı incə bir qumaş geyincə
Müşk ilə, ay ilə bəzəndi gecə.
Göydə ay parlaq bir sədəfə bənzər,
Kərx əttarı ona səpərdi ənbər.
O müşkin saçlı ay şaha ərmağan
Qənd, badam düzəltdi gözdən, dodaqdan.
Onları göndərdi şah mişkusuna,
Layiqdir müşk ilə mah mişkusuna.
Al günəş o səhər şəfəq sökərkən
Çıxdı bir gəlintək incə ipəkdən.
Çırpındı şah qəlbi gəlin eşqiylə,
Sanki rus zəngidir salmış vəlvələ.
Çalğıdan, şərabdan qurdu bir işrət,
Utandı, qibtədən tər tökdü cənnət.
Dostlarla içərkən artır fərəhi,
Şərabdan dönürdü başı, qədəhi.
O qədər xəzinə bəxş etdi o gün,
Yer onu çəkməkdən olurdu düşgün.
Gecə al günəşdən düyümü dəldi,
Şəfəqin əlinə bir əqiq gəldi.
Onu də uddu Busəhaq firuzə,
Busəhaqlara bax, ilişdi sözə[171].
Vüsala yetişmək üçün İskəndər
O müşkin mişkuya göndərdi xəbər,
Rövşənək olsun bir işıqlı çıraq,
Gəlsin, qədəmindən zinət alsın bağ.
Dedi Rövşənəyə sevimli ana:
"Gedirsən İskəndər şahın yanına.
Qiymətli yaqutsan İskəndər üçün,
Bir inci gövhərlə birləşsin bu gün.

Bu dövlət əqdinə bir arxa verək,
Yenə də ölkədə padşahlıq sürək.
Əmrindən yaramaz boyun qaçırmaq,
Sənə bu Rum şahı layiqdir ancaq.
Saçından xidmətə bağlarsan kəmər,
Taleyi sənə də səadət verər.
Ondan başqa hər kəs adını çəkər.
Saçıntək başları kəmərə dəyər[174].
Qulağında qızıl halqa daşısan,
Qapı halqasıdır onsuz bu halqan.
Rəftar et ki, odur bu gündə Dara,
Daratək bizimlə edər müdara".
Ananı dinlərkən o sevimli qız
Həyadan tər tökdü, baş əydi yalnız.
Saraya hərəkət əzmiylə durdu,
Ay kimi qızıldan taxta oturdu.
Aldılar padşaha məxsus gərdəyə,
Hər tərəf sarıldı ipək pərdəyə.
İskəndər səxavət əlini açdı,
Məclisin gözünə bir heyrət saçdı.
Şahdan hədyə aldı xidmətçi, dayə,
Qızıldan gövhərdən verdi hədiyyə.
Yabançı kəslərdən boşaldı saray,
Bir yerə toplandı günəş ilə ay.
Mehriban anası gəldi irəli,
Dənizə tapşırdı incə gövhəri:
"O uca padşahlar nəslindən nişan
Yalnız bu boy atmış sərvdir qalan.
Mən ona demirəm qiymətli gövhər,
Ya da ki, ərinə adlı-sanlı ər.
Atasız qalmışdır, dərdə salınmış,
Yetimdir, əlindən mülkü alınmış.
Əmanət tapşırdım sənə bir çiçək,
Bir sən bil, bir əqlin, bir də gələcək".
Şah qəbul edərək yanaşdı ona,
Yoldaşlıq tacını qoydu başına.





Şümşada tay oldu bəzəkli süsən,
Sevimli bir sərvə yurd oldu çəmən.
O gövhər ləlindən uca İskəndər
Başladı almağa dəyərli gövhər.
Gördü bir pərıdir sevimli dilbər,
Pərəstiş etmədə ona pərilər.
Canlı bir sərv idi, xurmadır barı,
Şəkərə dadımlıq verir göftarı.
Füsunkar gözləri kəskin, can alan,
Hər dərdə şəfadır, xəstəyə dərman.
Dirsəyi qısadır, saç, gərdən uzun,
Dodağı şəkərdir, xalı da uyğun.
Çənəsi sadədir, sallanmış buxaq,
Qaynar gözlərində gülabdan bulaq.
Bəslənmiş qırmızı qanla ciyərtək,
Sanki göz içində parlayır bəbək.
Duz səpsə sağalar xəstə ürəklər,
Dodağı dünyaya saçar çiçəklər.
Hər gülən dodağı şəkər saçardı,
Gülüşü gülüşə bir yol açardı.
Gözündən gül üzə gülablar axmış,
Beli incə idi, sinəsi qalxmış.
Qıvırcıq saçları müşkə çalırdı,
Günəş çeşməsinə kölgə salırdı.
Çeşməni, kölgəni görüb şəhriyar
Mənzilə yetişdi, oldu bəxtiyar.
Vəfalı gözləri xoş gəldi ona,
Ürəyi çırpındı, basdı bağrına.
Sıxıb qollarını boynuna saldı,
Kam aldı, kamından kamı-dil aldı.
Rövşənək işıqlı çıraqtək yandı,
Eyvanı cənnəttək nura boyandı.
"Cahanbanu" deyə, yeni ad taxdı,
Bütün ixtiyarı ona buraxdı.
Olduqca ayıqdı, dinc və həyalı,
Söylənməz sözlərdən ağzı qapalı.
Şahlığın açarın ona tapşırdı,

Başının tacını göyə qaldırdı.
Onu görməsəydi dözməzdi bir an,
Ayrılmazdı onun bir an yanından.
O behişt ölkədə şad bir ürəklə
Yaşadı cənnətdən gələn mələklə.
Səhər çöhrəsindən pərdə atarkən
Həbəşə bac üçün dağ çəkdi Xütən[17].
Getdikcə köpürür xoruzlu bardaq,
"Nuş olsun, iç" deyir xoruz coşaraq.
O tovuz dodaqlı kuzə ağzından,
Küplərdən camlara tökərdi al qan.
O məclis, o şərab, o çalğı, o çəng
Dünyanın üzünə verdi başqa rəng..
Yeddi ölkə şahı Kəyan rəsmiylə
Yeddi çeşmə kəmər bağlamış belə.
Günəştək taxtına oturdu səhər,
Fələk xidmətinə bağladı kəmər.
Yenidən bir içki məclisi qurdu,
Görənin başından ağlı uçurdu.
Məclisə düzüldü yararlı kəslər,
Hər gələn yer tutdu hünəri qədər.
Mütrüblər, çalğılar saçardı fərəh,
Saqi ruh verirdi əlində qədəh.
Coşduqca kamança və sazın səsi,
Çay kimi sılırdı başqa həvəsi.
İskəndər yenidən açdı xəzinə,
Öz səxavətinə başladı yenə.
Çox hədiyyə aldı İran əsgəri,
Başını parlatdı öz ətəkləri.
Hər kəsə payladı şahanə xələt,
Verdi bu dünyaya başqa bir zinət.
Uca bir günəştək verərkən ziya
Nurundan çox fayda alırdı dünya.
Günəş xəzinəsi daima axar,
Şimşək nuru isə bir kərə çaxar.
Səxavətli olsun gərək cahandır,
Şahlığın xisləti, bax, belə yaşar!





# İSKƏNDƏRİN İSTƏXRDƏ TAXTA OTURMASI

Muğlar çırağını, saqi durmadan
Mənə ver, qəlbimdən qoparma fəğan!
Gözlərə aydınlıq verər bu çıraq,
Qəlbimin çırağı ondan alır yağ.
Söylə, ey söz, nədir sənin kimyan?
Kimdir bu sikkənə kimiya vuran?
Səndən ki alınır bu qədər bəzək,
Hələ əskilməmiş bir hərfin gerçək.
Evimdən çıxdınsa, üz qoydun hara?
Qapımdan uzaşdın hansı diyara?
Bizdən baş verərkən bizdən uzaqsan
Naxışlar vururkən gözdən uzaqsan
Qəlbimin iş evi fərmanındadır.
Dil xidmətçi kimi divanındadır.
Bilmirəm nə quşsan, gözəlsən, şənsən.
Bizdən ən dəyərli yadigar sənsən
Söz ki var, ucadır hər bir ucadan.
Mətahın qıtlığa düşməsin bir an.
Dəyərli bir mətah olurmu kəsad?
Olursa, həsəddən doğar bu fəsad.
Ey sözün ustası, durma, söz gətir,
Şerin büsatını yerinə yetir.
Ad-sanla kim yatıb - onlardan söz aç,
Heyrət edənlərə söylə, əfsun saç.
Keçmişi nəql edən ravilər belə
İncə bir düşüncə, doğru rəy ilə
Nəql edir: Elə ki, uca şəhriyar
İsfahan şəhrində oldu bəxtiyar,
Firuzə fələyin səadətindən
İsfahan şəhrində etmədi məskən.
Tac qoymaq üçün o, İstəxrə köçdü,
Kəyumərs, Keyqubad yerinə keçdi.
Onunla böyüdü, bəzəndi İran,
İgidlər arxası bərkidi ondan.
Başçılar dedi: "Eşq olsun, tacidar!"
O böyük baş ilə ucaldı başlar.

Töhfələr verdilər taxtına layiq,
Padşahın oyanan baxtına layiq.
Nılın mənbəindən ta Kəngə qədər,
Çin dənizlərindən ta Zəngə qədər
Elçilər axışdı xərac verməyə,
Taxtına, tacına alqışlar deyə.
Taxtına basınca ayaq şəhriyar
Söz xəzinəsindən açdı tunc hasar:
"Eşq olsun, eşq olsun, ulu yaradan
Xalqını yaratmış haqqa inanan.
Torpaqdan başını bir mən kiminin
Ucaltdı, ulduzla etdi həmnişin.
İrana gətirdi Rumdan çəkərək,
Əmriylə daşları yumşaltdı mumtək.
Başımı o qədər ucaltdı zaman,
Yüklü gəcavəmi daşıyır dövran.
Öyrəndim o adil, ulu tanrıdan,
Ədalət yolundan dönmərəm bir an.
Yoxsula, məzluma olaram kömək,
Qaranlıq gecəyə parlayan şimşək.
Ağlımla düşüncəm olmuş mənə yar,
Bu dünya himayəm altında yaşar.
Doğru bir yol ilə bu gün getməli,
Sabahkı günümsə bəllidir, bəlli.
Qorxaram bəhanə tapmaq günündən,
Pəhrizə çalışdım varlığımla mən.
Nə aciz qarınca, nə də güclü fil
Əlimdən bir zərər görməz, onu bil.
Ovcumun içində olsa da, yenə
Dikmərəm gözümü özgə mülkünə.
Xalq mənə versə də əziyyət, kədər,
Qıymaram incisin məndən bir nəfər.
Kənd ocaqlarından alıram xərac,
Şəhərdən nə vergi istərəm, nə bac.
Əlimə keçsə bir xəzinə, sərvət,
Hər kəsə verərəm, layiq bir qismət.
Məndən sənət alar hər bir sənətkar.
Əlinə dövlətdən verərəm açar.





Qaldırram hər kimin varsa hünəri,
Zəncirə çəkərəm divanələri.
Düşkünlər, dilsizlər tapacaq aman,
Qurtulmaz əlimdən boş yeyib yatan.
Vücudu sağlamlar bunu bilməli,
Sənətdən gərək boş qalmasın əli.
Görsəm ki, bir nəfər çəkir çox zəhmət,
Qazancı xərcini ödəmir əlbət,
Elə möhtaclara, söz verirəm mən,
Köməklik edərəm öz xəzinəmdən.
Din ilə, ağılla tutaram işi,
Yoluna qoyaram alış-verişi.
Bir işdə kimsədən qorxum yox mənim,
Qorxanlar önündə titrər bədənim.
Dəyirman yemidir fayda verməyən,
Əfvə layiqləri bağışlaram mən.
Dünyaya bəxşişlə vurmuşam bəzək,
Əlaçıq kimsəyə edərəm kömək.
İskəndər kimsəyə verməz əziyyət,
Zalımı qəhr edər, məzluma hörmət.
Hər bir yaxşılığa bu şah yüz verər,
Bir yamanlıq edən bir cəza görər.
Kim günah işləsə cəzaya çatar,
Peşiman olursa, ədlim bağışlar.
Əlimdə məhv olur başı dik düşmən,
Peşiman olursa, bağışlaram mən.
Mənəm yaxşılığı öncə başlayan,
Yamanlıq başlayan düşməndir, düşman.
Mən ələk kimiyəm, ələrəm torpaq,
Dəyərsiz qalığı ataram ancaq.
Bir dolam, quyudan suyu çəkərəm,
Bu başdan alıb o başa tökərəm.
Qılıncla hər nə ki, keçirsəm ələ,
Paylaram yenə də qamçı ucuyla.
Bu taxtın başına keçmək, haq bilir,
Düşkünə əl tutmaq məqsədilədir.
Vücudum olmuş həm bulud, həm günəş,
Bir əlimdə su var, birində atəş.

Önümə daş çıxsa dönər bir muma,
Əkini suvarram çıxsa qarşıma.
İrana mən özüm gəlmədim Rumdan,
Bu mülkə göndərmiş böyük yaradan,
Haqqı və batili ayırd edim mən,
Alır bağlı qıfıl açarı məndən,
Din daşıyan başlar qalxsın əflakə,
Dinsiz başları da tullayam xakə.
Ehtiyac adını qaldırdım artıq,
El ilə çırağa verim barışıq.
Hər evdə firiştə doğurum divdən,
Bir bina ucaldım hər uçuq evdən.
Harda ədalətim olsa hökmüran,
Qırqovul zərrəcə qorxmaz tərlandan.
Sürüdə qoyuna qurd olar çoban,
Marala, ceyrana toxunmaz aslan.
Yamanı edərəm yaxşılıqla ram,
Yaxşılar yamanlıq etsə qoymaram.
Hər başı göylərə qaldırsam, bir də
O başı bir daha görməzlər yerdə.
Mənə tay olandan qopardım ciyər,
Qoymadım dağıtsın başqa vəhşilər.
Kimsəni yaxmadım gizlin zəhərlə,
Aşkara bağrını dəldim xəncərlə.
Nə dünya üstündə alovtək axdım,
Nə də ki, səbəbsiz bir xırman yaxdım.
Kimsənin qəlbini haqsız qırmaram,
Qırsam da, varımdır əldə mumiyam.
Birinin gözünü ağrıtsam əgər,
Öz əlimdən darı tökmək də gələr.
Bu işdə mənə yar olsun yaradan,
Bu yaman gözlərdən qorusun hər an."
Bunları söylərkən bir-bir İskəndər,
Göylərə ucaldı dinləyən əllər.
Məclisdə var idi adam hər yandan,
Birisi elədi şahı imtahan,
Natiqlik düşkünü, hədsiz söyləyən,
Divanə xislətli hikmət öyrədən,





Bir casus vardı, tez öpdü dərgahı,
Sınamaq istədi İskəndər şahı:
"Şahım, bir dinara ehtiyacım var,
Versəniz, dünyaya dəyər bu dinar."
Gülərək söylədi ona İskəndər:
"Şahdan bəxşiş istə rütbəsi qədər."
O casus söylədi: "Səxavətli şah,
Bir dinar verməkdən utansan hərgah,
Dünyanı bağışla mənə bir kərə,
Qaldır bu başımı uca göylərə."
Şah dedi: "Ey şaşqın, bu dəfə yenə
İstəyin müvafiq deyil ölçünə.
Çox yersiz iki şey istədin məndən,
Biri məndən kiçik, digərindən sən.
Hər sözün xüsusi bir ölçüsü var,
Ölçüsüz söylənən söz qulaq yırtar.
Bir söz ki, daşlara düyün vuracaq,
Gözəl söz olsa da söyləmə, burax."
Padşahdan soruşdu bir igid oğlan:
"Xalq neçin alçaqda, sən ucadasan?
Deyirsən hamı bir yoldaşlıq, ancaq
Nədir bu aşağı, yuxarı? Burax."
Dedi: "Mən başçıyam, xalq isə ümmət,
Baş yerə enərsə pozular şövkət.
Otlara yaraşar başını əymək,
İnsanın başıysa ucada gərək.
Padşahın mövqeyi olmalı uca,
Görənlər nur alsın ondan doyunca."
Başqa bir dilavər dedi: "Şəhriyar,
Ağıllı kimsəyə bəzək nə yarar?
Qəlbində var sənin tanrı sifəti,
O palçıq vücuda vurma zinəti."
Şah dedi: "Şahanə dəbdəbə, şövkət
Gözlərə bəxş edər yenilik, əlbət.
Onunçun edirəm özümü gülşən,
Gözümüz nurlansın, ürək olsun şən.
Görmürsən, atlaz don geyincə bahar,
Nə qədər zövq alır ondan ruzigar?"

İnandı ağıllı kəslər bu sözə,
Qulaqdan asdılar yaqut, firuzə.
Oldular yenidən şaha sənaxan,
Hamısı ürəkdən bağladı peyman.
Xalq onu səbirli görüb oldu şən,
Ömrünə baş əydi hamı yer-yerdən.
Cəmşidin rəsmiylə böyük İskəndər
Taxtının başına keçdi bir səhər.
Daima göründü xalqa mehriban.
Böyüklər rəsmini tutdu hər zaman.
Məktublar göndərdi hər bir diyara,
Hər hüdud bəyinə, hər bir sərdara.
Ədliylə o bütün qəlbə girmişdi,
Basqından hər kəsə aman vermişdi.
Dünyanı özünə etmişdi o, ram,
Ram etmək yolunda tutmadı aram.

## İSKƏNDƏRİN DARANIN QIZI RÖVŞƏNƏYİ RUMA GÖNDƏRMƏSİ

O yaqut qədəhi, saqi, birbaşa
Mənə ver, ayağım toxunmuş daşa.
Bir çarə arayım, daşlıqdır hər yan,
Yaquttək özümü qoruyum daşdan.
Fələk dəvəsini sür ətlə sürür,
Ondandır ki, gündə bir oyun doğur[178].
Peşəsi sülhdür, döyüşdür hər an,
Keçirir gündə bir rəng xəyalından.
Keçmişi bir kərə alsan nəzərə,
Görərsən bənzəmir bu günkülərə.
Tanrının verdiyi pərvərişlərlə
Hər gözəl girmişdir başqa bir şəklə.
Sanma biz yatarsaq yatar ruzigar,
Bu ev heç bir zaman olmaz tarümar.
Çoxları köçmüşdür köhnə dünyadan,
Bu dünya yenə də həmandır, həman.
Dəyərli kişilər keçib getdilər,





Dostlar da onları təqib etdilər.
Yoluna azuqə hazır et bir az,
Dost olan dostundan geridə qalmaz.
Nə qədər yolu pis getsə də, bişəkk,
Axura düz gedir hər çolaq eşşək.
Nəql edir köhnədən tarix yazanlar.
Olmamış şahların taxtı zülmkar.
İskəndər dünyanı tutduğu zaman
Şəxsi istəyinə uymadı bir an.
Çalışdı dünyanı islah etməyə,
Onunçün yetmişdi bu böyüklüyə.
Şahlıqda bir örnək al İskəndəri,
Sən də gör İskəndər görən işləri.
Bu dünya mülküylə oldu bəxtiyar,
Onun istəyinə uydu ruzigar.
Həbəş və Xorasan, Qurdan da Çinə
Qol gücü görmədən keçdi əmrinə.
Elçilər, qasidlər getdi hər yana,
Sikkələr vuruldu onun adına.
Bir aslan ürəyi çarparkən onda,
Dünyanı tutmuşdu qılınc altında.
İrana mana bilmədi sərdar,
Rumlu öz yurdunda salamat yaşar.
Bir gecə uyaraq göylər baxtına,
Doğru bir məsləhət verdi taxtına.
Vəziri çağırdı, ona söz açdı,
Bu gizli fikrini ortaya saçdı:
"Madam ki, əlimə keçmişdir İran,
Bu yerdə bağlanıb qalmaqdır ziyan.
Daima dolanır bu yeddi fələk,
Dünya seyrinə var məndə də istək.
Görüm bu dünyada yeni nələr var,
Varmıdır məndən də güclü tacidar?
İşıqlı fikrimcə budur məsləhət
Dünyanı gəzməyə çıxarkən, əlbət,
Xəzinə, dövləti Ruma göndərmək.
Oraya etimad bağlamaq gərək.
Hər işdə lazımdır ayıqlıq, diqqət,

Hər kuzə çeşmədən çıxmaz sələmət.
Taxtımın başını tutar bir düşmən,
Taxtımdan, tacımdan ayrılmaram mən.
Dünyanın çəkilməz bəlaları var,
Bu yolun qorxusu, cəfaları var.
Ruma dön, orada məskən elə, qal,
Mənim də fikrimə uyğundur bu hal.
Fitnədən o mülkü qoruyursan sən,
Çünki ay nayibdir ışıq günəşdən.
Rövşənək xatunu götür bərabər,
Onunla ölkənin işi düzələr.
Bir fikir doğunca günəş ağıla,
Hər yaxşı-yamana bir ölçü saxla.
Nayibsən, işi gör, dinlə ədl ilə,
Məni yaxşılıqla gətir sən dilə.
Onunçun bəyəndim səni hər kəsdən
Böyüklük gözüylə sənə baxdım mən".
Sözə başlayaraq hünərli vəzir,
O buyruq verənə göstərdi tədbir:
"Padşaha layıqdır hər buyruq, fərman,
Əmriylə iş görür hər iş bacaran.
Getdikcə şövkətin kəmalə dolsun,
Qərəzlə istəyin qol-boyun olsun,
O uca rəyiniz göstərdi tədbir,
Qarşını görməkdən ziyanmı gəlir?
Şahın göstərdiyi uğurlu işə
Mən boyun qoyaram, düşmə təşvişə.
İşində, gücündə, ancaq, hər zaman
Ayıq olmalıdır uca hökmüran.
Bu mübarək səfər çatınca sona,
Dönüncə yenə öz doğma yurduna,
Ağır iş deyildir böyük sərvərə
Dünyanı tapşırmaq iş bilənlərə.
Dövləti saxlamaz yalnız bir nəfər,
Dünyanı özünə bağlamaz bir ər.
Dünyada var saysız ölkə və dövlət.
Bu dövran hər kəsə ayırmış qismət.
Ram etsən özünə tanrı verəni,





Qismətin ondadır, o tutar səni.
Hər padşah əmrinə boyun əyincə,
Hər ölkə, hər tərəf sənindir məncə.
Olsa düşman evi sənin torpağın.
Cilovu başına buraxma, saqın.
Başqalar mülkündə durmaq nə yarar,
Vurma ayağına onunla cıdar.
Yad mülkü nə əldə saxlamaq olur.
Nə də varına bel bağlamaq olur.
Sanma bu dünyada çarpışma yoxdur.
Hər kəs bir ağadır, göz dikən çoxdur
Riyasət fikriylə burda, ey salar,
Rumlardan kimsəni etməzsən sərdar.
Kəyan ovlağıdır əcəm torpağı,
Orda bir vəhşidir yadlar ayağı.
Nə qədər xatadan uzaqdır həyat,
Dünyada padşahlıq adını ucalt.
Ölkənə dönərkən uzaq səfərdən,
Qısaltmış olarsan uzun işi sən.
Sən güldür üzünü şahzadələrin,
Silinsin qəlbindən qəmin, kədərin.
Hər şahı layiq bir ölkəyə göndər.
Nə yeri istərsə o yerə göndər.
Hər biri bir səmtə tərəfdar olsun,
Hər tərəf bir şaha giriftar olsun.
Qorxuram əcəmlər qalxsın yenidən.
Daranın qanını almaq istərkən,
Yunana və Ruma çıxarsın ordu,
Dağıtsın ölkəni, nəyə gərək bu?
Hər biri padşahlıq edərsə tək-tək
Ortada düşmənlik artacaq, bişəkk.
Hər kəsi mülkünün qayğısı alır,
Ölkəmiz düşməndən sələmət qalır.
Düşmənlər talana başlarsa ancaq,
Yolunu bununla olur bağlamaq.
Bir də ölkələrdə kin toxmu saçma.
Yurduna düşmənin yolunu açma.
Qoyma qanla yusun şahlar dünyanı,

Qoy alovlanmasın düşmənin qanı,
Sanma dik başların tökdüyü qandan
Səyavuş qanıtək qalmaz bir nişan.
Yersiz qan tökməkdən daim dur geri,
Qanlıdır səninlə çarxın xəncəri.
Ərənlər söyləmiş nə gözəl məsəl:
"Dəyməz dəyməyənə ziyanlı bir əl."
Yetməsin kimsəyə səndən qəm, kədər,
Az ziyan verənlər az ziyan çəkər.
Xor baxma, alçalmaq sığmaz hər başa,
Kimsəni öldürmə, əbədi yaşa."
Vəzir yol göstərdi, tökdü çox tədbir,
Sözləri padşaha eylədi təsir.
Dövran gümüş teştin ağzını açdı,
Qara qarğa qızıl yumurta saçdı[178].
Qoca möbidlərsə tarix boyunca
Yumurta və teştdən demiş doyunca[179].
İskəndər ağlıyla tökdü bir tədbir,
Əmr etdi: tez gəlsin, atlansın vəzir.
Orda kitabxana varsa nə qədər,
İşarə elədi, tez gətirsinlər.
Hər çeşid elmdən dəyərli sözlər,
Hər incə hikmətdən açdı bir dəftər.
Yunana göndərdi tərcüman ilə
Çevirsin bir dildən başqa bir dilə.
Padşahın əmriylə gəldi Ərəstu,
Durmadan at çapsın Yunana doğru.
Rövşənək xanımı alsın bərabər,
Götürsün xəzinə, kitab və dəftər.
İranı tərk etdi şahın əmriylə
Yunanın yolunu keçirdi ələ.
Rövşənək padşahdan hamilə olmuş,
Sədəfin qoynuna inci qoyulmuş.
Yunana yetişdi dəbdəbə, əskər,
Yükdən inləyirdi o nazlı gövhər.
Doqquz ay olunca, gövhər mədəni
Dünyaya bəxş etdi öz gövhərini.
Beşiyi öpərək oldular dilşad,





Uşağa qoydular İskəndərüs ad.
Ərəstu vəkildi şahdan, həm vəzir
Padşahlıq işində tökürdü tədbir.
Yeməkdə, içməkdə o şahzadəyə
Verirdi can kimi gözəl tərbiyə.
Cismini bəslərdi nazla, nemətlə,
Körpə qəlbini də şüur, hikmətlə.
Yüzlərcə gəlmişdir belə gözəllər,
Onu torpaq yemiş, qalmamış əsər.

## İSKƏNDƏRİN ƏRƏBİSTANA GETMƏSİ VƏ KƏBƏNİ ZİYARƏT ETMƏSİ

Ey saqı, əl uzat qəm qovan meyə,
Durma, ver mən kimi qəlbi dərdliyə.
Rahatlıq ətriylə dirçəlsin bu can,
Qurtulum kədərdən, qəmdən bir zaman.
Yaxşıdır hər falı xeyr işə yormaq,
"Rux"u yox, oyunda "şahrux"u vurmaq[180],
Alçalırkən belə uca görünmək,
Sarsılıb durarkən yenə öyünmək,
Şam kimi bağrının içindən yanmaq,
Zahirdə sevinclə nura boyanmaq
Hər işdə bir miskin aciz qalınca,
Qaçar acizlikdən falçı dalınca.
Əlinə keçirir daş, qumdan açar,
Daş, qumdan çox zaman dəmir də çıxar.
Bir qapı qeybdən yox olsa hərgah,
Kimsə aça bilməz, açar bir allah.
Xeyrə vur falını, faydan ondadır,
Çünki xoş fal vurmaq uğur yaradır.
İnləmə "xəstəyəm" deyə, ey filan,
Desən ki: "sağlamam" sağlam olarsan.
Hər işdə bizdən bir qürə atmaqdır,
İşləri sazlayan yalnız o haqdır.
İnsaf bu pərdədə bizə məhəkdir,
Tərs pərdə çıxarmaq nəyə gərəkdir.
Könül, pərdə dardır, sən mənə yar ol!

Pərdə yırtanlardan sən pərdədar ol!
Bu parlaq beytləri hekayət edən,
Mənim ziynətimə yaraşıq verən
Nəql edir: dünyada olunca yiyə,
İskəndər xeyməni vurunca göyə,
Şahın fərmanıyla hər nə dövlət var,
Yunana daşıdı mətin adamlar.
Dünya hiyləsindən olunca iraq,
Dolaşmaq fikrinə sarıldı qıvraq.
Ədlindən müjdələr alınca dövran,
Bir qətrə içmədi onu anmadan.
İskəndər uğurlu şah olduğundan
İşində ayıqdı hər an, hər zaman.
Dünyanın sazını əlinə aldı,
Ancaq şəfqət deyə xoş hava çaldı.
Kəməndi altına girincə dünya,
Uymadı ürəyə yatmaz havaya.
Böyük kimsələrə vermədi ziyan,
Asayiş altında yaşadı hər yan.
Dikbaşlıq edəni öldürürdüsə,
Yerinə qoyurdu ən yaxşı kimsə.
Ölkədə bir şəhər yıxsaydı əgər,
Qurardı ondan da gözəl bir şəhər.
Bu dünya belədir, bu vaxta qədər
Birini yıxarsa, birini tikər.
İskəndər başladı abad etməyə,
Oldu hardan-hara İskəndəriyyə.
Çindən Qeyruvana yol var nə qədər
Uca dərgahına axdı qasidlər.
Hər padşah vəsiqə alırdı ondan,
Ölkələr sığındı ona hər yandan.
Dəyərli töhfələr gəldi hər yerdən,
Adına yaraşan zərdən, zivərdən.
İskəndər əmr etdi, cavab olaraq
Məktublar müşk ilə yazılsın ancaq[18]
Bir zaman ötmüşdü bu qərar üzrə,
Göylər dəfələrlə baş vurdu yerə.
Padişah dünyanı gəzməkçin yenə,





Hazırlıqla düşdü səfər qəsdinə.
Oxumuş ərəbdən gələn məktubu,
İllərcə qəlbində qalmış arizu.
İstədi büsatı İranda qursun,
Ərəb də bu yolda ona baş vursun[18].
Kəbəni ziyarət etsin bir zaman,
Sevinsin mübarək fallı naxışdan.
Hökmüran olunca bütün İrana,
Xeyməni köçürdü Ərəbistana.
Xəzinə topladı bir neçə xalvar,
Biyaban yolunu tutdu şəhriyar.
Ərəb başlarını onun baxşışı
Əydirdi büsbütün əmrinə qarşı.
Görüncə əmrinə ram olmuş zəfər,
Hökmünə baş əydi dikbaş ərəblər.
Yel kimi at sürdü Ərəbistana,
Ərəblər düşmədi ondan ziyana.
Hər yerdə atını edincə rahət,
Həm bəxşiş saçdılar, həm hədsiz nemət.
Hər çeşid lüzumlu yeməkdən başqa,
Bəslənmiş sürülər verməkdən başqa,
Gücləri çatdıqca şahın önünə
Hər yerdən çəkdilər ağır xəzinə.
Səhralar dolaşan görkəmli atlar,
Zəhərdən su içmiş parlaq qılınc var,
Boyu otuz arəş, üstü çox parlaq,
Nizələr, qan ilə bəslənmiş mızraq.
Yüyənsiz dəvələr, löklər hər yandan,
Toz, torpaq içində yel kimi uçan.
Bunlardan başqa çox bəxşişlər daşdı,
Yüklənən gön, dəri, nəfis daş-qaşdı.
Ona hörmət üçün hey zaman-zaman
Hər yerdən çəkildi yüklənmiş karvan.
İskəndər xəzinə ağzını açdı,
Qızılı, zinəti xalvarla saçdı.
Atlazdan səhraya fərşlər açaraq,
Yaqutlar altında gizləndi torpaq.
Yanaşdı Kəbəyə şən bir üz ilə,

Həccin əmalını öyrəndi belə.
Dünyanın nafinə basmışdı ayaq
Aləmin nafindən ənbər açaraq.
Çarxın pərgarıtək mərkəz nöqtəni
Dolaşdı, ziyarət etdi Kəbəni.
Təvafı olduğu kimi bitirdi,
Kəbə halqasını ələ gətirdi.
Öpərkən Kəbənin qapılarını
Ürəkdən andı o, böyük tanrını.
Başını mübarək qapıya vurdu,
Xəzinə saçaraq yoxsul doyurdu.
Qızılı su kimi edərdi rəvan,
Dəvə bağışladı o karvan-karvan.
Doğrular evində tutunca qərar
Tanrıya pərəstiş etdi tacidar.
Kəbəni xəzinə-gövhərə tutdu,
Damları müşk ilə ənbərə tutdu.
Təvaf işlərindən azad olaraq,
Basaraq Yəmənin gönünə ayaq[18],
Parlatdı Yəməni ordunun tozu,
Gönü parladantək Süheyl ulduzu,
Oradan atını İraqa sürdü,
Yunana dönməkçün hazırlıq gördü.
Böyük Azərbaycan hökmüdarından
Bir elçi gələrək dedi: Hökmüran,
Nə üçün ram etdin bütün dünyanı?
Sildin ruzigardan zülmü, tüğyanı?
Verdin hər ölkəyə qurtuluş, aman,
Ermənistan nədən çıxdı xatırdan?
Doğduğun şəhərə bu yaxın ölkə
Nə üçün bürünsün qaranlıq kölgə?
Ermənistan oda ibadət edər,
Başqa padişaha itaət edər.
Orda Ad nəslindən bir pəhləvan var,
Qüvvəti Rüstəmin gücünə çatar.
Adı Dəvalidir, hər bağrı yarır,
Aslan dərisindən yosun qoparır.





Ermənistandakı bütün igidlər
Yalnız bu padşaha boynunu əyər.
Hər kəs badə içər onun adına,
Yaxın ölkələrdən bac gəlir ona.
Ordunla bu səmtə hücum etməsən,
Ölkəni şübhəsiz alacaq bizdən."
Hünərdən, gücdən söz açınca ona,
Babildən at saldı Ermənistana.
Ölkədən yuyaraq fitnəni, qanı,
Rum şahı xoşladı Ermənistanı.
Silindi ortadan hər bir köhnə iş,
Möbidə ibadət, oda pərəstiş.
Ordan da tez hücum etdi Abxaza,
Açdı abxazlara kindən darvaza.
Səs saldı gurlayan təbil hər yerə,
Süngülər sirrini açdı göylərə.
Hansı bir qələyə göndərdi xəbər
Açarı durmadan təslim etdilər.
Dəvali Abxazda şahlıq edərkən
Eşitdi Rum şahı gəlmiş səfərdən.
Bağladı vəfaya gön kəmərini,
İşıqlı qəlbindən ataraq kini
Atlandı, yüyəni aldı tez ələ,
İskəndər əlini öpmək qəsdilə.
Xəzinə götürdü o şəhriyara,
Çatınca tapşırdı xəzinədara.
Dərgaha gəlincə öpdü torpağı,
Kinini yenərək olmadı yağı.
Dünyanı zəfərlə ölçən İskəndər
Gördü mərdlikdə yox ona bərabər.
Nəvaziş göstərdi o qəhrəmana,
Taxtının yanında yer verdi ona.
Sordu əhvalını şəfqətli səslə,
Qəlbini qızdırdı qızğın nəfəslə.
Əmr etdi xəznədar şəxsə İskəndər,
Versin Dəvaliyə xəzinə, gövhər.
Gətirsin adına layiq bir xələt,

Sırğa və həmayil, cəvahir, zinət.
Həm qılınc, həm qədəh, cavahir, ipək,
Verilsin padşaha layiq bir bəzək.
Hər nə əmr etmişdi uca şəhriyar
Yerinə yetirdi o xəzinədar.
Ucaldı Dəvali, qəlbi oldu şən,
Geyindi İskəndər ipəklərindən.
Tovq asdı, tac qoydu, cavahirnişan,
Sayıldı başını dik tutanlardan.
Təşəkkür dilini açaraq ona:
"Padşahım, yaradan yar olsun sana!"
Qüruru yenərək, kiçildi deyə,
Kiçilmiş başını qaldırdı göyə.
O gündən xidmətə sıxdı kəməri,
Padşaha xidmətdən durmadı geri.
O, şahpərəstlikdə elə ad aldı,
Şaha xas olanlar geridə qaldı.
O yerlər göründü şaha bağ kimi,
Gözünü parlatdı bir çıraq kimi.
O gözəl torpaqda enib dincəldi,
Sevincin, istəyin barını dərdi.
Ən qoca bir dehqan vermişdir xəbər:
Tiflisi ilk abad etmiş İskəndər.
O cənnət bəzəkli gözəl torpağı
Yaxşılıq toxmuyla etdi gül bağı.
O yerdə İskəndər belə əmr etdi,
Rumun ayiniylə hər bir iş getdi.
Keçdi o torpağı seyr edə-edə,
Ov üçün at sürdü çöldə, dərədə.
On beş gün dağlarda, çöldə yürüdü,
Həm şikar edirdi, həm yol ölçürdü.
Ovla gəzişərkən gözəl ölkəni,
Can atdı görməyə şah Nüşabəni.
Eşitdi qadının vardır şövkəti,
Dəyərli ölkəsi, malı, dövləti.
Gördüyü çəməndən, sudan şənləndi,
Gəldi bir çəmənə, atından endi.





## İSKƏNDƏRİN BƏRDƏYƏ GƏLMƏSİ VƏ NÜŞABƏ İLƏ GÖRÜŞMƏSİ

Canpərvər şərabı dur gətir, saqı,
O susuzlar üçün çeşmədir, saqi!
Yanıram, təşnəlik salmış bir dərdə,
Mənə ver, şərabə oldum aludə.
Bərdə nə gözəldir, necə qəşəngdir,
Yazı da, qışı da güldür, çiçəkdir.
İyulda dağlara lalələr səpər,
Qışını baharın nəsimi öpər.
O yaşıl meşəsi cənnətə bənzər,
Şən ətəklərinə bağlamış kövsər.
Söyüdlük çöllərə vermişdir zinət,
Ağ bağı elə bil həqiqi cənnət.
Qırqovul yuvası hər sərv ağacı,
Oxuyur kəkliyi, ötür turacı.
Səssizlik içində dincəlir gülşən,
Torpağı silinmiş qayğı, kədərdən.
Reyhanı yaşıldır illər uzunu,
Hər çeşid naz, nemət bürümüş onu.
Yem üçün gələr quş bu gözəl yurda,
İstəsən "quş südü" taparsan burda.
Torpağı yoğrulmuş qızıl suyundan,
Elə bil hər yanda bitmiş zəfəran.
O yaşıl yerləri dolaşıb gəzsən,
Şənlikdən başqa bir xəyal görməzsən.
İndi o dərgahın taxtı alçalmış,
İpəyi, quması küləklər çalmış.
Təzə nar gülləri töküllüb solmuş;
O narlar, nərgizlər dönüb toz olmuş.
İndisə yerində bu gözəl yurdun,
Bar sel yumuş dərə, qurumuş odun.
Yenə də bol olan o göyərtilər,
Ədalət toxmundan göyərsə əgər,
Yenidən gözəlcə bəslənsə diyar,
Get-gedə yaşıllıq, gözəllik artar.

Padşahın əlinə keçərsə fürsət,
O taxta yenidən verərdi zinət.
Hərum adlanırdı bu yurd hər yerdə,
İndisə adına deyirlər Bərdə.
Bu mərdlər, gözəllər yurdunda, inan,
Çox saysız xəzinə gizləmiş zaman.
Belə şux, sevimli gülşən harda var?
Harda var xəzinə saçan bu diyar?
Belə nəql edir söz xəzinədarı,
Köhnə xəzinənin adlı saları:
Hakim qadın varmış, adı Nüşabə,
Uymuş il uzunu keyfə, şərabə.
Erkəksiz yaşayan bu dişi ceyran
Gözəldi, göyçəkdi erkək tovuzdan.
Xoşsöhbət, ürəyi saf, mətanətli,
Bir pəri əndamlı, xoş təbiətli.
Önündə minlərcə gözəl qız varmış,
Xidmətə ay kimi kəmər bağlarmış.
Bunlardan başqa, var igid, qəhrəman
Otuz min qulamı - qılınc oynadan.
Dərgaha yaxın da olsa, yenə də
Evinə girməzdi erkək bir bəndə.
Qadınla aşardı onun hər işi,
Tapşırıq almamış ondan bir kişi.
Sarayda iş bilən qadınları var,
Yalnız kətxudasız iş görər onlar.
Qulları bir yurdda salmışdı məskən,
Yaxın bir obanı etmişdi vətən.
Qəhrindən, kinindən onun qorxaraq
Şəhrinə bir kişi basmamış ayaq.
Biyara getməyə versəydi fərman
Yolunda kişilər keçirdi candan.
İskəndər səhraya çəkincə ordu
Çadırlar başını əflakə vurdu.
Gördü bir şənliklə yoğrulmuş cənnət,
Etdi əkinlərə, çaylara heyrət.
Sordu: "Bu şən ölkə kimindir, kimin?
Kim burda padşahlıq edir, söyləyin."





Dedilər: "Gördüyün bu var, bu yatır,
Bu gözəl torpaqlar bir qadınındır.
Qadındır, erkəkdən ürəkli, qoçaq,
Dəniz incisindən təmiz və parlaq.
Tayı yox şüurda, adda və sanda,
Rəiyyət becərir çətin zamanda.
Mərdliklə belinə bağlamış kəmər,
"Kəyan nəslindənəm" deyə fəxr edər.
Külahsız qadındır, ancaq tacı var,
Bir əskər üzünü görməz bu sərdar.
Hesabsız qəhrəman qulamları var,
Önündə üzünü görməmiş onlar.
Köksü gül, ağ bilək qız, gəlin ancaq
Hər işdə onunla edər ittifaq.
Boyları ox kimi, döş nara bənzər,
Sanki hər məmədən süd əmmiş şəkər.
Ən incə ipəklər, ən parlaq tüllər
O lətif əndamdan utanıb titrər.
Firiştə onlara baxmaz cürətlə,
Baxsa göydən enər bir fəlakətlə.
Bağın eyvanında parıldar tək-tək
Gündüz şən bir günəş, gecə çıraqtək.
O ağ bənizlərə etsən tamaşa
Az qalır şəfəqdən gözlər qamaşa.
Şaqraq səslərini eşitsə hər kəs
Can qurban etməyə göstərər həvəs.
Qulaqda, boyunda incilər gülür,
Dodaqlar yaqutdur, dişlər isə dürr.
Bilmirəm nə füsun oxumuş bunlar
Ki, şəhvət toruna olmamış şikar?
Bu mavi səmanın altında ancaq
İşləri şərabdır, çalıb çağırmaq.
Nəsilcə uca, pak hökmüdar qadın
Onları qoymazdı şəhvətə yaxın.
Sənəmxanası var saraylar qədər,
Azad girib gəzər orda afətlər.
Pərdə arxasında keçirir həyat,
Doğma ölkəsinə verir qol-qanad.

Möhtəşəm şahanə bir sarayı var,
Bır büsat açmış ki, şahlara yarar.
Büllurdan taxtı var, göyə vurur baş,
Üstünə xalvarla tökmüşdür qaş-daş.
O büllur taxtı bir qəndildən parlaq,
Gecələr aydan da işıqlı çıraq.
Oturur o büllur taxta hər səhər,
Uca tanrısını hər gün yad edər.
Gəlintək taxtında əyləşir yalnız,
Xidmətçin ayaqda durur gəlin, qız.
Mavi çərx altında sazla, qədəhlə
Dünyanı keçirir daşğın fərəhlə.
Tanrıya səcdədən durmazlar geri,
Yox yemək, içməkdən başqa işləri.
Şahanə sarayla, böyük dövlətlə
Riyazət çəkərdi bır ibadətlə.
O qədər dindardır bu nazlı dilbər,
Əz cənnət köşkündə yatmaz gecələr.
Başqa bir köşkü var mərmər daşından,
Ay kimi hər gecə süzülür pünhan.
Köşkündə o günəş, o nazlı qönçə
Başlar ibadətə şəfəq sökücə.
Bir sona suya baş vurduğu qədər
Yasdığa baş qoyub yatar o dilbər.
O pəri əndamlı qızlarla yenə
Mey ilə, çalğıyla başlar keyfinə.
Gecəni, gündüzü keçirir belə,
Gündüzü belədir, gecəsi elə.
Nə gündüz əl çəkır can bəsləməkdən,
Nə gecə tanrıya səcdə etməkdən.
Vardır qapısında çox xidmətçilər,
Özünün, işinin qeydini çəkər."
İskəndər bu işdən şənləndı, ancaq
O naxşı görməyə göstərdı maraq.
Yaşıllıq içində gördü bu dünya,
Gövhərdən qiymətli olan kımıya.
O yerdə başladı istirahətə,
Bir neçə gün daldı eyşə, işrətə.





Hökmüdar qadına verdilər xəbər,
Mübarək fal ilə gəlmiş İskəndər.
Pərəstiş etməyə gördü hazırlıq,
Göndərdi padşahın adına layiq
Hər çeşid yararlı, ləziz yeməklər,
Ürəkdən xidmətə bağladı kəmər.
Ayırdı mətbəxə, minıyə yarar
Gözəlcə bəslənmiş canlı heyvanlar.
Müşk, ənbər qoxuyan dadlı yeməklər,
Əlini yumağa müşk ilə ənbər.
Hər çeşid yeməli, dadlı meyvə var,
Müşk ilə şəkərdən bir neçə xalvar.
Mey, noğul, bostanın bəzəyi reyhan
Neçə gün daşındı şaha durmadan.
Həm də mehtərlərə ayrı olaraq
Hər gün göndərirdi müəyyən ərzaq.
O qədər mərdlik üz verdi qadından
Tə"rifi dillərdə oldu bir dastan.
Padşahın könlündə açdı bahartək
Onunla görüşmək arzusu çiçək.
Qadını öyrətmək istədi o şah,
Olsun bu ölkənin sirrindən agah.
Bilsin sərhəddini bu məmləkətin,
Varmıdır əslı bu sözün, söhbətin?
Şəbdizə vurunca gündüz qızıl nal,
O dünya günəşi atlandı dərhal[184].
Hazırlıq görüncə ucaldı göyə,
Yol aldı saraya "Elçiyəm" deyə.
Elə ki, saraya çox yaxın gəldı,
Yolun zəhmətindən bir az dincəldi.
Göylərə baş vuran bir saray gördü,
Onu yerlər öpür, göylər öpürdü.
Xidmətçi qadınlar onu gördülər,
Qaçıb Nüşabəyə verdilər xəbər:
"Rum tacidarının şən dərgahından
Ölkəmiz alıbdır şənlikdən nışan.
Ağıllı bir elçi gəlmişdir bizə,
Rum şahından xəbər gətirmiş sizə.

Ağıl mədənidir başdan-ayağa,
Bənzəyir tanrıdan yanan çırağa."
Nüşabə sarayı bəzədi artıq,
Dəmirli yollara vurdu yaraşıq.
Nazənin qızlara vuruldu bəzək,
Düzüldü sıraya yüz əlvan çiçək.
Müşkin kəməndlərə düzüldü gövhər,
Daş-qaşa büründü ipək geyimlər,
Bir bağça tovuzu kimi səkərək
Parlayıb, gülümsər işıq çıraqtək
Padşahlıq taxtına oturdu xoşhal,
Əlində ətirli, gözəl portağal.
Əmr etdi, padşahlar ayini üzrə
İskəndər elçisi gəlsin hüzurə.
O uca sarayın baş vəkilləri
Əmrini icradan durmadı geri.
Elçi çox sür"ətlə girdi qapıdan,
Qondu taxt üstünə o qorxmaz aslan.
Belindən nə qılınc açdı, nə kəmər,
Elçitək etmədi səcdə İskəndər.
O gözəl sarayda bir hikmət gördü,
Sevimli bir saray, bir cənnət gördü.
Hər yanda qaynaşır huri və pəri,
Müşk ilə, ənbərlə yoğrulmuş yeri.
Daş-qaşa batmışdı gəlinlər, qızlar,
Baxanın gözündə parlar ulduzlar.
Elçiyə daş-qaşın parıltısından
Bir alov göründü durduğu məkan.
Sanki birləşmişdir mədənlə dərya,
Bütün gövhərləri tökmüş buraya.
Elçinin tutduğu uğursuz işə
Nüşabə pərt olub, düşdü təşvişə:
"Bu zirək kişiyə indi nə demək,
Qoyulan ayinə əməl etməmək?
Həddini tanıtmaq gərəkdir ona:
Bu elçi saymayır bizi, baxsana."
Nüşabə baxınca düşərək şəkkə
O bişmiş qızılı vurdu məhəkə.





Diqqətlə baxınca tanıdı birdən,
Taxtında yer verdi, qəlbi oldu şən.
Bildi İskəndərdir, dolaşır ona,
Taxtında oturmaq yaraşır ona.
Yeddi mavi göyün səadətilə
Onun tərifini gətirdi dilə.
Endirdi həyadan göz qapağını,
Utandı, tər yudu al yanağını.
Sezdiyi bu işi açmadı ona,
Açarım var, deyə bağlı qıfılına.
İskəndər bir elçi kimi davrandı,
Özünü olduqca o sərbəst sandı.
Çox salam yetirdi hey dönə-dönə,
Təkmil bir elçilik etdi özünə.
Salamlar bitincə dedi: - Ey sərdar
Şöhrətli, şövkətli, adil tacidar
Deyir: "Ey şöhrəti dünyanı tutan,
Ən adlı kəslərə meydan oxuyan,
Nə üçün çevirdin bizdən yüyəni?
Hüzura gəlmədin, anmadın məni?
Nə zülüm etdim ki, düşmən kəsildin?
Ey harın at, bizi acizmi bildin?
Bundan da kəskin bir qılınc kimdə var?
Kimin oxu belə qızğın od saçar
Ki, ona sığınmaq yararlı ola,
Səninçin məsləhət budur, gəl yola.
Uca dərgahından çəkinmə, gəl, get,
Coşduğum gündə qorx, ondan həzər et.
Bu gözəl ölkənə mən ki yol aldım,
Öz dövlət kölgəmi üstünə saldım.
Qapıma neçin baş vurmadın bir an,
Neçin üz çevirdin mənim yolumdan?
Könlümü alırsan meyvə, şərabla,
Aldadırsan noğul, reyhan, kababla.
Etdiyin bu işlər qəbuldur, ancaq
Doğru fikirlərdən gəl olma uzaq.
Səni bu idrakla görməyim, inan.
Bəxtiyar görünür hümay quşundan.

Qəbul başlanırkən səhər, çox erkən
Şahın dərgahına sən də gələrsən."
Elə ki, yetirdi özündən xəbər
Başını aşağı dikdi İskəndər.
Nüşabə cavabçın lalə sayağı
Gül açıb, tərpətdi yaqut dodağı:
"Ey cəsur padişah, eşq olsun sənə,
Elçilik edirsən özün özünə.
Mənə saf ürəyim söyləyir belə,
Bu başla, şahanə, uca sayənlə
Bir elçi deyilsən, hökmverənsən,
Göndərilmiş deyil, sən göndərənsən.
Peyğamın qılıncdır, qoparır başlar.
Səndən başqa bunu mənə kim vurar?
Ancaq şah qılıncla oynarsa artıq,
Qılıncı göstərər başıucalıq.
Söz açma İskəndər qılıncından sən,
Özünə çarə tap, İskəndər sənsən.
Məni çağırarkən toruma düşdün,
Gözünü yaxşı aç, çiysən, bir düşün.
Taleyim gətirmiş səni bu taxta,
Eşq olsun dövləti düşünən baxta."
İskəndər dedi: "Ey bu taxta layiq,
Arama baxtının hökmündən artıq.
İskəndər dənizdir, mən çayam, ancaq
Günəşlə kölgəni olmaz bir tutmaq.
Bir kəsə tay tutma məni, ey huşyar,
Mən kimi minlərcə gözətçisi var.
Bu fikri qəlbindən sən sil büsbütün,
Padşahı bundan da çox uca düşün.
Yoxsa İskəndəri sandın kimsəsiz,
Özünə elçilik edən bir aciz?
Uca dərgahına sığmaz igidlər
Özümü zəhmətlə elçilik edər?"
Ağıllı Nüşabə yenə dürr səcdı,
O gül dodağından qıfılı açdı:
"Qəlbimi bu qədər aldatmaq nədən?
Yalan atını gəl minib çapma sən.





Əl çək bu tərslikdən, yetər inadın,
Mərdliklə şan, şöhrət qazanmış adın.
Böyükdür pəyamın, adın da, sən də
Aslanı gizləmə qurd dərisində.
Elçidə olurmu belə cəsarət?
Hüzurda göstərsin bu qədər hiddət?
Qəhr ilə buyruqdan nə əl çəkirsən,
Nə də qarşımızda boyun əyirsən.
Bizimlə hökm ilə edirsən rəftar,
Belə rəftar yalnız padşahda olar.
Var bundan başqa çox nişanlar, hələ
Ondan da çox əsrar gələcək ələ".
Tez verdi belə bir cavab İskəndər:
"Bir tülkü aslandan gətirməz xəbər!
Gözündə olsam da cəsur, qəhrəman,
İskəndər deyiləm, elçiyəm ondan.
Xəbəri böyüklər göndərmiş belə,
Hökmünü dəyişmək yararmı? Söylə!
Sözümdə varsa kin, acıq, kükrəyiş,
Bu sənin və onun bildiyi bir iş.
Ürəkli olmama səbəb onu bil,
Göndərən aslandır, bir tülkü deyil!
Belədir şahların rəsmi, elçilər
Amanda olurlar, görməzlər zərər.
Dediyim sözləri demiş tacidar,
Dilin qıfılına göstərmə açar.
Doğru bir cavab ver mənə bir kərə,
Yenə də dönüm öz gəldiyim yerə."
Nüşabə qızdı o aslan ürəyə:
"Günəşi palçıqla suvadın" deyə.
Zərrəcə qorxmadı, gətirmədi tab,
Verdi qılınc kimi kəskin bir cavab:
"Yersizdir,- dedi,- bu çalışıb durmaq,
Günəşə palçıqdan vurursan suvaq."
Kənizə əmr etdi: "Ver, baxsın" deyə,
Padşahlar rəsmini öpən ipəyə.
İpəkdə göstərdi ona bir bucaq,
Söylədi: Əlində tut, diqqətlə bax.

Bu surət, bu sima kimindir, kimin?
Sarayda hörmətlə saxlanır neçin?
İnad etməyinin qalırmı yeri?
Örtmə öz qaşınla uca göyləri."[185]
İskəndər dinlədi onu hörmətlə,
Yazılı ipəyi açdı sürətlə.
Rəsmini tanıdı baxınca şəklə,
Gördü almış düşmən ölkəni ələ.
Bu işdə kin, hiddət göründü yersiz,
Bir cavab verməkdən qalaraq aciz,
Qorxudan saraldı bir saman kimi,
Sığındı allaha tutulan kimi.
Nüşabə gördü ki, o qızğın aslan
Pozuldu, alçalıb düşdü ucadan.
Dedi: "Ey uğurlu, böyük tacidar!
Zəmanə başlara çox oyun açar.
Düşünmə, hörmətim çoxdur, bunu bil,
Bu ev öz evindir, başqa yer deyil!
Pərəstiş edərəm sənə hər zaman,
Ya orda, ya burda bəndəyəm, inan!
Bu rəsmi onunçun göstərdim ki, sən
Mənim də şəklimi aydın görəsən.
Erkək tinətliyəm olsam da qadın,
Hər işi bəllidir mənə dünyanın.
Mən də bir aslanam, düşünsən bir az,
Aslanın erkəyi, dişisi olmaz.
Qara bulud kimi gurlasam kinlə,
Qılınc tüstüsündən yanar su belə.
Aslanlar buduna basaram mən dağ,
Nəhənglər yağından yaxaram çıraq.
Məni düşmənliyə çəkmə sevgidən,
Vurğunun olana tənə vurma sən!
Kim tikan əkərsə, tikan dərəcək,
Kim nicat verərsə, nicat görəcək.
Əgər sən üstünlük edərsən mana,
Qələbə çalarsan bir dul qadına.
Mən qalib gəlsəm, kın coşduğu zaman
Ataram gizlənən şahı ortadan[186].





Tülküylə qurd kimi biz etsək savaş,
Sən kiçik olarsan, mənəm böyük baş.
Sınaqlı qocalar söyləmiş belə:
"Güləşmə ən fəqir, yoxsul bir kəslə,
Səndən şey qoparmaq fikrini izlər,
Ürəkdən çalışar, üstünlük edər."
Vücudum şəhərdə etsə də məskən,
Qəlbim qafil deyil şahlar işindən.
Hindistan mülkündən Yunana qədər
Virandan, abaddan tutmuşam xəbər.
Göndərdim hər yerə bilikli adam,
Ağıllı, sınaqlı, mahir bir rəssam.
Böyük fatehləri öyrənim deyə,
Rəsmini aldırdım incə ipəyə.
Adlı padşahların rəsmini çəkən
Hər rəsmi gətirib mənə verərkən,
Sanıram dünyanı verdilər mana,
Öz incə rəyimlə baxaram ona.
O rəsmi doğurdan tanıyım deyə,
Göstərrəm başqa bir görən kimsəyə.
Desələr ki, filan tacidardır bu,
O zaman təsviri sanaram doğru.
Sonra da təpədən dırnağa qədər
Hər rəsmə salaram dərin bir nəzər,
Yaşlıdan və gəncdən öz qədərincə
Bir ölçü götürrəm incədən incə.
Yaxşını, yamanı tanır xəyalım,
Bar zəka tanıyan şüur, kamalım.
Boşuna keçməyir gecə, gündüzüm,
Özümlə oynayan deyiləm özüm.
Bu himmət tərəzim durmadan işlər,
Şahlarda ağırı, yüngülü ölçər.
İpəkdə gördüyün surətlər ki, var,
Tək sənin xəyalın könlümə yatar.
Çünki surətinlə tanışam çoxdan,
Bu nəqşin dostluqdan göstərmiş nişan."
Sözünü ürəklə dedi, şənləndi,
Öz büllur taxtından aşağı endi.

"Taxtımda, - dedi, - sən otur namidar,
Bir taxta yaramaz iki tacıdar.
Bilirsən şahmatın iki şahı var,
Hər qəlbə yeni qəm gətirir onlar."
Taxtından enincə o pərisurət
Durdu hüzurunda, göstərdi xidmət.
Gəlintək oturdu qızıl kürsüyə,
"Padşaha kiçik bir bəndəyəm" deyə.
O nəhəng balıqdan şahın görkəmi
Rəng verdi, rəng aldı zürafə kimi.
Düşündü: "Qadın da olsa bu salar,
Ürəyi bir erkək ağlıyla parlar.
Bax, belə işləri görən qadına,
Pərilər afərin söylər adına!
Qadınlar olmasın gərək çox cəsur.
Dişi aslanlarda kin kəskin olur.
Yüngüldür çəkidə qadının daşı,
Kişi ölçüsüylə durmaz yanaşı.
Qadınlar pərdəylə örtülsə xoşdur,
Pərdəsiz musiqi ahəngi boşdur.
Bax, Cəmşid nə gözəl söyləmiş gerçək.
"Qadın ya pərdə, ya məzarda gərək!"
Qadını, saleh də olsa, buxovla,
Oğru dost olsa da, eşşəyi bağla!"
Düşündü: "Nədir bu acı həqarət?
Bu yerdə kim edər sənə mərhəmət?
Fikrini bişir də, qəlbini xoş tut,
Yıxıldın, artıq öz canını unut.
Gözəldir, bal qatmış gül ləblərinə,
Belə bir sevimli dilbər yerinə
Olsaydı amansız, kinli bir düşman,
Artıq əl çəkəydim gərək başımdan.
Bu yerdən çıxarsam ağır yükümü,
Hər işdə saxlaram düzgün ölçümü.
Şaşqınlar yolunu tutmaram bir də.
Örtmərəm üzümü gərəksiz yerdə.
Açaram bəndi bu bağlı qəlbimdən,
Düyünü düyünə necə vurum mən?





Qarınca düşərsə parlaq bir tasa,
Bir çarə düşün, güc iş görməz yoxsa[187].
Səbr edim, çox çətin olsa da bu hal,
Bu işlər yuxudur, yaxud bir xəyal?
Eşitdim çox şadmış bir gənc müqəssir,
Dara çəkilirkən boynunda zəncir.
Dostlardan birisi verdi bir sual:
"Az qalır ömründən, hey, nədir bu hal?"
Dedi: "Son nəfəsdir, ömrüm qalır az,
Az ömrü kədərlə keçirmək olmaz."
Qurtardı yaradan onu zillətdən,
İşığa çıxartdı qatı zülmətdən.
Qıfıla çox zaman tapılmaz açar,
Bir açan tapılar, nəhayət açar."
Özünə çox bu cür sözlər söylədi.
Çarəsiz canını təslim eylədi.
Yalnız çapğın etsə hər bir pəhləvan,
Düşər div əlinə pəhləvan, inan.
Xanəndə bəstəsiz şərqi söyləsə,
Söz ilə kamança gülər o səsə.
Bir zaman çox dərin fikirə getdi,
Öz təbiətini məzəmmət etdi.
Səbr etdi, bu ağır dərdə, kədərə,
Təslimlə dik başı əyildi yerə.
Nüşabə xidmətə bağladı kəmər,
Əmr etdi: durmayıb gözəl pərilər
Şahlara yaraşan bir süfrə açsın,
Ortaya hər çeşid yeməkdən saçsın.
Kənizlər şam kimi qalxdı ayağa,
Şahanə bir süfrə hazırlamağa.
Hər çeşid yeməklər axdı hər yandan,
Yeməklər bişmişdi qoçdan, toğludan,
Uzun və yuvarlaq incə çörəklər
Saraydan başlamış qapıya qədər,
Kökələr yoğrulmuş yağla, şəkərlə,
Şəkərli küncüddə dada bax hələ.
Ənbərlə yoğrulmuş dadlı yeməklər
Cənnət yeməyindən verirdi xəbər.

Dağ kimi qalanmış öküz və balıq,
Çəkdi yer öküzü bundan ağırlıq.
Süfrədə quzular coşqun sevincdən
Quş kimi qol-qanad açmışdı şən-şən.
Ən dadlı mürəbbə, limonlu şərbət,
Püstədə, badamda var başqa ləzzət.
Bar hədsiz paludə - ənbər qoxuyan,
Çox məğzi paludə sağalar ondan.
Tər halva və badam halvası daşır,
O qədər çoxdur ki, qablardan aşır.
Gülabla çəkilmiş şərbət, gülşəkər,
Saçdığı şirənin nəfəsi ənbər.
Bunlardan başqa o taxtın üstündə
Qızıl büsat qurdu şahın önündə.
Bir xonça qoyuldu günəşdən parlaq,
İçində dörd büllur kasa qoyaraq,
Biri ləl, o biri qızıldan dolmuş,
Biri dürr, birinə yaqut qoyulmuş.
Elə ki, uzandı əllər süfrəyə,
Ağızlar açıldı təam yeməyə,
Nüşabə dedi: "Ey böyük hökmüran,
Yeyiniz, ən dadlı bu xuruşlardan."
İskəndər söylədi: "Ey sadə dilbər,
Ölçüsüz söyləmə, tökməyəsən tər.
Düzmüsən süfrəmə almaz, yaqut, dürr,
Daş-qaş yeyilərmi, bu nə deməkdir?
Daşı da yeyərmi ağıllı insan?
Bu rəngi təbiət həzm etməz, inan!
Eylə bir yemək ver mədəmiz dolsun,
Rəğbətlə ona əl uzatmaq olsun."
Nüşabə gülərək söylədi şaha:
"Daşın ki, boğaza yolu yox daha,
Faydasız, yaramaz belə daş üçün
Bu qədər vuruşmaq, çarpışmaq neçin?
İndi ki, yeməyə yaramaz bu daş,
Dünyada onunla ucalarmı baş?
Dəyərsiz bir daş ki, olmayır yemək,
Onunçun bu qədər zəhmət nə gərək?





Yollardan daşları almaq lazımkən,
Daşı daş üstünə qoyursan nədən?
Bu daşdan doyunca hər kəs ki, aldı,
Yemədi, daş yenə yerində qaldı
Deyilsənsə daşa pərəstiş edən,
Daşını yüngül et, yerində qal sən."
O incə qadının bu söhbətindən
Yeməkdən əl çəkdi o polad bədən.
Dedi: "Ey xanımlar xanımı qadın,
Qüvvətdə erkəkdən ucadır adın.
Doğru söylədin ki, belə gövhərlə
Hər sərraf ancaq bir daş alar ələ.
O zaman dəyərli olardı sözün,
Öncə bu qaş-daşdan qaçaydın özün.
Tacımda cavahir parlar, doğrudur,
Padşahlar tacında cavahir olur.
Sənin xonçandakı bu qaş-daş daşır,
Bu danlaq, bu töhmət kimə yaraşır?
Süfrəyə cavahir saçmaq nə gərək?
Gövhərdən qaçmağı mənə öyrətmək?
Sərrafın gözünə toz atmaqdır bu,
İskəndər yaqutu hər evdə dolu.
Bununla bərabər diqqət edincə
Sözlərin yerlidir, doğrudur, məncə.
Eşq olsun bu fikri sağlam qadına,
Mərdliyin yolunu göstərir mana.
Ey uzaq görən qız, gəl məni dinlə,
Qızıl sikkəsini nəsihətinlə
Ataram bir kərə torpaqlara mən,
Qızıla torpaqdır təbii mədən".
Sonra Nüşabənin yaqut dodağı
Yaqutla bəzədi bütün torpağı.
Əmr etdi xonçaya qoyuldu yemək,
Qızıl noğuldanlar, əntiq və qəşəng.
Hər yeməkden özü dadırdı öncə,
Çox heyrət etdi şah bunu görüncə.
Şah rahat deyildi belə xidmətdən.
Ayağa qalxdı tez yemək bitərkən.

Gedərkən Nüşabə bağladı peyman,
İskəndər verməsin mülkünə ziyan.
Vəsiqə yazmağa şah verdi fərman,
O cənnətdən çıxıb getdi hökmüran.
İskəndər şəhərdən çıxınca gerçək,
Fələkdən kin gördü, Tanrıdan kömək.
Düşmüşdü qurtulmaq üçün qayğıya,
Şükr etdi qurtaran böyük Tanrıya.
Gündüzdən günəşi qapınca gecə,
Bir çıraq parlatdı bir şam sönüncə.
Al Günəş göyünün uca səqfinə
Haləli ulduzlar düzüldü yenə.
Padşah da yuxuya tez hazırlandı,
Dörd ünsür də yatdı, qapı bağlandı[188].
Dan yeri sökünce dincəldi artıq,
Qaranlıq içində söküldü ağlıq.
Şəfəqlər içində qalxdı yuxudan,
Səhərtək bir məclis qurdu hökmüran.
Günəşin əlində bir narınc vardı,
Fələk narıncının başını yardı[189].
O mələk əndamlı Nüşabə şən-şən
Uğurlu fal ilə çıxdı şəhərdən.
Elə bil qaranlıq çökünce lay-lay,
Göründü məşriqdən bədirlənmiş Ay.
Pərvintək kənizlər yanında gedər,
İncidir başından dırnağa qədər.
Gözəllər dolaşır dörd bir yanında,
Yüz Zöhrə qaş kimi bir barmağında.
Şahlara yaraşan bir dərgah gördü,
Dünyaca bir ordu, barigah gördü.
O qədər ipəkli bayraq ucaldı,
Hava gül, torpaq göy rənginə çaldı.
Çadırlar gövhərdən olmuşdu nişan,
Dərgahın yolunu kəsmiş hər yandan.
Aradı, öyrəndi, gəldi saraya,
Gördü bir xeymədir ucalmış Aya.
İpləri ipəkdən möhkəm hörülmüş,





Sütunu qızıldır, mismarı gümüş.
Atından endi yol tapsın hüzurə,
Üz sürtsün dünyanın öpdüyü yerə.
Növbətçi hörmətlə verincə izn,
Zərnişan çadıra girdi nazənin.
Gördü ki, dünyanın şahları gəlmiş,
Bir tac kölgəsində başlar əyilmiş.
İskəndər önündə kəmər-kəmərə
Padşahlar oturmuş, göz dikmiş yerə,
O parlaq büsatdan düşdü qorxuya,
Görənin ürəyi dönərdi suya.
Hamısı divarda surətə bənzər,
Danışıb gülməyə kimdə var hünər?
Hasarı görüncə hasarlı gəlin
Titrədi, bu qəbul göründü gərgin.
Yer öpdü Nüşabə, afərin aldı,
O aslan ürəklər buna mat qaldı.
Kənizlər hakimin əmrini alcaq
Bir kürsü qoydular günəşdən parlaq.
Yanında oturdu dünya gəlini,
Aldı qız-gəlinlər dörd dövrəsini.
Halını soruşdu, göstərdi hörmət,
Coşdu o gəlişlə məclisdə işrət.
Bir az toxtayınca yeni oturan,
İşarət edildi uca padşahdan:
Tez süfrə ağası gətirsin xörək,
Ortaya düzülsün hər çeşid yemək.
Öncə gətirildi ətirli şərbət,
Sanki yerə sərdi hovzunu cənnət.
Gülab kimi axan bu arxı, yəqin
Yuxuda nə Xosrov görmüş, nə Şirin.
O qədər xonçalar düzüldü ora,
Ənbərdən ucaldı toz buludlara.
Ən ləziz yeməklər bol-bol axaraq
Hər yanda dağ kimi vurmuşdu qalaq.
İkiqat ələnmiş yağ qatlamalar
Ən parlaq aydınlıq kimi parıldar.
Ələnmiş ağ undan, bişmiş yuvarlaq,

Ay kimi qoğallar xəzdən də yumşaq.
Qoyuldu xonçaya yüz çeşid yemək,
Yeməklər xonçaya verirdi bəzək.
Yox idi elə bir yemək dünyada
Bir mövqe tutmasın qızıl xonçada.
Dadlıdır, yeməklər gəlincə xoşa,
Dopdolu qədəhlər çəkildi başa.
Göyün ortasına gəlincə günəş,
İçdilər mey qəlbə salınca atəş.
Hamının çatılmış qaşı açıldı,
Sərxoşlar üzünə nəşə saçıldı.
O pəri bədənli nazlı dilbərlər
Çalğını dinlədi axşama qədər.
Zülmətdən gecə bir ordu çəkərkən,
Təbiət gözündən mürgü tökərkən
Cahandar söylədi o pərilərə:
"Bu gecə basmayın ayaq şəhərə!
Buyruğum belədir, səhər gərək mən
Bir məclis düzəldəm yerdən göyəcən.
Fırıdun və Kəyan rəsmiylə şən-şən,
Dolğun kam alaraq çalğıdan, meydən,
Qoy şərab bir yanğın salsın könülə,
Bişsin hər işimiz bu qan çayilə!
Ayrılaq bir zaman dünya işindən,
Pərvərdə mərcanla bəslənsin bədən.
Mey ilə gül kimi parlayaq belə,
Güllərdən rəng alaq bu kürə ilə.
Saçaq qətrələrdən torpağa ənbər,
Çimsin bu şərabdan güllər, olsun tər."
Pərilər hörmətlə öpdü torpağı,
Şənləndi, ismətdən yandı yanağı.
Məclisdə Nüşabə, o nazlı dilbər,
Sanki dan sökərkən doğmuş bir ülkər.
Ənbərdən gecə şən büsat qurunca
Yayıldı o müşkin saçlar boyunca.
O müşkin saçlardan böyük İskəndər
Bir kəmənd düzəltdi, saçırdı ənbər.
Ayı, Müştərini kəməndlə birdən





Yerlərə endirdi uca göylərdən.
Şənlik gecəsiydi o şanlı gecə,
Pərilər dalmışdı nazlı sevincə.
İskəndər qəlbini çalmaq fikrilə
İstərdi atəşdən parlatmaq şölə.
Padişah əmr etdi: "Tez od qalansın,
Müğlərin rəsmiylə gündür, müşk yansın."
Meydən bir od yaxdı ki, şöləsində
İçənlər yandı öz əlbəsəsində.
Çalğı nəşəsiylə yeyib içdilər,
Gecəni şənliklə etdilər səhər.
Laciverdə şəncərf vurunca dövran
Samur sarı tülkü doğdu o zaman.
Yenidən canlandı şənlik və həyat,
Quruldu sevimli, şahanə büsat.
Çəmənlər yenidən nəşəyə gəldi,
Kəklik və qırqovul cilvəyə gəldi.
Nəğməyə başladı pəriüzlülər,
Günəş mehreganda daha xoş gələr.
O gülgün meydən ki, yaquta bənzər,
Gündüzün üzünə səpdilər gövhər.

## İSKƏNDƏRİN NÜŞABƏ İLƏ MƏCLİSDƏ OTURMASI

Dur, saqi, şərabdan bir qədəh gətir!
O qızıl çiçəkdən bir fərəh gətir!
Üzümün rəngini şərabla bir tut,
Yaquta bənzətmə, qıl tam bir yaqut!
Fıridun şənliyi, Cəmin novruzu
Üzlərdən silmişdi kədəri, tozu.
İskəndər şövkətlə taxta oturdu,
Önündə padşahlar boynunu burdu.
Oxuyub çalanlar, şərab və qədəh
O gözəl məclisə verirdi fərəh.
Nüşabə naz ilə hey qədəh alar.
Ortada gəlinlər qol-qola oynar.

Məclisdə Feyləqus oğlu İskəndər
O pəri qızlara salmadı nəzər.
Birinci, nəfsini oda salmazdı.
İkinci, hərəmdə ov ovlamazdı.
Başçılar məclisdə ağır oturdu,
Padşaha hörmətçin mərd kimi durdu.
Göy soyuq, günəşin xeyməsi ocaq,
Yer quru, Cəmşidin yastığı yumşaq[192]
Günəş Dəlv bürcündən çıxdı qırağa,
Girdi Hut bürcünə balıq tutmağa[193].
Pul-puldur dağların ətəyi, qəlbi
Buzlanmış balığın arxası kimi.
Qurd gözlü qasırğa kəsir nəfəsi,
Kürkçünün zəhmətə artmış həvəsi.
Maralın kök budu buzdan qorxaraq,
Aslan sağrısını etmişdi sığnaq.
Buzlamış ceyranın kabablıq budu
Suların bağrına hey duz vururdu[194].
Buludlar o qədər sıx kafur saçmış,
Çinarın qolları ağ çiçək açmış[195].
Bənövşə qönçəsi tumurcuq ikən
Bahar yarpağıtək qar gəlir göydən.
Olmuş gül ağacı yeldən hamilə,
Qarnını doldurmuş çiçəklər ilə.
Ağzını açmadan buzlu nəhrlər,
Otların dodağı süd ətri verər.
Yadlardan gül üzə pərdə çəkəli,
Bülbülün təblini yırtmış dan yeli.
Bülbültək bardaqlar gəlmiş fərəhə,
Kəkliktək ağzından düşməz qəhqəhə.
İçənlərin üzü meydən alıb rəng
Qızarmış, tərləmiş gül yarpağıtək.
İskəndər əmr etdi: "Şənlik eşqinə
Məclisdə bir alov parlasın yenə."
Yenidən yaraşıq, bəzək vuruldu,
Cənnətə bənzər bir məclis quruldu.
Məclisdə gül kimi bir atəş yanır,
Qibtədən güllərin qəlbi dağlanır.
Odlu tikan tutmuş əldə sarı gül,





Bu, Zərdüşt odunun tikanı deyil.
O müşkin kömürdən axan şölələr
Daşlara əks edən gövhərə bənzər.
Qara rəng kömürlər ki, alovlanır
Xəzinə üstündə yatan ilandır.
Ya qoca insafsız, rəhmsiz məcus
Əmr etmiş həbəşi qarət etsin rus[196].
Hindistandan gəlmiş bir nəfər cadu
Xırmana vurar bir arpadan odu.
Müğ arpa yerinə əkmiş ərğəvan,
Bənövşə düşürmüş biçdiyi zaman[197].
Həbəş müşk aparmış Mazandarana,
Yerinə saf qızıl vermişdir ona.
Ev hindli qadından qana bürünmüş,
Abinus qırmızı söyüdə dönmüş.
Səqlablı atını çapmışdır Çinə,
Bərtasdan bir samur kükrəmiş yenə.
"Bilal"da çıxarmış gözəl bir səda,
Həbəşdə yaşarkən səs verir Rumda.
Onun şən səsinə qara zəncilər
Qəlbindən qan tökür, gözündən zəhər.
Qara qamışlıqdan çıxmış bir aslan,
Uzun barmaqları alovlu oxdan.
Katibin dalından göyərmiş qələm,
Barmağında müşkin qələmlər möhkəm[198].
Bir atlaz satandır, oturmuş çox şən,
Geyimi qoca bir qadın külündən.
Bir çox ip əyirmiş toxunsun palaz,
Palazın yerinə tapmışdır atlaz.
Kimyagərdir bu, kürəsi yanar,
Dəmiri ataraq saf qızıl alar.
Alovlar qızıldan qurmuş bir iksir,
Öz ətəklərinə saf qızıl səpir.
Alovu bürüyən sıx-sıx tüstülər
Neylufər gülünün zülfünə bənzər.
Reyhanla bəzənmiş saxsı güldandır,
Ancaq bu, meşədən çıxan reyhandır[199].
Od deyil, Cəmşiddən qalma bostandır.
Günəş xonçasında kökə yapandır.

Ağ-qara cövhəri parladandır bu,
Müğlərin yoldaşı - hirbüdün dostu!
Yeni bir qönçədir, yediyi tikan,
Cövhəri qədimdir, görüşdə cavan.
Qış vaxtı yoxsula şən nəğmə söylər,
Qonşuya qazandan elçilik elər.
Sazının telləri edər zümzümə,
Zərdüştün Zəndindən xoşdur bu nəğmə!
Zənd ilə Zərdüştü yaxan atəşi
Yaxmışdır dünyanın böyük günəşi.
Al gül yarpağıdır sərv budağında,
Ötər kəklik, turac sol və sağında.
Qırmızı mərcandan ucalmış çinar.
Başında "ququ"tək kəkliklər ağlar:
Ördəyə başında yer versə çinar,
Köksündən acı bir sızıltı qopar.
Ördəyin vücudu suyun düşgünü,
Atəşə girərsə qaralar günü.
Bu bağda coşaraq ötüşər quşlar,
Hər quşda başqa səs, başqa ahəng var.
Setarla çalınır sanki hər nəğmə,
Şərqidən yüz kərə gözəl zümzümə.
Ciyər duz yedikcə hey qanı damır,
Duzun da həsrətdən bağrı qavrılır.
Dişlərə sirr açır şəkərburalar,
Yedikcə insanın həvəsi artar.
Qan daman kababın qoxusu ənbər,
Müşkiylə bəslənmiş aşlar, yeməklər.
Hər çeşid mürəbbə, turşu, meyvə var,
Limon və portağal, narınc ilə nar.
Çalanın Zöhrətək oynayır qəlbi,
Kuzələr parıldar Müştəri kimi.
O gülgün şərab ki, dilbərdən dilbər,
Dünyadan dünyaca qaldırmış kədər.
Hamının keyfi saz, səsləri yumşaq,
Yalnız saz kəskindir ötsə də şaqraq.
Orda bişmiş idi yoldaşlar tamam,
Bircə şərab idi, ortalıqda xam.
Yarım sərxoş idi böyük hökmüdar,





Çənginin əlində çəng sutək axar.
Çəng səsi, mey, reyhan, qızarmış quşlar,
Dar gözlü sənəmlər, sıxı ağuşlar.
Kimdir həyatından belə kam alan?
İskəndərə məxsus bu şərəf, bu şan.
İskəndər eşqinə müştəri üzlər
Küpləri boşaltdı gündüzə qədər.
Elə ki, gündüzün yarısı keçdi..
Fələk də kürənin nisfini biçdi.
İskəndər əmr etdi xəzinədara:
"Xoş gəldin edilsin bu qonaqlara!
Xalvarla gətirsin qızıl və bəzək.
Dəvələr yüküylə atlaz və ipək.
Bir alay həbəşi şux xidmətçilər,
Boyları sərv kimi, görüşü dilbər.
Nə müşkə çəki, nə tirməyə daş var,
Baxdıqca insanın gözü qamaşar.
Dəyərli üzüklər, zümrüd, firuzə,
Brilyant, daş-qaşlar gülümsər üzə.
Qızıldan parlaq tac - zümrüd naxışlı,,
Gövhərlə işlənmiş naxışlı, daşlı.
Ətəyi kafurla dolu bir qumaş,
Üstündə parlayır dəyərli daş-qaş.
Kəcavə qatırda zərdi, zivərdi,
Kəcavə çəkənlər qızıl kəmərdi.
Bu qədər zər, zivər, dövlət, yatır var,
Verdi Nüşabəyə xəzinədarlar.
Nüşabə geyindi şahanə xələt,
Necə ki, günəşdən ay alır zinət.
Yenidən əmr etdi böyük İskəndər:
"Hədiyyə alsın hər pəriüz dilbər!"
Verildi adına görə hədiyyə,
Burda geysin deyə, aparsın deyə.
O qədər yükləndi hər gözəl pəri
Çəkə bilməyirdi zəri, zivəri.
Təşəkkür edərək öpdülər yeri,
Sevinclər içində döndülər geri.
Gövhər toplayınca uca mədəndən,
Axıcı xəznətək döndülər şən-şən.

# İSKƏNDƏRİN ƏLBÜRZ DAĞINA GETMƏSİ

Ey saqi, qırmızı süddən ver ki, hər
Civəyə əks etsə, ona can verər.
Ver mənə, dönmüşdür qanım civəyə,
Söz düzüm dırnaqdan keçən riştəyə[200].
Ey şəfəq sökmədən oyanan himmət,
Yenə söz saçmağa etmişəm niyyət.
Bu qızıl sözlərlə bir gövhər qurum,
Əlaltı başları daşlara vurum.
Qızılda varmıdır o güc, parıltı,
Mən kimi dindarı etsin əlaltı?
Bəzəkçün yaranmış bu qızıl, gövhər
Bənd olsun, zəncirdir, qəm, kədər verər.
Qorxaraq əyridən, quldur, oğrudan
Varlılar qızılı gömər hər zaman.
Yoxsul ki, hər zaman qızıl düşünər,
Bu istək ona da xəzinə verər.
İndi ki, qızıldan ucadır istək,
Ən yoxsul, ən zəngin kimsədir, demək.
Bu dünya olmuşdur yoxsul dünyası,
Həm özü məsuddur, həm əqrəbası.
Qorxusuz və rahat yaşar hər zaman,
Çəkinməz quldurdan, qorxmaz oğrudan.
Düşüncə, kədərdir çox sərvət, çox var,
Dünyası az olan olur bəxtiyar.
Tarixə dəyərli gövhər düzənlər
Gövhərli xəznədən belə nəql elər:
O Cəmşid idraklı aldıqca fərəh
Nüşabə eşqinə qaldırdı qədəh.
Gül ilə, mey ilə verdi əl-ələ,
Neçə gün keçirdi sərkərdələrlə.
İş görmək fikriylə bir gün oturdu,
Bahardan bəzəkli bir məclis qurdu.
Çəkdi o məclisə elə bir hasar
Bürcündə görünməz oldu ulduzlar.
Baş sərkərdələri eylədi dəvət,





Hörmətli yer verdi, göstərdi şəfqət.
Şən məclis qurdu bu sınanmış ərlər,
Padşahın ağlından aldılar bəhər.
Fikrini açmaqdan durmadı geri,
Bütün istəyini sürdü irəli:
"Könlümə qonmuşdur belə bir həvəs,
Sizdən başqasıyla almayım nəfəs.
Sizin rəyinizlə istərəm ancaq
Dünyanı mən qarış-qarış dolaşmaq.
Ruma dönmək idi fikrim, nə etmək,
Atın cilovunu çevirdi fələk.
Əzm etdim ki, Ruma çevirməyim üz,
Ölkələr dolaşım gecə və gündüz.
Şən, uçuq yerlərdə gəzim hər yanı,
Əlimə keçirim bütün dünyanı.
"Səncab" ölkəsinin başında durum,
"Səqlab" gümüşünə sikkəmi vurum.
Ölkələr, torpaqlar dolaşmaqla mən
Öyrənim xalqlardan hansıdır çox şən.
Alım bu şənlikdən faydalı bəhrə,
Çünki təsir edir dəmir dəmirə.
Birinci yürüşdə istəyim ancaq
O qoca Əlbürzə kəsmə yol açmaq.
Dağları, çölləri aşıb keçərək,
Sonra da dənizə səyahət etmək.
Xəzər dənizinə durum baxım mən,
Damlalar çiləyim suya qədəhdən.
Ordumla sahilə çıxınca artıq
Bir həftə ovlayım quş ilə balıq.
Sonra da baxaram əzmim nəyədir,
Zəmanə o zaman bir yol göstərir.
Bu işlər olurmu fikrinizlə saz?
Dövlət doğrulardan boyun qaçırmaz."
Başçılar yer öpdü: "Sizindir əmr,
Bizim fikrimizdir şah tökən tədbir.
Baş qoyarıq, hara qoysanız ayaq,
Əmriniz hər başa bir tacdır parlaq.
Suda, ya atəşdə yer varsa, yenə

Fikrimiz baş əyər hər bir əmrinə.
Atsanız yerə ən uca dağlardan,
Qorxusuz düşərik yerə hər zaman.
Şahdan bir yol seçmək, bizdənsə ancaq
Padşahın əmrinə boyun qatlamaq".
Bu sözdən ürəyi olunca rahət,
İskəndər onlara etdi çox hörmət.
Yola çıxmaq üçün gördü hazırlıq,
Açdı xəznələrin ağzını artıq,
Ordunu gövhərlə elə doyurdu,
Onları cəvahir daşımaq yordu.
Öz kəskin ağlıyla qabağı görən
Qorxaraq çəkindi yaman gözlərdən.
Xəzinə yükləndi, yol aldı, ancaq
Yollarda çətindi onu daşımaq.
Dağlara qaldırmaq çətin olurdu,-
Xəzinə çəkirdi göylərə ordu.
Belə bir fikirə gəldi İsgəndər,
O köhnə top üçün düzəltsin çənbər.
Yerləri öyrənsin o, mənzil-mənzil.
Quru nə qədərdir, dəniz neçə mil.
Bilsin yer üzündə uca, alçağı,
Enə və uzuna ölçsün torpağı.
Ədldən, zülümdən tutaraq xəbər
Hər yoldan azana olsun bir rəhbər.
Hər zülmü ədlilə yusun dövrandan.
Qurtarsın hər azad xalqı bu qandan.
Hər qorxulu yerə çəksin bir hasar,
Hər yerdə bir hünər eyləsin izhar.
"Yollar çox uzaqdır" deyə düşündü,
Yollarda təhlükə, qorxu göründü.
Hədərə getməsin çəkdiyi zəhmət,
Xəzinə olmasın düşmənə qismət.
Gördü ki, talandan varlanmış əskər,
Varlandıqlarından qorxdu İskəndər.
Birinci, çalışmaz varı olanlar,
Əlindən var-yoxu getməkdən qorxar.
İkinci, qarşıya çıxsa ac, bəlli,





Qılıncı endirər o iki əlli.
Sınaqlı kəslərdən böyük İskəndər
Özüylə almışdı yüz on üç nəfər.
Hamısı şahanə məclisin qəlbi,
Hər işdə ağıl və tədbir sahibi.
Sınaqdan Bəlinas hamıdan yaşlı,
Hamıdan bilikli, hamıdan başlı.
Ən çətin işlərə onu çəkərdi,
O da ən ağıllı tədbir tökərdi.
Xəzinə və yolun çətinliyindən
Söz açdı ona hər uzağı görən.
Bəlinas söylədi hey düşünərək:
"Xəzinə torpağa gömülsün gərək!
Ordu da padşahı təqlid eləsin,
Bir xarabalıqda malı gizləsin.
Bilinsin xəzinə gizlənən məkan,
Hər kəs öz varına qoysun bir nişan.
O uzaq yollardan qayıdan zaman
Hər kəs qoyduğundan tapsın bir nişan.
Tanısın qoyduğu nişanı hər kəs,
Etsin öz malını almağa həvəs."
Bu fikri İskəndər irəli sürdü.
Ordunun xeyrini bu işdə gördü.
Torpağa gömdü öz xəzinəsini,
Nişanla bərkitdi dörd dövrəsini.
Əmr etdi, basdırsın sərvəti olan,
Qəlbindən silinsin qorxu və duman.
Dağlarda, daşlarda hamı yer-yerdən
Daş-qaşı gömərək döndülər şən-şən.
Hər kim ki, xəzinə və sərvət qoydu,
Üstündə bir nişan və surət qoydu.
Beləydi ruzgarın fəndi, oyunu,
Başqa bir xəyala çevirdi onu.
Ayrı bir tərəfdən Ruma yol aldı,
Xəzinə o yerdə gömülmüş qaldı.
O qədər saz idi ordunun halı
Ehtiyac görmədi alsın o malı.
Açıqda o qədər tapdılar dövlət,

Gizlənən sərvətə olmadı rəğbət.
Səfərdən Yunana basarkən ayaq,
Dünya işlərindən oldular uzaq.
Tikdilər məbədçin ən yüksək bina,
Oldu hər kəs üçün ibadətxana.
Deyrə vəqf edildi gömülən sərvət,
Hər kişi verdi baş rahibə bir xətt,
O xətlə tanrıya, dinə inanan
Axtarıb tapsın hər sərvətdən nişan.
O monastırlarda indiyə qədər
Gömülən sərvətdən qalır sənədlər.
Bunu dini bir borc bilənlər, əlbət,
Məbədə ürəkdən göstərir xidmət.
Sənəddən birisi verilir ona,
Düşür o sərvəti tapmaq yoluna.
Xəzinə açanın gəlsə müjdəsi.
Alar hər xəznədən ayaq kirəsi.
Mənə bəxtim ayaq kirəsi vermiş,
Ayağım xəzinə-içinə girmiş.

## İSKƏNDƏRİN DƏRBƏND QALASINI ALMASI

Dur, saqi, mey gətir, versin mənə naz,
Gəncliyi qaytarar, insan qocalmaz.
Əlimdən çıxmışdır bu iki dövlət.
Edirəm küpdəki qana qənaət.
Kim istər yaxşı ad keçirsin ələ
Gərək bu qapıda olsun bir kölə.
Qoysun yaxşılıqda elə təmiz ad,
Bununla sonunu eləsin abad.
Vücuda geyinsin belə bir köynək,
Saxlasın bəladan onu zirehtək.
Hər kim öz sonundan yaxşılıq umar,
Gözəl addan başqa gözəl adını var?
Durma, sən ey uca ad-san bəyənən.
Dünyada yaxşı ad almaq istəsən,
Geyin, yaxşılıqla bir donu parlat,





Başqa əlbəsəni yaxşılıqla sat.
Görməyirsənmi bu müşkü hər zaman
Qara bir ipəkdə saxlayır satan?
Bu yeni xəyala bəzək vuranlar
Ən gözəl adlardan daim dəm vurar:
Gözəl ad çıxardı böyük İskəndər.
Ondan fayda gördü, dərdi çox bəhər.
Yaxşılarla durdu, oturdu hər an,
Yanına yol tapa bilməzdi yaman.
Şahlardan ziyadə böyük İskəndər
Məzluma daha çox salırdı nəzər.
Hər yerdə bir zahid görsəydi, xəlvət
Çapardı yanına, edərdi hörmət.
Hər yerdə çətin-bir döyüş başlardı,
Zahidlərdən kömək, himmət umardı.
İskəndər onunçun üstün gəlirdi,
Daşı firuzədən seçə bilirdi.
Onunla bərabər çarpışan ordu
Bu işdən incidi, üzünə durdu
Dedilər ona: "Ey dünya sarsıdan,
Sən dövlət işinə çalış hər zaman.
Ordudur qazanan uğurlu zəfər,
Sən ancaq zahidə salırsan nəzər.
Dünyanın açarı qılıncdır, əlbət,
Bu zahid kəslərlə nədir bu ülfət?
Zəfərə silahsa zöhd ilə himmət
Bu nöqsanımızı bizə də öyrət.
Döyüşçün çaparkən bu meydanlara
Biz də zahidlərdən istəyək çara?"
İskəndər dinlərkən əskər sözünü,
Dinmədi, saxladı bundan özünü.
Faydalı görünməz tez cavab vermək,
Hər cavab vaxtında verilsin gərək.
Elə ki, Əlbürzə yol aldı ordu,
Hər yerdə şahdan bir nayib oturdu.
Bu çətin yollarda heç yorulmadan
Ovçu aslan kimi keçdi Şirvandan
Açaraq öz istək qol-qanadını

Oradan Dərbəndə sürdü atını.
O zaman çox abad deyildi şəhər.
Üstündə bir qala vardı mötəbər.
Qalada kök salmış azğın quldurlar,
O yoldan kim keçsə yolunu burar.
Elə ki, İskəndər çadırı qurdu,
Quldurlar çadırı yuxarı vurdu[291].
Qala qapısını bağladı düşman,
Qorxmadı qılıncdan, qılınc vurandan.
Hüzura gəlməkdən baş qaçırdılar,
İtaət ipini bütün qırdılar.
Şah çağırsa belə uca dərgaha,
Heç biri itaət etməzdi şaha.
Onlara dostluqla uzansa qolu
Yenə də gedərkən kəsərdi yolu.
Çarəsiz qalınca çox kədərləndi,
Əzm etdi ortadan qaldırsın bəndi.
Əmr etdi ki, yüz min silahlı əskər
Hasarlı qalaya doğru gəlsinlər.
Yıxsınlar mancanaq, sapan, daş ilə,
Köpürən qan ilə versinlər selə.
Qırx gün o hasarda çalışıb durdu,
Kərpic də qopara bilmədi ordu.
O yüksək qaladan ox qanad salmış,
Nə kəmənd yetişər ona, nə qayış.
Belə sərt görüncə sapın atanlar
Gəlintək qaladan çox utandılar.
Nə hasar araba ona yol tapır,
Nə də mancanaqdan qorxusu vardır.
Yorulub qalınca bu çalışmaqdan,
Bu günbəd üstünə boş qoz atmaqdan.
Sınaqlı İskəndər bir məclis qurdu,
Başçılar gəlincə belə buyurdu:
"Bu qala haqqında nədir fikriniz?
Yorulduq düşünüb-daşınmaqdan biz.
Ölkələr fəth edən dikbaş igidlər
Ədəblə baş əyib dua etdilər:
"Bəndəyik, əmrinə bağladıq kəmər,





Dincəlmək bilmədik bu günə qədər.
Qırx gündür yuxusuz, yorğun yeməksiz.
Buludla, günəşlə çarpışırıq biz.
Buludun başına, bilirsən, yol yox,
Nə qılınc vurular, nə nizə, nə ox.
Hər işə div kimi tapdıq bir çara,
Bu divlər evində gəldik zinhara.
Bu uğursuz yoldan gəl dönək geri,
Çeynəyək daşları, dik təpələri".
İskəndər duydu ki, igid başçılar
Acizdir bu işdən, olmuşdur naçar.
Sürmədən günəş mil çəkdi gözünə
Batdı bir al gövhər Nil dənizinə[292].
Sahildə səpərək xəzinə, gövhər,
Bir məclis bəzədi bahara bənzər.
Hamı bu məclisə gəldikdən sonra
Söylədi döyüşkən uca başlara:
"Yaxında varmıdır bir zahid dindar,
Dünya işlərindən çəkilən kənar?"
Bir nəfər söylədi: "Uca tacidar,
Bu yaxın köhüldə qoca zahid var,
Kimsənin üzünü görməz bu adam,
Bir çəngə ot ilə keçinir müdam."
Yerindən ox kimi qopdu hökmüran,
Ayrıldı məclisdə olan dostlardan.
Xas adamlardan da qoşuldu ona,
Aradı, iz tapdı köhül yoluna.
Gecə, yol düşmənin günündən qara,
Fənər tuturdular o şəhriyara.
At sürdü, köhülə gəlincə yaxın,
Aydınlıq köhülə edincə axın,
İşığı görüncə zahid uzaqdan
Dışarı sıçradı o qaranlıqdan.
Gördü bir mələkdir günəştək parlar,
İqbalı olmuşdur yuxudan bidar.
Qoca tez padşahın yanına keçdi,
Şahlığın nuruyla padşahı seçdi,
Söylədi: "Görürəm, bir gövhərsiniz,

Zənnimcə cahangir İskəndərsiniz.
İskəndər şəfqətlə ona əl verdi,
Onunla bərabər köhülə girdi.
Soruşdu: "Bu yerdə dostun kim, ey pir?
Bu çöldə yeməyin, geyimin nədir?
Bir də anlat mənə, dar köhüldə sən
Nə bildin cahangir İskəndərəm mən?
Söylədi: "Həmişə qəlbin olsun şad,
Hər zülmün bəndindən olasan azad.
Ulduzun bəxtində versin əl-ələ,
Taleyin ucalsın səadət ilə.
Görüncə səni mən tanıdım ondan:
Ayı qaranlıqda tanıyar insan.
Dünyada sanma tək sənin güzgün var,
Mənim də ürəyim güzgüdür, parlar.
Yüz ildir parladır onu riyazət,
Bir surət göstərə bilir, nəhayət.
Ey uca fikirli, sordunuz məndən:
Necə ömr edirsən dar göhüldə sən?
Olmuşam sayəndə sağlam bir insan,
Əvvəlkindən daha sağlamam, inan.
Qəlbimdə kimsəyə yox məhəbbət, kin,
Azadə, bəxtiyar yox mənim təkin.
Dünyada bir vəfa görmədim, gerçək,
Vəfasız kimsədən umulmaz kömək.
Hər işi fikrimlə çox ölçüb biçdim,
Özümə yararlı bu yeri seçdim.
Hesabı, kitabı kəsdim dostlardan,
Yalnız bir dostum var - böyük yaradan.
Doyunca yeməyə etmədim adət,
Mədəni doldurmaq zəhmətdir, zəhmət.
Yediyim köy otdur, geydiyim həsir,
Daşları, bax, bunlar kimiya edir.
Bu illər uzunu tacidarlardan,
Səndən başqasını görmədim, inan.
Səbəb nə, göylərdə sönmüşkən çıraq
Uğurla köhülə basdınız ayaq?
Sənə bu köhüldə, ey böyük insan,





Xidmətçin əskiyəm bir qara quldan."
İskəndər dedi: "Ey sınaqlı qoca,
Çarəm yox, gəlmişəm, fikrimdir uca
Tanrı bir dəmiri böldü ikiyə,
Bizlərə tapşırdı "sahib ol" deyə.
Onlardan qılınc və açar bəzərkən
Açarı sən aldın, qılıncı da mən.
Bu dəmir qılıncla işıqlı gündə
Mən haqqa köməyəm ədlin önündə.
Sən də, gəl, gecəykən göstər kəramət,
Ədalət yolunda bir açar tərpət.
Mənim bu qılıncım, sənin açarın
Açsın qapısını xalqın, diyarın.
Bu dik dağ başında var uca hasar,
O yerdə yurd salmış azğın quldurlar.
Gecə də, gündüz də çalırlar karvan,
Sənə də qəsd edir bu azğın düşman.
İstəyim bu işlək yolu açmaqdır,
Ədl ilə, biliklə bəzək saçmaqdır.
Sən öz himmətinlə göstər bir hünər,
Tale də bu yolda köməklik edər.
Əyridən, oğrudan təmizlənər yol,
Yolçunun ərzağı artar, olar bol."
Elə ki, anladı o qoca dindar,
Qalada hökm edir azğın quldurlar,
Ahından açınca odlu bir sapan,
Göylərin qapağı açıldı haman.
Dağa o sapanı elə fırlatdı,
O dağ öz içində dənizə batdı.
Padşaha söylədi: "Qayıt indi sən,
Uca dağ oynayıb qopdu yerindən."
Məclisə dönüncə uca şəhriyar,
Məclisdə olanlar qarşı çıxdılar.
Ən gözəl bir məclis qurdu yenidən,
Ortaya mey gəldi, üzlər oldu şən.
Xidmətçi gəldi ki, qalabəyidir,
Hüzura gəlməyə izn istəyir.
Əmr etdi, hüzura aldılar onu,

Girincə yer öpdü, əydi boynunu.
Alqışlar yağdırdı uca dərgaha,
Açarı ədəblə verdi padşaha.
Söylədi: "Bu gecə qopdu bir bəla,
İsgəndər gücüylə dağıldı qala.
İki bürc hasardan birdən qoparaq
Uçuldu padşahın bürcündən iraq.
Tanrının qəhrindən qopdu bir sapan,
Hasara düşüncə dağıldı hər yan.
Səninsə sapanın çatmaz bu yerə,
Günəşi yandırmaz kiçik bir zərrə,
Bilirəm, xarablıq deyil ordudan,
Başqa bir qapıdan gəlir bu sapan.
İndi ki, göyün də hökmü səndədir,
O qala, o da sən, sənindir əmr."
Baxdı başçılara, dedi İskəndər:
"Duaya bundan xoş kim dəlil istər?
Qırx gündür daş, qılınc yeyir bu hasar,
Sınaqlı igidlər hey çarpışırlar.
Bu qədər qılıncın almaz gücüylə
Qopmadı o dağdan bir kəsək belə.
Yoxsul bir zahidin çəkdiyi ahdan
Dağıldı bir hasar, bürc oldu viran.
Cizcə bu qalaya kim oldu üstün?
Bu dünya zahidsiz olmasın bir gün."
Başçılar bu işə çox heyran oldu,
Öz dediklərindən peşiman oldu.
Yer öpüb dedilər: "Sən ey hökmüran,
Taxtından, tacından ayrılmayasan.
Ölkədə qolların qüvvətə dolsun,
Çəkiyin daşları əbədi olsun.
Belə nüktələri sənsən tanıyan,
Səni öz kölgəsi etmiş yaradan.
Bu sirri, hikməti biz də anladıq,
O yanlış yollardan çəkildik artıq."
Yenidən bürüdü qoşun hasarı,
Yollardan qaldırdı yol vuranları.
Qalanın yerinə ərazı verdi,





Onları verdiyi mülkə göndərdi.
Göylərlə öpüşən qalanın bir-bir
Uçulmuş yerləri edildi təmir,
Elə ki, dağıntı, uçuqlar bitdi,
Zülmün qalasını ədl evi etdi.
O dağda əhali doymuşdu cana,
Şikayət etdilər o hökmürana:
"Bu qıpçaq xalqı bir dəhşətdir, dəhşət...
Əkin əkməyə də bizdə yox cür ət.
Axına başlarkən açıq dağlardan
Əkindən, biçindən qoymazlar nişan.
Axından ölkəmiz çox ziyan edir,
Malımız, canımız məhv olub gedir.
Rahatlıq versəydin bu ölkəmizə,
Böyük bir mərhəmət edərdin bizə.
Bu açıq və uçuq yerləri bir-bir
Daş ilə dağ kimi eyləsən təmir,
Onda çöl xalqının axınlarından
Rahatlıq içində dincələr xəzran"[203].
Əmr etdi: nə qədər açıq, uçuq var,
Çəksin bu xəzranın xalqı bir hasar.
Gecə də, gündüz də qara daşlarla
Olduqca böyük səd çəkilsin yola.
İş bilən, sınanmış daş yonanlardan,
Dağlarda açığı sədlə bağlayan
Bilikli ustalar göndərdi ora,
Keçidlər alındı möhkəm hasara.
Hasar işlərindən azad olaraq
Hərəkət qəsdilə ucaltdı bayraq.
Gurlayan təbillər açırdı yara,
Ağaclar abnustək olurdu qara.
İskəndər xeyməni çıxardı çölə,
Yollarda mənzili qatdı mənzilə.
Ata ülkər kimi verdi hərəkət,
Hər bürcə çatınca saçdı səadət,
Gecənin saçları müşkin həlqədən
Neylufər günbədə saçarkən səmən,

Yolun zəhmətindən padişah, ordu
Azacıq dincəldi, bir məclis qurdu.
"Əfsanə söyləsin" deyə, İskəndər
Çağırdı o yerdən bir neçə nəfər.
Verdi bir çox sual o yerə dair,
Bütün vəqələri öyrəndi bir-bir.
Söz sözü çəkərkən hər yerdən onlar
Açdılar şaha çox maraqlı əsrar:
"Burda bir qala var ki, cənub yeli
Əssə də, o yerə uzanmaz əli.
Mınadan bir daşdır, saçar müşk, ənbər,
Həm gözəl, həm şəndir bir cənnət qədər.
Sərir adlanır o mübarək məzar,
Orda Keyxosrovun taxtı, camı var.
Keyxosrov mülkündən köçüb gedərkən,
Taxtına, tacına bu yerdir məskən.
Məzarı odlu bir köhüldür ancaq,
O yerə olmayıb ayaq da basmaq.
Həm də o məkanda padşahlıq edən
Bir məlikzadə var onun nəslindən,
O şahın yerinə pərəstiş edər.
Taxtını, tacını düşməndən güdər."
O dünya dolaşan uca hökmüran
Gül kimi açıldı bu xoş dastandan.
Harda macəralı bir qala alsa,
Yenilən qüvvətli, ya aciz olsa,
Girərdi qalaya Keyxosrov sayaq
Apaçıq, ya da ki, gizli olaraq.
Qalanı dolaşıb dönərdi yenə,
Bəxşişlər verərdi keşikçisinə.
Hər şeyi görməyə marağı vardı,
Hər işin üstündən odtək çapardı.
Elə ki, eşitdi bu keyfiyyəti,
Qalanı görməyə artdı rəğbəti.
Qoca Keyxosrovun köhnə canından
Dövlət məclisinə versin yeni can.





# İSKƏNDƏRİN SƏRİR QALASINA GETMƏSİ VƏ KEYXOSROVUN QƏBRİNİ ZİYARƏT ETMƏSİ

Saqi, dur şərabla könlümü güldür,
Bu işdə səbrinə bir ölçü götür.
Könül çırağının tükənmiş yağı,
Mey ilə parlat bu sönük çırağı.
Gündüz qarğa rəngli qara gecədən
Çıxmış Zəngibardan kafur kimi şən[104]
Uğurlu cənnəttək işıqlı gündüz
Şəfəqlər içində parladırdı üz.
Havada toz, duman yox zərrə qədər.
Laciverd rənginə boyanmış göylər.
Guşəyə çəkilmiş küləkli xəzan.
Baharın dan yeli əsir hər yandan.
İşıqdır dağ, çəmən, bütün yer üzü,
Parlar al çıraqla dünyanın gözü.
Kainat bir cənnət bağına bənzər,
Hər yanda qoxuyar müşk ilə ənbər.
Bəxtiyar İskəndər uğurla yenə
Taxtından oturdu təxti-rəvanə.
Göylərə söykəndi tacının başı,
Ucaldı bayrağı, açıldı qaşı.
Yer yorulmuş idi at nallarından.
Dağların başına düşdü həyəcan.
Ordunu Səririn şəhrinə çəkdi,
Keyxosrov taxtını görmək istərdi.
Səririli eşitdi İskəndər gəlir,
Keyxosrov taxtını görmək istəyir.
İşindən, ağlından tutmuşdu xəbər,
Adildir cahangir böyük İskəndər.
Kəyanın nəslinə verməmiş ziyan,
Doğruya köməkdir, arxadır hər an.
Çoxunun başına qoymuş qızıl tac.
Bəxşişlər vermişdir, almamış xərac.
Şahı qarşıladı iki mənzildən,
Xalılar döşədi, yollar oldu şən.

Dəyərli bəxşişlər saçdı o qədər.
Sayını olmadı bilən bir nəfər.
Gül kimi təртəzə hər çeşid dəri,
Götürmüş həddindən çox bu şeyləri.
Zil qara samur, al tülkü dərisi..
Qaqum, qunduz, vaşak ki, hər birisi
Baharda ilk açan yarpağa bənzər.
Üstünə səpilmiş bənövşə, ənbər.
Başını dik tutan boyları çinar,
Döyüşdən qorxmayan igid qulamlar,
Cilovda yeriyən qullar hər biri
Görüşdə ən təzə, xidmətdə diri.
Hüzura göndərdi belə bir baxşış,
Başqa töhfələri həddini aşmış.
Saraya axınca bu var, bu dəniz,
Nazirlər saymaqdan qaldılar aciz.
Sərirli hüzura gəldi, baş vurdu,
Belini ikiqat bükərək durdu.
İskəndər şəfqətlə oturtdu onu,
Hörmətlə yüksəltdi uca boynunu.
Məclisdə bitincə görüş ayini,
Soruşdu taxt ilə cam qissəsini:
"Anlat ki, tilsimli cam, Kəyan taxtı
Necədir, sönmüşdü onun da baxtı?"
Sərirli dedi: "Ey dünyanın şahı,
Şərəfli şahların ey şahənşahı!
Keyumərs ordundan kiçik bəndədir,
Firidun mülkünün fərmanındədir.
Ulduzlar yayına ox olsun sənin,
Göy kimi dünyanı tutsun kəməndin.
Keyxosrov camıdır hər şeyə açar,
Sənin də əlində açan güzgü var.
Fərq budur, dünyada qazandı ad-san
İskəndər güzgüdən, Keyxosrov camdan.
Taleyi oyanmış padşahlar getdi,
Bu taxtı, bu tacı sənə tərk etdi.
Taxtınla dünyaya saçılsın işıq,
Başından tac əskik olmasın artıq.





Dünya tacidarı əzm etmiş, desək
Köhnəlmiş bu tağa vursun yeni rəng.
Onunçun atını sürmüş bu yerə,
Ucalsın daxmamız uca göylərə."
İskəndər dedi: "Ey böyük namidar,
Kəyandan bu taxta, taca yadigar.
Çünki mən Kavusun taxtına keçdim,
Cəmşidin camından gülgün mey içdim.
Bu uca taxt ilə cam üçün, gerçək
Oynamış yerindən, çırpınır ürək.
Bilmək istəyirəm, uca tacidar
Dar köhüldə necə tutmuşdur qərar?
Keyxosrov sirrini arar İskəndər,
Sən otur, o yerə yalnız yol göstər!
Yiyəsiz taxtına ağlayım bir an,
Öpüm gülgün camın dodaqlarından.
Bu taxt ki, Xosrovdan qalmış yadigar,
Şahın ölümündən açarmı əsrar?
Eşidim o cansız camdan bir salam,
Vücudum canlansın, yaşayım xoşkam.
Canımın güzgüsü paslıdır, gərək
O pasla güzgünün tozunu silmək.
Görməklə qəlbimə düşsün bir təşviş,
Asan olsun mənə hər bir çətin iş."
İskəndər sözünü salmadı yerə,
Sərirli itaət etdi bu əmrə.
Tez qalabəyinə göndərdi xəbər:
Qarşıya çıxarsın böyük töhfələr.
Çeviklik göstərsin hər bir xidmətdə,
Həm qonaq sevməkdə, həm nəzakətdə.
Tapşırıq verdi: taxt keşikçiləri
Padşaha xidmətdən durmasın geri.
Yol versin, Keyxosrov taxtına keçsə,
Qədəhi doldursun gülgün mey içsə. .
Keyxosrov taxtına əyləşdirsinlər,
Töksünlər başına inci və gövhər.
Şərabla doldurub firuzə camı
Versinlər padşaha, qalmasın kamı.

Versin xoşladığı yeməkdən ona,
Durmayın geri baş əyməkdən ona.
Elə ki, bitirdi tapşırıqları,
Dedi: "Şah buyursun qalaya sarı.
İzninlə burada qalmalıyam mən,
Sizi qarşılayım ordan dönərkən."
Getməkçin tərpəndi böyük İskəndər,
Bəlinas onunla getdi bərabər.
Məhəkə vurulmuş beş-altı qul da
Ona yoldaş oldu bu çətin yolda.
Mağara yolunu durmadan biçdi,
O qədər ucaldı, göyləri keçdi.
Dırmandı rahatlıq etmədən belə
Çərx kimi burulan yoxuş, keçidlə.
Gördü bir qaladır, alçalar göylər,
Adını davada çəkməmiş bir ər.
Gəlinlər tez şərbət hazır etdilər,
Qatdılar dodaqdan ona gül, şəkər.
Açıldı şahanə gözəl bir süfrə,
Yeməkdən düzüldü adına görə.
Sarayın qızları bənzərdi aya,
Hər yandan padşahı aldı araya.
Dəbdəbə, şövkətə daldı İskəndər,
Dövlətin siması qəlbi cəzb edər.
Şah xörəkdən yedi, şərbətdən içdi,
Qalxınca Keyxosrov taxtına keçdi.
Taxtın ayağına gəldiyi zaman
Hörmətçin tacını aldı başından.
Elə bil səsləndi hər qapı, divar:
"Yuxudan oyandı yatan tacidar."
Sərirli vermişdi belə bir fərman:
"Keyxosrov taxtına çıxsın hökmüran."
O böyük tacidar keçincə taxta,
Bir simürğ oturdu sanki budaqda.
O qızıl sütunlu taxtı güdənlər
Söz xəzinəsindən saçdılar gövhər:
"Padşahın çıxması şahanə təxtə
Hər zaman uğurlu yol açar bəxtə.





Yaqutu ölçən bu gövhər cam ki, var,
Çox saysız sərvətə olmuşdur açar.
Bu dövlət becərən cam və taxt ilə
Çox taxtı və camı alarsan ələ."
O biri dedi: "Ey uca şəhriyar!
Bir ölkə görməmiş səntək tacidar.
Keyxosrov taxtına sən ki oturdun,
Başını fələyin taxtına vurdun."
İncə bir dil açdı başqa bir nəfər:
"Keyxosrov, Keyqubad nə vaxta qədər,
Qolun ki, bu taxtla gücləndi artıq,
Edərsən Keyxosrov və Keyqubadlıq."
Şah bu taxt önündə bəxtiyarlıqla
Gözəl fal vuruldu namidarlıqla.
Padişah bu taxta bəzək, şan verdi,
Ölən Keyxosrova yeni can verdi.
Şah taxtın üstündə oturdu çox az,
Tez taxtı öpərək endi keyfi saz.
Şah taxta o qədər xəzinə saçdı,
Xəznədar gözünü heyrətlə açdı.
Əmr etdi: bir qızıl kürsü qoyulsun,
Xosrovun camı da yanında olsun.
Kürsüyə oturdu adlı tacidar,
Keyxosrov camını ələ aldılar,
Saqi tapşırığı görüncə belə,
Parlatdı o camı qızıl mey ilə.
Verdi İskəndərə qəlbində sevinc:
"Keyxosrov eşqinə bu şərabı iç!
Bəxtinin ulduzu sənə yar olsun,
Qolların bu camla bəxtiyar olsun!"
Şah camı görüncə ayağa qalxdı,
Bir kərrə içərək camı buraxdı.
Cama qolbağından saldı bir gövhər,
Oturdu, önünə qoydu İskəndər.
Yiyəsiz o taxta kədərlə baxdı,
Gözündən şərabsız cama yaş axdı.
Padşahsız, şərabsız, yetimtək duran
Boş taxta, boş cama çəkdi bir dastan:

- Qalmasın qızıl taxt yiyəsiz, yalnız,
Bu cam da olmasın qızıl şərabsız.
Hər qədəh işığı alır şərabdan,
Hər taxta qiyməti verir hökmüran.
Tacidar getdimi, durma, taxtı qır!
Şərabı töküls ə, camı yerə vur!
Padişah taxtında olar sərafraz,
Cənnətin taxtında naz ilə yatmaz.
Dünyadan cənnətə keçən bir insan,
Bax, belə bir taxtı sanacaq zindan.
Bir quş gülşənindən ayrı düşərkən
Qəfəsi "ac"dandır, toru ipəkdən.
Budaqdan yaşıl tac qoyduğu zaman
Sədəfi, ipəyi çıxarır yaddan.
Biz tac düşgünüyük neçin bu qədər.
Ölüm basqınından tutan yox xəbər?
Xəzan qılıncını görmədiyindən
Qol-budaq ataraq bahar olur şən
Maral sağrısını şişirdən zaman
Bilmir ki, bu yerdən keçəcək aslan.
Cüyürlər çöllərdə oynur, şənlənir.
O qorxunc aslanlar yatmışmı, nədir?
Ahunun göbəyi dolmuş müşk ilə,
Bəbirlərin dişi sınmamış hələ.
Belə bir qəflətlə keçir günümüz,
Bir zaman yanğından qopar ünümüz.
Faydasız olan bu taxt nəyə gərək?
Üstündə başqası ömür sürəcək.
Biz başqa kəslərə yer qızdırırıq,
Bu yerdən utanmaq gərəkdir artıq.
Faydasız bu taxta uyma, saxtadır,
Yerimiz taxt deyil, quru taxtadır.
Bu qızıl taxt deyil, versəniz fikir,
Ayağa vurulmuş ağır kündədir.
Bir taxt ki, əbədi yer deyil sana,
Onu ölməmişkən parçalasana!
Keyxosrov camında qalmamışsa su,
Yerinə mey tökmə, qoy qalsın quru.





# İSKƏNDƏRİN KEYXOSROV MƏQBƏRƏSİNƏ GETMƏSİ

Ey saqi, Keyxosrov camını doldur,
Bir cam ki, hər gözə verir işıq, nur.
Dur, ağzına qədər mey doldur ona,
Hörmətlə ver əsrin Keyxosrovuna.
Ey uca şövkətli adil padişah,
Müştəri simalı, asiman pənah!
Keyxosrov qurduğu məclislər hanı?
Taxtında oturan İskəndər hanı?
Onlar öz bürcünü ataraq getdi,
Şövkəti, dövləti sənə tərk etdi.
Dünyada İskəndərtək etsən rəftar,
Sənindir hər buyruq, sənsən tacidar.
Bu dünya adına vurmuşsa sikkə,
Səninlə şənlənmiş olsa da ölkə,
Könül vermə könül aldadanlara,
Dünya üz verməmiş mehribanlara.
Onu kim sevdisə, dostun önünə,
Bax, nələr çıxarmış o dönə-dönə.
Bir taxtı hiyləylə qurdu, bax, sonra
Nə oyun açdı o, taxt quranlara.
O cam ki, bir nəfər məstı şad etdi,
Bax, cam sahibinə nə bidad etdi.
Bu yeddi kişvərdə Keyxosrov sənsən,
İskəndər mülkünə fərman verənsən.
Bu şahdan güzgü al, o şahdan cam al,
Düz göstərdikləri yolla get, nam al!
Hər işə bir qərar verərkən bu gün.
Sabaha ondan bir səmər var, düşün.
Şahlara tac verən tacidar sənsən!
Atanın taxtında yadigar sənsən!
Şən yaşa, getdi o şən yaşayanlar,
Köçdü tacidarlar, sənsən tacidar!
Bu bağda turacın qanadlarıtək
Nə çinar qalacaq, nə də bir çiçək.
Əxistan ömrünü vurdusa başa,

Bu yaşıl gülşəndə sən var ol, yaşa!
O məni ucaltdı nazla, nemətlə,
Göylərə qaldırdı yerdən hörmətlə.
Sən məni ucaltdın ondan da artıq,
Bağının qapısı üzümə açıq.
Yerlərə naxışlar vurduqca dövran
Üzünə şənliklər gülsün hər zaman.
Zamanın əlaçıq hatəmlərindən
Yalnız sən qalmışsan, yaşa daim sən!
Nədən söyləyirdim, harada qaldım,
Atımı sürərək, hara yol aldım!
İskəndər o taxtda, o camda, heyhat
Görmədi rahatlıq, görmədi səbat.
Göylərin əbədi taxtı olmayan
Hər bir taxt deyilmi həyata zindan?
Bəlinas həkimi dəvət elədi,
Oturdu o cama yaxın, söylədi:
"Camdakı ayinə sən də qıl diqqət,
Ondakı əsrarı ara, tap əlbət!"
Bəlinas o cama edincə nəzər,
Qolayca oxundu bütün rəqəmlər.
O yerdən ki, haman cam asılmışdı,
Sırayla bir neçə xətt yazılmışdı.
O xəttə dərindən saldılar nəzər,
Gizli bir hesabı dərhal seçdilər.
Padişah, Bəlinas öz kamalilə
Xətlərin sayını gətirdi ələ.
Sonralar padişah bu torpaqlardan
Öz vilayətinə keçdiyi zaman
Camdakı ayini tapdı Bəlinas,
Üstürlab düzəltdi o ayinə xas.
Elə ki, İskəndər yol tapdı cama,
O yerdə dincəldi, yetişdi kama.
Dedi Bəlinasa: "Səndəndir kömək,
Bu taxta başqası qonmasın gərək!"
Bir tilsim düzdü o ağıllı həkim,
O taxtın üstündə otursa hər kim,
Az keçər, bu taxt da tərpənər birdən,





Onu bu yaqut taxt atar üstündən.
Eşitdim o cünbüş indi də vardır,
Qızıl taxt üstündə o bərqərardır.
Xosrov ayinini təqlid edərək
Gəldi darvazaya şah Keyxosrovtək.
Camdan, taxtdan gəldi məqsədi ələ,
Üz qoydu Keyxosrov yatan köhülə.
Şahı qələbəyə böyük zəhmətlə,
Apardı köhülə yüz əziyyətlə.
Elə ki, köhülə şah yaxın oldu,
O daşlıq yollarda atlar yoruldu.
Getmək çox çətindi, nə yol, nə iz var,
Hər yanı bürümüş tikan və buxar.
Bələdçi söylədi: "Padşahım, dur,
Keyxosrov yatdığı köhül, bax, budur.
Yolları şimşəkli ildırım vurmuş,
Qayalıq qayalıq üstündə durmuş.
Köhülün sirrini öyrənmək üçün,
Padşahım, bu yolda bir qədər düşün.
Diş-dırnaq tökülür qorxunc yollarda,
Keyxosrovtək özün yatarsan orda.
Əsrar pərdəsinə olma çox yaxın
İşi çox uzanar arayanların.
Yüyəni geriyə çevirin daha!..
Bu köhül içində yatmış əjdaha."
İskəndər üzünü çevirdi ondan,
Köhülə piyada getdi hökmüran.
Bəlinas arxada, önündə rəhbər,
Sınanmış iki qul, bir də İskəndər.
Keçdilər zəhmətlə, bitdi qayalıq,
Köhül dəhlizinə çatdılar artıq.
Köhül xəzinəsi gəlincə ələ
İskəndər qəlbinə düşdü vəlvələ.
Gördü daş köksündə köhnə bir yarıq,
Ensiz bir yolu var, dar və qaranlıq.
Köhül sahibindən tapmaqçın nişan
Köhülə zəhmətlə girdi hökmüran.
Bir qədər keçmədi, od qalxdı birdən,

Alışıb yanırdı içəri girən.
Soruşdu: "Bəlinas, nədir bu odlar?
Darısqal köhüldə hardandır buxar?"
Bəlinas diqqətlə baxdı bir zaman,
Bilsin ki, neçin od fışqırır daşdan.
Gördü bir parlayan dərin quyu var,
İçində qaynaşır əlvan işıqlar.
Kimsə o işıqdan tutmamış xəbər,
Arayan tapmamış ondan bir əsər.
İşığa nə qədər aradı yol, iz,
Bir işıq tapmadı, qaldı səmərsiz.
O igid belinə bağladı kəndir,
Bilsin ki, quyuda bu ataş nədir?
Parlayan günəşdən tapdı bir nişan,
Anladı od necə çıxır quyudan.
Toplu bir alovdu, deyil dağınıq,
Gördü ki, kükürddür bu yanan işıq.
İşarət verincə çıxdı quyudan,
Dualar edərək dedi: "Hökmüran,
Tələsmək lazımdır, göstərin tədbir,
Su deyil, quyudan çıxan ataşdır.
Kükürd mədənidir bu, alovlanır,
Kükürddən dörd yanı alışıb yanır.
Bu sirri bilirmiş köhüldə yatan,
Özünü kükürdlə məhv etmiş, inan."
Padşaha, köhülə etdi çox dua,
Çıxarkən üzərlik səpdi alova.
Köhüldən çıxınca axtardı yolu,
Tapmadı, qəlb oldu kədərlə dolu.
Eşitdim, dənizdən bulud qalxaraq
Şiddətli qar səpdi, doldu hər bucaq,
Dünyanı sarsıtdı qarlı bir tufan,
Dərələr, təpələr doldu o qardan.
O qarda sərgərdan qaldı İskəndər,
Qarlı kipriyindən axdı qətrələr.
Qala xalqı xəbər tutunca bundan
Köməkçin axdılar ora hər yandan.
Təpiklə, kürəklə yolu açdılar,





Çox zəhmət çəkdilər, hiylə saçdılar,
Şah yolu tapmaqçın ətrafa baxdı,
Köhülün küncündən zirvəyə qalxdı.
Yaşıl donlu tovuz humay quşundan
Ağ, parlaq sümüyü qapdığı zaman[209]
Səriri taxtına səadət verən
Sərir qalasından enincə şən-şən,
Döndü öz çadırı qurulan yerə,
Yenidən yar oldu bəxt İskəndərə.
Dincəldi dəhşətli zəhmət çəkməkdən,
Mağara yolunu gedib, gəlməkdən.
Düşdü sıxıntıya, düşdü qorxuya,
Özünü ovdurub, daldı yuxuya.
Yatdı, vücuduna rahatlıq çökdü,
Dan yeri ağardı, al şəfəq sökdü.
Yenidən baş vurdu səhər göylərə,
Şəfəq mey camını vurunca yerə.
Bu saxsı torpağa lacivərd fələk
Sarı reyhanlarla vurunca bəzək,
Əmr etdi, şahanə məclis bəzəndi,
Noğulla, şərabla süfrə şənləndi.
Səririn şahını dəvət elədi,
Hörmətlə oturtdu, şəfqət elədi.
Onunla qədəhi aldılar ələ,
Hamı sərxoş oldu o gülgün meylə.
O bəxşiş əlləri açıldı yenə,
Xəzinə axıtdı ev sahibinə.
Həmayil, təxtü tac verdi hökmüran,
Taxtı fil sümüyü, tacı qızıldan.
İpəkdən don verdi, üstü zər, gövhər,
Sanki bir pərvindir, cavahir çəkər.
İçinə yarımca portağal sığan
Portağal biçimli firuzə fincan.
Yarısı tutulmuş qızıla, ləlе,
Nar kimi dolmuş nar dənələrilə.
Zümrüddən nərd verdi - üstü əl-əlvan,
Bəzəyi qırmızı, sarı yaqutdan.
Büllurdan bir xonça, günəş kimi şən,

Sankı göy budaqda açmış yasəmən.
Yorğa at, başında qızıldan yüyən.
Yüyənin bəzəyi əlvan gövhərdən.
Ağır yük altında tərləmiş yüz lök,
Tükləri tər-təmiz, həm sağlam, həm kök-
Yük vurmuş o bağlı şeylərdən hələ,
Cavahir batmanla, qızıl xərmənlə.
Rütbəyə münasib verdi hər kəsə
Hər çeşid qəba və zərli əlbəsə.
Verildi o qədər xələt və sərvət.
Sərirli taxtını parlatdı zinət.
Öpdü şah əlini o dönə-dönə,
Sevinclər içində döndü evinə.
İskəndər oradan köç təbli çaldı.
Bayraqlar işıqlı göyə ucaldı.
Səhraya endi o dağlıq yerlərdən,
Dəniz sahilində eylədi məskən.
O çöldə bir həftə ov etdi, artıq
Köçmək məqsədilə gördü hazırlıq.

## İSKƏNDƏRİN REY VƏ XORASANA GETMƏSİ

Dur, saqı, o qızıl camı qoyma boş
Ki, Cəmşid, Firidun yadigar qoymuş.
Ver bu saf aşiqə o saf şərabdan,
Məstliklə keçsin bu rəyalı dövran.
Ey könül, nədir bu oyunun hələ?
Hər dəfə çıxırsan yeni bir rənglə.
Nəfsinin ağacı yamyaşıl durur,
Başını burmadan, başını sən bur![206]
Şərabı içməmiş, gözüm, məst olma!
İçsən də, dönərək bütpərəst olma!
İndi ki, zəfəran yemədən şadsan,
Yemə zəfəranı, ölərsən, inan![207]
Olma şahlar kimi yemək düşgünü,
Qorx, səni yaxalar fəlakət günü.
Bu ev ki, qızğın od fışqırır hər an,





Tək laqeyd olanlar qurtulur ondan.
Bərkliklə hər bərklik bir muma dönmüş,
Neft ilə, kükürdlə hansı od sönmüş?
Keçmişi nəql edən o qoca sərvər
Vurur öz nəqşinə belə bir zivər:
Keyxosrov taxtından Xosrov dönüncə
Ordunun içinə getdi ilk öncə.
Bir gün öz taxtında oturdu artıq,
Köçməyə tökürdü tədbir, hazırlıq.
Bir qasid ay kimi girdi içəri.
Qasid adətilə öpərək yeri
Uca şəhriyara açdı çox əsrar,
Anlatdı nə varsa gizlin, aşikar.
"Üzümü qapına sürtmək üçün mən,
Bura at çapmışam İstəxr şəhrindən.
Nayibin var qızğın salamı sizə,
İxlasla ərz edir xidmətinizə:
- Şərtlər ki, qoymuşdur nayib tikirkən,
O şərtlə yerimdə nayib oldum mən.
O gündən ölkəni almışam ələ,
İnciyən olmamış bir nəfər belə.
Əməl etdim şahın dediklərinə,
Şərtləri yetirdim bütün yerinə.
Şükr olsun, alçaqdan və ya ucadan
Ölkəyə tük qədər dəyməmiş ziyan.
Dönükdür üzü bu namərd fələyin,
Gah şəfqət göstərir, gah həsədlə kin.
Çərx ikicanlıdır yaxşı-yamandan,
Ulduz gah dost olur, gah qatı düşman.
Əkilməmiş ağac göyərmiş Reydən,
Söyləyir: Keykavus nəslindənəm mən!
Yırtıcı bir divdir, dəhşət yaradır,
Ölümə əjdaha kimi can atır.
O ceyran otaran çobanlar belə
Çomağın yerinə ox almış ələ[208].
Bel ilə işləyən götürmüş kaman,
Belçilər olmuşdur silah daşıyan.
Bu azğın özünü sanır Əhrimən,

Hər yerə çatırsa qoparır şivən.
Söyləyir: mənimdir bu tac, bu ölkə,
Namusa rəng ilə vurur bir ləkə.
Başında yığıntı saysız əskər var,
Dənizin suyundan toz çıxarırlar.
Bəxtinə güvənib, olmuş qəhrəman,
Meydanda bir nəfər yox qarşı çıxan.
Özünü kim tutsa şaha bərabər,
Başıyla sərvəti əlindən gedər.
Ona yüyən çəkir Xorasan xalqı,
Döyüşə aparır bu üsyan xalqı!
Bəlx ilə Nişabur boyu hər yerdə
İştirak edirlər bu şurişlərdə.
Bu fitnə başçısı hazırlıq görür,
Taxtının durduğu yerə yürüyür.
Kini qızğın olan belə fitnəyə
Baxma çox yüksəkdən, alçaqdır, deyə.
Kiçikdən ən böyük bir fitnə doğur.
Hər qurdun sümüyü ayağa oxdur[209].
Bu fitnə yaşasa uzun bir zaman,
Padşahlıq işinə əl atar, inan.
Buludtək ayının almasan üstün,
Taxtını qılıncla alacaq bir gün.
Bir tərlan qayışı açsa ayaqdan,
Kəklik qol-qanaddan düşər o zaman.
Qüvvətli ordum yox ki, dava günü
Çıxarım düşmənin xain gözünü.
Ölkədə qalmamış adlı igidlər,
Hamı şah yanında bəndəlik edər.
Odur ki, artdıqca tamahı, öcü,
Qolu qüvvətlənir. Yox olsun gücü!
Yalnız şəhriyarın yel kimi qopan
Ordusu götürər bu tozu yoldan!"
Qasid öz sözündə hünər yaratdı,
Məktubda olanı sözlə anlatdı.
Ən gizlin əsrardan, yaxşı, yamandan
Məktubda nə varsa, elədi bəyan.
O aslan ürəkli, o fil gövdəli





Çəkdi öz-özünə bu xoş məsəli:
"Burda Keyxosrovun taxtı altında,
Orda bir başqası mənim taxtımda.
Bənzər o dastana bu tac, taxt, ordu:
"Hindudən sərvəti çalar bir hindu[210].
Bu yerdə dayanmaq yaramaz daha,
Gecikmək düşməni edər ə əjdaha."
Padşahın ordusu göymüdür, nədir?
Durmadan hər zaman hərəkət edir.
O karvanbaşıdır, dünya bir karvan,
Artırdı karvanın yükü hər yandan.
Yük ilə dolmuşdu hər yer, hər guşə,
O yerdə qarışmış bu iş o işə.
Yalnızca edərdi hər işə çara.
Böyük bir arxaydı sığınanlara.
Hər kimi öz bəxti etsə cahangir,
Elə bir ayağa yaramaz zəncir.
Şəhriyar yerindən hərəkət etdi,
Sahillər boyunca yol alıb getdi.
Aydan da yuxarı ucaldı bayraq,
Bisütun kimi bir sütun vuraraq.
Həm gözəl ov vardı, həm gözəl ovlaq,
Getdi yol uzunu ov ovlayaraq.
Salxımlar əyilmiş ağırlığından.
Köklükdən tərpənə bilməyir ceyran.
O qədər sel axdı çayın gözündən,
Silindi toz, torpaq dünya üzündən.
Coşmuşdu şimşəkli neysan buludu,
İldırım salmışdı müdhiş gurultu.
Göyərti kök salmış qara torpağa,
Rəqs üçün baş əyir yarpaq yarpağa.
Kəskin naləsiylə yırtdı bülbüllər
Gülün köynəyini göbəyə qədər.
Sədbərgin üstündə duran qızıl gül
Yaqut nallı ata minmiş elə bil.
Tut ilə yarpağı, bu iki növbər
Halvadan, inəkdən verirdi səmər.
Yer sarı, sular göy geyinmiş, demək,

Yarı göy, yarısı sarı bir ipək.
Çöldə çöl xalqına şeyda bülbüllər
Sazdan da incə, xoş bir şərqi söylər.
Hər arpa bir düyün vurmuş kəmərə,
Biçin salamı var əkinçilərə.
Qarnını böyüdür dağda ceyranlar,
Qurdlarsa dişini etmişdir mişar.
Budunu doldurmuş ətli marallar,
Çöldə dağ öküzü dağlara qalxar.
Yenicə doğan şux ceyranlar belə
Çölləri doldurmuş öz balasıyla.
Şah ovla, çalğıyla, qədəhlə yekdil
Yolları biçirdi hey mənzil-mənzil.
Ay yeni doğmuşdu gülpic şəklində.
Getdikcə xalxaltək olunca girdə,
Halqa pərgarından çıxdı İskəndər,
O yerə indi "Zər-xalxal" deyirlər.
Buludtək Gilana atıldı ordan,
Sanki bir meşəyə girdi bir aslan.
Önünə çıxarkən bir atəşkədə,
Ondan buz yaratdı atəşpərəstə[211].
Elə ki, hirbüdün qırdı belini,
Ortadan silindi Zərdüşt ayini.
Əzm etdi düşmənə yolu kəsməyə,
Gilandan birbaşa tərpəndi Reyə.
Hər atəşpərəstə verdi çox cəza,
Qalın tüstülərlə doldu göy, fəza.
Eşitdi: gəlmişdir o qızmış aslan,
Tülkütək oldu bir deşikdə pünhan.
Qaçaraq Xorasan səmtinə getdi,
Rey padşahının gözündən itdi.
Padişah eşitdi: o azğın düşman
Aslandan qorxaraq qaçmış meydandan.
At saldı, düşmənin ardınca getdi,
Yolunu bağladı, tez basqın etdi.
Üstünü alaraq, kin boğa-boğa
Başını bir anda saldı torpağa.





Elə ki, düşməni torpağa atdı,
Qaçqınlar içində qorxu yaratdı.
Düşmənin başını saldığı yerdə
Bir təpə vardı o yaşıl çöllərdə.
Müzəffər və sağlam dövlət adına
Təpənin başında saldı bir bina.
Qızıldan vurdurdu şux bəzəkləri,
Ona pəhləvicə ad qoydu "Həri".
Binanın işləri bitdikdən sonra
Ordunu yeritdi şah Nişabura.
Gördü ki, ikilik çıxmış meydana:
Şəhərin yarısı dost idi ona,
Yarısı Daraya təbil vururdu,
Dostluqdan açıqca boyun bururdu.
Bir bayraq var idi Daradan nişan,
Sanırlar Daradır altında duran.
Bu uca bayrağı "namusdur" deyə,
Daranın adından ucaltmış göyə.
Nə qədər kin ilə coşdu İskəndər,
Daranın eşqindən əl çəkmədilər.
Bu kinə tapmışdı yalnız bir çara:
Köməklik göstərsin doğru dostlara.
Ordundan sınaqlı, igid kəslər də
Bir bayraq dikəltsin bu kinli yerdə.
Padşahın məqsədi bu idi ancaq,
Kin ilə çarpışsın bu iki bayraq.
Bilirdi, Daranı sevir bu şəhər,
Bu yolda çalışmaq verməz bir səmər.
Bu nifaq, düşmənlik sürəcək həşrə.
Səmimi bir dostluq girməz o şəhrə.
Torpağa girmişsə o qatı düşman,
Hələ kin sönməmiş kinli torpaqdan.
Kəkliyi saldırdı qırqovullara,
Mərvə tərpənərək düşdü yollara.
Söndü əmri ilə hər atəşkədə,
Yaxdı pərvanəni qızğın atəşdə.
Bəlxə yetişərkən, Zərdüştü odu

Qılınclar zərbindən dönüb su oldu.
Orada bir bahar vardı qəlb açan,
Güllərin dimağı acıydı ondan[212].
İçində qədərsiz gözəl, şux dilbər,
Çiçəkli bahartək sənəmxanələr.
Saysızdı xəzinə bu şən ocaqda,
Zəhmətsiz qoyulmuş hər bir bucaqda.
Qızıldan nal vurmuş möbidin atı,
"Azərgüşəsb" idi o yerin adı.
Elə ki, əl tapdı ora hökmüran,
Müğləri məst gördü müğlər camından.
Hurini cənnətdən atdı dişarı,
Qovdu cəhənnəmə dost olanları[213].
Köhnə xəzinəyə olunca məhrəm,
Ondan çox sinəyə parladı mərhəm.
Xorasan səmtinə etdi hərəkət,
Qaldı hər şəhərdə bir neçə müddət.
Xorasan beynindən çıxardı duman,
Onlara çox cəza verdi hökmüran.
Hər səmtə axırdı müzəffər ordu,
Ona gənc taleyi kömək olurdu.
Kirmanı, Qəzneyni, Quru cahangir
Atların nalıyla ölçürdü bir-bir.
Hər hansı şəhərə gəlsə tacidar,
Qapısı üzünə dərhal açılar.
Ölkələr dolaşmaq olsa da çətin,
Yollarda sayı yox xəzinələrin.
İskəndər hər yerə bassaydı ayaq,
Xəzinə yüküylə ağırlaşaraq,
Yeri doldurarkən xəzinə, sərvət,
Torpağa basdırıb, etdi hərəkət.
Qızıl ki, insanı edəcək qorxaq,
Ya atəş udsun, ya bu qara torpaq.
Qızılı torpağa gömən hər qafil
Ağzına dəmirdən vurur bir qıfıl.
Madam ki, torpağı sovurur külək,
Ona bir dəmirdən qıfıl nə gərək?





# İSKƏNDƏRİN HİNDİSTANA GETMƏSİ

Saqi, ver ərinmiş o saf qızıldan,
Qırmızı kükürdü odur doğuran[214].
Mənə ver, dərmantək tutiya edim,
Misimi onunla kimiya edim[215].
Həvəslə sür atı, xoşdur bu çöllər,
Cilovu çəkmə ki, atındır dilbər.
Gözəl bir ad ilə çirkin dünyadan
Köçərək tut cənnət bağında məkan.
Bağlanma torpağa, gəl həzər eylə,
Qarunu udmuş öz xəzinəsiylə.
Dincliktdir qurtuluş, gəl, olma sərkəş.
Dağıntı olmaqla yığcamdır günəş.
Qorxulu, zəhmətli olduqca yollar
Ticarət əhlinin qazancı artar.
Yollar quldurlardan olsa salamət
Bazar əsnafına olmaz mənfəət.
Qaydadır, hər yerdə xəzinə vardır,
Yolunda qorxunc bir əjdaha yatır.
Sözə yağ, bal qatan o dehqan yenə
Belə yağ, bal qatır işin məğzinə:
Padişah Qəzneyndən Bəlxə aşınca,
O acı dənizdən uzaqlaşınca,
O qədər sərvərlər ona baş vurdu,
Hindistan səfəri qarşıda durdu.
Ağıllı kəslərlə etdi məsləhət:
"Bax, ayaqlarımdan öpür bu dövlət,
İranın torpağı ovcum içində,
Atımı çevirmək istərəm Hində.
Öncə Keyd üstünə ordu tökərəm,
Kin ilə hiylədən mən əl çəkərəm.
Başqa kəslər kimi baş əysə mənə,
Köməkdən başqa şey etmərəm ona.
Mənimlə başlasa qızğın savaşı,
Qılıncımla düşər o şəxsin başı.
Bu yandan o yana çevirrəm, bir də

Çökdürrəm onu mən bildiyim yerdə.
Ordumu çəkərəm uzaq səfərə,
Bir qılınc vuraram Fovrə bir kərə.
Qaparam tacını, mal olar yurdu.
Çin, Xəta üstünə çəkərəm ordu.
Oradan gedərəm Təraza, Çaça,
Dünyanı gəzərəm at çapa-çapa."
İgidlər, sərdarlar hamı yer-yerdən
Çox məmnun qaldılar bu xoş xəbərdən.
Ulduzu ona yar olduğu gündə,
Dövləti kamala dolduğu gündə[216],
İskəndər başını göylərə vurdu,
Parlayan günəştək tərpəndi ordu.
Qəzneyndən atıldı tez Hindistana,
Yollar şövkətindən döndü bostana.
İstədi başlarda yaxsın tüstünü,
Durmadan alsın tez Keydin üstünü.
Buludtək oynadı talan fikrilə,
Mülkünü qılıncla keçirsin ələ.
Görmədən ağıllı kəslər məsləhət
Etmədi azğınlar kimi hərəkət.
Yelayaq qasidlə o gün İskəndər
O Keydə göndərdi belə bir xəbər:
"Çarpışmaq istərsən, durma, ordu çək!
Ha, indi yetişdim qara buludtək.
Baş əyib əmrə bel bağlamış olsan,
Qurtuldun, demək, bu kəskin qılıncdan.
Yuxudan o zaman nərgiz oyanar,
Üstündə yağmurlu bir bulud oynar.
Günəşin dimağı olduqca azər,
Bağları, daşları çiçəklə bəzər.
Dəhşətlə kükrəsəm inlər bu dünya,
Tərpənsəm, yerindən oynar dağ, qaya.
Alçaqda atarmı ovçu bir şahin,
Altına coşqun sel, ya ki, su keçsin?
Bir tükün kinlə baş qaldırsa orda,
Yüz başı bir tükdən asaram burda.
Dağ-daşın qılınctək olsa da kəskin





Qılıncım köhülə çevirər, çəkin.
Qızılçın gəlmədim hind ölkəsinə,
Məğribdə azmıdır gövhər, xəzinə?
Gözəllər ardınca çapmaq nahaqdır,
Xarəzmin günəşi daha parlaqdır.
Əldə Hind qılıncı gəldim "Hind" deyə,
Sərxoş fil ətindən kabab yeməyə.
Yemə Hind xəracı məni anmadan,
Ürəyim hindli bir poladdır, inan!
Başını sevirsən, gəl mənə ver bac,
İskəndər yoxsa nə baş qoyar, nə tac!"
Keyd ilə gəlincə qasid üz-üzə
Tor kimi sözünü caladı sözə.
Ona çox kəsərli sözlər söylədi,
Hər sözü tutuşan bir atəş idi.
O kəskin sözləri Keyd eşidincə,
Qorunmaq fikrilə çəkindi öncə.
O gecə görmüşdü qarışıq yuxu,
Yozmaqdan canına düşmüşdü qorxu.
Bilirdi: İskəndər olmuş cahangir,
Fələkdir hər işdə onunla əlbir.
Düşmənlik neylədi, bax, o Daraya,
Nə etdi Həbəşə, Rey, Buxaraya.
Məsləhət görmədi üz çevirməyi,
Onun meydanına kinlə girməyi.
Bilmədi, üstünə gəlmişkən düşman,
O necə qurtulsun bu vuruşmadan?
Qorxudan başladı rica etməyə,,
Şahı çox yad etdi "afərin" deyə:
"Bilirəm: zəkidir, həm də çox ayıq,
Tək ona yaraşır bu cahandarlıq.
Taxtının rütbəsi alçaldır ayı,
Böyüklük haqqıdır, yox onun tayı.
Hörmətdən başqa mən nə etdim ona?
Nə üçün çağırır məni meydana?
Xəzinə istərsə, hamısı qurban,
Əmr etsə, ataram tacı başımdan.
Canıma qəsd etsə, xoşdur, nə deyim,

Dişimlə edərəm hüzura təqdim.
Yoldan da bir bəndə göndərsə mana,
Taxtımı, tacımı tapşırram ona.
Kiçiklik həddini əsla keçmərəm,
İskəndər ağadır, mən bir nökərəm.
O mənə naz etsə yalvararam mən,
Narazı qalmasın öz bəndəsindən.
Mənimlə döyüşü o lazım görsə,
Atını kin ilə üstümə sürsə,
Axaram o coşğun Nil ayağına,
Ataram canımı fil ayağına.
Başımı qaçırsam kinli döyüşdən
Qırılar inadı, əzmi bu işdən.
Məqsədi mülkümdən salmaqsa itkin,
Minnətlə razıyam, nə gərək bu kin?
Kükrəyib qoşunla çıxsa qarşıya,
Qaçaram, dar deyil başıma dünya.
Əvvəldən mənimlə bağlasa peyman,
Söz versə, sözündə dursa hər zaman,
Talandan əl çəksə, dost olsa mana,
Qapımdan kinini atsa bir yana,
Verərəm dörd şey ki, beşincisi yox,
İşığı, dəyəri ulduzdan da çox.
Birinci, qızımı göndərrəm şaha,
Nə qız, bir günəşdir, aydır dərgaha.
İkinci, yaqutdan bir camdır, qış-yaz
İçdikcə o camdan şərab azalmaz.
Üçüncü, filosof, gizlini görən,
Göylərin sirrini bilən, göstərən.
Dördüncü, təbibdir, hər dərdi bilir,
Ondan hər xəstəyə bir şəfa gəlir.
Hədiyyə verərəm edərsə qəbul,
Təşəkkür edərək deyərəm: sağ ol!"
Elçi baş əyərək dedi: "Bu şeylər
Hədiyyə gedərsə, böyük İskəndər
Mülkündə başını göyə ucaldar,
Qohum olduğundan hörmətin tutar.
Adını adlılar içində çəkər,





Hər bir istəyinə rəğbət göstərər."
Hind şahı gördü var ağlı, anlağı,
Möhkəmdir, büdrəyən deyil ayağı.
Söylənən sözləri - şərti tutaraq,
Sözə bir qədər də yağ, bal qataraq,
Bir qoca hindlini bu işə görə
Elçiylə göndərdi uca hüzurə.
Şahın dərgahına gələrək onlar
Oldular bağçada gül saçan bahar.
Görüncə hindli o sərapərdəni,
Ayparası aydan uca xeyməni,
Torpağa baş vurub içəri girdi,
Əvvəlcə salamı şaha yetirdi.
Rüsumat bitincə o hindu birdən
Söz açdı qəbulə keçən şeylərdən.
Dörd şeydən danışıb söylədi: "Ey şah!
Heç kəsdə tapılmaz belə bir dəsgah".
Bu istək coşdurdu onun qəlbini,
Göz görmək istədi eşitdiyini.
Töhfəni tez ələ almaq fikriylə
Bir an da olsa səbr etmədi belə.
Şirindil hindliylə uca hökmüran
Söylənən şərtlərlə bağladı peyman.
Bəlinas və başqa kəslərlə yenə
Göndərdi örtülü, ağır xəzinə.
Göndərdi alması mum edən məktub,
Bütün Hindistanı ram edən məktub.
Yazıldı Keydə bu bir hökmürandan,
Qızğın əjdahaya müdhiş aslandan.
Bu məktub hər katib işinə yarar,
İçində nə qədər gözəlliklər var.
Ürək qızğınlığı üz verdi şaha,
Dostluq şərtlərini artırdı daha.
Qələmi o katib alınca ələ,
Məktubu yoğurdu müşkü ənbərlə.
Bəlinas, bir neçə rumlu birlikdə,
Məktubu aldılar hind şahı Keydə.
Bəlinas at çapdı bir an durmadan.

Hind qərargahına çatdığı zaman
Keydin saf qəlbini şən, parlaq gördü,
Hindu hiyləsindən çox uzaq gördü.
Baş əydi, çünki o, bir tacidardır,
Hörmətli taxtı, həm qurşağı vardır.
İrəli gedərək öpdü naməni,
Hinduyə tapşırdı o xəzinəni.
Məktubu o katib oxudu əzbər,
Qorxudan yerlərə əyildi göylər.

## İSKƏNDƏRİN HİNDLİ KEYDƏ MƏKTUBU

İskəndər məktubu yazmışdı belə,
Daşı mum edirdi şəfəqqətilə.
Ay, günəş yaradan adından sonra,
Düşüncə və ağlın yolu yox ora,
Odur hökmüranlıq və hökm verən,
Bütün peyğəmbərə vəhy göndərən.
Laciverd göylərin altından sonra
Salamlar söylərəm namdarlara!
Məktubda yazmış: "Ey böyük pəhləvan,
Taleyin gənc olsun, güclənsin arxan!
Fikrim və iradəm bu idi ancaq,
Fil ilə, toppuzla möhkəm çarpışmaq.
Bir qüvvət göstərim titrəsin cavan,
Dağlar parçalansın bu toppuzumdan.
Bu Hində elə bir od vurum, ondan
Qalmasın bir nəfər boyun ucaldan.
Uca fil başına kəmənd atım mən,
Qandan bixi-ruyən çıxarım nildən[217].
Hindin torpağını qana bələyim,
Suların başına torpaq ələyim.
Sülh üçün tələşı görüncə səndə,
Bu işdən cilovu çəkmədim mən də.
Can verən bu dadlı sözlərinlə mən
Qul oldum sənə bir tacidar ikən,
Möhkəm bir kirişlə bağlandı könlüm,





Öz cadu dilində vurdun bir düyün.
Elə bir iş et ki, bu közəl peyman
Nəslimiz içində qalsın hər zaman.
Dörd adlı gövhəri göndərsən mənə,
Mən dəxi belə söz verirəm sənə:
Bir ordu kəsilsə bu yeddi kişvər,
Mülkünə bir tükcə yetişməz zərər.
Hər yaxşı, yamanda kömək verərəm,
Bu dediklərimdə duraram möhkəm."
Qasid bu məktubu oxudu Keydə,
Yetirdi salamı, baş vurdu bir də.
Bu sevimli sözlər bir füsun saçdı,
Üzünə sehirli qapılar açdı.
Hiyləgər cadunun etdiyi əfsun
Etdi cadugəri özünə məftun.
"Bilirəm ki, Hinddə çoxdur cadugər,
Bilməzdim var Hində cadu edənlər."
Bir qədər danışdı durduğu yerdə,
Verilən töhfəni tapşırdı Keydə.
Yerindən oynadı Keydin ürəyi,
Qaynadı padşaha qarşı bir sevgi.
Söylədi: "Afərin sənə, hökmüran,
Bu dünya padşahsız qalmasın bir an!"
Bilikli elçiyə göstərdi hörmət,
Aldı hazırlığa bir həftə möhlət.
Elə ki, bir həftə keçdi vədədən,
Hazırlıq işləri başa gəlirkən,
Padşahın əmrinə edərək səcdə,
Şeyləri hörmətlə verdi qasidə.
Qoşdu dörd peykərə hər çeşid zivər,
Göndərdi dəyərli, sevimli şeylər.
Cavahir, ləl, inci, yaqut, xəzinə,
Fillərin üstündə ağır gəncinə.
Saysız Hind poladı, bağlanmış yüklər,
Xalvarla tökülmüş ud ilə ənbər.
Yürüyən dağ kimi sarsılmaz qırx fil,
Göbəyinə çatmaz coşqun, dərin Nil
Üç ağ fil göndərdi qızıl taxtına,

Bir qaranlıq çökdü düşmən baxtına.
Bəlinasa bəxşiş verdi hökmüran,
Həm bişkin müşkdən, həm də xam uddan.
Pəriduxt uddan bir taxta oturdu,
Göylərin beşiyi ona baş vurdu.
Qoşdu çox xəzinə pərisurətə,
Hər biri mal olmuş min bir zəhmətə.
Götürdü Bəlinas o zər-zivəri,
Bir kişvər xəracı onun hər biri.
Tapşırdı şövkətli İskəndərinə,
Dövləti haqq belə ucaltdı yenə.
Görüncə dəyərli o xəzinəni,
Tanrının verdiyi dörd hədiyyəni,
O qədər şənlətdi bu İskəndəri,
Unutdu Rumdakı xəzinələri.
Şah o dörd peykərə bir sınaq saldı,
Görüncə doğrudur, çox məmnun qaldı.
Elə ki, parlaq cam su ilə doldu,
Onun şərbətindən xalq məmnun oldu.
Filosofla söhbət etdiyi zaman
Hikmətlər öyrəndi köhnə dünyadan.
Rəf oldu, o təbib salınca nəfəs
Bədəndən xəstəlik, ürəkdən həvəs.
Örtülü sərvətə növbət gəlincə,
Hinddə Çin çinisi göründü incə[218].
Gözəllik ölçüsü tutan kəslərin
Tutduğu ölçüdən daha nazənin.
Gördü toz görməmiş təzə bir çiçək,
Bahardır, dəyməmiş soyuq bir külək.
Büt kimi bəzənmiş incə bir dilbər,
Hindu bütü kimi pəriyə bənzər.
Baş yumru, qaş geniş, ağız dar - göyçək,
Yaşıl bir budaqda üzü al çiçək,
Şəkərdən çox dadlı təzə bir qönçə,
Çiçəkdən həm lətif, həm daha incə.
Saçları tor kimi, hər tərəf çin-çin,
Çin-çin tellərinə quldur bütün Çin.
Qara müşk bəsləyən ceyrandı Çində,





Qərənfil yemişdi doğarkən Hinddə.
Saç deyil, müşkdən hörülmüş zəncir,
Günəşdən sallanmış bulud kimidir.
O müşkin buluddan al gül saçaraq,
"Sünbülə" bürcündən asmışdı başaq.
Sevimli, buğdayı rəngi, şux, dilbər,
Qara, müşkin xalı bir arpa qədər.
Baş vermiş arpadır müşkin buğdadan,
Deyil buğda deyə, boz arpa satan[219].
Türk simalı idi o hindli afət,
Şaha Hind elindən vermişdi cənnət[220].
Yox, hindu deyildi o türk dilbəri,
Hindutək çalırdı bu könülləri.
O Rumi üzüylə, hindu diliylə
Etmiş Rum şahını özünə kölə[221].
Bir şəkərxəndə, bir dümdüz neyşəkər,
Sevimli, ən incə qönçə bir dilbər.
Olduqca gözəl, həm nazlı bir pəri.
Həm sudur, həm oddur parlaq gövhəri.
Onundu bu gəlin, bu dilbər qönçə
Qarşıya çıxdı şah onu görüncə.
İshaqın rəsmində böyük hökmüran
Ki, ağlın gözünə ondadır dərman,
Əqd etdi, başladı qızın toyuna,
Sonra qolun saldı onun boynuna.
Töhfələr sazladı hindu şahına,
Bir büsat başladı başlıq adına.
Verdi top-top ipək, xalvarla gövhər,
Qumaşdan bir çadır, qızıl taxt-zivər,
Zümrüd cam, əqiqdən gözəl bir sını,
Yaquta qərq etmiş hər birisini.
Yaqutdan, ləldən düzülmüş bir tac,
Polad nallı atlar - görməmiş qırmanc.
Qulağı halqalı qullar və dilbər,
Zərxara geyinmiş rumlu kənizlər.
İnsanın ağlına gələndən artıq
Göndərdi Keyd üçün qatarla sandıq.
Cahandar İskəndər kamına yetdi,

Ayüzlü gəlinin toyunu etdi.
İncəlik o qızda olmuşdur tamam,
Əndamı bir parça soyulmuş badam.
Lətif paludəyə barmaq vurunca
Barmağı bulaşdı ona boyunca.
Yonulmamış bir dürr, açmamış bir gül,
Humay da o gülə vurğun bir bülbül.
Yontuldu bu inci, açıldı qönçə,
Pərdəli sözə bax, nə qədər incə.
İskəndər istəklə olunca dəmsaz
Dövlət işlərindən dincəldi bir az.
İstəxrə sınanmış qasid göndərdi,
Dövlət işlərindən məlumat verdi.
Yazdırdı qəlbinə yatan sözlərdən,
O müşkin ölkədə şanlı zəfərdən:
"Hindistan səfərim olmuşdur belə,
Necə ki, dost istər, baş tutdu elə.
Keydə kin etməyə verrmədim qərar,
Dost oldu, dost kimi elədim rəftar.
"Qənvuc"a gedirəm "Fur" üstə ələn,
Bu yolda köməkdir ulu yaradan.
Görüm orda nələr qarşıma çıxar,
Bəlkə də iş bitər, mən deyən olar.
Yunan dənizindən, Çin dənizindən
Tutaraq, hər yerdə nayibim sənsən.
Durma, yay dünyaya səadət səsi,
Hər kəsə ver bizdən şənlik müjdəsi.
Əskərlər, qocalar, pirlər, cavanlar -
Nə qədər ölkəmdə var yaşayanlar,
Hamını sevindir, bizdən ver xəbər,
Xeyir ver, bilik ver, ədalət göstər".
Belə məktub yazdı bütün kişvərə,
Qasidlə göndərdi bütün ellərə.
Səfər tədarükü gördü gəlinə,
Hörmətlə göndərdi Yunan elinə.
Ona qoşun verdi inanmışlardan,
Yanına qoşdu şah böyük bir karvan.
O zinətli taxtın yanınca yenə





Göndərdi Yunana ağır xəzinə.
Torpağa gömüldü yerində qalan,
O yerə qoydu bir bələdçi, nişan.
Ağıllı vəzirə bir məktub yazdı,
Ədalət işindən heç ayrılmazdı.
Bildirdi ona hər yaxşı, yamandan,
Dostlara üz verən bəxtiyar andan.
İskəndər azacıq dincəlib durdu,
Furun torpağında xeymənı qurdu.
Şahların rəsmini tutdu həvəslə,
Hindistan mülkünü doldurdu səslə.
Başladı bəxşişlər verməyə hər gün,
Dünyaya bununla olmuşdu üstün.
Badələr qaldırdı Keyin adına,
İndi badə qalxır onun yadına.

## İSKƏNDƏRİN HİNDİSTANDAN ÇİNƏ GETMƏSİ

Saqi, ver mənə o qırmızı sudan
Ki, ondan qocalar gəncləşir hər an.
Ver, ondan parlasın gənclik ulduzu,
Bu sarı gülləri edim qırmızı.
Ox, yenə üz verdi şənlik, səadət,
Çalğıçı çalğıya göstərdi rəğbət.
Yazılan şerdən xəbər tutdu yar,
Şairin ölməyən ümidləri var.
Ey tarix söyləyən, dimağı parlaq!
Bu incə şerimi, durma, aydınlat!
Söylə, döyüşlərdə böyük İskəndər
Furların başına gətirdi nələr?
Məqsədə uyğun nəql edən əhli-hal,
Pərdədən göstərir belə bir xəyal:
Keyd ilə girincə sülhə hökmüdar,
Gah gülgün mey içər, gah edər şikar.
Furu talan üçün göndərdi ordu,
Bəxtiyar ömrünə son zərbə vurdu.
Qılıncı çəkincə qından tacidar,

Düşmənin kəlləsi oldu tar-mar.
Mülkünü büsbütün eylədi tarac,
Qoydu qılıncından başına bir tac.
Düşməni düşüncə qədəmlərinə
Ölkəni tapşırdı başqa birinə.
Oradan tərpəndi, ucaldı bayraq,
Atlara etmədi saziş bu torpaq.
Üç şey üç ölkədə fəlakət alır,
Hər üçü məhv olur, ömrü azalır:
İranda fil, Çində pişik, Hinddə at
Məhv olur, açmayır əsla qol-qanad.
İskəndər gördü ki, o abü hava
Yelayaq atlara etməyir vəfa.
Tibetə tərpəndi tez Hindistandan,
Oradan tez Çinə keçdi hökmüran.
Tibetin dağına çatınca ordu
Səbəbsiz sürəkli qəhqəhə vurdu.
"Belə qəhqəhəyə, - sordu, - səbəb nə?
Burda insan ancaq ağlar özünə."
Dedilər: "Zəfəran rəngli bu torpaq
İnsanı səbəbsiz güldürür ancaq."
Padşaha maraqlı göründü bu iş,
Neçin bu qəhqəhə, neçin bu rəviş?
Dənizi, qurunu, çətin çölləri
Keçərkən hey mənzil-mənzil irəli,
Yolu ov qanından qupquru gördü,
Çölləri müşk ilə dopdolu gördü.
Ceyranı görüncə çöldə nafədar,
Əmr etdi gözəl bir ceyran vurdular.
Hər yerdən sel kimi ordu axardı,
Çöllərdən xalvarla nafə yığardı.
Çin səhralarından keçdi bir zaman,
Abadlığa çatdı böyük hökmüran.
Bir çayır göründü cənnətdən də şən,
Başını behiştə dayamış gülşən.
Hər tərəf yamyaşıl, gözəl gülzardı,
Hər dörd-beş addımda çeşmə axardı.
Xoş iqlim, xoş hava, sıx, geniş orman,





Yamyaşıl, meyvəli ağacdı hər yan.
Saf çaylar, çeşmələr axır hər yerdə,
Gümüştək parıldar mavi peykər də.
Şeh düşmüş, ən lətif, ən təzə otlar
Bir düzüm incidir sanki parıldar.
Çeşmənin başında ceyran izi var,
Yamyaşıl çəmənlər müşk ilə dolar.
Maral dırnağını çəmənə çalmış,
Yaşıllıq üstünə müşkin xət salmış.
Tapılmaz boz bir yer, hər tərəf otlaq,
Varsa da boz təpə - daşlıqdır ancaq.
İskəndər görüncə o gözəl yeri,
Hindistan şövqündən çəkildi geri.
Atları, əmr etdi uca tacidar,
O sulu otlağa boş buraxdılar.
Bir həftə şən həyat sürdü vüqarla,
O yerdə dincəldi pəhləvanlarla.
O biri həftədə gözəl gün seçdi,
Elə ki, uğurlu gün ələ keçdi,
Köç təbli çaldırdı uca tacidar,
O yerdən sürətlə Çinə çapdılar.
Təbilçi dolduqca acığa, qəhrə,
Təbildən qopurdu bağırtı, nərə.
Çinin al güzgüsü şəfəq saçarkən,
Ordunu Çin səmtə çəkdi hökmüran.
O polad və zireh geyimli ordu -
Hər biri yelqanad ata oturdu.
Hava saf, gözəldir, yollar tikansız,
Varsa da tikanlar, ballı, ziyansız,
Dağların, çöllərin dadlı otundan
Şəkərli süd əmər hər körpə ceyran.
Ovlaqdan keçərkən şanlı İskəndər
Tozundan çöllərə yayıldı ənbər.
Şahın damğasını daşıyan ceyran
Göbək salmış müşkin ağırlığından.
Oxundan torpağa üz qoyan ceyran
Gözündə tiryəktək görünür cahan[222].
Kükrəyən aslandı ulu cahandar,

Sıçrayan qaplandı altında şikar.
O qədər ov etdi rumlu İskəndər,
Ceyrandan, maraldan boşaldı çöllər.
Atlar dırnağından ipək çöl, çəmən
"Ceyrangöz" olmuşdu ceyran gözündən [223].
Qabırğa deşən ox çəkirdi nərə,
Ceyran da, müşk də düşürdü yerə.
Başdan dırnağadək hər maral, ceyran
Mədənə dönmüşdü qızıl oxlardan.
Padşahın kamanı pusquda durur,
Hər oxa bir maral, bir ceyran vurur.
Oxların etdiyi incə nəqqaşlıq,
Çöllərin rəngini silmişdi artıq.
Ovlaqda ona ov oldu əyləncə,
Vaxtını keçirdi bir gün, bir gecə.
Dünyanın gəlini, dilbər gözəli,
Hasara düşüncə göylər gözəli,
Eşqindən gecə bir hindu qadıntək,
Sehr etdi fəzaya, saçdı min bəzək.
Öz köhlən atından İskəndər endi,
Ordu da onunla bərabər endi.
Rahatlıq etməyə qərar verdilər,
Quş da tərpənmədi səhərə qədər.
Sübhün gözəli zər xalxalı ilə
Göyün xeyməsinə saçarkən şölə[224],
Dünya hindu kimi tüstü yayardı,
Yəğma və Xülləxtək cahan ağardı.
Gurultu qopunca şahın təblindən,
Yəğmaya, Xülləxə yayıldı şivən.
Dünyanı dolaşmaq fikri daşıyan
İskəndər qoşuna verdi bir fərman:
Qoşunu bu yerdə düşərgə salsın,
Bir ayı başa-baş dincini alsın.
Tövlədən, axurdan doldu hər tərəf,
Yaşıl çəmənlərdə biçildi ələf.
Xaqana dedilər: bezdi çöl, orman
Zirehli atların polad nalından.
İrandan kükrəyib axan bu selin





Əlindən qurtular nə xaqan, nə Çin.
Bu bir seldir, tutar bütün dünyanı,
Kölgədə buraxar keçmiş tufanı.
Yağmuru xərabə edər hər yeri,
Dənizdə məhv edər zor nəhəngləri.
Qara əjdahadır, kükrəmiş Rumdan,
Ölkələr görməmiş bir belə aslan.
Həbəşin üzünə o damğa vurdu,
Zənci qara geydi, bir matəm qurdu,
Daranı büsbütün etmişdir tarac,
Hindin şahlarından qapmış qızıl tac.
Furların talanı bitincə, demək,
Məqsədi Fəğfuru yəğma eyləmək.
Yerindən qoparsa bu coşqun dəniz,
Dağlar da kökündən uçar tərtəmiz.
Qorxudan tez məclis çağırdı xaqan,
Qorxmaqla haqlıydı elə aslandan.
Qan ilə yazdı hər hüduda bir xətt:
"Ölkəmiz qan ilə yoğruldu, dəhşət!"
Bir məclis bəzədi, gəldi qasidlər,
Göndərdi Xətadan Xütənə qədər
Fərğanə, Pəncabı qoruyan, güdən
Hüdudun sınanmış igidlərindən.
Xərxiz ilə Çaçdan, böyük Kaşğardan
Çağırdı hesabsız igid pəhləvan.
Hər yerdən toplanıb gəlincə ordu,
Xaqanın ürəyi sakitcə vurdu.
Yürüyən bir dağın üstünə mindi,
Bir polad dağ kimi yerdən tərpəndi.
Şaha iki mənzil qalırkən ordu
Tövlələr bağladı, çadırı qurdu.
Tez-tez o padşahdan tuturdu xəbər,
Ona nə yol ilə yetirsin zəfər,
Gizlicə arayıb tapdı xəfiyyə,
Düşmənin halını öyrənsin deyə,
Nəhayət, xəfiyyə gətirdi xəbər:
"Şanlı tacidardır rumlu İskəndər.
Səxada, kərəmdə qazanmış ad-san,

Gözəl bir məsləkdir, deyildir insan.
Şüurlu ağıllı və açıq gözlü,
Zəhmətdə sakitdir, xəlvətdə sözlü.
Hər zaman mətindir, yaşar vüqarla,
Kimsənin qanına susamaz əsla.
Ədl ondan bir fayda görər, şər - ziyan,
Xalq məmnun, tanrı da razıdır ondan.
Hamıya yaxşılıq istər, kin bilməz,
Kimsənin dərdinə sevinməz, gülməz.
Görmədim ona bir üstün pəhləvan,
Yoxdur pəncəsindən onun qurtulan.
Oxu məgər Arış oxluğundandır
Ki, daşlarda dərin yara ondandır.
Şimşəkdir, qılıncı alsa əlinə,
Ələ mey aldıqda, saçar xəzinə.
Ağıl ölçüsüylə hər şeyi ölçər,
Hikmət qayçısıyla hər işi biçər.
Saf, doğru olmayan sözə inanmaz,
Mətindir, verdiyi sözünü danmaz.
Hər işin üstünə düşsə, yaradır.
Məclisdə, şikarda o bambaşqadır.
Yalnız ov zamanı yox onda səbir,
Döyüşdə, vuruşda çox səbirlidir.
Vəhşəti dünyadan əqlilə qovmuş,
Özü də padşahlar nəslindən doğmuş.
İgidlər şahıdır, qızınca meydan,
Sərxoşkən ayıqdır çox ayıqlardan.
O işə girər ki, xəyaltək gəlir,
Məclisdə hənəyi çox ətirlidir.
Sözü az, özü çox səbirli, yumşaq,
Doğruluqda doğru, düzlükdə qovaq.
Minsə kin atına, qəhri guruldar,
Yendiyi düşmənə mərhəməti var.
Dalğalı tufandır sözdə dodağı,
Alimdən dərs alır məsləhət çağı.
Qocalar fikriylə girişir işə,
O ancaq gəncləri alır döyüşə.
Allaha sığınır o hər bir zaman,





Yaman gün görərmi tanrı tanıyan?
Sərvtək yəhərə qalxdığı zaman
Atından fillərin bağrı olar qan.
Qarşıya çıxarsa qocaman bir fil,
Sanki fil qətrədir, o daşqın bir Nil.
Azacıq haranlıq etsə at ona,
Qamçıyla batırar onu al qana.
Qıvrılmış ilantək sağ, sola qaçar,
Şölətək arxaya, önə od saçar.
Dünyanı sarsıdan padşahlar bütün
İgidlər gücüylə oldular üstün.
Orduda tək odur zor qılınc vuran,
Həm ordu qırandır, həm ordu quran.
Düşməndən nə qorxu, nə ürküsü var,
Tək əlsiz, ayaqsız kəslərdən qorxar.
Xeymədə büsatı çox geniş dilər,
O yalnız əyləncə zamanı gülər.
İstəməz baş əysin ona bir nəfər,
Baş əyən kimsəyə çox hörmət edər.
Bəxşişi xəzinə - budur həyatı,
Tövləylə bağışlar qatırı, atı.
Əl açan kəslərə kim gövhər verər,
Bu, gövhər yerinə bir kişvər verər.
Qəlbinə gətirsə nə kimi dilək,
Tezliklə göyərdir onu bu fələk."
Xaqan bu işlərdən tutunca xəbər,
Haq verən şövkətdən eylədi həzər.
Şah ilə sülh üçün qəlbi yumşaldı,
Uzaqdan-uzağa məhəbbət saldı.
Döyüşmək fikrindən daşındı artıq.
Yol axtarırdı ki, etsin barışıq.
Dünyanın şahına verdilər xəbər,
Çin, Xəta türkləri hərbə gəldilər.
Bir məsəl çəkdi şah ki: "Nəşəsi var,
Ayağıyla gəlsə tora xam şikar."
Mənimlə çarpışmaq istərsə əgər,
Namərdlik deyil bu, çox mərdlik edər.
Arızu yolları qısaldı sizə,

Uzun yol həm də çox azaldı bizə.
Onlara çin ilə çataram qaşı,
Çin üçün qan ağlar Çinin dağ-daşı.
Ağarırkən fəza, lacivərd göydən
Günəş İskəndərə salam verirkən,
Oturtdu katibi bir Ütaridtək,
Müştəriyə vursun Zöhrədən bəzək.
Bir məktub istədi olduqca parlaq,
Kamil bir ay kimi aydın, yuvarlaq:
Yazarkən ikiyə ayırdı sözü,
Ümid bir gözüydü, qorxu bir gözü.

## İSKƏNDƏRİN XAQANA MƏKTUBU

Qələmi alınca o qələmvuran,
İlk sözü başladı ulu tanrıdan.
Anıldı bu yeri, göyü yaradan:
Bir varlıq var olmaz onu anmadan.
Ondandır hər ümid, rahatlıq, kömək,
Arayan hər qəlbə ondandır dilək.
Ən çətin günlərdə odur əl tutan,
Tək odur qoruyan atəşdən, sudan.
Xəzinə göstərir bəxşiş zamanı,
Zəhmətdən qurtarır onun ehsanı.
Bu dünya əzəldən olmazdı çox şən,
Əmriylə oldu bir bəzəkli gülşən.
Hökmünə uyanlar ən şərəflidir,
Eşq olsun, kim ona afərin deyir.
Namənin başını o bitirirkən
Bir dastan bəzədi şahın dilindən:
"Bu məktub yenilməz İskəndər şahdan
İskəndər dostuna ki, odur xaqan.
Göylər tanrısının əmriylə müdam
Xaqana bizdən çox hörmət və salam.
Çox gözəl anlayır o himmətli zat,
Sizin bu ölkəyə sürərkən biz at,
İrandan hərb üçün gəlmədim, ancaq





Çinin xaqanına gəlmişəm qonaq.
Pərəstiş yoluyla etsin itaət,
Göstərsin qonağa lazımı hörmət.
Sizin bu şəhərdə uca günəş var,
Atını Məşriqdən Məğribə çapar.
O günəş, bax, mənəm, gəlib çatmışam,
Ordunu Məğribdən Şərqə atmışam.
Tutdum ağ, qaranı qılınc gücüylə,
İstəyən kimsəyə payladım belə.
Həbəş ölkəsindən atıldım Çinə[223],
At çapdım Məğribdən Məşriq zəminə.
İşıqlı günəşin batdığı yerdən
Günəş qaynağına at sürmüşəm mən.
Qara müşk ağacı əkmişəm Hinddə,
Fikrim ağ yasəmən tikməkdir Çində.
Sürdüyüm dövrandan var isə qorxun,
Əmrimin xəttindən qaçırma boyun,
Hökmümdən azacıq boyun qaçırsan,
Bərk qulaqburması verər bu dövran.
Aslanı o yerə gətirmə, saqın,
Şikara acıqla eyləsin axın.
Qaytar, qoyma girsin bostana aslan,
Fillərin yadına salma Hindistan.
Başına açar bir böyük fəlakət,
Sərxoşluq adına qurar bir işrət.
Gördünmü, qılıncım çarpışma günü
Etdi qan dənizi zənci çölünü?
Söndürdüm Darada olan qüruru,
Nə qədər kiçiltdim, bax, coşqun Furu.
Başqa padşahları taxtından saldım,
Başından bir anda tacını aldım.
Firidun hərbimə gəlirsə bu gün,
Əsirim olacaq, deyildir mümkün.
Atım hər ölkəyə çapdığı zaman,
Boşaltdım o evi azğın düşmandan.
Mənə bir azacıq yaxşılıq edən,
Dünyada yamanlıq görməmiş məndən.
Hər kəsə söz verdim, bağladım ilqar,

Sözümdən dönmədim, iqrarım - iqrar.
Hər əhdə, peymana söz verdi dilim,
Əhdimdən dönməyə varmadı əlim.
Məqsədim, Yəğmaya, Çinə çapmaqdan
Yəğma, Çin gözəli deyildir, inan.
Özümün qiymətli incilərim var,
Çinli qulamlarım, bir çox pərim var.
İrandan Çinə at sürmək bir kərə
Mənimçin göylərdən düşməkdir yerə.
Çin türkü, beynində nə varsa, burax,
Bu kəskin küləkdə yandırma çıraq.
Xəzinə və bəxşiş vermək yerinə
Neçin bu aslanla başladın kinə?
Neçin yol ağzına toplanmış ordun?
Yolumda İskəndər səddini qurdun?
Bizimlə döyüşə etdinsə niyyət,
Buxuru atəşə tökmüşsən əlbət.
Bəxtimi pişvaza gəldinsə, nədən
Önümdə baş əyib üzr istəmirsən?
Xəbər ver, hesabdan qalmayım geri,
Səbətdə ilandır, ya sümükləri?[226]
Ordu səbr etməkdən doymuşdur cana,
Mənim bu səbrimdən gəlmiş həyəcana.
Çinin ceyranını görmüş şirlərim,
Az görmüş belə kök ceyran əskərim.
Zəncirini qırmış qızmış aslanlar,
Susamışdır qana qoç pəhləvanlar.
Oxların dımdiyi oxluğu dəlir,
Döyüşmək eşqiylə həyəcana gəlir.
Nizənin yoldadır gözü, ey düşman,
Gürzüm yüz batmandır, səninki batman.
Əlinə yay alsa nişançı türklər
Atdığı hər oxla bir ordu yenər.
Ox atanlara da padişah olsan,
Kamanı tutanlar alacaq nişan.
Tüstümə düşərsə hər bir dudman,
Çin naxşı olsa da olacaq duman.





Alçaq bir insanam, sülh etməsən sən.
Su içmək qədər də səbr eyləsəm mən.
Nizəmdə məhv edər bu əjdahanı,
Necə od tufanı yeyər samanı.
Pəhləvan köksünə oxum yan alır,
Aslanlar böyrünü hey nişan alır.
Dənizin dibi də çarpışsa, bəzən
Qılınc toz qaldırar göyə dənizdən.
Qarşıma dağ çıxsa dayanmaz bir an,
Bir dağ dikəldərəm dəmir oxlardan.
Fil pəncə atarsa ayaqlaram mən,
Filgövdə padşaham - filləri yenən.
Ceyranı belindən, ovu budundan
Çeynəmək şir üçün olduqca asan.
Dənizlər laçını çıxsa şikara,
Quşlardan yem verər o, balıqlara.
Siz əlsiz, ayaqsız bir balıqsınız.
Ağzında əjdaha nəhəngəm yalnız.
İtlər ki, çox yaman sümük çeynəyir,
O xəncər dişiylə çörək də yeyir.
Qüvvətim hər yerə dirəmiş ayaq,
O yerdə zəfərdir mənə bir dayaq.
Kinlə qarşılaram kin yolu getsən,
Məhəbbət edərəm, məhəbbət etsən.
Cəvahir, ya nəhəng istəsən əgər,
Dənizim həm nəhəng, həm gövhər verər.
Görmədin, qılıncım başlarkən döyüş,
Nəhəngdir, üstünə gövhər tökülmüş?
Mənəm o xəzinə əjdaha peykər,
Camımda zəhər var, həm də pazəhər.
Məndə gövhər də var, əjdaha da var,
De, görüm, hankısı işinə yarar?
İpəyə tutaram, hüzura gəlsən,
Kəməndə salaram, inad eyləsən.
Səninlə həm yumşaq tərpəndim, həm sərt,
Hər iki sınaqla sınadım, əlbət.
Qapıma sülh ilə qədəm qoysan sən,
Günəştək çəkilib gedərəm Çindən.

Yoxsa ki, düşərəm bu kin izinə,
Çini tökdürərəm Çin dənizinə.
Məktubu oxuyub salma təxirə,
Barışıq, ya döyüş: göstər bir kərə.
Sel tökən buludlar cuşa gəlirkən,
Ayıq ol, dəhşətlə kükrəyən seldən."
Çağırdı dil bilən kamil bir insan,
Ömründə kimsədən qorxu duymayan.
Yazılan məktubu tapşırdı ona,
İskəndər möhrüylə verdi xaqana.
Elə ki, məktubu oxudu xaqan
Az qaldı yıxılsın uca taxtından.
Məktubdan qəlbinə düşdü həyəcan,
O həm zirək idi, həm zirək anan.
Bu iki xəyala sarıldı ancaq:
Sülh ilə yanaşmaq, yoxsa çarpışmaq?
Fikrə əzab verər ikilik hər an,
Yatağa baş qoyar çarə axtaran.

## XAQANIN İSKƏNDƏRƏ CAVABI

Ey saqi, gülabtək şərabı bir an
Üstümə sən mənim, qalxım yuxudan
Bu gülgün gülabdan ciyər su alır.
Hər bir başağrısı ondan azalır.
Keşikçi, qapını, durma, tez bağla!
Sonra get, sən də öz dərdinə ağla!
Qəlbimi sıxıntı, qəmdən et uzaq,
Məni öz düşüncə, dərdimə burax!
Kimsəylə danışmaq həvəsim yoxdur,
Özümlə etməli söhbətim çoxdur.
Uzaq bir ölkədən müştəri kimsə
Gövhər mədənini görməyə gəlsə,
Baxarsa Nizami xəzinəsinə,
Düşsə söz bəzminin şən nəşəsinə,
Söylə: "Ev sahibi evində yoxdur,
Olsa da, yadlara qarşı soyuqdur."
Yox, xəta söylədim, düşün, ey rəqib,





Qəribə düşmənlik olmazmı qərib?
Qapımı bağlama, get, açıq burax,
Uğurlu sayılmaz qapı bağlamaq.
Madam ki, söz mənə dəniz ad vermiş,
Qapımı dəniztək açın siz geniş.
Qapını aç, sula, durma bu yerdə,
Ay kimi çadır qur xərabələrdə.
Qoy gəlsin arayan kəslər, nəhayət,
Bu söz sultanını etsin ziyarət.
Üzümə sabah bir pərdə çəkirkən
Gilədən Gilana tələsərəm mən.
Müştərilər gəlir mənə hər yandan,
Məni görmək üçün tapmazlar imkan.
Rəssam fırçasından tək bir mənzərə
Çəkilmiş görərlər bəyaz dəftərə.
Sözümdən, bax, necə kənara çıxdım,
Hardaydım, gör, gəlib bir hara çıxdım?
Bu parlaq xəznənin baş surətgəri
Saçdı sərvətindən bu gövhərləri:
Əfrasiyab mülkünün varisi erkən
Başını günəştək ucaltdı Çindən[22].
Tutmuşdu xəbər ki, Rumdan bir müdhiş,
Kükrəyən əjdaha ölkəyə gəlmiş.
Məktubu oxuyub dalmışdı xaqan,
Dəhşətlər içində qalmışdı xaqan.
Təmiz bir düşüncə, sağlam fikirlə
İşin hikmətini keçirdi ələ.
Əvvəlcə istədi sülh üçün xaqan
Bir məktub göndərsin ona durmadan.
Əmr etdi: otursun o çinli katib,
Kağıza, qələmə versin bir tərtib.
Şahlara yaraşan bir qələm çalsın,
Hər sözə rütbəni nəzərə alsın.
Qələmin nafindən tökdü katiblər
Çinli ağ ipəyə müşk ilə ənbər.
Şux, bişmiş sözlər ki, qəlb alır hər an,
İnsanın beynində yer tutub qalan,
Ümidlər bəsləyən, qurtuluş verən,

Sülh ilə çırpınan, hiddət göstərən,
Çarpışmaq yolunu bağlayan əfsun,
Daşları yumşaldan sehirli oyun.
Tikici ox kimi dili bağlayan,
Həm kinə, həm sülhə bir qapı açan.
Naməyə oldu baş zinət, baş naxış
Bir ad ki, bu adlar ondan yaranmış.
Hamıya köməkdir kömək görmədən,
Özündən diridir dirilik verən.
Dünyanı yaradan o ulu qüdrət
Güc verər zəifə, göstərər şəfqət.
Göydəki işığa bayraq tikəndir,
O qara divlərə qələm çəkəndir.
Dolanan pərgara hərəkət verən,
Mərkəzi nöqtəyə sükunət verən,
Hər bir şey onunla etmədə zühur.
Hər şey ki, verilir, verəni odur.
Hər susan, söyləyən, ayıq, sərxoşdan
Sirrinə yol tapmaz onun bir insan.
İnsanlar acizdir bəndə olaraq,
İqtidar, böyüklük onundur ancaq.
Böyüklük o ulu tanrı ki, ondan
Vücuda gəlmişdir zəmin, asiman.
Söz açdı, padşahdan çox üzr istədi,
Tanrıdan ona yüz afərin dedi:
"Dünyada yaşayan tacidarlardan
Açarı tək sənə vermiş yaradan.
Dənizdən dənizə atıldın: sənin
İrana, Turana uzandı əlin.
Məğribdə döyüşdən-azad olaraq,
Məşriqin xəttinə qaldırdın bayraq.
Dünyanı büsbütün keçirdin ələ,
Ürəyin döyüşdən doymamış hələ.
Yolda əjdaha var, cilovu gəl çək,
Əfsanə uzundur, gecələr gödək.
İran, Rum padşahı İskəndər sənsən,
Mən də bu ölkədə fərman yeridən.
Mən kimi qulların varsa bir yığın,





Mən başqa bir şeyəm, olma çox qızğın.
Sən də, mən də torpaq, yerlər də torpaq,
İnsan torpaq qədər olmalı yumşaq.
Ağalıq torpağa girincədir şən.
Torpaqda seçilməz kimsə kimsədən.
Qətrəni dənizə atsalar əgər,
Başqa qətrələrdən kim onu seçər?
Bu daşlıq yerə ki, şah kölgə saldı,
Ölkəmin neməti artıq çoxaldı.
Verilən nemətin, haqqa inanan
Şükrünü artırsın gərək hər zaman.
Allah mənim üçün artırdı nemət,
Təşəkkür edirəm tanrıya əlbət.
Nə qədər canım var şükr edərəm hey,
Dünyada varmıdır bundan gözəl şey?
Eşitdim bir necə bilən kimsədən,
Ordunu hər yerə çəkmək istərkən,
Harda ki, bazar var, nemətlə dolu,
Göndərərsən ora bir neçə rumlu.
Ərzaqdan nə varsa, olub müştəri
Alsınlar qarşıya çıxan şeyləri.
Yandırıb quyuya tökürsən nemət,
Haqq verən nemətə etmirsən hörmət.
Şəhərdə bitincə bütün zəxirə[228],
Çapırsan əjdaha kimi o yerə.
Aclıqla ölkəyə sahib durursan,
Mum əriyən kimi qızarmış oddan.
Onunçün tərpəndim mən öz yerimdən.
Qıtlığı qaldırmış öz şəhərimdən.
Bu yerdə hiylə və füsun iş görməz,
Çin sizə zəxirə və ərzaq verməz.
Döyüşdən yaxşıdır barışıq, şəfqət,
Biri dərd gətirir, biri səadət.
Çinli tarlasını etmə tar-mar,
Sənin də tarlanı bir gün sel basar.
Qüvvətli olsan da, qəlbi yumşaq ol,
Şahlıqdan yaxşıdır tanrı qoyan yol.
Yaramaz heç zaman ağıllı insan

Özündən güclüyə oxusun meydan.
Dünyaya yarayan böyük ağılsan,
Hökmünə bağlıdır hər yaxşı, yaman.
Bir şəxsin olmasa şəxsə imdadı
Say vaxtı heç saya alınmaz adı.
Sənə məxsusdur bu padşahlıq, dövlət,
Sənədir tanrıdan fərman və şövkət.
Hər bir şey təməldən möhkəm qurulur,
Təməlsiz binalar çox tez də uçur.
Gümüşü zər etmək, əqiqi billur,
Meyvəni zorakı yetirmək olur.
Satıcı almanı evdə yetirir,
Odur ki, yeyərkən dadı itirir.
Ədl üçün yaratmış səni yaradan,
Zülüm baş verərmi adil padşahdan?
Dünyada zalıma eləmə kömək
Ki, bir gün bu işdən sorulur, bişəkk,
Pozsa öz rəyini rəyi xoş insan
Öz abad mülkünü etməzmi viran?
Təbii halından bu dönük dövran
İstiyə, soyuğa uyduğu zaman,
O isti, soyuqda arama səhhət,
Dəyişmiş ondakı sağlam təbiət.
İlin hər fəslinin var əlaməti,
Gərəkdir göstərsin o təbiəti.
Hər bahar göstərsin baharlığını.
Hər bir yay göstərsin öz varlığını.
Hər şey öz əlindən döndüyü zaman
Dönənlərə qarşı dönər bu dövran.
İskəndər insafla ad almış ərdir,
Yoxsa hər bir igid bir İskəndərdir.
Sanma ki, acizəm qızğın döyüşdə,
Dağdan toz qoparram bir tərpənişdə.
Fillərin belinə taxt qoysam əgər,
Hindistan mülkündən xəracım gələr.
Alaram altıma qızmış aslanı,
Belinə qoyaram hürgüc palanı.
Səninlə, dövlətlə, şövkətlə, əlbət,





Kin alışdırmağa etmədim niyyət.
Bu yerə onunçun açdınsa qanad,
Qarşında bəndətək əyilmiş qat-qat.
Başımı qanında sürtüm torpağa,
Tək mən yox, baş əyər Çində hər ağa.
Zehninə nə gəlsə, ona gedərəm,
Böyük bir minnətlə qəbul edərəm.
Bu işdə yox mənə əskiklik, töhmət,
Qonaqsan, qonağa vacibdir hörmət."
Qəlb açan cavabı qasidə verdi,
Məktubu durmadan şaha yetirdi.
Oxudu o qızmış aslan məktubu,
Maralın ovuna müntəzir durdu.
Çin şahı qorxurdu gecə basqından,
O gecə sübhədək yatmadı xaqan.
Günlərin birində parladı dünya,
Günəş nur saçarkən torpağa, suya,
Xaqan öz ağlının yoluyla getdi,
Sınanmış kəslərlə məsləhət etdi.
Bir vəziri vardı ağıllı, bilən,
Dünya nur alırdı tədbirlərindən.
Ortaya hər hesab atsaydı xaqan
Vəzir həll edərdi onu hər zaman.
Ondan öz fikrini sordu bu işdə,
Fikri sağlam idi hər bir gedişdə.
"Bu kinin önündə nə sayaq durum?
Çarxın qulağını mən necə burum?
Madam ki, qaşını çatmışdır bu Çin,
Nə atsın ilk zərim - məhəbbət, ya kin?
Çarpışsam, düşmənim güclüdür, əzər,
Başını Keyxosrov tacları bəzər.
Onunla keçinmək istərəm gerçək,
Xalq məni aciz bir xaqan biləcək.
Bilmirəm bu şahın nədir istəyi?
Ölkəyə gəlməkdən nədir diləyi?
Xaqana söylədi ağıllı vəzir:
"Çətindir göstərmək sənə bir tədbir.
Əzmin çox kəskindir, qorxuram, yəqin,

Əmrin də əzmintək olacaq kəskin.
Barına, orduna məğrur olaraq,
Yenilmək görünür sənə çox uzaq.
Belə bir şəhriyar gəlmiş qapına,
Dostluq qapısını bağlama ona.
Fəth etmiş, hər yerə basarkən ayaq,
Bu işə olarmı heç soyuq baxmaq?
Oyunmu sanırsan bunu, tacidar?
Bu işdə yararlı incə nöktə var.
Bu işlər tanrının işidir, bişəkk,
Düşməklik - tanrını sınamaq demək.
Günəşi qılıncla sarsıtmaq olmaz,
Qocaman Əlbürzü dağıtmaq olmaz.
Qəbul et, yoxsa bu qocaman fələk
Dövlət sahibinə ziyan verəcək.
Nə bəxti atmağa yarar, ey xaqan,
Nə də bəxtiyara kəsilmək düşman.
Xoşbəxtə taxılma, olsan da mətin,
Onunla çarpışmaq çətindir, çətin.
Bəxtiyar əzm etsə, başmağı cütlə,
Ən kəskin neştərə vurulmaz şillə.
Onunla birсə ay get keçin bir az,
Bu yerdə yad olan çox uzun qalmaz.
Şişəyə öncə sən vurma daş, kəsək,
Qırılsa çətindir onu düzəltmək.
Yaralar sağalıb taparsa səhhət,
Yaranın yeri tük çıxarmaz, əlbət.
Çalış ki, bu qara əjdaha bədən
Hörmətlə sovuşsun bizim ölkədən.
O gün daş atıldı Sinin tasına,
Gəldi bu əjdaha Çin qapısına.
Düşünmə, lacivərd boyalı paltar
Hər şəxsə göylərdən gəlir, ey salar![229]
Ahəngsiz səs ilə inləyir cahan,
Qüsur pərdədədir, suçsuzdur çalan.
Pərdəyə istəsən xoş ahəng vermək
Həmahəng pərdəyə get elə kömək."
Düşmənlik etməkdə Çin tərəfdarı,





Görmədi fələkdən kömək asarı.
Düşündü bu işə uyğun bir çara,
İtaət etməyi aldı qərara.
Əzm etdi sülh ilə yola gəlməyə,
Dərgaha üz qoysun "elçiyəm" deyə.
Nəzərdən keçirsin o cahandarı,
Başını dik tutan o başçıları.
Şahlıq şövkətini görərək bir bir,
Sonra da bu işə töksün bir tədbir.
Günəş qayıqçısı o gün səhərkən,
Qayığı salırkən suya sahildən,
Xütən şəhriyarı, Çin tacidarı
Tədbirlə geyindi elçi paltarı.
Aşina olmadan kimsə bu sirrə.
Çapdı İskəndərin düşdüyü yerə.
Şahın dərgahına gəldiyi zaman
Bu işdən tez xəbər tutdu hökmüran:
Hüzura bir elçi göndərmiş xaqan,
Görüşdə mübarək, sözdə pəhləvan.
Padişah əmr etdi: "Gəlsin hüzurə,
Buyursun elçilər oturan yerə."
Möhtəşəm elçi tez girdi dərgaha,
Pərəstiş yoluyla baş əydi şaha.
Əmr etdi, otursun aşağı yandan,
Xaqanın əmrini eyləsin bəyan.
Padşahın əmriylə elçi oturdu,
Oturdan kimsəyə bir də baş vurdu.
Bir zaman oturdu qırpmayaraq göz,
Yaxşıdan, yamandan açmadı bir söz.
Gördüyü büsata qalaraq məhbut,
Etdi o dövrədə nöqtətək sükut.
Elçiyə işarə etdi İskəndər:
"Xaqandan gətirdin, söylə, nə xəbər?"
Bulud arxasında gizlənən o ay
Qılınctək dil açdı, dür saçdı lay-lay:
"İran, Rum şahının bu gəlməsindən
Səadət taparaq, ölkə oldu şən.
Bu yerlər, ölkələr, Çindən Maçinə

Böyük tacidarın keçsin əmrinə.
Dünyada yaşasın uca dərgahı,
Olsun tacü taxtın böyük pənahı.
Gizli sözlərim var sənə, tacidar,
Qorxuram bu yerdə etməyə izhar.
Belə əmr etmişdir məni göndərən:
"Xəlvət et, olmasın eşidən, görən.
Qalmasın xaslardan gərək bir nəfər,
Bir sən ol o yerdə, bir də İskəndər.
Açıqda, gizlində qalsa bir kimsə,
Sirrimi açma sən, düşməsin səsə."
İskəndər çəkindi yersiz istəkdən,
Ehtiyat eylədi xəlvət etməkdən.
Əmr etdi durmadan böyük tacidar:
O sərvə vursunlar qızıldan cidar.
Qızıl bir kəmərlə çəkib qolunu,
Bir zəncir altına aldılar onu.
Çəkildi büsbütün saraydakılar,
Qapıya yönəldi xaslar, hər kim var.
İskəndər tək qaldı, çəkindi ancaq,
Yanına bir almas qılınc qoyaraq.
Söylədi: "Kimsə yox, bir mənəm, bir sən.
Durma, aç düyünü qapalı sözdən."
Padşahın əmrilə əsrarlı kişi
Düyünü qıraraq, anlatdı işi.
Əsrarın üzündən pərdəni açdı,
Duaya başladı, inci, dür saçdı:
"Necə ki, yaşıla bürünüb hər bağ.
Hər qızıl gül olur yanar bir çıraq.
Gül kimi parlasın üzün hər zaman,
Tək səndən yaşıllıq alsın bu cahan.
Qazılsın dünyanın möhrü adına.
Çatasan dövlətə, öz muradına.
Zənnimcə tanıyır məni şəhriyar,
Daha yalvarmağa nə ehtiyac var?
Sirrimdən əgər o tutmamış xəbər.
Bilirəm, İskəndər doğruluq sevər.
Sənə öz yanımdan elçi gəldim mən,





Əsirin olmuşam, əsir etmədən.
Mənəm Çin xaqanı, qoşun sərvəri.
Sənin xidmətində öpürəm yeri."
Pozuldu bu cəsur işdən tacidar.
Xoşuna gəlmədi belə bir rəftar.
Acıqlı bağırdı ona hökmüran:
"Seçilir qumaşın üzü astardan.
Tərlandan seçirəm aciz sərçəni,
Bağrından tanıram müşkü, nafəni.
Ancaq saxlayıram həya və hicab,
Örtülü kəslərdən açmaram niqab.
Anlat ki, nə məcbur eyləmiş səni,
Gizlində qalmadın, yırtdın pərdəni?
İndi Rum şahından heç qorxmayaraq,
Poladı mum kimi sandınmı yumşaq?
Sarsılmaz qolumdan qorxmadınmı sən?
Mənim tərəzimə torpaq tökürsən![230]
Gənc maral nə qədər olsa da cəsur,
Cilovu aslandan çəkməsi xoşdur.
Bir cavab olaraq söylədi xaqan:
Yüz min afərinə ey layiq olan,
Bilirəm amansız deyil padişah,
Dərgaha onunçun gətirdim pənah.
Başımı hansı düşmənim kəsər?
Dişini uzaqdan göstərsə qaban
Kin ilə döyüşər o qara aslan.
Dişini çıxarıb, əysə boynunu,
Aslan da toxunmaz, bağışlar onu.
Məndən ki, görməmiş sultan namərdlik,
O igid aslandan uzaqmı mərdlik?
Qarşına qılıncla gəldiyim zaman
Qorxardım səndəki kəskin qılıncdan.
Mən ki göstərmədim sənə xəyanət,
Daha üz verərmi mənə həqarət?
Ölkəmə at saldın, göstərdin şəfqət,
Sənə kin bəsləmək olur cinayət.
Qəlbimdə qalmadı kin, qərəz əsla,
Dərgaha gəlmişəm belə mənla,

Mən şəfqət göstərsəm, bağlamasam kin,
Kim kəsər başını şəfqət edənin?
Tutaq ki, günahım həddən artıqdır,
Qəriblik bir böyük üzürxahlıqdır.
İskəndər insaflı, mərhəmətlidir,
Suçsuza hər zaman şəfqət göstərir.
Kim ona sığınsa, qanından keçər.
Kim aman istəsə, görməz bir zərər.
Mən ki bu dərgaha öncə yönəldim,
Səndəki ədalət izilə gəldim.
Adildir cahangir, böyük İskəndər,
Ona hər bir zaman haqq yardım edər."
Yağlı bir dil ilə nöktələr saçdı,
Padşahın qəlbindən düyünü açdı.
İskəndər söylədi: "Xoş gəldin, şad ol,
Belə düşkünlükdən artıq azad ol!
Ancaq bu gəlişdən nə imiş fikrin,
Bu necə sirrdir, aydın göstərin?"
Sığınan dedi: "Ey dünyaya sığnaq.
Bu sirri yararmı səndən saxlamaq?
Bu uca dərgaha onunçun gəldim,
Fikrini, yolunu bilib öyrəndim.
Gəlməkdən məqsəd nə? Anladım bunu,
Nədir bu gəlişin əvvəli, sonu?
Əl tutsa mənə bu dönük ruzigar,
Padşahı kin ilə edim bəxtiyar.
Bu dilək əlimdən gəlməsə ancaq,
Dəstimdən çıxan ox düşərsə uzaq,
Məqsədim hörmətlə öpməkdən yeri.
İskəndər kinindən çəkilsin geri.
Mən əsirgəmədim canımı şaha,
Qılınca əl atmaq nə gərək daha.
Cəvahir əlinə gəlirsə asan,
Nə çıxar zəhmətlə daşı yonmaqdan?
Madam ki, sülh ilə göyərər dilək,
Döyüşə at çapmaq daha nə gərək?
Çin, Turan taxtını məndən istəsən,
Boynumu çəkmərəm bu itaətdən.





Dostluğu ataraq kəsilsən düşman,
Atamın yurdunu bağışlamasan,
Adının möhrünü edərəm qəbul,
Olaram mən satın alınmamış qul
Nə olur, padşahın geniş mülkündə
Çoxalsın get-gedə dost olan bəndə.
Vuruşa qəsd etmə, kinindən çəkil,
Bütün Çin donunun bir çini deyil.
Dəyərli qulların çin-çin saçından
Bir çin də mənə ver, sənindir fərman.
Ayın saf üzünə yaraşmaz bu çin,
Qaşının tağından çəkilsin bu kin."
İskəndər söylədi: "Ey fikri gözəl
Verdiyin sorğuya eləyim əməl:
Düşmənin başını öpsün toz, torpaq,
Olsun yad kimsələr dünyadan uzaq.
Əmrinə baş əyən hər bir kişvərdə
Nayiblər tikilsin məndən hər yerdə.
İndi ki, mən sənə qılınc çəkmədən
Başını əyərək təslim oldun sən,
Taxtınla başını uca eylərəm,
Tacını başında saxlarsan möhkəm.
Nə mülkün, nə tacın gərək. Ol əmin,
Qoymaram ki, olsun işlərin çətin.
Yalnız bir şərtim var, bütün mülkündən
Mənə yeddi illik xərac verəsən.
Yeddi il vergisi verilsə mənə,
O başqa vergilər halaldır sənə."
Dinləyən ağlına aydınlıq saçdı,
Ağzını incə bir cavabla açdı:
"Tacidar nə haqla istəyir hələ
Yeddi illik xərac bu az ömürlə.
Ömrümü edərsən təmin yeddi il.
Yeddi il xərc vermək çox çətin deyil."
Bu sözü bəyəndi uca hökmüran,
Qızınca beyni bu incə cavabdan.
Söylədi: "Altı il nə versə diyar,
Ayaq müzdü verdim sənə, ey huşyar.

Görürəm şüurun, ağlın incədir,
Qəbuldur mənə tək bir illik gəlir."
Türklərin xaqanı dünya şahından
Daşqın bir sevinclə oldu kamiran.
Dərgahın tozunu kirpik ucuylə
Süpürə-süpürə söylədi belə:
"Bilirəm: mətindir verdiyi peyman,
Gücünü artırsın ulu yaradan!
Madam ki, tacidar söz verir buna,
Əz əliylə bir xətt gərəkdir mana.
Bir illik xəracı verdiyim zaman
Məni öz yerimdə qoysun hökmüran.
O xəttin qolumda olsun bir qolbaq,
O xətti başımçın saxlayım ancaq.
Başımla mən də söz verirəm, inan,
Bu dostluq yolundan çıxmaram bir an."
Söz getdi arada, bağlandı peyman:
Qaçsın hər ikisi vəfasızlıqdan.
Düşmənlik silinsin, dostluq var olsun,
Bu dünya durduqca bərqərar olsun.
Nəhayət, bir fərman verdi hökmüdar:
Xaqanın qolundan açılsın bağlar.
O qızıl zəncirdən ucalsın başı,
Tacının cəvahir olsun daş-qaşı.
İskəndərlə bitdi bu əhdü peyman,
Öz ordugahına qayıtdı xaqan.
Gecənin sultanı açınca çətir,
Qaranlıq müşk kimi saçırdı ətir.
Ulduzlar o qədər qızıl səpirdi.
Yer öküzü qızıl altına girdi.
Şah meylə təskinlik verdi dimağa,
Axıtdı şərabı yaqut dodağa.
Axşamdan sübhəcən oturdu yenə,
İçdi Cəm camını Cəmin eşqinə.
Yuxunun yoluna səpmişdi tikan,
Zəhməti, kədəri unutmuş bir an.
Nə düşmən işindən kədər çəkərdi,
Nə keşikçi səsi, nə döyüş dərdi.





Sübhəcən şahanə qədəh sonaraq,
Gecəni keyf ilə keçirdi oyaq.
Təbii yaqutu yontunca zaman,
Yaqutlu tac ilə cüft oldu cahan[232].
Qapıdan girdi tez keşikçi əskər:
"Neçin qəflət etmiş uca İskəndər?
Budur, Çin xaqanı qoşunla gəlir,
Ayağı altında yer, göy titrəyir.
Qaynaşan ordusu dünya doldurur,
Göylərə səs salmış təbil və şeypur.
O qədər fil var ki, incinir yollar,
Günəşə, aya baş qaldırmış qubar.
O qədər qoşun var, çıxmış hesabdan,
Heç bir kəs görməmiş o qədər insan.
Ordusu daşıyır hər çeşid yaraq,
Poladdan dənizdir, hər dalğası dağ.
Xaqan da oturmuş qocaman filə,
Arada iki mil vardır fasilə."
Bu heyrətli işdən tutunca xəbər,
Padşahlıq taxtından endi İskəndər.
Yol ölçən bir köhlən ata oturdu,
Hərb üçün sazladı müntəzəm ordu.
Xaqanla döyüşə tez hazırlandı,
Onun peymanını bir hiylə sandı.
Əmr etdi, təbillər gurlasın kinlə,
Düz qaşlar çatılsın düyünlü çinlə.
Uca bir dağ kimi ordu çəkərək,
Vurdu ox, yay, qılınc, qalxandan bəzək.
Kəşfiyyat qoluna verdi çox yaraq,
Dənizdən buluda ucaltdı bir dağ.
Bu işdən xaqana verildi xəbər.
Onunla döyüşə çıxmış İskəndər.
Ordunun qəlbində at sürdü xaqan.
Səs ilə bağırdı: "Kimdir hökmüran?
Söyləyin atını bu səmtə çəksin,
Üzünü üzümdən gizləyir neçin?"
O çinli səsindən İskəndər durdu,
Donunu çinləyib belinə vurdu.

Fil yıxan atını səyirtdi hamam.
At saldı öndəki filə durmadan.
Dil açdı, türklərə eylədi qarğış:
"Fitnəsiz anadan bir türk doğmamış.
Çinlidən gözləmə çin qaşdan başqa,
Verdiyi peymana çevirir arxa.
Nə doğru söyləmiş keçən qocalar:
"Çinlidən umulmaz vəfa, etibar."
Hamı dargözlüyə bəsləmiş rəğbət,
Başqanın gözündə görürlər vüsət.
Əvvəlcə sülh üçün niyə söz verdin?
Sonra düşmənlikdə nə fayda gördün?
Peymanım, qəlbim bir, tutmuşam bir yol,
Sözüm az, doğruluq, sədaqət bol-bol.
Demək ki, sizlərdə məhəbbət kindir,
Çindəki türklərin qəlbi çin-çindir.
Bu çinli türklərdə olsaydı vəfa
Donunun çinində yaşardı dünya.
Qəlbimi bağladın öz peymanına,
Ey dönük, indi səs vurursan mana.
Poladdan bir dağa dönsə vücudun,
Yəcucdan, Məcucdan olsa da ordun,
İskəndər, İskəndər səddidək, inan,
Tərpənməz o polad əzən Yəcucdan.
Turacın əcəli çatdığı zaman
Şahin ovlağına qonar havadan.
Çəyirtkə al qanad açınca, əlbət,
Al qanla verəcək sərçəyə bir xətt.
Tacını alaram dikbaşlıq etsən,
Suçundan keçərəm dostluğu güdsən.
Tinətim yaralar, həm də sağaldar,
Arıtək həm balım, həm də iynəm var."
Dedi Çin xaqanı: "Mən, ey şəhriyar,
Sözümdən dönmədim, möhkəmdir ilqar.
Sənə dost demişəm, dostam hər zaman,
Sözümdə doğruyam, möhkəmdir peyman.
Hökmünə baş əydim, artıq dönmərəm,
Verdiyim əhdimdə sabitqədəməm.
Yanına onunçun gəlmişəm, inan,





Manqalın ətr alsın mənim udumdan.
Biləsən məndə də var qüvvət, hünər,
Ulduzlar göyünə çəkərəm əskər.
O qədər hünərsiz deyiləm ki, mən
Yenmədən qayıdam hər bir döyüşdən,
Görürsən, dağ kimi var mətin ordum,
Coşqun bir dənizdən belə yox qorxum.
Yalnız arxa duran tale var səndə,
Yer sənə kölədir, göy sənə bəndə.
Kin, inad göstərən bir bəxtiyara,
Çəkir öz başını ağacda dara.
Sənin arxandadır bu göy, bu dövran,
Dövranla döyüşmək olurmu asan?"
Endi fil belindən, durdu fil kimi,
Çağladı Firona doğru Nil kimi.
İskəndər gördü ki, üzr ilə xaqan
Ona üz çevirmiş, gəlir hərasan.
Önünə at çəkdi, misli yox Çində,
Başdan quyruğacan qızıl içində.
Endi bu at ilə onu kamiran,
Yanında yer tutdu böyük pəhləvan.
Bu atdan başqa çox şey verdi ona,
Bir illik xəracı keçdi xaqana.
Dost olandan sonra şah ilə xaqan
Düşmənlik kəsildi xanədanlardan.
O yerdə birləşdi hər iki ordu,
Hər iki padşahın qəlbi bir vurdu.
Silahı, acığı tökdülər yerə,
Töhfələrlə onlar keçdi alverə.
Çinin süpəhdarı Çin diyarından
Azuqə göndərdi şaha hər zaman.
Sarayın xalqına bu yeyintilər
Kifayət edirdi axşam və səhər.
Çalğı məclisində qədəh vurardı,
Birlikdə oturar, birgə durardı.
Məclisdən ovlağa çaparkən onlar,
İkisi bir yerdə edərdi şikar.
Heç biri təklikdə içməzdi badə,
Hər biri hər işdə yaşar azadə.

## RUM VƏ ÇİN NƏQQAŞLARININ YARIŞI

Saqi, can bəsləyən bir mey ver mana,
Bir mey ki, can kimi gərəkdir cana.
Solmuş çiçəyimə təravət versin,
Soyumuş qanıma hərarət versin.
Çiçəkli bahartək bir gülşən gündə,
Ruzgardan seçilmiş gözəl, şən gündə
Şaha Çin xaqanı gəlmişdi qonaq,
İki parlaq günəş bir oturaraq,
Zəncidən, Yunandan, Çindən, İrandan
Qonaqlar səf çəkmiş hər iki yandan.
Məclisin üz-gözü mey ilə şəndi,
Dünyanın çöhrəsi tozsuz gülşəndi.
İçki şənliyində gövhərdən dalğa,
Cöyləyən dodaqdan axır qulağa.
İş bilən kəslərdən açıldı söhbət:
Dünyada bilikcə kim tapmış şöhrət?
Dəyərli şey çıxar hansı torpaqdan?
Sənətcə dünyada kim almış ad-san?
Birisi söylədi: "Cadu və hiylə
Hindlidən baş verir, baxsan diqqətlə."
O biri söylədi: "Bəxti yatanlar
Hər sayaq cadunu Babildən alar."
Başqası söylədi: "Verir ən şaqraq
Xanəndə Xorasan, çalğıçı İraq."
Birisi söylədi: "Yüksəkdir, əlbət,
Ərəbin dilində olan fəsahət."
Birisi dedi: "Rum nəqqaşı, əlbət,
Dünyada qazanmış böyük bir şöhrət."
O biri söylədi: "Görmədin, nədir,
Çin naxşı dillərdə bir əfsanədir."
Deyişmə coşdurdu Rum ilə Çini,
Yenməyə başladı biri-birini.
Hər biri fikrini isbat edərək
Naxış pərgarından göstərdi örnək.
Deyişmə sonunda verildi qərar,
İki qaş tağıtək bir tağ qursunlar!





Bu tağa hər iki qaş arasından
Bir örtü çəkilsin müəyyən zaman.
Rumlu bir guşədə sən ətə dursun,
Çinli bir bucaqda naxışlar vursun.
Müəyyən saatlar gəlməmiş başa
Baxmasın heç biri digər naxışa.
Yalnız bu iş sona vardığı zaman
Qalxsın bu asılı pərdə ortadan.
Görsünlər bu iki incə naxışdan
Hansıdır ən təzə, incəlik saçan!
Ustalar oturdu bir nəqqaş kimi,
İki tağ altında iki qaş kimi.
Axıra yetincə müəyyən zaman
Örtüyü çəkdilər iki naxışdan.
Hər iki "Ərjəng"in birdi peykəri,
Vurduğu naxışı, rəngin, zivəri.
Onlara baxınca heyrətlə qaldı,
Hər iki surətdən bir ibrət aldı.
Nə sayaq çəkmişlər iki peykəri,
Surətcə birindən seçilməz biri.
Oturdu şah iki tağ arasına,
Heyrətlə bir ona baxdı, bir buna.
Seçmədi onları biri-birindən,
Tutmadı bir xəbər gizli sırrından.
Nə qədər diqqətlə eylədi nəzər,
İşin iç-üzündən tutmadı xəbər.
Arada incə bir fərq vardı: biri
Surəti göstərir, alır o biri.
Bəlinas baxdıqda iki surətə
Əsrarlı sənətdən düşdü heyrətə.
Çalışdı, ortaya çıxsın həqiqət,
Naxışdan keçirdi ələ bir hikmət.
Əmr etdi, durmadan əsrar öyrənən
Ortaya bir pərdə çəksin yenidən.
Elə ki, ortadan asıldı pərdə
Biri zövqə daldı, o biri dərdə.
Rumlunun lövhəsi parladı yenə,
Pas düşdü çinlinin saf güzgüsünə.

Naxışsız qalınca çinlinin tağı,
Padşahın gül kimi açdı yanağı,
Pərdəni aradan bir də çəkdilər,
Göründü hər iki tağda bir peykər.
Bildi ki, o parlaq naxışlı tağa
Hər naxış əks edir başdan ayağa.
Yan-yana işlərkən iki sənətkar
Arada pərdədən çəkmişdi hasar.
Rumlu bir lövhəni çəkirmiş gözəl,
Çinli də lövhəyə verirmiş siqəl.
Parlarkən çinlinin vurduğu naxış
Rumlunun şəklindən əksi alırmış.
Yarışın sonunda qərar verdilər:
Hər iki sənətkar göstərmiş hünər.
Rumluya çatmaz bu, naxış tökməkdə,
Çinli də üstündür siqəl çəkməkdə.
Eşitdim, olmaqçın Çinə peyğəmbər,
Reydən Çinə getdi Mani surətgər.
Elə ki, bu xəbər yayıldı Çinə,
Axdılar o gələn yolun səmtinə.
Yolunda axar su hovzuna bənzər,
İşıqlı büllurdan hovuz çəkdilər.
Rəssamın fırçası vurdu yaraşıq,
Üstündən dalğalar oynadı sıx-sıx.
Hərəkət verirdi sanki ruzigar,
Sahili öpürdü coşğun dalğalar.
Hovuz ətrafına naxışlar vuran
Çəkdi çay yanında bitən otlardai.
Mani çox uzaq bir eldən gəlirkən
Yolçunu susuzluq salmışdı əldən.
O hovzu görüncə səbirsiz qaçdı,
Boş, quru kuzənin ağzını açdı.
Doldurmaq fikrilə vurdu daş hövzə,
Əlində qırıldı o saxsı kuzə!
Bildi ki, çinlilər bu yolda aşkar
Hovuzla ona bir quyu qazmışlar.
Çıxardı naxışlar açan bir qələm,
Aldadan hovuza vurdu bir rəqəm.





Baş əyən qələmlə əl işlədərək
Çəkdi hovuz üstə ölü bir köpək.
Cəmdəyə hər yandan daraşmış qurdlar,
Görüncə susuzun ürəyi çatlar.
Hovuza susuzlar edərkən axın,
Ölü it görüncə getməsin yaxın.
Sürətlə yayıldı Çinə bu xəbər,
"Uzaqlaş" naxşını vurdu surətgər.
Gördülər mahirdir, onda sehr var,
Maniyə, "Ərjəng"ə sığındı onlar.
Bax, yenə səyirtdim ikinci kərə,
Çəkdim söz başını baxın nə yerə!
Neçə gün bir yerdə İskəndər, xaqan
Zövq aldı qədəhdən, meydən, çalğıdan
Get-gedə məhəbbət artırdı, gerçək,
Onu da, bunu da öyürdü fələk.
Bir gün şah söylədi ona: "Ruzigar
Bir əngəl açmasa, səfər fikrim var.
İradəm dönməkdir yenə yurduma,
Mən Çindən tərpənmək istərəm Ruma."
Ona hörmət ilə söylədi xaqan:
"Sənindir bu dünya, sənindir dövran!
Hər yerə üz qoysan bu taleyinlə,
Ayaq basdığın yer hər kəsə qiblə.
Atını hər yerə çapsa hökmüran
Borcumuz qulluqdur ona hər zaman."
Çox heyrət etdi şah bu ayıqlığa,
Ondakı vəfaya və sayıqlığa,
İskəndər məclisi xaqana hər an
İşıqlı göründü günəşdən, aydan.
Ürəklə xidmətə başladı xaqan.
Şahın xidmətində durdu hər zaman.
Şah üçün dəyərli bəxşiş gətirdi,
Bununla başını aya yetirdi.
Hörmətlə tutduqca onu hökmüran,
Dostluğu daha da artırdı xaqan.
Hər kəsə padişah böyüklük versə,
Dikbaş olmamalı elə bir kimsə.

Hər zaman kiçiklik yoluyla getsin.
Özündən ucaya alçaqlıq etsin,
Neysandan nə şərəf almışsa sədəf,
Çinə də şah verdi elə bir şərəf[233].
Bağdadda və Rumda nəfis görünən,
Hər çeşid qiymətli o geyimlərdən,
Verdi Çin şahına elə bir dəsgah.
Onu görməmişdi heç bir padişah.
Şahanə bəxşişlər doyurdu Çini,
Çinlinin alnından açıldı çini.
Qalmadı o böyük Çində bir nəfər
Geyməsin xəz, atlaz, zərif geyimlər.
Etdi İskəndərin gördüyü bu iş
O dargözlülərin qaşını geniş.
Şahın kip qaşıtək dostluq bərkişdi,
İskəndər başına hamı and içdi.

## XAQANIN İSKƏNDƏRİ QONAQ ETMƏSİ

Gəl məni azad et, saqi, "yox demə!
Qədəhdən göz yaşı tök ətəyimə.
Bir mey ver ki, olsun saf şirə kimi.
Yusun hər çirkabdan bu ətəyimi.
Çapqınlıq etmə, ey Çin üzlü gözəl.
Bir saat qaşına çin gətirmə, gəl!
Qeydimə qal mənim, qəlbimi şad et,
Qüssədən bir günlük məni azad et!
Xaqanın gəliri keçsə də ələ,
Sel kimi axıtma, yağıştək xərclə.
Malından bir az ye, bir az ver, ancaq
Başqalar üçün də azacıq burax.
Yemə var-yoxunu, çox yaşayarsan,
Yoxsulluq yamandır qocalan zaman.
Xərclə, ye, bərk tutma köhnə dünyanı,
Xəsislik, ac qalmaq məhv edər canı.
Dağıtma əlində var isə sərvət,
Bihudə yeməkdən çəkərsən zəhmət.
Xərclərkən ölçüdən gəl götürmə əl.





Nə artıq nə əskik - ortadır gözəl,
Sapım yoğun olsa incə iynədən.
Çox iynə gözünü kor edəcəksən.
Yazdığım tarixin nəqqaşı yenə
Bu naxşı vurmuşdur Çin ipəyinə:
Hər yerdə səs çıxdı: böyük İskəndər
Çin ətəklərinə səpdi dürr, gövhər.
Bu idi xaqanın fikri, həvəsi,
Versin İskəndərə ayaq kirəsi.
Açsın bir şahanə ziyafət ona,
Zər töksün atının ayaqlarına.
Özünün adına, sanına görə.
Şahına hədiyyə çəksin hüzurə.
Şahın bəxti kimi olduqca parlaq,
Bir gözəl gün seçdi, qurdu təmtaraq.
Bir məclis bəzədi cənnətdən də şən.
Şirəni axıtdı aslan dişindən.
Meyvədən, meydən, həm balıqdan, quşdan
Elə bir qonaqlıq düzəltdi xaqan,
Dünyada nə qədər gözəl nemət var,
Basmışdı bağrına qızıl xonçalar.
Çin xuruşlarından başqa, al-əlvan,
Mislini cənnətdə görməmiş bağban.
Ləzzətli halvalar hazır olmuşdu,
İçi qənd, badamla doldurulmuşdu.
Elə qablar vardı, gəzib arayan
Dünyada birini tapmazdı ondan.
O qədər cavahir gəlmiş ortaya
Ki, sərraf bir ilə almazdı saya.
Həşəmətli şahın ziyafətinə
Sərf oldu böyük bir dolu xəzinə.
Türk şahı xaslarla yola çıxaraq,
Getdi İskəndəri çağırsın qonaq,
Torpağı öpdülər ayinə görə,
Dəydi yer öpməkdən başı göylərə.
Söylədi: "Bu uca bəxtin, ey sərvər!
Taxtımın başına yol tapsa əgər,
Tacıyla taxtını əziz edərdi,

Məni bu şərəflə çox böyüdərdi."
Səmimi dəvəti şah qəbul etdi,
Xaqana şərəfli hörmətçün getdi.
Ordu, şah birlikdə haman dəvətə
Baş əyib atlandı o ziyafətə.
Xəzinə ağzından açıldı yerlər,
"Yol açın!" səsindən titrədi göylər.
İskəndər çatınca süfrə boyuna,
Elə bil çatdı Xızr həyat suyuna.
Qızıl bir taxt gördü, günəşdi, gerçək.
Onda dürr çeşməsi dəniz suyutək.
Qızıl taxt üstündə oturdu şən-şən
Əlində bir turunc kafur, ənbərdən.
Sağ əldə dünyanı yoxlayan fəğfur[234],
Xidmətə baş əymiş, hüzurda durur.
Şah onu çağırdı, hörmətdir deyə,
Oturtdu şah kimi qızıl kürsüyə,
Başqa tacidarlar hörmətə görə
İskəndər yanında diz çökdü yerə.
Xaqan əmr eylədi: "Yeməklər gəlsin,
Qızıl xonçalarda xörəklər gəlsin!"
Hər yandan töküldü şahanə yarpaq,
Meynə yarpağıtək tökdü hər budaq[235].
Fərxarə bənzəyən istək evindən
Tez hazır olurdu hər istənilən[236].
Elə bil cənnətdir, arayan kimsə
Xonçada tapırdı hər nə istəsə.
İştahla yedilər o xuruşlardan,
Hücumla şəraba açdılar meydan,
Qırmızı şərablar verdi qol-qanad,
Qırmızı rənglərdən qurdular büsat.
Çalmağa oturdu, bütün dünyadan
Seçilmiş ən məşhur oxuyan, çalan.
Ən incə oxucu səslər ucalır,
Ozanlar rəsmiylə oxuyur, çalır.
Çalanlar başladı süğdi nəğməsi,
Göylərə ucaldı sazların səsi.
Vardı pəhləvicə o qədər çalan





Nəğməyə yenilik verirdi hər an.
Rəqs edən kəşmirli gözəllər durur,
Oynarkən yel kimi mayallaq vurur.
Elə çalğıçılar gəlmiş Yunandan,
Ağlını itirir eşidən insan.
Rum və Çin xidmətə bel bağlayaraq,
Bəzədi Rumdan və Çindən bir bayraq.
Xəzinə ağzını açınca xaqan,
Qarun xəznəsində yer oldu pünhan[237].
Əvvəlcə saçdı çox cavahir, gövhər,
Daş-qaşa tutulmuş gözəl geyimlər.
Büllurdan büsatı günəşdən parlaq,
İncəlikdə sudan təmiz və yumşaq.
Çin ipəklərindən bir neçə xalvar,
Müşk ilə, ənbərlə dolu bir ambar.
Kafurlu təbəqdən ətr almış hər yan,
Quru ud artıqdı təzə kafurdan,
Çaçi kamanlarla çini ipəklər,
Bir neçə qılınc da ona bərabər.
Bir ilxı yorğa at, görkəmli, oynaq,
Yel kimi yeriyən, gövdəsi parlaq,
Göylərdə durnanı, sarı ovlayan
Laçınla qızıl quş, böyük bir karvan.
Qırx fil öz taxtıyla, uca, qüvvətli,
Sümükləri möhkəm, vücudu ətli.
Bir dəstə qara qul - cəbhələr yenən,
Ayüzlü kənizlər - ölü dirildən.
Çəkdi bu şeyləri şah hüzurinə,
Bunlardan başqa çox şey verdi yenə.
yenidən başqa bir xəzinə açdı,
Ondan da dəyərli bəxşişlər saçdı.
Verdi o, quyruğu qara bir köhlən.
Səhər küləyindən iti yeriyən.
Yürüyən, şahanə bir təxti-rəvan.
Üstündə tərpənməz əsla oturan,
Qaçmaqda ceyrandan iti, həm oynaq,
Atəşdən qızğındı, sudan da yumşaq,
Çölün quşlarından çox yüngül uçan.

Dənizdə balıqdan iti oynayan,
Qaçarkən qorxunc div sanırdı görən,
Elə bil doğulmuş divlər nəslindən,
Qalmaz tərpənişdə göylərdən geri,
Olmaz dan yeri də bu meydan əri.
Meydanda elə bir cövlanı vardı,
Xəyalı o yarı yolda qoyardı.
"Fərəsi" "Rüx" ilə ayaqdan salır,
"Fərəs"lə "Fili" də cəbhədən alır[238].
Bir qorxu saçardı onun süräti,
Yerişi ən incə xəyaldan iti.
Qorxmazdı səməndər kimi atəşdən,
Səməndər demirəm, İskəndər çəkən.
Bir ovçu quş verdi fitnəylə dolu,
Röyalı gecədən daha qorxulu.
Çərx kimi dolanır açarkən şəhbal,
Gəzişi cənubdu, çıxışı şimal[239].
Polad yay keçirmiş tunc dırnaqlara,
Əzmindən qartallar geyinmiş qara.
Boynunda çox qan var, hər quşa- yağı,
O qartal ovlayan yaylı caynağı
Görüncə simürğün bağrı sızıldar.
Çöllərdə kərgədan edərdi şikar,
Acıqlı, qaniçən, qorxu bilməyən.
Haqq onu yaratmış zülümdən, kindən,
Toğruldur quşların şahı bu Toğan,
O da Toğrul kimi ölkəyə sultan.
Qaragöz bir kəniz ənbər qoxulu,
Gülüzlü, dodağı şəkərlə dolu.
Cənnətdə bəzənmiş bir sənəmdir bu,
Edər o fitnəni könül arizu.
Yürüyən bir aydır o sərv ağacı,
Müşkin bir kəmənddir cüt qara saçı.
Su kimi lətifdir o çənə, buxaq,
Atəşdə suyu kim görmüş baş-ayaq?





Üzü bənövşəyə qızıl gül atır,
Gül üzdə bənövşə keşikçi yatır[241].
Uca sərv möhtacdır onun boyuna.
Şəkər bir bəndədir, bal dostdur ona.
Müşk onun zülfünə bağlamış kəmər,
Zülfü də günəşə köləlik edər.
Bir şəkərparədir, şirin söhbətdir,
Dodağı şəkərçin bir fələkətdir.
Arxası sincabdır, bədəni büllur.
İncə barmaqları xəz quyruğudur.
Ağ, lətif çənəsi gümüşdən nişan,
Ona bir tuğ asmış gül buxağından.
Çənəyə, buxağa vermiş yaraşıq,
Günəşdən top qapmış, aydansa işıq.
Qəmzədən ox çəkmiş, qaşından kaman,
Bu ox, bu kamanla ovlamış yüz can.
Boğazı o qədər ağ, lətifdir ki,
İçərkən görünür şərabın rəngi.
Dünyada sağ olsun elə bir dayə,
Bir gözəl bəsləmiş tən edir aya.
Dar gözü kimsəyə salmaz bir nəzər,
Ağzı dar gözündən daha dar, dilbər.
Elə bil ağız yox, yaranmış yoxdan,
Ona "Taysız gözəl" demiş ad qoyan.
Dəyərli töhfələr təqdim eləyən
Fəxr ilə öyməyə başladı şən-şən:
"Budur at, ovçu quş və gözəl kəniz,
Əzizdir, bunları sən də tut əziz.
Nə kimsə belə at minmişdir hələ,
Nə belə bir quşu keçirmiş ələ.
Deməyə nə hacət, bir zaman gələr,
Hər biri göstərər böyük bir hünər.
Gülüzlü kənizdir belə bir gözəl,
Gözəllikdə yoxdur özünə bədəl.
Anadangəlmədir onda üç xislət,

Onun dördüncüsü tapılmaz, əlbət,
Birinci, gözəldir, bərabəri yox,
Can alır, cənnətdə belə pəri yox.
İkinci, güclüdür, həm də döyüşkən!
Qaçmaz döyüş günü mərd kişilərdən.
Üçüncü, yox səsdə ona bir bədəl,
Şən, şaqraq nəğməsi Zöhrədən gözəl.
Gözəl səs dalınca pəstdən, ucadan,
Nəğməsindən yatar həm quş, həm ilan".
İskəndər bəyəndi, haqq verdi ona,
Xoş səsi, gül üzü gəldi xoşuna.
Qadında mərdliyə vermədi qiymət,
Bu işdə azacıq düşündü, əlbət.
Tikanlar bərk olur, çiçəklər incə,
Qadında igidlik az olur məncə.
Vücudu geyinsə kəskin poladı,
Mərdlikdə payı yox, qadındır adı.
Çaxmaq daşı olsa suda balıqlar,
Dənizdə nəhəngə olacaq şikar.
Yararmı kağızdan qayrılsın qalxan,
Atılsın dənizə, suya sonradan.
Padşahı bu fikir etmədi təmin,
Qadını mərdlikdə görmədi mətin.
Özünə qul etdi qəbul etməklə,
Sonradan adını unutdu belə.
Gözəl bəxşişləri alaraq ondan
Yatağa çəkildi İskəndər xaqan.
Məşriqin tovuzu o səhər erkən
Başını ucaltdı firuzə göydən,
Yenidən qədəhi padişah aldı,
Yenidən dərgaha çalğı səs saldı.
İki gün işrətlə baxdı keyfinə,
Yerişə başladı yel atı yenə.
Qayıtmaq üçün şah verincə qərar,
Dolanışı kəskin, iti ruzigar,





Xaqanın verdiyi türküzlü kəniz
Padşahın yanında olmadı əziz.
Nədənsə xoşuna gəlmədi bu qız,
Kölgətək pərdədə buraxdı yalqız.
Parladı günəştək o toxtamış ay,
Gözündən gül üzə axıtdı bir çay.
Kənizlər evində şam kimi söndü,
Bir quyu içində kölgəyə döndü.
Çövkana pərəstiş edən bu dövran
Ələ top keçirdi gecə oyunundan.
Şahlardan top qapan böyük hökmüran
Cilovu çövkana buraxdı bir an.
Qalxdı dağlar yaran gəmiyə birdən,
Fil atın üstünə mindi filbədən.
Ucaltdı bayrağı boyun çəkənlər,
Qiyamət başladı, göründü məhşər.
Ordunun olurdu eni bir ağac,
Ceyranla dolmuşdu bütün çöl, yamac.
Çindən Cəndə qədər hey başdan-başa
Yer-göy bürünmüşdü ipək qumaşa.
Ordunun sayına çatdı hökmüran,
Var idi beş yüz min adlı pəhləvan.
Qabaqda, arxada tovuzrəng türklər,
Sağ, solda poladqol aslanlar gedər.
Ordunun qəlbində durmuş hökmüdar.
Sahildə dağ kimi dəmir külahlar.
O dəmir külahlı ərlərdən başqa
Qırx filə söykənmiş həm ön, həm arxa.
Qarşıda ucalmış şahın sancağı,
Min igid əlində tutmuş bayrağı.
Xas qullar belində qızıldan kəmər,
Ərinmiş saf qızıl çubuğa bənzər.
Gözəl, gənc igidlər coşurdu seltək,
Hər yandan çəkirdi minlərcə yedək.
Yolun zəhmətini qat-qat azaldan

Nədimlər bürümüş onu hər yandan.
Şövkətlə tərpəndi Rum şəhriyarı,
Yanınca gedirdi Çin hökmüdarı.
Elə ki, yolları ölçdü bir qədər,
Xaqana işarə etdi İskəndər.
Durmayıb mülkünə qayıtsın yenə,
Cilovu çevirsin türk ölkəsinə.
Şah ilə görüşdü, ayrıldı xaqan,
Üzünü islatdı kirpik suyundan.
O dünya dolaşan atını sürdü,
Qoşunla Ceyhuna doğru yürüdü.
Elə ki, yetişdi o dərin çaya,
Dincəlmək əmrini verdi orduya.
O yerdə sevimli bir çəmən gördü,
Enməkçin münasib bir məskən gördü.
Kəndirlər çəkildi, çadır quruldu,
Mərkəzin sütunu qüvvətə doldu.
Gövhərlə işlənmiş o çadırlardan
Ceyhunun sahili oldu gülüstan.
Mavəraünnəhri görüncə guya,
Bir şəhər demirəm, gördü bir dünya.
Nə qədər var-dövlət almışdı Çindən
Qaldığı yerlərdə dağıtdı şən-şən.
Şənləndi o yerdə viranə yerlər,
Yenidən saldırdı bir neçə şəhər.
Səmərqənd ki, dünya sevinir ona,
Deyirlər, İskəndər etmişdir bina.
Rumda, Xorasanda yayıldı xəbər:
Getdiyi yerlərdən döndü İskəndər.
Padişah zəfərlə gəlmişdir deyə,
Xalq çıxdı yollarda şənlik etməyə.
Toy-bayram başlandı, ucaldı bayraq,
Hər yerdə, hər evdə şənlik quraraq
Varlılar səpdilər varı, dövləti,
Göndərdi padşaha ayaq zəhməti.





# İSKƏNDƏRİN RUS QOŞUNUNUN HÜCUMUNDAN XƏBƏR TUTMASI

Saqi, dur bu gecə mənə ver şərab,
Bu başağrısına vacibdir gülab.
Bir mey ver, suyu da eləsin huşyar.
Verməsin başlara ağırlıq, xumar.
Xoş gəlir dünyanı ölçən ərlərə
Calasın səfəri başqa səfərə.
Görsün hər ölkədə yeni bir adət,
Olsun hər mənzildə azacıq rahət.
Hər yeni geyimə bir nəzər salsın,
Gördüyü şeylərdən bir sınaq alsın.
Azacıq düşünsən, bir nüktə vardır:
Hər kəs öz şəhrində bir şəhriyardır.
Öz şəhrində olsan ən alçaq insan
Yaxşıdır qürbətdə sultan olmaqdan.
İskəndər hər yerdə qələbə çaldı,
Lakin vətən eşqi qəlbini aldı.
Hökmündə olsa da saysız vilayət,
Əz doğma yurduna çəkərdi həsrət.
O gecə qət etdi, səhər qalxaraq
Atına küləkdən taxsın bir ayaq.
Qəlbində söndürsün vətən odunu,
Xorasan havası şənlətsin onu.
Əcəm torpağına at salsın yenə,
Oradan yol açsın İstəxr mülkünə.
Dünyanın rəngi də uysun baxtına,
Şöhrətlər qazansın uca taxtına.
Keçsin Nuşafərin mülkündən bir də,
Yaxşını, yamanı görsün o yerdə.
Yeni don geydirsin köhnə işlərə,
Önündə bir dünya diz çöksün yerə.
Hər kəsə yenidən versin var, dövlət,
Töhfələr paylasın, göstərsin şəfqət.
Bəxşişlər ayırsın istəyənlərə,
Yenidən yaşayış versin hər yerə.
Gedərkən bunları düşünür dərin,

Başqa cür düşünməz hökmüran, yəqin.
Abxaz hökmüdarı olan Dəvalı
Ucalmış, padşaha yaxın olalı.
İskəndər hökmünə bağlarkən kəmər
Dünyaları ölçər, ölkələr gəzər,
Padşahın yanına gəlincə, birdən
Təbiltək inləyib qopardı şivən:
"Padşahın, rusların zülmü çox dərin,
Abxaz gərdəyindən qaçırır gəlin.
O gözəl ölkədən gəlmiş bir tanış,
Deyir: o var-yoxdan çöp də qalmamış.
Alan, Ərk rusları edərək axın
Yağmurtək ölkəyə etmişdir basqın.
Dərbəndə, ətrafa fitnələr saçmış,
Gəmiyə doluşub, dənizə qaçmış.
Qədərsiz basqınlar etmişdir yenə,
Yenidən yol vermiş o köhnə kinə.
Qəflətən talamış hər yerdə nə var,
Bir də yol tapmasın o şum ayaqlar.
Deyirlər, qədərdən çox ölən varmış,
Həm qırıb dağıtmış, həm də aparmış.
Heç bir şey qalmamış dolu anbarda,
Xəzinə boşalmış, yoxdur dinar da.
Xəzinə geyimdən boşalmış, gerçək,
Sandıqdan dür çalmış, taxtımdan ipək.
Gördüyün o Bərdə olmuşdur viran,
O zəngin şəhərdən qalmamış nişan.
Gözəl Nüşabəni almışlar əsir,
İşrət qədəhini qırmışlar bir-bir.
Sarayda görmüşdün o qədər gəlin,
Onlardan qalmamış heç bir nazənin.
Vurmuş bir-birinə kəndi, şəhəri,
Atəşdə yandırmış şən ölkələri.
O qızğın döyüşdə məhv olsaydım mən
Asudə olardım bu dirilikdən.
Sənin xidmətində oldum bəxtiyar,
Orada əsirdir gəlinlər, qızlar.
Düşməndən intiqam almazsa padşah,





İmdada yetişsin o böyük allah.
Çox keçməz ki, ruslar girər hər yana,
Dağ çəkər Rum ilə Ermənistana.
Elə ki, keçirər ələ xəzinə,
Durmayıb tələsik qaçarlar yenə.
Şəhərlər alaraq, talar hər yanı,
Bəlkə də tutarlar bütün dünyanı.
Onlarda aslanla qurd ürəyi var,
Qana mərd, süfrəyə acız olurlar.
Mərhəmət umulmaz düşməndən bir an,
Yalnız surətindən görünər insan!
Eşşəyin cəvahir olsa da yükü,
Yenə də eşşəkdir, parıldar tükü.
Madam ki, yol tapmış bunlar xəznəyə,
Ziyanlıq verəcək bir çox ölkəyə.
Zülümlə açacaq yeni qol-qanad,
Karvanlar soyacaq, sönəcək həyat.
Ölkəyə dərindən ziyan vuracaq,
Ruma, Xorasana əl uzadacaq."
Acıqlandı padşah bunu dinlərkən,
Onun övladına olan sitəmdən.
Nüşabə üçün də qəmləndi hədsiz,
Çünki o ölkəni tuturdu əziz.
Acıqlı başını dikdi köksünə,
Başını kədərlə qaldırdı yenə.
Dedi: "Ey Dəvalı, verirəm fərman,
Qəlbimdə çırpındı canında olan.
Vəğəni anlatdın, sən dur bir yana,
Bu işi büsbütün gəl tapşır mana.
Görərsən nə səhman verrəm işlərə,
Kəməndim nə qədər baş tökər yerə.
Alaram ağılı, huşu başlardan.
Aslanlar qanına sallam həyəcan.
Aslanla oynamaq deyildir asan,
İtləri salaram kinli qürurdan.
Qoymaram Bərtasdan, ruslardan nişan,
Başları qurtarmaz ayaq altından.
Ruslar, Misr olsa da, tökərəm Nilə,

Şüuru azınca əzdirrəm filə,
Taxtımı qaldırram dağından yüksək.
Daşları dəhşətdən ərisin gərək.
Nə əjdər qoyaram bu köhüllərdə,
Nə də ot ki, dərman olsun bir dərdə
Ruslardan bu öcü almayıb getsəm,
Feyləqusun oğlu deyiləm, itəm.
Bərtasın qurdunu tora salmasam,
Bərtas tülküsündən daha alçağam.
Dövranın gərdişi verərsə imkan,
Alaram öcümü kinli düşmandan.
Qaytarar nə ki şey aparmış bizdən,
Düşər ayağıma o qarət edən.
Nüşabə qurtarar zəncir altından,
Mən şəkər alaram qamışdan, inan!
O gümüş, daşlarda gizlənsə belə,
Xamırdan tük kimi çəkərəm çölə.
Tədbirlə açılar bu çətin işlər,
Ağacda zamanla açar çiçəklər
Hər işdə tədbirdən əl götürməmək.
Zamandan-zamana dolanır fələk,
Bu yola varımdır ərzaq, hazırlıq.
Murada çatınca dözərəm, artıq.
Qocaman dağlardan dənizə qədər
Üsullu-üsullu iş axıb gedər.
Fikrim at sürməkdı əcəm mülkünə,
O yerdə əylənmək istədim yenə.
İndi ki, üz vermiş belə bir dastan,
Taxtımdan ayrılmaq yaxşıdır bundan.
Qoşunum əzm etdi tərpənsin, ancaq
Bu yolda yəhərim taxtım olacaq.
Düşməndən intiqam almayınca mən
Qaçaram yatmaqdan, istirahətdən."
Dəvalı o halı gördüyü zaman
Azaldı qəlbində kinli həyəcan.
Dodağı doldurdu yeri ənbərlə,
Üz sürtdü, torpağı suvardı zərlə.





## İSKƏNDƏRİN QIPÇAQ ÇÖLÜNƏ ÇATMASI

Dur, saqi, qədəhi al ələ, doldur!
Kimsəyə içməkdən başqa yol yoxdur.
Günəş parçasıdır, badə deyil bu,
Gövhərində vardır həm atəş, həm su.
İki pərvanədir bağlanmış bura,
Birinin üzü ağ, birinin qara[243].
Kimsənin şamına deyil pərvanə,
Dinləməz kimsəni, baxmaz fərmanə[244].
Çıraqdan işıq ver, ev işıqlansın,
Hər iki pərvanə atəşdə yansın.
Bu yaşıl baxçaya verən yaraşıq
Çıraqdan parladır belə bir işıq.
Feyləqusun oğlu böyük İskəndər
Rusun talanından alınca xəbər,
Gecəni yatmadı, əzm etdi kinə,
Hər sayaq düşündü, daşındı yenə.
Neyləsin, bu işə necə don biçsin,
Üstündən atlayıb qolayca keçsin.
Dan yeri yaqutdan şəfəq saçanda,
Şəbdizin belindən təngi açanda[245],
İskəndər yenə də ata minərək
Yel kimi tərpəndi, oldu bir şimşək.
Ceyhun sahiliylə atını saldı,
Oradan Xarəzmə doğru yol aldı.
Arxada ordusu dənizək axır,
Çöllərin hesabı barmağındadır.
Xarəzmin çölünü ölçərək biçdi,
Ceyhuna gələrək, Amildən keçdi.
Aləmi qurtarmaq fikriylə rusdan
Suda və quruda durmadı bir an.
Yeməyib, yatmayıb, hey sürürdü at,
Səqlab çöllərinə açınca qanad,
Qıpçaqla qaynaşan boz çöllər gördü,
Baldırı ağappaq gözəllər gördü.
Üzü od, yanağı su kimi oynaq,
Günəşdən və aydan daha şux, parlaq

Hamı kiçik gözlü, könül ovlayan,
Bir pəri səbrini əlindən alan.
Nə örtü, nə yaşmaq bilirdi onlar,
Nə də qardaşından, ərindən qorxar.
Darlıqda keçinən subay əskərlər,
Görüncə örtüsüz bir dəstə dilbər,
Dözməyib, qaynadı gəncliyin qanı,
Dinləməz oldular əmri, fərmanı.
Padşahın qorxusu çökdü əskərə,
Əl ata bilmədi o gözəllərə.
İskəndər görüncə o afətləri,
Xoşuna gəlmədi bu adətləri.
Ağ bədənlər gördü, gümüş vücudlu,
Ordu bütün susuz, onlar sərin su.
Ordunun halına yandı, nə demək,
Hər qadın qadındır, erkək də erkək!
Bu işə sərf etdi öz hünərini,
Çağırdı qıpçağın böyüklərini.
İskəndər onlara etdi çox hörmət,
Ucaldı başları, göstərdi şəfqət,
Örtülü dedi çöl qıpçaqlarına:
"Üzünü gizləmək xoşdur qadına.
Qadın ki, yadlara açar üzünü,
Nə əri düşünər, nə də özünü.
Bərklikdə ansa da daşı, poladı,
Yenə də qadının qadındır adı.
O azğın çöl xalqı, o köçərilər
Padşahı dinləyib durdu bir qədər.
Bu əmrə əymədi boyun heç biri,
Ən doğru sandılar bu ayinləri.
"Bəndəyik biz, deyə, təslim oldular,
İtaət edərik sənə, tacidar!
Üz örtmək doğru yol deyildir, ancaq,
İtaət etməz bu ayinə qıpçaq.
Üz örtmək ayini qoy olsun sənin,
Bizə də göz örtmək olmuşdur ayin.
Baxmamaq gərəkdir naməhrəm üzə,
Nə suçu var üzün, cəza ver gözə.





Bu sözlər gəlirsə padşaha ağır,
Nə üçün bəs üzə, arxaya baxır.
Bu hasar deyilmi qıza, gəlinə?
Heç biri girməmiş yad gərdəyinə.
Bizim qız-gəlinə yetər bu örük,
Yadlar gərdəyindən tutmamışdır yük.
Örtü salmaqdansa xalqın üzünə,
Özün bir örtü çək baxan gözünə.
Gözünə pərdəni asan bir nəfər,
Şübhəsiz, nə günəş, nə də ay görər.
Bu işdə cahandar əmr edir bizə,
İstəsən hər qıpçaq can verər sizə.
Edərik hər əmrin olsa, itaət,
Öz ayinimizdən dönmərik, əlbət."
Qıpçağın dilini uzun görüncə,
Susaraq, aldı bir acı düşüncə.
Padşaha apaydın oldu həqiqət,
Bu xalqa bir fayda verməz nəsihət.
Tutarlı bir tədbir göstərsin, deyə,
Söylədi bu sirri o fərzanəyə:
"Bu kəmənd saçlılar gözəldir, dilbər.
Hayıf ki, yadlardan üz örtməyirlər.
Pərvanə atəşdə yandığı qədər,
Yadlara bəladır bu qara gözlər.
Nə yolla qıpçağı bəs yumşaldım mən,
Gizləsin üzünü naməhrəmlərdən?!"
Bəlinas dil açdı ona hörmətlə:
"İtaət edərəm böyük minnətlə,
Mən elə bir tilsim qurum bu yerdə,
Dastanlara düşüb qalsın dillərdə.
Tilsimi hər qadın gördüyü zaman,
Üz-gözünü örtüb keçər yanından.
Bu şərtlə: padişah qalsın mənimlə,
İstədiyim şeyi gətirsənələ."
Gərəkli şeyləri yaxşı-yamandan,
Güc ilə, qızılla tapdı hökmüran.
Bəlinas güvəndi bəxtiyarlığa,
Tədbirlə başladı sənətkarlığa.

Qara daşdan qurdu gözəl nazənin,
Dikəltdi bir yeni ayinli gəlin.
Ağ mərmər çadrası heykəl daşında,
Səmən yarpağıydı bidmişk başında.
Hər qadın keçirkən gördüyü zaman
Utanıb üzünü gizlədi ondan.
Üzünü, gözünü örtdü hər göyçək,
Utanıb üzünə çəkdi bürüncək.
O gün ki, çarşablı heykəl quruldu,
Qıpçağa üz örtmək bir adət oldu.
Sənətkar kişidən sordu İskəndər:
"Nə üçün bu xalqa daş etdi əsər,
Etmədi verdiyim əmrə itaət,
Bu cansız Heykəldən aldılar ibrət?"
Bəxtiyar bilici dedi: "Hökmüran,
Qıpçağın ürəyi qatıdır daşdan!
Bu gümüşbədənlər daşürəklidir
Daşürəkliləri onunçun sevir.
Hər biri elə ki, daşa yan alır
Qatı ürəkləri ondan yumşalır.
Üz-gözü bərk daşdan yaranmış dilbər
Utanıb, üzünü yadlardan örtər.
Bizə də gərəkdir belə bir örtük,
Ərlərə hörmətdir, yadlara örük.
Bir də ki, göylərə aid bir sirr var.
Etmərəm o gizlin sirri aşikar."
O tilsim kök saldı durduğu yerdə,
Üzlərə oldu bir ismətli pərdə.
Tilsimli o heykəl yenə ucalır,
Uçmamış, o çöldə indi də qalır.
Çevrəsi oxlardan dönmüş ormana,
Çay boyunca bitən ota, tikana.
Ətəkdə qartallar salan oxlardan
Daha çox görünür qartal və tərlan.
O yerdən keçərkən daim qıpçaqlar,
Pir deyib, başını səcdəyə qoyar.
Hər atlı, piyada o yoldan gedir,
Heykələ pir deyə, pərəstiş edir.





Atını sürərkən daşa, pir deyə,
Edir oxluğundan bir ox hədiyyə.
Çobanlar sürüylə keçərkən ordan
Verər o heykələ bir qoyun qurban.
Qartallar ucadan edərkən pərvaz
Qoyundan o yerdə bir tük də qoymaz.
Qorxaraq, o polad pəncə qartaldan
Heykəlin səmtinə gəlməz bir insan.
Bax, bilici necə bir heykəl qurdu,
O sənəm gah açdı, gah düyün vurdu.

## İSKƏNDƏRİN RUS ÖLKƏSİNƏ ÇATMASI VƏ MÜHARİBƏSİ

Saqi, dur, örtülü bakirəni sən
Mənə ver, qorxursa ərə getməkdən.
Əlimi yuyum hər kirdən, murdardan,
Təmiz olmalıdır bikrə əl vuran!
Yenidən bu bülbül girmişdir bağa,
Bu pəri yan almış işıq - çırağa.
Fikrimə can verir bu pəricamal,
Pəriyə döndərmiş məni bir xəyal.
Bu qara Əhrimən mədənindən mən
Bir gövhər alım ki, çıraqdan rövşən.
Minlərcə eşq olsun, zəkalı ərlər
Zülmətdən çıxarır işıqlı gövhər.
Keçmişi gözəlcə bilib tanıyan
Tarixdən nəql edir belə bir dastan:
Rum sənətkarına şah verdi fərman,
Tədbirlər tökərək mum alsın daşdan.
O tələb edilən uğurlu heykəl
Firuzə naxşıtək bəzəndi gözəl.
Heykələ vurmuşdu elə bir bəzək,
Türklərin nəqşinə bağladı ipək.
Heykəli dikəltdi mahir sənətkar,
Önündən şövkətlə keçdi hökmüdar.
Keçirkən saçırdı, cəvahir, dövlət,

Dincəlmək fikriylə çəkirdi zəhmət.
Həftədə bir neçə mənzil gedirdi,
Mənzildə həftədən çox dincəlirdi.
Düşmənə olunca yaxın, coşdu kin,
Əjdərlər pəncəni etdilər kəskin.
Qarşıda göründü geniş bir sahil,
Gecəykən o yerdə etdilər mənzil.
O yaşıl çəməndə ordu, tacidar
Yolun zəhmətindən rahat oldular.
Ulduztək bəzədi baş ordugahı,
Göylərə ucaltdı onda dərgahı.
Hər tərəf bayraqla döndü tovusa,
Ordunun ağzını çevirdi rusa.
Bu qorxulu xəbər çatdı ruslara:
Əskərlə yetişdi o rumlu Dara,
O qədər əskər heç gəlməz xəyalə,
Dağlar da dayanmaz etsə bir həmlə,
Zor igidləri var qılınc oynadan,
İnsanı qıvrılmış ilantək sancan.
Qızmış bir aslandır kəmənd quranlar,
Fillərin başını yerə buranlar.
Çinli qulları var, hərbə girincə
Bir teldən ox atar yüzlər, minlərcə.
İskəndər deyil tək acıqlı aslan,
Bəladır dünya o qan qusduran.
Ardınca dağ kimi bir ordu gəlir,
Yer, göy titrəyərək tozlar yüksəlir.
İki yüz fili var üstü poladdan,
Torpağın canına salır həyəcan.
Çölləri tutmayır igidlər, fillər,
Ordusu ordular yaran bir əjdər.
Eşitdi rusların sərdarı Qıntal
Ki, dövran doğurmuş başqa bir əhval,
Yeddi rus soyundan tərpətdi ordu[246],
Hər qövmə uyan bir yaraşıq vurdu.
Bərtasdan, Alandan, Xəzrandan hədsiz
Sanasan sel kimi axdı dağ, dəniz.
İsudan Qıpçağın çölünə qədər





Hər yeri doldurdu ox, geyim, xəncər.
Hesaba gəlməyən qədər əskər var,
Sayından acizdi böyük hesabdar.
Qarşıda olanı saydı bir bilən,
Ziyadə göründü doqquz yüz mindən.
Rusa iki ağac qaldığı zaman,
Atlardan enərək tutdular məkan.
Rus Qıntal söylədi: "Mərdləri yenən
Döyüşdə qorxarmı qızdan, gəlindən?
Heç zəhmət görməmiş belə bir əskər,
Xəzinə karvanı, üstü zər, zivər.
Belə bir namuslu nazlı utancaq
Ruslarla döyüşdə tutarmı ayaq?
Cilovu, yəhəri qızıldır, gövhər,
Saf büllur təbəqlər, yaqut qədəhlər.
İşləri içməkdir, kefdir hər zaman,
Bir kərə keçməmiş hərbin yanından.
Gecələr alır xoş qoxudan fərəh,
Gündüzlər içkiylə qaldırır qədəh.
Biz ruslar ciyəri yeyərik bol-bol.
Qızlara yaraşır bu şərab, noğul.
Rumlular, çinlilər döyüşə girməz,
Geyinər qırmızı diba, sarı xəz.
Haqq bizi nemətlə etmiş sərafraz,
Haqq verən bəxşişin önü alınmaz.
Yuxuda görsəydim bu qəniməti
Axardı ağzımın dadlı şərbəti.
Bir deyil, hədsizdir taclar, bəzəklər,
Dənizdə tapmarıq bu qədər gövhər.
Bu zəngin dövləti keçirsək ələ
Bütün ölkələrə düşər vəlvələ.
Padşahlıq edərək dünyanı alaq,
Əsrlər boyunca tacidar olaq."
Atını oynatdı dağın başına,
Bir neçə nəfər də qoşuldu ona.
Əliylə uzağı göstərdi: "Baxın,
Hurilər dünyaya etmişdir axın!
Dərgahı büsbütün gövhər, xəzinə,

İncilər saçılmış silah yerinə.
Yəhərlər büsbütün yaqutla dolu,
İncidir, gövhərdir atların çulu.
Ulduzlu külahlar ucalmış göyə,
Uzun don az qalır ayağa dəyə.
Tirmələr, ipəklər, fərşlər, xalçalar,
Nə əldə nizə, və oxluqda ox var.
Xalxalı qızıldan taxmış ayağa,
Zülfünün ucunu burmuş qulağa.
Hamısı şahanə zinətlə dolu,
Yox gedən ayağı, yox güclü qolu.
Bu əlsiz, ayaqsız nəfərlər neylər?
İskəndər bunlarla ordumu yenər?
Onlara bir iynə batırsan, bişəkk,
Ağızlar açılar bir pəncərətək,
Tarixlə, təqvimlə hərbə gedirlər,
Həsabda bir ayı təxir edirlər[247].
Bu ordu ən qızğın döyüşdə bir az
Əzilmiş kəsəkdən toz da qoparmaz.
Birlikdə hücuma keçsək üz-üzə,
Bu ordu dayanmaz bir həmləmizə."
Zəhmətlə keçinən sadəlövh ruslar
Hiyləyə aldanıb dedilər: "Sərdar!
Nə qədər ki, can var - əmrində varıq,
Bu əhdə, peymana baş, can qoyarıq.
Hər işdə, hünərdə olarıq nəhəng,
Qoymarıq qalsın bu gülşəndən bir rəng.
Bir basqın edərik azğın düşmana
Nizəmiz daşları boyar al qana.
Nizədən qılınca əl atan zaman
Başını keçirər kəməndə düşman."
Rus ordu qəlbini bir ocaq gördü,
Gücündən dağları yupyumşaq gördü.
Döndü ordugaha diləyi zəfər,
Qılıncdan pas sildi, qəlbindən kədər.
O biri tərəfdən şah da oturdu,
Başçı igidlərlə bir məclis qurdu.
Padşahı igidlər almış ortaya,





Bənzərdi dörd yanı ulduzlu aya.
Qədər xan Xətadan, Qur xan Xütəndən,
Dəbis Mədayindən, Vəlid Yəməndən,
Dəvalı Abxazdan, Hindi də Reydən,
Qubad İstəxrdən, Nəsəbi Keydən,
Gilanlı Zərivənd Mazandarandan,
Xavər ölkəsindən Niyal pəhləvan,
Sipənd Xorasandan, Fum da İraqdan,
Bərişad Ərməndən, bu ittifaqdan,
Rumdan, Əfrəncədən, Mısirdən, Şamdan
Hesaba gəlməyən bir çox pəhləvan.
Padişah onları qurtardı qəmdən,
Ümidlər verməklə etdi qəlbi şən.
Dedi: "Düşmənimiz dava görməmiş,
Aslanla döyüşə etməmiş vərdiş.
Quldurluq, oğurluq, bir də yol vurmaq,
Düşmənin mərdliyi, bax, budur ancaq!
Qılıncı görməmiş hər iki əldə,
Bıçağı, nizəni kökisdə, beldə.
Bunlarda tapılmaz kəskin bir yaraq,
Yaraqsız döyüşdə neylər bir qoçaq?
Qarşıya çıxsa bu çılpaq nəfərlər
Biçərik başından göbəyə qədər.
Meydanda başlasam qılınc oyunu
Bağlaram Əlbürzün uca qolunu.
Mənəm əl gəzdirən o uzaqlara,
Can almaq istərkən can verdi Dara.
Kəməndi hiyləylə atdı Keyd mana,
Saldım o kəməndi öz ayağına.
Furun qoşunuyla döyüşə girdim,
Mərdliyimdən ona kafur yedirdim.
Yayım ki, qaşına bir düyün aldı,
Xaqanın yayında giriş boşaldı.
Ruslarla döyüşdən indi qorxmaram,
Onlar bir sel isə, mən də bir dağam.
Xəzər dağından Çin suyuna qədər
Türklərlə doludur bütün bu yerlər.
Bilirəm Rumları sevməyir bir türk,

Rumlara kinləri rusdan da böyük.
Türklərin oxuyla yenə bu zaman
Qabar əskik olmaz rus ayağından.
Zəhər ki, vücuda salır zəlzələ,
Sağalır yenə də başqa zəhərlə[248].
Eşitdim: bir tülkü yırtıcı qurddan
Köpək səsləriylə tapmışdır aman.
Durmayıb iki qurd kin ilə coşdu,
O qoca tülkünün dalınca qoşdu.
Çox zorba itləri vardı bu yurdun,
Qanına susardı tülkünün, qurdun.
Qorxudan tülkücük qopardı fəğan,
İtlərin bəndini açdı ağzından.
İt səsi bürüdü kəndin üstünü,
Canavar sandılar qoca tülkünü.
İtlərin səsindən hürkərkən qurdlar,
Qurtuldu o tülkü, olmadı şikar.
Sınaqlı düşmən də hər işdə belə
Qurtulur düşməndən düşmən əlilə.
Mənim ki, dəbdəbəm ucalır göyə,
Varmı ehtiyacım başqa köməyə?
Hər bağlı qapını açardır açan,
Çarə tapılmazsa, danış qılıncdan."
Başçılar bağırdı baş endirərək:
"Yolunda qanımız tökülsün gərək!
Hər zaman hünərlə işə yaradıq,
İndi biz olarıq ondan da artıq.
Həm hünər göstərmək, həm də mal üçün
Çalışmaq bir borcdur istiqbal üçün!"
Orduya verdi çox padişah ürək,
Ürəksiz bir nəfər olmasın gərək!
Düşündü, daşındı axşama qədər,
Cam ilə qılıncdan neyləsin səhər?!
Üzünü gizlərkən gündüz gecədən,
Keşikçi növbətdə, casus yatırkən,
Hesaba gəlməyən növbətçi əskər
Keçidli yollarda keşik çəkdilər.
Keşiksiz qalmadı qaranlıq gecə,
Keşikdə qaldılar şəfəq sökünçə.





# İSKƏNDƏRİN RUSLARLA VURUŞMASI

Ey saqi, durma, gəl, sevindir məni!
Şəngərflə yoğurmuş odlu civəni
Ver mənə, bəzəyim uca eyvanı,
İşlədim ərinmiş o saf boyanı.
Ey sınaqlı dehqan, dünya görmüş pir,
Ürəyə yatımlı sözləri gətir!
Şah Çindən Rus üstə gələndən sonra
Onu çərxin atı götürdü hara?
Çərx ona nə oyun başladı təkrar?
Nə hiylə işlətdi ona ruzigar?
Tarixin sərrafı, o gövhər satan
Sözləri gövhərlə asdı qulaqdan.
İskəndər elə ki, coşğun rus gördü,
Dünyanı qanadsız bir tovus gördü.
Böyrünü vermədi gecə yatağa,
Durdu bəxt ararkən ulduz saymağa.
Öz ipək fərşini yığınca yerlər,
Teşt ilə, qılıncla oynadı səhər,
O teştdə parlayan qılınc günəşin
Başını kəsərək, gördü öz işin.
Qara örtüsündən qaldırınca baş
Şimşəkli qılınca büründü dağ, daş.
İki ordu deyil, iki dəniz qan,
Qədərcə çox idi dəniz suyundan.
Çapdılar o meydan boyu "qan" deyə,
Qılınclar, bayraqlar ucaldı göyə.
İki meydan boyu polad ayaqlar,
Sıx yerdə dağ kimi tutdular qərar.
Sançıya əmr etdi böyük İskəndər.
Qoşuna san verdi, düzüldü səflər.
O polad geyimdən, almas qılıncdan
İşıqlı günəşə ucaldı duman.
Hər qövmün başında özündən sərdar
Çəkdilər meydanda dağ kimi hasar.
Dəvali və İran pəhləvanları
Sağ qolda yerləşdi, coşdu qanları.

Qədər xan fəğfurlu igidlər ilə
Cəbhənin solunu götürdü ələ.
Cinahda ox atan xas qulamlardı,
Dönüş yollarına qanad salardı.
O polad geyimli fil ən ortada,
Kükrəyən igidlər durmuş arxada.
Filgövdə padişah minbir ümidlə
Minmişdi dağ kimi qızmış ağ filə.
Qarşıda bənizi qırmızı ruslar
Məcusun atəşi kimi parıldar.
Sağ qolu bəzəmiş Xəzran dəstəsi,
Soldan da ucalır Bərtasın səsi.
Alanı arxadan, İsuvi qoldan,
Əzm etmiş baş, boyun qoparsın hər an.
Cəbhənin qəlbində rus kinə dolmuş,
Köksündən İskəndər eşqini yolmuş.
Hər iki tərəfdə səf çəkdi əskər,
Lacivərd göy kimi ucalmış yerlər.
Rusların təblindən doğru həyəcan,
Xəstə bir hindlitək qopardı fəğan.
Göyləri sarsıdan təbil və boru
Yerlərin qarnına salırdı buru.
Zorba türk borusu etdikcə şiddət
Türklərin qoluna gəlirdi qüvvət.
Coşduqca yer yaran at kişnəməsi
Balığa çatırdı yerin naləsi.
Həftğuş əmudların təpiklərindən
Fələyin öküzü qopardı şivən.
Dəldikcə qılınc hər gümüş peykəri
Gümüşdən çıxarır qan danələri.
Dəmirdən keçdikcə üçpərli oxlar[249]
Sanki çəmənlikdən ötürdü quşlar.
Nizədən qamışlıq olmuş yer üzü,
Dağ çökür çuxura yedikcə gürzü.
Tüklərin ucuyla nizə ucalır,
Düşmən öz qanıyla dəstəmaz alır.
Qurd gönündən olan müdhiş təbildən
Qızışır döyüşlər, coşur döyüşkən.





Daşlarda nizə qan çeşməsi açar,
Bir orman göyərdir yay ilə oxlar.
Oxların meyvəsi al güldən nişan,
Güllərin qan damar hər tikanından.
Qalxanı əridən polad nəhənglər
Başını uzatmış, sərkəşlik edər.
Dağlara deşiklər açırdı buxar,
Yerlərin canında bir titrəyiş var.
Rus döyüşməsindən dəhşət çökürdü;
Aslanlar altında atlar ürkürdü.
Əflatun, Fəlatus xalqıtək nadan
O yerdə əskikdi bir aciz rusdan.
Rumlular fələyə ucaltdı bayraq,
Qılıncdan suya bir atəş olaraq.
Havanın boğazı sanki tıxandı,
Dünyanın nəfəsi artıq dayandı.
Nə yerdə yer tapır yeriyən ayaq,
Nə uçan havada tapırdı bucaq.
Ruslardan bir nəfər açdı meydanı,
Bir tülkü papaqlı Bərtas aslanı
Küləyə minmişdi yeriyən dağtək,
Dağ külək belində durarmış demək!
Döyüşmək istədi, suladı meydan,
Özünü öyərək, oxudu dastan:
"Xam dəri geyinən hər bir Bərtası,
Mənim varlığımla qızar arxası.
Pələnglər yırtaram dağlar qaşında,
Nəhənglər yeyərəm sular başında.
Aslantək alışdım sağrı yırtmağa,
Tülkütək baxmaram yağlı quyruğa[250].
Pəncədə kəskinəm, qüvvətdə mətin,
Maral böyrü yırtmaq deyildir çətin.
İçdiyim, tökdüyüm daima al qan,
Geyimim xam dəri olmuş hər zaman.
Nizəm daldan dəysə çıxar göbəkdən,
Sınamaq istəsən, bu meydan, bu sən!
Bir ordu kükrəsə Çin ilə Rumdan
Atəşin alovu ucalar mumdan.

Mənə qandan başqa töhfə gətirən,
Yox olsun elə bir yolçu, döyüşkən.
Kim mənə qaş çatsa qürur edərək,
Zivər yox, al kəfən geyinsin gərək!"
Onun qarşısına şah ordusundan
Çıxdı bir nizəli igid pəhləvan.
Meydanda kin ilə açdılar pəncə,
Çarpışma uzandı hey döyüşdükcə.
Acıqlı Bərtasın son qılıncından
Torpağa sərildi rumlu pəhləvan.
İkinci rumlu da ölüm, kin gördü,
Bərtasın bəxtini çox mətin gördü.
Hindi adlı igid şahzadə vardı.
Hindli qılıncıyla çox baş vurardı.
Qızmış aslan kimi qopardı fəryad,
Cumdu qurd üstünə əlində polad.
Qol kimi sınandı, oldu çox həmlə
Kimsənin taleyi gülmədi hələ.
Acığa dolunca şahzadə Hindi,
Qılıncı düşmənin çiynindən endi.
Başını biçdi o kəsici almas,
Atın dırnağında çırpındı Bərtas.
Ruslardan başqa bir qılınc oynadan
Boynunu ucaltdı əlində qalxan.
Öyünə-öyünə girdi meydana,
Susamışdı sanki düşmən qanına.
Hindi qılıncını endirdi ona,
Ehtiyac qalmadı rus qalxanına.
Çıxdı bir başqa rus qılınc vurmağa,
Göz-gözə gəlincə düşdü torpağa.
Çox igid öldürdü, oldu gün yarı,
Tazitək qovurdu o, ceyranları.
Rusların nəfəsi tıxandı ondan,
Olmadı daha bir qarşıya çıxan.
Vücudu al qana batmışdı daha,
Yüyəni çevirdi tez ordugaha.
Görüncə İskəndər göstərdi hörmət,
Verdi ən dəyərli, yararlı xələt.





Hər iki tərəfdən enərək ordu
Keçidli yollarda keşikçi durdu.
Dan yeri sökərkən saqi qalxdı şən,
Şərabdan torpağa yaqut səpərkən,
Od saçan dəniztək hər iki əskər
Pusquda yenə də kaman çəkdilər.
O qanlı meydana çaparaq təkrar
Aslan yıxmaq üçün ova çıxdılar.
Gurlayan şeypurlar çaldıqca çalır,
Başlardan ağıl, huş, üzdən rəng alır.
Qurd gönlü təbillər etdikcə fəryad,
Ürək yox, yumşalır ən qatı polad.
Səs-küydən titrədi yerin damarı,
Göy atdı nalını, günəş mismarı.
Dikbaş bir eylaqlı susadı qana,
Atını od kimi sürdü meydana.
Vücudu gizlənmiş polad içində,
Ürəyi dünyadan bərk idi kində.
Döyüşmək istədi qızmış filbədən,
Gələn qurtulmadı dəmir gürzündən.
Qorxdu dəhşətindən hər bir namıdar,
O aslan pəncədən baş qaçırdılar.
Bir saat sonra bir acıqlı aslan
Meydana at çapdı öz ordusundan.
Buxara atında qızmış fil kimi,
Atıldı irəli daşqın Nil kimi.
İgid eylaqlıya bağırdı gələn:
"İşıqlı, al günəş çıxdı pərdədən,
Əlində saqitək cam olan mənəm!
Eylaqlı qanından şərab içənəm."
Atı məhmizlədi bitincə sözü,
Yuxarı qaldırdı o, polad gürzü.
Qızmış fil vurduğu kəskin mizraqdan
Fil vücudun başı gəldi ayaqdan.
Eylaqlı toppuzdan oldu sərsəri,
Onun qan tufanı məst etdi yeri.
Onlardan bir atlı çıxdı meydana.
Dağ kimi yanaşdı o dağ yarana.

Aldığı zərbədən oldu yerlə bir,
Əlində çox igid can verdi bir-bir.
Belə baş qoparmaq nəticəsində
Bir qürur göründü hər şivəsində.
Bir çox polad geyim, almaz qılınclar
Qarşıya çıxınca oldular şikar.
Səhərdən ikindi çağına qədər
Olmadı qarşıya çıxan bir nəfər.
Burdu qulağından qazanın qədər,
Yenidən qanlarla qaynadı ciyər.
Ruslardan at çapdı bir gövdəsi fil,
Üzü qıpqırmızı, gözləri bir Nil.
Rumlardan pəhləvan istəyib durdu,
Çox mərdlik göstərdi, mərd başlar vurdu.
Qanını axıtdı kimə yan aldı,
Bir neçə bədəndən şirin can aldı.
Sınaqlı igidin bu bas-kəsindən
Olmadı rumlardan meydana gələn.
Ruma əl tapınca rus aldı meydan,
Filləri süst gördü öz çomağından.
Oynatdı qılıncı, coşdurdu kini,
Öldürdü bir neçə rumlu, çinlini,
Nizəylə boynunu bir az uzatdı,
Qürurla meydanda nizə oynatdı.
Rum qərargahının yaxın böyründən
Atını çapdı bir adlı döyüşkən.
At deyil, bir şahin oynatdı qəşəng,
Yox, qılınc deyildi, asmışdı nəhəng.
Əynində ipəkdən bir çuqalı var,
Başını bir polad dəbilqə oxşar.
Sərxoş ifrit kimi soxuldu hərbə,
Əlində dörd başlı bir kəskin zərbə.
Nizəni qaldırdı rusa baxaraq,
Dedi: "İstəmirsən torpaqda yatmaq,
Bil, mazandaranlı Zərivənd mənəm!
Döyüşdə divlərlə mən əylənənəm.
Ondakı heybətdən rus bir şey qandı,
Səfrası qarışdı, başı fırlandı.





Meydanı daraldı - anladı o kəs,
Bu başqa hərifdir, ona bənzəməz.
Atı oynatmadı, çəkildi geri,
Bildi ki, mərdlikdə yox bərabəri-
Cilovu çevirdi tez ordugaha,
Yel kimi sovuşdu, durmadı daha.
Aslana çevirdi arxa, arxadan
Zərbəni endirdi ona pəhləvan.
Qaçanın belini zərbəsi yardı,
Köksündən dördbaşlı nizə çıxardı.
Uçan at yel kimi keçdi meydanı,
Ruslara yetirdi o əzgin canı.
Tanış, yad qaçaraq tutdular xəbər,
Səlibə dönmüş bir ölü gördülər.
Bildilər döyüşkən, qızmış əjdaha
İgidlər belinə xaç vurdu daha.
Çəkildi arxada, öndə yüyənlər,
Çıxmadı Bərtasdan, rusdan bir nəfər.
Qoşunun nəhayət səbri tükəndi,
Bir rus pəhləvanı dağtək tərpəndi.
Qıntala qohumdu, adı da Kupal,
Fil canlı pəhləvan yanaşdı, dərhal
Girdi bir-birinə iki çarpışan,
Qılınclar oynadı hər iki yandan.
Zərivənd nəhayət bir qılınc çaldı,
Kupal pəhləvanın canını aldı.
Belə bir hünərlə dikbaş ruslardan
Yetmiş nəfərini qırdı pəhləvan.
Acıqlı aslandan qıvrıldı Qıntal,
Ordunu döyüşdə görüncə topal,
Pəhləvan atlandı zireh geyərək
Budağı qılıncdan olan sərvtək.
Atıldı əjdaha yəhər qaşına,
Yüyəni buraxdı meydan başına.
Zərivənd görüncə bu əjdahanı
Kükrəyən buludtək oynadı qanı.
İki iti qılınc çıxdı qınından,
Göy kimi istidən qızışdı meydan.

Pərgar pərlərıtək mərkəzi ölçən,
Biri gec, birisi sürətlə keçən,
Çatıb bir-birinə, girdilər hərbə,
Yaralar açaraq,.vurdular zərbə.
Qazana bilmədi heç biri zəfər,
Çarpışma uzandı gecəyə qədər.
Nəhayət, bir qılınc endirdi Qıntal,
O gəlin bəzəkli igidi dərhal
Torpağa düşürdü qızıl yəhərdən,
Aslan pəncəsində öldü filbədən.
Öldürən girincə düşmən qanına,
Sevincək döndü öz ordugahına.
Bu ışdən sıxıldı böyük tacidar,
Torpağa sərildi gilanlı salar.
Əmr etdi igidi etsinlər rahət,
Adına münasib edilsin xidmət.
O sultan şövkətli şəfəq sökərkən,
Dağa dalğa vurdu Çin dənizindən.
"Qan" deyə, susadı hər iki əskər,
Bisitun dağıtək bayraq çəkdilər.
Dənizdən kükrədi bir bulud peykər,
Hər meşə içından çıxdı bir əjdər,
Nəhənglər nərəsi ucaldı dağa,
Hər yandan axırdı qan dalğa-dalğa.
Filgövdə bir rumlu toppuz əlində,
Qılıncı əlində, oxluq belində,
Döyüşə çağırdı versin imtahan,
Çıxdı sarı kaftan geymiş pəhləvan.
Toppuzu başından vurunca birdən
Rusda nə baş qaldı, nə qol, nə bədən.
Başqası kükrədi, onu da yardı,
Qarşıya çıxandan beyin qopardı.
Qılıncda, qədəhdə, şöhrətli, şanlı,
Fərincə adında, özü alanlı,
Toppuzu çiynində atı oynatdı,
İnsanın başından huşunu atdı.
Bu qapdı toppuzu dolaraq kinə,
O da tez gürzünü atdı çiyninə.





Toppuzlar oynadı göydə yan-yana,
Şiddətlə sarıldı düşman düşmana.
Alanlı döyüşə girdiyi zaman,
Bildi ki, acizdir talesiz düşman.
Toppuzu başından elə endirdi,
Baş, beyin dağıldı, qarnına girdi.
Düşmənin başını salınca yerə,
Qürurla boynunu çəkdi göylərə.
Acıqlı bir aslan Ermənistandan -
Vurub öldürməkdə cəsur pəhləvan.
Adı Şərvə, özü döyüşdə kamil,
Nə aslan tay idi ona, nə də fil.
Hər əldə bir qılınc - nəhəngdən nişan,
Çox nəhəng başını qoparmış aslan.
Alanlı üstünə at səyirdərək
Parlayan qılıncdan oynatdı şimşək.
Fərincə görüncə adlı igidi,
Qalxanı qanadtək çiyninə tikdi.
Şərvə bir qılıncla saldı nəfəsdən,
Çırpındı, can quşu uçdu qəfəsdən.
Eysudan bir məğrur susadı qana,
Atını od kimi çapdı meydana.
Mərdliklə çalışdı, göstərdi hünər,
Şərvəyə aslanlıq nə fayda verər?
Düşmənin heybəti qorxutdu onu,
Bir ağır zərbəyə verdi boynunu.
Cərəm adlı bir dağ Ləzgi dağından,
Əlindən zinhara gəlmiş bu cahan.
İgidin poladdan külahı vardı,
Üzündən, gözündən döyüş yağardı.
Əynində dəmirdən bir geyimi var,
Saf gümüştək yanar, civətək parlar.
Şərvəyə yanaşdı o qızmış aslan,
Gözünü açmağa vermədi aman.
Bir qılınc endirdi aslan Şərvəyə,
İgidin tozunu sovurdu göyə,
Düşməni torpaqda görüncə belə,
Beynini dağıtdı at təpiyiylə.

Boynunu çəkən çox adlı pəhləvan
Oturdu buza o soyuqqanlıdan.
Dəvalı görüncə elə bir gərdən,
Gərdən yox, meydanda gərdənlər yeyən.
İlantək qıvrıldı, istədi yaraq
Düşməni yıxmağa hazır olaraq.
Başına dəbilqə qoyaraq o şir,
Özü Çin poladı, üzü xas dəmir,
Zəhərli qılıncı boynuna saldı,
Saç kimi hörülmüş kəməndi aldı
Atını sardı bir dəmir örtüyə,
Dağ kimi atıldı tez üzəngiyə.
Düşmənin üstünə çapdı gülərək,
Məktəbdən evinə dönən çocuqtək.
Cərəm görən kimi o pəhləvanı,
Qorxdu bu döyüşdən, titrədi canı.
Çətindi o yerdən geri qayıtmaq,
Çarəsiz ölümə boyun qoyaraq,
Dəvalı səmtinə çapdı sürətlə,
Aslanla döyüşdə başladı hiylə.
Dəvalı düşmənin qıvrılmasından
Özünə örkəntək sarıldı yaman.
Ortada çox sözlər keçdi, müxtəsər,
Xeyirçün bir söz də söyləmədilər.
Dəvalı coşunca kinin selindən
Qılıncı endirdi düşmən belindən.
Şığıdı, zəhmətsiz ortadan keçdi,
O ağır qayanı ikiyə biçdi.
Bir sərxoş fil kimi qardaşı vardı,
Qanını almaqçın meydana vardı.
Aldı Dəvalıdan sağalmaz yara,
Çəkildi qardaşı yatan çadıra.
Güldü bəxt o polad arxalı dağa,
Çox ordu qıranı sərdi torpağa.
Codrə adlı bir rus oxudu meydan,
Südəmər ceyrandı ona hər aslan,
Qocaman gövdəli, güclü, döyüşkən,
Meydanda təklikdə bir ordu yenən.





Boynundan asmış çox igid qanını,
Çox boyun çəkənin almış canını,
Qurşaqda düyünü çox möhkəm vurdu,
At sürüb Dəvalı önündə durdu.
Qılınclar oynadı kin ilə dolu,
Bağlandı ayağın qaçacaq yolu.
Sınanmış igidlər çox döyüşdülər,
Burulan qılınclar etmədi əsər.
Rus kəskin qılıncı qaldırdı sağa,
Burdu birdən-birə o polad dağa.
Yardı dəbilqəni, keçdi gözünə,
Vücudu qərq oldu qan dənizinə.
Aldığı yaradan çox süst göründü,
Cilovu qaparaq geriyə döndü.
Başını bağladı, boşaldı yəhər,
O baş sınmasından sındı İskəndər.
Həkimə əmr etdi çatsın haraya,
Sağaldan bir dərman qoysun yaraya.
Çox şəfqət göstərsin köməyə gedən,
Dəvalı sağalsın o xəstəlikdən.
Gecə öz başına örtük çəkəndə
Ay başından düşdü müşkin kəməndə.
Hər iki tərəfdə durdu qaravul,
Orduya milçək də tapmadı bir yol.
Elə ki, ucaltdı günəş boynunu,
Zülmətdən yudu bu çərxin donunu,
Bir daha səsləndi qızmış aslanlar,
Çölü ceyranlara etdilər məzar.
Ətrafa səs saldı zəng, boru, cərəs,
Qan coşur kərənay aldıqca nəfəs.
Fəryada gəldikcə şeypur ilə kus,
Açılır qırmızı güldən Səndərus.
Yenidən meydana çıxdı o Codrə,
Özündə görmədi süstlük bir zərrə.
Qara aslan kimi atını təkrar
Meydanda oynatdı Hindi namidar.
Codrəyə üstünlük göstərdi hər an,
Dəyərsiz yaralar vermədi ziyan.

Nəhayət, qaşına bir düyün aldı,
Codrənin başını yəhərə saldı.
Kam aldı vurmaqla düşmən boynunu,
Atının nalına tapşırdı onu.
Meydanda dolaşdı o igid aslan,
Bir çox pəhləvandan boşaldı meydan.
Vardı bir pəhləvan, adı da Tartus,
Mərdliklə tanırdı onu hər bir rus.
Sanki qıvrılırdı qırmızı ilan,
Qarşıya kim çıxsa alar ondan can.
Hindiyə kükrədi kəskin yel kimi,
Dağlardan tökülən coşqun sel kimi.
Düşmənlə o qanlı toqquşmalarda
Mərdliklə heç biri qalmadı darda.
Nəhayət, rus birdən keçdi həmləyə,
Hindinin tozunu sovurdu göyə.
Qanını canından çəkdi birbaşa,
Axıtdı mey, camı çaldı bir daşa.
Atdı dəbilqəni, bağırdı: "Mənəm
Qorxunc bir əjdaha, aslan yenənəm!
Kim mənə qaş çatsa qürur edərək,
Geyim yox, kəfənə bürünsün gərək.
Mənə Tartus adı vermişdir anam.
Rusların Rüstəmi sayılır bu nam.
Ordunu ayaqdan salmasam, inan,
Dönmərəm geri bu qanlı meydandan."
Hindinin ölümü şaha dəyərək,
Qıvrıldı özünə gəlin zülfütək.
Atını meydana çapmaqdı fikri,
Yenə də əzmindən tez döndü geri.
Mənalı nəzərlə süzdü sağ-solu.
Kim açar ordudan intiqam qolu?
Meydana at saldı igid bir nəfər,
Çinli qılıncından çaxdı şimşəklər.
Coşğun aslan kimi bir uca atlı,
Hünərli, ürəkli, şərəfli, adlı,
Dəmirə batmışdı başdan-ayağa,
Tək ağzı görünür nəfəs almağa.





Dolaşır meydanı baş ucaldaraq,
Oynayan qılıncı şimşəktək parlaq.
Ondakı çaldlıyı düşmən görəli
Qaşının üstündə qurudu əli.
Ruslardan meydana səyirtdi bir at,
Qılınc oynatmağa açdı qol-qanad.
O kəskin qılıncla elə bərk vurdu,
Düşmənin kəlləsi ətəkdə durdu.
Ondan ürəkli bir atlı pəhləvan
Erkək aslan kimi oxudu meydan,
Onun da başını yedi bir yara,
Bir bəla kəsildi bir çox başlara.
Qırx nəfər o qaya arxalı rusdan
Asanca öldürdü döyüşçü aslan.
Hər səmtə dönürdü atı ahəstə,
Rusdan yüzü ölər, yüzü də xəstə.
Hər yana edirdi həmlə bir kərə,
Ruslardan bir ordu sərirdi yerə.
Gördülər nizəsi susamış qana,
Qorxudan çıxmadı kimsə meydana.
Zəfərli bir həmlə edərək axdı,
Yüyəni yelcilov ata buraxdı.
Dağ kimi hər səmtə düşürdü gözü,
Yüzü yara alır, ölürdü yüzü.
İskəndər heyrətlə öydü igidi
"Bu qola, qılınca eşq olsun!" dedi.
Hünərlə döyüşür, düşməyir dara,
Alov yağdırırdı o tikanlara.
Müşk, ənbər səpincə yerə qaranlıq
O igid meydandan qayıtdı artıq.
Günəşi örtüncə dağların qaşı,
Yuxuya gedərkən gündüzün başı,
Qara əjdahatək qaranlıq gecə
Başını balıqdan aya çəkincə,
Zülmətlər yolçunun yolunu tutdu,
O qara əjdaha ayı da uddu.
Atlı əl çəkmədi çalıb çapmaqdan,
Rahatlıqçın döndü geri pəhləvan.

Qaranlıq içində oldu tez nəhan,
Olmadı onu bir görən, tanıyan.
İskəndər o atlı, qoçaq igidi
Bir aslan ürəkli aslan zənn etdi.
Deyirdi: "Doğrudan bu ər oğlu ər
Döyüşdə mərdliklə göstərdi hünər.
Görsəydim üzünü, igidliyinə
Verərdim yüz başı bağlı xəzinə.
Bir bəla kəsildi bu düşmən xalqa,
Mənə öz qolumtək oldu bir arxa.
Coşğun bir aslandı, deyildi insan,
O igid aslana eşq olsun hər an!"
Firuzə rəngli tağ ertəsi günü
Dağ-daşdan ucaltdı yaqut güzgünü.
Alanlı bir atlı döndü aslana,
Qara əjdahatək girdi meydana.
Əlində yetmiş zor igidin gürzü,
Kökündən ayırır qoca Əlbürzü.
Mərd kimi dolaşıb başlar yarırdı,
Fələyin qəlbindən toz qoparırdı.
İran, Rum və Çinin igidlərindən
Çox kişi öldürdü o nər döyüşkən.
Yenə o rus qıran adlı pəhləvan,
At çapdı meydana o qızmış aslan.
Yayına xam göndən bir giriş vurdu,
Ox aldı əlinə, yayını qurdu.
Yay tutan qolunun gücüylə oxdan
Alanlı pəhləvan təslim etdi can.
Sanki bir məkikdir hind qamışından,
İçından ox dəyib keçmiş bir zaman.
Bir pişik gözlü rus alnında qırış,
Acığı aslantək qaşına yığmış.
Döyüşdə tanışdı ona hər yaraq,
Zirehə yüz yerdən vurmuşdu yamaq.
Durdu həm qılınc, həm at oynatmağa.
Polada batmışdı başdan-ayağa.
Meydanda döyüşü sanırdı asan,
Atını yüklədi hər bir silahdan.





Ürəyi daşdan da möhkəmdi, əlbət,
Bilmədi döyüşdə var necə dəhşət.
Silaha təklikdə alışmışdı bu,
Düşmən qılıncından duymamış qorxu.
Əjdaha ürəkli salınca nəfəs,
Aciz bir ov gördü, çıxarmadı səs.
Gördü ki, üstündə çox yarağı var,
Özündən, atından xoşdur çul, paltar.
Başını qılıncla oynatdı yerdə,
Çulundan üzünə çəkdi bir pərdə.
Başqa rus kin ilə at oynatdıqca,
Torpağa sərildi qılınc atdıqca.
Başqa rus yanaşdı kəskin poladla,
Onlara dəyəndən dəydi buna da.
Yayından şığıyan hər kəskin oxdan
Yan verdi yerə bir igid pəhləvan.
O atlı qəhrəman düz on ox atdı,
On igid qəhrəman torpaqda yatdı.
Yenə də görünməz oldu gözlərə,
Qayıtdı igidlər oturan yerə.
Neçə gün o igid hərbə yanaşdı,
Örtülü çıxaraq, açıq savaşdı.
Qalmadı kimsədə cəsarət, hünər,
Döyüşdə onunla dursun bərabər.
Can, qılınc qorxusu çatdı bir yerə,
Az qaldı dağılsın onlar çöllərə.
Namusa dalaraq etdilər səbir,
Hiyləyə uyaraq tökdülər tədbir.
Bir gün bu qoca çərx dövran edərkən,
Bir gövhər çıxardı qır dənizindən.
Meydan bəzənərək səflər düzəldi,
Hər yandan bir igid nərəsi gəldi.
Gurladı çanlar rus ordugahından,
Qalxdı qışqırıqlar göyə hər yandan.
Mərkəzdə ruslar da ordu çəkərək
Səfləri bəzədi gözəl gəlintək.
Atıldı bir köhnə kürklü döyüşkən,
Sanki bir nəhəngdir çıxdı dənizdən.

Piyada, bir parça dağdı gövdəsi,
Beş yüz atlıdan da çoxdu hərbəsi.
Qocaman, qüvvətli pəncəsi vardı,
Almazı sıxsaydı tez yumşaldardı.
Div kimi qan iyi duymuş, qaniçən,
Fırlanmış cəhənnəm dəhlizlərindən.
Ayağında onun boyuna uyar
Həm qalın, həm uzun bir zənciri var.
Sanasan kükrəmiş vəhşi bir aslan,
Kəskin səs-küy ilə dolmuşdu meydan.
O güclü ayağı hər yerə vurur,
Zərbindən açılır dərin bir çuxur.
Dəmirdən əyribaş toppuzu vardı,
Dağların başını dağa dayardı.
Hər yana cumdu bu dəmir toppuzla,
Çox igid öldürdü, sərdi sağ-sola.
O qalın bədənin kobudluğundan
Canı kir bağlamış, qartmaqdır hər yan.
Döyüşmək qəsdiylə girsə meydana
Nə qılınc, nə toppuz kar edər ona.
Belə bir əjdaha atıldı birdən.
Firiştə öldürən, o insan yeyən.
Sanki bir qarınca tutur görüncə,
Qoparır başını o aslanpəncə.
Başqa bir işi yox başlarkən savaş.
Bədəndən gah ayaq qoparır, gah baş.
Tutunca qarşıya çıxan yağını
Qırır gah belini, gah ayağını.
Qocaman gövdəli cəsur bir atlı,
Döyüşdə sınanmış bir yel qanadlı
At sürdü, meydanda ucaltsın boyun,
O qızğın atəşlə oynasın oyun.
Görüncə bu nəhəng onu uzaqdan.
Tutmaqla yırtmağı çəkmədi bir an.
Meydana başqa bir pəhləvan çıxdı,
Bir anda onu da atından yıxdı.
Böylecə əl atar-atmaz çomağa
Bir neçə igidi sərdi torpağa.





Çox ürək yardı o yırtıcı aslan,
Ən cəsur mərdlərin bağrı oldu qan.
Hər ağıl sahibi edərdi heyrət:
Nə insan, nə divdi o zorba xilqət!
Gündüzə səs vurdu qaranlıq gecə
Al günəş başını yerə dikincə.
İskəndər bu işə çox heyrət etdi,
Məclisdə qapalı məsləhət etdi:
"Bəladır bu insan öldürən qoçaq,
Onunla döyüşə acizdir bu xalq.
Silahsız bu adam qarşı gəlirkən,
Silahlı igidlər qaçır önündən.
Nəsilcə, şübhəsiz, bu insan deyil,
Olsa da, bu abad torpaqdan deyil,
Virana yerdəndir, vəhşi xilqəti,
İnsana bənzəyir yalnız surəti."
Orduda tapıldı onu tanıyan,
Baş əydi, təmkinlə dedi: "Hökmüran!
Madam ki, əmr edir adil padişah,
Şahı o vəhşidən eyləyim agah.
Bir dağ var, zülmətə yaxındır qolu,
Tük kimi incədir gedilən yolu.
O yerdə yaşar bu xilqətdə insan,
Tərkibi torpaqdan, gücü poladdan.
Onların əslini doğru bilən yox,
Əslindən, irqindən xəbər verən yox.
Hamısı göygözdür, qırmızıyanaq,
Aslandan da qorxmaz bu acıqlı xalq.
Çox dayanıqlıdır, güclüdür onlar,
Meydanda biri bir ordu dağıdar.
Erkəyi, dişisi dolsa hiddətə,
Dünyanı çevirir bir qiyamətə.
Silahda, döyüşdə sınaqları var,
Savaşdan başqa şey tanımaz bunlar.
Görməmiş onlardan ölən, bir nəfər,
Arabir görünür yalnız dirilər.
Bunların sərvəti qoyundur ancaq,
Hər zaman qoyunla keçinir bu xalq.

Yunladır bunların ticarətləri,
Yoxdur bundan başqa bir sərvətləri.
Kimsədə tapılmaz xəzinə, sərvət,
Bunların var-yoxu samurdur, əlbət.
Ən incə, dəyərli, qara samurlar
Ancaq bu ölkədən, bu yerdən çıxar.
Hər qadın, erkəyin alnında geniş
Kərgədan kimi bir buynuz göyərmiş.
Bunların buynuzu olmasa, inan,
Surətcə seçilməz bu çirkin rusdan.
Baş, sima, təbiət, biçimsiz peykər,
Baxdıqca ən çirkin xoruza bənzər.
Kim yatmaq istərsə - gənc olsun, qoca.
Qonar şahin kimi uca ağaca.
Buynuzu bənd edər qalın budağa,
Div kimi tərpənməz, başlar yatmağa.
Yaxından budağa baxdığın zaman
Asılmış əjdaha görərsən ordan.
Yorğun da olsalar yatmazlar əsla,
Çünki yatmaq ziyan verər ağıla.
O yerə arabir gəlirkən ruslar
Ağacdan asılmış o divə baxar.
Bu yığnaq özünü o divdən gizlər,
Ona yanaşmağın yolunu izlər.
Onu bir kəndirlə salarlar bəndə,
Boynunu çəkərlər dəmir kəməndə.
Möhkəm bağlayınca zənciri, bağı,
Onu əlli nəfər çəkər aşağı.
Əsir olduğundan tutunca xəbər,
Dönər ildırıma, nərildər, kükrər.
Dartınıb qırarsa zənciri, bağı,
Əlindən qurtulmaz onun bir yağı.
Bir ziyan verməsə möhkəm bağına,
Gətirərlər onu rus torpağına.
Açılmaz o qalın zəncir boynundan,
Gəzdirib çox qazanc alırlar ondan.
Onu gəzdirərlər kəndlərdə ev-ev,
Onlara çox sərvət qazanır bu dev.





Ruslarla bir dava düşdüyü zaman
Bu canlı fil ilə qızışar meydan.
Zəncirə çəkilər güclü əjdaha,
Boynundan zənciri açmazlar daha.
Belə od meydana çıxsa, qorxudan
Üzlərdə rəng qalmaz, bədənlərdə can.
İskəndər o bəla haqqında daldı,
Bu dastan beyninə bir ataş saldı.
Dedi: "Bu iş məni qorxudan deyil,
Ox çubuqları bir ormandan deyil.
Bu uca taleyim mənə olsa yar,
O divin başı da nizəmdə oynar."
Şəfəq gün doğandan çıxarınca baş
Qaranlıq Məğribdə gizləndi yavaş.
Şərq şahı orduya verdi yaraşıq,
Ancaq div haqqında fikri qarışıq.
Sağ qolda dayandı rumlu, bərbəri,
Tutmuş Yəcuc kimi sədd-İskəndəri.
Dar gözlü çinlilər solu almışdı,
Onların gücündən yer daralmışdı.
Ordunun qəlbində igid İskəndər,
Atı da altında bir dağa bənzər.
O yanda rus ilə Bərtas və Alan
Harın atlar kimi coşurdu hər an.
Təbillər zənglərlə olmuş həmahəng,
Borular gurlayır məhşər surutək.
Dağ yaran nağara etdikcə fəryad,
Simurğ Qaf dağında salırdı qanad.
Coşduqca şeypurun, neyin naləsi
Tanrıya ucaldı sığıntı səsi.
Çarpışan ordular deyirdi: - Görək
Kimə öz taleyi olacaq kömək?
Yenə də divüzlü, o qızmış aslan
Fil kimi kükrədi, oxudu meydan.
Bir neçə igidi öldürdü yenə,
Bir kimsə çıxmadı onun önünə.
Yenə o zirehli, igid döyüşkən
Şah qərargahının bir tərəfindən

Qılınc oynadaraq hərbə yanaşdı,
Günəşin çeşməsi ondan qamaşdı.
İskəndər tanıdı o mərd igidi:
"Keçən gün vuruşan aslandır" dedi.
İgidin haqqında düşdü təşvişə,
O, əjdaha ilə çıxmış döyüşə.
Dedi: "Çox heyf olsun, belə qəhrəman
Bir divin əlində düşsün ayaqdan."
O igid adlı, o kəskin cilovlu,
O odlara girmiş qəlbi alovlu
Göy yerin başına dolandığıtək
Divin ətrafında dolandı fələk.
Birinci tədbirdə o mətin qaya
Kəskin ox yağdırdı qəlbiqaraya.
Gördü div oxlardan duymayır qorxu,
Oxatan oxundan acığa doldu.
Bir almaz biçimli polad kərpici
Çarpdı o nəhəngə, çatdıqca gücü.
Kərpici dəvəyə çarpsaydı, inan,
Çalatı çıxardı o biri yandan.
Canını sıxdı div öz kürəyilə,
Kərpici əzdi o bərk əmdəyilə.
Bir polad kərpic də atdı yenidən,
Onu da rədd etdi o qalın bədən.
Üçüncü kərpic də qırıldı belə,
Alınmaz çayların önü kərpiclə.
Bildi ki, dəmirdən yoğrulmuş insan
Qorxmayır kərpicdən, qorxmayır oxdan.
Alovlu nəhəngi çəkdi qınından,
Əjdaha üstünə cumdu pəhləvan.
Çiynindən vurunca sarsıtdı onu,
Zənn etdi zalımın yetişdi sonu
Çıxdı tez altından yenə Əhrimən.
Davaya sarıldı iki döyüşkən.
Açıldı, kəsdi div bəxtin yolunu,
Haçabaş dəmirlə bərk tutdu onu,
Yəhərdən qaldırdı o qızmış aslan,
Dəbilqə torpağa düşdü başından.





Niqabın altından doğdu bir bahar,
Lalə yarpağından incə, gülruxsar.
O gözəl başını kəsmək istərkən,
Görüb gül üzünü utandı düşmən.
Gördü ətəyinə düşmüş hörüklər,
Saçını boynuna sardı o dilbər.
Hind oğrusu kimi çaldı xəzinə,
Rumdan çalıb verdi rusun əlinə.
O div əl tapınca pəri dilbərə,
Rusun divlərindən qopdu bir nərə.
Çünki rast gəlmişdi gözəl ceyrana.
Yenə də başladı ceyran ovuna.
Sıxıldı kədərli işdən İskəndər,
İlantək qıvrıldı qəlbində kədər.
Şah dedi: "O qara fili filiban
Coşdursun, kin ilə qızışsın meydan!"
Filban nərə vurdu o qara filə,
Sürdü div üstünə, döndərdi Nilə.
O filayaqlıya vurdu çox zərbə,
O odlu qarurə girişdi hərbə,
Nə dağa qarurə edirdi əsər,
Nə nizə dənizə verirdi xətər.
Görüncə o sərxoş fili əjdaha,
Əlini uzatdı filə bir daha,
Bilirdi: döyüşdə sınanmış fillər
Ancaq xortumundan tutsan yenilər.
Xortumu elə bərk tutdu div insan,
Filə bu şən dünya kəsildi zindan.
Xortumu kökündən qoparıb atdı,
Uca fil dağ kimi palçığa batdı.
Bu qorxunc oyundan qorxdu İskəndər,
Qorxdu ki, bu işdən məhv olsun əskər.
Dedi fərzanəyə gözündə hiddət:
"Məndən üz çevirdi bu bəxt, bu dövlət!
Bəxtim üz döndərmiş, bax bu gedişə,
Bilsəydim girməzdim qorxulu işə.
Ucalar göylərin uğursuz əli,
Nazdan məhrum edər bir çox gözəli.

Şah gətir-götürü sürər az zaman,
Hər ildə bir kərə qızışar aslan.
Dinclik yox, çapmaqdan yoruldu atım,
Beləcə keçəcək bütün həyatım...
Vəziri tədbirlə verdi çox ürək,
Dedi: "Ey şəhriyar, səbr etmək gərək!
Zəfərlə olarsan yenə bəxtiyar,
Sənin həm tədbirin, həm qılıncın var.
Çarəmiz bağlansa qara daşlara,
O daşdan qılıncla taparıq çara.
Elə ki, taleyin qucaqlar səni,
Salarsan bəndə yüz belə fitnəni.
Sənin bir tükünün, şanlı hökmüran,
Dəyəri artıqdır bütün ordudan.
Belədir ulduzlar göstərən əsrar:
Elə ki, düşmənlə şah hərbə başlar,
Bəxtinin gücüylə bu güclü insan
Şiddətlə torpağa verəcəkdir yan.
Doğrudur, bu qaya gövdəli yağı
Vücudca qabadır, bərkdir ayağı,
Gövdəsi tunc kimi olsa da qatı,
Sarsıtmaq olur bu canlı poladı.
Ona kar etməyən qılıncı unut!
Dəmirlə dağılmaz göydəki bulud.
Hünərlə başını gətir kəməndə,
Sal kəmənd altında zəncirlə bəndə.
Ona ox və qılınc etməyirsə kar,
Çünki bərk arxası, qalın gönü var.
O divi zəncirlə edərsən əsir,
Yoxsa bu qılınc, ox etməz bir təsir."
Bu böyük müjdədən uca padişah
Şükr etdi, tanrıya apardı pənah.
Tanrıdan görüncə səadət, kömək,
Atıldı atına, oldu bir şimşək.
Onu Çin xaqanı vermişdi Çində,
Doğmuş böyük Çinin göy tövləsində.
Bir kəmənd istədi, atının başı
Çevrildi o qaraürəyə qarşı.





Saldırdı o qorxunc divə İskəndər,
Necə ki, dağlara bir bulud çökər.
O nəhəng yerindən qımıldanmadı,
Qolunu bağladı İskəndər adı.
Düşməni bağlayan kəməndi birdən,
Çərxi-çənbəritək atdı filbədən.
Boynundan salınca bəndə yağını,
Yer öpdü padşahın mərd ayağını.
Boynundan kəməndə keçincə düşmən,
Div tutan İskəndər vermədi aman.
Kəməndlə aşağı çəkdi boynunu,
Ordugaha doğru sürüdü onu.
O div ceyran kimi yerdə süründü,
Tazı qarşısında ceyrana döndü.
Elə ki, qüvvətli o vəhşi maral
Düşməkdən, qalxmaqdan əzildi, dərhal
Padşahın ordusu qopardı nərə,
Yüksəldi səsləri uca göylərə.
Təbillər gurladı, o coşğun səsə,
Uyaraq, yer-göy də başladı rəqsə:
Elə ki, İskəndər bəxtin gücüylə
Divqılıq insanı gətirdi ələ,
Oturtdu düşmənlər oturan yerə,
Qoşdu zindanında yatan divlərə.
O igid padşahın bu qüvvətindən
Ürkərək, qorxuya düşmüşdü düşmən.
Rus şahı Qıntal bir yumşaq mum oldu,
Rum şahı İskəndər nəşəyə doldu.
Yenidən başlandı məclis çalğısı,
Açıldı dünyaya şənlik qapısı.
Dinlərkən çalğını o məclis boyu,
Qədəhdə qaldırdı gül rəngli suyu.
Andıqca talein səadətindən
O gülgün şərabı içirdi şən-şən.
Gecə göy qıfılı xəznəyə vurdu,
Müşkü kafur çəkən tərəzi qurdu.
O müşkin badəni içir hökmüran,
Mütrüb o pərdədən çalardı hər an.

İçirdi ərinmiş ləli qədəhlə,
Dinlərdi o yeni ləli fərəhlə.
İçdikcə ürəkdən silindi kədər,
İstəyən kimsəyə saçardı gövhər.
Məclisdə hər yandan qissə dinlərkən
Bir çox şey soruşdu hər bir qissədən.
Yenidən söz açdı ulu hökmüran
Atı yel qanadlı qılınc vurandan:
"Bilmirəm, onu bu div gövdəli şir
Öldürdü, yoxsa ki, götürdü əsir.-
Qalırsa, bəndini tez qırmaq gərək,
Nizənin gücüylə qurtarmaq gərək!
Getmişsə, getmişi olmaz unutmaq,
Onu bir qədəhlə gəl xatırlayaq!"
İçkidən beynində qan alovlandı,
O zindan xalqına ürəyi yandı.
Əmr etdi o dilsiz əsiri yenə
Alsınlar padşahın şən məclisinə.
Padşahın əmriylə o bağlı nəhəng
Məclisdə dikəldi uca bir dağtək.
İskəndər gücüylə vücudu əzgin
Məclisdə göründü solğun və qəmgin.
O dilsiz ağrıdan yaman inlədi,
Əz dilsiz tövrüylə şəfa dilədi.
O vəhşi divgövdə inləyincə zar
Dilsizə acıdı uca tacidar.
Yerindən əmr etdi o divlər yenən
Zənciri açdılar divin əlindən.
Buraxdı başına onu hökmüran,
Bu azad etməkdən görmədi ziyan.
Əz böyüklüyüylə onu oturtdu,
Yedirtdi, içirtdi, hörmətli tutdu.
Bir neçə qədəhlə onu yar etdi,
Meylə öz qəlbini aşikar etdi.
Kəlləsi qızınca sərxoş çağında,
Kölgətək süründü taxt ayağında.
Kimsəyə isinməz vəhşi qəlbilə
Ona dost olanı tanıdı belə.





Tələsik dışarı çıxdı məclisdən,
Güclünün olmadı tozunu görən.
İskəndər heyrətlə düşdü təşvişə,
Hər kəsdən bir fikir sordu bu işə.
Şərabdan olunca bunun könlü xoş,
Nə üçün məclisdən çıxdı bu sərxoş?!
Dövlət böyükləri qaldılar heyran,
Hər biri bir fikir eylədi bəyan.
Birisi dedi: "Bu vəhşidir hələ,
Zənciri açınca üz qoydu çölə."
O biri dedi: "Mey edincə əsər,
Buradan çıxınca evinə gedər."
İskəndər məclisdə gizlin, ya açıq
Söylənən sözlərə dinmədi artıq.
Düşündü, fələyə əyərək boyun,
Gecə pərdəsindən doğar nə oyun?
O qədər keçmədi, o fil gövdəli
Girdi əllərində bir gəlin beli.
Şahın qarşısında qoydu şəfqətlə,
Diz çökdü, torpağı öpdü hörmətlə.
Gətirdi belə bir gözəl şikarı,
Yenə də məclisdən çıxdı dışarı.
Bu işdən heyrətə düşdü hökmüran,
Gördü yar belinə sarılmış ilan.
Padşahdan utandı o nazlı mələk,
Çəkdi ətəyini üzə duvaqtək.
Görüncə o parlaq ayı padişah,
Əmr etdi: yadlardan boşalsın dərgah.
İskəndər çadırı xəlvət edərkən,
Əliylə niqabı çəkdi üzündən.
Gördü bir afətdir xəyaldan uzaq,
Bir nur qaynağıdır günəşdən parlaq.
Bir pəriəndamdır olduqca incə,
Pəritək əlinə keçmiş bu gecə.
Cəhənnəm görmüş bir əndamı gümüş,
Malikdən qaçaraq cənnətə düşmüş.
Sərvtək yaşıldır başı hər zaman,
Qızılgül rəngini borc almış ondan.

Atdıqca o qəmzə oxunu təkrar,
Bir neçə ruhları edirdi şikar.
Dodağı bazara salır fitnələr,
Üstünə tökülmüş xalvarla şəkər.
Açılmış səməndir onun qucağı,
Güllərə örnəkdi dilbər yanağı.
İskəndər elə bir ayı gördükdə,
Önündə canlandı sanki bütkədə.
O azad qamətli kəniz önündə
Özünü gördü ən aciz bir bəndə.
Kəniz ki, ağalar qul olur ona,
Bax, necə ürəklər düşər toruna!
Bildi Çin hasarlı bu gözəl şikar
Xaqandan verilmiş ona yadigar.
Meydanda mərdliklər görmüşdü ondan,
İgidlər demişdi: Bu qızdır aslan!
Acındı əlindən çıxan gəlinə,
Sonra bu nə sayaq düşmüş əlinə?
- Halını aç, - dedi, - ey şəkərpara!
Dediyin dastanla könlümü ara!..
O gözəl, pərəstiş edən, sevimli,
Padşaha baş əydi, açıldı dili.
Duaya başladı: "Ucalsın baxtın,
Bar olsun dünyada bu tacın, taxtın!
Dünyaları açan cahangir sənsən,
Haqq səni yaratmış ədl ilə dindən.
Şövkətin gündüzdən daha aşikar,
Dövlətdən ürəyin daha xoşrəftar.
Səndəndir qurtuluş ümid gününə,
Günəşin işığı səndəndir yenə.
Ordular dağıdan hökmüdarlar var,
Biri qılınc vuran, biri tacidar.
Günəşsən, tək doğmuş səni ruzigar.
Həm kəskin qılıncın, həm də tacın var.
Məclisdə dünyanın hökmüranısan,
Döyüşdə zamanın pəhləvanısan!





Mən kimi torpaqda varmı o qüdrət,
Həyatın suyilə olsun həmsöhbət?
Kimdə var cəsarət dinsin hüzurda,
Zöhrə də həyadan əriyər burda.
Uğursuz qəziyyəm şərhə yaramaz,
Madam ki, deyirsən, söyləyim bir az:
Mən haman kənizəm, ey şahım, inan,
Bakirə qızlardan seçmişdir xaqan,
Dərgaha verərkən dedi: - Ey sərvər,
Bu sandıqda vardır gizlin incilər!
O sözü çox ağır göründü sənə,
Acıqlı nəzərlə baxdı şah mənə.
Pərdənin ardında oturtdu səssiz,
Anmadı bir dəfə, unutdu təmiz.
Olduqca sıxıldım, padşahdan uzaq,
Davaya cəlb etdi məni sıxılmaq.
Padşahın bəxtiylə o ilk döyüşdə
Hünərlər göstərdim tək bir dönüşdə.
İkinci gün yenə qopardım nərə,
Bir bəla kəsildim düşmən əsgərə.
Taleyim olmadı üçüncü gün yar,
Döyüşdə düşmənə oldum giriftar.
Nə düşmən? Kin ilə kükrəyən nəhəng!
Surətdə tanrının qəhrindən örnək.
O zalım əjdaha keçdi qanımdan,
Orduya götürdü o qorxunc insan.
İnsafsız ruslara tapşırdı məni,
Söylədi: "Gizlədin bu xəzinəni."
Yenə də durmadan meydana qaçdı,
Filləri yıxmağa kəskin qol açdı.
Elə ki, taleyin səni ucaltdı,
O divi fil kimi torpağa atdı.
Taleyin çəkincə səni zəfərə,
O gücdən ucaldı başım göylərə.
Gördüm ki, div çəkir qıvrımlı bəndin,
Bəlanı özünə çəkir kəməndin.

Sağ qılınca yenə o müdhiş əjdər,
Qıvrıldım, qəlbimi sıxdı bir kədər.
Lakin kəməndinə bu div düşərkən
Gül kimi açıldım, qurtuldum qəmdən.
Rusların dərdləndi şən könülləri,
Xeyritək saraldı qızıl gülləri.
O gecə vəhşilər başlarkən işə,
Hər yoldan keçəni saldı təşvişə.
Kəndirlə bağlandı əlim, ayağım,
Qaranlıq yer oldu mənim otağım.
Ahəngi, söhbəti xoşa gəlməyən,
Mənə bir orduydu qarovul çəkən.
Gecədən bir qədər keçdiyi zaman
Qarışıq bir səs-küy qopdu bayırdan.
İçəri bir bulud girdi qapqara,
Göydən daş yağdırdı qarovullara.
Rəqiblər o gecə çəkirkən keşik
Qorxudan hər biri aradı deşik...
Hey başdı, qoparıb çırpırdı daşa,
Yainki vurardı başqa bir başa.
Bədəndən o qədər qoparmışdı baş,
Başlardan qurmuşdu uca bir dağ, daş.
Yerimdən quş kimi qaldırdı haman,
Açdı zəncirləri əl-ayağımdan.
Taxtının yanında qoyuldum yerə.
Başımı qaldırdı yerdən göylərə.
Zindanda dustaqdım bir xəzinətək,
Bu gündən gərəkdir şən həyat sürmək.
Bəzəklə gözəldir qadın ayağı,
Qadına yaraşmaz zindan otağı.
Bax, belə düşünür coşğun ürəyim,
Yuxumda görünür bu şən diləyim."
Pəri qız halını şaha söylərkən
Padişah gül kimi açıldı birdən.
Bir öpüş aldı o gül dodağından.
Qul kimi söylədi ona hökmüran:





"Ey tozsuz, şən çiçək, ey gözəl dilbər!
Tanrı sevgisinə bürünmüş peykər!
Eşqinə əzm etdim səni görəli,
Ey məclis bəzəyi, meydan gözəli!
Meydanda səni bir can alan gördüm,
Ürəkli, güclü bir pəhləvan gördüm.
Səsin də gözəldir sənin özüntək,
Bu iki hünərdə tək yarandın, tək!
Qalx, mənəm hərifin, çal, ey canlı saz.
Könlümü sazınla şənləndir bir az!"
Sazını zövq ilə çaldı o pəri,
Mizrabla oynatdı incə telləri.
Ən yeni bir mahnı başladı şən-şən,
Oxudu pəhləvan nəğmələrindən:
"Padşahım, sərvərim, tacım, şövkətim!
Ey ağıl mədəni, ağıl dövlətim!
Gənc başın olsun hər töhmətdən uzaq,
Saf qəlbin görünsün çeşmədən parlaq.
Taleyin gənc olsun, fikrin bəxtiyar,
Dünyanı fəth edən güclü tacidar!
Vücudun dincliyə əzm etsin sənin,
Pak olsun çirkabdan, kirdən ətəyin!
Hər yerə üz tutsan yaxşı-yamandan,
Arxan ağlın olsun, kömək yaradan!
Elə ol, ulduzun kamınca dönsün,
Adına baş əysin dünya büsbütün!"
Sonra öz sirrini açmağa durdu,
Sazında ona bir işarə vurdu:
"Ən gözəl bir ağac girdi bir bağa,
Çöhrəsi döndü bir işıq - çırağa.
Bostanda açmamış qönçə bir çiçək,
Çəməndə yuxulu nərgiztək qəşəng.
Qədəhlə al meydir, kimsə içməmiş,
Təzə bir incidir, ələ keçməmiş.
Umardı şikardan dönər tacidar,
O qönçə çiçəyi edər bəxtiyar.

Ağ bahar qırmızı, təzə gül dərər,
Gah bidmüşk, gah qızıl bir lalə görər.
Girməyə şah fürsət tapmadı bağa,
Bir nəzər salmadı işıq - çırağa.
Ah, neçin belə gül, belə şən bahar
Gülməsin, soldursun onu xəzanlar?
Qorxuram, bu xəzan girsə bu bağa,
Belə bir baharı sərsin torpağa!"
Yar səsi duyunca o poladbədən
Bir aşiq naləsi qopdu qəlbindən.
Çalğısı, xoş səsi edərkən əsər,
Onun gül üzündən verirdi xəbər:
"Qızıl üz, incə söz, nə dilbərdir bu?
Haramın olmasın belə arizu!"
Nüktəni duyunca şanlı döyüşkən
Oldu o istəkdən dilək istəyən.
Düşməni yenməyi aldı nəzərə,
İstəkdən əl çəkdi, sığındı səbrə.
Mey tələb etməyi münasib gördü.
Mənzilə bununla azıq götürdü.
Qədəhi mey ilə doldurdu yenə,
İçdi o gülüzlü qızın eşqinə.
Bir cam da xoş içim yaqutla silə,
"İç" deyə, verdi o dodağı gülə.
Qədəhi dodağa götürdü mələk.
Öpərək qaytardı, aldı öpərək.
Bir əli qədəhdə dilbər gözəli,
Zülfüylə oynardı o biri əli.
Gah öpüş vurardı cam dodağına,
Gah dişləK o gülün xam dodağına.
Nəşəli məclis ki, kədərdən boşdur,
Acı mey və şirin noğulla xoşdur.
Aldılar badəni gülgün dodağa,
Girdilər nəhayət isti yatağa.
"O dilək evindən uzaq ol, uzaq!"
Deyərək, öpüşə uydular ancaq!





# İSKƏNDƏRİN RUSLARI MƏĞLUB ETMƏSİ

Saqi, ver o müşkin şərabdan bir an,
Qandan rəng vermişdir o meyə dehqan.
Mənə ver, əlimə düşəndə çünki
Mənə də rəng verir şərabın rəngi.
Səhərin ordusu ələm çəkincə,
Gecənin hərfinə qələm çəkincə,
Dünyanı parladan günəş nurundan
Sövda qucağında ayıldı cahan.
Bağırdı dan quşu kəskin ötərək,
Sərsəm nur, dəli div, şeytan görəntək.
Şah qalxdı yuxudan azacıq küskün,
Könlünün qəmini sildi büsbütün.
İbadət evində düşdü səcdəyə,
Şükr etdi, yalvardı: "Ey tanrı!" deyə.
Uca pənahından dilək istədi,
Ondan gah qüdrət, gah kömək istədi.
Üzünü torpağa sürtdü bir qədər,
Zirehi çirmədi, bağladı kəmər.
Taxtı fil üstündə oldu bərqərar,
Parladı fərsəxlər boyu qılınclar.
Keçən günlər kimi yenə İskəndər
Ordunu bəzədi, düzüldü əskər.
O geniş çöllərdə böyük tacidar
Ordudan dağ kimi çəkdi bir hasar.
Bərkitdi hasarın sağ-sol qolunu,
Poladla tozun da kəsdi yolunu.
Qürurla ruslar da o biri yandan
Ordunu sazladı, bəzəndi meydan.
Rusların canları kinlə gurlayır,
İntiqam odundan beyin qaynayır.
Nizənin, qılıncın şimşəklərindən,
Başdan ağıl çıxır, əllərdən yüyən.
Dağların beynini süpürmüş yaylar,
Ordular üstündə oxlar vıyıldar.
Baş, boyun qoparan polad toppuzdan
Beyinlər tökülür qanlı ağızdan.
Fil yıxan mızraqlar dolunca kinə

Donunu çərx atdı Nilin küpünə.
O çibin qanadlı incə qılınclar
Qartal qanadını qüvvətdən salar.
Çevrilmiş tas kimi iti süngülər
Qotazın üstünə bir tas qan tökər.
Atların dırnağı əqiqdi qandan,
Yəhəraltılar da qandan al-əlvan.
Nizələr qalxana ulduzlar düzər,
Qalxandan qalxana düşər kölgələr.
Dəmir, kərpic qırmış o qədər insan,
Yer üzü kəsilmiş bir məzarıstan.
Baş üzən, leş, cəmdək yeyən qılınclar
Çölləri qan ilə etmiş laləzar.
Nizələr döşləri tikmiş iynətək,
Oxlardan öyrənmiş qayçı işlətmək.
Hər qılınc əjdaha kimi başını
Qınından çıxarıb, çatır qaşını.
Yollarda o qədər tökülmüşdü can,
Məhşər bazarına dönmüşdü meydan.
Ruslar hər tərəfdə göstərir hiddət,
Rumların başına açır qiyamət.
Soxulmuş rum ilə rus bir birinə,
Bənzər ağ, qırmızı donlu gəlinə.
İskəndər meydanda qızmış aslandı,
O əli silahlı bir pəhləvandı.
Meydanda bağırır necə bir aslan,
Zirehli fil necə oxuyur meydan.
Şah haman fil ilə aslana bənzər,
Filin də, şirin də yolunu kəsər.
Hər qılınc tutana vurunca nərə,
Başını qılıncla salırdı yerə.
Əbbasi çətritək örtərək qara,
Bərtasın tasını vurdu daşlara.
Üzəngi və qılınc gücüylə hər an
Saysız baş qopardı sağdan və soldan
Nə özü tərpənir yerdən, nə əsgər.
Vuruşur taleyi gülənə qədər.
Bəlinas parlayan üstürlab ilə
Çalışır xoş tale keçirsin ələ.
Olunca uğurlu iqbal aşikar,





Şah qılıncı oldu dünyaya açar.
Dedi: "Dur, taleyin sənədir kömək,
Bu qanlı meydanda sənindi dilək!"
Nil kimi axdı şah öz sol-sağına,
Başları fırlatdı fil ayağına.
Ağzını açaraq odlu əjdaha,
Ruslara şah basqın etdi bir daha.
Padşaha üz verdi səadət, zəfər,
Əzdilər Qıntalı, üstün gəldilər.
Bu son şanlı zəfər gəlincə ələ
Düşməni oynatdı bir həmlə ilə.
Qaçmağa başladı basılan yağı,
Dünya İskəndərə verdi şahlığı.
Filbədən əl atdı uzun kəməndə,
Qıntalın başını keçirdi bəndə.
Ruslardan kin ilə tökdülər çox qan,
Çox oldu tutulan, ölən, asılan.
Çox can, baş itirən qırmızı ruslar
Qırmızı rəngini itirdi naçar.
Ruslardan, Bərtasın aslanlarından
Əsir düşdü yüz min qılınc oynadan.
Qalanlar yem oldu ac qılınclara,
Fitnəyə ölümdən başqa yox çara.
Soyulmuş, talanmış azca bir miqdar
Salamat qurtarıb geri qaçdılar.
O qədər qənimət aldı İskəndər,
Olmadı sayını bilən bir nəfər.
Hədsiz qızıl, gümüş, xəz, inci, gövhər,
Tövlələr dolusu canlı dəvələr.
İskəndər düşmənə çalınca zəfər,
İşləri oldu şux lövhədən dilbər.
Endi öz atından "zəfərdir" deyə,
Bildi ki, qovuşmuş bütün diləyə.
Üz sürtdü torpağa, dedi: Ey rəhbər!
Mən qara torpağam, səndəndir zəfər!"
Dedi: "Haqq vermiş bu böyük zəfəri",
Yoxsula payladı xəzinələri.
Dünya boşalınca kinli düşməndən,
Dincəlmək fikrinə düşdü hökmüran.

## NÜŞABƏNİN XİLAS EDİLMƏSİ

Qalx, saqi, saf gövhər saçan camından
Mənim tərkibimə gövhər saç bir an!
Onunla islansın quru can tası,
Gövhərlə silinsin gövhərin pası.
Elə ki, Feyləqus oğlu İskəndər
Dincəldi, üzünə gülüncə zəfər,
O yerdə aradı eylə bir məkan,
Oturan kəslərə verməsin ziyan.
Ağacı tubadan olsun sevimli,
Süsəndən sərt olsun otunun dili.
Axan saf çeşmələr versin səs-səsə,
İçimi mey kimi, mey halal isə.
Ətəyi yamyaşıl, ox ormanlığı,
Hər yandan bürümüş budaq budağı.
Bu suda, havada pərvəriş edən
Hər ağac uzundu əlli ərəşdən.
Belə yer keçincə ələ, tacidar
Tutdu bu mübarək bucaqda qərar.
Qurdu Rum büsatı şən əməllərlə,
Şənlıyə başladı şux gözəllərlə.
Məclisdə şahlarla doldu dörd yanı,
Nəşəylə qaynadı məclisin canı.
Əmr etdi: "Qənimət saxlayan ərlər
Qarətin sayından versinlər xəbər!
Rus, Bərtas və başqa xalqdan alınan
Silsilə dağ kimi xəzinə, saman.
Katiblər hesaba etsinlər diqqət,
Öyrənsin nə qədər vardır qənimət".
Qənimət çəkənlər durmadı daha,
Qədərsiz qənimət çəkdi dərgaha.
Açıldı hər başı bağlı xəzinə,
Baxdıqca fərəhdən çırpındı sinə.
Yüklərdə o qədər daş, gövhər vardı,
Sayı yox, sayanlar hey yanılardı.
Saf mədən qızılı, civə gümüşü,
Məhtabı işıqdan salır görüşü.





Batmanla zəbərcəd, xalvarla gövhər,
Qızıl qalxan, nəhəng donlu zirehlər.
Xüsusi toxunmuş mitqal və kətan,
Silsilə dağ kimi qalanmış hər yan.
Zər ilə işlənmiş qədərsiz paltar,
Ulduztək parlayan saysız qalxanlar.
Qılınc, tüklü dəri dağ kimi durur,
Saya gəlməyirdi zil qara samur.
Saf qaqum o qədər yüklənmiş, görcək,
Nə saymaq mümkündür, nə də söyləmək.
Al tülkü dərisi, sincablar parlaq,
Hələ nal görməmiş bir ilxı daylaq.
Saf vaşaq dəridən məclis olur şən,
Gündüzə xal düşmüş qara gecədən.
Bunlardan başqa çox xəzinə, saman,
Ürək sıxılırdı onu saymaqdan.
Padişah baxınca o dərilərə
Bir cənnət baharı gəldi nəzərə.
Onları tanıdı bir-bir hökmüdar,
Hər mətah nə kimi işə yarayar.
Gördü parça-parça sincabla samur,
Eləcə üst-üstə tökülmüş durur.
Ən başda asılmış bir köhnə dəri.
O qədər köhnədir getmiş tükləri.
Nəzərdən keçirdi o dəriləri,
Bilmədi nədir o asılmış dəri.
Sordu ki: "Bu köhnə dərilər nədir?
Nə kimi bəzəyə bunlar əl verir?"
Çox incə bir cavab verdi rus ona:
"Gördüyün mətahlar borcludur buna!
Dəriyə xor baxma, "köhnədir" deyə,
Dəyərli sərvətdir bizim ölkəyə.
Zahirdə çirkinsə bu köhnə dəri,
Bizcə hər dəridən çoxdur dəyəri.
Hər bir dəri yığan çıxsa bazara,
Bazarda bu tüksüz dərıdır para.
Sabit deyilsə də bu sım ilə zər,
Çünki dövran onu tez-tez dəyişər.

Bizim sikkəmizdir bu köhnə dəri.
Tük qədər əksilməz bunun dəyəri".
Bu işə çox heyrət etdi tacidar,
Bu əmrə, bax, necə boyun qoydular.
Vəzirə söylədi: "Hər bir dövlətin
Qolunu siyasət etmişdir mətin.
Bax, nələr yaradır xalq siyasəti.
Dəriyə verir bir qızıl qiyməti.
Bu yerdə gördüyüm bütün şeylərdən
Yalnız mən bu işə deyərəm əhsən.
Bu xalqda olmasa belə bir gövhər,
Bu yerdə bir şəxsə kim boyun əyər?
Hər kim etməmişsə bir hünər izhar,
Yalnız bu hünərlə rus şahlıq qurar."
Vurulunca başa qənimət günü
Yerinə yetirdi haqqın şükrünü.
Tanrının şükrünü edincə tamam,
Məclisi bəzədi, ələ aldı cam.
Xoş nəğmə, dadlı mey edincə əsər
O bahar buludu yağdırdı gövhər.
Ordunun çalışan böyüklərinə
Xalvarla dağıtdı ipək, xəzinə.
Qızıl paylamaqdan daşdı var, dövlət,
Hamıya yenidən payladı xələt.
Orduda qalmadı kəcavə çəkən
Məfrəşi olmasın xaradan, zərdən.
İstədi o dili bağlı kişini,
Zənciri açılmış çöllü vəhşini.
O dağ, daş dolanan çöllü yetişdi,
Şahın qarşısında səcdəyə düşdü.
Heyrətlə süzdü şah başdan-ayağa,
Başını oynatdı o mətin dağa.
Verdi çox hədiyyə o canavara,
Dəyərli çox daş-qaş, gümüş, zər, xara.
Rədd etdi ki, belə sərvət, xəzinə,
Ey şahım, nə gərək bu çöl əhlinə?
Bir qoyun başını atdı oduntək,
Göstərdi ki, mənə bu qoyun gərək!





Padişah əmr etdi: yeməli olan,
Çöllərdə bəslənmiş kök qoyunlardan
Bir sürü verdilər, aldı o kişi,
Padşaha təşəkkür edərək vəhşi
O böyük sürünü önünə saldı,
Sevinclər içində evə yol aldı.
Qəlbaçan, quşların oynağı olan
Bu yeri bəyəndi böyük hökmüran.
Dünyada alırdı çalğı, meylə kam,
Çərx ona baş əyib verirdi salam.
Şərabdan o sərxoş olduğu zaman
Üzü rəng alırdı gül rəngli sudan.
Rusların şahını çağırtdı bir də,
Oturtdu onu ən layiqli yerdə.
Zənciri açdırdı o uca şövkət,
Verdi saf qızıldan toxunmuş xələt,
Ürəkdən bir bəndə oldu padşaha,
Öz keçmiş kinini unutdu daha.
Zindandan buraxdı bütün əsiri.
Xələtlə ucaltdı, açdı zənciri.
Ruslara əmr etdi: "Gəlsin Nüşabə!"
Onsuz əl vurmadı gülgün şərabə.
Padşahın əmrinə tələsdi ruslar,
Günəşin yanında ay tutdu qərar.
Gəldilər zülümdən solmuş gözəllər,
Bəyənmiş olduğu bir dəstə dilbər.
Nüşabə bəzəndi şux geyimlərlə,
Döndü ilk baharda açılan gülə.
İskəndər talandan saçdı xəzinə,
Təzədən bir gəlin bəzədi yenə.
Kamınca mey içdi bir neçə gecə,
Bəxtiyarlıq günü sona yetincə,
Verdi Dəvalıya qızın əlini,
Nigahla bağladı ona gəlini.
Bu mübarək ayın yetincə başa
Verdi çox xəzinə, tutdu daş-qaşa.
Şövkətlə göndərdi yenə Bərdəyə,
O gözəl ölkəni ucaltsın deyə.

Ölkəni təmirə sərvət, mal verdi,
Yol xərci bir yana, çox cəlal verdi.
Elə ki, işlərə verdi intizam,
Etdi igidlərə böyük ehtiram.
Verdi rus şahına yenidən tuğ, tac,
Ancaq əmr eylədi: göndərsin xərac.
Öz doğma yurduna dönüncə ruslar,
Qıntal öz taxtında oldu bəxtiyar.
Bir daha çıxmadı onun əmrindən,
Hər zaman yad etdi şərab içərkən,
O yaşıl çəməndə hər gün tacidar
Gah şənlik qurur, gah edirdi şikar.
Uca sərv altında çalğı səsiylə,
Qədəh qaldırırdı ney naləsilə.
Könlü şad olduqca çox şənlənirdi,
O coşğun ürəyi fərəhlənirdi.
Padşahlıq, şən tale, ömür, qönçə gül,
Neçin şad olmasın belə bir könül?!

## İSKƏNDƏRİN ÇİNLİ KƏNİZLƏ ŞƏNLİK ETMƏSİ

Saqi, ol xəyallı şərab ilə dur,
Kəhrəba rəngli bu saxsını doldur!
Bu qara torpaqdan süzülən gövhər
Şənlətsin qəlbimi, qalmasın kədər!
Gündüzdən daha şux, parlaq bir gecə!
Günəşdən aydındı, işıq və incə!
Bu yaşıl künbədin şənliklərindən
Şən, zümrüd körpələr doğurur çəmən.
Əsrarlı ulduzlar dönmüş çırağa,
Ağ gümüşdən rəqəm yazmış torpağa.
Bu qorxunc hərfləri bilən, oxuyan,
Tutarmı bu sonsuz köhüldə məkan?
Dünyada çalışmaq boş şeydir, ancaq
Ruzini səy ilə olmaz artırmaq.
Kədərə dəyməz bu dünya, şən keçin!
Kim deyər bu saray tikildi qəmçin?





Şənlikçin yaranmış dünya, bunu bil!
O zillət, fəlakət ocağı deyil!
Bu zəhmətli yerdə çox tutma qərar,
Bu dibsiz quyudan yükünü çıxar.
Ver şənlik meyini, can qurban ona!
İçək, həm də verək başqalarına,
Gün keçdi, sabah da gəlməmiş ələ,
Yalnız bu gecəni şən keçir hələ.
Bu gecə keyf ilə ömür sürərik,
Sabahın işini sabah görərik.
Hələ qəm çəkilməz xəzəl gəlməmiş,
Məzara girilməz əcəl gəlməmiş.
Yalnız şənlik gərək, nuş edərkən mey,
Şərab məclisində yox başqa bir şey!
Özünü zillətdə tutmaq nə gərək!
İl boyu qəm, kədər udmaq nə gərək!
Girmə bu dünyanın kəc qapısından,
Heçlikdən bir fayda görərmi insan?
Fil ayaq altına bizi almadan
Dur köçək bu yurddan, yeriyir karvan!
Gəl yeyək var-yoxu özgə yeməndən!
Zövq alaq başqası qarət etmədən.
Elə bir qazanclı maya al ələ,
Köçürkən keçmişlər almış özüylə.
Qorx sən bu bac alan, yol vuranlardan,
Yolda var-yoxunu edərlər talan.
Yoxsula ver nəyin varsa, çox, ya az,
Yoxsul daxmasını kimsə aramaz.
Görmürsən, bac verən bu dövlətlilər
Yoxsul dəhlizindən qaparaq verər.
Eşq olsun ən doğru düşünən mərdə,
Varına yer verdi xərabələrdə!
Bir günlük tarixi vardır bu çərxin,
Yüz illik xəznəni gizlətmək neçin?
Gəl, otur üz-üzə, edək şadlıq biz.
Edək bir gecəlik Keyqubadlıq biz!
Gəl, otur, ömürdən bu gün kam alaq,
Dünəni, sabahı xatırlamayaq!

Çəkinək faydası olmayan şeydən,
Bu işdən heç məmnun deyil düşüncən.
Əlində nə qədər var isə imkan,
Çalış ki, şən keçsin hər nəfəs, hər an.
Qəlbimiz hər zaman şən olmalıdır,
Kin, tamah bədənə atəş nalıdır.
Ömrə sərmayədir aldığın nəfəs,
Kədərə tapşırmaq əbəsdir. əbəs!
Şənliklə səslənsin çıxan nəfəslər!
Şən nəfəs almasan, sərmayən gedər.
Barı ver, könlünü şənləndir ancaq,
Ucuzdur bir heçə bir könül almaq.
Sərvətçin kar olma, dönmə sərt daşa!
Sərvətin olmasın, ancaq sən yaşa!
Bərk tutma dünyanı, etsən bir nəzər,
Bərk tutmaq ölümə çətinlik verər.
Bu dünya malına uyma çox, zinhar,
Hər sadə keçinən asudə yaşar.
Sevimli bir saat, uğurlu gecə,
Onda şən keçirmək olur könülcə.
İskəndər dövrünün yaqutlarından
Belə nəql eləyir tarixi yazan:
Tacidar o gecə qəlbində fərəh
Gül dodaq eşqinə doldurdu qədəh.
O camı qaldırdı gül dodağına,
Cam da bir qul kimi baş əydi ona.
Oturmuş bir cavan sərv ağacıtək,
Gah lalə tökür, gah ərğəvan çiçək.
Müşkin gül üstünə yazılmış bir xətt.
Gülə gül suyuyla çərx vermiş zinət.
Həm düşmən fəthindən könül çox şəndi.
Həm də dostlarıyla evi gülşəndi.
Çağırtdı gül üzlü o dilaramı,
O mələk sımalı nazik əndamı.
Bir saz, bir oxuyub çalandı həmdəm.
Çadırda qalmadı daha naməhrəm.
Min bir istək ilə istənmiş dilək,
Başına, üzünə vurmuş yüz bəzək.





Al nar dənəsindən dodağı dilbər,
Dili al nabatdan daha şirin, tər.
Gözləri gül, ağzı o qədər dardı,
Biri saz, o biri könül çalardı.
Araqçın altından o müşkin tellər
Kəmənddir asılmış ətəyə qədər.
Məclisə yaraşıq verən, oxuyan,
Şahın əlindədir çalan hər zaman.
İskəndər əmriylə aldı sazını,
Gövhər xəznəsinin açdı ağzını:
"Bu gecə dünyamız yenidir, şəndir,
Hər şənlik İskəndər dövlətindəndir.
Xoş olur gül, çiçək çağı ruzigar,
Hər tərəf gülümsər gülərkən bahar.
Qalxdıqca al günəş od kimi yanır,
İşıqlı dünyadan nur dalğalanır.
Toxuyur, əsərkən səhər küləyi,
Yer rumi, göy isə Şüştər ipəyi.
Al qızıl güllərlə şənlənincə bağ
Yanar hər qönçədən bağda yüz çıraq.
Şah qoymuş dünyaya zəfərlə təməl,
Güzgü pas altında görünməz gözəl.
Keyxosrov əldə cam tutduğu zaman
Taxtınız qalmasın boş belə camdan!
İskəndər Cəmşiddən olmuşsa yüksək,
Gül üzüm günəşə üstündür gerçək.
Şah qızıl çəkməli Fıridunsa, mən
"Gavə bayrağıyam", onu fəth edən.
Taclı Keyqubadsa uca İskəndər,
Mənim tacım isə müşküdür, ənbər!
Firuzə taclısan, Keykavus isən,
Məndən taxt tələb et fil sümüyündən.
Şah Süleyman kimi div salsa bəndə,
Çox Məcnun çöllərə salmışam mən də.
İskəndər ki, bütün dünyanı tutdu,
Könlümsə o dünya tutanı tutdu.
Şahın dünya tutan uca kəməndi
Ay, Günəş boynuna salırsa bəndi,

Zülfümdən bir kəmənd eşərəm ona,
Qorxmadan ataram şahın boynuna,
Padşahın aytutan bir kəməndi var,
Mənim də kəməndim şahları tutar.
Kəskin ox atırsa uca hökmüdar,
Məndə də ox atan min naz, qəmzə var.
Qılıncla gülgün qan tökürsə salar,
Mənim gül üzümdən al qan damcılar,
Qılınc oynatmağa şah versə qərar,
Mənim də qılıncdan kəskin dilim var.
Şah toppuz qaldırsa qulaq ucuna,
İki zülfüm də bir toppuzdur mana.
Atından tək bir tuğ asmış hökmüran,
Mən on tuğ asmışam ağ buxağımdan,
Şahda bir qutu var, içi ləldir,
Mənim də qutumda var ləl ilə dürr.
İskəndər yaqutu mədəndir ancaq,
Al, canlı yaqutdur məndəki dodaq.
Əflakə münəccim olmuş İskəndər,
Mənim keşiyimi ulduzlar çəkər.
O başı üstündə ucaltmış sancaq,
Qapımda yüksəlmiş yüz elə bayraq.
Aləmə şah isə o sərvərliklə,
Gözəllər şahıyam canpərvərliklə.
Üzümdən örtümü atdığım zaman
Yalnız bir telimə dəyməz bu cahan.
Ay üzdə yer versəm müşkin tellərə,
Ayı bir telimlə çəkərəm yerə.
Bu əqiq dodaqdan şəkər tökərkən,
Rəhiq mey çəkərəm incə püstədən.
Rəhiqim suyu da rəqsə gətirər,
Əqiqim yuxuya bir nəşə verər.
Göydən tuğ istəsən, buxağımdan al!
Şəkərdən duz umsan, dodağımdan al!
Dodağım şəkərdir, gülüşü şəkər,
Bu gülgün yaqutun öpüşü şəkər.
Öpüşün qapısı bununla belə,
Bağlanmış Səmərqənd çubuqlariylə[253].





Tutaq ki, kimiya daşı zər edir,
Nəfəsim torpağı müşk, ənbər edir.
Süheyl edən kimi gönlərə əsər,
Nəfəsim nəsimə o ətri verər.
Bir gözlə edərəm könülləri qan.
O biri gözümlə alaram yüz can.
Bu yandan ovlaram gəlsəm üz-üzə,
O yandan ataram daşqın dənizə.
Qəmzəmlə aldadıb salaram dərdə,
Tayım yox, mahirəm belə işlərdə.
Üzümü rahiblər görsə, nur deyə,
Dindar hirbüd kimi düşər səcdəyə.
Zahidin ürəyi qara daş isə,
Sazımın səsiylə gətirrəm rəqsə
Bu gümüş əndamla gümüş saçaraq
Xəzinə qıflını açmaram ancaq.
Baxçamın qapısı deyil aşikar,
Ancaq bağban bilir hardadır açar.
Tər-tazə yetişmiş xurmalarım var,
Tək quru tikanı görər başqalar.
Elə bir gülabam, kədər verərəm,
Məndən duz umana ciyər verərəm.
Gecə türk üzümü görmüşmü, nədir?
Xalımtək mənə bir hindli bəndədir.
Yeni ay bir hilal kimi doğaraq,
Vüsalım fikriylə boşaltmış otaq.
Tellərim, başlasa rəqsə, yox çara,
Kəkliyin ayağı düşəcək tora.
Üzüm zülf altından olsa aşikar,
Çəməndə güllərin ağzı sulanar.
Birçəyim qıvrılsa bu çəmən boyu,
Kəməndə salaram o parlaq suyu.
Lətif bədənimi etsəm aşikar,
Ağ badam içinin budları sınar.
Ağ gümüş biləyim görünən zaman
Yasəmən tər tökər utandığından.
Dodağım şəkərə dadımlıq verər,
Qulaqda halqalı bir quldur gövhər!

Ağzım ki, çəkişdi Müştəri ilə,
Üzüyü qazanan keçirdi ələ.
Mənimlə bir cınaq çəksə gül, çiçək,
"Apardım" sözünü unutsun gərək[254].
Gözümdən Babilə bir əfsun çatdı,
Ondan, bax, nə qədər cadu yaratdı!
Çinə bircə telim getdi ərməğan,
Müşk oldu ahunun göbəyində qan.
Zülfü qulağımda edərsəm çənbər,
Üst-üstə tökülür bayğın könüllər.
Bu sərxoş gözlərin naz, qəmzəsilə
Yüz əldən getmişi gətirrəm ələ.
Çox qaçqın könüllər ovladım hər an.
Onlara quyudur, bax, bu zənəxdan.
Aşiqə bir tellə verərəm tuğ tac.
Ətrimlə Xülləxdən alaram xərac.
Möhrümü vuraram Çin xaqanına,
Beş növbət salaram Rumu talana.
Bu müşkin xalımla çinli bağrıyam,
Falca Rum qəlbinin şən çırağıyam[255].
Yuxulu çağımda verərəm məzə,
Qanını tökərəm edərkən qəmzə.
Dodağım rəng verir hər gülgün lələ,
Üzümün xəyalı oynar günəşlə.
Müğ mənə "sənəmdir" deyə yalmanır,
Cənnətin bir sənəmxanəsi sanır.
Mənim nar döşlərim görünən zaman
Narların ürəyi soyudu bağdan.
Döşlərim dikəlmiş təzə narınctək,
Hansı bir bəxtiyar onu dərəcək?
Uğurlu ağacam, iki narım var,
Bir güləm, pərdədə gözəl barım var.
Tufanla qopsa da dünya təməldən,
Bəxtiyar şah olsun, bir mey, bir də mən!
Bir dastan işlətmək istərəm ona,
Almaq öz sazımtək öz qucağıma.
Bir öpüş vurum gah məst gözlərinə,
Gah qara zülfümü verim əlinə.





Bu şərtlə canımda eyləsin məkan,
Başımı çəkməyim ayaqlarından.
O günəş eşqindən sərxoş olaraq,
Məhşərdə yuxudan ayılım ancaq.
O hansı çeşmədir ömrü uzadan?
O hansı kölgədir gənclik oyadan?
Vəslimdir şən, uzun bir həyat verən,
Mən gənclik verərəm qəmzə edərkən.
İskəndər dirilik suyuçun gedir,
Mən varkən zülmətə o neçin gedir?
Axtarmaq istəsən zülmət yolunu,
Qara zülfüm sənə göstərir onu.
Yaqut rəngli sudan istəsən içmək,
Dirilik suyunu ələ keçirmək.
Parlaq bir yaqutdur bu gül dodaqlar,
Həyat suyu kimi yüz çeşməsi var.
Şahım, ram ol mənə, çox sərkəş olma!
Bu həyat suyuna, gəl, atəş olma!
Pəriyəm, ipəklər içində gizlin,
Qapını bağlama sevirsə qəlbin!
Üzünə açıqdır qapım hər zaman!
Məni sındırsan da, sınmasın peyman!
Ürəkdən daş asmaq bitməzmi daha?
Gözələ xor baxmaq yetməzmi daha?!
Olma daş ürəkli, sevirəm səni!
Kölən bil, gözəl bil, qulun bil məni!
Mən fələk olmaqla sənin yarınam,
Çindənəm, sənin mən, bil, qəmxarınam.
Deyiləm kölgədə yetişən bir gül.
Günəşi kölgədə saxlamaq müşkül!
Mən kimi meyvəni qapatma evə,
Dad verməz kölgədə yetişən meyvə.
Mənəm ən ətirli, sevimli reyhan,
Reyhan olmalıdır evdə hər zaman.
Burax bu kəkliyi ovlasın tərlan!
Gəl, çəkin ov güdən bu qartallardan!
Ağacın xurması yetişmiş ikən
Başqası yeyəcək onu, dərməsən.

Mən kimi kim sənin dərdini çəkər?
Dərdini çəkərək səpərəm şəkər.
Ürəklər qan oldu qan içməyimdən,
Boynumda nə qədər qan qalmış, bilsən?
Çox şəkər dodağa oxudum meydan,
Dodağım şirindir şəkərburadan.
Həm səsim, həm özüm əzəldən gözəl,
O gözəl, bu gözəl, gözəldən gözəl.
Saqisi mən olsam, mey olmaz haram,
Canım işrət saçar bir mütrüb olsam.
Çalğımla hər kəsi sərxoş edərəm,
Sonra hər sərxoşu öldürər qəmzəm.
Uzaqdan edərəm şux dilbərliklər,
Qucaqda edərəm canpərvərliklər.
Qarşımdan gözlərə sevinc salanam.
Qucağa çəkdikcə könül çalanam.
Mən olam, saz ola, bir də köhnə mey,
Aşiqin taqəti qalırmı? Hey, hey!..
Sən kimi şəhriyar olsa mənə yar,
Bu könül şənlikdən başqa nə arar?
Dövrandan kim almış mənim kimi kam?
"Dünyada tapılmaz" olmuş mənə nam!.."
Elə ki, sazına vurdu son mızrab,
Təsnifi bitirdi dodağı ənnab.
Şahın məhəbbəti o sözdən coşdu,
Sanki tərlan fərə üstünə qoşdu.
O bahar turacı naz ilə, şən-şən.
Turunctək soyuldu qızıl beşikdən.
Könül getdi əldən, sərapərdə boş,
Sevimli məşuqə sevdadan sərxoş,
Xəlvət bir gecədə elə bir mələk,
Mümkünmüdür ona könül verməmək?!
Gənc, gözəl maralı yıxdı nər aslan,
Qarət məclisində başladı talan.
Sığındı o laçın sona ovuna,
Günəşsə getdi ay qonaqlığına.
Şəkərtək əmirdi hey dodağını,
Sorurdu şəkərli ney dodağını.





Bağrına basdı o gül köküslünü,
Xəzinə ağzından açdı möhrünü.
Bakirə şərabı laləzar gördü,
Qapalı bağçada alma, nar gördü.
Əqiq möhr üstünü basmamışdı pas,
Saf üzük qaşını deşməmiş almas[256].
Bir qönçə güldür, yox üstündə tikan,
Görməmiş bağbandan başqa bir insan.
O qızğın atəşin artıqlığından
Damardan fışqırmaq istəyirdi qan.
Şəkərli dil ilə söhbət açdılar,
Yağ, bala dönərək qucaqlaşdılar.
Sarıldı iki sərv, iki gülpeykər,
Qatdılar badama, yağa qənd, şəkər,
Əyildi "əlif-lam" kimi cift ayaq.
İki hərf kimi bir cinsdən olaraq.
Elə ki, almaz o gövhəri dəldi,
Həm almaz yatdı, həm gövhər dincəldi.
Həyat çeşməsində məsud İskəndər
Şənliklə keçirdi bəxtiyar günlər.
İşrətlə keçirdi bir neçə gecə,
Çıxmadı o yerdən, daldı sevincə.

## İSKƏNDƏRİN DİRİLİK SUYU AXTARMASI

Saqi, gəl, qədəhi doldur mey ilə,
Al elə nəğməylə, çalğı, ney ilə!
Bir mey ki, içənlər fikrincə, demək,
Xəstəyə şəfadır, dərdliyə kömək.
Ucalırkən səhər xoruzun səsi,
Qarovul zənginin susdu naləsi.
Təbilçi təblinin səsi ucaldı,
Quşların nəğməsi ətrafı aldı.
İbadət edənlər qalxdı yuxudan,
Pərəstiş etməyə düzüldü hər yan.
O səhər yuxudan qalxdı tacidar,
İbadət etməyə verərək qərar,
Ona şəfqət edən haqqı etdi yad.

Etdi bu hikmətlə dünyanı abad.
Nəhayət verincə ibadətinə,
Şərab məclisini bəzədi yenə.
Mey ilə, çalğıyla gah olurdu şad,
Vəfalı dostları gah edirdi yad.
Gülabdan saf olan gül rəngli şərab
Hər başdan dərd alır, hər beyindən tab.
Onunla bir məclis qurdu şəndən şən,
Uzaqdı düşməndən, qanlı döyüşdən
Elə ki açıldı, uzandı söhbət,
Danışdı hərə bir gözəl rəvayət.
Biri söhbət açdı Xorasan, Qurdan,
Ordakı qızıldan, qüvvətdən, zordan,
Birisi danışdı Rey, İsfahandan,
Firidun dövləti çıxan məkandan.
Çindən, Xərəzmdən söz açdı biri:
"Var gözəl ipəyi, müşkü, ənbəri".
Birisi söylədi: "Gözəldir Qeysur,
Bu yerdən çıxar hər səndəl və kafur".
"Hindistan gözəldir, - dedi, - bir nəfər,
Odunu ud olur, palçığı ənbər".
Məclisdə var idi bir nəfər qoca
Danışmaq növbəti ona çatınca
Maraqla başladı qoca sözünü,
Baş əyib, torpağa qoydu üzünü:
"Dünyada zülmata çatmaz bir diyar,
O gözəl torpaqda suyu var.
Ömrünü artırmaz xəzinə, cəlal,
Torpaqda çox yatır xəzinə, xam mal.
Yaşamaq istəsən dünya uzunu,
Get, keçir əlinə həyat suyunu!"
Bu sözdən utandı məclis, qaldı mat,
Qaranlıq bir yerdə olurmu həyat?
Şah dedi: "Yoxsa var başqa bir hikmət?
Həyat çeşməsində olan bu zülmət.
Yazılmış hərflər qarasıdır bu,
Mənəvi həyata can verir suyu.
Kim görmüş yoxsa bu həyat suyunu,





Zülmətdə ölümdən qurtarsın onu!"
O qoca dedi: "Ey uca tacidar!
Bu sudan uzaqdır dediyin əsrar.
Var Şimal qütbündə qaranlıq bucaq,
Ağ, gümüş çeşməsi hər sudan parlaq.
Bu qaranlıq yerə deyirlər zülmat,
O zülmət içində var abı-həyat".
O suyu kim içsə olur qəlbi şən,
Qurtulur ölümdən və xəstəlikdən.
Sözümdə azacıq olsa şübhəniz,
Soruşun sınaqlı qocalardan siz!"
İskəndər bu sözə heyrət etdikcə,
Aramaq marağı artdı getdikcə.
Sordu ki: "Bu zülmat harda?" Göstərən
Göstərdi padşaha: "Bax, bu sağ əldən
Qaranlıq ölkəyə qısa yol gedir.
Gəldiyin bu yolun onda biridir."
Eşidincə bunu şah dedi: "Ancaq
Zülmətdə mümkündür işığı tapmaq."
Zülmata çevirdi şah öz yolunu,
Gedərkən nəzərə aldı ordunu.
Sürətlə bir neçə mənzil at sürdü.
Əsgərin bir çoxu xəstədir, gördü.
Ardınca axırdı bir dünya ordu.
Xaslar da yanında alay vururdu.
Ordu bazarını görən bir insan
Seçməzdi məhşərin bazarlarından.
O yerdə quş südü arayan belə,
Ordu bazarında gətirdi ələ.
Hər quraq bir yerə çatdı İskəndər.
Yağışdan yaşıla büründü çöllər.
Xızır iz salmışdı sanki bu yola,
Yainki gedirdi şahla qol-qola.
Ordu çoxluğundan şah getdi fikrə,
Belə yol getməkdə sığındı səbrə.
O çöldə vardı bir böyük mağara,
Padşahın ordusu çatınca ora.
Ordunun yanında nə qədər yük var,

Mağara yanında yerə qoydular.
O geniş çöllərdə saldılar məskən,
Şənlikdən viranə çöllər oldu şən.
Çölbəyi o yerə ad verdi: Bünğar,
Get-gedə o şəhər adlandı Bulğar.
Bu gün o ölkədə rəyasət sürən
Yerləşib qalandır şah səfərindən.
İskəndər görüncə o saysız ordu
Yol və iz bilməyir, bir tədbir qurdu.
Ordudan ayrıldı bir neçə əyyar,
İstidən, soyuqdan, çıxmış oxçular,
Ürəkli, sümüyü bərk, dəliqanlı,
Səbirli, qüvvətli, gənc, polad canlı.
Əmr etdi qocaya və xəstələrə:
Əskərlə çıxmasın ağır səfərə!
Qocalar, xəstələr bu qorxunc yerdə,
Dolaşıq yollarda düşməsin dərdə.
O yola - qocasız etdilər səfər,
Qocalar oturdu, yol aldı gənclər.
Bir nəfər o yerin ayıqlarından
Hüzura istədi ulu hökmüran.
Yox idi ordunun sayı, miqdarı,
Hər mənzil başında qoydu onları.
Şor, şirin hər azıq çarpsa nəzərə,
Yüklətdi qüvvətli, gənc dəvələrə.
Qoşunla at çapdı qaranlıq suya,
Bir naib tikdi o qalan orduya.
Onlara nəsihət elədi bir az:
"Bu yerdə qəflətlə göz yummaq olmaz!"
Atını Şimala doğru çaparaq,
Günəş gərdişindən şah düşdü uzaq.
Fələyin qütbündən doğunca işıq,
Azacıq keçmədən sönürdü artıq.
Üfüqə baş qoydu xətti-üstüva,
Qütb isə kənardan keçdi ortaya.
Bir yerə çatdılar parlaq günəşdən
Yalnız bir xəyaldı gözlə görünən.
Sürdülər kölgəlik deyilən yerə,





Saçdılar bayrağı kölgəliklərə.
Havadan işığı yer qapmış artıq.
Hər yerə hakimdi dərin qaranlıq.
Bu yandan ətrafı qaranlıq tutmuş.
O yandan yol-izi bir dəniz udmuş.
Ağlıyla bu yolu tutaraq rəhbər,
Xətti-üstüvayə qarşı getdilər.
Get-gedə pərgardan olduqca uzaq,
Günəşdən, işıqdan düşdülər iraq.
Gedərkən bir yerə çatdılar o gün,
Gözlərdən aydınlıq itdi büsbütün.
Hər yandan yolları bürüdü zülmət,
Bu dünya qaralsa verərmi ləzzət?
İskəndər şaşırdı, aradı tədbir:
"Bu yolda doğru iz göstərən kimdir?"
Bilənlər söylədi ki: "Bu qaranlıq
Pərdədir, iç-üzü görünməz artıq.
Mümkündür irəli getmək yol ilə,
Dönərkən çətindir gətirmək ələ".
Çox çarə aradı hər tədbir verən,
Olmadı buna bir tədbir göstərən.
Gecəydi o yerdə, qaranlıq diyar,
Müşkü ud yerinə etdi ixtiyar[257].
Kinindən olmuş göy dəli, zəncirli,
Zəncinin yerinə keçdi kəşmirli[258].
Getdikcə yol oldu tükdən də incə,
Zülmətdən qurulmuş qaranlıq gecə.
Hər kişi qayıtdı öz mənzilinə,
Bu işə bir tədbir düşündü yenə.
Bir igid gənc vardı, ağılca ulu,
Saf, işıq ürəyi şəfqətlə dolu.
Atası qocaydı, doxsan yaşı var,
Bədən ağrısından sızlayıb ağlar.
O gün-ki, padişah vermişdi əmr:
"Çıxmasın bu yola xəstə ilə pir!"
Gənc oğlu vurğundu xəstə ataya,
Necə ki, bir xəstə göynər almaya.
Qocanı özüylə aldı bərabər,

Necə ki, başqalar yaqutu gizlər,
Azıq sandığında gizlətdi onu,
Onunla dolaşdı zülmət yolunu.
Taleyin qoşundan küsdüyü gecə
O gənci aldı bir dərin düşüncə.
Gecəykən sandığı açdı o cavan,
Etdi atasına o sirri bəyan:
"Padişah səfərdən oldu peşiman,
Çətinlik çəkməkdən qırılmış peyman.
Qəlbinə bir qorxu salmış qaranlıq,
Bir tədbir düşünə bilməyir artıq.
Bələdçi olmadan gedir irəli,
Bilməyir nə sayaq dönəcək geri".
Oğluna baxaraq dedi ixtiyar:
"Bu qara pərdədə gizli bir sirr var.
Padişah getməyə başlarkən ora,
Zülmətdən dönməyə vardır bir çara:
Padşaha gərəkdir ilk dəfə doğan,
Vücudu sapsağlam boğaz bir madyan.
Anadan olunca o körpə daylaq
Başını bir yerdə kəssinlər, ancaq
Örtməyib qoysunlar yerdə cəmdəyi,
Anası görüncə, yansın ürəyi,
İçində qopsun bir həyəcan, hiddət,
Durmasın padişah, etsin hərəkət.
O yoldan geriyə döndüyü zaman
Ordunun önündə gedəcək madyan
Çaparaq sevimli daylağa sarı,
O yoldan beləcə çıxar dışarı.
O yolda bələdçi olmadan belə,
Dışarı çıxarlar bu tədbir ilə."
Qocanın sözünə o gənc uyaraq,
Kələfin başını tapdı bu sayaq.
Göylərin o müşkin ipəyi səhər
Olunca ud rəngli dibayə bənzər,
İskəndər məclisdə yenə oturdu,
Getməyə hər biri bir tədbir qurdu.
O məclis nə qədər göstərdi tədbir,





Bu əsrar haqqında söylədi fikri,
Xoşuna gəlmədi ulu padşahın,
Tədbirlər kimsəyə deyildi aydın.
Öz zəif fikriylə o gənc yanaşdı,
Bələdçi haqqında şaha söz açdı.
Atası söyləyən sözləri bir-bir
Padşaha anlatdı ki, budur tədbir!
Xoş gəldi bu sözlər, yatdı könlünə,
Beynində yer etdi o dönə-dönə.
Dedi: "Ey mərd oğul, belə fikri sən
Nə sayaq oldu ki, qurdun özündən?
Bu bilgi özündən gəlməmiş ələ,
Sən kimdən öyrəndin, gəl, doğru söylə.
Bar, sərvət verərəm doğru söyləsən,
Zillətə düşərsən düz deməməkdən"
Gənc dedi: "Padşahım, mənə ver aman,
Boşalsın kəcavə bu yüklü atdan.
O gün ki, əmr etdi ulu hökmüdar:
Çıxmasın yola bir xəstə, ixtiyar,
Bir qoca atam var, bu qoca insan
Çox qulaqburması görmüş dövrandan.
Ürəyim çox yandı qoca atama,
Əmrə itaəti unutdum tamam.
Özümlə gizlincə gətirdim onu,
Pis gətirdimsə, pis olmadı sonu.
Dünən yol haqqında olan sözləri
Atama açmaqdan durmadım geri.
Onun təlimini dinlədim bir an,
Söylənən tədbiri öyrəndim ondan."
Çox incə bir nüktə söylədi, deyə,
Şah onun sözündən ucaldı göyə.
"Bilənlər padşahı olsa da yenə,
Bu gənclər möhtacdır qoca fikrinə.
Gənc budaqlarıyla oynarsa qabaq,
Başını ucaldar bir köhnə budaq.
Bilikdə birinci olsa cavanlar,
Qocalar fikrinə ehtiyacı var".
Dünya padşahı söhbətdə ikən

Qapıdan dıv gövdə o vəhşi birdən
İçəri girincə yanaşdı məğrur,
Padşaha göstərdi bir şələ samur.
Hər biri parlaq bir qunduzdan artıq,
Bir-birindən alır bəzək, yaraşıq.
Malına xiridar çıxdı hökmüran,
Yenə birdən-birə yox oldu ordan.
Qaranlıq içində yox oldu vəhşi,
Padşahı heyrətə saldı bu işi.
İşıqlıq göstərdi, fikri eşitdi,
Zülmətə getməyə padşah əmr etdi.
Əmr etdi: "Yelayaq bir boğaz madyan
Alsınlar, o heyvan doğduğu zaman,
Kişinin sözünə tamam uyaraq,
Alınsın, kəsilsin o körpə daylaq".
Padişahın fərmanı həyata keçdi,
O işıq çeşməyə doğru yol seçdi.

## İSKƏNDƏRİN ZÜLMƏTƏ GETMƏSİ

Saqi, bu zülmata bənzər torpağı
Araşdır, ver mənə həyat bulağı!
O parlaq su ilə mənə sal-nəzər,
Bu həyatdan daha canlı həyat ver!
Bu bahar fəslində yeni və köhnə
Tarixdən başlaram gözəl tərənə.
Rəvayət eyləmiş sınaqlı dehqan:
Yazın ilk gecəsi ulu hökmüran
Zülmata getməyə əzm etdi artıq,
Fikri təskin edər hər bir qaranlıq.
Günəşi qıfıla vurunca göylər,
Qaranlıq içində doğar min gövhər.
Bu həyat suyunda kim etsə məskən,
Gərəkdir bir pərdə çəksin önündən.
Çimənlər bu duru, saf çeşmələrdə
Gərəkdir üzünə çəksin bir pərdə.
İskəndər zülmata edərkən səfər,
Söylədi: "Artıqdır bu mühüm şeylər!"





Cilovu buraxdı "zülmat" deyərək,
Əjdər quyruğunda gizləndi Aytək [illegible]
Söylədi o zaman böyük İskəndər,
Ona rəhbər olsun Xızır peyğəmbər.
Atı Xızra verdi böyük tacidar,
Bilirdi onda bir aslan qəlbi var.
Verdi ki, bu yolda səyirtsin onu,
Onunla tapsın bu həyat suyunu,
Çuxurlar parladan bir gövhər verdi,
Çeşmələr arayan bir rəhbər verdi.
Dedi ki: "Bu yolun hər tərəfinə
Həqiqi bir rəhbər özünsən yenə!
Cilovu hər yana istərsən burax,
Aç ağıl gözünü, ayıq ol ancaq!
O çeşmə nə yerdə olsa aşikar,
Aldatmaz səni bu gövhər, parıldar.
Uğurla iç haman uğurlu sudan,
Mənə də göstər ki, yeyəsən ehsan!
Göy gərdişli Xızır haman fərmanla
Ahəngi pozmadan üz qoydu yola.
Ordudan ayrıldı, irəli getdi.
Hər yana himmətlə bir nəzər etdi.
Su üçün dolandı bütün bucağı,
Çatmadı suya o susuz dodağı.
Əlində parladı parlayan gövhər,
Tapıldı nəhayət aranan gövhər.
Gümüş rəngli çeşmə axırdı şən-şən
Süzülən gümüştək daş göbəyindən.
Bu çeşmə tərifdən uzaqdı, uzaq.
Bir nur çeşməsiydi bu qaynar bulaq.
Bir ulduz nə sayaq olursa səhər,
O parlaq çeşmə də olur o təhər.
Hələ bədr olmadan nura dolsa ay,
Eləydi bir az da böyük olsa ay.
Qaynayır, durmayır öz mənzilində,

Sankı bir civədir iflic əlində.
O qədər parlaqdır bu lətif cövhər,
Dünyada yox ona bənzəyən gövhər.
Yox başqa gövhərdə bu nur, bu günəş,
Ona həm su demək olur, həm atəş.
Xızr həyat suyunu tapınca artıq,
Hər iki gözünə doldu bir ışıq.
Aşağı enərək dərhal soyundu,
Doyunca həm çimdi, həm də yuyundu.
Doyunca içdi o həyat suyundan,
Əbədi həyata çatdı arayan.
Atına içirdi, çimdirdi onu,
Tökdü ağ qədəhə həyat suyunu.
Atının yanında oturdu bir an,
Göz götürməz oldu o aydın sudan.
İstədi gəlincə yoldan İskəndər,
Desin: "Həyat suyu budur, qıl nəzər!"
Bir daha çeşməyə göz gəzdirərkən,
Dirilik çeşməsi yox oldu gözdən.
Dərhal bu iş oldu Xızr üçün məlum,
İskəndər o sudan qalacaq məhrum.
Qorxmadı, utandı o İskəndərdən,
Xızr da su kimi itdi gözlərdən.
Söylənən sözləri rumlu ravilər
Başqa bir şəkildə rəvayət edər:
Bu yolda İlyasla Xızır yoldaşdı,
Çeşməyə gedərkən dostlar yanaşdı.
Görüşdü hər iki sevimli rəhbər,
Çeşməyə çatınca atdan endilər.
O bulaq başında açdılar süfrə,
Bulaq başı verir dad yeməklərə.
Süfrədə çörəkdən ətir qalxardı,
Duzlanmış qupquru bir balıq vardı.
Birisi əyildi su içsin deyə,
Əlindən o balıq düşdü çeşməyə.





Cumdu o firuzə rəngli bulağa,
Əl atmaq istədi üzən balığa.
Tutunca gördü ki, diridir balıq,
Uğurlu bir fala sevindi artıq.
Bildi ki, can verən bu parlaq bulaq
Aranan dirilik suyudur ancaq.
Həyat çeşməsindən içdi doyduqca,
Bir həyat qazandı dünya durduqca.
Dostuna tez xəbər verdi bu zaman,
İçdi bu əbədi həyat suyundan.
Təəccüb etmə o gümüş bulağa,
Yenidən can verdi ölü bulağa.
Təəccüb bundadır: bir ölü balıq
Dirilik suyuna yol açdı artıq.
Bu quru balıqdan, həyat suyundan
Ərəblər nəql edir başqa bir dastan.
Başqa bir yerdəymiş həyat çeşməsi,
Yol azmış məcusun, Rumun dəstəsi.
Tutaq ki, zülmətdə həyat suyu var,
Yol açan içməzsə kimdir günahkar?
Xızr, İlyas kam aldı həyat suyundan,
Ancaq vermədilər özgəyə nişan.
Biri kam alaraq döndü səhraya,
Biri də içərək cumdu dəryaya.
Dənləri bir sudan içib boy atdı,
Ancaq onu iki dəyirman dartdı.
Çeşməni keçirmək fikriylə ələ
İskəndər at çapdı min zəhmət ilə.
Dirilik verən bir çeşmə dilərkən,
Çeşmədən göyərdi sulu bir çəmən.
Çeşməni ararkən qırx gün at saldı,
Onu tapmayaraq kölgədə qaldı.
Atəşini düşmüşdü şah ürəyinə,
Uymuşdu çeşmənin xoş ahəngine.
Çeşmədən kölgə yox, gümüş nur çıxar.

Ancaq çox az olur kölgəsiz sular.
Çeşməyə lazımsa onun kölgəsi,
Neçin kölgəsizdir günəş çeşməsi?
İçməli olursa çeşmə günəşdən,
Kölgədə qalmışdır o çeşmə nədən?
Çeşmədə kölgəlik yaxşıdır tozdan,
Bunda sərinlik var, onda həyəcan.
Şah o kölgəlikdə tapmadı çara,
Gündüzü olmuşdur kölgədən qara.
Əbədi həyata ümid bəslərkən,
İndi can qayğısı çəkir hər yetən.
Padşahın ümidi söndüyü zaman
Qayıtmaq istədi gəldiyi yoldan.
Düşündü, nə tədbir eləsin barı,
Qaranlıq kölgədən çıxsın dışarı.
O yolda qarşıya çıxdı bir mələk,
Padşahın əlinə o əl çəkərək,
Dedi: "Bu dünyanı keçirdin ələ,
Belə çiy xülyadan doymadın hələ?"
Ovcuna buraxdı pul qədər bir daş,
Dedi: "Tut bu daşı canından da baş!
Bu daşlıq dünyada çalış, tök tədbir,
Bu ağırlıqda daş əlinə keçir!
Qəlbində minlərlə olsa da dilək,
Bu daşın tayıyla doyarsan, bişəkk..."
O daşı İskəndər aldı mələkdən,
Gözündə yox oldu ona daş verən.
O zülmət içində çapdı İskəndər,
Gözündə bir zülmət, könüldə kədər.
Bir hatif səsləndi ona qeybdən:
"Qismətı hər kəsə yazıdır verən!
İskəndər zülmətə doğru at çapar,
Xızr isə çeşməni işıqda tapar.
Ararkən tapmadı çeşmə İskəndər,
Xızra qismət oldu, gördü çox səmər.
Yüzü halva üçün yandırar ocaq,
Halva şirin eylər bir ağzı ancaq."





Başqa bir səs gəldi ki: "Ey əhli-Rum!
Bu gözəl ölkədə var parlayan qum.
Peşiman olacaq onu götürən,
Dizinə vuracaq heç götürməyən."
Keçirkən parlayan qumdan hər nəfər
Götürdü bəxtinə görə bir qədər.
O yerdə şah gördü çox hikmət, çox raz
Ki, ondan birini söyləmək olmaz!
İsrafildən, Surdan bir bəhs açaraq,
Demədim, məqsəddən düşməyim uzaq.
Açmış bu mədəni başqa bir şair"",
Yenidən bir əsas qurmaq çətindir.
Əli çatmayınca həyat suyuna,
Qayıtdı şah işıq çeşmə yoluna.
İskəndər orduya verincə fərman,
İşığa döndülər zülmət yolundan.
O yeni cığırla gəldiyi yoldan
Bələdçi olmuşdur o dərdli madyan.
Qırx gün yol getdikdən sonra qaranlıq
Getdikcə çəkildi, göründü işıq.
Al günəş buluddan çıxdığı zaman
Qan-tərə batmışdı o susuzluqdan.
Qismətsiz bir şeyə göstərdi həvəs,
Qismətin deyilsə çalışma əbəs!
Ruzi arxasınca qaçmaq nə gərək!
Sən otur, ruzinin özü gələcək.
Biri toxum səpər, o biri biçər,
Bəxtiyar odur ki, bu sözü dinlər.
Hər şeyi özünçün əkmək nə yarar?
Dünyada hesabsız ruzi yeyən var!
Keçənlər zəhmətlə əkdiyi bağdan
Gələnlər meyvəni dərmiş hər zaman.
Keçənlər bir çox şey əkmişdir bizə
Biz də əkməliyik gənc nəslimizə.
Dünya bir tarladır, diqqətlə baxsaq,
Hamı bir-birinə cütçüdür ancaq.

## İSKƏNDƏRİN ZÜLMƏTDƏN ÇIXMASI

Saqi, ver ürəyə yatımlı meydən!
Ver ki, meyxoş gəlir ömür gənc ikən!
O meylə ağzımı isladım bir an,
Bəxtimi daha gənc eləyim ondan.
Oyanıq taleyi olunca rəhbər,
Zülmətdən dişarı çıxdı İskəndər.
Çox gözəl rəhbərlik eylədi madyan,
Bir az da azmadı getdiyi yoldan.
İlk gündə keçdiyi zülmət xəttinə
Pərgartək yenidən qayıtdı yenə.
Padşaha taleyi elədi kömək,
İşıqlı dünyaya çıxdı sevincək.
Cilovu parlatdı ordu səmtinə,
Ancaq çatmamışdı öz diləyinə.
Bu işdən ürəyi sınmadı ancaq,
Ruzını qismətlə mümkündür tapmaq.
Heyvan tapmadısa, kədər yox bunda,
Heyvantək ölmədi heyvan yolunda[261].
Darılma sənə üz verdikdə kədər,
Ondan da böyük bir dərddən qıl həzər!
Hər gün bu çöllərdə gəzmək çıl-çılpaq
Yaxşıdır, ya dəniz dibinə batmaq?
Doğrudur, ağrıdan hər baş incinər,
İncimәz qılınc, gürz yarası qədər.
Dünyada hər işdən çətin bir iş var,
Ürəyi möhkəmə olur zəfər yar.
Qumluqdan aldığı şeyləri ordu
Töhfədir deyərək qarşıya qoydu.
Daşların hamısı qırmızı yaqut,
Gözlərə nur verir, ürəklərə qut.
Daşdan az götürən düşmüşdü dərdə,
Heç götürməyənlər ahda, kədərdə.





Peşman olmuşdu az götürənlər,
Odlara yanırdı götürməyənlər.
Şah oldu iki gün səfərdən aram,
Yuxudan, yeməkdən aldı intiqam.
Bir zaman padşahın əyildi başı,
Yad etdi mələyin verdiyi daşı.
Tərəzi istədi daşı çəkməyə,
Ağır daş qoydular "ölçüdür" deyə
Batmanlardan keçdi o bir misqal daş,
Nə qədər daş qoydu misqal çıxdı baş.
Yüz kişi bir qapan çəkdi o düzə,
Girdi daş bir gözə, daşlar bir gözə.
Daş ağır gəlirdi yüz parça dağa,
Çəkənlər darıldı bu ağırlığa
Deyirlər uzaqdan demiş Xızır: "Ancaq
Bu daşın vəznidir bir ovuc torpaq."
Bir gözə bir ovuc torpaq tökdülər,
Çəkinin gözləri oldu bərabər.
Bu incə nüktədən bildi tacidar:
Torpaqdır, onu bu torpaq doyurar[262].
Bir gün şah xaslarla taparaq fürsət,
Bir məclis bəzədi - sanasan cənnət
Zərkəmər qulamlar taxtın ucunda,
Qızıl bir ağactək gümüş sütunda.
Dünyanın şahları bir səf çəkərək
Qarşıda diz çökmüş hamı kölgətək.
Dünya işlərindən açıldı söhbət,
Söylənən hər şivə qəlb üçün rahət.
Hər biri zülmətli çeşməni andı,
Söz sözü çəkərək, söhbət uzandı.
Qaranlıq altında su varsa, nədən
Nə üçün tapmayır arayan, gəzən?
Zülmətdə yox isə belə bir cadu,
Nə üçün dillərdə əzbərlənmiş bu?
Bu yolda deyildi çox incə sözlər,

İşıqlandı başlar, nurlandı gözlər.
Haman məmləkətin qocalarından
Söylədi: "Bu sirri bilsin hökmüran.
Cahangir İskəndər dünya dolaşdı,
Göy kimi durmadan ölkələr aşdı,
Ümidlə aradı həyat suyunu
Ki, qorxunc ölümdən qurtarsın onu.
Bir şəhər vardır, bu ölkədə çox şən,
O abad şəhərdə tapılmaz ölən.
O şəhri uca bir dağ salmış bəndə,
Şəhr əhli o dağda düşmüş kəməndə.
O dağdan səs gəlir hey zaman-zaman,
Heyrətə düşür hər eşidən, duyan.
Oradan birini adıyla səslər:
Ey filan, yuxarı səmtə et səfər!
O səsi, fərmanı eşidən adam
Yerində bir an da tutmayır aram.
Sürətlə dağlara dırmanır dərhal.
Gedəndən nə sorsan olur dilsiz, lal.
Dağların ardında yox olur gözdən,
Yoxdur bu hikməti açan, öyrənən.
Məqsədin qurtulmaq isə ölümdən,
Ölümsüz şəhərdə eyləyin məskən!"
Bilici söyləyən sözdən İskəndər
Sarsıldı, üzünü sardı bir kədər.
Bu işçin ürəyi vurdu riqqətlə;
Fikri qət etməkçin uçdu sürətlə.
Əmr etdi, ordudan bir neçə kişi
O şəhrə gedərək, öyrənsin işi.
Qalsınlar söylənən yerdə bir qədər,
Bu işdən versinlər doğru bir xəbər.
Onlara tapşırdı: "Dağdakı səsə
Yerindən qalxmasın sizdən bir kimsə!
Lap adla, nişanla çağırsa necə
Siz bu səs-sədanı almayın vecə.
Cavabı uzatmaq yoluyla barı,
Açılsın pərdənin gizlin əsrarı".





Nəsihət alanlar baş əydi əmrə.
Gizlin bir yol ilə girdilər şəhrə.
Şəhərdə uğurla atı çapdılar,
Ən gözəl bir yerdə mənzil tapdılar.
Şəhərin haqqında bildilər xəbər,
Düz çıxdı qocanın dediyi sözlər.
Şəhərdə birinin adına dağdan
Apaçıq səs gəlir hey zaman-zaman
Adını eşidər-eşitməz hər kəs
O dağa çıxmağa göstərir həvəs.
O qədər səbirsiz gedir yolunu,
Qılıncla qaytarmaq olmayır onu.
Gələnlər göstərdi yüz tədbir, hünər,
Pərdənin sirrini öyrənmədilər.
Seyr etdi dolanan fələk bir zaman,
Bir neçə mənzili dolaşdı dövran.
Şah adamlarıyla çərx kimə düşdü,
Birini aparmaq fikrinə düşdü.
Qeybdən gələn səs, əsrar arayan
Kişidən birini çağırdı dağdan.
Adını eşidən durmadı bir an,
Səs gələn tərəfə qaçdı durmadan.
Gedəni dostları tutdu yer-yerdən,
Dedilər: "Tələsmə, dayan, ey gedən!
Bir yolçu sövdalı olmasın gərək,
Pərdənin sirrini bəlkə öyrənək".
Gedənə o sözlər etməyir əsər,
Bağırır, dartınır, qurtulmaq istər.
Bir söz də deməyir yarasın işə,
Çərx kimi çalışır çıxsın gərdişə.
Güc ilə qurtuldu gedən sevincək,
Onlardan uzaşdı uçan çibintək.
Dostları bu işdən etdi çox heyrət,
Gedəndən hər biri aldı bir ibrət.
Bizdən ən ağıllı, həm iş bacaran,
Bax, necə ayrıldı bir sirr açmadan!
Az zaman keçincə bu hadisədən

Al günəş parladı, güldü çöl, çəmən.
O biri yoldaşa yetişdi növbət,
O da bu dağlarda yox oldu xəlvət.
Get-gedə azaldı əsrar arayan,
Olmadı o hərfi bilən bir insan.
Qorxudan şiddətlə çırpındı ürək,
Göylər də kimsəyə etmədi kömək.
Əsrardan heç biri tutmadı xəbər,
Kədərlə padşaha tərəf döndülər.
Şikayətləndilər: "Bir çoxu bizdən
Dağlara dırmandı, olmadı dönən.
Nə dağa çıxarkən bir az durardı,
Nə geri dönməyə bir ümid vardı.
Bilmədik pərdədə nəyin səsidir,
Hansı bir çalanın şən pərdəsidir.
Pərdənin yolunu bilmədik, artıq
Çarəsiz şəhərdən geri qayıtdıq.
Bizdən də apardı bir neçə insan,
Daha səs gəlmədi bir də o dağdan.
Olunca onların yolu dağ, gədik,
Biz də çöl yolunu tutaraq gəldik.
Bu çərxin işləri belədir, belə,
Biri düşmüş dağa, o biri çölə".
Söylənən əsrarı eşitdi bir-bir,
Bildi: bu yol "gedər-gəlməzə" gedir.
Dönsəydi o dağa gedənin biri,
O zaman gözəldi bu dağ səfəri.
İskəndər bu işdən eylədi heyrət:
"Öyrənən yox, nədir bu gizli hikmət?"
Bildi ki, dırmanan o dağa, daşa
Dünyada ömrünü vurmuşdur başa.
Bir məsəl çəkdi ki: "Ölər hər doğan,
Əcəl pəncəsindən kim qurtarmış can?"
Bir ov ki, bacarmaz ovçular ilə,
Məzara gedər o öz ayağıyla.
Yediyi bir oxdan hər ovçu tərlan
Düşər yer üzünə öz qanadından.





## İSKƏNDƏRİN RUMA QAYITMASI

Ey saqi, dayanma, qədəhi gətir!
Qədəhsiz şənlənmək mümkün deyildir.
Ver, bir qurtum içim, gətir kuzəni,
Əcəl pəncəsindən, gəl, qurtar məni.
Bir kirpik vurunca bu acı dövran,
Hər yerdə törədir yüz yaxşı-yaman.
Birinin başını bağlayır yerə,
Birini qaldırır uca göylərə.
Birini günbəddən salır quyuya,
Birini balıqdan ucaldır Aya.[83]
Hər anda başlayır canbaz oyunu,
Bu dünya bir heçdir, həm heçdir sonu.
Dikbaşlıq yaramaz, uyuşmaq gərək,
Dikbaş at hər zaman qırmanc yeyəcək.
Dikbaşlıq edərsə ən gözəl bir at
Mısır eşşəyindən əskikdir qat-qat.
Bu dünya dünyaca görmüşdür adam,
Ürkərək kimsəyə olmamışdır ram.
Elə kimsənindir belə ruzigar,
Anlayan kəslərin işini anlar.
Rəvayət edənlər belə anladır:
Mağara yanında qurunca çadır,
Tənirə xəzinə tökdü tacidar.
Saldığı o şəhər adlandı Bulgar.
Bulgardan keçərək ruslar elinə,
Döndərdi o mülkü şən bir gəlinə.
Oradan qayıtdı Rum dənizinə,
Yelkənlərlə çıxdı öz ölkəsinə.
Bir xəbər tutunca Rum başçıları
Axışdı müzəffər bayrağa sarı.
Hər kəs öz şahını qalib görüncə,
Şükürlər edərək daldı sevincə.
Şahın gəlməsiylə Yunan ölkəsi
Ay kimi nur saçdı, güldü çöhrəsi.
İskəndər gətirən zülmətdaşından
Yaqut rəngi aldı cavahir satan.
Aldı o sərvətdən şəhərlər ziynət,
Yerlər xəzinədən tutdu bərəkət.

Axdı hər qəsrdən cənnət sevinci,
Yerlərə tökdülər qızıl, ləl, inci.
Xəzinə ağzından qırıldı qıfıl,
Zillət qapısına vuruldu qıfıl.
Ay kimi gəldi öz bürcünə o şah,
Başında günəştək çinli bir külah.
Şah Rumdan gedərkən bənzərdi yerə,
Dönərkən sığmadı uca göylərə.
Bulud ki, göylərə su ilə gedər,
Dönərkən dənizə saf inci səpər.
Şah yunan taxtına oturdu şən-şən,
Dincəldi yolların zəhmətlərindən.
Şah yeddi ölkənin fikrindən doydu,
Hər bir məmləkətdə bir nayib qoydu.
Şahlıqlar baş əydi hər fərmanına,
Sədaqət göstərdi hər peymanına.
Şahın gəlməsiylə ucaldı onlar,
Hər kəs öz mülkünə döndü bəxtiyar.
Hər biri təklikdə şahlıq edərdi,
Başını dik tutub, asıb-kəsərdi.
Boynunu əymədi kimsə kimsəyə,
Hər biri başını ucaltdı göyə.
İskəndər adına qədəh qaldırır,
İçərkən hər biri tək onu anır.
Şah Yunan taxtına oturdu yenə,
Bəxtin açarını aldı əlinə.
Dünyaya elmlər, biliklər saçdı,
Tanrı hikmətindən qapılar açdı.
Getdi haqq əmriylə peyğəmbərliyə,
Hörmətlə baş əydi "fərmandır" deyə.
Yenidən başladı şah hazırlığa,
Dünyanı dolaşdı başdan-ayağa.
İki dəfə səfər etdi İskəndər,
Birində çöl gəzdi, birində şəhər.
Birində dolaşdı abad yerləri,
Yenə Ruma döndü Rumun sərvəri.
Birində yolsuz hər çölü, hər dağı
Keçdi ay, günəştək onun bayrağı.
Birinci məclisi bitirdim artıq,
İkinci məclisə vurdum yaraşıq.





Bu "Şərəfnamə"nin məclisində mən
Saçmışam ən incə, bakir sözlərdən.
Ona bağladığım incə incilər,
Hər dastan başında saçdığım gövhər,
Bir yerdə bir telə düzülsə bunlar,
O tel ən parlayan inciylə dolar.
Hər dastan başında mənalı sözlər,
Hikmətə dair bir başlıca dəftər.
Tarixə ən tanış o saqiləri,
Aldım iş başına hər bir rəhbəri.
Oturan göz oldu bu biliklərə,
Xəznədə keşikçi oldu gövhərə.
Belə incə nəqşi kim qura bilər?
Bu gözəl rəngləri kim vura bilər?
Sazına bağladım elə incə tel,
Olmuş hər nəğməsi Zöhrədən gözəl.
Hər yerdə bir yanlış gördüm, silərək
Toxudum ona ən doğru bir bəzək.
Doğruluq yolunu tutmayan sözlər
Aya ucalsa da qiymətdən düşər.
Hər yerdə o qoca, o sənət əri
Yanlış söyləmişdi doğru sözləri.
Yanlışa yenidən vurdum bir bəzək
O qoca şairdən üzr istəyərək [illegible]
Çatınca sona bu binanın nisfi,
Verildi mənə bu dünyanın nisfi.
O biri nisfini, zaman olsa var,
Təbimlə bəzərəm elə bil gülzar.
Oxucu yuxudan qalxar bu səsə,
Balığı dənizdə gətirər rəqsə.
Zəmanə azacıq verərsə aman,
Şüurum söz verir mənə, var güman
Bu Rumi qılıqlı, naxışlı bağda
Al güllər göyərdim sarı torpaqda.
Ən parlaq firuzə və incilərdən
Xəzinə doldurum, şaşırsın görən.
Hər bağdan bir çiçək alaraq hələ,
Hər güldən bir gülab axıdım nəhrə.
Padşahın taleyi edərsə kömək,
Sözlərim düzülər incə incitək.

## NÜSRƏTƏDDİN ATABƏYİN SİTAYİŞİNƏ DAİR

Saqi, ay işıqlı camı ver mana!
Padşahın taxtını öpmək adına,
Taxtımı ucaldım uca Pərvinə,
Qədəhı boşaldım şah şərəfinə.
Ölkələr fəth edən, dünya pənahlı,
Firidun kəmərli, xaqan külahlı,
Sultan Nüsrətəddin ədalətindən
Bu dünya xatırlar şərab içərkən.
Bir göydür ki, ulduz ona nur verir,
Dənizdir ki, tacı öz gövhəridir.
Dünyanı yumuş bu üçüncü dəniz,
Nəsara dinindən etmiş tərtəmiz[265].
Uca, dik başını Müştəri öpər,
Onun bir nəzəri min işıq səpər.
Təslis və tərbiə cəvahir saçan,
Nəsara dinindən etmiş tərtəmiz[266].
Mübarək bəxtindən dünya kam almış,
O köhnə şahlardan yadigar qalmış.
Ulduz baş çəksə də uca göylərə,
"Bəndənəm" deyərək baş qoyar yerə.
Dünyanı padşahlıq gücüylə hər an
Doldurmuş biliklə, silmiş qubardan.
Məclisin başında parlaq günəşdir,
Döyüşdə əjdaha yaxan atəşdir.
O qədər durudur qəlbinin gözü,
Onunla nurlanır günəşin üzü.
Qılıncı qana qəsd etdiyi zaman
Su, atəş çıxarır qara daşlardan.
Yayından buraxsa nişan oxunu,
Yerlərə bağlar o, göyün boyunu.
Firənglə Fələstin, Rum keşişləri
Verdiyi buyruqdan durmazlar geri.
Gördüm ki, güvənmiş işıqlı baxta,
Oturmuş şahanə mübarək taxta.
Əlimdə yox elə böyük hədiyyə,





Şahım, o şahanə taxta səpməyə!
İskəndər getdiyi çeşmədən də saf
Bir gövhər düzdüm ki, ondan da şəffaf
Bitincə gövhəri aldım hüzurə,
Gövhəri hədiyyə verdim gövhərə[267].
Verdim bu gövhərin üzüyünü mən
Yeni İskəndərə o İskəndərdən.
Yaşasın padişah uca baxtıyla!
Var olsun həmişə tacü taxtıyla!
Bağçanda ötən bu şeyda bülbülün
Səsiylə şənlənsin mübarək ömrün.
Elə tacıdarsan, göylərin tacı
Tacının ucunu öpmək möhtacı.
Bu taxta tək səni bəyəndi dövlət,
Dünyada bəxtiyar bir sənsən, əlbət.
Dünyada olmamış mümkün kimsəyə
Göndərsin padşaha layiq hədiyyə.
Böyük bir dəryaya saxsı kuzədən
Bir damcı su damsa, olurmu görən?
Qara daşdan sızan damcılar, əlbət,
Dənizə yetişməz, bu bir həqiqət!
Nizami ki, quldur, bəndədir sana,
Yazdı bu naməni sənin adına.
Qarışqa, Süleyman taxtıdır, deyə,
Bir çibin qanadı verdi hədiyyə.
Tovuzun qanadı olsa da rəngin,
Baxsana səsinə - pişikdən çirkin.
Bax, kiçik bir bülbül cəh-cəh edərkən
Quşları aşağı endirər göydən.
Mən haman bülbüləm, uçdum cənnətdən,
Sənin gül bağçanda eylədim məskən.
Dövründə oxuyum elə tərانə.
İllərcə yayılsın adın cahanə.
Onunçun adına yazdım bir dastan,
Qələmim qızıla batsın naxışdan.
Qəsdim fil tiynətli zər almaq deyil,
Məhmudun filinə bənzəməz bu fil.

Kimsə istəmədən sərvət verərsən,
Qədərsiz xəzinə, xələt verərsən.
Yazmaqdan olsaydı qəsdim gövhər, dürr,
Dürr, gövhər yonmaqla keçərdi ömür.
Bu işə eşqim var əzəldən, başdan,
Qızılda gözüm yox, eşqimdir cahan.
Söz demək sirrini mənə verdi haqq,
Sənə də düşüncə, qüvvət və anlaq.
Xəyala nə gəlsə artıqsan ondan,
Məmləkət alan ol, dünyanı tutan!
Bu uca fələkdən hey zaman-zaman
Başqa bir zəfərlə səadət qazan!
Dünya gənc ömrünə dadımlıq olsun,
Qismətin dünyadan qoy artıq olsun!





# İZAHLAR

[1] *Göyləri sən qurdun, ucaltdın, Allah,*
*Ona yer üzünü etdin güzərgah.*

Qədim insanların təsəvvürüncə, bütün kainatın mərkəzi yer hesab edilirdi; Göy isə yerin ətrafında dolanır. Buna görə, - yer göylərin güzərgahı, keçdiyi yoldur, - deyilir.

[2] *Sənsən bu aləmdə bir damcı sudan,*
*Günəşdən işıqlı gövhər yaradan.*

Burada Günəşdən işıqlı gövhər ifadəsi ilə insan da nəzərdə tutula bilər. Bir damcı sudan (nütfədən) insanı yaradan sənsən, - mənası da anlaşıla bilər.

[3] *Fələyi uca bir hasara aldın,*
*O yerdə idrakı kəməndə saldın.*

Yəni insanın şüuruna, fikrinə göylərin xaricində nə olduğunu bilməyə imkan vermədin.

[4] *Sənin varlığındır o laməkandan,*
*İdrak elçisini hər an daşlayan.*

Yəni sənin yersiz - məkansız olan varlığın səni tapıb öyrənmək istəyən idrak elçisi insanı hər an daşlayıb, yaxına buraxmaz.

[5] *Yollardan tüstünü qaldırsan əgər,*
*Bir çibin Nəmrudun beynini yeyər.*

Dini rəvayətlərə görə, Nəmrud allahlıq iddiası edərkən bir çibin onun burnundan beyninə getmiş, onu öldürmüşdü. Nəmrud Babili tikdirmiş və orada hökmranlıq etmişdir. Özü bütpərəst olmuşdur. Guya imana gəlmədiyindən vücuduna milçəklər daraşaraq onu tələf etmişdir.

[6] *İstəsən əzilsin düşmənin beli,*
*Quşlarla qırarsan əshabi-fili.*

Dini rəvayətə görə, müsəlmanların peyğəmbəri Məhəmmədin anadan olduğu 569-cu ildə Həbəş padşahı Ərəbistana gələrək, Kəbəni dağıtmaq məqsədi ilə Məkkəni mühasirəyə alır. Onun ordusunda müsəlləh hərbi fillər də var imiş. Lakin Allah onun üzərinə Əbabil quşlarını (dağ qaranquşları) göndərir. Bu quşlar dımdiklərində xırda daşlar gətirib, Həbəş qoşununun üstünə salırlar. Kimin başına bu daşlardan düşürsə, o, yara çıxardıb ölür. Bu hadisə həbəşləri geri qayıtmağa məcbur edir. Hərbi fillər ərəblərə dərin təsir bağışladığı üçün həmin ili fil ili, onların sahiblərini isə əshabi-fil (fil sahibləri) adlandırırdılar.

7 *Gah kiçik nütfəyə qoydun qızıl tac,*
*Gah xırda çərdəkdən yaratdın ağac.*

Yəni gah bir damcı sudan ibarət olan nütfədən bir xoşbəxt adam - bir padşah, bir filosof, bir peyğəmbər yaradırsan, gah da bir çəyirdəkdən bir ağac çıxarırsan.

8 *Gah Xəlil alırsan bütxanələrdən,*
*Gah dost yaradırsan biganələrdən.*

Dini rəvayətə görə, İbrahimxəlil peyğəmbər öz atasının dinini, yəni bütpərəstliyi atmış, bütxanəyə gedib, bütləri qırmışdır. Burada Xəlil - İbrahimxəlil peyğembərə işarə olmaqdan əlavə, eyni zamanda dost mənasını verir. İbrahimxəlil əvvəl bütpərəst ikən biganə idi, Allahı tanımırdı, sonra Allahı tanıdı, bütləri qırdı, biganəlikdən çıxıb dost oldu. Qiymətli cavahir doğan bir evdən, Əbu Talibi də çıxaran sənsən.

Burada qiymətli cavahir dedikdə, ya Məhəmməd peyğəmbər və ya onun əmisi oğlu, dördüncü xəlifə Əli nəzərdə tutulur. Məhəmmədin atası öldükdən sonra əmisi Əbu Talıb yetim qalmış Məhəmmədi oğulluğa götürmüşdü. Nizami burada demək istəyir ki, Əbu Talibin böyüklüyünə, yəni peyğəmbərin atalığı və Əlinin atası olduğuna baxmayaraq, yenə də onu qapıdan qovdu, çünki Əbu Talib, sünnilərin əqidəsinə görə, islamiyyəti qəbul etməmişdi.

10 *Kəsərli ayəni öyrətmək səndən,*
*Şeytanın gözünü tikməksə məndən.*

İslam dininə görə, güya Şeytan "Quran"ın ayələrini eşitdikdə orada dura bilməz, qaçıb gedər. Nizami bu beytində demək istəyir ki, sən mənə ayələrini öyrət, yəni mənə yardım et, mən də Şeytanın gözünü bağlayım, günah işlər görməyim.

11 *Adın mehribanlıq etsə bir qədər,*
*Mənimlə oynaya bilərmi divlər?*

Yəni sən məni istəsən, gözün üstümdə olsa, qara qüvvələr mənə ziyan vura bilməz.

12 *Bu köhnə dəzgahdan düşərsəm uzaq...*

Yəni ölüb bu dünyadan gedərsəm... Burada köhnə dəzgah dünya mənasında işlənmişdir.

13 *Zamindir qaraya, ağa bu rəhbər...*

Yəni Məhəmməd günaha da, savaba da zamindir.

14 *Xalını qaraldır Əbbasilərin,*
*Gözünə nur saçır şəmmasilərin.*

Əbbasi xəlifələrinin paltarları və bayraqları qara idi. Xalını qaraltmaq





ifadəsi burada Əbbasilərin səltənət və əzəmətinə işarədir. Şəmmas-atəşpərəst, həm də gözdə ağ - tıtə deməkdir, İnad göstərmək mənasında işlənir.

Yəni atəşpərəst şəmmasilərin gözündən ağlığı, korluğu alıb nur saçdı, onları müsəlman etdi.

15 *Dodağı İsadan daha möcüzkar.*

Yəni onun (Məhəmmədin) nəfəsi ölüləri diriltən İsanın nəfəsindən daha möcüzəlidir.

16 Zülmətin suyutək geyinmiş paltar.

Yəni dirilik suyu zülmətdə, qaranlıq içində gizli ikən, onun da vücudu qara paltarla örtülü idi.

17 *Göy - ona dünyada dörd tağı quran,*
*Yer - ona fələkdə beş növbət vuran.*

Yəni göylər ona yerdə dörd ünsürdən dörd qübbəli çadır quran, yer də göylərdə onun beş növbət vuranıdır. Səlcuq padşahı Sultan Səncərdən qabaq şahların saray darvazasında gündə dörd dəfə nağara çalmaq qayda idi.

Sultan Səncərdən sonra nağara çalmağın sayı beşə qaldırıldı. Nizami burada beş növbət vuran dedikdə, beş vaxt namaz qılmağı nəzərdə tutur.

18 *Odur öz ağlına eləyən təkyə,*
*Ayı barmağıyla bölən ikiyə.*

Dini etiqadlara görə, Məhəmmədin möcüzələrindən biri də Ayı barmağı ilə ikiyə bölməsidir. Güya qureyşilərin rəislərindən Əbu-Sufyan və Əbu Cəhl bir dəfə Məkkədə Məhəmməddən doğrudan da peyğəmbər olduğunu isbat etmək üçün Ayı barmağı ilə ikiyə bölməyi tələb etmişlər.

Məhəmməd də güya barmağı ilə Aya işarə etmiş və Ay iki parça olmuşdur. Sonra yenə barmağını Aya doğru uzatmış, Ay parçaları yenidən birləşmişdir.

19 *Hər iki dünyadan bir don tikərək,*
*Onlardan düzəltmiş yeganə bəzək.*
*O donu geyərkən pak vücuduna,*
*Bir qarış az gəldi uca boyuna.*

Yəni Məhəmməd iki aləmdən də yüksəkdir, onun varlığı bu aləmə, yer və göy aləminə sığışmadı.

20 *Dəvətə genişlik o vermiş yenə,*
*Daşlar da şahiddir möcüzəsinə.*

İslamiyyət uğranda apardığı müharibələrin birində Məhəmmədin ağzını vurub yaralamışdılar. Bu beyt həmin hadisəyə işarədir.

21 *Göy gecə məclisi qızışdırmışdı,*
*İşıqdan gecənin gözü qamaşdı.*

Məhəmməd peyğəmbərin meraca getdiyi, yəni göyün yeddinci təbəqəsinə qalxdığı gecə göylər ondan işıqlandı.

23 *Çin ipəklərinə düzmüş dürr, gövhər...*
*Yəni göyləri ulduzlarla bəzəmişdir.*

Yetmiş yollu yurddan köçünü vurdu, Çadın yeddinci fələkdə qurdu. Yəni yetmiş iki millətin yurdu olan bu dünyadan köçüb, yeddinci fələyə meraca getdi.

24 *Doqquz hücrəsini bir an buraxdı,*
*Göyün doqquzuncu tağına qalxdı.*

Məhəmmədin doqquz arvadı və doqquz otağı vardı. Yəni o, doqquz hücrəsinin ışından əl çəkdi, dünyanı tərk etdi, doqquzuncu fələyə getdi.

25 *Yeddinci əflakə çapdığı zaman*
*Dişan atıldı dördkünc daxmadan.*

Dini etiqada görə, Məhəmməd meraca Büraq adlı mövhumi at üzərində getmişdir. Dördkünc daxma - güya dörd ünsürdən (sudan, oddan, havadan, torpaqdan) vücuda gəlmiş yer deməkdir. Yəni yeri buraxıb, göyə çıxdı.

26 *Ərəb səmasında bir Süheyl çapdı,*
*Yəmən gönü ondan yeni rəng tapdı.*

Yəni onun (Məhəmmədin) Büraqı ərəb torpağının göylərində Süheyl ulduzu kimi parladı, onun nurundan Yəmənin tumaçı rəng və xoş qoxu aldı. Süheyl - cənubda görünən çox parlaq bir ulduzdur.

27 *Gecə otlağından, sərxoş olaraq*
*Ay kimi gəlmişdi əldə şəbçıraq.*

Əfsanələrə görə, şəbçıraq elə bir gövhərdir ki, dəniz atı sahilə otlamağa çıxarkən onu özü ilə çıxarır, işığında otlayır, doyub məst olandan sonra yenə o gövhəri özü ilə dənizə aparır. Nizami burada Büraqı həmin əfsanəvi dəniz atına, Məhəmmədi də həmin nurlu gövhərə bənzədir: at, gövhəri (şəbçıraqı) dənizə apardığı kimi, Büraq da Məhəmmədi göylər dənizinə, asimana aparmışdır.

28 *O səyyar dənizdən toz qoparırdı.*

Burada dəniz - göylərə işarədir. Yəni Məhəmməd göyləri çox sürətlə keçib gedirdi.

29 *Çatdı hər dənizə yeddi ülkərdə,*
*Yeddi yol yuyundu o dənizlərdə.*

Yəni göylərin yeddi təbəqəsini keçib, daha da yüksəklərə qalxdı.

30 *Ütarid ulduza verdi qələmi,*
*Əlinə qələmi alarmı ümmi?*

Ütarid ulduzu - köhnə astroloji təsəvvürə görə, göylərin katibi sayılır. Ümmi isə savadsız deməkdir. Yəni oxuyub-yazmaq bilməyən Məhəmməd öz gəlişi ilə Ütarid ulduzunu savadlandırdı, işıqlandırdı.





31 *Ərş divangahını sürətlə keçdi,*
*Dərcin də yolunu bir anda biçdi.*

Dərc - burada Məhəmməd peyğəmbərin güya meraq gecəsində keçdiyi göy pillələrindən birinin adıdır. Yəni Məhəmməd göyün təbəqələrini, o cümlədən dərc pilləsini keçib, yeddinci qata yüksəldi.

32 *Ağızdan çıxmayan səsi eşitdi,*
*Görünməz simanı ziyarət etdi.*

Yəni Allahdan gələn səsi eşitdi və gözə görünməyən varlığını iman gözü ilə gördü.

33 *Tərifə başlasam dörd yavərini,*
*Dörd gövhər satan var, dörd gövhər alan.*

Burada dörd yavər dedikdə, Məhəmməddən sonra onun yolunu davam etdirmiş olan dörd xəlifə nəzərdə tutulur. Gövhər - burada islam dini deməkdir. Dörd gövhər satan və alan - yenə dörd xəlifəyə işarədir.

34 *Bu dərviş sifətli dörd böyük soltan,*
*Dünyaya olmuş dörd təkbir oxuyan.*

Dərviş sifətli dörd soltan - yenə dörd xəlifəyə işarədir. Dörd təkbir - ölü üçün oxunan namazdır; burada üz çevirmək mənasındadır. Yəni o dörd xəlifə dünyadan üz çevirib, onun bütün varına göz yummuşlar.

35 *Bazarlar olmuşdu səs-küydən uzaq,*
*Zınqırov səsindən dincəlmiş qulaq.*

Yəni bayır-bazar küydən, gurultudan boşalmış, hər tərəfə səssizlik çökmüşdü. Gecə qarovulları yatmış, zınqırovların səsi kəsilmişdi (Şahların qarovulları bellərinə zınqırov bağlardılar ki, onun səsindən yuxuları qaçsın, yatmasınlar).

36 Dan yeri başını salmışdı suya.

Yəni Günəş də göyün dənizinə qərq olmuşdu.

37 *Gah başım dizimin üstündə dalğın,*
*Yer - başım altında, göy - ayağımın.*

Yəni başım dizimin üstündə, fikrə dalmış halda xəyalat və ilham göylərində uçurdum. Deməli, yer başımın, göy isə ayaqlarımın altında idi.

38 *Günəş qarşısında əriyəntək mum,*
*O mumla gözümdən çəkildi yuxum.*

Yəni Günəş mumu əridən kimi, mənim qızğın fikirlərimlə coşğun ilhamım yuxumu əritmişdi, səhərə qədər yatmamışdım.

39 *Müəzzin başlarkən birinci qunut*
*Ki: "Subhanə həyyəlləzi layəmut"...*

Yəni azançı əvvəl Allahın əmrlərinə tabelik duasını oxudu: "Həmişə diri və əbədi ölməz olan Allaha alqışlar olsun", dedi.

40 *Başladı ürək, dil: "Şeir yaz" deyə,*
*Harut, Zöhrə kimi cadugərliyə.*

Yəni Harut və Zöhrə bir-biri ilə eşqbazlıqda şirin, gözəl söhbətlər və sehrbazlıqlar etdikləri kimi, mənim də qəlbim, dilim bədii söz yaradıcılığında möcüzəli sənət əsərləri yaratmaqla məşğuldur.

Harut və Marut dini xurafatda İki mələyin adıdır; Güya Babil qülləsində bir quyudan başıaşağı asılmışlar.

Əfsanəyə görə, Harut Zöhrə adlı bir qadınla eşqbazlıqda ona sehr və əfsun öyrətmiş və güya bu qadın öyrəndiyi sehr ilə göyə qalxaraq orada Zöhrə ulduzuna çevrilmişdir. Zöhrə ulduzu İran mifologiyasında həm də göy çalğıçısı sayılır. Farsca ona Nahid deyilir.

41 *Bu barlı ağacdan kim meyvə dərsə,*
*Söyləsin xoşbəxtdir bu bağban kimsə.*

Burada barlı ağac Nizaminin əsərinə - "Şərəfhamə"yə işarədir. Kim meyvə dərsə, yeni kim "Şərəfnamə"ni oxusa... Bağban isə o meyvələri yetişdirən, yəni o sözləri yazan Nizamidir.

42 *Ancaq bir şərtim var: bir para dəcəl,*
*Qonşunun malına uzatmasın əl.*

Burada Nizaminin müasirləri olan bəzi xırda şairlərə işarə edilir. Qonşunun malına uzatmasın əl, yəni mənim əsərlərimi oğurlamasın.

43 *Damcı oğrusundan qorxarmı dəniz?*
*Buludum yağdırar ondan çox, şəksiz.*

Yəni mənim təbim bir dənizdir: o, damcı oğurlayanlardan qorxmaz. Oğruların apardıqları damcılar əvəzinə ilhamımın buludu bir anda mənə ondan çox muzd verir.

44 *Ay işığı qədər olsa yüz çıraq,*
*Yenə Günəş ona vuracaqdır dağ.*

Burada günəş Nizami, çıraq isə dövrünün xırda şairləridir.

45 *Dağlara buludlar ağ kafur saçdı,*
*Ac torpaq ağzını kafurçün açdı.*

Yəni dağdan kafur yağdıran bulud göründü - qocalıqdan başımda saçlarım kafur kimi ağardı və həyatım sona yetdi (müsəlmanlıqda ölünü basdırmazdan əvvəl yuyarkən üstünə kafur səpərlər).

46 *Bu zaman bir bucaq xoşdur saraydan,*
*Oyuncaq əlini uzadar dövran.*

Yəni qocalıqda yoxsulca bir küncdə yaşamaq sarayda kef çəkməkdən yaxşıdır, çünki bu zaman artıq dövran insanı qocalığına görə ələ salar, ona istehza edər.





47 Məşriqdən ağardı daha dan yeri.

Yəni saçlarım ağarmış, artıq qocalmışam.

48 *Başına tac ilə kim vursa bəzək,*
*Əmgəyi ağ deyil, müşk olsun gərək.*

Yəni taca layiq olan başa şirmayı kimi ağ saçlar deyil, müşk kimi qara saçlar lazımdır; demək, bunun üçün qoca deyil, cavan olmalıdır.

49 *Keçərsə körpüdən bu Gilan atım,*
*İnanma Gilana bir də qayıdım.*

O zaman yaxşılığı ilə məşhur olan Gilan atı nəzərdə tutulur. Yəni ömrümün Gilan atı həyat körpüsündən keçəndən sonra bir də dünyaya qayıtmayacağam, əbədiyyətə qarışmış olacağam.

50 *Qəbrim şüşəsinə əl qoyan zaman,*
*O pak gövhərimi heç olmasa an.*

Şüşə - burada təpəcik mənasındadır. Adətə görə, birinin qəbri üstünə gedənlər o qəbrin təpəciyinə əl basarlar.

51 *Bir mey ki, suyu saf, axan gümüşdür,*
*Onu hər dörd məzhəb halal görmüşdür.*

Burada zülal suyu kimi təmiz, saf şərab deməklə Nizami güya cənnətdə olan kövsər suyunu nəzərdə tutur və onun bütün məzhəblərdə halal olduğunu söyləyir.

52 Dörd məzhəb - müsəlmanların iki böyük qismindən biri olan sünnilərin məzhəbləridir: hənəfilər, şafeilər, hənbəlilər və malikilər.

Bərcistək oxum var, atmaram ancaq.

Bərcis Müştəri ulduzunun farsca adıdır. Bu ulduz Qövs ( K a m a n ) bürcündə olduğu üçün ondan ox atarmış. Nizami anlatmaq istəyir ki, düşmənlərlə və paxıllarla mübarizədə mənim də Müştəri ulduzu kimi silahım, sözdən, şeirdən oxlarım var, istəsəm vuraram.

53 Zöhrətək çəkiyə qoyaram dirhəm.

Zöhrənin evi Tərəzi bürcüdür. Yəni mən də söz dirhəmini (gümüşü) Zöhrə kimi tərəzidə çəkərəm.

54 *Hər çillə qırx gündür, xəlvəti mindir,*
*Bu yerdən məclisə girmək çətindir.*

Çillə - burada zahidlərin cəmiyyətdən uzaqda keçirdikləri qırx gün deməkdir. Buna dərviş çilləsi deyilir. Yəni qırx çillədən və min cürə pəhriz, qənaət, ibadət işləri ilə məşğul olandan sonra, daha şahların məclislərində iştirak etmək yaramaz. Demək, ömrümü azad, öz aləmimdə keçirdikdən sonra daha saraya girmək, saray şairi olmaq məndən uzaq olan işdir.

55 *Görsəydim özümdən gözəl bir gülşən,*
*Al, sarı gülünü dərməzdimmi mən?*
*Hazıram budumdan kabab yeməyə,*
*Günəştək getməyim dilənçiliyə.*

Yəni əsərlərimdən gözəl əsər, özümdən yaxşı şair görsəydim, mən də onun budağından bir gül dərərdim. Lakin, yox, ətəyimi öz sözümün fidanından doldururam, öz ətimdən kabab yeyirəm. Buna görə, Günəş kimi başqalarının qapısını gəzmək mənə lazım deyildir.

56 *Mən Ölü olsam da, ən mərd bir kəsəm,*
*Karvanda gedərəm, karvansız şəxsəm.*

Yəni mən qoca və zəif olsam da, həyat yolunda mərdliklə yeriyən bir adamam. Mən bu dünyada yaşayanlardan - bu karvan əhlindən deyiləmsə də, dirilər karvanı ilə gedirəm.

57 *Nəfsin noxtasını bərk tutdum qırx gün,*
*Qırx günün içində hazır olur gön.*

Gönü tamamlamaq və qırmızı rəngə boyamaq üçün qırx gün dabbaqxanada bişirirlər. Yəni mən də qırx gün riyazət çəkdim, nəfsimin ıxtiyarını əlimə aldım, öz guşəmdə oturdum və məqsədimə nail oldum.

58 *Çünki dörd balışda görmədim səbat,*
*Dörd divar içində keçirdim həyat.*

Dörd balış - şahlıq taxtına və dörd ünsürə işarədir. Bu, eyni zamanda qüdrət və qüvvət rəmzidir. Yəni dörd ünsürdən əmələ gələn bu dünyada, yaxud onun şahlıq taxtında bir səbat, vəfa görmədim. Odur ki, bu dünyadan üz çevirib, xəlvətə çəkildim.

59 *Qəlbim qadın deyil, çaxmaqdır, çaxmaq,*
*Məryəmtək boyludur, bakirdir ancaq,*
*Kişiyə getmeyə nə ehtiyac var,*
*Onun öz daşından öz odu çıxar.*

Yəni təbimin kimsəyə ehtiyacı yoxdur. O, Məryəm kimi ərsiz də doğmağa qadirdir. Onun poladı da, çaxmağı da özündəndir. Yazdıqlarım, yaratdıqlarım öz qəlbimin orijinal məhsuludur, kimsənin onda haqqı yoxdur.

60 *Nizami bu sapa düzərkən gövhər,*
*Qələmdən silindi qələm görənlər.*

Yəni mən "Şərəfnamə"ni yazarkən Firdovsinin yazdıqlarını buraxdım, yazmadım; deyilməmiş, yazılmamış olanları nəznə çəkdim.

*61 Quruda, dənizdə kim çəksə zəhmət,*
*Balıqdan dürr alar, öküzdən sərvət.*

Mifoloji təsəvvürə görə, Yer kürəsi öküzün, öküz balığın üstündə, balıq da





suda dayanmışdır. Beytin mənası: kim ki əməyə alışmış, zəhmət çəkməyi özünə sənət etmişdir, o, yerin altında olan balığın qarnında da olsa dürr, Yerin istinad etdiyi öküzün altında da olsa xəzinə əldə edə bilər. Əməyin qarşısında heç bir şey dura bilməz.

62 Gümüş küp, ya qızıl bir teşt istəsən,
İraq torpağından uzaq getmə sən.

Əgər sənətin gümüş küpünü, şeirin qızıl teştini istəyirsənsə, bunu İraqda axtar.

63 *Bilənlər əkdiyi üç toxumdan mən,*
*Bir ağac əkərəm həm uca, həm şən.*

İskəndər Zülqərneyn üç sifətə malik imiş: padşahlıq, alimlik və peyğəmbərlik. Nizami burada İskəndərin tarixi haqqında bu üç mövzuda yüksək və parlaq bir əsər yazacağam deməklə, "İskəndərnamə"ni nəzərdə tutur.

64 Üç qapı tikdim, üç xəzinə demək,
Çəkdim hər qapıda ayrıca əmək.

Yəni üç ev üçün - İskəndərin sifətlərini göstərən padşahlıq, alimlik və peyğəmbərlik evləri üçün üç qapı tikdim; üç cəhətdən əsər yazdım. Hər cəhət üçün ayrıca əmək sərf etdim. Bunların hərəsi özlüyündə bir sənət və söz xəzinəsidir.

65 *Bu namə mübarək olacaq, bişəkk,*
*Şahın məclisində olsa mübarək.*

Burada şah - Nüsrətəddin Əbu Bəkr ibn Məhəmmədədir, namə isə "Şərəfnamə"yə işarədir.

66 *Yaquta bənzəyən suyu, saqi, dur,*
*Bu yaqut yağdıran qədəhə doldur.*
*Bu saxsı cama mey həyat axıdır,*
*Onun reyhanını öz torpağıdır.*

Yaquta bənzəyən su - Nizaminin çoşub-daşan sözləri, yaqut yağdıran qədəh, cam - onun qəlbi və təbidir; mey - o qədəhin canıdır, yəni şairin sözləri o qəlbin həyatıdır.

67 *Ey inci, üzə çıx söz dənizindən,*
*Sultanın tacında get elə məskən.*

Yəni ey sözlərim, təbimin dənizindən çıx, şahın tacına layiq qiymətli incilər ol.

68 *Düşmən son düşünən, ürəyində kin,*
*İstiqbal görəndir, ləqəbi Bişkin.*

Yəni düşmən işə keçəndən sonra o, iş haqqında düşünür. Bişkin isə öncəgörmə qabiliyyətinə malik olduğu üçün, hadisə baş verməmişdən qabaq

onun çarəsini tapır. Bişkin - Atabəy Nüsrətəddin Əbu Bəkr ibn Məhəmmədin ləqəblərindən biridir.

69 *Qılınc sahibidir, tac verən şahdır,*
*Üç növbət vurandır, beşə pənahdır.*

Üç növbət - uzun zaman padşahların qapısında gündə üç dəfə nağara vurardılar. Deyirlər ki, bu, İskəndər Zülqərneyndən qalmışdır. Beş növbət - müsəlmanların hər gün beş vaxt qıldıqları namazdır.

Beytin mənası: qüvvət və taxt-tac sahibi olan Nüsrətəddin elə bir şahdır ki, onun qapısında, İskəndər dövründə olduğu kimi üç dəfə növbət vurulur. Özü də islamın yardımçısı və pənahıdır.

70 *Fərattək səmimi bir dostluğu var,*
*Nil kimi düşməni gizlində boğar.*

Yəni Nüsrətəddinin dostluğu Fərat çayının suyu kimi şirin və aşkardır. Düşmənini də, guya Tanrı düşmənlərini boğub gizlədən Nil çayı kimi xəbərsiz məhv edəndir.

71 *Fələktək hər kəslə girsə meydana,*
*Atar qalxanını torpaqtək suya.*

Yəni Nüsrətəddin göy kimi, fələk kimi yenilməzdir; o, vuruşanda duşməni öz qalxanını suya atar, məğlub olar.

72 *Hər şəhrə hünərlə qələbə çalmış,*
*Qarun sərvətini əlinə almış.*

Qarun - mifoloji rəvayətə görə, mal-dövlətinin çoxluğu, eyni zamanda xəsisliyi ilə məşhur bir adam imiş.

73 *Yer xəzinəsindən bir çuval tikmiş,*
*Xeyri zər toplamış, yasəmən gümüş.*

Xeyri - rəngi həmişə sarı olan həmişəbahar gülüdür. Zər - qızıl deməkdir. Yasəmən də gümüş kimi ağ, xoş qoxulu çiçəkdir.

Yəni Keyxosrov, o qədər dövlətlidir ki, xeyri sarılığını onun qızıllarından, yasəmən də ağlığını onun gümüşlərindən almışdır.

74 *Fillərlə döyüşdə atınca kəmənd,*
*Qənnucun şahını edərsən filbənd.*

Qənnuc - Hindistanın ən qədim şəhərlərindən biridir. Sultan Mahmud Qəznəvi tərəfindən məhv edilmiş bir dövlətin paytaxtı idi. Vaxtilə çox böyük olmuş, indi isə bir qəsəbə halındadır. Filbənd etmək - şahmatda fil və piyada ilə şahı mat etmək deməkdir,

75 *Saydığım altı şey maxsusdur sana,*
*Adında altı hərf şahiddir buna.*





Altı şey - izahı yuxarıdakı misralarda verilir. Adında altı hərf - ərəb əlifbası ilə yazılarkən Nüsrətəddin sözündəki altı samit hərfdir: n, s, r, t, d, n.

76 *Yeddi göy altında, ey dünya şahı,*
*Beşinci ölkənin sənsən pənahı.*

Beşinci ölkə - qədim Şərq coğrafiyasında Türküstan və Azərbaycan sayılırdı. Yəni Türküstan və Azərbaycanın şahı sənsən.

77 *O gizli xəznəni aça bilməsə,*
*Verər qızıl açar şənlik o şəxsə.*

Yəni bu əsəri oxuyub oradakı hikmətləri anlamasa da, əlində belə bədii bir açarın, əsərin olması onu sevindirər.

78 *Bu Çin ipəyinin naxış evində,*
*Maninin fırçası düşmüşdür bəndə.*

Yəni "Şərəfnamə" elə sənətkarlıqla işlənmişdir ki, məşhur sənətkar Mani bunun qarşısında heyran qalmışdır.

79 *Ulduz güzgüsüylə o boyük qeysər,*
*Qaranlıq içindən çıxardı gövhər.*

Yəni ilk dəfə güzgü qayıran, qaranlıq bir dəmirin içindən işıqlı gövhər çıxaran İskəndər oldu.

80 *Bulqar şəhrini o, etdi bərqərar,*
*O şəhrin adıdır əslində Bün-qar.*

İskəndər zülmətə gedəndə əsbab-əsləhəsini və qoşununu bir mağarada qoyub getmiş, sonra o mağaranın yerində bir şəhər tikdirmiş, adını Büni-qar qoymuş və bu ad tədricən Bulqar şəklinə düşmüşdür. Büni-qar - mağaranın dibi deməkdir.

81 *Dünyaya gəlmədən əvvəl xaçpərəst,*
*Çəkdi bu dünyaya xaç kimi bir xətt.*

İskəndər ekvator xəttindən biri Şimal, digəri Cənub qütbünə tərəf xətlər çəkdi, dünyanı dörd yerə böldü.

82 *Həmin bu dörd bucaq ətləsi xətlə*
*Həndəsi ölçünü keçirdi ələ.*

Ətləsi xətt - ekvator xəttitidən çəkilən xətlərə işarədir. Beytin mənası budur ki, İskəndər həmin bu dörd xətlə həndəsə elmini yaratdı.

83 *Dörd bucaq üstünə bir də artırdı,*
*Bu doqquz fələyə beş növbət vurdu.*

Dörd bucaq - İskəndərin ekvator xəttinin üstündən keçən qütblər dairəsi ilə dörd yerə böldüyü dünyaya işarədir. Yəni İskəndər bu dörd bucaq dünya üzərində elə bir nağaraxana qurdu, daha doğrusu, elə bir əzəmət sahibi oldu ki, səsi, tərifi doqquzuncu fələyə çatdı.

84 *O, rübi-məskunu etdi aşikar...*

Qədim ərəb coğrafiyaşünasları yeri dörd hissəyə bölərdilər. Bunlardan yalnız birində insan yaşayırmış. Misranın mənası: dünyanın dörddə birinin məskun olmasını həndəsə vasitəsilə İskəndər müəyyən etdi.

85 *İskəndər bir böyük yol təqib etdi,*
*Dirilik suyunun dalınca getdi...*
*...Dirilik suyunun olmadı sonu,*
Ancaq indi tapdı həyat suyunu.

Yəni İskəndər o zaman abi-həyat tapmaq üçün zülmətə gedərkən düşünürdü ki, o sudan əbədi həyat tapacaq. Lakin o vaxt axtardığım indi "Şərəfnamə"nin bulağından tapdı və əbədi həyata yetdi.

86 *Xızr bu süfrəndə olmuş həmsüfrən,*
*Yetmiş yeddi suda ağzını yu sən.*

Bu, Nizaminin özünə xitabıdır. Madam ki, sən sənət bulağının daimi həyat suyunu içərək Xızr ilə həmsüfrə oldun, o halda daim doğru, təmiz sözlər söylə. Yetmiş yeddi su - son dərəcə təmizlik və paklığa işarədir.

87 *Rum şahı oldu bu bəxşişdən çox şən,*
*Mumunu qorudu yanar atəşdən.*

Yəni İskəndər (Bertelsdə - Dara) bu peşkəşdən sevindi və özünü Daranın qəhrindən hifz etdi.

88 *Ulduz tərəzisi ortaya gəldi,*
*Taleyi göründü Əsəd bürcündən.*

Yəni rəsəd alətləri işə başladı. Onun bəxtinə Əsəd (Şir) bürcü düşdü ki, bu da şücaət və quvvət əlamətidir.

89 *Günəş yaxınlaşdı o gün Həmələ,*
*Gedirdi elmdən çatsın əmələ.*

Yəni bu zaman Günəş də bilik və əmək nişanəsi olan Həməl bürcünə girmişdi.

Bundan sonra gələn üç beytin mənası belədir: bu zaman tale ulduzları öz evlərində idilər; Ütarid ulduzu Cövza bürcündə, Ay və Zöhrə Buğa bürcündə, Mərrix isə öz fərəh evi olan altıncı evdə idi. Səadətə yaxın olan belə bir tale ilə İskəndər dünyaya gəldi.

Şərq astrologiyasında hər planet üçün iki ev, daha sonra isə bir yoxuş, bir də eniş evi qeyd edilir. Öz evində və yoxuş evində planetlər müvəffəqiyyəti göstərir. Astrologiyanın təsvir edilmiş horoskopunda isə (horoskop - orta əsrlərdə münəccimlərin insan anadan olarkən onun taleyini, gələcəyini qabaqcadan söyləmək üçün tərtib etdikləri ulduzların düzülüş cədvəlidir) bütün planetlər ya öz evində və ya yoxuşunda göstərilir. Deməli, bu haləl müvəffəqiyyəti, xoşbəxtliyi xəbər verir.





90 *Bəxtini oxudu parlaq alnından,*
*Verdi oğluna da ondan bir ünvan.*

Yəni Nikumaxis İskəndərin taleyini təyin edərkən öz oğlu Ərəstunun da adını ona bağladı.

91 *Tale xidmətində duran zamanda,*
*Söz qaşı möhrünü vuran zamanda.*
Oğlunu tapşırdı gənc şahzadəyə.

Yəni ulduzlar xoşbəxtlik göstərən vəziyyətdə olduqları bir gündə o, Ərəstunu İskəndərə tapşırdı.

92 *Ağacdır - dörd kökü, altı böyrü var,*
*Çoxunu boğmuşdur bu qorxulu dar.*

Bu dünya altı cəhəti (önü, arxası, sağı, solu, üstü, altı) və dörd kökü, dörd ünsürü (su, od, torpaq, hava) olan bir dar ağacıdır ki, çoxlarını çarmıxa çəkmişdir. Buraya çoxları gəlib-getmişdir.

93 *Əlində tərəzi mahir söz ölçən,*
*Saxta əşrəfini saldı rövnəqdən.*

Burada Nizami özünü mahir söz ustası, əsərini də sözün dəyərini, saxta, ya saf olduğunu təyin edən tərəzi, əyar adlandırır.

94 *Hər hərfin üstünə barmaq bassam mən,*
*Tapılmaz üstündə qələm işlədən.*

Yəni mən başqalarının əsərinə toxunmaq istəmirəm; nöqsan axtarmağa başlasam, tənqidimin qabağında heç kəs dura bilməz.

95 *Elə bir dabbaqlıq etdim bu gönə,*
*Mətanət göstərsin hər ağır günə.*

Yəni mən özümə elə tərbiyə vermişəm ki, mənə əziyyət etsələr də, başqasını incitməyə qalxışmaram.

96 *O yaşıl sərv ilə Rumun torpağı*
*Reyhantək bəzəndi, şənləndi bağı.*

Yəni gənc İskəndərlə bütün Rum ölkəsi xoşbəxt oldu və onunla fəxr etməyə başladı

97 *Gəldi qurd ağzından sübhün nəfəsi,*
*Keşikçi itinin kəsildi səsi.*

Qurd ağzı - yalançı səhər, dan yeri deməkdir; yəni sübh açılmağa başlayanda, qarovulçunun itinin səsi kəsiləndə, itlər yatanda.

98 *Coşdu toppuz, yağdı mancanaq daşı,*
*Əyildi öküzün, balığın başı.*

Yəni elə şiddətli müharibə oldu ki, enən gürzlərin qüvvətindən yerin altında öküzün və balığın (gav-mahinin) başı əyildi.

99 *Ləli yer öküzü udduğu zaman,*
*Pusqudan sıçradı qapqara aslan.*

Dini rəvayətə görə, yer gav-mahinin, o da suyun üzərində durur. Günəş də gedib həman suda batır. Yəni gövhərə bənzəyən günəşi gav-mahi uddu, nəticədə qaranlıq çökdü.

100 *Mənimlə bu qorxu bilməyən pələng,*
*Olmasın Rum, zənci kimi iki rəng.*

Yəni bu pələng qorxusuz və iki rəngli olan dünya mənimlə ikiüzlülük etməsin, mənə qalib gəlməsin. Rum - ağ rəngə, gündüzə, zənci - qara rəngə, gecəyə işarədir.

101 *Aldadan yol oldu bu uzaq yollar,*
*Yeddinci fələkdə ancaq işıq var.*

Yəni dünyanın çox uzun olan yolu azdırıcıdır və qurtuluş işığı çox uzaqda görünür.

102 *Çin şahı atına qoyarkən yəhər*
*Zəncinin nalına od vurdu göylər.*

Yəni səhər açılmağa başlayanda gecə atını sürətlə sürüb getdi.

103 *Günəşi pusqudan fələk sıçratdı,*
*Ulduzlar üzüyü əlindən atdı.*

Yəni Günəş çıxarkən ulduzlar söndü.

104 *Dəvənin zəngindən, fil güzgüsündən*
*Sədəf şəvə doğdu inci doğurkən.*

Şərq mifologiyasına görə, yağış dənizə ildırımsız yağanda sədəflər dürrə, ildırımla yağanda isə şəvəyə hamilə qalır. Beytin mənası: müharibədə dəvələrin boynundan asılan zənglərin ildırım kimi səsindən, fillərin üstündə olan güzgülərin şimşək kimi parıltısından dəniz sədəfləri dürr əvəzinə şəvəyə hamilə qalırlar.

105 *Maral buynuzuna göndər zeh çəkər,*
*Qarışqa başını dırnağa tikər.*

Maral buynuzundan qayrılmış yay və yabanı eşşək gönündən hazırlanmış kirişlə elə düzgün ox atıla bilər ki, qarışqanın başını ayağına tikər.

106 *Göylərin Harunu keşik çəkərək,*
*Belinə asmışdı saysız qızıl zəng.*

Göy Harunu və ya hindusu - gecə qarovulçusu Zühəl ulduzudur ki, yeddinci fələkdə olur. Dinlər tarixinə görə, yəhudilərin peyğəmbəri Musa, qardaşı Haruna qarovulçuluq vəzifəsini tapşırmışdı. Harun qurşağının və paltarının dövrəsinə qızıl zınqırovlar asmışdı. Qarovulçu mənasında işlənən Harun sözü buradan alınmışdır.





107 *Ordunun çəkisi elədikcə meyl,*
*Bu gözdən o gözə axıdırdı sel.*

Nizami burada bir-birinə qarşı duran iki ordunu gözləri poladdan hazırlanmış bir tərəzinin bir-birini dartan iki gözünə bənzədir. Beytin mənası: poladdan silahlar daşıyan iki quüvvətli ordu iki tərəzi başı kimi bir-biri ilə vuruşurdu. Bu gözdən o gözə qan sel kimi axırdı.

108 *Zəncinin qəlbinə çökmüşdü qorxu:*
*"Biz ipək sanırdıq, cod palazmış bu...".*

Yəni biz əvvəl zənn edirdik ki, İskəndər yumşaq və ədalətlidir. İndi görürük ki, o, çox zalım və adamyeyəndir.

109 *Hər filin belinə taxt qoyulmuş ac,*
*Üstündə bir zənci, başında bir tac.*

Yəni fillər üstündə ağ şirmayı yəhərlərdə zəncilər oturmuşdular. Onların başlarında qıvrım saçları müşkdən taca bənzəyirdi.

110 *Fülərin yanınca gedən piyada*
*Hər yerdə yüz fili salırdı bəndə.*

Burada Nizami şahmat oyununun gedişlərindən istifadə edir. Şahmatda piyada filin yolunu kəsə bilir.

111 *Coşarsam atından salaram Nili,*
*Bu rüxüm piyada buraxar fili.*

Yəni mənim nərəm Nil çayının səsini batırar. Mənim heybətim fili dəhşətə gətirər.

112 *Rəcəzi bitincə tərpəndi duman,*
*Xəznədə qıvrıldı sanki bir ilan.*

Rəcəz - vuruşanların mübarizəyə girməzdən qabaq yüksək tonla oxuduqları şeirdir. İran mifologiyasına görə, xəzinəni ilan mühafizə edir.

Yəni ilan xəzinə sövdası ilə qıvrılan kimi, o da qalibiyyət arzusu ilə qıvrıldı.

113 *Kəməndi tamğaclı qaşına bənzər,*
*Çaçların qurduğu yay kimi çənbər.*

Tamğac - Türküstan şəhərlərindən biri, Çaç isə indiki Daşkəndin yerində bir şəhər olmuşdur. Tamğaclılarda qaşlarını kaman kimi düzəltmək adət idi. Çaçlılar da yaxşı kaman qayırmaqla məşhur olmuşlar.

114 *Mən ərəb huşlu bir Rum sərvəriyəm,*
*Zənci öldürən bir sübhün nuriyəm.*

Ərəblər ayıqlıqları ilə seçilərdilər. Zənci qaralığından gecəyə bənzədilir. Rumlu da sübh kimi ağ olur. Yəni sübh gecənin qaranlığını boğan kimi mən də zənci öldürənəm.

115 *Fil kəskin qolumdan bir qılınc yesə,*
*Filban Nil küpünə atar əlbəsə.*

Yəni filə bir zərbə vursam, filin sahibi matəm paltarı geyər. Nil küpü-sürməyi boyaq küpü deməkdir.

116 *Poladın açdığı dərin yaradan,*
*Qalmadı abinus ağacında can.*

Abınus ağacı - Hindistanda bitən sərt və qara bir ağacdır; burada isə zəncinin vücudu deməkdir. Yəni bir zərbə ilə zənci məhv oldu.

117 *O qara buluda qızdı hökmüran,*
*Çəkdi ağ nəhəngi qara qınından.*

Qara bulud - zənci, ağ nəhəng - qılınc deməkdir.

118 *Zəncilər gecəydi, rumlular çıraq,*
*Rumlular qarğanın gözüydü ancaq.*

Yəni zəncilərin qoşunu gecə kimi qara, rumluların qoşunu isə çıraq kimi (ağ) idi; yaxud zəncilər qarğa kimi qara, rumlular qarğanın gözü kimi ağ idilər. Burada həmçinin zənci qoşunların çoxluğu və rumlu qoşunların azlığı da ifadə edilmişdir.

119 *Əqiqlər şəvədən qalamış ocaq,*
*Zəncilər od tutub, kül qalmış ancaq.*

Əqıq - qırmızı rumlular, şəvə isə qara zəncilərdir. Yəni rumlular zənciləri qalayıb yandırdılar.

120 *Qarğalar ağ şahin əlində əsir.*
*Yəni İskəndər zəncilərə qalib gəldi.*

121 *İnsanın yükünü çəkən hər hammal,*
*Ya çıraq daşıyır, yaxud ipək mal.*

Həbəşlər gah qalib gəlir, gah məğlub olurdular. Lakin bu halların ikisi də, hammalın müştərisi kimi təsadüfdən asılı olurdu. Yəni hammalın daşıdığı mal özününkü olmadığı kimi, həbəşin qələbəsi də onun müvəffəqiyyəti sayılmazdı.

122 *Göy üzü geyərkən laciverd paltar,*
*Hər kəsə laciverd paltar hazırlar.*

Laciverd - tünd göy, həm də matəm rəngi sayılır. Yəni laciverd rəngində olan göylər insanlar üçün də o rəngdə matəm paltarı biçər. Deməli, göylərin, fələyin qəza-qədərindən yaxa qurtara bilməzsən,

123 *Çox danə görərsən bu dəyirmanda,*
*Növbətlə üyüdür unu hər bəndə.*

Yəni dünya dəyirmanında dən, sərvət çoxdur. Hər kəs öz dənini növbətlə o dəyirmanda üyüdüb faydalanır. Demək, rumlular da öz növbələrində bu dünya dəyirmanından istifadə etdilər.





124 *Həndəsi hərflər, cizgili xətlər,*
*Bildirir sənindir şanlı bir zəfər.*

Yəni həndəsi xəttin hərfləri göstərir ki, sən qalibsən. Həndəsi xətt

Ərəstunun atasının İskəndərə vermiş olduğu qalibiyyət və məğlubiyyət cədvəlinə işarədir.

125 *Şah içdiyi camın hər damcısından,*
*Mühəndis əkirdi gözəl bir fidan.*

Yəni şah şərab içdikcə falçı mühəndis bir ümid ağacı əkirdi, ona gözəl vədlər verirdi.

126 *Qasidə tapşırdı bir top, bir çıvkan,*
*Bir çuval küncüd də verdi ərməğan.*

Qədimdə İnsanlar bir-birilə məktub əvəzinə əşya göndərər və öz fikirlərini onların vasitəsilə bir-birinə çatdırardılar. Buna əşya yazısı deyilir. Əlifba icad edilməmişdən qabaq bu, əsas yazı formalarından biri olmuşdur.

127 *Küncüddən çox olsa Dara qoşunu,*
*Mənim də quşlarım dənləyər onu.*
*Üzərlik doldurdu kiçik çuvala,*
*Qasidə verincə dedi: "Çıx yola!"*

El arasında üzərliyi bədnəzərdən qorunmaq üçün yandırarlar. Lakin son dərəcə acı olduğu üçün quşlar onu yeməz. Dara İskəndərə küncüd göndərmişdi, İskəndər dedi ki, onu mənim quşlarım yeyər, yəni sənin qoşununu mənim əsgərlərim yox edər. İskəndər isə Daraya üzərlik göndərdi və bununla demək istədi ki, mənim qoşunumu düşmənin quşları yeyə bilməz.

128 *Mən onu içərsəm verər səadət,*
*O məni yeyərsə doğar fəlakət.*

Yəni mən şərabı içsəm, o, qəlbimə hərarət və işıq saçar, o məni yesə, yəni bərk sərxoş edib məni öldürsə, qismətim torpaq olar.

129 *Keyxosrov dünyadan edərkən səfər,*
*Cavahir camından vermişdi xəbər.*

İran mifologiyasında Keyxosrovun gövhər bir camı varmış ki, dünyanın bütün hadisələri, həm keçmiş və həm də gələcək onda əks edilirmiş. Yəni Keyxosrov ölərkən Daranın əhvalını öz camında görüb, əvvəlcədən xəbər vermişdi.

130 *Elə iş görmə ki, doğsun sənə kin,*
*Dəmirə tez təsir etsin sükahin.*

Əslində sükahin deyil, segahəndir. Bu, sirkə ilə dəmirdən hazırlanan bir boyadır. Pas salmiş dəmiri sirkə yeyər.

131 *Qızıl öz vəznini versə arpaya*
*Qızıl qiymətiylə çıxar ortaya.*

Yəni sən qızılsan, İskəndər arpadır. Əgər sən özünü İskəndərlə bərabər etsən, dəyərsiz arpaya qızıl dəyərini vermiş olarsan; belə ki, qızılın arpa kimi çəkilməsi arpanı qızıl qiymətinə qaldırır.

132 *Tox ilə ac kabab yesə bir yerdə,*
*Tox adam kababdan düşəcək dərdə.*

Yəni ac adam kabab tikələrinin irilərini, yağlılarını yeyəcək, tox isə bu iştahdan məhrum olduğu üçün dərd çəkəcəkdir.

133 *Harada görünmüş aciz bir yunan,*
*Belə bir gəmini çıxarsın sudan?*

Yəni bir rumluda haradan o qədər güc ola bilər ki, gəmini dənizdən çıxarıb qovsun? Burada dəniz İran məmləkətinə, gəmi də Daraya işarədir.

134 *Dilini bağla ki, əldə qalsın baş,*
*Dil quru olarsa, boğaz olmaz yaş.*

Quru dil - susmaq, yaş boğaz isə başın kəsilib qana bulaşması deməkdir. Yəni dilini saxla ki, boğazından qan axıdılmasın.

135 *Qan ilə islanmış dilsiz bir başdan,*
*Şübhə yox, yaxşıdır başsız bir insan.*

Yəni baş kəsilmiş olduğu üçün danışa bilməyən bir dil başı ağılsız, biliksiz olanın dilindən yaxşıdır. Deməli, yersiz danışmaq lal olmaqdan pisdir.

136 *Məclis qur, ulduzlar nur verdi yerə,*
*Firiştə qapını açmış göylərə.*

Böyüklərlə məsləhətləş, müharibə və sülh məsələsini müzakirə və həll et. Tale ulduzları göydən baxır, qədər mələkləri asimanda qapıları açıb gözləyir.

137 *Cəmşid tarixini oxu bir daha,*
*O ayı gör necə uddu əjdaha.*

İran mifologiyasında deyilir ki, çiyinlərində iki ilan bitmiş Zöhhak Cəmşidin taxtını əlindən almışdı. Burada əjdaha- Zöhhak, ay isə-Cəmşiddir.

138 *Haman əjdahaya sonra Firidun,*
*Əjdaha gücüylə açdı nə oyun?*

Yəni sonra Cəmşidin nəvəsi Firidun böyük bir qüvvətlə hücuma keçib, Zöhhakı məğlub etdi.

139 *Öz mülkümdən mənə iqta göstərmə,*
*Süheylə baratı Yəməndən vermə.*

Burada İskəndər Daraya cavab verir ki, öz ölkəmdən mənə pay vermə. Süheyl ulduzu özü Yəməndədir, yəni Yəmənə məxsusdur, ona Yəməndən barat verilməz.





140 *Divlərlə oturub dursa Süleyman,*
*Qalmaz barmağında üzüyü, inan!*

Ehtiras və tamah divi ilə dostluq etmə, yoxsa Süleyman kimi padşahlıq üzüyünü itirmiş olarsan.

Şərq mifologiyasından məlumdur ki, Süleyman Bilqeysə aşiq olmuşdu və ona sonsuz dövlət və sərvət verməyə hazır idi. Bilqeys də Süleymandan yalnız üzüyünü istəmiş (Süleymanın üzüyü "Möhrı-Süleymani" adı ilə məşhurdur; güya o, bütün aləmə həmin üzüyün vasitəsi və gücü ilə hökm edirmiş), o da üzüyü vermiş, Bilqeys isə onu alıb yanından keçən arxın içinə atmışdı.

141 *Çıxarkən bir sənlik, mənlik ortaya,*
*Ah, necə doymasın cana bu dünya?!*

Yəni dünyanın işləri ona görə düzəlmir, insanlar ona görə cana gəlmişdir ki, mən və sən bir zamanda yaşayırıq, heç birimiz bir-birimizi bəyənmirik, xudbinlikdən əl çəkmirik.

142 *Bilirəm, bax, budur, fikrinin canı:*
*Tutmaz bir tərəzi iki batmanı.*

Yəni iki düşmən iki batmanlıq daş kimidir ki, hərəsi tərəzinin bir gözündə bir-birinə qarşı durmuş, biri o birisindən aşağı və ya yuxarı olmur.

143 *Məni öz daşınla gəl çəkmə daha,*
*Bəhməni bununçün vurdu əjdaha.*

Yəni sən özünü mənimlə müqayisə etmə, sən mənə bərabər deyilsən; mən sənin nəzərində kiçiyəmsə də, sən belə imtahana girmə, çünki Bəhmən belə imtahanda əjdaha tərəfindən uduldu. Bu, ehtimal ki, Bəhmən Ordəşir ilə yeznəsi və sərkərdəsi Mekabizin əhvalatına işarədir. Qüdrət və əzəmətinə güvənən Bəhmən ona qarşı üsyan edən Mekabizin əlində aciz qalmışdı.

144 *Cavabda daş, dəniz atsan ortaya,*
*Dağ kimi daşımı ataram suya.*

Yəni əgər özünü dağ və dəniz kimi əzəmətli sayaraq mənə meydan oxusan, mən də daşdan olan kökümü dənizdə yerləşdirib, dağ kimi sənə qarşı duraram.

145 *Çin şahı şəhərə nəfəs verərkən,*
*Ulduzu Günəşə dəyişdi Ədən.*

Yəni səhər açılıb Günəş çıxınca, Ədən dənizinə bənzəyən göy ulduzlarını verib, onun əvəzinə Günəşi aldı.

146 Yollara töküldü dəmirdən tikan.

Qədim Şərqdə (hətta orta əsrlərdə Avropada da) müharibə zamanı düşmənin dəvələrini, atlarını zəif salmaq üçün onların keçdiyi yollarda ayaqları altına üçkünc dəmir tikanlar tökərdilər.

147 *Davullar gurlarkən dəhşət verərək,*
*Təbilin dodağından öpürdü fələk.*

Yəni təbillərin gurultusu göylərə qalxmışdı, fitnəkar fələk fitnə qoparmaqda öz havadarı olan davulların, təbillərin ağzından öpürdü.

148 *O qədər toz qonmuş tərkə, yəhərə,*
*Yer göyə dönmüşdü, göy isə yerə.*

Yəni döyüş zamanı heyvanların ayaqları altından göyə o qədər toz qalxmışdı ki, göy yer kimi tozlu idi. Atlıların parıldayan əsləhə və yaraqları isə yeri ulduzlu göyə bənzədirdi.

149 *Zənci öz tacına düzüncə gövhər,*
*Çin şahı taxtından düşdü dərbədər.*

Bu beytdə zənci - axşam, gecə; tac - göy, səma; gövhər - ulduz; Çin şahı - Günəş; taxt (orijinalda: ağ taxt) - gündüz, yaxud gündüzün işıqlı səması; düşdü dərbədər - (Günəş) batdı deməkdir. Yəni gündüz keçdi, axşam oldu.

150 *Günəş yaqutunu oğru çalınca,*
*Bu dünya düşmüşdü yaqut dalınca,*
*Məhtabı tutaraq dedilər: "Oğru,*
*Günəşdən gövhəri oğurlamış bu!"*

Yəni Günəş batdı, insanlar onun işığını Aydan almağa başladılar. Ayın Günəşdən gövhər oğurlaması - işığı Günəşdən almasına işarədir.

151 *Bəhmənin qoluna sarılmış ilan,*
*Düşmüş İsfəndiyar tunc çardağından.*

Yəni Bəhmənin uzun və qüvvətli qoluna əcəl ilanı sarılmış, İsfəndiyar tunc qalasından düşüb həlak olmuşdur. İsfəndiyar - Keyler sülaləsindəndir. Güştasbın oğludur. Firdovsinin "Şahnamə"sində pəhləvan kimi təsvir olunur. Bəhmən isə Güştasbın nəvəsidir. Qədim İran şahlarındandır. Əsil adı Ərdəşirdir.

152 *Nəslimə əzəldən ölümdür qismət,*
*Öldürən bu əmrə verir şəhadət.*

Yəni qatilim mənim Keylər nəslindən olduğumu öz sui-qəsdi ilə isbat etdi. Bu öldürülmək də mənə babalarımdan miras qalmış bir taledir.

153 *Könlünü çevirmə Rövşənəyimdən,*
*Təbii, işıqla Günəş olur şən.*

Yəni qızımdan, Rövşənəkdən məhəbbətini əsirgəmə, həyat məhəbbətlə gözəlləşir.

154 *Gecənin gözünə qaranlıq axdı.*
*Bağdadı Kaxsız və Kərxsiz buraxdı.*

Yəni çərxi-fələyin gözü kor, üzü qara oldu ki, İranın Bağdadını saraysız, qalasız və Kərxsiz qoydu. Bağdad Kərxi Bağdad hasarı xaricində sənətkarlara məxsus geniş bir yer idi.





155 *Dünyadan al günəş qanad çəkincə,*
*Yaqut içdi, şəvə daldı sevincə.*

Yaqut - Günəş, günəşli gündüz; şəvə - qaranlıq gecə deməkdir. Yəni Günəş batdı, gecə oldu.

156 *Əbləh atlı səhər gəlib üfüqdən,*
*Axuru çəməndə yerləşdirirkən...*

Əbləh atlı səhər - sübh vaxtı göyün iki rəngli olmasını bildirir; çəmən - göy, səma deməkdir. Yəni Günəş dan yerinin alaqaranlığından çıxıb, göyə yüksələrkən...

157 *Göy günbəz altında gəl qurma büsat,*
*Kəhrəba qalədə yaramaz nişat!.*

Göy günbəz - səma, göy; kəhrəba qələ - yer, dünya deməkdir. Yəni bu dünyada şadlıq, sevinc məclisi qurma.

158 *Üzünü kəhrəba kimi saraldar,*
*Əlbəsən laciverd bir rəngə çalar.*

Yəni dünya vəfasızdır, bugünkü al yanağını sabah saraldar; bugünkü toy paltarını sabah matəm geyimi ilə əvəz edər.

159 *Etsin mey özümü unudan kimi,*
*İki məğz yaratsın mənə dan kimi.*

Dan - dan yeri deməkdir. Dan, yaxud sübh iki olur; birincisinə yalançı sübh, ikincisinə həqiqi sübh deyərlər. Beytin mənası: elə şərab ver ki, məni özümdən çıxartsın, iki məğzli etsin - beynimi iki qat işıq eləsin.

160 *Ey dövlət, hardasan, məni sevindir,*
*Mehdi qapısında taxtını endir.*

Burada Mehdi sözü, çox güman ki, şairin mədh etdiyi Atabəy Nüsrətəddinə işarədir.

161 *- Ey qoca pəhləvan, - söylədi ona, -*
*Başın kölgə salmış öz ayağına.*

Yəni qocalıqdan belin elə bükülmüş ki, başının kölgəsi ayağına düşmüşdür.

162 *Gözəlcə bir cavab verdi pəhləvan:*
*"Söylərkən dilimiz dönər çox zaman".*

Yəni dil ağızda sümüksüz ətdir, hər cür mənasız və yalan söz söyləməyə qabildir.

163 *Dörd tağ altında beş növbət nə gərək?*
*Şeşdərsiz olurmu bu doqquz fələk?*

Dörd tağ - dörd ünsür: kainatın əsasında duran su, od, torpaq, külək; beş

növbət - şahların sarayı önündə gündə beş dəfə çalınan hərbi musiqi; şeşdər - nərd oyununun duşeşi; doqquz fələk - göyün xəyal edilən doqquz təbəqəsi. Yəni dünyada şahlığın beş növbətini vurma, çünki bu səmanın altında həyat nərdi duşeşsiz oynanmır, deməli, səndən üstünləri də ola bilər.

164 *Diləkçin kim köynək geysə tərsinə,*
*Duayla avanda çevirər yenə.*

Müsəlman Şərqində Allahdan ehtiyacım istəmək üçün köynəyi tərsinə geymək adət kimi olmuşdu. Yəni ehtiyacını diləmək üçün köynəyini tərsinə geyən adam məqsədinə çatdıqdan sonra onu yenə rastına çevirib geyə bilər.

165 *İran başçıları xidmətdə durdu,*
*Onun daşlarıyla tərəzi qurdu.*

İranın böyük adamları ona tabe oldular. Tərəziyə onun daşlarını qoydular, yəni onun böyüklüyünü təsdiq etdilər.

166 *Diniylə atəşə çöküncə dehqan,*
*Həm atəş söndü, həm ona inanan.*

Dehqan - burada Zərdüştün ruhanisi, muğ mənasindadır, Beytin mənası: muğ atəşkədədə atəşpərəstlik dini ilə Zərdüştün ayinlərini icra edərkən həm od söndü, həm özü öldü.

167 *Novruz ilə Səddə bayramlarında...*

Səddə - Novruza əlli gün qalmış iranlıların bayram etdiyi gündür; güya od bu gün tapılmışdır. Atəşpərəstlik dininin banisi Zərdüştün iradəsi ilə keçirilən bu bayramda od yaxıb şənlik edərlər.

168 *Zöhrətək Babildə parladı öncə.*
*Haruti kəsləri təmizləyincə.*

Mifologiya üzrə, Zöhrə ulduzu sehr və cadu hamiyəsi sayılır. Haruti kəslər - Harutun ardınca gedənlərdir. Harut və Marut - Babilə göndərilmiş iki mələkdir. Onlar Zöhrəyə uyub sehrbazlığa başlamış və buna görə də cəzalandırılmış, Babil quyusunda asdırılmışlar.

169 *Hirbüdün oduna soyuq su tökdü,*
*Çox hirbüd belini ikiqat bükdü.*

Hirbüd - atəşkədə xidmətçisidir. Beli ikiqat bükmək - məğlub olmaq deməkdir.

170 *Əjdaha görüncə gəlir Bəlinas.*
*Bildi ki, şüşəni qıracaq almas.*

Almasın xassəsi şüşəni kəsməkdir. Yəni o əjdaha kimi görünən qız Bəlinası gördükdə bildi ki, sehrinin şüşəsinə doğru almas gəlir. Deməli, Bəlinas ona qalib gələcəkdir.

171 Mişku - hərəmxana.





172 *Qızıldan yazılsın gərək bu sözlər:*
*"Çarvadar əkəni dəvəçi biçər".*

Çarvadarla dəvəçi eyni rütbədə və eyni hüquqdadırlar. Birinin əkdiyini ona bərabər və tay olan ikincisi biçə bilər.

173 *Gecə al günəşdən düyümü dəldi,*
*Şəfəqin əlinə bir əqiq gəldi.*
*Onu da uddu Busəhaq firuzə,*
*Busəhaqlara bax, ilişdi sozə.*

Busəhaq - İranın Nişabur şəhərindəki firuzə mədənlərindən birinin adıdır ki, ondan çıxan firuzəyə Busəhaq deyirlər. Əqiq - burada qırmızı deməkdir, axşam şəfəqinə işarə olunur. Günəş qırmızı qızıldan düyümlənmiş böyük bir düyüm kimi alınır; gecə bu düyümü açır, açıldıqca ondan şəfəq doğur, sonra gecə şəfəqin qırmızılığını Busəhaq Firuzənin göy rəngi ilə dəyişdirir, şəfəq də çəkilir, səmai göy olur.

Burada Günəş düyümünün açılması, şəfəq əqiqinin görünməsi, sonra qırmızının göylə örtülməsi - İskəndərlə Rövşənəyin zifaf gecəsindəki vəziyyətini təsvir edir.

174 *Ondan başqa hər kəs adını çəkər,*
*Saçıntək başları kəmərə dəyər.*

Yəni İskəndərdən başqa kim səninlə evlənmək fikrinə düşsə, o öz başını daşa vurar, boş qayıdar.

175 *Səhər çöhrəsindən pərdə atarkən,*
*Həbəşə bac üçün dağ çəkdi Xütən.*

Xütən - burada gün, həbəş isə gecə deməkdir. Dağ çəkdi - yəni Günəşi parlatdı.

176 *Fələk dəvəsini sürətlə sürür,*
*Ondandır ki, gündə bir oyun doğur.*

Yəni dünyanın işləri tez-tez dəyişilir, bu gün sülh ilə, sabah dava ilə keçir.

177 *Kəyan ovlağıdır əcəm torpağı,*
*Orda bir vəhşidir yadlar ayağı.*

Yəni İran Keylərin qəbiristanıdır. Orada yabancılar gəldi-gedərdir. Onlar burada çox qala bilməzlər.

178 *Dövran gümüş teştin ağzını açdı.*
*Qara qarğa qızıl yumurta saçdı.*

Gümüş teşt - səhər, qara qarğa - gecə, qızıl yumurta isə Günəş deməkdir. Yəni səhər oldu, gecənin qoynundan Günəş doğdu.

179 *Qoca möbidlərsə tarix boyunca*
*Yumurta və teştdən demiş doyunca.*

Yumurta və teşt - burada astronomiyaya işarədir. İranda möbidlər, yəni Zərdüşt dini ruhaniləri, bunların köməyi ilə guya qeybdən xəbər verərdilər.

180 *Yaxşıdır hər falı xeyr işə yormaq,*
*"Rux"u yox, oyunda "şahrux"u vurmaq.*

Yəni insan çətinliyə düşəndə ümidsiz olmamalı, əksinə, cəsarətlə mübarizəyə atılmalıdır.

Şahrux - şahmat oyununda elə bir gedişdir ki, bununla eyni zamanda da şah qaçırılır və fil də vurulur. Rux - şahmatda top fiqurudur.

181 *İskəndər əmr etdi, cavab olaraq,*
*Məktublar müşk ilə yazılsın ancaq.*

Yəni İskəndər hər ölkədən ona müraciət edənlərə müsbət cavab verdi, sülh və xeyirxahlıq bildirdi.

182 *İstədi büsatı İranda qursun,*
*Ərəb də bu yolda ona baş vursun.*

Yəni şahlığını İranda etsin, eyni zamanda Ərəbistan da ona tabe olsun.

183 *Təvaf işlərindən azad olaraq,*
*Basaraq Yəmənin gönünə ayaq.*

Yəni Kəbəni (bütxanəni) ziyarət şərtlərini yerinə yetirdikdən sonra, Yəmənin məşhur qiymətli dərilərini ayağı altına saldı, onlara sahib oldu.

184 *Şəbdizə vurunca gündüz qızıl nal,*
*O dünya günəşi atlandı dərhal.*

Şəbdiz - gecə; qızıl nal - Günəş; dünya günəşi - İskəndər deməkdir. Yəni səhər olcaq İskəndər atına mindi.

185 Örtmə öz qaşınla uca göyləri.

Göyləri qaş ilə örtmək - çox çətin, yaxud mümkün olmayan bir işə girişmək deməkdir.

186 *Mən qalib gəlsəm, kin coşduğu zaman*
*Ataram gizlənən şahı ortadan.*

Yəni sən dünyanı tutmuş bir padşahsan, mən cuşə gəlib səni yıxsam, Yer kürəsini yıxmış olaram.

187 *Qarınca düşərsə parlaq bir tasa,*
*Bir çarə düşün, güc iş görməz yoxsa.*

Yəni sürüşkən bir qaba qarışqa düşəndə onu bir çöp, bir samanla oradan xilas etmək lazımdır, yoxsa zor ilə onu tutmaq istəsən əzilib məhv olar.





188 *Padşah da yuxuya tez hazırlandı,*
*Dörd ünsür də yatdı, qapı bağlandı.*

Dörd ünsür - dünya və dörd divar; qapı - burada qapının iki tayına bənzədilən iki göz qapağı. Yəni padşah dörd divar arasında gözlərini qapayıb, yuxuya daldı.

189 *Günəşin əlində bir narınc vardı,*
*Fələk narıncının başını yardı.*

Narınc - Günəş, Günəş kürəsi. Yəni Günəş çıxdı, üfüqü qan rəngli şəfəqlə boyadı.

190 *Lacivərdə şəncərf vurunca dövran*
*Samur sarı tülkü doğdu o zaman.*

Yəni şəfəq keçib, havalar qatı maviyə çalanda qara gecədən sarı ay doğuldu.

191 *Nəğməyə başladi pəriüzlülər,*
*Günəş mehreganda daha xoş gələr.*

Mehregan - mehr iranlılarin qədim təqvimi üzrə aylardan biri, payızın birinci ayıdır. Mehregan həmin ayın on altıncı günüdür ki, farslar bu günü böyük bayram edərlər; payızda gecə və gündüzün bərabər olması.

192 *Göy soyuq, Günəşin xeyməsi ocaq,*
*Yer quru, Cəmşidin yastığı yumşaq.*

Yəni havanın soyuqluğundan yer buz bağlamışdı, quru idi. Lakin İskəndərin səxavəti və Cəmşid kimi ucalığı ilə soyuq qışda çadır isti, yastıq yumşaq olmuşdu.

193 *Günəş Dəlv bürcündən çıxdı qırağa,*
*Girdi Hut bürcünə balıq tutmağa.*

Ulduzşünaslıqda Dəlv bürcü Günəşin "ev"lərindən biri sayılır. Günəş bu bürcə yanvar ayında girir. Hut, yəni Balıq və ya Su bürcünə isə Günəş fevral ayında girir. Yəni bu məclis düzələn zamanda il yanvardan fevrala keçirdi.

194 *Buzlamış ceyranın kabablıq budu,*
*Suların bağrına hey duz vururdu.*

Yəni ceyranlar qışın bərk soyuğundan donub ölmüş, buz bağlamış və suyun bağrı onların halına yanmışdı. Deməş, ceyranlar odda deyil, suda kabab olmuşdu.

195 *Buludlar o qədər sıx kafur saçmış*
*Çinarın qolları ağ çiçək açmış.*

Burada kafur sözü qar mənasında işlənmişdir. Yəni çinarın budaqları qardan ağ çiçək açmışdı.

196 *Ya qoca insafsız, rəhmsiz məcus*
*Əmr etmiş həbəşi qarət etsin rus.*

Yeni od yandıran qoca atəşpərəst həbəşin qaranlığını - kömürü rusun qırmızılığına - oda qarət etdirdi.

197 *Muğ arpa yerinə əkmiş ərğəvan,*
*Bənövşə düşürmüş biçdiyi zaman.*

Yəni muğ (atəşpərəst) arpa əvəzinə ərğəvan əkmiş və bənövşə rəngində gül biçilmişdir. Ağacın yanmasına işarə olunur.

198 *Katibin dalından göyərmiş qələm,*
*Barmağında müşkin qələmlər möhkəm.*

Burada katib manqal, onun barmaqlarında tutduğu manqalın içində olan qara kömür lülələri mənasında işlənmişdir.

199 *Reyhanla bəzənmiş saxsı güldandır,*
*Ancaq bu, meşədən çıxan reyhandır.*

Saxsı güldan - burada saxsıdan qayrılmış manqal, onun reyhan gülləri də manqalın içindəki odlardır. Meşədən çıxan reyhan - kömürdən əmələ gələn odlar deməkdir.

200 *Ey saqi, qırmızı süddən ver ki hər*
*Civəyə əks etsə, ona can verər.*
*Ver mənə, dönmüşdur qanım civəyə,*
*Söz düzüm dırnaqdan keçən riştəyə.*

Dırnaqdan keçən riştə - zərif keçi tükündən və ya yundan əldə əyrilmiş iplikdir ki, bu, baş barmağın uzadılmış dırnağından keçirilib əyirilir. Belə iplik cəhrə ipliyindən daha incə və saf olur. Mətnin mənası: "Ey saqi, o qırmızı süd olan şərabdan mənə ver ki, sarılıq xəstəliyinə tutulanlar onu civə kimi içərkən rəngləri qan kimi qızarır. Mən bu saat qəmdən qana dönmüş titrəyən civəyə bənzəyirəm, dərdimi sözün dırnaqdan keçən incə və saf ipliyinə düzürəm"

201 *Elə ki İskəndər çadırı qurdu,*
*Quldurlar çadırı yuxarı vurdu.*

Yəni quldurlar baş qaldırıb, ona itaətsizlik etdilər.

202 *Sürmədən Günəş mil çəkdi gözünə,*
*Batdı bir al gövhər Nil dənizinə.*

Burada Günəş gözə bənzədilir. Yəni göyün gözü olan Günəş gecənin sürməsindən çəkdi, özünü onun qaranlığı ilə gizlətdi, göyün mavi dənizinə batıb getdi - Günəş batdı, gecə düşdü.





203 *Onda çöl xalqının axınlarından*
*Rahatlıq içində dincələr xəzran.*

Xəzran - yəni xəzərlilər. Xəzər dənizinin şimal-qərbində və Volqa çayının ər iki sahilində yerləşən türk qəbilələrindən biri olmuşdur.

204 *Gündüz qarğa rəngli qara gecədən,*
*Çıxmış Zəngibardan kafur kimi şən.*

Burada ağlıq mənasını verən kafur Zəngibarda və Həbəşistanda istehsal dilir. Yəni səhər açılmışdı.

205 *Yaşıl donlu tovuz humay quşundan*
*Ağ parlaq sümüyü qapdığı zaman...*

Yaşıl donlu tovuz - göy, səma; humay quşu - günəş; ağ parlaq sümük - sübh, səhər deməkdir. Yəni göy Günəşdən sübhü aldı, - səhər açıldı.

206 *Nəfsinin ağacı yamyaşıl durur,*
*Başını burmadan, başını sən bur!*

Yəni həvəs və ehtiras sənin qapında durmuşdur. O sənə qalib gəlmədən sən ona qalib gəl - nəfsini öldür.

207 *İndi ki, zəfəran yemədən şadsan,*
*Yemə zəfəranı, ölərsən, inan!*

Zəfəran yemək, deyilənə görə, adamı gülməyə sövq edir. Burada zəfəran bu cəhətdən şərabla müqayisə edilir və zəfəran sözü altında şərab nəzərdə tutulur. Yəni əgər şərab içmədən şadsan, kefin yaxşıdırsa, onda şərab içmə, çünki sərxoşluqdan və lüzumsuz yerə çox gülməkdən məhv ola bilərsən.

208 *O ceyran otaran çobanlar belə*
*Çomağın yerinə ox almış ələ.*

Yəni çobanlar da çobanlıq ağacını atıb, əllərinə silah almışlar, yollarından azmışlar.

209 *Kiçikdən ən böyük bir fitnə doğur,*
*Hər qurdun sümüyü ayağa oxdur.*

Deyirlər, qurd topuğunun sümüyü zəhərli olur. Beytin mənası: xırda bir şeydən çox vaxt böyük bir ziyan baş verə bilər. Qurd topuğunun bir sümük qırıntısı ayağa batsa, bir oxun başı qədər yara salıb əzab verər.

210 *Bənzər o dastana bu tac, taxt, ordu,*
*"Hindudan sərvəti çalar bir hindu".*

Yəni mənim bu taxt-taca malik olmağını "Bir hind oğrusunun paltarını başqa bir hind oğrusunun oğurlaması" hekayəsinə bənzər.

211 *Önünə çıxarkən bir atəşkədə*
*Ondan buz yaratdı atəşpərəstə.*

Yəni bütün atəşkədələri dağıdıb xaraba qoydu.

212 *Orada bir bahar vardı qəlb açan,*
*Güllərin dimağı acıydı ondan.*

Burada bahar - atəşkədə mənasındadır. Yəni orada bir atəşkədə vardı ki, qızıl gül onun rənginə paxıllıq etdiyindən acı olmuşdu. Qızılgülün dadı acı olur.

213 *Hurini cənnətdən atdı dışarı,*
*Qovdu cəhənnəmə dost olanları.*

Yəni hurilər yaşayan cənnəti hurisiz qoyub, hurilərini dağıtdı, cəhənnəm əhli olanları da cəhənnəmdən qovdu. Burada cənnət - atəşkədə, huri - od, cəhənnəmə dost olanlar - muğlardır.

214 *Saqi, ver ərinmiş o saf qızıldan,*
*Qırmızı kükürdü odur doğuran.*

Qırmızı kükürd - əski kimyagərlərin fikrincə, elə bir maddədir ki, hər hansı maddəyə vurulsa qızıla çevirər.

215 *Mənə ver, dərmantək tutiya edim,*
*Misimi onunla kimiya edim.*

O iksiri mənə ver ki, mis vücudumu onunla qızıla döndərim.

216 *Ulduzu ona yar olduğu gündə,*
*Yəni baxtı açıldığı, xoşbəxt olduğu zaman.*

217 *Uca fil başına kəmənd atım mən,*
*Qandan bixi-ruyən çıxarım nildən.*

Bixi-ruyən - boyaqçıların işlətdiyi qırmızı kök, nil isə Hindisanda bitən qara otdur.

Beytin mənası: Hindistanda o qədər qan töküm ki, qara ot (nil) əvəzinə qırmızı boya kökü bitsin.

218 *Örtülü sərvətə növbət gəlincə,*
*Hinddə Çin çinisi göründü incə.*

Örtülü sərvət - Keydin qızı deməkdir. Yəni əsmər gözəllər ölkəsi olan Hindistandan Çinin ağ gözəli göründü.

219 *Baş vermiş arpadır müşkin buğdadan,*
*Deyil buğda, deyə, boz arpa satan.*

Yəni o əsmər gözəlin arpa boyda xalı buğdadan bitmişdi, buğdayı rəngli gözəl üzündə idi. Bu, arpanı buğda yerinə satıb aldadanlardan deyildi. Deməli, bunun zahiri buğda, əsli arpa deyil, əksinə, zahiri arpa, əsli buğda idi; saf və təbii gözəl idi.

220 *Türk simalı idi o hindli afət,*
*Şaha Hind elindən vermişdi cənnət.*

Yəni o gözəl türk simalı, ağüzlü idisə də, özü hind qızı idi, şah üçün cənnəti Hindistanda yaratmışdı.





221 *O rumi üzüylə, hindli diliylə*
*Etmiş Rum şahını özünə kölə.*

Yəni o Rum (ağ) üzlü və hind dilli, hindcə danışan gözəl Rum şahını özünə qulam etmişdi.

222 *Oxundan torpağa üz qoyan ceyran,*
*Gözündə tiryəktək görünür cahan.*

Yəni onun oxu ilə yıxılan ceyranın gözündə dünya qaralırdı; yaxud, tiryəkdən məst olan kimi, gözləri süzülüb qalırdı.

223 *Atlar dırnağından ipək çöl, çəmən*
*"Ceyrangöz" olmuşdu ceyran gözündən.*

"Ceyrangöz" - bir növ ipək parça adıdır; üstündə ceyran gözü kimi naxışlar olduğu üçün belə adlanır. Beytin mənası: o qədər ceyran ovlanmış ki, yer "ceyrangöz" parçası şəklində idi.

224 *Sübhün gözəli zər xal-xalı ilə,*
*Göyün xeyməsinə saçarkən şölə...*

Sübh gözəli - Günəş; zər xalxal - Günəşin nuru; göyün xeyməsi - göy qübbəsi, səma deməkdir. Beytin mənası: səhər açılıb Günəş göydə görünməyə başlarkən...

225 *Qara müşk ağacı əkmişəm Hinddə,*
*Fikrim ağ yasəmən tikməkdir Çində.*

Yəni Hindistanı fəth etmişəm, indi Çini də fəth etmək istəyirəm. Burada qara müşk - hindlilərin qaralığına, ağ yasəmən isə çinlilərin ağlığına işarədir.

226 *Xəbər ver, hesabdan qalmayım geri,*
*Səbətdə ilandır, ya sümükləri?*

İlan kin və ədavət rəmzidir. İlanın bel sümüyünü isə qədim iranlılar dostluq üçün özlərində saxlardılar. Beytin mənası: söylə görüm, arada dostluq var, ya düşmənlik?

227 *Əfrasiyab mülkünün varisi erkən,*
*Başını günəştək ucaltdı Çindən.*

Burada Əfrasiyab mülkünün varisi İskəndərdir. Əfrasiyab mülkü ifadəsi - bir zaman Əfrasiyabın İranı zəbt edərək ona hakim olmasına işarədir.

228 *Haqq verən nemətə etmirsən hörmət,*
*Şəhərdə bitincə bütün zəxirə.*

229 *Zəxirə - ərzaq, sursat.*
*Düşünmə, laciverd boyalı paltar,*
*Hər şəxsə göylərdən gəlir, ey salar!*

Yəni zənn etmə ki, kişinin başına gələn bəla göydən gəlir.

230 *Sarsılmaz qolumdan qorxmadınmı sən?*
*Mənim tərəzimə torpaq tökürsən!*

Birinin tərəzisinə torpaq tökmək - onu gücsüz saymaq, asanlıqla məğlub ediləcəyinə inanmaq deməkdir. Yəni polad kimi gücümdən qorxmadan məni ağır daşlarla deyil, yüngül torpaqla çəkmək istəyirsən.

231 *Ulduzlar o qədər qızıl səpirdi,*
*Yer öküzü qızıl altına girdi.*

Mifoloji təsəvvürə görə, Yer kürəsi öküz üstündə durmuşdur. Beytin mənası: gecə oldu, o qədər ulduz doğdu ki, göydən yerə işıqdan sanki qızıl töküldü, yer öküzü qızılın altında duran kimi idi. (Nizamidə; yer öz öküzünü xəzinəyə sürdü.)

232 *Təbii yaqutu yonunca zaman,*
*Yaqutlu tac ilə cüt oldu cahan.*

Yəni göy təbii yaquta bənzəyən Günəşi xırdalayıb səmaya səpmiş, səma almazlarla bəzənmiş tac kimi yerin başına qoyulmuşdur.

233 *Neysandan nə şərəf almışsa sədəf,*
*Çinə də şah verdi elə bir şərəf.*

Yəni İskəndər çinlilərə çoxlu dürr-cəvahir bağışladı.

234 Fəğfur - qədimdə Çin imperatorlarına verilən titul.

235 *Hər yandan töküldü şahanə yarpaq,*
*Meyvə yarpağıtək tökdü hər budaq.*

Yəni payızda ağac yarpaqlarını tökən kimi, ziyafət süfrəsinə də o bol rəngarəng yemək boşqablarıdüzüldü.

236 *Fərxarə bənzəyən istək evindən,*
*Tez hazır olurdu hər istənilən.*

Fərxar - Çində gözəlləri ilə məşhur bir şəhər olmuşdur. Yəni o məclisdə,

Fərxar şəhərində olan kimi, hər kəs öz istədiyinə o saat nail olurdu. Cənnətdə həmişə hər şey arzu edilən dəqiqədə hazır olan kimi orda da hər şey hazır idi.

237 *Xəzinə ağzını açınca xaqan,*
*Qarun xəznəsində yer oldu pünhan.*

Yəni Çin padşahı xəzinə qapısını açıb, Qarun xəzinəsindən hər tərəfə hədiyyələr saçırdı.

238 *"Fərəsi" "rüx" ilə ayaqdan salır,*
*"Fərəs"lə "fil"i də cəbhədən alır.*

Yəni (şahmat oyununda olan kimi) düşmənin atını topla vurur, filini də atla aradan çıxarır.





239 *Çərx kimi dolanır açarkən şəhbal,*
*Gəzişi cənubdu, çıxışı şimal.*

Yəni o ov quşu ova getməkdə cənub küləyi kimi, ovdan gəlməkdə isə şimal küləyi kimi sürətli, iti qanadlı idi.

240 *Su kimi lətifdir o çənə, buxaq,*
*Atəşdə suyu kim görmüş baş-ayaq?*

Atəşdə suyun baş-ayaq görünməsi ifadəsi ilə tər damcıları süzülən lətif ağ buxağın od kimi qırmızı yanaqlar altında sallanması nəzərdə tutulur.

241 *Üzü bənövşəyə qızıl gül atır,*
*Gül üzdə bənövşə keşikçi yatır.*

Burada bənövşə - saçlar, qızıl gül - yanaq deməkdir. Yəni yanağı qara saçların bənövşəsinə qızılgül taxmış, bənövşəni qızılgülün qarovulçusu etmişdir.

242 *Müşk onun zülfünə bağlamış kəmər,*
*Zülfü də Günəşə köləlik edər.*

Yəni müşk onun saçlarının beli bağlı qulu, saçları da Günəş kimi parlaq yanaqlarının beli bağlı qulamı idi.

243 *İki pərvanədir bağlanmış bura,*
*Birinin üzü ağ, birinin qara.*

Ömrün ətrafında dönən iki pərvanə - gecə və gündüz deməkdir. Ağ pərvanə - gündüz, qara pərvanə - gecədir.

244 *Kimsənin şamına deyil pərvanə,*
*Dinləməz kimsəni, baxmaz fərmanə.*

Bu pərvanələr kimsənin işığına getməz, yəni gecə-gündüz, zəmanə, dövran heç kimə tabe deyil.

245 *Dan yeri yaqutdan şəfəq saçanda,*
*Şəbdizin belindən təngi açanda...*

Burada yaqut - Günəş, şəbdiz - gecə, təng - aman yolu, kəhkəşan deməkdir. Yeni səhər açılanda, ulduzlar göydə gözdən itəndə...

246 Yeddi rus soyundan tərpətdi ordu.

O zaman Rusiya yeddi vilayətə bölünürdü.

247 *Tarixlə, təqvimlə hərbə gedirlər,*
*Hesabda bir ayı təxir edirlər.*

Yəni onlar tarix və təqvim üzüylə uğurlu-uğursuz saatı təyin etməklə başlayır və bu astronomik hesablama üçün bir ay yubanırlar.

248 *Zəhər ki, vücuda salır zəlzələ,*
*Sağalır yenə də başqa zəhərlə.*

Təbabətdə zəhərlənməni bədənə başqa bir zəhər vurmaqla da müalicə edirlər; burada həmin tibbi əməliyyata işarə olunur.

249 *Daşlarda nizə qan çeşməsi açar,*
*Bir orman göyərdir yay ilə oxlar.*

Burada daşlar dedikdə döyüşçülərin daş kimi bərk sinələri nəzərdə tutulur. Yəni nizə, mızraq döyüşçülərin daş sinələrinden qan bulağı açmış və o bulağın ətrafında nizə, ox meşəsi bitmişdir.

250 *Aslantək alışdım sağrı yırtmağa,*
*Tülkütək baxmaram yağlı quyruğa.*

Yəni mən müharibədə aslan kimi pencə-pencəyə vuruşuram, tülkü kimi hiyləgərliklə məşğul olmuram.

251 *Boynunu çəkən çox adlı pəhləvan*
*Oturdu buza o soyuqqanlıdan.*

Yəni bu müharibə çox igidləri məhv etdi. Buza oturmaq - burada soyumaq, ölmək deməkdir.

252 *Firuzə rəngli tağ ertəsi günü,*
*Dağ-daşdan ucaltdı yaqut güzgünü.*

Firuzə rəngli tağ - göy, səma; yaqut güzgü - Günəş. Yəni ertəsi günü dağın arxasından Günəş doğdu.

253 *Öpüşün qapısı bununla belə,*
*Bağlanmış Səmərqənd çubuqlariylə.*

Yəni dodaqlarım gözəl, öpüşüm çox şirinsə də, lakin onların qapısı Səmərqənd ağacı ilə bərk bağlanmışdır, oradan öpüş içəri girə bilməz.

254 *Mənimlə bir cınaq çəksə gül, çiçək,*
*"Apardım" sözünü unutsun gərək.*

Yəni güllər də mənim gözəlliyimlə bəhsə girişə bilməz; mən öz gözəlliyimlə hər zaman güllərdən, çiçəklərdən üstünəm.

255 *Bu müşkin xalımla çinli bağrıyam,*
*Falca Rum qəlbinin şəm çırağıyam.*

Burada müşkin xal - qara, çinli bağrı - ağ vücuda, ağ sifətə yaraşıq deməkdir. Yəni fala baxdırmışam, bəxtimə Rum qəlbi, yəni İskəndər düşmüşdür. Rum qəlbinin şəm çırağıyam - yeni məhəbbətim İskəndərin ürəyindədir, İskəndərin xoşuna gəlmişəm.

256 *Əqiq möhr üstünü basmamışdı pas,*
*Saf üzük qaşını deşməmiş almas.*

Yəni o qız hələ bakirə idi, o vaxta qədər ona kişi əli toxunmamışdı.

257 *Gecəydi o yerdə, qaranlıq diyar*
*Müşkü ud yerinə etdi ixtiyar.*

Orijinalda "qaranlıq diyar" deyil, "yarımişıqlı diyar"dır. Yəni gecə olanda o diyar ağ udu (işığı) deyil, qara müşkü (qaranlığı) seçdi.





258 *Kinindən olmuş göy dəli, zəncirli,*
*Zəncinin yerinə keçdi kəşmirli.*

Yəni göyün halı zəncirli dəli kimi qarışdı. Ağ sifətli kəşmirli qara bədənli zəncini əvəz etdi; hava işıqlandı.

259 Əjdər quyruğunda gizləndi Aytək.

Dini rəvayətlərdə Ayın tutulması əjdahanın onu tutub gizlətməsi ilə izah edilir. Buna görə də Ay tutularkən əjdahanı guya qorxudub qovmaq üçün mis qablara döyüb hay-küy salarmışlar. Misranın mənası: İskəndər Zülqərneyn zülmata getdi.

260 Açmış bu mədəni başqa bir şair.

Burada Nizami Firdovsini nəzərdə tutur.

261 *Heyvan tapmadısa, kədər yox bunda,*
*Heyvantək ölmədi heyvan yolunda.*

Burada birinci və üçüncü "heyvan" - abi-həyat, dirilik suyu mənasındadır. Yəni İskəndər dirilik suyunu tapmadısa da, bundan incimədi və çox şükür etdi ki, heyvan suyu, yəni dirilik suyu yolunda heyvan kimi ölmədi.

262 *Bu incə nüktədən bildi tacidar:*
*Torpaqdır, onu bu torpaq doyurar.*

Yəni bu mənalı hekayədən şah anladı ki, şahlığın tamahını yalnız qəbir torpağı doydurar.

263 *Birini günbəddən salır quyuya,*
*Birini balıqdan ucaldır Aya.*

Yəni bu dünya birini göydən yerə endirir, birini yerdən göyə qaldırır - birini alçaldır, birini yüksəldir.

264 *Hər yerdə o qoca, o sənət əri,*
*Yanlış söyləmişdi doğru sözləri,*
*Yanlışa yenidən vurdum bir bəzək,*
*O qoca şairdən üzr istəyərək.*

Qoca şair - Firdovsidir.Yəni Firdovsi İskəndər dastanını yanlış rəvayətlər üzrə bəzətmişdi. Mən bunu doğru dastan üzrə bir də bəzədim (yenidən işlədim) ki, bunun üçün də Firdovsidən üzr istəyirəm.

265 *Dünyanı yumuş bu üçüncü dəniz,*
*Nəsara dinindən etmiş tərtəmiz.*

Mifoloji rəvayətə görə, üç dəniz - birinci asiman, göy, ikinci - dünyanı qaplayan mühit dənizi, üçüncü - havada sallanan dənizdir. Bunun suyu dünyanı yumaqdadır.

Nəsara dini - Allahı üç ünsürdən (ata, oğul, ruhül-qüds) ibarət hesab edən xristianlıq.

[266] *Uca, dik başını Müştəri öpər,*
*Təslis və tərbiə cəvahir saçan,*
*Üçbucaq oturdan, dördlü koturan.*

Yəni Müştəri ulduzu kimi yüksəkdə olan, baxışları gövhər saçan. Tərbi - dördləmə; burada bardaş qurub oturma; təslis - üçləmə; burada məclisdəkiləri üçbucaq şəklində oturtma; sağda, solda və qabaqda.

[267] *Bitincə gövhəri aldım hüzurə,*
*Gövhəri hədiyyə verdim gövhərə.*

Yəni "Şərəfnamə"ni yazıb qurtardıqdan sonra Nüsrətzəddinə ithaf etdim. Beytdə əvvəlki iki "gövhər" sözü "Şərəfhamə"ni, sonuncu "gövhər" isə Nüsrətəddin Atabəyi bildirir.



# İQBALNAMƏ



# KAMİLLİK ZİRVƏSİ

Dünya mədəniyyət tarixinin zənginliyi sonsuz bir ümmanı xatırladır. Bu sonsuz ümman insan zəkasının bəhrəsi olan nadir elm, fəlsəfə və sənət inciləri ilə dolu zəngin xəzinədir. İnsanlığın dərin ehtiram və məhəbbətlə qoruyub saxladığı və yaşatdığı bu mənəvi mədəniyyət xəzinəsində orta əsr Azərbaycan fəlsəfi poeziyasının ən görkəmli nümayəndəsi, Şərqi və Qərbi əsrlər boyu məftun etmiş Nizami Gəncəvinin insanpərvər yaradıcılığı xüsusi yer tutur.

Fəlsəfənin müxtəlif müddəalarını fövqəladə gözəl ədəbi formalarda ifadə etməkdə Şərq mədəniyyətinin bəşəriyyət qarşısında böyük xidməti var. Dahi İbn Sina Aristotelin "Poetika" əsərinə yazdığı şərhdə yunan mədəniyyətindən fərqli olaraq Şərq üçün mahiyyətcə insani olan fəlsəfi poeziyanın səciyyəviliyindən bəhs edir. Bu poeziyanın yüksək inkişaf zirvələrinə çatması Şərq mədəniyyətinin çiçəklənmə dövrünə - orta əsr Şərq intibahı dövrünə düşür. Nizami də daxil olmaqla bu dövrün dahi alim, mütəfəkkir və sənətkarları öz yaradıcılıqlarını yüksək kamala yetmiş, nəcib əxlaqi sifətlər, əql və gözəllik daşıyıcısı İnsana həsr etmişlər. "İqbalnamə"nin də əsas qəhrəmanı adı böyük hərflə yazılan İnsan obrazıdır. Bəlkə məhz buna görə Nizami belə bir qəhrəmanı sərkərdə, hökmdar və elm havadarı kimi şöhrət tapmış Makedoniyalı İskəndərin surətində verir. Poemanın əsas məqsədi isə insanın səadətinə xidmət, bu səadəti təminetmə yollarını arayıb tapmaqdır.

"İqbalnamə"də bir-biri ilə üzvi surətdə bağlı üç istiqamət, üç məqsəd izlənir: İnsan ağlının, zəkasının və bununla əlaqədar elmin, fəlsəfənin tərənnümü və təbliği; insanın yüksək əxlaqi keyfiyyətlərinin tərənnümü və təbliği; insan xoşbəxtliyini təmin edən, zülmə və bədxahlığa son qoyan ədalətin, azad, bərabər və dost insanların cəmiyyətinin tərənnümü və təbliği.

Nizami "Xəmsə"sinin özəyini təşkil edən bu üç ayrılmaz xətt "İqbalnamə"də özünün ən yüksək fəlsəfi-bədii ifadəsini tapır və poemanın müxtəlif hekayələrinin əsas məzmununu təşkil edir.

Böyük mütəfəkkirin dünyagörüşünü heç cür dövrün hakim ortodoksal dini dünyagörüşü çərçivəsilə məhdudlaşdıra bilmərik. Filosof şair dinlə əlaqədar məsələləri islam ruhaniləri mövqeyindən yox, ruhanilər tərəfindən çox vaxt kafir damğası vurulmuş məşhur Şərq filosofları Fərabi, İbn Sina, Bəhmənyar mövqeyindən işıqlandırır.

"İqbalnamə" XII əsrdə yazılıb və bu dövrdə yazılan bütün başqa əsərlər

kimi o da bir sıra ithaflarla - Allahın, peyğəmbərin, dövrün hökmdarlarının şəninə yazılmış mədhiyyələrlə başlayır. Lakin Nizaminin ənənə üzrə yazdığı mədhiyyələri hər şeydən əvvəl böyük mütəfəkkirin humanizmi və özünəməxsus bir səciyyə daşıyan rasionalizmi ilə fərqlənir. Məsələn, minacat (Allahı mədh) əslində ağlın mədhinə çevrilir:

Ağıl bir yerdə ki, xəzinə tapar
Allahın adını eyləyər açar,
Allah ağıllıya nəvazişkardır,
Ağılsızlara da əlacı vardır.

Şairin dövründə hökm sürən mürtəce ruhanilərin kor-koranə inamı ağla qarşı qoyaraq, elmi, fəlsəfəni və xüsusən məntiqi küfrlə eyniləşdirmələrini və bu yolun yolçularını amansız təqib etmələrini nəzərə alsaq, ağlı və elmi bu şəkildə tərənnüm edən Nizaminin bir vətəndaş kimi qorxmazlığı, mərdliyi daha çox çarpar və onun orta əsr şəraitində təbliğ etdiyi rasionalizmin əhəmiyyətini müasirlərimiz daha düzgün qiymətləndirə bilərlər.

Nizami yaradıcılığı yüksək inkişaf pilləsinə qalxmış orta əsr Şərq və Azərbaycan mədəni intibahının məhsulu idi. Lakin nəzərə almalıyıq ki, bu İntibah kəskin, amansız siyasi və ideoloji mübarizədə qələbə çalır, onun nümayəndələri isə çox vaxt canlanndan belə keçərək əqidələrini müdafiə və təbliğ edirdilər. Yeri gəlmişkən, poemanın girişində şaha ithafa nəzər salaq. Şair şahla öz bərabəri kimi danışır, şaha özünü necə aparmaq barədə məsləhət verir. Burada şahlara nəinki itaət görünmür, əksinə, onlar tənqid atəşinə tutulur:

Boşdur çox şahların ancaq başları, ...
Zəlitək qan sorub ləzzət alarlar.

Nizaminin ənənə üzrə yazdığı mədhiyyələr öz ideya məzmununa görə daha çox nəsihətnamə adlana bilər. Bunlarda şair itaətkar kimi yox, mərifət öyrədən müəllim kimi çıxış edir. Nizaminin şahlara itaətkarlığı ilə bağlı ədəbiyyatşünaslıqda ara-sıra rast gəlinən fikirləri isə səhv hesab edirik.

"İqbalnamə" orta əsr fəlsəfi poeziyasına məxsus tərzdə qurulub. Yüksək bədii formada yazılmış hekayələr bir-birilə əvəz olunur və əsərin süjetini açaraq oxucunu heyran edir. Burada mütəfəkkirin fəlsəfi konsepsiyasının məğzini insanın əxlaqi və intellektual kamilliyinin cəmiyyətin sosial kamilliyi ilə tamamlanması ideyası təşkil edir.





Ayrı-ayrı hekayələrdə bu ümumi konsepsiya ilə yanaşı, biz filosof şairin dünyagörüşünün muxtəlif cəhətlərini açan, nisbətən konkret məsələlərin qoyuluşunu və şərhini də tapırıq. Məsələn, Arşimed ilə çinli kənizin, Qibtlı Mariyənin hekayələrində əsas məqsəd elmin, ağlın təbliğidir. Eyni zamanda birinci hekayədə şəhvət pislənir, həqiqi insani sevgiyə isə bəraət qazandırılır.

Yoxsul çörəkçinin hekayəsi və onun varlanması haqda danışarkən Nizami taledən söhbət açır, taleyi maddi aləmin, ulduzların qanunauyğun hərəkətilə bağlayır və ulduzların sirrini açmağı poemada Valisə (qədim yunan filosofu Falesə) həvalə edir.

Orta əsr dünyagörüşünə müvafiq olaraq Nizami tale və qəzavü-qədəri insan üzərində hökmran hesab edir. Qəzavü-qədərlə mübarizədə insan gücsüzdür. Məhz buradan da Nizami qəhrəmanının fələyə qarşı, bəlkə də özü tərəfindən tamamilə dərk olunmamış, etirazı irəli gəlir. Məcnunun səhraya qaçması, İskəndərusun şahlıqdan imtinası fələyin zülmünə etiraz deyilmi?

Poemada fələk "qəddar", "oyunbaz", "qanıçən", "təlxək" və başqa təşbehlərlə xarakterizə edilir. Fələyə qarşı ən güclü etirazı İskəndərin vaxtsız ölümü doğurur. Nizami öz qəhrəmanı ilə birlikdə yer üzərində heyatın çox qısa olduğundan şikayətlənir. İskəndərin ölümü səhnəsində oxucu qarşısında iki əzabkeş dayanır: İskəndər və Nizami özü.

Şərq, eləcə də dünya ədəbiyyatında Allah və fələyin bir-birinə münasibəti problemi öz daxili ziddiyyətlərinə görə ən maraqlı probemlərdən biridir. Fələyi adətən bütün şərlərin törədilməsində günahlandırır, onu hətta çox vaxt şərlə eyniləşdirirlər, Allah isə pak təsəvvür edilir.

"Alimlrəin Hürmüzü inkar etmələri və həlak olmalarının hekayəsin"də həsəd, alçaqlıq, yalan kimi mənfi sifətlər pislənir. Eyni ideyalar sonrakı "Əflatunun çalğı aləti qayırması" hekayəsində də təbliğ edilir. Burada da həsəd, özündən bədgümanlıq pislənir. Lakin bu hekayədə Ərəstu sonra öz səhvini başa düşdüyü üçün əfv edilir. Hekayə böyük insan hünərinin mədhinə həsr edilmişdir. Sokrat İskəndərə deyir:

Kim qane olarsa bir ovuc dənə
Dönməz dəyirmantək sənin dövrənə?
Arpa çörəyinə edib qənaət,
Buğda çörəyinə çəkmərəm minnət.

Yəni dünya nemətlərindən əl çəkmək insana zülm və zalımlıq hökm sürən dünyada öz mənliyini, insani ləyaqətini qorumaq üçün lazımdır. Nizami qəhrəmanlarında tərki-dünyalığa meyl də buradan doğur. Nizami qəhrəmanları

tərki-dünyalığa behişt naminə yox, bu dünyada insani ləyaqəti qorumaq, insan qürurunu itirməmək naminə meyl edir, aza qane olurlar. Eyni zamanda, hekayədə əxlaqi paklıq, təmizlik, nəcabət ideyaları da Sokratın dili ilə təbliğ və tərənnüm edilir.

İskəndərə mənəvi, əxlaqi paklıq öyrədən Sokratın hekayəsindən sonra, Nizami öz qəhrəmanını və onunla bərabər saysız-hesabsız oxucusunu yenə də əqlin qulluğuna dəvət edir. İskəndərlə hind aliminin görüşü zamanı Nizami mahiranə bir şəkildə, sual-cavab yolu ilə, dövrü üçün bir sıra mühüm fəlsəfi və elmi məsələlər qoyur. Məsələn, din öyrədirdi ki, Allahın varlığı ağılla dərkedilməzdir. Hindli alim isə şahdan Allahın varlığı, mahiyyəti və yeri haqda ağıllı dəlillərlə əsaslandırılmış sübut tələb edir, bizim kainatdan başqa bir kainatın olması, o dünya, insanın canı, röya, bədnəzər haqda suallar verir. İskəndər hindliyə dini qane edəcək cavablar verir, bir tərəfdən "əqildə görünməz şeyə yer yoxdur" deyirsə, digər tərəfdən din tərəfindən qəbul edilmiş təsəvvürlərdən kənar çıxanı qılınc və təşt, yəni edam gözləməsini də onun və başqalarının nəzərinə çatdırır. İskəndərin hindliyə cavabları Nizami dövründəki Şərq elminin və bu elmə əsaslanan fəlsəfənin səviyyəsini əks etdirir.

Qədim yunan elminin Ərəstu, Bəlinas, Sokrat, Əflatun, Valis, Fərfuriyus kimi nümayəndələrini bir yerə toplayan böyük mütəfəkkir onları orta əsr fəlsəfə və elminin ən ümdə və mühüm məsələləri haqda fikir söyləməyə, qoca kainatın tarixindən danışmağa məcbur edir. Maraqlı burasıdır ki, Nizami qəhrəmanları - filosofları dilləndirərək

onların fikrini çox vaxt olduğu kimi yox, Şərq fəlsəfəsi cərəyanlarına uyğun şəkildə verir. Orta əsr ərəb dilli füosoflar, məlum olduğu kimi, qədim yunan fəlsəfəsinə dair əsərləri tərcümə və təfsir edərək, bu fəlsəfəni qədim və orta əsr Şərq fəlsəfi fikriylə birləşdirib, yeni orijinal keyfiyyətli təlim yaratmışlar. Nizami poemasındakı məclisdə də yunan alim və filosoflarının adından söylənən fikirlər, orta əsr klassik ərəb dilli fəlsəfə süzgəcindən keçirilən və böyük mütəfəkkiri bu və ya digər şəkildə xüsusilə maraqlandıran fikirlərdir. Nizami qəhrəmanların dili ilə müxtəlif müddəaları sadalayıb qarşı-qarşıya qoyarkən, açıq və dolayı yollarla oxucusunu öz dünyagörüşünə bələd edir, ona feodal cəmiyyətində hökm sürən, ehkam kimi qəbul edilmiş fikirlərə qarşı öz şübhələrini, inamsızlığını aşılamağa çalışır.

Poemada qoyulmuş məsələlər, onların izahı, aydın və örtülü şəkildə, Nizami azadfikirliliyini, onun elmi-fəlsəfi görüşlərinin, xüsusən dinə münasibətinin tarixən mütərəqqi olduğunu açıq nümayiş etdirir. Əgər hindli alim ilə söhbətdə şah "haqqı düşüncədə olmaz axtarmaq" və onu sirraçılmaz





pərdə hesab edirdisə, yeni məclisdə fələyin "sirrini" ortaya qoyur və onu açmağa cəhd göstərir: "Yaradılış necə olub? İlk tərkib nədir? Dünyadakı dəyişkənlik necə baş verib?" Yeni məclisdə söhbət bu məsələlər ətrafında gedir.

İlk xilqət haqqında birinci Ərəstu söz açır. O, yaradılışın başlanğıcını və əsasını hərəkətdə görür. Alim hərəkətdən odun yaranmasını, oddan havanın, havadan suyun, suyun xıltından isə torpağın yaranmasını, bunların qarışmasından da nəbatat və heyvanatın əmələ gəlməsini söyləyir. Valis hər şeyin əsasında olan ilk cövhəri suda görür, su və hərəkət dörd ünsürü və dünyanı yaradır. Bəlinas əvvəl yerin yaranması və sonra onda hərəkət vasitəsilə dörd ünsürün əmələ gəlməsini qəbul edir. Əgər Ərəstu, Valis və Bəlinas ilk yaradılışdan danışarkən hərəkət və dörd ünsürü əsas götürür, Yaradandan söhbət açmırlarsa, Sokrat bunların içində birinci olaraq Yaradandan danışır. Yaradanın heybətindən bir bulud qalxmış, ondan göy və yer əmələ gəlmişdir söyləyir. Sokratın ardınca Fərfuriyus da Yaradandan və onun yaratdığı cövhərin suya, suyun isə göyə və yerə çevrilməsindən söhbət açır.

Hürmüz Yaradanın varlığını iqrar edir, lakin ilk xilqətin nə sayaq əmələ gəlməsini bilmədiyini söyləyir. Əflatun dünyanın, Yaradan tərəfindən mayesiz yarandığını qəbul edir.

İskəndər bu məclisi tamamlayaraq Yaradanın varlığını qəbul edir, lakin yaradılışın necə olduğunu dərkedilməz sayır. Nizami məclisə yekun vuraraq öz fəlsəfi qayəsini burada işıqlandırır. Nizaminin fikrincə, Yaradan hər şeydən əvvəl əqli yaratdı və ona ilk yaradılışın sirrindən başqa dünyanın bütün sirlərini açdı. Nizami bu məclisi tamamlayarkən Xızrın özünə müraciətlə dediyi:

Bu gizli sözləri, fikirləri sən
Neçin lal dillərə isnad edirsən?

beyti yeddi alim məclisində söylənilən müddəa, iqrar və inkarların, əslində şairi düşündürən fəlsəfi fikirlər olduğuna bizi inandırır, onun bu yolda inamı, tərəddüdü və şübhələri haqda aydın təsəvvür yaradır. Təsadüfi deyil ki, Xızrın verdiyi suala cavab kimi aşağıdakı beyt səslənir:

Dövrün kişiləri nakişidirlər,
Elmə yox, nücuma həvəs edirlər.

Ancaq əsərin orta əsr oxucusu üçün yazıldığını nəzərə aldıqda, onun hakim dünyagörüşünə nə cür zərbə vurduğunu dərk etmək olar. Poemanın bu

fəsli ardınca gələn "İskəndərin peyğəmbərliyə yetişməsi" fəsli də söylənilənləri bir daha sübut edir. Həmin fəsildə İskəndər daha yaradılışdan söz açmayıb Yaradanı axtarır. Əgər əvvəllər İskəndər yaradılış sirri və Yaradanı dərkedilməz hesab edirdisə, indi:

İstədi çalışıb sirləri örtən
Yeddi qat sürməni silsin tamamən.

Maraqlıdır ki, şah ilahi qəzəbə gəlmir, əksinə, mərhəmətli Allah alim və rəhmdil şahın bu axtarışı qarşısında ona peyğəmbərlik bəxş edir. Allah peyğəmbər kimi səfərə çıxan İskəndərdə yenə də dünyəvi büiklərə ehtiyac hissi oyadır. Peyğəmbərlik səfərinə çıxan İskəndər dünyəvi ağla möhtacdır.

Nizami rasionalizmi və azadfikirliliyi gələcək hadisələrin izahında xüsusilə gözə çarpır. Şah yola dini kitabları yox, Ərəstu, Əflatun və Sokratın yazdığı nəsihətnamələri götürür. Nəsihətnamələri oxuduqca onların arxasında qədim yunan mütəfəkkirlərindən çox Nizami dühasını, Nizami məntiqi və Nizami insansevərliyini görürük; mütəfəkkirin siyasi və etik görüşləri burada geniş planda verilmişdir. Nizami humanizmi və müdrikliyi İskəndərin səfərə çıxarkən anasına etdiyi vəsiyyətdə də özünü göstərir.

Poemanın belə səhnələri İskəndərin bir şah və sərkərdə kimi müdrikliyini nümayiş etdirir, onun yüksək insani keyfiyyətlərini açır və onu bir nümunə kimi dünya şahlarına və hər şeydən əvvəl, şairlə həmdövr olan şahlara göstərir. İskəndər ədalət səsini aləmə yayaraq zülm, nadanlıq və bədxahlıqla mübarizəyə qalxır. Ölkələr fəth edərək, xalqları haqqa və ədalətə tabe edərək şah bu üç qüvvədən özünü də, insanları da xilas etməyə çalışır. Onun müharibələri sülhə xidmət edir; o, dağıtmaqdan çox qorxur. Əmin-amanlığın bərpası İskəndərin əsas qayəsidir. Poemada Nizami özünəməxsus sənətkarlıqla İskəndərin tikintilərinin füsunkar gözəlliyindən bəhs edir.

İskəndərin səfərinin təsvirində mütəfəkkir həyati səhnələrlə yanaşı, allegoriyadan da geniş istifadə edir. Məsələn, səfər vaxtı İskəndərin əsgərləri iti daşlarla dolu yolu keçərək, yüksək dağın zirvəsinə qalxıb oradan özlərini sevinclə o biri tərəfə atırlar. Şah alimlərin məsləhətilə bu qəribə görünən hərəkətin səbəbini öyrənə bilir. Deməli, insanlar qorxunc, düşgünlük və ehtiraslarla dolu, əzablı həyat yolunu keçib zirvəyə (zirvə burada kamillik, paklıq rəmzidir) qalxdıqda azad dünyaya çatırlar ki, bu da yaşadığımız dünyanın tərki deməkdir.

Lakin hadisədən xəbərdar olan şah bu sirri gizli saxlayır, qoşununu tez o yerlərdən çəkir və yenə de insanlara din öyrədə-öyrədə səfərini davam etdirir.





Burada biz bir daha İskəndərin tərki-dünyalıqdan uzaq, bu dünya ilə bağlı olduğunu görürük.

Nizami alleqoriya və realist təsvirləri üzvi surətdə birləşdirərək İskəndərin mənəvi yüksəlişini insanların ağlı və mənəvi kamilliyi uğrunda apardığı mübarizə fonunda verir. Əsəri oxuduqca bu iki məqsədi güdən müvazi xətt unudulmamalı və poemanın insanın dünyəvi səadətinə xidməti Nizami oxucularının diqqət mərkəzində olmalıdır.

Kamilliyin zirvəsi ictimai bərabərlik, azad və xoşbəxt insanlar şəhəridir. Bu şəhər nizamişünaslıqda Nizami utopiyası kimi məlumdur. Bu şəhərə çatana qədər şah çox ölkə və möcüzələrə rast gəlir, çox zülmə və nadanlıqlara son qoyur, xeyir və mərifət yayır. İskəndərin susuz səhra əhlilə görüşü, onlara etdiyi xeyirxahlıq, xaqana din qəbul etdirməsi, dənizin dəhşət doğuran səsindən sahildə yaşayan əhalini xilas etməsi, Yəcuc səddini bağlaması sanki şahı pillə-pillə ideal şəhərə yaxınlaşdırır.

Şəhər İskəndərin səfərinin sonu və axtarışlarının zirvəsidir. Nizaminin ideal cəmiyyət haqqında təlimi ədəbiyyatşünaslıqda və xüsusən nizamişünaslıqda ən geniş işlənmiş problemlərdən biridir. İdeal şəhər və cəmiyyət haqda həm qədim dövr, həm də orta əsr Şərqinin abidələrində müxtəlif təsəvvürlərə təsadüf edirik. Yaxın və Orta Şərqdə böyük şöhrət tapmış IX əsr alim və filosofu Fərabinin "Xeyirxah şəhər" əsərində hətta ideal şəhərlərin müəyyən təsnifatı belə verilir. Bu dövr ədəbiyyatında rastlaşdığımız ideal şəhərlər haqqında yazılar adətən real və eyni zamanda alleqorik məna daşıyır. Həmin şəhərlər həm həqiqətən ictimai zülmü dəf etmiş insanlar, həm də çirkin mənəvi ehtiraslarına qalib gəlmiş pakların cəmiyyəti kimi düşünülür.

Orta əsr Şərq humanizminin məhsulu olan ideal utopik cəmiyyətlər adətən bu iki funksiyanın ifaçısı kimi çıxış edir. Tarixdən məlumdur ki, kəskin sinfi mübarizə nəticəsində xalq kütlələrinin gücünə əsaslanaraq, Şərqdə ideal dövlətləri bu və ya digər dərəcədə xatırladan demokratik qərmətilər, ismaililər dövlətləri mövcud olub, bunlar və xüsusən Beyləqanda, XI əsrdə kəskin sinfi mübarizə nəticəsində müvəqqəti də olsa yaranan xalq hakimiyyəti, sözsüz ki, Nizaminin ideal cəmiyyət nəzəriyyəsini qidalandıran real zəmin idi.

Nizaminin kamil cəmiyyət nəzəriyyəsi fantastik uzaqgörənliyin məhsulu, şair dühasının qeyri-adi tapıntısı deyil. Bu nəzəriyyə Şərq və dünya ictimai-fəlsəfi fikir tarixinin ideal cəmiyyət haqqındakı nəzəriyyələr zəncirində bir halqadır - XII əsrə qədər tarixən mövcud olan bu və ya digər dərəcədə utopik ideala yaxınlaşan, müvəqqəti də olsa ömür sürmüş demokratik dövlətlərin qanunauyğun davamıdır.

Deyilənlər mütəfəkkir şairin "Xəmsə"də inkişaf etdirdiyi və "İqbalnamə"də

tamamladığı görüşlərin tarixi əhəmiyyətini əsla aşağı salmır, əksinə, ümumdünya mədəni inkişafının mütərəqqi axarında Nizaminin iştirakını göstərir.

Nizamiyə görə insanın mənəvi kamilləşməsi cəmiyyətin mənəvi kamilləşməsinin rəhnidir, lakin birinci yalnız ikincinin kamilliyi zamanı özünə tam imkan tapır. Əsil insanların cəmiyyəti üçün ictimai bərabərsizlik, zorakılıq, tamahkarlıq, qanlı müharibələr, kin, qorxaqlıq, yaltaqlıq, sevincdə və qəmdə qardaş həmrəyliyinin olmaması, sonsuz mənəvi və ictimai fitnələr qəbuledilməzdir.

"İqbalnamə" "Xəmsə"ni tamamlayır, başa çatdırırsa, ideal cəmiyyət təlimi də "İqbalnamə"dəki axtarışların, istəklərin son zirvəsidir. "Sirlər xəzinəsi"ndən başlamış "İskəndəmamə"yədək Nizami hər bir poemasında zorakılığı, nəcib zəhmətkeş xalqa zülm edilməsini, əyri yollarla vardövlət yığmağı, tamahkarlığı, qəddarlığı, vicdan alverini, rüşvəti dəfələrlə kəskin tənqid etmiş, adil hakimlər silsiləsi yaratmışdır.

Nizaminin ictimai rifah haqqındakı son təsviri yürüşlərdə əldən düşmüş ordunun və İskəndərin qarşısında canlanan, Günəş şüalarına qərq olmuş, gözəl ab-havaya malik, çəpərsiz bağları, çobansız sürüləri ilə təəccüb oyadan hakimsiz bərabərlik və dostluq diyarı olan şəhərdir. Bu şəhəri qoruyan sirli qüvvələr oğruları və zorakıları cəzalandırırlar. Şəhərdə ürək istəyən hər şey varsa da, nə qala divarları, nə şəhər darvazaları nəzərə çarpır. Zəngin dükanlar qıfılsızdır.

Bu şəhərin əhalisi həm də qonaqpərvərdir. İskəndərin "Siz nə üçün belə cəsursunuz?" sualına onlar "Biz zəifik, ancaq dindarıq, doğruçuyuq, əyriliklə işimiz yoxdur" deyə cavab verirlər. O insanlar İskəndərə öz sosial-etik qayələrini izah etdikcə, sanki qarşımızda din və etiqad haqqında Nizami təliminin mahiyyəti canlanır. Başa düşürük ki, mütəfəkkirə görə, "din" bərabərlik və ədalətdir.

Bizdə bərabərdir hamının varı,
Bərabər bölərik bütün malları.
Bizdə artıq deyil heç kəsdən heç kəs,
Bizdə ağlayana heç kimsə gülməz...
Birini qəzəbli, acıqlı görsək,
Ona məsləhətlə eylərik kömək.
Qızıla, gümüşə aldanmaz heç kəs,
Onlar bizim yerdə bir şeyə dəyməz.
Xəsislik bilmərik dünyada bizlər,
Zorla şey almarıq bir arpa qədər.





Gördüyümüz kimi, bu adamların etiqadı həqiqətə əsaslanan ümumi ahəngdarlıqdan başqa bir şey deyilir. Xeyir və ədalətin rəmzi olan bu həqiqət mütəfəkkirin dövründə dillərində "ənəlhəqq", əllərində silah Yer üzərində ədalətin təntənəsi üçün mübarizə aparanlara xüsusən yaxın və vacib idi.

Diqqətəlayiq cəhətdir ki, bir çox xalqları öz dininə gətirmiş peyğəmbər İskəndər bu məkana yetdikdə öz peyğəmbərliyini unudur. Onun dini burada heç kimə lazım deyildir. Əksinə, o özü bu insanların əqidəsinin əsil mənasını başa düşür ki, bu mənanı da bircə insanlıq sözü ilə ifadə etmək olar. Ömrü boyu uğrunda mübarizə apardığı kamillik artıq İskəndərin qarşısındadır. Şəhəri görərkən İskəndər yolunun sona çatdığını anlayır və Ruma qayıtmağı qərara alır.

Bu şəhərin təsvirini verməklə Nizami öz dünyagörüşünün izahında da son nöqtəni qoyur, çünki bərabərlik şəhəri mübariz humanist Nizaminin də, dövrün zülmlə daim mübarizə aparan zəhmətkeş xalqının da istək və arzusunda son zirvəydi.

Nizaminin ədalətli cəmiyyət konsepsiyasını uydurma, həyata keçməyəcək arzu, boş fantaziya hesab etmək olmaz. Bir qədər fantastik olsa da, o, gerçək ola biləcək arzunun ifadəsidir və mövcud quruluşla, mövcud siyasi və əxlaqi münasibətlərlə barışmayanlar üçün bələdçi rolu oynayır. O, öz insani ləyaqətini başa düşərək, zorakılığın və qızılın yox, insanlar arasında xeyirin, dostluğun, məhəbbətin hökm sürməsi uğrunda mübarizə aparanların arzusunu ifadə edir. O, insan ləyaqətinin mənəvi təmizliklə, başqasına təmənnasız kömək etmək, başqasının kədərinə və sevincinə şərik olmaqla ölçüldüyü cəmiyyət uğrunda mübarizə aparanların arzusunu ifadə edir.

Nizaminin başqa əsərlərində öz əksini tapmış sosial-etik görüşləri ilə birlikdə götürülərsə, "İqbalnamə"dəki kamil cəmiyyət təlimi oxucunu ədalət uğrunda daha fəal mübarizəyə çağırır. Nizami idealının bütün dövrlərin insanlarına yaxınlığı və doğmalığının səbəbi də buradadır. Şairin öz sözü ilə desək, "İqbalnamə" dürr yox, dəryadır. "İqbalnamə"nin təkraredilməz bədii gözəlliyini yalnız onu dəfələrlə, sevə-sevə oxuyanlar dərk edə bilərlər.

***Zümrüd Quluzadə***

Harda ki, ağıl bir xəzinə tapar,
Allahın adını eyləyər açar.
Allah ağıllıya nəvazişkardır,
Ağılsızlara da əlacı vardır.
O, sözün sirrini əyan eyləyər,
O verər zəlilə, acizə hünər.
Zahirdən, batindən aşikar, nihan,
Əqlə yol göstərən odur hər zaman.
O, bu imarətin səqfini tikmiş,
O, bu karxananın nəqşini çəkmiş.
Qəlbə də xoş gəlir ondakı qüdrət,
Əqlə də vacibdir ona itaət.
Bütün varlıqların fövqündə durur,
Varlığı hər şeyi yaradıb qurur.
Hikməti gizlindir, hökmü aşikar,
Onun tərifinə dil aciz qalar.
Əsli pak, zatı pak, təkdir vücudu,
Nə oddur, nə torpaq, nə yel, nə də su.
Varlıqlar hamısı onun möhtacı,
Onunsa heç kəsə yox ehtiyacı.
Yeddi qat içində nə var binadan,
Min alqış ona ki, odur yaradan[1].
Ona qovuşmağa yol yoxdur fəqət,
Əqlə, düşüncəyə sığmaz bu hikmət.
Desək ki, göydədir o pərvərdigar,
Ona təzim edən yer tənha qalar.
Yox, əgər yerdədir, söyləsək, allah,
Şənini alçaltmaq olmazmı günah?!
Məbudun zatından danışan zaman
Axtarma nə göydə, nə yerdə məkan.
Əgər qüdrətindən deyib-danışsaq,
Hökmünə tabedir bu göy, bu torpaq.
Hər bir kəramınə, qəzəbinə sən
Naşükür olmayıb, baş əyməlisən.
Birinin könlündə yandırar çıraq,
Birinin könlünə çəkər dərdlə dağ.
Birinə saraylar verər fələkdən,

Birini quyuya salar yüksəkdən,
Birdir hüzurunda onun çox, ya az,
Böyüyü, kiçiyi əsla ayırmaz.
Onun qarşısında çöp kimidir dağ,
Hökmünə bağlıdır ölmək, yaşamaq,
Heç bir kəs torpağa dil verə bilməz,
Nəqş vura bilməz suya da heç kəs[2].
Təkcə o yaradar torpaqdan insan,
Tək odur suya da naxışlar vuran.
Azanın yoluna nur saçan odur,
Bağlı qapıları ilk açan odur.
Sakin, mütəhərrik, - nə var dünyada;
Varlığı bağlıdır o böyük ada.
Hökmüylə yaranmış bütün kainat,
Bütün canlılara o verir həyat.
Ondan ad almışdır bu varlıq tamam,
O, tamdır, qalanlar nə var - natamam.

## MİNACAT

Bəndəyə əl tutan sənsən, ilahi,
Yoxdur səndən başqa onun pənahı.
Olmuş-olacağı sənsən yaradan,
Sənin kəməminə möhtacdır insan.
Lütf elə, əlini mənə də uzat,
Mənə öz qovğamdan özün ver nicat.
Sənsən, pərvərdigar, hər bir muradım,
Səndən hasil olar hər bir muradım.
Mərhəmət görərsə səndən bir insan.
Nə göydən qorxar o, nə də ulduzdan.
Sən varkən ehtiyac yoxdur göylərə.
Asiman var ikən kim baxar yerə.
Varkən bu dünyada hər cürə büsat,
Behiştdə nə üçün axtaraq həyat?
İnanma ki. cənnət burdan şən olsun,
Deyirsən yaxşıdır, sən deyən olsun.
Bizə də behiştdə bir yer ayır sən,





Sil pis naxışları düşüncəmizdən.
Biz öz çarəmizi bilmirik əsla.
Hansı yol yaxşıdır apar o yola.
Səni ümid ilə hey axtarmaqda
Kimisi qarada, kimisi ağda[3].
Bir meyvə dərməkçin sənin bağından,
Hərə bir qapıda eyləyir fəğan.
Məndə cəsarət yox sənə söz deyim,
- Onu ver,- deyərək bir şey istəyim.
Diləyim yerinə yetsə hər kəsdən.
Görürəm o deyil, sənsən lütf edən.
Sənin mövcudata yox ehtiyacın,
Onların hamısı sənin möhtacın.
Sən ki, dostluq ilə çıxdın qarşıma,
Biganəlik külü tökmə başıma.
Feyzindən işıq ver gözlərimə sən,
Qoy olum asudə özgə gözlərdən.
Pərvanə olmuşam şəbçırağına.
Bir quşam, qonmuşam sənin bağına.
Bu kiçik bəndəni salma gözündən.
Böyüksən, kömək et böyüklüklə sən.
Mən nəyəm, bir zərrə - gözlə görünməz,
Səndən nur almışdır o zərrə - sönməz.
Sənin qüdrətinlə aşkar olmuşam,
Hər bir xəzinəyə açar olmuşam.
Köhnə hekayəti çatdırdım sona,
Başlasın təzə söz indi cövlana[4].
Saldın ilk sözümü sən dildən-dilə,
Bu son addımı da yetir mənzilə[5].
Ziya saç, qoy qəlbim işıqla dolsun,
İncə mətləblərə o, güzgü olsun.
Bu çətin yollarda budur məqsədim:
Sənin bəyəndiyin bir yolla gedim.
Elə kömək et ki, işlərimə sən.
Özün şad olasan dediklərimdən.
Mən öz xoşum ilə gəlim önünə,
İtaət eyləyim peyğəmbərinə

## SONUNCU PEYĞƏMBƏRİN TƏRİFİ

Nə bir taxt istədi Məhəmməd, nə tac,
Qılıncla çox aldı şahlardan xərac.
Yox, yox, səhv elədim, o böyük nəbi
Həm taxt sahibiydi, həm tac sahibi.
Onun taxtı idı bütün bu əflak,
Başının müqəddəs tacıydı "lövlak"[6].
Mələk simalıydı, allahtanıyan,
Bizə də allahı o verdi nişan.
Bizləri cənnətə odur aparan,
Cəhənnəm odundan odur qurtaran.
Parlayıb nur saçdı bu kainatda,
Bənzərdi Zülmatda abı-həyata[7].
Uca qalxmasaydı ərşin tağından,
Kimdi kainatın sirrini açan?[8]
Mənəvi bir töhfə o verib bizə,
Ərşin sovqatını göndərib bizə.
Yolunun torpağı olan başımız
Dəyməz başındakı bir tükə yalnız.
Bizim halımıza qəlbdən yanaraq
Gündüz günəş oldu, gecələr çıraq.
Hər sınıq ürəyin odur pənahı,
Odur bağışladan hər bir günahı.
Dahidir, böyükdür o dahilərdən,
Üstündür, yüksəkdir hər peyğəmbərdən.
Cənnətdən torpağa gəldisə edəm,
O qoydu torpaqdan cənnətə qədəm[9].
Aytək çıxdı Yusif quyudan əgər,
Nur saçdı quyudan o, aya qədər[10].
Xızra abı-həyat oldusa qismət,
Həyat çeşməsindən keçdi Məhəmməd[11].
Yunisi uddusa balıq bir zaman,
Ona səcdə etdi balıqla ilan[12].
Davuddan yadigar tək bir zireh var,
Məhəmməd yüz zireh qoyub yadigar[13].
Süleymanın taxtı getdisə bada,
Məhəmməd əbədi qaldı dünyada.





Isanın beşiyi göyə qovuşdu,
Məhəmmədsə özü göylərə uçdu[14].
Tur dağı Musaya oldusa eyvan,
Məhəmmədin qəsri yarandı nurdan[15].
Şəminin önündə durub çıraqlar,
Səndən işıq istər, səndən pay umar.
Şəffaf bir çeşməsən, təmiz bir bulaq
Özünü suyunla yuyub bu torpaq.
Bu quru torpağın sədası sənsən,
Bu xəstə dünyanın şəfası sənsən.
Həkimsən, aydındır düşüncən, zəkan,
Əlində allahın hökmü bir dərman.
Məxluqun gözünə sən işıq verdin,
Göydə mələklərə yaraşıq verdin.
Adın möhür kimi sözə ziynətdir,
Camından hər qətrə əbədiyyətdir.
Ondan birCə udum içərsə hər kəs,
Dünyada dərd bilməz, əziyyət bilməz.
Elə et ki, olsun o dadlı şərbət
Bu yazıq bəndəyə - mənə də qismət.

## KİTABIN YAZILMASININ SƏBƏBİ

Dolanıb döndükcə qoca rüzigar,
Özünə bir yeni müəllim arar.
Köhnə havaları dəyişər tamam,
O yeni nəğmələr bəstələr müdam.
Dövran oyunbaztək oynar bir müddət,
Çıxarar pərdədən bir təzə surət.
Edib füsunkarlıq bu surət ilə,
Xalqı əyləndirər bir zaman belə.
Onu da qocaldıb dövran itirər,
Səhnəyə yeni bir surət gətirər.
Təzə şairlər də təzə xətt ilə
Köhnə tarixləri təzələr belə.
Hər dövrün olar bir usta bağbanı,
Bəsləyib böyüdər körpə fidanı.
Bir gövhər hüsnünü itirsə əgər,

Daşdan baş qaldırar başqa bir gövhər.
Gəlinimdə olan şuxluq, təravət
Peykərşünaslara eylər kifayət16.
Təzə olmasaydı bu əsər, yəqin
Təzə bir söz demək olardı çətin.
Bir harın at idim bir zaman mən də,
Zəhmətlə, zillətlə düşdüm kəməndə.
Hər bir xəzinədə var məndən nişan,
Ancaq, heyf olsun ki, deyiləm cavan!
Gənclik - təzə nallı, harın, köhlən at,
Qocaldın - nal qızır, düşür əldən at.
Kürədən çıxanda güzgü bərq vurar,
Fəqət sınan zaman zirehə yarar[17].
Söz, sənət eşqilə çırpınan ürək
Alır sirdaş kimi ilhamdan kömək.
Düşüncəm beynimin qızıl qanından
İncitək incə söz alardı hər an.
Çünki gizlində bir ilhamçım vardı,
Mənimlə örtülü söz danışardı.
Susmuşdur sirdaşım xeyli zamandır,
Mən də söz tapmıram, halım yamandır.
Bir də ki, sözümü dinləyib duyan
Bizi tərk eləyib, gedib dünyadan.
Şah Arslan torpaqda, qəbirdə ikən,
Necə söz söyləyim, şer yazım mən?
Şah əgər lütf ilə etsə mərhəmət,
Yeni söz deməyə eylərəm cür'ət.
Bu dar keçidlərdə dərd məni aldı,
Bədənim sustaldı, rəngim saraldı,
Yolumu tufantək tutdu fikirlər,
Gözümdə qalmadı yuxudan əsər.
Gecə, dar qəlblərdən qara bir gecə,
Yollar baş tükündən daha da incə!
Belə bir gecədə mümkünmü səfər?
Heç belə bir yolda quyu seçilər?
Zülmətə bürünmüş keşikçixana,
Həmlə eləmişdir fil pasibana[18].
Bir ahu balası doğmuşdur çəmən,





Müşk-ənbər saçmada öz göbəyindən[19].
Nə pərvanə şamdan uzaq dayanır,
Nə də ki, şam ondan uzaqda yanır.
Bir belə gecədə oturmuşam tək,
Kağızda yazılar qara gecətək.
Dürr üçün qəvvastək suya batırdım,
Gah seçib götürür, gah da atırdım...[20]
Gecədən bir qədər keçmiş olardı,
Hələ qaranlıqda, sübhə çox vardı,
Fələyin köhləni olub təngnəfəs21,
Xoruzlar banlamır, gəlməyir bir səs.
Daxmada gecənin hörüklərindən
Yeddi rəng ipəklər toxuyuram mən[22].
Bu laciverd küpdən mən də İsatək
İplər çıxarıram hər an rəngbərəng[23].
Əvvəldən bəsləyib tərbiyə verən
Bir nəcib insandır məni yetirən:
Mötəbər bir şəxsdir o Xoylu İmad;
Qalxmaq istəyənə o edər imdad.
Səxası dünyanı salmış heyrətə,
Dürlə bəzək vurmuş o, səxavətə.
Bu qoca dünyada ona tay hanı
Ki, sözü, səxası tutsun cahanı?
Onda Müştərini görərək hər an,
Vurar üzüyünə Ütarid nişan[24].
Əfsus ki, bəxtimin sərkəşliyindən,
Gizləyir bu dünya o zatı məndən.
İşlərim düyünlü, nəsibim dərd-qəm,
Nə yaxın bir dost var, nə də bir həmdəm.
Məgər neçə uşaq tutar bir mama?
Bir ağac nə qədər yetirər xurma[25]?
Yuxusuz, ac-susuz qalıb o gecə,
Bu mavi dəryada üzürdüm təkcə[26].
Gecə gecə deyil, dibsiz bir quyu,
Ayı da, günü də udmuşdu suyu[27].
Gecənin bağrını yarmışdı zülmət,
Kölgə eləyirdi işığa töhmət.
Atdığım kəməndlə, şahın bəxtindən

Əmlik ceyranları ovlamışam mən[28].
Əngin dənizlərə mən tor atmışam,
Bu torla növbənöv balıq tutmuşam[29].
Xoş görüb bəxtini şahın rəsəddə,
Mən sözə başladım xoş bir saətdə.
Vuruşur önümdə Çin ilə Həbəş[30],
Şaha edəcəyəm onları peşkəş.
O qorxunc gecədə süstləşərdim mən,
Tutmasaydı şahın bəxti əlimdən.
Çatdı mədəninə gövhər axtaran,
Könül azad oldu qəmdən, qubardan.
Qızıl çadırını günəş ucaltdı,
İpləri dağların başına atdı.
Gecəki əzabı unutmaq üçün
Bir məclis bəzədim mən də həmin gün.
Ariflər bəyənən bir yer seçərək,
Orda bir taxt qurdum mən sultanlartək.
Yeni bir üsulla büsat quruldu,
Düşüncəm məclisə xidmətçi oldu.
Şərabım, reyhanım, məzəm, həmdəmim
Sözümdü, fikrimdi, qəlbimdi mənim
Qızışıb coşduqca beynim şərabdan.
Gəldi səxavətə söz də bu zaman[31].
İlham buludlarım çəkdi nərələr,
Gövhərşünaslara yağdırdı gövhər[32].
İki şey cəsarət istər insandan:
Biri od, biri də yırtıcı aslan.
Sanki həmcins imiş odla aslan da,
Nə düşsə məhv edər bunlar bir anda.
Taleyim açıldı, oldum bəxtəvər,
Zöhrə dəf göndərdi, Müştəri dəftər[33].
Lütfdən gah bəzək yaradıram mən,
Gah hikmət saçıram söz xəzinəmdən.
Saçdığım gövhərlə bəzəndi cahan,
Çünki var şah kimi bir gövhər alan.
Yenidən mədənə mən əl uzatdım,
Gedib xəzinənin məğzinə çatdım[34].
Heç yaxşı iş deyil yalan danışmaq,





Bu qızıl, bu da od, ərit, yoxla, bax!
Neçə vaxt ağ rəngə laciverd qatdım,
Bitdi "Şərəfnamə", murada çatdım.
Coşdu Çin naxışlı şerim, sənətim,
Gör hara qalxacaq mənim şöhrətim!
Gör əvvəl nə əkdim, gör bitdi nələr,
Sınığı bu sayaq bitişdirərlər[35].
Neçə il olar ki, gövhər sevənlər
Axtarıb tapmayıb bir belə gövhər.
Axır ki, tapıldı bir gövhər satan,
Yaxşı mal alınar satıcısından.
Padişah əmr etdi: bəzənsin bir bağ,
Sərvlər çəmənə gətirsin növraq.
Qəlbi nurlu şahın şərəfinə mən
Güc alıb idrakın şəfəqlərindən,
Bir sərv bəzədim ki, məclis şad olsun,
Onun şərəfinə badələr dolsun.
Şer yox, mənasız nəzm yazanlar
Çətinlik çəkməzlər, onlara nə var?
Daşlardan cəvahir çıxaran ancaq
Bilir ki, çətindir gözəl söz tapmaq.
Bu incə xəyallar məni coşdurdu,
Könlümün atəşi beynimə vurdu.
Öz tüstüm başıma qalxdıqca mənim,
Quruyub qaxaca döndü bədənim.
Gəlincə bu gözəl gəlin hasilə
Məndə səbr gərək, şahda hövsələ.
Sözə bax, baş alıb hara ucalır,
Mən nələr deyirəm, o nələr çalır?
Bilmirəm bu qədər füsunkar sözlər
Babil quyusundan çıxır nə təhər?[36]
Zöhrəyə o "Zənd"i kimlər öyrətdi,
Oxuyub Harutu tamam bənd etdi?[37]
Sehirli nəğməmdən Zərdüşt xar oldu,
Söndü çox "Zənd"lərin alovu, odu[38].
Dəryaya dürr saçsın qətrə buradan,
Qoy xurma daşısın Bəsrə buradan[39].
Bu altıkünc tağda bir buludam mən,

Səpərəm hər yana su ciyərimdən[40].
Bitkitək pay alır hamı suyumdan.
Yağışım sərvlər yetirir hər an[41].
Kölgətək işıqdan kim çəksə zərər.
Əlbəttə, həmişə ondan çəkinər.
Çeşməmdən feyziyab olsa da çoxu,
Getmir gözlərinə həsəddən yuxu[42].
Mənim meyxanamdan içərlər şərab[43],
Mənim sözlərimdən bağlarlar kitab.
Bu feyzi onunçün qazandım ki, mən
Əsla su içmədim yad bir çeşmədən[44].
Xəlvətdə poladdan sildim ki, pası,
Yaqut rəngi alsın onun aynası[45].
Silib bu aynanı parlatdım par-par,
Yerdən toz-torpağı külək aparar.
O Çin üzlü nigar, bilmirsən məgər
Rumun qalasını necə fəth edər?
Xəzinə kəşf etmək istəsə biri,
Gərək unutmasın çətinlikləri!
Xəzinə kəşf etmək istəsən əgər,
Hər bir çətinliyə tab et, sinə gər!
Məsəl var, deyərlər, eşit, qulaq as:
"Viranə ocaqdan heç tüstü çıxmaz!"
Yuxu var, əvvəlcə çox qorxunc olur,
Gün doğur, ürəyin fərəhlə dolur.
Qəlbə qorxu salan çox şeylər üçün
İnsan şükr eləyir axırda bir gün.
Nə çoxdur şairlik iddia edən, -
Qorxuram meydanda qan tökülməkdən.
Yayın ortasında çox yağsa yağış,
Elə soyuq düşər, sanki dönüb qış.
Havaya yağışdan nəm çöksə əgər,
Günəş o çirkləri silib məhv edər.
Payız yetişdikdə, bilir ki, hər kəs,
Daha lətif külək, incə meh əsməz.
Artıq rütubətdən törəyər vəba,
Tənəffüs çətindir belə havada.
Bundan qurtarmaqçün qalayarlar od,





Tökərlər bu oda səndəl, gül və ud.
Təbimlə şaha ud yandıraram mən,
Daha başqa bir iş gəlməz əlimdən.
Allah məni ona bəndə xəlq etmiş.
İtaətdən başqa bilmərəm bir iş.
Dünyagörmüş adam, - yaxşı ya yaman,-
Şikayət eyləməz öz ruzgarından.
Bu dünya heç kəslə deyil həmavaz,
Sazəndələr kimi bir hava çalmaz.
O, sazda görərsə ipək bir teli,
Qırıb atmaq üçün uzanar əli.
İpək yetirməkdə iki cür qurd var,
Ziddir odla sutək həmişə onlar.
Biri baramanı toxuyur bir-bir,
O biri karvanla ipək məhv edir.
Pətəkdə iki cür arı var müdam,
Necə ki, aldadar pərvanəni şam,-
Biri yem daşıyar hey axşam-səhər,
O biri gizlincə o yemdən yeyər.
Bal verən arının bircəsi, yəqin,
Yüzündən yaxşıdır bal yeyənlərin.
Hələ can almamış əcəl, turaclək:
"Dad, məni tutdular!" - çığırıb dad çək[46].
Tamahkar dünyadan nə ummaq olar.
Ya səni yandırar, ya da çiy saxlar,
Qaynayıb coşarsan, yanarsan dərddən,
Qaynayıb coşmasan, çiy qalarsan sən.
Fələk - yeddibaşlı qorxunc əjdaha,
Bircə zərbə vursa, məhv oldun daha[47].
Xəlbirə bənzəyən teştdir asiman,
Sən bir xəlbir torpaq, o da bir teşt qan[48].
O, teştdən su töksə başına nahaq,
Sən elə xəlbirtək üstünə torpaq.
Torpaq da, çeşmə də olan bir yerdə
Lazımdır, əlbət ki, teşt də, xəlbir də.
Bu göy rəngli küpün çox hiyləsi var,
İçindən görərsən yüz cür rəng çıxar[49].
Küpə bir cadugər minər, deyərlər,

Bu küpə minmişdir yüz min cadugər[50].
Fələk hesabını gəl etmə nahaq,
Alçağı yüksəkdir, yüksəyi alçaq.
O gah altda olur, gah üstdə olur,
Ona alt-üst demək daha doğrudur.
Əbəsdir fələklə bəhsə girişmək,
Heç kəslə həmahəng olmayıb fələk.
Atdığı hər addım fənddir, kələkdir,
İşləri büsbütün oyundur, rəngdir!
Birini göylərə ucaldır bəzən,
Bəzən də qul edir onu görürsən.
Tülkütək geydirər qırmızı papaq,
Sonra qara itə yedirdər ancaq.
Nədir dörd yol üstə məskən düzəltmək?[52]
Nədir qarın güdmək dördayaqlıtək?
Dörd balış qeydindən qurtaranda biz,
Asudə yatarıq səssiz-səmirsiz[53].
Yolüstü mənzildir bu köhnə torpaq,
İkicə qapısı var onun ancaq:
Giriş qapısından girərsə hər kəs,
Çıxış qapısından çıxmaya bilməz.
Bədbəxtdir bu dərin quyuda qalan,
Qar kimi düşərək donub buz olan.
Xoşbəxtdir şimşəktək yalnız bir anda
Parlayıb sönənlər fani cahanda.
Nə lazım dünyada fərsiz bir şamtək
Gecələr uzunu can verib sönmək?
Etibar etməyən öz gəmisinə
Gərək əvvəlcədən üzmək öyrənə.
Tələsən adama köhlən at gərək,
Yabıyla nə qədər o yol gedəcək?
Hiylədən pozulub, korlanıb dünya,
Nə qəlbdə qan qoymuş, nə üzdə həya.
Fələk o fələkdir: dağ çəkib hədər,
Bizi gah saraldar, gah da göyərdər.
Hər pərdədə yalnız o adam çalar
Ki, ola pərdədən yaxşı xəbərdar[54].
Düz yolu yaxşı bir rəhbər göstərər,
Mən yola çıxıram, bəs hanı rəhbər?





Elə bir pis vaxtda gələcək ölüm
Ki, bezmiş olacaq dünyadan könlüm.
Qəflət qoşun çəkib gələcək birdən,
Yatağa baş qoyub yatacağam mən.
Xəyal dünyasına edib tamaşa
Ömrü yuxu kimi vururam başa.
Belə qol-qanadla olarmı uçmaq?
Hara çatdıracaq belə əl-ayaq?
Belə dörd müxalif yol a ayrıcından
Çıxmaram, ya qoca olum, ya cavan[55].
Qocalıq ədası göstərsəm əgər,
Məndən bu cavanlar üz döndərərlər.
Cavanlıq eləsəm bu bədənlə mən
Gərək başqasından borc alam bədən.
Yaxşısı budur ki, olam hər zaman
Qoca ilə qoca, cavanla cavan.
Açam bu düyünü bəlkə birtəhər,
Məndən dost-aşnalar inciməyələr.

## SÖZÜN TƏRİFİ VƏ PADŞAHLARA NƏSİHƏT

Dəniz dalğalanıb gələrsə feyzə,
Sədəfdən dürr alıb çıxardar üzə[56].
Yenidən dövlətim başımdan aşdı.
Dövlətli ürəyim sözlə dostlaşdı.
Qaranlıq çəkildi, doğdu gözəl gün,
Şux səhər açıldı şux bülbül üçün.
Oyandı yenidən, bəxtim oldu yar,
Gör indi şad könlüm nələr yaradar?
Tale birisinə verərsə açar,
O, qara daşdan da gövhər çıxarar.
Hər günə ruzigar dedik əzəldən.
Birində cələ var, o birində dən.
Varlıq pərgarının ulu rəhbəri
Mənə söz mülkünü verəndən bəri,
Xeyli düşündüm ki, bu ölkəni mən
Bəs kimə tapşırım özüm gedərkən?

Bir şəhər yaratsam, baxtım olsa yar,
Kim olsun bəs ona sonra şəhriyar?[57]
Əqlim söylədi ki: - Belə şəxs gərək
Tanınsın dünyada məruf insantək.
Elə lütfkar əl ola ki, onda,
Misli tapılmaya bütün cahanda.
Gərək qarışqaya azca yem verə,
Filə də fil payı seçib göndərə.
Olmaya sərsəri, xam adamlartək
Əlindən gəlməyə qələm də çərtmək.
Qarışqa yemiylə fili yemləyə,
Cəbrayıl rütbəsi verə milçəyə.
Bütün bəxti dönmüş şahların, əlbət,
Ölçü bilməzlikdən olub bəxti bəd.
Baş ilə ayağı pis fərq etmişlər,
Məst olub, tacı da qoyub getmişlər.
Kiçik çox pay almış, böyük az almış,
Böyüyün qiyməti belə azalmış!
Mənasız səxavət göstərsə hər kəs,
Yırtıq təbil kimi çıxaracaq səs.
Ölçü-biçi bilsən hər bir işdə sən,
Böyük hesabları düz həll edərsən-
Mətahı böləndə sən elə böl ki,
Aparanın ağır olmasın yükü.
Qoyma qoca şaha gənc üstün gələ,
Şiruyə Pərvizi öldürdü belə[58].
Qocaman ağaca mişar çəkmə sən.
Zöhhak bunun üçün düşdü təxtindən[59].
Hökmdar ölçüylə bəxş edə gərək
Odu da, suyu da, - güntək, buludtək.
Əliylə dürr saça o, dənizlərə,
Dağlarda torpağı lələ döndərə.
Harda bayrağını ucaltsa göyə
Kisədən paylaya bol-bol hədiyyə.
İdrak sahibidir, şükür allaha,
Naz da, nəvaziş də yaraşır şaha.
Dağlardan ta saman çöpünə qədər
Hər şeyin hər zaman qədrini bilər.
Hər kəsdə nə qədər varsa ləyaqət,





O qədər göstərər ona səxavət.
Odur ki, çox-çoxdur mədh edənləri,
Dünyada yox misli, yox bərabəri.
Çoxları istədi "İqbalnamə"ni,
Tək ona həsr etdim mən bu naməni[60].
Çünki tanıdığım bütün şahlardan
Tək odur əməyə düz qiymət qoyan.
Boşdur çox şahların ancaq başları,
Nahaq çox kəsdirmiş onlar başları.
Hay-küy çox, heç bir şey yoxdur süfrədə,
Dönüb bədənləri quru cəsədə.
Onlarda bir tacir təbiəti var,
Zəlitək qan sorub ləzzət alarlar.
Dənıztək düşüncəm, dürrtək sözlərim,
Ləl ilə doludur mənim əsərim.
Şah özü sərrafdır, qədrini bilər,
Sözümün rütbəsi qat-qat yüksələr.

## PADŞAHIN TƏRİFİ

Deyirlər: göylərdə bir ağ xoruz var,
O, ərşin altında tutubdur qərar.
Deyirlər: o xoruz banlar hər səhər,
Yerdəki xoruzlar ona səs verər[61].
Bilin ki, göylərin o quşu mənəm,
Hər səhər oyadar quşları nəğməm.
Şəhərin quşları ötər hər səhər,
"Dünyanı dindirən odur" deyərlər.
Nizami, durma, gəl, xəzinəni aç,
Bəsdir bu Gəncədə qalıbsan möhtac.
Bir ov vurubsansa, çıxar meydana[62],
Bir xəzinən varsa, göstər cahana!
Belə xəzinəni bəxt verər ancaq,
Xəzinən dünyanı nurlandıracaq.
Vurubsan qızıla şah sikkəsini[63],
Xütbə de, vüqarla ucalt səsini.
O, elə şahdır ki, dövründə nə var,
Onun şöhrətiylə edər iftixar.
Ucadır, igiddir hər hökmdardan

Məlik Nüsrətəddin, o şanlı sultan,
Zəkada o, Mosul hökmranıdır,
Mərdlikdə şahların Qədərxanıdır.
Şövkətdə, zəkada Mahmud kimidir,
Polad yumşaltmaqda Davud kimidir.
Almış fərmanını Mahmudilərdən,
Həsəbi, nəsəbi Davudilərdən[64].
Meyvəli bahardır, sinəsində gül.
Söz qoşur şəninə qumru və bülbül.
Məclislər içində təzə bahartək
Dürr, dirhəm paylayar o, ətək-ətək.
Tünd şərab qədəhə tökülsə əgər,
Ləl lacivərdə şəbxun eyləyər[65].
Suya qılınc vurub, od saçan zaman
Buludlar günəşi qoruyar ondan.
Tərlanı ov üçün qalxarsa, yəqin
Tərlanı dad çəkər göydə fələyin.
Fəzada uçarsa əgər üqabı[66],
Ya Ayı ovlayar, ya afitabı.
Hanı bu dövranda elə bir insan,
Oğurlaya bilsin bir sifət ondan?
Ayın şüasını ip bilən naşı
Oğrunun, əlbət ki, əzilər başı.
Göl ilə sərabı tanımayanlar
Yolda susuzluqdan taqətsiz qalar.
Ayı göydə fətir eyləyib güman
Çoxları quyuya düşüblər, inan[67].
Mələyə bənzəyər divlər kənardan,
Div zülmətdən törər, mələksə nurdan[68].
Allahtanıyandır bizim hökmdar,
Mehr, vəfa ilə dolu qəlbi var.
Tək məni salmayıb müşkülə bu iş,
Kim ona layiqli mədhiyyə demiş?
Neçün Bışgin demiş ona bu dövran?
O ki mehribandır bütün şahlardan.
Bışgın kəlməsini dürüst yazsalar,
Ona layiq bir ad Keypışın olar[69]
Keypışin desələr, layiqdir, əlbət,
Həm Key nişanlıdır, həm Keyxasıyyət.
O, abad eləmiş dünya yurdunu,





Xeyrini görənlər bilirlər bunu.
Qopdu bir zəlzələ, göyü oynatdı,
Şəhərlər dağılıb yerlərə batdı[70].
Dağ-daş sarsılaraq, qopub uçanda
Fələk toz altında qaldı bir anda.
Ruzgarın etdiyi oyunbazlıqdan
Sanki alt-üst oldu torpaq, asiman.
Surun gur səsindən balıq qorxaraq
Atıldı öküzdən bir xeyli uzaq[71].
Fələk zəncirinin həlqələritək
Yerin də bəndləri ayrıldı tək-tək.
Azdı yollarını gur axan sular.
Dağlar çarpışmaqdan bitab oldular.
Yusiflər gözünə sanki batdı mil,
Sanki aşıb-daşıb Misrı basdı Nil[72].
Heç bir göz salamat qalmadı, inan,
Matəm sürməsinə qərq oldu cahan.
Nə qədər xəzinə batdı o gecə,
O şənbə gecəsi yox oldu Gəncə.
Hamı: kişi, qadın, qoca ya cavan
Qopardı dəhşətli fəryadla fəğan.
Bircə sap gövhəri sağ gördü səhər,
O düzdü yenidən saplara gövhər[73].
Bu gövhər kanının baxtı yar oldu,
O bəla ölkədən tez kənar oldu.
Az zaman içində bu viran ölkə
Keçdi abadlıqda Rumu da bəlkə.
Baxmayın zəlzələ qoparıb tufan,
Ölkəni bir anda elədi viran,-
Görün ki, nə sayaq qadir hökmüdar
Pozulmuş cəlalı etdi bərqərar!
Palçıq barıları tamam sökdürdü,
Yerində qızıldan divar hördürdü.
Xəzinə sərf edib, verdi təmtəraq,
Səyilə ölkədən dərd oldu uzaq.
Bağçalar salındı, evlər dikəldi,
Hər evdən yüz çıraq işığı gəldi.
O ki, bu torpağı eylədi abad,
Dərgahı heç zaman olmasın bərbad.

## TƏZİM XİTABƏSİ

Nə gözəl günəşsən, ta uzaqlardan
Edirsən bizimçin hər şeyi əyan.
Işıq cinsindəndir hərçənd ki, çıraq,
Işıqsız çıraq da görünməz ancaq.
Əsil tacidarlıq, düşün, yaxşı bil,
Yüzlərcə tac yığıb saxlamaq deyil.
Hökmüdar odur ki, hər başa müdam
Mərhəmət göstərib, tac edə ənam.
İnsanı azdıran xəyalları sən
Başlardan qılıncla rədd eləmisən.
Ucalsa bir şahın fikri, bayrağı,
Şad olar ordusu, yurdu, torpağı.
Sənin bayrağına bəzəkdir zəfər,
Gücünlə yox oldu dərdlər, sitəmlər.
Kəyanlar köçüblər indi dünyadan,
Yerləri boş deyil, sənsən hökmüran.
Ölkədə bu xalqa rəhbər oldun sən,
Fitrətin gözəldir sənin əzəldən.
İndi bu dünyada sənsən tacidar,
Əlinlə tac qoyar başına şahlar.
Çatmaz ədalətdə sənə Pişdad,
Keyxosrov, Keykavus, nə də Keyqubad!
Yeddi firuzəli bu qəsrdə sən
Haqqa, ədalətə vüsət vermisən[74].
Bir qədəh mey verir sənə Nizami,
Gərək nuş edəsən Keykavus kimi.
Bu tusi qədəhlə Mahmuda bildir
"Şahnamə"nin qədri-qiyməti nədir![75]
İki xəzinənin varisi, hökmən,
Səxavətdə sənsən, söz deməkdə mən[76].
Borc əgər vaxtında ödənilməsə,
Qaydadır: varisdən çatar varisə[77].
Mən elə söz dedim - deməmiş heç kəs,
Bir iş gör - olmasın ona heç əvəz.
Mənə əqlim çatıb bu işdə dada,
Müvəffəq olasan sən oxumaqda.





yar etsək bu iki gözəl niyyəti,
Birə on artacaq sözün qiyməti!
Bağımda reyhandır mənim bu əsər,
Sənin eyvanını qəndiltək bəzər.
Məclis qur, bu meylə doldur kasanı,
Şöləsi, nəşəsi durultsun qanı.
Sən mey iç, gətirmə heç bir bəhanə,
Ağzım möhürlüdür üz vurma mənə.
Damağın çağ olsun, bəxtın də cavan,
Cahanda olasan Cahan pəhləvan.
Bu dünya, bu dövran sənə yar olsun,
Ruzgarın həmişə xoş ruzgar olsun!
Göylər ülviyyətdən düşməz heç zaman,
Sən də göylər kimi uca olasan.
Qılıncın kəskindir gün şöləsindən,
Göyü də yer kimi sən ram edibsən.
Parlaq qılıncından məhv olsun yağı,
Səndən qüdrət alsın Kəyan bayrağı.
Böyük bir iş üçün, bil, ey hökmüdar,
Göndərdim, doğrudur, mən bir yadigar.
Sən özün əbədi bir yadigar qal,
Dediyim bu sözü daim yada sal!

## KİTABIN BAŞLANMASI

Yunanlı filosof, zəkada nadir,
Çıxartdı mədəndən belə cavahir:
Bir dəfə dünyanı səyahət edən
İskəndər keçərək neçə ölkədən,
Qalib öz yerinə, yurduna çatdı,
Doğma vətənini nurla parlatdı.
Ağıl hər bir sirrə yol tapsın deyə,
O verdi fikrini elmə, biliyə,
Xəyalı göyləri gəzdi, dolaşdı,
Bağlı qapıların sirrini açdı.
Bəyəndi pəhləvi, yunan və dəri
Dilində yazılmış bir çox əsəri.
Bir də fars dilində şahanə dəftər

Olmuşdu dilində su kimi əzbər,
Istər Rum elində, istər Yunanda,
Dünya dillərində nə var cahanda.
Buyurdu tərcümə edilsin bütün
Bilik xəznəsini doldurmaq üçün.
Dürr yığdı elm üçün bir-bir hər yandan.
Bunlardan yaratdı böyük bir ümman.
Onun yaratdığı birinci əsər
Dünyaşünaslıqdan verirdi xəbər,
O biri - ruhani sirlərə açar,
Onunla yunanlar əbədi yaşar.
Bir də "İskəndərin qeydləri"dir,
Mum kimi yumşalar bununla dəmir.
Kin, qəzəb, mərhəmət nədir - bilərlər,
Fələyin sirrindən tutarlar xəbər.
O gövhər kanını yox edib ruzgar,
Bircə "Intiyaxis" qalıb yadigar[78].
Neçə əql övladı nur yaya yaya,
O şahın rəyilə gəldi dünyaya.
O böyük, ağıllı, ayıq hökmüdar
Öz şahlıq taxtında tutarkən qərar,
Əmr etdi, verildi belə bir fərman:
"Alimdir gözümdə ən əziz insan!
Elmlə, hünərlə! - Başqa cür heç kəs
Heç kəsə üstünlük eləyə bilməz!
Rütbələr içində seçilir biri -
Hamıdan ucadır alimin yeri!"
Belə qərar verdi: yanında ancaq
Hər kəs öz elmiylə bir yer tutacaq.
Hamı elmə, fənnə elədi rəğbət.
Çünki elmə təşviq edirdi dövlət.
Elmə qiymət qoydu böyük hökmüran.
Elm ilə ucaldı dünyada Yunan.
Onun tacü təxti indi yoxsa da,
Elm ilə məşhurdur bütün dünyada.
Qəsrinin bürcləri göyə dəyərdi,
Haqqın cəlalına o, baş əyərdi.
Hücrəsi ziynətsiz, bərsiz-bəzəksiz,





Bir dəri üstündə o, çökərdi diz.
Söyüddən qurulmuş sadə bir otaq,
Yerliyi ağappaq, tərtəmiz torpaq.
Könlü bu dünyadan doyduğu zaman
İbadətxanaya olardı rəvan.
Tacını götürüb, bir xeyli müddət
Elərdi ürəkdən haqqa ibadət.
Üzünü sürtərək təmiz torpağa
Başlardı tanrıya o yalvarmağa.
Keçmiş günlər üçün şükr eləyərək,
Gələcək işlərə dilərdi kömək.
Bütün qazandığı qalibiyyəti
Sanardı allahın bir inayəti.
Allaha şahanə dua edərdi,
Özü də duaya layiq bir ərdi.
Könüldən gəlməyən dua, yaxşı bil,
Mənasız bir işdir, ibadət deyil.
Sidq ilə ibadət eləsə insan
Naümid qayıtmaz haqq dərgahından.
İskəndər belə bir düz yolla getdi,
Odur ki, cahanı tamam fəth etdi.
Qafil şahlar kimi keyfə dalaraq,
Yaxşını, yamanı gözündən ıraq
Qoymazdı... O, zülmə verməzdi imkan,
Saxlardı dünyada daim bir mizan.
Qocalar, cavanlar, uşaqlar üçün
Açıqdı qapısı onun bütün gün.
Özünə düzlüyü eləyib şüar,
O, yeddi ölkəyə oldu hökmüdar.
Tədbir soruşardı iş bilənlərdən.
Odur ki, olmuşdu özü işbilən.
Yoxsa rum papaqlı bir türk nə sayaq
Çinə, Hindistana basardı ayaq?[79]
Deyirlər, getsəydi o bir yer üstə,
Yanında hazırdı bu altı dəstə:
Minlərcə ən möhkəm, mərd qılıncvuran
Durardı əmrində onun hər zaman.
Əfsunda Harutu vurub keçənlər,

Neçə əfsun quran, neçə cadugər[80],
Elə nitqlər ki, dilləri atəş,
Heyrandı onlara səmada günəş.
Alim, uzaqgörən hikmətşünaslar,
Saysız, hesabsızdı qiymətşünaslar,
Qoca zahidlər də vardı bir qədər,
Dua elərdilər onlar gecələr.
Peyğəmbərlərə də gətirib pənah,
Almışdı orduya onlardan da şah.
Bir işi düyünə düşsə, hər zaman
Kömək istəyərdi daim bunlardan.
Bu altı dəstədən məclis qurardı,
Onlardan iş üçün tədbir sorardı.
Hər kəs bildiyini açıb deyərək,
Ona öz işində edərdi kömək.
Bu qədər köməkçi edib məsləhət,
Düyünü açardı onlar, nəhayət.
Yaşlı kişilərin məsləhətilə,
Xoştale ulduzun hərəkətilə
Gördüyü tədbirlər düz çıxan zaman,
Çatardı məqsədə qadir hökmüran.
Ona rast gələndə bir qatı düşmən,
Vuruşda işləri bərkə düşərkən,
Qızılı salardı işə ən əvvəl,
Qızıltək eylərdi işi təmiz həll.
Qızıl iş görməsə, iş olsa mahal,
Qılınca atardı əlini dərhal.
Qılınc etməsəydi bu işə çara,
İşi tapşırardı əfsunçulara.
Bir iş görməsəydi onlar da əgər,
Köməyə gələrdi onda natiqlər.
Söz də etməsəydi düşmənə təsir,
Alimlər yığışıb görərdi tədbir.
Onlar da qalsaydı tədbirdə naçar,
Zahidlər allaha yalvarardılar.
Bu da verməsəydi əgər səmərə,
Həvalə edərdi peyğəmbərlərə.
İşə gəlməsəydi heç biri hərgah.





Haqqa gətirərdi axırda pənah.
Bəxti yar olardı o şaha müdam,
İşinə verərdi xeyr ilə əncam.
Keçdiyi yollara edərdi diqqət,
Gördüyü şeylərdən alardı ibrət.
Kefdən, əyləncədən ovçuluğadək
Heç şeyə baxmazdı bir oyuncaqtək.
Şah içki məclisi düzəltdi bir gün,
Şadlığa qərq etdi dünyanı bütün.
Müğənnilər gəldi, çalanlar gəldi,
Ucsuz-bucaqsız bir məclis düzəldi.
Məclisdə bir gözəl oxuyan vardı,
Şah ona daima nəzər salardı:
Libası yeddi rəng zərif ipəkdən,
Ərişi, arğacı güldən, çiçəkdən,
O qəşəng paltara edib tamaşa,
Heyran qalmış idi xanəndəyə şah.
Paltar günəş kimi par-par yanırdı,
Ancaq ki, xam bezdən astarı vardı.
O paltar sahibi bir xeyli müddət
Ömr etdi, hər yanda qazandı şöhrət.
Soldurdu, toz-torpaq vermədi aman.
O zərif paltarı köhnəltdi zaman.
Tikişlər sökülüb, bəndlər boşaldı,
Xanəndə oxuyub çalmaqdan qaldı.
Gördü çox köhnədir əynində paltar.
Astarı üz etdi, üzü də astar.
Bu bədrəng paltarı şah görən zaman
Ona acıqlanıb dedi: "Anadan,
Atıb qızılgülün ləçəklərini,
Bəzədin tikanla ətəklərini,
Niyə palaz oldu geydiyin ipək?
Gövhərşünaslara şəvə nə gərək?"
Xanəndə baş əyib təzim eylədi,
Başına, canına and içib dedi:
"Haman o libasdır bu, ey hökmüdar,
Diqqətlə nəzər sal, özüdür ki, var.
Dəyişməyib ovda, inan ki, heç nə,

Astarı çevrilib ancaq üzünə.
Üzü köhnəlmişdi, gizlətdim mən də,
Çünki utanardım şahım görəndə..."
Bu sözlər o şaha eylədi əsər.
Heyrətlə dayanıb baxdı bir qədər.
Şaha xoş göründü ondakı xislət,
Ona bəxş elədi hədiyyə-xələt.
Söylədi, təsirdən qəhərlənərək:
"Sirrimiz gizlində saxlansın gərək!
Bizim iç-üzümüz açılsa əgər,
Dünyanı üfunət basar, bürüyər!
Madam ki, o rumi ipək bir rəngmiş,
İçdən belə çirkin, üzdən qəşəngmiş,
Gümüş məcməidə gərək biz nahaq
Bir qara ud kimi coşub daşmayaq[81].
Ud, söyüd külüylə yoxsa gözəllər
Dişini ağardıb bizə gülərlər..."[82].

## İSKƏNDƏRİN BAŞQIRXAN QUL İLƏ ƏHVALATI

Ey müğənni, çal bir könül nəğməsi,
Titrətsin göyləri ərğənun səsi.
Elə bir hava ki, ürəyi açsın,
Qaranlıq gecəyə şəfəqlər saçsın!
Gözəl söz nəqqaşı məharət ilə
İskəndər adını nəqş etmiş belə:
"İki qərn sahibi" qoymuş namını,
Çünki Şərqdən, Qərbdən almış kamını[83].
Deyirlər ki, qoşa hörüyü varmış,
Onu kürəyinə daim atarmış[84].
Deyirlər, görübmüş bir belə röya,
Gündən iki qərni alıbmış guya[85].
Başqa rəvayətdə deyirlər yenə:
İskəndər yaşamış iki qərinə[86]
Dünya filosofu Əbu Məşər də
"Üluf" ad qoyduğu məşhur əsərdə





Yazır ki: "İskəndər öldüyü zaman.
Bu böyük itkidən çox qəmgin olan
Yunanlar onu çox sevdiklərindən,
Çəkdilər kağıza şəklini həmən.
Onun surətini nəqş edən rəssam
Şəkli layiqiylə eyləyib tamam,
Çəkibmiş yanında bir cüt də heykəl.
Sağ yanda bir gözəl, solda bir gözəl.
Heykəlin başında bir cüt də qəşəng
Buynuzlar çəkibmiş rəssam rəngbərəng.
Bunları görərək bir heyətşünas,
Bir cüt mələk ilə edibmiş qiyas.
Vücud xəlq edəndə çünki allah da
Mələklər oturdar iki yanında.
Ay üzlü İskəndər gözəlmiş əslən,
Daha gözəlləşmiş bu şəkillərdən.
Paylanmış bu şəkil bütün ellərə,
Onun şöhrətini yayımış hər yerə.
Bu şəkli seyr edən hər el, hər diyar
Rumlu ustadları alqışlamışlar.
Ərəblər bu şəkli seyr eləyərkən
Dəyişik salmışlar onları səhvən.
İskəndər bilmişlər o gündən bəri
Buynuzlu çəkilmiş mələkələri.
Odur ki, şübhəyə düşmüş ərəblər,
"Zülqərneyn" ləqəbi almış İskəndər"[87].
Başqa bir bilici deyir ki, onun
Qulaqları varmış həddindən uzun.
Dürdən taca bənzər qınları varmış.
İki qulağına o qın taxarmış[88].
Onları xəzinə kimi güdərək,
Möhkəm gizlədərmiş bir xəzinətək.
Başını qırxan bir qulundan qeyri
Kimsənin bu sirdən yoxmuş xəbəri.
Ancaq ki, həmin qul öldüyü zaman
İskəndər tapdı bir özgə başqırxan.
Şahın hüzurunda təzim edərək,
Başladı saçını qırxmağa dəllək.

Xəlvətdə saçını qırxıb qurtarcaq,
Şah ona yavaşdan dedi: "Bura bax.
Bilsəm, qulaqların sirrini əgər
Eşidib dünyada səndən bir nəfər,
Bir qulaqburması gələrəm sənə,
Daha sirr açmazsan bir özgəsinə".
Bunu qulağında o sırğa etdi,
Yaxın dostlardan da sirri gizlətdi.
Bu sözü kimsəyə əsla açmadan,
Saxladı küfrtək könlündə pünhan.
Bu sirrin dərdindən saraldı ancaq,
Çünki çox çətindir sirri saxlamaq.
Bir gün bərk darıxdı, çölə üz qoydu,
Gördü ki, çöldə var dərin bir quyu.
Dərdini quyuya eylədi izhar:
"İskəndərin uzun qulaqları var!"
Qəlbinin o yanar atəşi söndü,
Ürəyi dincəldi, evinə döndü.
Yenə də sirrini saxladı möhkəm,
Ağzının möhrünü açmadı bir dəm.
Bu işdən keçmədi o qədər zaman,
Bir qamış göyərdi həmin quyudan.
Bu qamış böyüdü, xeyli boy atdı,
Əlini o gizlin sirrə uzatdı.
Bir gün də bir çoban ordan keçəndə,
Gördü o qamışı quyu içində.
Əyilib qamışı kəsərək çoban,
Doğrayıb bir tütək qayırdı ondan.
Qəm-qüssə bilmədən onu çalırdı,
Tütəyi çaldıqca ləzzət alırdı.
Bir gün o səhraya çıxdı padişah,
Uzaqda bir çoban göründü nagah,
Çobanın çaldığı neyi eşitdi,
Çölləri üstünə qalxmış zənn etdi.
Çünki neyin səsi deyirdi aşkar:
"İskəndərin uzun qulaqları var!.."
O, neyin səsindən od tutub yandı,
Muma döndərərdi hirsi poladı.





Toxtayıb yerində durdu bir qədər.
Sonra səsə sarı getdi İskəndər.
Çağırıb çobanı soruşdu ondan,
Tütəyin sirrini danışdı çoban:
"Gördüm ki, bitib bu qamış quyuda,
Şəkər qamışıtək, şirin bir suda.
Mən kəsib doğradım öz əlim ilə,
Kəsilməsəydi o, gəlməzdi dilə.
Cansızdır, onunla qızır bədənim.
Dilsizdir, ancaq ki, dilimdir mənim..."
Şahı çox heyrətə saldı bu dastan,
Dönüb vətəninə qayıtdı ordan.
Xəlvətdə oturub o, fərman verdi,
Dəlləyin dalınca adam göndərdi.
Söylədi ona ki: "Tez elə bəyan,
De görüm, bu sirri kimə açıbsan?
De görüm, nə cürə eləyib hünər
Bu sirri özgəyə veribsən xəbər?
Səni bağışlaram düzünü desən,
Boynunu vurdurram yalan söyləsən!.."
Şahın sözlərini eşidib dəllək,
Gördü ki, düzünü söyləsin gərək.
Əvvəl yeri öpüb səcdə eylədi,
Sonra padişaha belə söylədi:
"Doğrudur, şah mənə vermişdi fərman,
Saxlayım hamıdan bu sirri pünhan.
Ancaq davam edə bilmədiyimdən
Təkcə bir quyuya açdım sirri mən.
Başqa heç kimsəyə demədim, ey şah,
Yalansa, qənimim olsun qoy allah!.."
Şah gördü ki, dəllək doğru söz dedi.
O düzlük istədi, bu da düz dedi.
Qullardan birinə buyurdu bu an,
Bir qamış gətirtdi həmin quyudan,
Təzə tütəyə də dəyəndə nəfəs,
Şahın qulağına gəldi həmin səs.
Bildi ki, heç sirri saxlamaz nihan,
Hamının sirrini açar bu cahan!

Allahı xeyr ilə eyləyərək yad
Dəlləyi qılıncdan elədi azad.
Üzünü örtməsin qönçə, nahaqdır,
Gec-tez lal yanağı açılacaqdır.
Qara daş içində gizlənən buxar
Axır ki, olacaq bir gün aşikar.

## İSKƏNDƏR İLƏ ÇOBAN DASTANI

Müğənni, dayanma, sübh açılarkən,
Püxtə bir mizrab vur o xam rudə sən.
Könlümə ruh versin gözəl nəğməsi,
Bu qafil sevdanı oyatsın səsi.
Həkimlər içində misilsiz olan
Bir qoca bu sayaq eyləyir bəyan:
O, rumi kəmərli, o Çin taclı şah
Taxtda oturmuşdu yenə bir sabah,
Qaşını çatmışdı onun qüssə, qəm.
Gözündə deyildi əsla cami-Cəm.
Yarının çöhrəsi günəşdi, aydı,
O qızı qızdırma yandırmadaydı.
Qəlbində qalmışdı arzusu, kamı,
Əfsus ki, müşküldü onun əncamı.
Şahın da köksündə sevdalı ürək
Qəmli, qüssəliydi həmin xəstətək.
Əmr etdi, nə qədər Rumda həkim var,
Hansı bir ölkədə, harda olsalar
Gəlsinlər, etsinlər çarə birtəhər,
Şahın ürəyindən silinsin kədər.
İşdən başı çıxan həkimlər gəldi,
Sarayda məşvərət - məclis düzəldi.
Min cür çarə etdi hərə bir yandan,
Ancaq o gözələ olmadı dərman.
Yanırdı almatək qızın yanağı,
Şahın açılmırdı qaşı, qabağı.
Ona vermiş idi şah öz könlümü,
Qəmlə keçirirdi bütün gününü.





Qüssə gətirmişdi o şahı cana,
Taxtından enərək çıxdı eyvana,
Eyvanda dayanıb qəmgin, mükəddər.
Ordan çölə, dağa salırdı nəzər.
Padişah çölləri seyr edən zaman
Göründü gözünə onun bir çoban.
Müdrik bir qocaydı, nurlu, zəkalı,
Kafurtək ağ idi saçı, saqqalı.
Sürü yayıldıqca çəmənə, çölə
Ürəyi fərəhdən gəlirdi dilə.
Şah bir az sevindi onu görərkən,
Çünki nur yağırdı gülər üzündən.
Tez adam göndərdi onun yanına,
Çağırtdı çobanı öz eyvanına.
Qulamlar baş əyib hökmünə yenə
Piri gətirdilər şahın qəsrinə.
Çoban daxil olub uca saraya,
Bir qəsr gördü ki, ucalmış Aya.
Bilirdi, belə sədd İskəndərin var,
Xoşbəxtdir bu qəsrə daxil olanlar.
Ədəblə yer öpdü, çünki bir müddət
Başqa şahlara da etmişdi xidmət.
Şah onu yanına dəvət elədi,
Onunla söhbətə başlayıb dedi:
"Ay kişi, gəl, mənə dağdan, dərədən
Gözəl bir sərgüzəşt danış görüm sən.
Ürəyim kədərdən çəkilib dara,
Bəlkə söhbətinlə edəsən çara..."
Çoban söylədi ki: "Ey tacidar, sən
Özünsən aləmi abad eyləyən.
Taxtın işıq salsın ölkəyə hər an,
Pis göz uzaq olsun taxtü tacından.
Əvvəl söylə görüm, sən, ey hökmüdar,
Nə üçün tutmuşdur könlünü qubar?
Söylə ki, müsahib o yolla getsin,
Sözləri dərdinə bir çarə etsin."
Çobanın sözünü şah çox bəyəndi,

Gördü ki, söz bilən və iş biləndi.
Ağıllı danışır dinpərvər kimi,
Mənasız söz demir çöllülər kimi.
Şah onu dərdindən etdi xəbərdar...
Bu sirri biləndə çoban da təkrar
Torpağı öpərək yenə də şaha
Sidqlə, ürəkdən elədi dua.
Dedi: "Gəncliyimin xoş zamanında
Mən xidmət etmişəm şahlar yanında.
O xidmət etdiyim şahlar içində
Biri var, yadımdan çıxmaz bu gün də:
O bir şahzadəydi, Mərvdə yaşardı.
Uca qəd-qaməti, gül üzü vardı.
Boyuna sərvlər min həsrət çəkər,
Üzünün rəngindən sərxoşdu güllər.
Vardı bir gəlini - gözəl, mehriban,
Saray nur alardı ay kimi ondan.
Göz dəydi o qıza, üz verdi əzab,
Qızdırma əlindən oldu o, bitab.
Canını yandıran bu bəd azara,
Nə qədər etdilər, olmadı çara.
Uca sərv incəlib söyüdtək əsdi,
Hamı o gözəldən ümidi kəsdi.
Şahzadə ölümlə pəncə-pəncəyə
Görəndə gözəli: - Sağalmaz, - deyə.
Hələ o dilbəri almamış əcəl,
Biçarə gözəldən tamam üzdü əl.
Naümid olaraq, o birdən-birə
Dünyadan əl çəkib düşdü çöllərə.
Vardı həmin yerdə ucsuz-bucaqsız,
Qupquru bir səhra - meşəsiz, dağsız,
Hər tərəf xaraba mağaralardı,
İçində pələnglər, şirlər yatardı.
Nə bir ot, nə yarpaq - hər tərəf ölü,
Xalq ona deyirdi: Ölümlər çölü".
Hər kəs əl çəksəydi dünyada candan,
O möhnət çölündə olardı nihan.





Heç görən, eşidən yoxdu: bir nəfər
Ordan sağ qayıdıb gətirə xəbər.
Şahzadə dözülməz qəmdən, qüssədən
O çölü etmişdi özünə məskən.
Bir dostu vardı ki, o şahzadənin
Yolunda canından keçərdi yəqin.
Bildi ki, bu çöldə cavan şahzadə
Ömrünü verəcək boş yerə badə.
Quldurtək niqablı, əlində yaraq,
Getdi arxasınca, ona çataraq
Tanınmaz bir səslə qopardı nərə,
Tutub şahzadəni o sərdi yerə.
Şahzadə sərvtək yerə yıxılcaq,
Tez onun gözünü bağladı qoçaq.
Tərk etdi durmadan o qorxunc yeri,
Onu gözübağlı qaytardı geri.
Cavanın vardı bir gizlin otağı,
Aparıb oturtdu orda qonağı.
Yanında qoydu bir keşikçi - məhrəm,
Sirri şahzadədən saxladı möhkəm.
Çörəyə, suya da edib qənaət,
Başqa şey verməyə vermədi rüxsət.
O dustaq şahzadə, sinəsi dağlı,
Qəlbi, könlü tutqun, gözləri bağlı,
Özü öz işinə qalmışdı heyran:
Bu bəla hardandır, nədir bu zindan?
Dostusa, durmayıb cəhd edir yenə,
Çarə axtarırdı onun dərdinə.
Çalışıb gəlini sağaltdı əvvəl
Yüz cürə şərbətlə dəf oldu əcəl.
Dərdbilən bir təbib elədi dəvət,
Saxladı yanında onu bir müddət
Qurtardı gözəli verdiyi dərman,
Tərtəmiz sağaldı o, qızdırmadan.
Əvvəlki gözəllik gəldi yerinə,
Başladı şənliyə, çəmən seyrinə.
Dərmandan tapınca o gözəl şəfa

Durdu axtarmağa könlünə dəva.
Cavansa, gözəli görəndə belə,
Duydu ki, ürəyi vurur eşq ilə.
Evində şahanə bir məclis açdı,
Udun xoş ətrini hər yana saçdı,
Düzdü hər tərəfə gülü, sünbülü,
Oturtdu bir yanda o qızıl gülü.
Sonra da gətirib gəldi içəri
Əjdaha ağzından çıxan qəməri.
Üzündən pərdəni açıb, nəhayət,
Elədi min cürə nəvaziş, hörmət.
Şahzadə nə gördü? Məclis düzəlib,
Sevgili yarı da məclisə gəlib...
Qorxunc cəhənnəmdən, dardan qurtuldu.
Həm cənnət, həm huri sahibi oldu.
Nə deyim, nə qədər sevindi o şah!
Daha nə şərh edim, artıqdır izah..."
İskəndər dinlədi dedikcə çoban,
Elə bil ayıldı pis bir yuxudan.
Dincəldi, yox oldu çəkdiyi əzab,
O yetkin qocadan aldı xam şərab.
Şah burda çobanla söhbət edərkən:
"Sağaldı!...Sağaldı!.." - Eşitdi birdən.
Padşah da sevindi, oldu bəxtiyar.
Bircə asqırmaqla sağalmışdı yar...
Çobanı görərək belə xeyirxah,
Onunla şahanə rəftar etdi şah.
Hər kəsin zatı pak olarsa əgər,
Ondan çox yazılar belə əsərlər.
Ay daim nur saçar, Müştəri parlar,
Hünərli şəxsin də hünəri parlar.
Itirmiş olmasa əqlini sərraf,
Tez seçib ayırar, deməz qəlpə saf.
Səninlə biri xoş danışsa əgər,
Könüldən dinlə ki, bir xeyri dəyər.
Nalayiq söz ilə etsələr xitab,
Sən gərək sükutla verəsən cavab.





# ARŞİMİDES İLƏ ÇİNLİ KƏNİZİN HEKAYƏSİ

Müğənni, yubanma, götür rudu sən,
Dumanlar çulğayıb beynimi qəmdən.
Elə nəğmə de ki, sənin xoş səsin
Beynimi başımda sakin eyləsin!
Yenə də o yurdun qocalarından
Rumlu bir filosof elədi bəyan:
"Vardı Arşimides adlı bir həkim,
Padşaha ən yaxın olan bu nədim
Kübar nəsildəndi Yunanıstanda,
Mərdlikdə heç misli yoxdu cahanda.
Yaxşılıq edəndi, varı da çoxdu,
Ondan yaxşı adam Yunanda yoxdu.
Əqli, düşüncəsi, idrakı vardı,
Təlimə diqqətlə qulaq asardı.
Ərəstu da ona atalıq etdi,
Təlim vermək üçün bir ev düzəltdi.
İskəndər divanı tapşırdı ona,
Əmindi məzluma yar olduğuna.
Ruslarla vuruşdan qayıdan xaqan
Bir kəniz vermişdi şaha ərməğan.
Alimin qəlbini oxşasın deyə,
Şah ona bu qızı etdi hədiyyə.
Elə bil ovçuya çatdı bir ceyran,
Doymadı o şirin, əmlik quzudan.
Sevdi çinli türkü, könlü şad oldu,
Qəmlər hindusundan o, azad oldu[89].
Onunla söhbətə-işrətə daldı,
Belə ki, bir müddət dərsdən də qaldı.
Dərs verən ustadı aldı əndişə,
Onun bu halından düşdü təşvişə.
Onu dərsdən qoyan nədir görəsən?
O saf düşüncəsi pozuldu nədən?
Yüz nəfər şagirdə dərs öyrədirdi,
Yaxşını, yamanı təlim edirdi.
Ancaq Arşimides olmasa dərsdə,

Qalan doxsan doqquz şagird gəlsə də,
Dərs deyə bilməzdi həvəslə ustad,
Çünki vardı onda böyük istedad.
Ancaq o təkcə də gəlsə, müəllim
Həvəslə edərdi dərsini təlim.
Əlbəttə, ağıllı bir qulaq asan
Yaxşıdır həmişə yüz şüursuzdan.
Ustad bir gün sordu Arşimidesdən:
"Nə olub, bizləri unutmusan sən"
Nə işdir, de, səni dərsindən qoyan?
Elmsiz yaşaya bilərmi insan?"
Arşimides dedi: "Bir təşnə əgər
Bir bulaq taparsa, söylə, neyləyər?
Şah mənə göstərib xeyli nəvaziş,
Gözəl bir çinli qız hədiyyə etmiş.
Özün gənc olasan, yanında gözəl,
Mümkünmü çəkəsən məhəbbətdən əl?
Bununçün mən dərsdən soyudum, əfv et,
Mümkünmü bir qəlbdə iki məhəbbət?"
Müəllim gördü ki, Arşimidesi
Yaman çulğamışdır şəhvət həvəsi,
Dedi ki: "Çox yaxşı, mümkünsə əgər,
O gülü bir mənim yanıma göndər...
Bir görüm neyləyib sənə o gözəl
Ki, dərsə, biliyə qoymursan məhəl?"
Baş əyib ustadın bu fərmanına,
O bütü göndərdi pirin yanına.
Ərəstu tapmışdı bir yeni dərman,
Xıltı ayırırdı onunla qandan.
O xılt ki, bədənə faydası vardı,
Qanı saflaşdırar və artırardı.
Bu dərman gözəllik məğzini aldı,
Dik sərvi əyərək taqətdən saldı[90].
Ustad o gözəldən aldığı xıltı
Bir təştin içinə yığıb saxladı.
Təşt onun tökdüyü xılt ilə doldu,
Gözəl çirkinləşdi, saraldı, soldu.
Söndü üzündə nur, dəyişdı halı,
Soldu, xəzəl oldu o gül camalı.
Çağırıb şagirdi bir gün müəllim,
Ona öz yarını eylədi təqdim,
Dedi: "Al, bu sənin çox sevdiyin yar,
Nazlayıb sevinclə evinə apar!"
Gənc baxıb sənəmə, sordu ustaddan:
"Kimdir bu eybəcər qadın, ay aman!
Bəs mənim o gözəl gövhərim hanı?
Ürəkdən sevdiyim dilbərim hanı?"
Onun cavabında alim əmr etdi,
O ağzı örtülü təşti gətirtdi.
Təştin qapağını açdığı zaman,
Dünyanı eylədi bu işə heyran.
Dedi: "Bəyəndiyin bu idi ancaq,
Ləzzət aldığına indi buyur, bax.
O gözəl bədəndə yalnız bu çirkin
Xılt idi, əzizim, sənin sevdiyin.
Mən həmin bu xıltı çıxartdığımdan,
Sən onu eybəcər adlandırırsan.
Qandan xılt çıxarsa, bax, belə olar.
Xıltlı qan sevməyin nə mənası var?
Gəl, tökmə üzünün suyunu nahaq,
İnsan bu su ilə canlanar ancaq.
Üzdən bir damcı su getməzsə, inan,
Üzünün suyuyla şad yaşar insan.
Əl çək hər kənizə könül verməkdən,
Bunlarla ömrünü bada vermə sən.
Sənə bircə dilbər edər kifayət,
Tək qalar çox arvad alan, nəhayət.
Ruzgar ona görə dəyişir hər an:
Törəyib dörd ana yeddi atadan[91].
Oğlunu bir rəngdə görmək istəsən,
Ürəktək bir ata-analı ol sən".
Arşimides rumlu alimin mumdan
Balı çəkdiyini gördüyü zaman[92]
Ondan üzr istədi, gəldi həvəsə,
Əvvəlki şövq ilə başladı dərsə.
Ancaq kənizdəydi ürəyi yenə,

Çünki məftun idi gözəlliyinə.
Uca sərv bir daha yarpaq açaraq
Dikəldi, yenə də atdı qol-budaq[93].
Bənövşə yenidən ətirlər saçdı,
Nərgiz xumar-xumar gözünü açdı.
Çinli türk gözəli açıldı gültək,
Meyxana yolunu süpürdü külək.
Yenə Arşimides gələrək cuşa,
Bənzədi gül görmüş uçan bir quşa.
Tərk etdi yolunu elm ilə dərsin,
Açdı qapısını eyşin, həvəsin.
O pəri qızıyla yaşadı pünhan,
Xoşbəxtdir pərilə xəlvətdə olan.
Görərək eşqində belə bir səbat,
Onu danlamaqdan əl çəkdi ustad.
Keçdi bir-iki il o gündən bəri,
Soldu Çin qızının ahu gözləri.
Torpağa səpildi solğun qızıl gül,
Yox oldu bağçadan o şeyda bülbül.
Necə ki, pərilər içər badəni,
Torpaq da uddu o pərizadəni.
Mənimlə xoş rəftar edərkən fələk
Vermişdi ondan da gözəl bir mələk.
O da sevimliydi, əziz canandı,
Ağıllı qadındı, iş bacarandı.
Rüxü qoymuş idi Ayı piyada,
"Atı" mat qoymuşdu "şahı" dünyada[94],
Qanımla bəslənmiş bir güldü, göyçək.
O da təkcə məni sevirdi cantək.
Gözümə nur idi mənim o mələk,
Yaman göz ayırdı rəhm etməyərək.
Fələk ayrı saldı o şux gözəldən,
yox imiş dünyada sanki əzəldən.
Nə qədər razıydım mən ondan, eyvah!..
Ondan razı olsun, görüm ki, allah!
Bir qüdrət bəxş edib taleyim sözdən
Köhnə dastanları təzələyəm mən,
Qənd-şəkər paylanar bayram gələndə,





Dedim ki, bir gəlin bəzəyim mən də.
"Şirin"in halvasın qurtaranda mən
Bir halvaçalanım getdi evimdən[95].
"Leyli" xəznəsinə çəkərkən hasar,
Orda da bir Gövhər eylədim nisar.
Bu toyu çatdırıb mən nəhayətə,
Təzə bir gəlin də verdim cənnətə[96].
Neçə gözəl dərdi sinəmdə ikən,
Rum-rus dastanını necə yazım mən?[97]
O qəmli çağları niyə yad edim?
Bu xoş dastanımla könlü şad edim.

## QİBTLİ MARİYƏNİN HEKAYƏSİ VƏ ONUN KİMYAGƏRLİYİ

Müğənni, gəl, qədim dövrü yada sal,
Müğlartək müğani xoş bir hava çal!
Yazığam, əzizlə, dərdimi dinlə,
Qızışdır canımı nəğmələrinlə!
Qoca bir filosof üzündən sözün
Pərdəni açaraq, nəql etdi bir gün:
"Mariyə adlı bir qibtlı vardı,
Bir əmir qızıydı, Şamda yaşardı.
Bir çox qalaları varmış ki, düşmən
Alıbmış onları bir-bir əlindən.
Yağı dadanmışdı onun yurduna,
Şikəstlik vermişdi bu dünya ona.
Düşmənin zülmündən təngə gələrək
Gedib İskəndərdən istədi kömək.
Əgər eləsəydi şah ona imdad,
Öz abad yurduna qayıdardı şad.
Şahın vəzirinə pənah apardı,
Kömək almaq üçün ona yalvardı.
Gördü ki, ağıllı, kamallı vəzir
Əyləşib bir dəstə gəncə dərs verir.
Əl çəkdi əvvəlki iddiasından,
Ona elm oxumaq göründü asan.

Gördü ki, dava bir cəncəlli işdi,
Həvəslə, səy ilə elmə girişdi.
Alimə ürəkdən eyləyib xidmət,
Onun hüzurunda göstərdi hörmət.
Kənizlər içində alimə məhrəm
Yoxdu ondan başqa yaxın bir həmdəm.
Ustadın pak, təmiz xisləti vardı,
Qız üzün açanda, o, göz yumardı.
Zərif əllərilə su tökəndə qız
O, tökülən suya baxardı yalnız.
Qadın ustadını öz ağ kafurtək
Gözəl bədəninə meylsiz görcək,
O da kişilərə olan həvəsdən
Çəkinib, özünü saxladı qəsdən.
Təkcə təlim oldu fikri, məqsədi,
Məqsədə biliklə çatmaq istədi.
Alim Ərəstu da o gözəl üçün
Bilik xəzinəsi açdı büsbütün.
O saf-təmiz dürrə çox dürlər saçdı,
Ona deyilməmiş çox sirlər açdı.
Elmin sirlərini açdı qadına,
Bir-bir təlim edib öyrətdi ona.
Hər elmin önündə qız səcdə qıldı,
Sinə lövhəsinə nələr yazıldı?!
İstədi vətənə qayıdıb ordan
Öz baba yurdunda olsun hökmüran.
Yox idi qüdrəti, varı, dövləti,
Dirildə yenidən o səltənəti.
Ərəstu bu işdən olub xəbərdar,
Düşündü: xəznəsiz olmaz şəhriyar,
Qızıl iksirini ona öyrətdi,
Qadını elmiylə iksirçi etdi.
Mariyə ucaldı o kimiyadan,
İksir alimitək qazandı ad-san.
Ərəstu öz bilik xəzinəsindən
Ona sirr öyrədib etdi işbilən.
Şahın izni ilə ordu, xəzinə
Verib, yola saldı öz ölkəsinə.





Mariyə yetişcək doğma yurduna
Davasız, qovğasız şah oldu ona.
O qədər varlandı qazancdan, bacdan
Ki, azad elədi yurdu xəracdan.
Sehirli kimyada olub işbilən,
Qızıl qayırırdı o xam gümüşdən.
Nəhayət qızılla doldu xəzinə,
Açdı xəzinəni elin üzünə.
Ölçüsüz bol qızıl qazansa hər kəs
Ona daş, ya qızıl, təfavüt etməz.
Qoşunda nə qədər süvari vardı,
Atının nalları qızıl nallardı.
Çoxu bu sarayda yeyib gəzərdi,
Hətta eşşəyin də palanı zərdi.
Qızıl bəzəklərin yox idi həddi,
İtin də zənciri qızıldan idi.
Elm-fənn aşiqi bir dəstə insan
Fəqirdi, yoxsuldu, dardaydı yaman.
Onlar xəzinədən tutdular xəbər,
Şahın hüzuruna gəlib, birtəhər,
O dövlət kanına etdilər minnət,
Dedilər: "Yoxsuluq, çəkirik zillət.
Başqa adamlartək yoxdur peşəmiz,
Yalnız düşünməklə ömr edirik biz.
Çünki güdməmişik dünyada qazanc,
Bir günlük çörəyə qalmışıq möhtac.
Rəhmdil məlikə edib mərhəmət,
Açar xəzinəni bizə də, əlbət.
Yəqin ki, mərhəmət edərsə əgər,
İksirdən bizə də bir şey öyrədər.
Gövhər xəznəsiylə zəngindir dünya,
Nə qədər paylansa çatar hamıya.
Nə olar, bizlər də bir parça çörək
Qazanıb, heç kəsdən minnət çəkməyək?!...
İşbilən, saf qəlbli, kamallı gözəl
Onların sözünə eylədi əməl.
Ölkədə bir guşə şux laləzardı,
"Səngi-əzəm" adlı bir qaya vardı.

Mariyə oraya çıxdı, qəmərtək
Başında buluddan qara bir örpək,
Müşkin zülflərinə nərgizə bənzər
Parlaq gövhərlərdən düzüb bir qədər,
Qara saçlarını kəmənd etmişdi,
Hörüb xaç şəklində o bənd etmişdi.
Dedi alimlərə: "Gəlin bir yaxın,
Qaşımın tağında bu bəndə baxın.
O gizlin iksiri, diqqət etsəniz,
Səhərtək alnımda görərsiniz siz".
Bunu eşidəndə, düşünüb hərə
Bir cür məna verdi həmin sözlərə.
Biri söylədi ki, Zöhrətək parlaq
Alnına işarə etdi o, ancaq.
Saçlarda aradı sirri bir nəfər,
Saçlar içindəydi çünki o gövhər.
Hərə bir yol tapdı həmin sənətə,
Düşdü hər birisi bir cür niyyətə,
Hərə o qissədən aldı bir hissə,
Alimin sirrini tapmadı kimsə.
Bir gün də yığışıb gəldilər onlar,
Dedilər: şərh etsin bu sirri təkrar.
Qoyub aşağıda o gələnləri,
Çıxdı eyvanına vüqarla pəri.
Həmin xəzinədən söhbət edərək,
Sehirli sözlərə vurdu min bəzək:
"O laləzar dağlar, sirli nəbatat,
O sehirli sözlər, o rəmz, o büsat,
O qızıl mədəni - o "Səngi-əzəm" -
Nağıldır... Kimyasa başqa bir aləm!.."
Hökmdar sirli bir xəznə göstərdi,
Dəmir qıfıl vurdu, zər açar verdi.
Ariflər bu sözdən tapdı xəzinə,
Nadanlar dərd, əzab çəkdilər yenə.
Bitkidə kimyanın varsa əsəri,
Qələmdir əslində onun cövhəri!
Bu qədər var ikən elmdə imkan,
Əfsus, pay almamış hamı kimyadan.





Kim əsil kimyaya verərsə ürək,
O, saxta kimyaya uymasın gərək!"
Deyirlər: Bağdada etmişdi səfər
Zirək xorasanlı, kasıb bir nəfər.
O, xeyli dolanıb çəkdi əziyyət,
Özünə bir peşə tapdı nəhayət.
Hamıya məlumdur, əhli-Xorasan
Bağdadda fənd ilə yaşayar asan[98].
Min misri qızılı vardı onun, saf,
Rumda da tapmazdı bunları sərraf.
Qızılı yeyəylə ovub sürtərək,
Sarı palçıq qatıb, etdi xəmirtək.
Bundan neçə möhrə qayırdı qoçaq,
İndi gəl qurduğu oyuna bir bax!
Gəlib bir əttarın yanında sayıb,
Bir-bir möhürləyib, əmanət qoyub
Söylədi: "Bunları saxla sən bir az.
(Əcəb möhrələrdir, əcəb möhrəbaz!)
Satıram bunları bir dinara mən,
Çox pul qazanarsan sən bu alverdən.
Vaxt olar, qayıdıb bu möhrələri
Birə on qiymətə alaram geri."
Əttar soruşdu ki: "Bunlar nədir bəs?"
Dedi: "Təbərrikdir, bilməsin heç kəs!"
Əttarın yanından dönüb geriyə,
Başladı əfsunla kimyagərliyə.
Darülxilafətə[99] yaydı bir xəbər
Ki, gəlib bir nəfər usta kimyagər,
Deyir ki: "Kimyada baş ustayam mən,
Yoxdur mənim kimi bu sirri bilən.
İstəsəm iksirlə edərəm, yəqin,
Biri - on, onu - yüz, yüzü də ki - min.
Yüz dinar pul verin siz əvvəlcədən,
Min dinar eləyim yüz dinarı mən.
Qoyun üstümdə də mənim bir nəfər
İşbilən, yetirsin işimə nəzər.
Əgər hünərimi təsdiq eləsə,
Daha söz deməsin mənə bir kimsə.

Yox, əgər görsəniz yalançıyam mən,
Baş məndən, təşt ilə qılınc da sizdən"[100].
Xəlifə eşidib, bərk tamahlandı,
Guya qızıl verib, qızıl qazandı.
Qurd özün bir tülkü cildinə saldı,
Xam şərab içirib, saf qızıl aldı.
Vur-tut on qızılı qalanda onun,
Düşünüb o, qurdu başqa bir oyun:
Zərgər qaydasıyla bir kürə qurdu,
Bir qaba cürbəcür dərman doldurdu.
Şəhərdə hər yana adam salaraq,
Təbərrik axtardı, tapmadı ancaq.
Müştərilər gəzib dükan-bazarı,
Axır ki, tapdılar həmin əttarı.
O qızıllı gilə verib zər dinar,
Gətirib ustaya çatdırdı onlar.
Mahır xorasanlı göstərib tədbir,
Həmin möhrələri doğradı bir-bir,
Sonra da alovlu kürəyə saldı,
Gil yanıb töküldü, saf qızıl qaldı.
Ərimiş qızılı qalıba tökdü,
Dibinə yaquttək saf qızıl çökdü.
Xəlifə tez xəbər tutdu bu işdən:
Təzə qızıl verir o köhnə mədən.
Gördü ki, qızılı o mahir ustad
Sehrlə, əfsunla artırır on qat.
Gövhər xəzinəsi qazansın deyə,
Hədsiz hörmət etdi həmin kişiyə.
Aldanıb hərifin bu oyununa,
On min misri qızıl göndərdi ona.
Tapşırdı: "Bunları tez işə sal sən,
Ey usta, çıxaram xəcalətindən.
Daha gözətçilər səndən əl çəkər,
Məlumdur səndəki sədaqət, hünər.
Düz çıxdın işinlə sən bu sınaqdan.
Təmiz olduğunu göstərdi mizan".
Alıb qızılları naz eyləyərək,
Qurdu hindu kimi yenə bir kələk.
Tədbirlə iş görüb xəlvət, gizlicə





İçdi qafillərlə bir neçə gecə,
Hamısı məst olub düşdü torpağa.-
Zirək xorasanlı qalxdı ayağa,
Bir neçə qul tapdı o,dayanmadan,
Atları yükləyib çıxdı aradan.
Gizlin bir yol ilə ordan birtəhər
Əkildi, görmədi onu bir nəfər.
Xəlifə bu işdən xəbər tutanda,
Onun qaçdığını biləək, bir anda
Təbərrik söhbəti düşdü yadına,
O biri söhbətlər puç gəldi ona.
Danışdı sirləri təbərrik satan,
Güldü bu hiyləni eşidən zaman.
Bir təbərrik yazılı versə kim sənə
Aç, oxu, mənə tap, uyma cildinə.
Bir əfsun eşitsən bir əfsungərdən
Ayıq ol, əfsuna düşməyəsən sən.
Dünyada görmədim elə kimyagər
Kimya oyunundan çəkməsin zərər.
İskəndər bir xəbər aldı Yunandan:
Olub xəzinəyə Mariyə ilan[101].
Şaha dedilər ki: "O dişi aslan
Bir şikar fikrinə düşəcək, inan!
İşbilən qadındır, dünyada heç kəs
Onun dövlətinin sayını bilməz.
Xəzinə sirrindən olub xəbərdar
Onun dünya qədər xəzinəsi var.
Əfsunla daşları saf qızıl eylər,
Sədəfdən çıxarar zərif incilər.
O qədər qızıl var, dövlət var onda,
Qarunun dövləti heçdir yanında.
Şah onun başını kəsməsə əgər,
Çox çəkməz, dünyanı o əldə edər.
Düşmənə qoşundur verən əziyyət,
Qoşun da qızılla düzələr, əlbət.*
Şah yandı qəzəbdən odlu günəştək,
Düşündü: Mən onu məhv edəm gərək.
Onu yox etməkçin bu pak torpaqdan,
Tədbir görülməli vermədən aman."

Artdı, alovlandı şahın qəzəbi,
Müdrik vəziri də bildi mətləbi.
Şahın hüzurunda baş əyib vəzir,
Ona ehtiramla göstərdi tədbir.
Dedi ki: "Gövhərtək safdır o qadın,
Kiçik bir kənizdir yanında şahın.
Şamda hökmüdara eyləyir xidmət,
Kənizin olmağa çəkir o minnət.
Bir müddət olmuşdur mənə xidmətkar,
Yaxşı fərasəti, yaxşı elmi var.
Onu elmə, fənnə məftun etmişəm,
Mən ona gizli bir sirr öyrətmişəm:
Qazanar nə qədər dövlət istəsə,
Dünyada o möhtac olmaz heç kəsə.
Bacarıq sahibi görərək onu
Öyrətdim xəzinə tapmaq yolunu.
O sənət yoluyla heç kəs dünyada
Əldə edə bilməz bircə arpa da.
Xoşbəxt Mariyədən başqa bir insan
Belə xəzinəyə olmadı ilan.
Kifayət qədər pul yığdı əlinə,
Gedib hakim oldu doğma elinə."
Vəzirin rəyini eşidən zaman
Əl çəkdi İskəndər həmin qovğadan.
Padşahın könlündən tozu siləntək,
Vəzir Mariyəyə xəbər verərək,
Dedi ki, padşahdan üzr istəməkçin
Tez onun yanına qasid göndərsin.
İşbilən Mariyə alıb xəbəri,
Açdı qızıl dolu xəzinələri.
Qasidə hazırlıq əmrini verdi,
Şaha misilsiz bir xəznə göndərdi.
Xəzinə görənlər hələ bu qədər
Bir yerdə xəzinə görməmişdilər.
Bəxşişlə rəf oldu - getdi nəhayət
Mariyədən kədər, şahdan ədavət.
Bəxşişlə ədavət, kin sönüb gedər,
Kini, küdurəti bəxşiş məhv edər!





# FAĞIR ÇÖRƏKÇİNİN HEKAYƏSİ VƏ ONUN VARLANMASI

Müğənni, öt yenə, o lətif səsin
Bülbülün səsini batil eyləsin.
Nəvalar nəvası olsun bu nəva,
Dərdlərin dəvası olsun bu nəva.
Belə deyirlər ki, Ruma bir zaman
Bir yoxsul gəlibmiş başqa diyardan.
Az vaxtda qazanmış o çoxlu dövlət,
Yığmış karvan-karvan xəzinə, sərvət.
Ancaq bilən yoxmuş dərya xəzinə
Dağdan, ya dənizdən çıxıb bəxtinə?
Kimisi deyirdi: mədən tapıbdır,
Kimisi deyirdi: yox, ev çapıbdır.
Əlqərəz, yazıqdan əl çəkmədilər,
Axır ki, padşaha verdilər xəbər.
Dedilər: "Yad eldən bura bir adam
Gəlmişdi, əvvəllər yoxsuldu tamam.
Keçməmiş aradan bircə il müddət,
O qədər qazanmış qızıl, mal, sərvət
Ki, padşah on katib ayırsa əgər,
Onun dövlətini saya bilməzlər.
O bir çörəkçiydi əvvəl, yoxsul, ac,
Quru çörəyə də, suya da möhtac.
İndi alıb-satır ləl ilə gövhər,
Ağıl bu barədə heç susa bilər?
Peşə yox, alver yox, əkin də əkməz,
Bu qədər dövləti hardan tapıb bəs?"
Yığılıb gördülər belə məsləhət:
Şah ondan bu sirri soruşsun xəlvət.
Əmr etdi padşah ki, o kişi bir gün
Üstündən şübhəni götürmək üçün
Xəlvəti padşahın yanına getsin,
Bu sirri xoşluqla ona nəql etsin.
Varlanmış çörəkçi gedib bargaha,
Ədəblə baş əydi ulu padşaha,
Diz çökdü, bir daha təzim eylədi,

Torpağa düşərək sənə söylədi.
Şah onu görəndə bəxtəvər, xoşbəxt,
Təxtinin yanına eylədi dəvət.
Gahdan hədələdi, gah xoş danışdı,
Sonra xəzinədən söz-söhbət açdı.
Dedi ki: "Sən xoşbəxt adamsan, yəqin.
Fələk də xoş baxmış üzünə sənin.
Eşitdim buraya köçüb gələndə
Bir günlük azuqə yox imiş səndə.
Indisə, deyirlər, çox sərvətin var,
Acizdir çəkməyə onu karvanlar.
Dövlət qazanmaqçın çəkərlər zəhmət,
Padşaha yetişər tapılma dövlət.
Bu işin sirrini doğru söyləsən,
Canından, malından arxayın ol sən.
Yox, əgər sözündə duysam bir yalan
Əmrimlə ən ağır cəza alarsan!.."
Çörəkçi gördü ki, qəzəblənib şah,
Bildi ki, düzlüyə qalıbdır pənah.
Təzim eləyərək şaha yenidən,
Söylədi: "Ey padşah, eşitmişəm mən,
Zülmünü görməyib kimsə dünyada,
Yaxşılıq yaraşır səndəki ada.
Xoş rəftar edibsən sən rəiyyətlə,
Yolunda can qoyar hamı minnətlə.
Sənin torpağında qazandım nemət,
Sənin sayəndədir məndəki dövlət.
Əgər qəbul edib buyuruq versən,
Tamam əl çəkərəm var-dövlətimdən.
Ən axmaq quluna bəxş edib, ələn,
Torpağı öpərək gedim qapından.
Əgər soruşursan, budur doğrusu,
Nəql edim nə cürə gəldi arxa su:
Ey şahım, mən bura gəldiyim zaman
Əliboş bir quldum, yoxsul bir insan.
Möhnət içindəydi ömrüm, həyatım,
Dedim, çörək satıb, çörəyə çatım.
Peşəmdən dərdimə olmadı dəva,





Doğrusu, bundan da görmədim səfa.
Şahı səxavətli bir məmləkətdə
Çörəkçi varlana bilməz, əlbəttə.
Karıxıb hər yerə baş vururdum mən,
Təsəlli tapırdım bu əlləşmədən.
Mənim bir arvadım vardır, çox zirək,
O, hamilə idi... qaldıq neyləyək?..
Çox çətin vururduq başa hər günü,
Günəş də kəsmişdi bizdən lütfünü.
Müşkün ətrindən də safdı o mələk,
Yeyirdik onunla biz yavan çörək.
Yetişdi arvadın doğum möhləti,
Məndən bir az isti quymaq istədi.
Evdə yemək üçün - ürək qanından
Başqa heç şey yoxdu, ey şahım, inan!
Evdə ikimizdik - bir mən, bir arvad,
Dedi ki: "Ay kişi, bir dadıma çat,
Ölürəm, bir azca şorba düzəltsən
Ölümdən canımı qurtararsan sən.
Yoxsa ki, ölmüş bil məni, həmdəmim,
Əcəl küləyindən batacaq gəmim."
Bu halda görəndə əziz yarı mən
Ağlaya-ağlaya tez çıxdım evdən.
Ona bir yeməli şey tapmaq üçün
Gəzdim küçə-küçə şəhəri bütün.
Bağlıydı üzümə qapılar - hər yan,
Bədlik bərk tutmuşdu mənim yaxamdan.
Baş alıb şəhərdən çıxdım kənara,
Rast gəldim köhnə bir xarabazara.
Gəzdim dönə-dönə o xarabanı,
Bir acgöz div kimi eşdim hər yanı.
Kim bilir nə vaxtdan qalıb bu saray,
Basıb qapısını toz-torpaq lay-lay...
Burda da bir zaman məşəllər yanmış,
Ətirli udlarla nura boyanmış.
Bir zənci gördüm ki: - atəşpərəstdi,
Əlində bir kuzə, özü də məstdi.
Asmışdı ocağa dolu bir qazan,

Basmışdı hər yanı orda buğ, duman.
Zənci dik atıldı yad adam görcək,
Burula-burula qalxdı tüstütək.
Üstümə çığırdı: "Ey div oğlu, sən
Üstümə cumaraq nə istəyirsən?
Sən də oğrusansa mənimtək əgər,
De, oğru oğrudan oğurluq edər?"
Onun qorxusundan onun hövlündən
Özümü itirib mat qalmışdım mən.
Zənci adətilə tutaraq dilə,
Könlünü birtəhər gətirdim ələ:
"Mən kiməm? Bir kasıb, bir fağır adam,
Gəldim ki, sayəndə mən də dolanam.
Hamı söyləyir ki, sən aslanbasan
Səxavət əhlisən, mərd bir adamsan.
Odur ki, dəvətsiz qonaq gəlmişəm,
Səni mən özümə pənah bilmişəm.
Bəlkə köməyinlə işim düzələ,
Əlimə bir qədər var-dövlət gələ..."
O məndə belə bir şirin dil görcək,
Acığı soyudu, yumşaldı mumtək.
Odur ki, əl çəkdi bəhs eləməkdən,
Çünki yağlı dilə aldanar düşmən.
"İçən, çalansanmı?" deyə soruşdu.
"Bəli!" Cavab verdim, gətirdi rudu.
Mən də həmin rudu alaraq ələ,
Qorxumdan kökləyib gətirdim dilə.
Mızrabı tellərdə oynadıb bu an
Bir nəğmə başladım ona yalandan.
Qaynar qazan kimi o coşdu, daşdı,
Başladı hay-küyə, həddini aşdı.
Gah şərab içirdi o gülə-gülə,
Gah da rəqs edirdi qazanc eşqiylə.
Zəncini aldadan bir hava çaldım,
Onun damarını əlimə aldım.
Mənimlə həriftək elədi rəftar,
Məst olub sirrini danışdı aşkar.
Dedi: "Gözləyirəm burda gizlicə,





Varlanmaq qəsdim var mənim bu gecə.
Var mənim özümtək bir yoldaşım da,
Mənsiz şərab içməz əsla dünyada.
Gizli bir xəzinə keçibdir ələ,
Üstündə əjdaha yatmayıb hələ.
Yalnız ikimizik ona əjdaha,
Odur ki, quldurluq etmirik daha.
Bir ilə yaxındır o xəzinədən
Yeyib kef çəkirik dərd-qəm bilmədən.
Tükənib xəzinə, xeyli azalıb,
Yerində sonuncu bağlama qalıb.
Dostum gedibdir ki, gətirsin onu,
Mən də gözləyirəm-burda yolunu.
Bu gecə sən bizə gəlibsən qonaq,
Odur ki, biz gərək qulluqda duraq.
Ancaq bir şərtim var: o qayıdanda,
Xəzinə gətirib gələn zamanda
Bir küncdə qısılıb durasan gərək,
Səs-səmir çıxmasın səndən ölütək.
Mənim fikrim budur: bu əjdahanı
Bu gecə öldürüm, qoy çıxsın canı.
Bütün xəzinəyə mən olub yiyə,
Çəkilib sığınım dinc bir guşəyə.
Sənə də, əzizim, ondan bir qədər
Qoy könlün şad olsun, verərəm səhər..".
Zənciylə mən şirin söhbətdə ikən
Ayaq tappıltısı eşitdik birdən.
Mən qalxıb gizləndim dərhal bir küncdə,
Fikrim gah tikanda, gah da türüncdə[102].
Qapqara bir adam girdi o anda,
Həmin bağlama da onun dalında.
Yükü çətinliklə endirdi yerə,
Yaman qüvvətliydi, bənzərdi şirə.
Hələ bağlı yükü töküb açmadan
Bir qədər yedi o, hazır sorbadan.
Yoldaşı yatmışdı. Getdi yanına,
Onun dediyini bu etdi ona:

Polad qılıncını ona əndərdi,
Bir anda leşini torpağa sərdi.
Qorxudan canıma düşdü vəlvələ,
Özümü birtəhər tez aldım ələ.
O kəsib başını, qalxdı ayağa,
Durdu bədənini şaqqalamağa.
Bir şaqqa götürüb çıxdı o yerdən,
Bu zaman huşumu itirmişdim mən.
Aradan keçincə bir xeyli müddət,
Gördüm ki, qayıdıb gəldi, nəhayət.
O biri şaqqanı alıb bu səfər,
Düzəldi yoluna yenə o təhər,
Bildim ki, o uzaq bir yerə gedir,
Gecə də qaranlıq, tutqun gecədir.
Qartaltək yerimdən şığıdım o an,
Cumdum xəzinəyə sarı durmadan.
Zənci o meyidi alıb gedəndə
Aldım xəzinəni çiynimə mən də.
Bir kasa doldurub hazır şorbadan,
Oldum evə sarı yoluma rəvan.
Mən elə gəldim ki, bəxtimdən qeyri
Kimsənin olmadı bundan xəbəri.
Bəxtim kömək oldu, evimə çatdım,
Yükümlə dərdi də çiynimdən atdım.
Gəldi qulağıma bir çağa səsi,
Artdı şad könlümün qat-qat nəşəsi.
Verdim, alıb yedi şorbanı arvad,
Təşəkkür elədi, könlü oldu şad...
Arvada dedim ki: "Bəxtim oğlandır,
Oğlan, doğrudan da, baş ucaldandır!"
Həmin bağlamanı o saat açdım,
Bu xəstə könlümə nəşələr saçdım.
Gördüm ki, xəzinə dolu bir mədən,
Tamam yaqut, qızıl, - boldu nə desən.
Döndüm bir mədənə o xəzinədən,
Dəniztək varlandım bir gecədə mən[103].
Oğlumun bəxtindən könlüm şad oldu,





Çünki xəzinəylə birgə doğuldu.
Oldum o gecədən varlı, bəxtiyar,
Çünki həm xəzinə tapdım, həm açar"
Bütün sərgüzəşti burada bitdi,
Sözünü qurtarıb o, sükut etdi.
Şah sordu: "Hansı gün doğulub oğlan?
Arvadın hamilə olub nə zaman?"
Çörəkçi tez gedib evinə dəydi,
Gətirdi padşaha etdiyi qeydi.
Həmin vərəqəni alıb şah isə
Göndərib tapşırdı alim Valisə:
"Uşağın bəxtini ulduzlardan sən,
Çalış, tədqiq elə, tezliklə öyrən.
Onun yaxşı-yaman bəxtini axtar,
Öyrəndikdən sonra de mənə aşkar."
Valis bu fərmanı alıb, bir müddət
Göydə ulduzlara eylədi diqqət.
Görüb ulduzların göydə seyrini,
Gizlin əhvalatın bildi sirrini.
Yazdı İskəndərə öz gördüyünü,
Qulaq deyəni yox, göz gördüyünü.
Valisdən məktubu aldığı zaman
Yazdığı şeylərə şah qaldı heyran.
Pərdə ardındakı o nəqşələrdən
Belə danışırdı tale göstərən:
"Bu, bir çörəkçidən olmuş uşaqdır
Ki, dövlət nuruyla parlayacaqdır.
O körpə anadan lüt doğulsa da,
Var-dövlət sahibi olmuş dünyada.
Atası oğlunun xoşbəxtliyindən
Varlanıb dövlətli olacaq birdən.
Taleyi belədir, uşaq doğulcaq
Xəzinə üstünə basacaq ayaq.."
Şahı sarsıtmışdı bu söz, bu söhbət,
O gövhər satana etdi mərhəmət[104].
Onu əzizləyib elə o gündən,
Elədi ən yaxın nədimlərindən.

## ALİMLƏRİN HÜRMÜZÜ İNKAR ETMƏLƏRİ VƏ HƏLAK OLMALARININ HEKAYƏTİ

Müğənni, sazını ələ alsana,
Xoşahəng nəğməndən bizə çalsana!
Dar pərdə dinləmək istəmirik biz,
Genişdir, yüksəkdir öz ahəngimiz.
Rumlu filosoflar sözləşib hərdən,
Yığılıb gələrdi hərə bir yerdən.
Onlar hər elmdən söhbət açardı,
Hikmətli sözləri şəfəq saçardı.
Kim yaxşı etsəydi sözünü isbat,
Başlılar başçısı olardı o zat.
Hürmüz adlı alim haqq danışmaqda
Gedərdi hamıdan daim qabaqda.
Çox möhkəm olardı onun dəlili,
Qane eləyərdi hamını dili.
Bir çox ruhanini faş etdiyindən,
Oldu yunanlılar onunla düşmən.
Bir gün yetmiş alim çıxardı qərar,
Onun hər sözünü etsinlər inkar:
"Hürmüz nə söyləsə, razı olmayaq,
Doğru sözlərinə asmayaq qulaq.
Onu yerli-dibli eyləyək inkar..."
İnkarla haqq sözü danmaqmı olar?
Hamısı söz qoyub əhd elədilər,
Hürmüz çıxardıqca mədəndən gövhər,
Qiymətdən salsınlar söz dənizini,
Torpaqla örtsünlər xəzinəsini.
Hər doğru sözünə yalan desinlər,
Onun haqq sözünü eşitməsinlər...
Hürmüz söz bəhrindən gövhər saçanda,
Elmi-ilahidən söhbət açanda,
Hər sözə dəlillər gətirib ustad,
Hər şeyi aydınca etdikcə isbat,
Gördü ki, onlara heç etmir bu kar,





Hər şeyi hay-küylə edirlər inkar.
Başqa bir xəzinə çıxartdı üzə,
Yeni dəlillərlə başladı sözə.
Gətirdiyi dəlil, dediyi fikir
Qəlbə yox, daşa da edərdi təsir.
Yenə də sözünü təsirsiz görcək,
Bildi ki, burda var yəqin, bir kələk.
Üçüncü dəfə də müşküllər açan
Diliylə haqq sözü eylədi bəyan.
Qəlbə fərəh verən gözəl sözlərdən
Onlara söylədi nə qədər desən.
Bu qədər çaldığı zəngin səsinə
Heç biri etina etmədi yenə.
Daha danışmaqdan taqətsiz oldu,
Boğazı qurudu, dili tutuldu.
Bildi ki, həriflər tərs davranırlar.
Aydın dəlilləri qəsdən danırlar.
Görməyib onlarda heç bir hərəkət,
Üzünü döndərib elədi nifrət.
Qışqırdı onlara hiddətlənərək:
"Qalın yerinizdə qiyamətədək!"
Bir anın içində o yetmiş nəfər
Qalıb hərəkətdən buza döndülər.
Başları su kimi ayağa düşdü,
Donmuş bədənləri torpağa düşdü.
Düz pərdədə əyri çaldıqlarından
Pərdənin dalında oldular nihan[105].
Həmin əhvalatdan tutanda xəbər
Ulduztək parladı orda İskəndər.
O sərv meşəsində gördü ki, ancaq
Yetmişi quruyub, biri qalıb sağ[106].
Hürmüzdən soruşdu, o etdi bəyan:
"Hümmətim kəşf etdi, - dedi, - asiman!
İskəndər "afərin" söyləyib ona,
Ordan tez qayıtdı öz dərgahına.,
Hər kəsə, xəlvətdə, düşəndə fürsət,
Ona bu dastandan edərdi söhbət:
"Yetmişlər başladı tufan salmağa,

Özləri çöp oldu, Hürmüzsə dalğa."
Haqqı eşitməsə hər kəs dünyada
Ömrünü kül edib verəcək bada.
Ustadın dərsini kim etsə inkar,
Onlartək kəfənə tutacaq ruzgar.
Dəlili qüvvətli olan bir sözü
Qanmaq istəməyən bədbəxtdir özü.
Taca layiq dürrü yerlərə vuran
İdraksız, şüursuz nadandır, nadan!
Hünərə göz yummaq deyildir hünər.
Hansı bir ağıllı tülə bez deyər?
Alimlə xoş rəftar etsən əgər sən,
Özün öz elmini aşkar edərsən.

## ƏFLATUNUN ÇALĞI ALƏTİ QAYIRMASI

Müğənni, ucalsın o incə səsin,
Qızdırsın qoy bizi odlu nəfəsin.
Qızışsın işlərim, gəl, dadıma çat,
Kömək ol, bazarım olmasın kasad!
Təblini çaldıqca təbilçi yeyin
Qızışdı havası soyuq gecənin.
Naümid olanda o qara qarğa
Ağ xoruz başladı xoş dil açmağa.
Çıxdı Rum taxtına İskəndər erkən,
Dili od, dimağı mumdu deyəsən[107].
Gəlib filosoflar səf vurmuşdular,
Taxtın qarşısında oturmuşdular.
Hərə bir elmdən bildiyi qədər
Danışır, deyişir, bəhs edirdilər.
Biri danışırdı təbiiyyatdan,
O biri dəm vurur ilahiyyatdan,
Kimi riyaziyyat bəhsinə girmiş,
Kimi həndəsəyə fikrini vermiş,
Birisi namusdan, ədəb-ərkandan,
Biri də hiylədən açmışdı dastan.
Hərəsi bir fənlə edir iftixar,





Hərənin özünün bir aləmi var...
Şaha arxalanıb bircə Ərəstu
Özünü hamıdan yuxarı tutdu:
"Mənəm hər alimə çarə eyləyən,
Yoxdur ehtiyacım heç bir alimdən.
Hikmət xəzinəsi məndədir bütün,
Mən oldum hikmətdə hamıdan üstün.
Filan elmi təsis eləmişəm mən,
Filankəs filan şey öyrənib məndən!"
Yalandan öymürəm burda özümü,
Sübutla deyirəm hər bir sözümü..."
Şah ilə arası saz olduğundan.
Hamı çəkinirdi, qorxurdu ondan.
Xoşuna gəlmədi bu, Əflatunun,
Hamıdan biliyi artıqdı onun.
Nə qədər vardısa orada alim,
Hamıya olmuşdu o ilk müəllim.
Əflatun onlardan üz döndərərək
Yox oldu saraydan Ənqa quşutək.
Gecəli-gündüzlü düşündü ustad,
Gizlində o, bir saz elədi icad.
Bir küpün içində gizləndi bir gün.
Axtardı səsini bu yeddi küpün[108]
Yaxşı olmasa da birinin səsi,
Küpdə xoş səslənər onun nəğməsi.
Bu qanun üzrə də o sahibhünər
Küpdə düzəldirdi , yeni nəğmələr.
O, rəsəd sahibi küpə girərək
Çərxi, ulduzları seyr etdi tək-tək.
Eşidib burada o, nalə, fəryad,
Etdi bu ahənglə bir nəğmə icad.
Rudda bu ahəngi münasib yerdə
Quru bağırsaqdan bağladı pərdə,
İçi boş qabağa çəkərək dəri,
Düzəltdi, bağladı o, pərdələri.
Ceyran dərisinə çəkdi qara rəng,
Quru ud səslənib oldu xoşahəng.
Bir xeyli cəhd edib fikrinə uyğun,

Düzəltdi, nəhayət, o bir ərğənun.
Telləri yaxşıca köklənmiş bu saz
Başladı verməyə ahəngdar avaz.
Zil və bəm nəğmələr hasil edərək,
Mizrabı gah yavaş vururdu, gah bərk.
Səslər çıxarırdı, bərkdən, yavaşdan,
Sanki nərə çəkir öküz, ya aslan.
Səslərdə o qədər məlahət vardı
Ki, heyvan eşitcək donub qalardı.
İnsan səslərindən heyvana qədər -
Sazdan çıxardırdı hər cürə səslər.
Belə ki, çaldığı o havalardan
Şadlanıb oynamaq istərdi insan.
Bütün heyvanları yatırdıb sazla,
Sonra ayıldardı xoş bir avazla.
Hər bir səsə uyğun səslər çıxardan
Bir saz düzəltdi ki, başqa bir insan
Onun sirlərini əsla bilməzdi,
O sazda bir hava çala bilməzdi.
Ustad həmin sazı çaldığı zaman
Edərdi xəstənin dərdinə dərman.
Çalğıda elə bir cəhət də vardı
Ki, həkim onunla dərdi tapardı.
Həmin sazdan çıxan səs əsasında
Təşxis olunardı illət bir anda.
Ərğənun təkmilə yetdiyi zaman
Süni ud çox yaxşı oldu xam uddan[109].
Alim sazı alıb, səhraya getdi,
Hər bir nisbət üçün onu kök etdi.
Dördbucaq xətt çəkib öz dövrəsinə,
Başladı çalmağa sazını yenə.
Çöldəki, dağdakı bütün heyvanlar -
Yüyürdü yanına onun hər nə var.
Yığılıb hamısı sazın səsinə,
Düzüldülər onun dörd dövrəsinə.
Hamısı bir anda huşdan gedərək
Sərildi torpağa bir-bir ölütək.
Nə bir qurd orda bir quzuya dəydi,





Nə bir şir gur tutmaq həvəsindəydi.
Sonra başqa cürə kökləyib yenə
Alim saz çalanda, onun səsinə,
O yatmış heyvanlar, çəkmədi bir an,
Ayıldı hamısı şirin yuxudan,
Yayıldı hamısı çöllərə həmən...
Heç belə sərgüzəşt varmı eşidən?
Bu xəbər bürüdü bütün cahanı
Ki, yaqut paylayır o yaqut kanı[110].
Əflatun yaradıb bir elə pərdə
Ki, onu bir bilən yoxdur heç yerdə.
Onun qurduğu saz elə səslənir
Ki; fələk o səsə yerlərə enir.
Müəyyən pərdədə bir hava çalır
Ki, bütün heyvanlar yuxuya dalır.
Başqa bir pərdədə çaldığı zaman
Yatanlar hamısı durur yuxudan.
Şahın sarayına çatdı bu xəbər
Ki, Zöhrə Harutla bəhsə giriblər[111].
Ərəstu bildi ki, o böyük ustad
Qəribə bir alət eləyib icad.
Xəcalət çəkəntək düşməndən düşmən
Utandı alimin bu hünərindən.
Sarayda bir küncdə xəyala daldı,
Onun dar qəlbini bərk həsəd aldı.
O zərif sənətin, o xəzinənin
Sirrini bilməkçin düşündü dərin.
Xəyala gedərək bir xeyli müddət,
Gecəli-gündüzlü çəkdi əziyyət.
Axır, əzab çəkib aylar uzunu,
Bu sirli kələfin tapdı ucunu.
Öz iti əqlinin köməyi ilə
Bildi ki, saz necə gəlirmiş dilə.
O səslər qulağa nə sayaq çatır
Ki, bəzən yatırdır, bəzən oyadır.
Bildi ki, o sazda necədir nisbət,
Düzəltdi belə saz o da, nəhayət,
Səhraya gedərək sazını aldı,

Bihuşluq gətirən havanı çaldı,
Heyvanlar eşidib, getdilər huşdan.
O, başqa bir hava çaldı bu zaman,
Bu dəfə olmadı ona bəxti yar,
Huşsuzlar yuxudan oyanmadılar.
Nə qədər çaldısa, bəlkə birtəhər
Yatmışlar ayılıb huşa gəlsinlər,
Olmadı...Köklədi sazı hər sayaq,
Özü də bu işə mat qaldı ancaq..
Aciz qaldığını özü görəndə
Axtardı əlacı müəllimində.
Gedib özü oldu ustada təslim,
Başladı almağa həvəslə təlim.
Soruşdu: "Huşsuzu huşa gətirən
O hansı havadır, bilməyirəm mən.
Hansı pərdələrdən çıxır o avaz?
Nə cürə köklənsin onda gərək saz?"
Əflatun gördü ki, o böyük insan
Yalvarıb öyrənmək istəyir ondan.
Çöldə bir xətt çəkib, sazını aldı,
Kökləyib, bildiyi havanı çaldı.
Nə qədər şir və gur var biyabanda
Yığılıb gəldilər səsə bir anda.
Birinci havanı çalanda, yenə
Baş qoyub yatdılar Mən'əl xəttinə[112].
Başqa bir hava da çaldı o ustad.
Ərəstu özü də yatdı o saat.
Əflatun bir hava çaldı bu zaman,
Heyvanlar ayıldı yenə yuxudan.
Başqa bir hava da çaldı yenidən.
Ərəstu sıçrayıb qalxdı yerindən.
Mat-məbhut yerində durub dayandı,
Bilmədi heyvanlar necə oyandı.
Nə oldu onları huşa gətirən,
Nə oldu onlara hərəkət verən?
Bildi ki, o alim, o sahibhünər
Sirri gizlətmişdir ondan bu təhər.
Ondan üzr istəyib, çox dua etdi,





O da gizlin-sirri buna öyrətdi.
Öyrənib bunları yazdı Ərəstu,
Özü yazdığını dəftərdən pozdu.
Ustadın hünərin eləyib iqrar,
Ehtiram göstərdi ona o ki var.
Şah bildi kimdəymiş əsil istedad,
Rumda Əflatundur elmə baş ustad.
O da rütbəsini artırdı onun,
Sarayda uca yer tutdu Əflatun.

## ƏFLATUNUN KEÇMİŞDƏN HEKAYƏ SÖYLƏMƏSİ

Müğənni, çəngini yenə saz elə,
Xoş sözçün səsini xoşavaz elə.
Könlünü şad elə sən o çəng ilə,
Gəl nəvaziş eylə xoş ahəng ilə!
Güldü ertəsi gün üfüq zəfərlə,
Gecə vidalaşdı qızıl səhərlə.
Səma çəmənində günəş gül açdı,
Ay da balıq kimi sulara qaçdı.
Öz qızıl taxtına çıxdı İskəndər
Belində gövhərlə bəzəkli kəmər.
Yenə alimlərdən bir məclis qurdu,
Əflatun hamıdan başda oturdu.
Əsrarlı sazına şah qalıb heyran,
Təəccüb içində soruşdu ondan:
"Ey hikmətli qoca, ey nuranı pir,
Sizin əqlinizə əyandır hər sirr.
Bilik qıfılına sizsiniz açar,
Bilik sayənizdə olubdur aşkar.
Keçmiş alimlərdən verin bir xəbər,
Olubmu sizdən çox bilən bir nəfər?
Sizdən əvvəlkilər elə bir xəyal
Edibmi ki, ola sizinçün mahal?"
Əflatun padşaha dua edərək,
Dedi ki: "Firuzə rəngli bu fələk

Cürbəcür əfsunlar edib ixtira
Ki, bizim əqlimiz yetməz onlara.
Keçmişdə alimlər görüb çox işlər,
Çox əfsun, çox hiylə icad etmişlər.
Doğrusu, onların indiki zaman
yüzdə birini də yoxdur anlayan!
Şah izn verərsə, o sirlərin mən
Deyərəm onda yox, yüzdə birindən."
Bu işə razılıq verdi İskəndər,
Danışsın onlardan alim bir qədər.
Əflatun söylədi: "Var ol, hökmüdar,
Sənin elmə, fənnə məhəbbətin var...
Deyirlər buxarla alov əl-ələ
Verib bu dünyaya saldı zəlzələ,
Bu qüvvət yerlərin bağrını yardı,
Bir düzdə tilsimli bir daş çıxardı-
Mis ilə qalaydan xilqətin əli
Sanki yaratmışdı bir at heykəli.
Heykəlin böyründə bir oyuq vardı,
Suların açdığı yerə oxşardı.
Günəş bu oyuqdan nur saçan zaman
Bir sehir görərdi orda hər baxan.
Bir çoban keçəndə bu geniş düzü
O sadə yarğana sataşdı gözü.
Orda parıltılı tilsimi görcək
Endi tez çuxura bir anda zirək.
O misdən yaranmış at heykəlinin
Böyründə bir oyuq göründü, dərin.
Gün işıq salmışdı həmin oyuqdan.
Seyr etdi heykəli diqqətlə çoban.
Orda çox köhnə bir meyid gördü ki,
Heç əskik deyildi onun bir tükü.
Onun barmağında bir üzük vardı,
Qaşı Müştəritək par-par yanardı.
Çoban tez əlini uzatdı ona,
Çıxarıb üzüyü aldı ovcuna.
Üzüyü ovcunda çevirdi, baxdı,
Sonra barmağına sevinclə taxdı.





Ayrı şey tapmadı baxdısa hara,
Daha ləngiməyib çıxdı bayıra.
Sürdü sürüsünü, getdi sevincək,
Səhəri gözlədi səbr eyləyərək.
Səmanın möhtəşəm göy bayrağında
Işıq saçan muncuq parıldayanda,
Çoban sürüsünü dağda tərk etdi,
Sürü sahibinin yanına getdi.
Ora getməyindən bu idi məqsəd:
Üzüyü göstərib, öyrənsin qiymət.
Çobanı önündə görəndə ağa
Başladı onunla xoş danışmağa.
Hal-əhval soruşdu qoyun-quzudan,
Aydın cavab verdi hər sözə çoban.
Çoban ağa ilə söhbət edərkən
Arabir yox olub itirdi gözdən
Bir də görünəndə çoban, tez ağa
Başladı heyrətlə acıqlanmağa:
"Bu nədir, arabir itirsən gözdən,
Yenə də gözümə görünürsən sən?
Əfsunçu olubsan durduğun yerdə,
Hardandır tapdığın bu sirli pərdə?"
Çoban bu sözlərə heyrət edərək,
Bu işə əqlindən istədi kömək.
Çoban ağasıyla söhbət edəndə;
Üzüklü əlini o tərpədəndə,
Üzüklə qaşı da hey burulurdu,
Gah altda, gah üstdə gəlib dururdu.
Qaş üstə çevrilib durduğu zaman
Görürdü çobanı ona hər baxan.
Qaş ovcun içində olanda isə
Onu görməyirdi artıq heç kimsə.
Elə yaratmışdı üzük yaradan
Gözə görünməzdi taxsa hər insan.
Çoban başa düşüb sirli oyunu,
Gedib dağda, daşda sınadı onu.
Qayıdıb üzüklə qurdu min kələk,

Necə ki, ulduzla oynayır fələk[113].
Gözə görünməmək istəyən zaman
Qaşı çıxarmazdı əsla ovcundan.
Nə zaman istəsə görünsün, yenə
Qaşı çevirirdi o öz yerinə.
Bu yolla şəhərdə qurub oyunu,
Yetirdi yerinə hər arzusunu.
Bir gün də bu sirrə qızışdı başı,
Ovcunun içinə alaraq qaşı,
Əldə hindli qılınc, saraya keçdi,
Şahın düz önündə gizli əyləşdi.
Dağılıb gedəntək ordan adamlar,
Şahın gözlərinə göründü aşkar,
Bu haldan ürəyi qorxuyla doldu,
Çarəsiz qalaraq şah təslim oldu.
Tələşla soruşdu: "Aç mətləbini,
De, kimdir göndərən buraya səni?"
Çoban cavab verdi: "Mən peyğəmbərəm,
Iman gətir, səni xoşbəxt eylərəm.
Istəsəm heç görməz məni bir adam,
Mənim möcüzəm də budur, vəssalam!"
Ona beyət etdi şah qorxusundan,
Bütün əhali də gətirdi iman.
Çobanın hörməti artdı, ucaldı,
Axırda şahlığı əlinə aldı.
Gör varmış o qaşda nə böyük hikmət
Ki, çoban peyğəmbər oldu, nəhayət!
Bir bax qaş qayıran o alimlərə,
Gör hikmət çatıbmış onda nə yerə!
Sehir gərək belə edilsin icad.
Bizimtək alimlər qalsın ona mat.
Nə qədər düşünüb daşındımsa mən.
Gəlmədi bu sirri açmaq əlimdən."
Şah bunu eşidib, elədi sənə
Həm o icadkara, həm Əflatuna.
Həmin o məclisdə iştirak edən
Hamı ibrət aldı o hekayətdən.





# İSKƏNDƏRLƏ SOKRATIN ƏHVALATI

Müğənni, o könül açan saz ilə
Mənim də könlümü bir aç, saz elə!
Bəlkə ilham alıb sazın telindən,
Ruma ipək həşyə nəqş eləyim mən[114].
Kainat-işindən xəbərdar olan
Bir alim deyir ki: "Bir zaman yunan
Əhli baş qoşmayıb əsla bir işə,
Hamı zahidliyi etmişdi peşə;
Dünyada göz yumub istirahətə,
Onlar xor baxırdı zövqə, şəhvətə,
Çox bilmək, az yemək yolu tutaraq,
Hamı riyazətlə məşğuldu ancaq.
Hətta varlılar da min əzab çəkər,
Dünya ləzzətindən elərdi həzər.
Guya ki, bilikli, ağıllı olan
Bu dünya zövqünə uymaz heç zaman.
Qadından, şərabdan çəkmişdilər əl,
Guya bunlar əqlə gətirər xələl.
O yerə çatdı ki, belə bir adət
Onların nəslini kəsdi nəhayət. -
Qadından uzaqda yaşamaq üçün
Qurudan dənizə köçdülər bütün.
Ayırdı qadını kişidən onlar,
Ayrı bir gəmidə qaldı qadınlar.
Kişilər qan alıb damarlarından
Uzaq yaşadılar daim qadından.
Bu qayda düzgün bir qayda deyildi,
Odur ki, onların nəsli kəsildi."
Şahın əmri ilə yenə bir səhər
Toplaşıb məclisə gəldi alimlər.
Saray ağasına şah verdi fərman:
"Heç kəsi yanıma bu gün qoymazsan!
Bir də ki, xəbər ver qoy gəlsin Sokrat,
Tərkibdə, ixlatda o böyük ustad!"[115].
Xidmətçi fərmana əməl eylədi,

Sokratı taparaq ona söylədi:
"Dəyiş paltarını, bəzəkli geyin,
Şahın hüzuruna gəl gedək, yeyin!"
Dünyagörmüş alim buna uymadı,
Onun təklifinə məhəl qoymadı.
Dedi: "İskəndərə get eylə bəyan:
Bir şey tapmayacaq əsla bu yoldan.
Çünki indi başqa aləmdəyəm mən,
Yalnız xəyalımdır burda görünən.
Haqsevər adamsa məni axtaran,
Tapa bilər ancaq haqq dərgahından..."
Qasid qulaq asdı həmin sözlərə
Gəlib xəbər verdi tez İskəndərə.
Şaha günəş kimi oldu aşikar,
Sokrat bir şamdır ki, xəlvətdə yanar.
Aytək gecə oyaq olmasa hər kəs
Axtarıb o şama yol tapa bilməz.
İskəndər hərçənd ki, sahib-tac idi,
Biliyə, hikmətə çox möhtac idi.
Ən gözəl gövhəri seçib hər zaman
Aqillər yollardı şaha ərməğan.
Ona alimlərdən hər bəxşişindən -
Kəlamı, söhbəti, hər bir işindən
Daha xoş gələrdi Sokratın sözü,
Fikri aydın idi, açıqdı gözü.
Şahın bilik sevən könlü o gün də
İstədi Sokratı görsün önündə.
Dedilər: "Xəlvətə çəkilib daim,
Xalq ilə get-gəli kəsib o alim.
Elə üz döndərib dünya işindən.
Gorda dürr tapıbdır qoca, deyəsən.
Qohumdan, qardaşdan üz döndərərək
Yaşayır kənarda, bir bucaqda tək.
Candan xidmət etsə bu cahan ona,
O yenə üz tutmaz əsla cahana.
Tərgidib tamamən o, ət yeməyi,
Palaza bürünüb, atıb ipəyi.
O hər cür yeməyə edir qənaət,





Bir az qovut eylər ona kifayət.
İbadət eləyir tənha, kimsəsiz,
Tapmayır yanına bir kimsə yol, iz.
Əql ilə dost olub Nizami təkin,
Ondan dərs alıbdır Nizami yəqin..."
Şaha təsir etdi verilən xəbər,
Sokratı daha çox sevdi İskəndər.
İnsanın belə bir xasiyyəti var:
İraq gəzənləri çox yada salar.
İnsandan qaçana, - belədir adət,-
İnsan daha da çox göstərər rəğbət.
Sokrat da eldən üz döndərdiyindən
Hamı onu görmək istərdi hökmən.
Şah onu nə qədər dəvət etdisə,
O məhəl qoymadı əsla məclisə.
Çox rica elədi ondan hökmüdar,
Onun ürəyinə etmədi bu kar.
Alimin gözəltək naz etməsinə
Naz çəkən hökmüdar dözürdü yenə.
Özünə ən məhrəm olan bir nəfər
Çağırdı yanına bir gün İskəndər,
Göndərib alimin tək hüzuruna,
Dedi ki, gizlicə söyləsin ona:
"Səni dəfələrlə mən dəvət etdim,
Var idi səninlə məhrəm söhbətim.
Bilmirəm nə üçün rədd elədin sən,
Hörmətin qədrini niyə bilmirsən?
Mənim dərgahımdan nədir bu həzər?
Buyur gəl, ya da ki, bir səbəb göstər.
Üzrünü isbat et ya açıq-aşkar,
Ya söylə, başqa bir məramınmı var?"
Qasid bu fərmana əməl eylədi,
Şahın sözlərini Sokrata dedi.
Dünyagörmüş alim, o alicənab
Qasidə söylədi belə bir cavab:
"Doğrudur, çağırıb məni hökmüdar,
Mənim də, pis-yaxşı, öz düşüncəm var.
Düşüncəm getməyi görmür məsləhət,

Çünki şahda yoxdur mənə məhəbbət.
Getməmək üçün də vardır çox dəlil,
Hara oynamağa gedib Cəbrail?[117]
Saraya getməyə edərdim rəğbət,
Görsəydim dəvətdə bir səmimiyyət.
Bilinər nafə müşk bağlasa əgər,
Çünki o bu zaman xoş qoxu verər.
Dostluq iddiası edən bir ürək
Sözdən başqa çox şey bildirə gərək.
Bir könül məhəbbət elərsə izhar,
Çox şeylə seçilər ondakı rəftar.
Şahın məclisinin o məhrəmləri,
Onun həmsöhbəti və həmdəmləri
Yolumu bataqlıq ediblər mənim,
De, necə oradan keçsin köhlənim.
Yəqin ki, məclisdə söhbət edərkən
İskəndər yaxşı söz deməyib məndən.
Odur ki, padşahın yaxın dostları
Dostluqla baxmırlar heç mənə sarı.
Şahın ürəyini adamtanıyan
Qiyas ilə bilər adamlarından:
Şahın adamları danışsa yumşaq,
Onda olar şaha ümid bağlamaq.
Kobud danışsalar səninlə yəqin,
Bil ki, şah bəsləyir sənə qarşı kin.
Səhnənin günbəzi düz olsa əgər,
Köklənməmiş tel də gözəl səslənər[118].
Günbəzin bir yeri olarsa xarab,
Xoş səsli adam da alar pis cavab.
Evdən çıxan pislik, yaxşılıq, yəqin,
Əslini göstərər ev yiyəsinin.
Doğrudur, sən özün "Gəl, gəl!" deyirsən,
Dostlarından "Get, get!" eşidirəm mən.
Onlar coşub-daşır coşğun dəniztək,
Belə vurhavurda mümkünmü gəlmək?
Bu ona bənzər ki, dərin bir dərya:
"Məndə dürr-gövhər var!" deyə, çağıra.
Ancaq ağzı açıq dura nəhənglər,





Ora dürr dalınca, söylə, kim gedər"
Qapında: "Uzaq ol!" deyənlər varkən,
Orada nə cürə şəfəq saçım mən?
Məni şah yanında pis göstərənlər
Mənə yox, özünə yamanlıq eylər.
Tək olan tanrıya pənah gətirən
Bir qul heç qorxarmı dünya əhlindən?
Mən bu qulluğumla ağayam sənə,
Gəlsəm hüzuruna, qul ollam yenə!
Baxsan bu məqama ağlın gözüylə
Bilərsən nə üçün ucadır belə."
Şahın xidmətçisi qayıdıb geri,
Ərz etdi hüzura bütün sözləri.
O, dürr süfrəsindən örtüyü açdı,
Şahın ətəyinə dürr-gövhər saçdı[119].
Gövhər bəxş etməkdən bezmədi mədən,
Şah isə yoruldu gövhər seçməkdən.
Düzdür, sərt olsa da Sokratın sözü,
Bəyəndi onları İskəndər özü.
Bildi, onu ancaq xəlvətdə görər,
Piyada yollandı ora İskəndər.
Gördü ki, yaşayır çox pərişan, tək,
Xərabə guşədə bir xəzinətək.
Dünya gərdişinə yumub gözünü,
Hücrəyə çəkmişdi Sokrat özünü.
Şahın ürəyini bu hal qanatdı,
Tərpədib ayaqla onu oyatdı.
Dedi: "Qalx ayağa, mənə qulaq as,
Eyləyim dünyada səni biniyaz."
Alim gülüb dedi: "Bu qüdrətin var,
Məni yox, get, başqa bir adam axtar.
Kim qane olarsa bir ovuc dənə,
Dönməz dəyirmantək sənin dövrənə!
Arpa çörəyinə edib qənaət,
Buğda çörəyinə çəkmərəm minnət.
Evdə bir arpası olmayan bir kəs
Yarım arpa qədər minnət götürməz.
Bir saman çöpündən yoruluram mən,

Dağ boyda yük alım çiynimə nədən?"
Şah dedi dübarə: "Ey nəcib insan,
Mal-dövlət, nə desən, eylərəm ehsan!"
Alim verdi şaha qürurla cavab:
"Gəl, məntək adama vermə sən əzab,
Mən qat-qat varlıyam hümmətdə səndən,
Mən bir azyeyənəm, sənsə çoxyeyən.
Bu geniş dünyaya maliksən özün,
Ancaq bu süfrədən doymayır gözün[120].
Mənsə, qorxmasaydım isti-soyuqdan,
Bax, bu şəltəni də atardım çoxdan.
Bu qədər ağır yük altındaykən sən,
Mənim tələbimi necə ödərsən?"
Hökmüdar söylədi: "Ver görüm cavab,
Sən kimsən, məni kim edirsən hesab?"
Belə cavab aldı padşah qocadan:
"Mən fərman verənəm, sən fərman alan!"
Şaha acıq gəldi, söylədi ona:
"Bu örtülü sözdən de, nədir məna?"
Yenə cavab verdi ağıllı Sokrat:
"Dinlə, mənasını deyim bu saat:
Mənim həvəs adlı bir nökərim var,
O daim önümdə fərmanla durar.
Həmin on nökərin nökərisən sən,
Mənə qul olana qulluq edənsən!"
Padşah bu sözlərdən dərsini aldı,
Utanıb, başını aşağı saldı.
Şah ona dedi ki: "Üzümdəki nur
Mənim pak fikrimə aydın sübutdur.
Sən paksan, paklardan düşmə uzağa,
Diriykən boş yerə girmə torpağa!"
Sokrat verdi ona gümüştək cavab:
Dedi ki: "Qulağa tökülməz simab![121]
Səndə ki pak olmaq idiası var,
Bəs niyə heyvantək edirsən rəftar?
Əlbəttə, tələsən bir heyvan ancaq
Oyadar insanı təpik vuraraq.
Mən yatmış, sən oyaq olan zamanda,





Təpik niyə vurdun bəs oyadanda?
Oyatdın hirslənib çox yatmağımdan,
Halbuki sən özün çoxdan yatıbsan!
Yatıb dovşan kimi, coşub pələngtək,
Gəl, ayıq aslanla qovğadan əl çək.
Özünə ov axtar, get, dolan bir az,
Mənimtək aslandan sənə ov olmaz!"
Bu qızğın danışıq təsir edərək
Şahın ürəyini yumşaltdı mumtək.
Sonra o, alimə eləyib minnət,
İstədi bir qədər öyüd-nəsihət.
Pərhizkar qocanın hiddəti getdi,
Şirin bir dil ilə o söhbət etdi.
Şahı nəsihətlə qane eylədi,
Ona öyüd verib belə söylədi:
"Əlində yumşalsa dəmir, bunu bil,
Tədbirlə yumşalar, hiddətlə deyil!
Qəlbi də, istəsən, bu sayaqla sən
Parladıb aynatək edə bilərsən.
Dəmiri aynatək parladan insan
Pası silməlidir öz vicdanından[122].
O qədər saf qəlbli, pak vicdanlı ol,
Mənəvi sirləri edəsən qəbul.
Pis olan şəxslərə vur qara damğa,
Çalış öz qəlbini saflaşdırmağa.
Qəlbiqara kəsin dili düz deyil.
Olmaz hər zəncidən bir Xacə Müqbil[123]
Zəncinin zahiri qaradır, ancaq,
Sən ağzından çıxan saf sözlərə bax.
Qara olsan əgər, söyüd kimi yan,
Zəncinin dişini odur ağardan[124].
Zənci dəmir kimi qara, parlaqdır,
Üzü qaradırsa, ürəyi ağdır!
Dirilik suyunu Zülmatda sanan
Alimlər o hökmü çıxarıb burdan[125].
Xıltdan ayrılmağı öyrən gümüşdən,
Çalış, gümüş kimi saf, təmiz ol sən!
Bir idrak nurani olarsa əgər.

Bu tutqun günbəzə qalxıb yüksələr[126],
Ləkəsiz, tərtəmiz saf səhər çağı
Allah sirlərinin olar ocağı.
Açsan pəncərədən sən pərdələri,
Onda işıq salar günəş içəri.
Günəşə göz yumub, yandırsan çıraq,
Külək söndürəcək onu, bil ancaq.
Günəşin nuruna yedəkçi ol sən,
Səni tərk etsə də, düşmə ümiddən[127].
Süpürüb təmizlə qapı-bacanı,
Heç qonaq çağırma sonra sultanı.
Ova gedən zaman sataşar gözü
Qapına-bacana, tez gələr özü.
O gəlsə yanına qonaq qalmağa,
Bizdən salam söylə sən o qonağa.
Bu qapıya gəldin, məğrur olma sən,
Əl çək boş, mənasız mənsəb güdməkdən.
O xas məclisini qəbul et candan,
Yoxsa qoymaz səni içəri dərban.
Palçıqlı başmaqla o taxtə sarı
Getmə, yolda çıxar sən başmaqları.
Şah ilə həmsüfrə olmaq istəsən,
Dırnaqlarını tut, əlini yu sən.
Şiri-nər olsa da, heç kimsə, əlbət,
Taxt üstə çıxmağa etməz cəsarət.
Taxtə nəqş edilmiş o bir cüt aslan
Dönmüşdür taxtaya taxt qorxusundan.
Sənin dərgahına gələn bir nəfər
Yolunu azarsa, bol sillə yeyər.
İndi sən bir düşün nə dərgahdasan
Gör necə, hansı bir seyrəngahdasan?[128]
Bu qapı önündə olmalısan qul,
Yolun bura düşsə, gəl, ədəbli ol!
Özünü sayırsan əgər hökmüdar,
İtlə, gözətçiylə, de, nə işin var?
Düzdür, tünd danışdım səninlə, amma
Budur xasiyyətim, məni qınama!
Bu yanar ürəyim o zaman göyə





Getmişdi, seyr edib sirr öyrənməyə.
İndi qayıtmışdır, gətirdiyi sirr
Bunlardır, söylədim mən sənə bir-bir.."
Qoca bu saf, təmiz sözləri dedi,
Bu sözlər şaha çox əsər elədi.
Üzü günəş kimi işıqlı, parlaq,
Tələsdi saraya ordan çıxaraq.
Əmr etdi katibə, o da diqqətlə
Yazdı bu sözləri zərli bir xətlə.

## HİNDLİ HƏKİMİN İSKƏNDƏRLƏ SÖHBƏTİ

Müğənni, çal, oxu, dilə gəlsin saz!
Bülbüllər bağlarda sakit dayanmaz.
Qızışsın ürəyim sənin nəğmənlə,
Mənim də lal könlüm qoy gəlsin dilə!
Həmin dünyagörmüş filosof dedi:
"Bu hikmət şaha çox təsir elədi.
Şadlığı mənasız görüb dünyada,
O, meyi, məzəni salmadı yada.
Açıldı səhərin zərrin pərdəsi,
Göründü günəşin gülər çöhrəsi.
Bilik ayinilə İskəndər yenə
Çıxdı öz möhtəşəm şahlıq taxtına[129].
Bir xadim təzimlə gətirdi xəbər
Ki, gəlib hüzura Hinddən bir nəfər.
"Şaha deyilməli sözüm var", deyir,
Şahın hüzuruna izin istəyir.
Eşitcək, buyurdu ona İskəndər
Ki, muğu Günəşə tez yetirsinlər[130].
Şahın əmri ilə göstərib hörmət,
Elçini saraya etdilər dəvət.
Ədəblə, ərkanla, o muğ əyildi,
Atəşin önünə təzimlə gəldi[131].
O parlaq günəşi taxt üstə görcək
Ona səcdə etdi atəşpərəstlək:
Şahın fərmanıyla xidmətçilər də

Onu oturtdular layiqli yerdə,
Məclisdə yerdən ta göylərə qədər
Hər şeydən çox şirin söhbət etdilər.
Hər kəs bacardıqca ürək sözünü
Deyib göstərirdi orda özünü.
Növbə o hindliyə yetişən vaxtda
Təzə gül açıldı köhnə budaqda[132].
Elə sirli sözlər dedi məclisə
Ki, məlum deyildi onlar heç kəsə.
Nurdan bəzək vurdu fələk bağına,
Dürdən sırğa asdı yer qulağına[133].
Elə səna etdi o müğ padşaha,
Sanki işıq saçdı bütün bargaha.
Hindli sənasını tamam elədi,
Sözün pərdəsini açaraq dedi:
"Pərvanə zülmətdə yanan çırağa
Uçantək, gəlmişəm mən də bu bağa[134].
Bəlkə çıraq mənə dostluq göstərə,
Bu tutqun könlümə bir işıq verə.
Mənəm hindlilərə rəhbər, pasiban,
Bədəncə qocayam, fikircə cavan.
Mənim başıbağlı çox sözlərim var,
Onları şərh edən az-az tapılar.
Deyirlər: dünyada hər elmi bilən,
Bilik dövranının başçısı sənsən.
Bir sapa düzülmüş gövhərdir əqlin,
Müşkül düyünlərə açardır dilin.
Həm taxt sahibisən, ucadır taxtın,
Həm bilik vermişdir sənə öz baxtın.
Sorğuma düz cavab alarsam səndən,
Günə sitayişdən əl çəkərəm mən.
Yox, cavab almasam suallarıma,
yollanıb gedərəm öz diyarıma.
Bircə şərtim vardır, ərz edim sizə,
Heç kəs qarışmasın söhbətimizə.
Mən bir-bir soruşum, sən də ver cavab,
Ancaq ki, xoşluqla etgilən xitab".
Şah dedi: "Bəhanə axtarma nahaq,





Aç sirri, sual ver, biz qulaq asaq!"
Hindli təzim ilə yeri öpərək,
Sıyırdı dilini hind qılıncıtək.
Şahı layiqincə tərif elədi,
Dünya işlərindən söz açıb dedi:
"De, nə cür ayrılsın ruh bədənimdən,
Qovuşum allaha hansı yolla mən?
Bilirəm, yaradan birdir dünyanı,
Harda tapmaq olar bəs yaradanı?
Özü gizlindədir, nişanı aşkar[135],
O bağlı qapını mənə kim açar?
Mənalar sahibi olan o vücud
Hardadır, yerdəmi, göydəmi mövcud?
Təsəvvür etməkmi, görməkmi olar?
Hardadır, nə deyim, əgər sorsalar?
Yerdəmi, göydəmi, hardadır, deyin.
Onun varlığını isbat eyləyin!"
Şah dedi: "Cavabı belədir bunun:
Bu söz həm qısadır, həm də çox uzun.
Özündən üzünü çevirən zaman
Allahın yolunu tapmış olarsan!
Ona yer axtarmaq doğru sayılmaz,
Yeri yaradanın öz yeri olmaz.
Heç kəs aça bilməz onun sirrini,
Tapmaz düşüncə də əsla yerini.
Düşüncə göz ilə görülə bilən
Şeylərə yol tapar, belədir əslən!
Allahı xəyalda olmaz axtarmaq,
Xəyaldan doğan şey divlərdir ancaq[136].
Bir şeyin əslinə çatarsa xəyal,
Onun yaranması deyildir mahal.
O şey ki, sığmayır insan ağlına,
Dünyanı yaradan deyirik ona.
Bu yolu qəflətlə getmək yaramaz,
Bulud örtər Ayı, göz yumsan bir az.
Haqqı tanımaqçın bəsdir bir nişan.
Bura yetişdinmi, daha dur, dayan![137]
Haqqı tanımaqçın bunlar deyil az,

Allahı tanıyan bu həddi aşmaz.
Bu sirli pərdəyə nə lazım daha
Axtarmaq ibtida və ya intəha?"
Şahın cavabını hindli dinlədi,
Yenidən suallar verərək dedi:
"Bu yerdə, bu göydə nə varsa, əlbət,
Bütün mövcudata var bir nəhayət.
Bəs bu kainatdan, de görüm, kənar
Başqa bir aləmə gedən yolmu var?
Var isə, nə üçün bilmir heç bir kəs?
Yox isə yoxluğa heç bir yol getməz."
Şah dedi: "Köhnədir bu məsələlər.
Təzə bir söz söylə, varınsa əgər.
Bu yerdən, bu göydən kənar çıxma sən,
Yoxsa sərіştəni lap itirərsən[138].
Bizə yeddi hüdud çəkmişdir fələk,
Onlardan kənara çıxmayaq gərək[139].
Bundan çıxma kənar, həddini tanı,
Qılınc, teşt gözləyir kənar çıxanı[140].
Bu uca barigah - uca bir hasar,
İçində əsirdir bütün xəyallar[141].
Aşa bilməz ikən onu fikirlər,
O yandan nə cürə gətirər xəbər?
Bunu həll etməkçin var bircə düstur:
Əqildə görünməz şeyə yer yoxdur!
Görünməz bir şeyi düşünsən əgər.
Hər səyin, zəhmətin gedəcək hədər.
Bir çox adamları gözlə görmədən
Təsəvvür elədim xəyalımda mən.
Ancaq həqiqətdə rastlaşan zaman
Gördüm ki, başqadır tamam o insan.
Üstüörtülü bir başqa cahan var,
Orda mümkün olar bu axtarışlar."
Hindli yenə sordu o hökmdardan:
"Nə üçün ikiyə bölünmüş cahan?
Bu cürə bəzəkli bir dünya varkən,
Bir də başqa dünya axtarmaq nədən?
Yaşamaq olursa burada mümkün,





Başqa bir dünyaya köçmək nə üçün?
Əgər orda isə bizim yerimiz,
Əvvəlcə bəs bura neçün gəldik biz?"
Əqilli şah dedi: "Bil, ey sadədil,
Öyrən, könlündəki o tozları sil!
Düzdür, iki dünya yaratmış xuda.
Xəzinə ordadır, açarı burda.
Çalışıb nə əksən bu dünyada sən,
Onun məhsulunu orda biçərsən.
Burda bütün şeylər dəyişir hər an.
Orda əbədidir hər şey, hər zaman.
Yaradan çəkmişdir iki cür pərgar:
Burda zəhmət çəkən orda əcr alar.
Bura bir körpüdür, keçmək gərəkdir,
Sel axıb dənizə töküləcəkdir.
Dağlardan süzülüb axan hər bulaq
Dənizə qovuşar axırda ancaq."
Qoca hindli yenə soruşdu ondan:
"Nədir bu bədənə həyat verən can?
Onu atəş kimi zənn edirəm mən,
Oddan bir şərarə almış hər bədən.
Can da ölüb gedir, sönür atəştək,
Buna şəkk-şübhə olmaya gərək?"
Bu sözdən od tutdu sanki İskəndər,
Saldı o hindliyə odlu bir nəzər,
Dedi: "Əhrimənlik sənin şanındır,
Oddan törənən can sənin canındır.
Yoxsa bilmirsənmi, can etsə səfər,
O yenə gəldiyi məkana dönər?
Atəşdən olsaydı insanın canı,
Cəhənnəm olardı onun məkanı.
Deyirsən: can dəxi çıraqtək sönər.
Qələtdir tamamən dediyin sözlər.
Uca bir aləmdən gəlmiş bizə can,
Yenə ora dönər, ölməz heç zaman!
Canını tapşıran adam üçün, bil,
"Can verdi" deyərlər, "can öldü" deyil.
Əlbəttə, bu sözdə vardır həqiqət,

"Verməklə" "ölməyin" fərqi var, əlbət.
Keç ondan, o qüdsi bir işıqdır, pak.
Allahın nurudur, nə sudur, nə xak!"
Hindli bir söz atdı yenə ortaya,
Soruşdu ondan ki: "Bəs nədir röya?
İnsan yatan zaman yuxu görərkən
Nədir xəyalına qol-qanad verən?
Dağları, daşları gəzir röyada,
Min cür sərgüzəştlər görür dünyada.
Əgər orda isə röya görən kəs,
Yerində sərilib yatan kimdir bəs?"
Acıqla söylədi ona hökmüdar:
"Röya bir xəyaldır, bədəndən doğar.
Bütün röyaların kökü bədəndir,
Yad deyil, hamısı bu bədəndəndir.
Yuxuda gördüyün canlı, ya cansız,
Sənin öz şamının odudur yalnız[142].
Sənə öz düşüncən göstərir yuxu,
Sənin öz arzundur onların çoxu.
Bilmək istəsən ki, neçin arzular
Yatmış bir adama görünür aşkar?
Hər qeyddən asudə olanda xəyal,
Ona gizlin qalmaz artıq heç bir hal.
Riyazət çəkənlər, bilmirsən məgər,
Ayıqkən ən gizlin sirləri bilər.
O sirr ki, başqası görər röyada
Onlar ayıq ikən görər dünyada."
Hindli yenə şahdan sual elədi,
Gövhəri almazla deşərək dedi:[143]
"Pis gözdən sən uzaq olasan, ey şah,
Gəl elə bir məni pis gözdən agah.
Necə bir qüvvədir, söylə, bəd nəzər
Ki, öz sevdiyini gözə gətirər?
Təcrübə sahibi, müdrik bir insan
Ondan daha pis şey görməyib, inan!
Bəyənilən şeyi görsə xoşnəzər,
Ona gözəl şeylər əlavə edər.
Hər şeyi bəyənsə bədnəzər, ancaq





Onu tələf edər, qoymaz qala sağ.
Biz hansı peşəni etdiksə tədqiq,
Görmədik bir sözü, əməli dəqiq.
Birce o bəd nəzər oxunu atan
Dümdüz nişanəyə vurur hər zaman.
De görək bir, nədir ondakı qüvvət,
Neçin üzərriklə dəf olur afət?
Nə bilim, birinə rast gəlsəm əgər,
O qəlbitəmizdir, yoxsa bədnəzər?"
Şah dedi: "Düşünüb alimlər incə,
Bundan çıxarıblar belə nəticə:
Şübhəsiz, hər şeyə düşərsə nəzər,
Havadan keçərək eləyər əsər.
Bu zaman havayla birləşir, yəqin,
Odur ki, təsiri artır nəzərin.
Dəydiyi nöqtəyə göz salar bir iz,
Hava da o yerə bir yol tapar tez.
Əgər sağlam olsa hava bu zaman,
Dəydiyi şeylərə yetirməz ziyan.
Yox, əgər olarsa havada zəhər,
Dəydiyi hər şeyi yəqin məhv edər.
Göz, dəyən hər şeyə tək özü deyil,
Havayla birlikdə zərər verir, bil.
Zənnimcə, burda bir başqa sirr də var.
O hələ bizlərə deyildir aşkar:
Bədnəzər tək özü eləməz təsir,
Səbəbkar - qarşıda cilvələnəndir.
Bədnəzər, önündə gözəl şey görcək,
Ona nəzər salıb cəza verəcək.
Gözəl şey olmalı ondan uzaqda,
Yolundan gözündən daim iraqda.
Gözünə görünsə bir gözəl surət,
Öz çirkin işinə başlar o əlbət.
Hər kim xoş görünsə gözünə onun
Tez tələf edər ki, olmasın məftun.
Birinə bəd nəzər dəyərsə əgər,
Dəyişər əhvalı, tez-tez əsnəyər.
Bədnəzər olarsa əgər bir insan

Alnı hərarətdən tərlər çox zaman.
Bu iki ələmət aydın göstərər:
Kimdir gözə gələn, kimdir bədnəzər.
Üzərrik yaxarlar göz dəyən üçün,
Od yaxıb-yandırar dərdi büsbütün.
Başqa alim isə belə şərh edir:
Üzərrik yananda tüstüsü gedir,
Qara pərdə kimi tutur havanı,
Qaytarır, rəf edir gələn bəlanı."
Rumipərəst hindli doymaq bilmədi.
Öz hind qılıncını çəkərək dedi:[144]
"Yaxşını, yamanı, deyin, nə təhər
Verir qabaqcadan münəccim xəbər?
Bir əməl ki, üzə çıxmayıb hələ,
Xoşluğu, bədliyi gələrmi dilə?"
Diqqətlə yetirib hindliyə nəzər
İlahi kəlamla dedi İskəndər:
"Dünyada nə varsa - yaman və yaxşı,
Göylərin tağına çəkilib naxşı.
Münəccim rəmlini atdığı zaman,
Taleyin naxşını oxuyur ordan.
Zəmiyə səpilmiş toxumun bir-bir
Necə bitməsini bilir, bildirir.
Bizə üz verəndə bir gün ehtiyac,
Eldir dərdimizə yaradan əlac.
Baxıb arzumuza, istəyimizə,
Açır qədərincə sirləri bizə,
Göndərir bir mələk, əlində açar,
Edir gizli sirri bizlərə aşkar."
Hindli bu şərabdan məst olub qaldı[145],
Nəhayət, qılıncı əlindən saldı.
Sordu ki: "Zənciylə çinli nə sayaq
Biri qara olmuş, o birisi ağ?
Bu küpdə olan rəng yalnız bircədir[146],
Bəs bu ikiliyin səbəbi nədir?"
Şah dedi: "Hərlənən bu kürə, əslən
Özü ikirəngdir, birrəng bilmə sən.
Güzgütək iki üz vardır günəşdə,





Bir üzü Çindədir, biri Həbəşdə.
Bir üzü eləyər üzü aypara,
Bir üzü eləyər kömürtək qara!"
Hindli sualların cavablarından
Qalmışdı şahdakı biliyə heyran.
Ona təslim olub diz çökdü yerə,
Şahın da ucaldı başı göylərə.
Çox şükür eləyib böyük allaha,
- Afərin! - dedilər alimlər şaha.

## İSKƏNDƏRİN YEDDİ ALİM İLƏ XƏLVƏTƏ ÇƏKİLMƏSİ

Müğənni, çal yenə qədim havanı,
Kömək et, bitirim mən bu dastanı!
Dünya dastanından bəlkə birtəhər
Canımı qurtarım, bitsin bu əsər...
Biri nəql edirdi filosoflardan:
"Şaha xoş göründü bu qoca dövran.
Mübarək bəxtindən gəlib hümmətə,
Bol dövlət payladı el-camaata.
Bəxşişin hüdudu, həddi olmadı,
Rumda bir nəfər də yoxsul qalmadı.
Şahlar baş əydilər ona cahanda,
Durdular hamısı qultək fərmanda.
O xoşbəxt padişah bir səhər yenə
Çıxaraq firuzə rəngli təxtinə,
Söhbətə başladı insafdan, dindən,
Dürr, gövhər saçdı söz xəzinəsindən.
Padişah son qoydu şirin söhbətə,
Meyl edib çəkildi yenə xəlvətə.
Kimsənin qəlbinə heç toxunmadan
Yeddi filosofu seçdi bu zaman:
Ərəstu - tədbirli bir vəzir idi,
Bəlinas - cavanmərd, Sokrat - pir idi.
Valislə Əflatun, bir də Fərfuryus -
Heyrandı bunlara o ruhulqüdüs[147].

Yeddinci Hürmüzdü, bilir ki, hamı
Yeddinci göydədir onun məqamı.
Yığışdı dövrəyə bu yeddi pərgar,
Nöqtətək mərkəzdə şah tutdu qərar.
Gözəl bir məclisdi, fikirlər parlaq,
Quru təkəbbürdən, badədən uzaq.
Bu məhrəm məclisdə alnıaçıq şah
Fikrindən onları eylədi agah.
Dedi alimlərə sirri açaraq:
"Sirrimiz nə qədər gizlin qalacaq?
Çox gecə keçirdik biz kef edərək,
Gəlin, bir günü də elmə sərf edək!
Bircə gün baxaraq Günəşə, Aya,
Fələyin sirrini qoyaq ortaya.
Bilək ki, bu öküz belitək çadır
Bu möhkəm yer üstdə necə dayanır?
Əvvəlı necəymiş bu göyün, yerin,
Bu haqda fikrini hamı söyləsin!
Ağıla, idraka bir vəzifədir,
Bilsin ki, dünyada ilk tərkib nədir.
Bu yeni əskiltmə və artırmalar
Yoxluqdan nə cürə olmuş aşikar?
Əzəldən nə olmuş xilqətə bais?
Bunu ulduzlardan tədqiq edək biz.
Belə elmi məclis yığılar az-az,
Daha bir də belə məclis yığılmaz.
Görək bu yollarda kim yeyin gedər?
Görək xəzinəni kim tez kəşf edər?
Hərə öz fikrini atsın ortaya,
Necə yaranmışdır, desin, bu dünya?
Onda ki, hökm etmiş uca yaradan,
Əvvəl yer yaranmış, yoxsa asiman?
Qoy açsın bu sirri ağlın açarı:
Necə çiçəklənmiş yerin baharı?[148]
Necə qoyulmuşdur bina əzəldən?
Necə səslənmişdir ilk mahnı teldən?"
Padişah beləcə dürrlər saçdı,
Bağlı xəzinənin ağzını açdı[149].





Sonra da buyurdu: "Cəsarət edən
Danışsın varlığın ilk tarixindən."
Sarsıtdı onları şahın sualı,
Dedilər: "Cavabı layiq olmalı."
Bir səslə dedilər qərar verərək:
"İlk sözə Ərəstu başlasın gərək!"

## ƏRƏSTUNUN DEDİKLƏRİ

Aydın düşüncəli alim Ərəstu,
Böyük tacidara sənа oxudu,
Dedi ki: "Elm axtar həmişə, ey şah,
Örtülü sirlərdən ol daim agah.
Haqqın köməyilə şad keçsin ömrün,
Olmasın səninçin açılmaz düyün.
Padşahın əmrinə əməl eləyim,
İlk xilqət haqqında fikrimi deyim:
Əvvəl vardı ancaq tək bir hərəkət,
Onu iki yerə ayırdı sür'ət.
Bu iki hərəkət gəlib bir yerə,
Yeni bir hərəkət doğurdu hərə.
Əvvəlki hərəkət ayrıldı yenə,
Bu üçü qoşuldu biri-birinə.
Üç xətt zahir oldu üç hərəkətdən,
Üç dövrə yarandı ondakı xətdən.
Mərkəzdən ayrıldı həmin dövrələr,
Yaranıb ortaya çıxdı bir cövhər.
Cövhər keşməkeşdən doğub parladı,
"Hərəkət eləyən cism" oldu adı.
Həmin cism qərar tutmayıb bir an
Dönür, hərlənirdi əsla durmadan.
Bu cismin parlayan saf parçaları
Həmişə qaçırdı mərkəzə sarı
Yüksəyə uçanlar etdi hərəkət,
Aşağı enənlər tapdı sükunət.
Parlaq cism hərəkət etdikcə belə,
Ondan parlaq göylər gəldi əmələ.
Göydə meyl edərək öz mərkəzinə

Onun ətrafında hərləndi yenə.
Əvvəlki meylinə bağlı qalaraq,
O, daim hərəkət etdi bu sayaq.
İlk pərgar hərlənib dövr edən zaman
Bu uca göylər də yarandı ondan.
Göyün gərdişindən od oldu aşkar,
Od hərəkət edən qüvvədən doğar.
Odun qüvvəsindən hava yarandı.
Hava istilikdən od kimi yandı.
Havada rütubət bol idi əslən.
Rütubət hərəkət etmədiyindən,
Onun zərrələri çöküb su oldu,
Bu cürə yarandı təmiz, şirin su.
Xılt saldı su daim sakit duraraq,
O xıltdan törədi gördüyün torpaq.
Dörd ünsür yaratdı o pərvərdigar,
Hərə öz yerində oldu bərqərar.
Qatdı bir-birinə onları həyat,
Yaratdı bunlardan bitki, nəbatat.
Bitki də başqa cür artdı, dirçəldi,
Cürbəcür heyvanlar vücuda gəldi.
Bu qədər dərk edir ağıl hikməti,
Uzağa getməyə yoxdur qüdrəti!"

## VALİSİN DEDİKLƏRİ

Alim Valis dedi: "Padşah hər zaman
Bu qoca dünyada yaşasın cavan!
Bilik təlimində bəxti yar olsun,
Elm yollarında daim var olsun!
Şahlar şahı özü verdi ki, fərman:
Hər kəs bildiyini eyləsin bəyan.
Mən də ərz eləyim: dünyaya təməl,
Məncə, su olmuşdur hər şeydən əvvəl.
Qızğın hərəkətdən və çaxnaşmadan
O yerə çatdı ki, od oldu əyan.
İldırım buxardan ayırdı odu,
Bundan rütubətli hava doğuldu.





Suyun qatılığı getdikcə artdı,
Həmin qatılıq da yeri yaratdı.
Cövhərlər yerbəyer olduğu zaman,
Təbiət qoynunda yarandı cahan.
Ən saf və ən lətif cüzündən onun
Yaranıb hərəkət elədi gərdun.
"Sudan bu kainat yarana bilməz",
Deyə inkar etmək istəsə hər kəs,
Nütfəni bir anlıq qoy salsın yada,
Sözümə sübutdur, dəlildir o da!"

## BƏLİNASIN DEDİKLƏRİ

Bilici Bəlinas təzim elədi,
Torpağı öpərək hörmətlə dedi:
"Ey şahım, görüm ki, dünya durduqca
Allahın yanında olasan uca!
Yar olsun əqlinə hər bilik, hər sirr,
Gözü nur, nuru göz ziynətləndirir.
Şah gizli sirləri soruşdu bizdən.
Fikrimi hüzura ərz eləyim mən:
İlkin tilsim kimi yaranmış torpaq.
Qalan tərkiblər də ondandır ancaq.
Hərəkət qüvvəsi ona etdi kar,
Atəşi söndükcə yarandı buxar.
Onun da ən parlaq zərrələrindən
Ulduzlar yaranmış, - fikrindəyəm mən.
Buxarda vəzncə ağır olanlar
Hərə bir mərkəzdə tuturdu qərar.
Onlardan birinci - işıqlı oddur,
Dünyanın ən yüksək tağı da odur.
İkinci - havadır, hərəkətdədir,
Hərəkət etməzsə, bilinməz nədir.
Üçüncü - sudur ki, təravət verər.
Hər şeyə təzəlik, lətafət verər.
Dördüncü - torpaqdır, tapdayır əyyam.
Tapdanan köksündən toz qalxır müdam."

## SOKRATIN DEDİKLƏRİ

Sokratın növbəti yetişən zaman
Sanki xurma yağdı yerə ağacdan,
Dedi ki: "Padişah, şadlıqla ömr et.
Din-bilik yolunda daim öndə get!
Sənə şikar olsun bütün arzular,
Sirrlər qarşısında daim aşikar.
Şahın sorduğunu kim deyə bilər?
Çünki çox gizlindir sorduğu sirlər!
Kim necə bacarır fikir söyləsin,
Varını hüzura təqdim eyləsin.
Xilqət səhifəsi açılmamışdan
Bircə vücud varmış, o da yaradan.
Bir bulud yaratmış əzmi, cəlalı,
Şimşəyi, yağışı olmuş faydalı
Onun yağışından yaranmış göylər.
İldırımından da günəş, ay, ülkər.
Maddələr çökdürüb ondakı buxar,
Bu yeri yaradıb etmiş bərqərar!"
Bələdçi getmədi bundan o yana,
Artıq danışmaqda görmədi mənə.

## FƏRFURYUSUN DEDİKLƏRİ

Alim Fərfuryus da təzim eylədi.
Torpağı öpərək belə söylədi:
"Ey şah, ömr edəsən durduqca dövran,
Bütün dövranların şahı olasan!
Dünya boş qalmasın ədalətindən,
Çünki zülmü, qəhri qəhr eləyənsən.
Haqsevən padşaha cavab olaraq,
Ərz edim fikrimi mən də bu sayaq:
Hələ bu dünyalar yaranmamışdan
Bir cövhər yaratdı böyük yaradan.
Tanrının feyziylə yetirdiyi bu.
Cövhər bir müddətdən dönüb oldu su.
İkiyə bölündü sonra bu su da.





Yarı üzdə qaldı, yarısı altda,
Bunlar andırırdı müşkü, kafuru,
Yarısı mayedi, yarısı quru[150].
Maye olan hissə etdi hərəkət,
Quru olan isə tapdı sükunət.
Hərəkət eləyən - göy oldu, parlaq.
Sükunətdə qalan - bu yer, bu torpaq.
Mənim də bildiyim bunlardır ki, var,
Düşüncəm çıxmayır bu həddən kənar."

## HÜRMÜZÜN DEDİKLƏRİ

Hürmüz də əl atdı qıfıla sarı[151],
Zənciri çeynədi əqlin açarı.
Düyünü açmadan əvvəl sıdq ilə
Şaha dua edib başladı belə:
"Açıla biləcək hər düyünə sən,
Görüm ki, əql ilə üstün gələsən!
Fələk istəyincə eləsin rəftar.
Şadlığın əbədi olsun payıdar!
Padşah hər budağın söz baharından
Lütf edib bir meyvə istəyirsə, mən.
Əlbəttə, çıxmaram belə fərmandan,
Mən də öz fikrimi eləyim bəyan:
Düşüncə yoluna düşəndən bəri
Seyr etdim firuzə rəngli göyləri.
Zənnimcə, bu dərya şövkətli göylər
Dağ başına çökən tüstüyə bənzər.
Bu qorxunc tüstünün üstündə ancaq
Bir elə nur var ki, pak, təmiz, parlaq.
Örtmüşdür o nuru tüstü pərdəsi,
Şan-şan görünmədə tutqun çöhrəsi.
Pərdəyə nəqş olan pəncərələrdən
İşıqlar süzülür cahana hərdən.
Bizim gördüyümüz Gün, Ay, ulduzlar
Həmin işıqdandır bütün hər nə var.
Vardır bu xilqəti yaradan, fəqət,
Bilmirəm nə sayaq olmuş ilk xilqət."

## ƏFLATUNUN DEDİKLƏRİ

Əflatun, o ustad, qəlbini açdı,
Dəniztək gövhərlər, dürrlər saçdı:
"Aydın düşüncəli dünya şahından
Dünyada heç bir sirr qalmasın nihan.
Bəxti hər bir işdə ona yar olsun,
Qurtuluş yolunda daim var olsun!
Şahın soruduğunu deyərik şəksiz,
Amma idrakından çəkinirik biz.
Heç yoxdur qorxumuz yanlış sözlərdən,
Çünki bəhs edirik naməlum yerdən.
Düşünüb mən belə verirəm qərar
Ki, yoxdan yaranmış bütün varlıqlar!
Vardan yaratsaydı varı yaradan,
Əbədi qalardı mayə hər zaman.
Mayədən doğurmaq - yaratmaq deyil.
Kəndxuda başqadır, xuda başqa, bil!
Bir kəs ki, əql ona ad verib: Qadir,
Özü bildiyini özü xəlq edir[152].
Ayrıca yaradıb o, hər gövhəri,
Vasitə olmayıb burda digəri.
Hər gövhər bəzənib kəmala yetdi,
Ortadan ixtilaf, ziddiyyət getdi.
Bu zidd qüvvələri bir yerə qatdı,
Ağıllı, hünərli insan yaratdı[153].
Bircə qarışqanın qanadında sən
Tanrı qüdrətini görə bilərsən!"

## İSKƏNDƏRİN DEDİKLƏRİ

Məclisi xətm etmək məqamı çatdı,
Şah sözün qədrini Aya ucaltdı.
Aləmə günəşdir böyük İskəndər,
Sinəsi nur dolu bir bağa bənzər.
Dövrəyə alaraq şah İskəndəri,
Işığa gəlmişdi nur aşiqləri.
Müdrik olar isə, əlbət, hökmüdar,





Onun ölkəsində müdrik çox olar.
Alimlər deyəni bir-bir eşitdi,
Hər camı ayrıca alıb nuş etdi[154].
Həmin alimlərə əvvəl İskəndər
Allahdan dilədi çox afərinlər,
Sonra söylədi ki: "Ey alimlər, mən
Kainat sirrini xeyli dərindən
Düşündüm, boş, əbəs deyil bu surət,
Əzəldən onu bir çəkən var, əlbət!
Bilirəm, gizli bir rəssam var, ancaq
Bilmirəm bunları çəkmiş nə sayaq?
Bilsəydim bunları necə xəlq etmiş,
Mənim də əlimdən gələrdi bu iş.
Düşüncə qavrasa bir şeyi əgər,
Şübhəsiz, özü də onu düzəldər.
Xilqətin sirrini kəşf etməmiş biz
Tədqiqə çatarmı heç qüdrətimiz?
Göylərə: yazılı vərəq dediniz,
Ayrı cür oxudu fəqət hərəniz.
Dünyanın nəqşini bir nəqş edən var,
Bundan artıq demək mənasız olar!"

## NIZAMİNİN DEDİKLƏRİ

Nizami, bu qapı açar götürməz,
İlk nəqş bağlananda görməyib heç kəs[155]
Böyük yaradıcı, nə olsa, ancaq,
Hər nə yaratdısa hündür ya alçaq,
Ən əvvəl, şübhəsiz, əqli yaratdı,
Onu öz nuruyla o, aydınlatdı.
Hər nəqşə çəkdisə qadir yaradan,
Əqlin nəzərindən etmədi nihan!
Yalnız ilk nəqşəni gizli nəqş etdi,
Əqlin gözündən də onu gizlətdi.
Ilk xilqət nəqşini qurtarıb, qəsdən
Açdı o pərdəni əqlin gözündən.
Sonra nə xəzinə oldusa aşkar,
Açmaqçın bəxş etdi əqlə bir açar.

Yalnız o ilk hesab qaldı gizlində,
Onda pərdə vardı əqlin gözümdə,
Əqlə aşkar oldu başqa hər nə var,
Nə zaman istəsə, ora yol tapar.
Əqlə bağlı olan o yoldan amma
Danışma, əqildən o yolu sorma.
Əql ancaq elə bir-yerə yol tapar
Ki, bilsin nə qədər məsafəsi var.
Qeyb yolu əqldən hədsiz uzaqdır,
Əql ora nə sayaq yol tapacaqdır?
Əqilli adamdır dünyada o kəs -
Gözü görməyəni qəbul eləməz!
Sənət sənətkarı nişan verəndə,
Bağlama sən ona başqa bir pərdə.
Sözə bax, mindiyi çolaq heyvanla
Uçrumdan, gör, necə çıxıbdır yola,
Yalçın qayaları dağıdıb əzən,
Lacivərd göylərin qoynunda süzən
Xızr adlı o hatif birdən səsləndi,
Salam verib göydən yanıma endi.
Mülayim bir səslə söhbət eylədi,
Beynimə sözlərlə nur saçıb dedi:
"Bu gizli sözləri, fikirləri sən
Neçin lal dillərə isnad edirsən?[156]
Sən neçün bu sərvi becərib belə,
O filosoflara verirsən, söylə?
Bu incə sözlərin sahibi sənsən,
Quru sümüklərə verirsən nədən?
Yemə çörəyini yad süfrələrdə,
Öz süfrən üstünə gəl çəkmə pərdə"[157].
Dövrün kişiləri nakişidirlər,
Elmə yox, nücuma həvəs edirlər.
Mərhəmət umarlar qara torpaqdan,
Torpaqdan yaxşıdır ancaq sağ insan[158].
Hoqqabaz torpaqda sehirbazlıq var,
Həm möhrə oğurlar, həm də oynadar[159].
Ovcunda gizlədər möhrəni, birdən,





Sonra da ağzından çıxar görərsən.
Zərnixi, görərsən, udar sapsarı,
Göy-yaşıl rəngində çıxar dişarı.
Qupquru ud yeyər torpaq xəzanda,
Ətirli müşk verər bahar olanda.
İnsan bədənini udanda ancaq,
Bilmirəm nə sayaq o qaytaracaq?
Torpaqda çürüyən bədənlərimiz
Dağıdır, dəyişir, yox olmur təmiz.
Yerində qalarsa o dağıntılar
Bir yerə yığanda yenə canlanar.
Torpağa tökülən şeylər tamamən
Torpaqdan dirçəlib qalxar yenidən.
Qızıl toz halına gələrsə əgər,
Civəylə onları cəm edər zərgər.
Dağınıq qızılı mahir sənətkar,
Madam ki, civəylə bir yerə yığar,
Bizim də əczamız dağılsa bir gün,
Onu da cəm etmək mümkündür, mümkün!

## İSKƏNDƏRİN PEYĞƏMBƏRLİYƏ YETİŞMƏSİ

Müğənni, çal rudu, çal səhər erkən,
Mərdlik nəğməsini gətir yada sən!
Oyandır məndə də nəğmə həvəsi,
Duymayım bihudə, bimənə səsi.
Yenə bir filosof dərinə getdi,
Rumun tarixindən belə nəql etdi:
O dünya padşahı - böyük İskəndər,
Uca ulduzlara o uca rəhbər
Elmdə o qədər oldu ki, pərgar
Əqli hər müşkülə saldı bir açar.
Bir çox viranənin örtdü üstünü,
Açdı neçə-neçə bağlı düyünü.
Sirli elmləri İskəndər qədər

Yoxdu bu dünyada bilən bir nəfər.
O, Rumun, Yunanın alimlərindən
Hər elmi öyrəndi möhkəm, dərindən.
Daha ulduzları göydə güdmədi,
Tamam başqalaşdı onun məqsədi.
Başından lovğalıq tacını atdı,
Öz başı allahın tacına çatdı.
Bir də yaranışı araşdırmadan,
Axtardı, bilsin ki, kimdir yaradan.
İstədi çalışıb sirləri örtən
Yeddi qat sürməni silsin tamamən[160].
Onu olduğutək görmək istədi,
Əlçatmaz arzuya irmək istədi.
Gecəli-gündüzlü bir xeyli müddət
Düşündü, parladı bəxti nəhayət.
Bir mələk göndərib bir gecə allah
Etdi o bihuşu özündən agah.
Ətrafa nur saçan parlaq günəştək
Yalan vəsvəsədən uzaq bir mələk
Parlaq gövhər saçdı şah hüzuruna,
Allahın vəhyini yetirdi ona:
"Bu saysız dağlarcan, coşğun çaylarcan
Alqışlar göndərdi sənə yaradan!
O səni dünyada şahlıqla birgə
Ləyaqətli bildi peyğəmbərliyə.
Sən allah əmriylə şah olduğundan,
İndi də belədir allahdan fərman:
Haqqın dərgahına baş əyim, deyə,
Söylə ki, son qoydum asudəliyə.
Fələktək dünyanın başına hərlən.
Azğını, vəhşini əhliləşdir sən.
Xalqı pis yollardan et haqqa dəvət,
Onlar da allaha etsin itaət.
Təzələ kökündən köhnə binanı,
Təmizlə qəflətdən bütün dünyanı.
Cahanı divlərin zülmündən qurtar,
Dünyalar şahına ol itaətkar!





Bütün yatmışları yuxudan oyat,
Əqlin üzündəki o nıqabı at!
Allah tərəfindən yoxsullara sən
Verilmiş mərhəmət xəzinəsisən.
Dünya pərgarını gəz diyar-diyar,
Səndən xeyir görsün bütün insanlar.
Bu dünya mülkünə özünsən ağa,
Çalış o dünyanı ələ almağa.
Bu yolda zəhməti qəbul edərək,
Allah rizası güd, xeyrindən əl çək!
Nə hörmətin varsa canlıya göstər,
Cansızçın vaxtını eyləmə hədər.
Canlıdan dəyərsə sənə bir ziyan,
Zəncirlə, məhv elə, heç vermə aman!"
İskəndər mələyə xitab eylədi:
"Ey müdrik ilhamçı, ey mələk, - dedi, -
Dinləyib o böyük pərvərdigarı,
Gərək tərk eləyəm mən bu diyarı.
Məşriqdən məğribə hücum çəkərək
Xalqları yuxudan oyadam gərək!
Ellərin dilini əsla bilmədən,
Onlarla nə cürə danışım bəs mən?
Nə sayaq bilim ki, nə deyir onlar?
Qarşımda hələ çox maniələr var...
Birisi budur ki, bu çətin səfər
Orduda vahimə törədə bilər.
Bir də ki, qoşunla səfər edərkən
Dağları, çölləri necə keçim mən?
Bu qədər zillətə edərlərmi tab?
Nə cürə onlara mən verim əzab?
O korlar ardımca gəlməsə əgər,
Kar olub sözümü eşitməsələr,
Mən yad ölkələrdə o kar-korlara
Nə əlac eləyim, varmı bir çara?
Əgər peyğəmbərlik fikrinə düşsəm,
Xalqı cəlb etməkçin hanı möcüzəm?
Hanı bir möcüzə, eləsin kömək,

Mənə inansınlar onu görərək?
Əvvəl yeriməyi öyrədib mənə,
Sonra da getməyi tələb etsənə.
Elmi dərya kimi çox insanların,
Zəkayla, biliklə tox insanların
Sarsıtmaq mümkünmü heç vüqarını?
yox etmək olarmı iqtidarını?"
O vəhyi gətirən xeyirxah mələk
Dedi, İskəndərə xitab edərək:
"Rəvandır hər əmrin, hökmün cahana,
Həm gizli, həm aşkar, bil ki, hər yana.
Qərbdə bir tayfa var, özü köçəri,
Nasikdir adları, yoxdur dinləri.
Şərqdə bir tayfa var, xislətdə mələk,
Onlara layiqdir Mənsək ad vermək[161].
Dəryatək cənubda bir tayfa yaşar,
Habildən törəyib qalmışdır onlar.
Şimalda bir tayfa salmışdır məskən,
Mütilik onlara qalmış Qabildən.
Başlayan zamanda uzaq səfərin,
Düşəcək qaraya, ağa güzərin.
Nasikdən Mənsəkə çək qoşunları,
Keç sonra Habildən Qabilə sarı[162].
Hamısı hökmünə, yəqin, baş əyər,
Başından keçərlər baş əyməyənlər.
Hər başçı ayağın heç ola bilməz,
Səni əvəz etməz dünyada heç kəs!
Aytək, Müştəritək gecə nur saçan
Parlaq bəxtinlə sən bir şəbçıraqsan.
Ucadan düşəndə işığın sənin
Açılar qapısı hər xəzinənin.
Yola çıxanda ol hər şeydən agah,
Səni hifz edənə apar sən pənah.
Hansı bir niyyətlə minsən atına,
Köməklər köməyi çatsın dadına!
Dünyada özünə, orduna əsla
Nə bir zərər dəysin, nə də bir bəla.





Nabələd yollarda öndən, arxadan
Keşikçin olmalı sənin hər zaman.
Səni hara çəksə işıqlı niyyət,
Əmrində duracaq nur ilə zülmət.
Qaranlıq arxanda, nur önündə - sən
Özün görünməzsən, ancaq görərsən.
Kim sənə xoşluqla itaət etsə,
Işıq bəxş edərsən sən də o şəxsə[163].
Hər kim lovğalıqla çıxsa qarşına,
Sən də qaranlıqdan bir pay ver ona[164].
Qoy bir kölgə kimi zülmətdə qalsın!
Qorxuda, dəhşətdə, zillətdə qalsın!
Bir də ki, atını cilovlayaraq
Nə zaman istəsən bir ölkə almaq,
Qarşına yad tayfa çıxarsa əgər,
Səninlə yad dildə söhbət etsələr,
Qadir köməkçinin ilhamıyla sən
Hər qövmün dilində cavab verərsən.
Dilbilən olarsan hər bir ölkədə,
Sənə gizlin qalmaz tək bir kəlmə də.
Sən də Rum dilində hər nə danışsan,
Anlar tərcümansız orda hər insan.
Allah bu möcüzü bəxş etmiş sənə,
Qalibsən bununla sən hər düşmənə!"
Şah gördü bu sözdə böyük bir məna,
Söylədi: "Baş əyər bəndə fərmana!"
Qasiddən peyğamı qəbul eylədi:
"Allaha biz müti bəndəyik" dedi.
O gündən hazırlıq gördü səfərə,
Əsla baş qoşmadı başqa işlərə.
Kənar məşğələdən uzaq olaraq,
Səfərə tədarük görürdü ancaq.
Mələk gətirmişdi ona xoş xəbər,
Əlavə olaraq, yenə İskəndər
Tədbirlər öyrəndi hər bir alimdən,
Çatar məqsədinə çox tədbir bilən!
Səfərdə həmişə faydalı olan

Mənalı kəlamlar yığdı durmadan.
Allah tərəfindən gəlmiş mükəmməl
O "Sifri-əzəm"dən başqa üç gözəl
Nəsihətnamə də keçirdi ələ,
Yazdırdı ipəyə qara müşk ilə.
Ərəstu oldu ilk naməni yazan,
O xəbər verirdi yaxşı-yamandan.
İkinci naməni bildiklərindən
Əflatun yazmışdı duyub dərindən.
Üçüncü xəzinə Sokratdan idi,
Qiymətli gövhərlə doluydu içi.
Sözlər bir-birinə rəbt edilərək,
Üç nəsihətnamə tamama yetcək,
Padşah möhürlədi bunları o dəm,
Səhmanla bağlayıb saxladı möhkəm.
Tədbirə ehtiyac duyduğu zaman
Açıb oxuyardı bir-bir onlardan.
O gövhərlə dolu xəzinələrdə
Dərman axtarardı düşdüyü dərdə.
Görsəydi çətindir bir qərar vermək,
Allahın feyzindən istərdi kömək.
O bir gün çıxaraq öz ac-təxtinə[166],
Firuzə rəngli tac qoyaraq yenə, -
Aqil vəzirinə buyurdu belə:
Müti qələmini alaraq ələ,
Elm ilə zəkaya edib riayət,
Yazsın bir faydalı, gözəl nəsihət.
Elə nəsihət ki, dinləsə onu,
Dost bilsin özünə qurd da qoyunu.
Fərmanı dinləyib vəzir hörmətlə,
Təzim edib şaha çıxdı rüxsətlə.
Mədəndən gövhərlər çıxarmaq üçün[167]
Fikrini başına yığaraq bütün,
Diltək itiləyib qələmi, yenə
Qamışdan qənd səpdi kağız üstünə[168].





# ƏRƏSTUNUN NƏSİHƏTNAMƏSİ

Allahın mədhini edib ifadə,
Ərəstu yazmışdı rəhbərnaməda:
"Ey şah, elmə, fənnə sən daim yar ol,
Nadandan, cahildən daim kənar ol!
Bağlı bir qapıya açar axtarsan,
Ancaq alimlərdə axtar, taparsan.
Əgər sahib olsan dövlətə, vara,
Şükr elə bununçün pərvərdigara.
Zəfərlər çalanda, yetəndə kama
Allahın xovfunu yaddan çıxarma.
Allahdan qorxana bəxti yar olar,
Ondan qorxmayanlar daim xar olar.
Səlamət yaşamaq istəsən əgər,
Oda üzərrik at hər gün, hər səhər.
Pis gözə inanma, ondan gəz kənar,
Heç öz gözünə də etmə etibar.
Demiş müdrik qoca belə bir məsəl:
"Gərək yaman gözdən qorunsun gözəl!"
Bir ağac çox uca qalxmasa, inan,
Şiddətli küləkdən görməz bir ziyan.
Ovlaqda ovçular ox atsa əgər,
Dikbaş təkələrə daha çox dəyər.
Hər kəsi ötməkçün çıxanda yola,
Tələsmə, həsədə yol vermə əsla!
Həsəd dərdə salar daim insanı,
İnsana yad edər dostu, aşnanı.
Heç kəsi qaldırma kinlə yerindən,
Qaldırdın, yerə sər arxasını sən!
Biriylə köhnədən olarsa kinin,
Kökünü qazıma onun nəslinin.
Ata intiqamın alma oğuldan,
Çalışıb onunla dost ol hər zaman.
Günəşlə kölgədə çox azdır ara,
Biri işıqlıdır, biri qapqara.
Tikan xurma ilə bir yerdə bitər,
Biri zəhərlidir, biri qənd-şəkər.

Naqqaya qonşudur sədəf dəryada,
Qılınc yox, dürr verir şaha dünyada[169].
Qardaşın qanını alma qardaşdan,
Tamam ayrı şeydir çünki südlə qan[170].
Bir kəsçün özgəni incitmək olmaz,
Qoyunu qoyunun ayağından as!
İstəsən allahdan mərhəmət, kömək,
Pisliyi kökündən atasan gərək!
Pislərlə fələk də elər pis rəftar,
Yaxşılıq görərlər daim yaxşılar.
Həmişə dünyada yaxşılıq axtar,
Yaxşı ad almaqda əbədiyyət var!
Yaxşı adlananla yaxşı ol müdam,
Yoxsa sən özün də olarsan bədnam.
Zatı pis olana üz göstərmə sən,
Qurdu bəsləməkdən ziyan çəkərsən.
Bədgövhər adamla heç addım atma,
Öz təmiz kimyanı küllərə qatma.
Bədəsil olarsa əgər bir adam
Qırmızı gövhəri saraldar tamam.
Ağıllı adamla dost olsan əgər,
Elmi, mərifəti sənə də keçər.
Çox pul qazanmağı eləsən niyyət,
Pulsuz adamlarla etmə məsləhət.
Ciddiyyət gözləmək yüngül adamdan -
Gövhər istəməkdir arpa satandan.
Gur, öküz, ya pələng, - bütün heyvanlar
Ancaq həmcinsiylə gəzər, dolanar.
Nacins olar isə əgər bir nəfər,
Ondan görəcəkdir çoxları zərər.
İki saf güzgünü qoysan üz-üzə,
Onlarda bir ləkə görünməz gözə.
Qorxma acizlərə zülm edənlərdən,
Yoxsa qəm-qüssəyə batarsan hökmən.
İnsana ram olsa aslanlar əgər,
Bunu insafdan yox, qorxudan edər.
Həyasız adama qarşı sərt rəftar
Yumşaq davranmaqdan faydalı olar,





İşini bərk tutan düşməni yoxla.
Yumşaq-yumşaq çağır, tutdun, bərk saxla!
Başı fitnə dolu olarsa hər kəs,
Şirinliklə çağır, iliklə kəs.
İki xam bədxahın birsə qərarı,
Fənd ilə, tədbirlə ayır onları!
Qurd ilə pələngi sal bir-birinə,
Sənin istədiyin yetsin yerinə.
Şah və ya əkinçi,- gözləmə nəsəb,
Özünə görə ver hər kəsə mənsəb.
Güclünün yanına güclünü göndər,
Alimin üzünü alimə döndər.
Göndərdiyin adam işbilən olsa,
Heç öyüd-nəsihət istəməz əsla!
Paslanıb kəsməsə qılıncın əgər,
Qızıl ver, daşları dəmirə döndər[171].
Xəzinə qızılı yığmaq üçündür,
Qızıl da düşməni yıxmaq üçündür.
Quyruqla mümkündür tülkünü tutmaq,
Şirniyə aldanar həmişə uşaq.
Xalqın məclisində mütrübtək şad ol,
Sərvsən, kibrdən, çalış, azad ol[172].
Dünyanı sübh kimi nurunla bəzə,
Camalın səhərtək görünsün gözə.
Bəzəmə özünü sən reyhansayaq,
Özgənin əlində ol nurlu çıraq[173].
Səninçün bir yükdür daim xəzinə,
Dincəlmək istəsən, ver özgəsinə,
Zər ataş deyil ki, daim yığılsın,
Qığılcım kimidir, gərək dağılsın.
Qızıl ya sahibi xoşdur? - Sorma sən,
Düyün bənddən pisdir, bənd də düyündən[174].
Bir gün atəşpərəst soruşdu oddan:
"Söylə, mən yaxşıyam, ya sən yaxşısan?"
O dedi: "İstəsən düzünü bilmək,
Mənə yanmaq gərək, sənə də ölmək!"
Geniş ətəkli ol, çünki meyvələr
Geniş ətəklərə daha çox düşər[175].

Çox yemə, süfrədə hər şey çox da var,
Artıq bir qətrədən qədəh də daşar.
Bir müflis xəzinə tapmışdı həmən
Yıxılıb ölmüşdü sevindiyindən.
Necə susuz olsan, istiyə düşsən,
Tələsik soyuq su əsla içmə sən.
Bir yeri talayıb dağıtmış olsan,
Orda mənzil salıb yatma heç zaman!
Əsla içməyəsən yoxlanmamış su,
İçirt başqasına, yoxla bir onu.
Qəribə görünən meyvəni yemə,
Özünü dərd-qəmə düçar eləmə!
Olarsa birisi yeməkdə loğman,
Saxlar öz nəfsini yad loxmalardan.
Heç kəs getmədiyi naməlum yolla,
Yoldaş çox olsa da, getmə sən əsla!
Çox yaxın olsa da, qorxulu yoldan
Qorxusuz uzaq yol yaxşıdır, inan!
Çox yığıb, yükünü ağır etmə sən,
Qoşunun içində dilə düşərsən.
Əlinə keçərsə əgər qənimət,
Ondan yoxsula da qoy çatsın qismət.
Bir pay ver xəlvəti pay istəyənə,
Allahın rizası bəs edər sənə.
Gizlincə verilən bir bəxşiş, inan,
Hifz edər insanı dərddən, bəladan.
Orduya nə versən, rütbəylə payla,
Yol xərcindən artıq pul vermə əsla.
Qarınqulu adam olsa da qoçaq,
Qarnı doyan kimi tənbəl olacaq.
Nə o qədər ver ki, sərxoş olsunlar,
Nə də elə et ki, lap ac qalsınlar.
Nə çox bərk, nə çox boş et rəftarını,
Orduda itirmə etibarını.
Gündə iki dəfə qurub ziyafət,
Bütün başçıları sən eylə dəvət.
Heç bir yad ölkədə şərab içmə sən,
Heç yerdə əylənmə Ruma dönmədən.





Nurani adama tapşır əmanət,
Olmaz duru suda toz, ya üfunət.
Günəş hər bir şeydən pak olduğundan
Dağ, dəniz sirrini gizlətmir ondan.
Xoşbəxtlik istəsən, xoşbəxtı tanı,
Xoşbəxt xoşbəxt edər çünki insanı!
Bədbəxt adamlardan ol daim kənar
Ki, üzüm üzümə baxıb qaralar.
Doğma xislətindir vəfalı olmaq,
Çalış ki, əslini itirmə ancaq.
Biri adətini dəyişsə əgər,
Yığdığı dövlət də onu tərk edər.
Köhnə xasiyyətdən dönmə heç zaman.
Xasiyyət dəyişmək deyildir asan.
Aqil ol, əl çəkmə xasiyyətindən,
Özgə xasiyyətə uyma qətiyyən!
Həmişə düz gedən piyada əsgər
Vəzir olan kimi əyri yol gedər[176].
Taleyi xoş olan xoşbəxt adamla
Aranı xoş elə, çəkişmə əsla.
Hər bir hadisədən ötrü fələklə
Bəhs etmə, onunla xoş rəftar elə.
Ruzigar nə versə qəbul eylə sən,
Çalış, ustadının çıxma sözündən.
İncimə dövlətin etdiyi nazdan,
Dövlətin nazında dövlət taparsan.
Vaxtı yetişəndə sənin də, əlbət,
Çəkəcək nazını bir gün o dövlət.
Sədəfin qabığı xeyli bərk olur,
Odur ki, içi də dürlə doludur.
Bərk daşlar içində gizlənər gövhər,
Gövhər çətinliklə əldə edilər.
Bəd gündə ulduzdan olma bədgüman[177],
İşlər yaxşılaşar, əlbət, bir zaman.
Göy rəngli günbəzdən olma mükəddər,
Aqibət xeyr olar, düzələr işlər.
İş bərkə düşəndə, məyus olma sən,
Könlünə qüvvət ver, bəxtinə güvən.

Göyə atılan daş yerə tez düşər,
Bu qısa müddətdə işlər dəyişər[178].
Zülmü bırdəfəlik yadından çıxar,
Çünki zülmkarlıq ömrü azaldar.
Padşah ədaləti çıxartsa yaddan
Ölkəsi tez olar zülm ilə viran.
Allah ədalətçün yaradıb səni,
Zülm etmə, ədl ilə saxla ölkəni!
Pis fikrə düşərsə yaxşı bir insan,
Özünə yamanlıq eləyər, inan!
Dünya yaranandan belədir qanun,
Dəyişir istisi, soyuğu onun.
Havada olanda belə ziddiyyət,
Onda heç axtarma, heç umma səhhət.
Yaxşısı budur ki, ildə hər fəsil
Öz qaydası ilə keçsin müttəsil.
Gərək bahar fəsli keçə bahartək,
Yay da yaylığını göstərə gərək.
Bir şey qaydasından çıxarsa kənar,
Ondan üz döndərər, əlbət ki, ruzgar.
Əgər pislik etsə bir nəfər sənə,
Sən yaxşılıq etsən bir özgəsinə,
Onu da, bunu da yad etmə əsla,
Xalqa bədguluqdan dilini saxla.
Çalış ki, kirpiyin olsun almaztək[179],
Ayıq ol, ölkənin keşiyini çək.
Belə məsəl çəkmiş aqil bir insan:
"Qurd girməz sürüyə, yatmasa çoban!"
Canın möhkəm olsa, döşünə döymə,
Gülüb, yersiz-yersiz özünü öymə.
Acızlik üz versə, qəm çəkmə yenə,
Bunu da bildirmə özgələrinə.
Özünü şad göstər, heç olma qəmgin.
Gizlin dərdin olsa, zahirdə sevin.
Qarşına bir döyüş, qovğa çıxarsa.
Döyüş adamına ehtiyac varsa,
Başqa bir ordudan qaçıb gələni
Əsla qəbul etmə, aldadar səni!





Qaçmağa öyrənmiş adam qaçacaq,
Sənin də ordunu xarablar ancaq!
Döyüşdə qələbə çalmaq istəsən,
Müzəffər sərkərdə seç özünə sən.
Qələbə qazanmış xoşbəxt atlılar
Səni hər səfərdə edər bəxtiyar.
Yaxşı, pis,- nə etsən, həmişə bil sən
Yaxşını allahdan, pisi özündən."
Bu məşhur naməni qurtarıb ustad,
Şaha təqdim etdi, o da oldu şad.

## ƏFLATUNUN NƏSİHƏTNAMƏSİ

Oyanıb qalxanda günəş yuxudan
Müşkə kufur səpdi sanki asiman[180].
Şad xəbər göndərib dedi: "Əflatun
Qələmlə ipəyə nəqşələr vursun.
Elə gözəl namə yazsın o gərək,
Hər bir oxuyana eləsin kömək!"
Şahın buyruğuyla əzəmətli pir
Mədəndən gövhərlər çıxardı bir-bir.
Müti qələmindən saçıldı gövhər,
Beləydi dəftərə yazdığı sözlər:
"Bizdən yaradana min-min ehtiram,
Yerdən də, göydən də ziyadə salam!"
Allaha şükr elə mədəni açdı,
Sonra söz bəzminə gövhərlər saçdı:
"Şahımız ucadır bütün aləmdən,
O, parlaq gövhərdir, bu aləm - mədən.
Əsildir, yüksəkdir o da gövhərtək,
Özünü həmişə qorusun gərək[181].
Hər kəs, yaxşı-yaman, - nə qoysa əsər,
Bununla zatını büruzə verər.
Oğru ovlağıdır bizim bu cahan,
Onu özbaşına qoyma heç zaman!
Keşikçi olmasa həmişə ayıq,
Deyildir dünyanı güdməyə layiq.
Hər kim bu dünyanı istəsə tutmaq,

Qılıncla, tədbirlə fəth edər ancaq.
Mərdlərin qan tökən qılıncı, bəli,
Alim tədbirilə olar kəsərli!
Şahın məclisi də gərək hər zaman
Ola alimlərə şərəfli məkan.
Şah yeyib-yatmağa meyl etməyərək,
Bilik toplamağa çalışa gərək!
Şaha yoldaş olan iki bəla var,
Yoxsuldan uzaqdır həmin bəlalar;
Biri aşpazdır ki, yağlı yeməklər
Bişirib, padşahı ona cəlb edər,
Biri də cilvəli şux məşuqəsi
Ki, ona bağlanar könlü, həvəsi.
Bunlar xeyir verməz: biri doldurar
Qarnını, o biri şirəni sorar.
Nə çox əylənən ol, nə də çox yeyən
Bunlardan süstləşər, keyiyər bədən!
Qırmızı və sarı gördüyün cahan
Bir rəngin büsatdır - adam aldadan.
Məşuqə adlanan bir əjdəhadır,
Bu dünya kam vermir, ancaq can alır.
Dünya yurdumuzdur, candan əzizdir,
Bizim həm yerlimiz, həm yerimizdir.
Dünyanı dördəlli tutmayaq gərək,
Nədən can-ciyərlə süfrə bəzəyək?
Qanla qidalanıb yaşayır bədən,
Ciyərsiz bu qanı alarıq nədən?
Dörd tərkib birləşib ahəngdar olmuş,
Dörd cövhər birləşib, həyat var olmuş.
Yığmasaq onların ipini əgər,
Hərəsi bir yana baş alıb gedər.
Su dönsə torpaqda çiçək ətrinə,
Qayıdar əslinə o bir gün yenə.
Tuluğu dağıdıb qaçdı bir eşşək,
Sahibi qəmləndi bu halı görcək.
Dünya tikanlıdır, kirpiyik biz də,
İynə var, tikan var xislətimizdə[182].
İki qarı qızın başladı bəhsi,





Dünyanı götürdü onların səsi[183].
Bu dedi: "Üzünün çirkinliyindən
Ərə getməmisən bu vaxtacan sən!"
O dedi: "Üzün çox göyçəkdir sənin,
Bununçün almırlar səni də yəqin!"
Bu qədər nə üçün yataq dünyada?
Yuxu da ölümə bənzər mənada.
Bir də duracaqmı həmin yuxudan?
Bunu doğru, dürüst bilməyən insan
Yuxudan ölümtək etməli həzər,
Çünki bir-birinə bunlar çox bənzər!
Dovşan yuxusutək pis yuxu olmaz,
Yatanla öləndə hiss, duyğu olmaz!
Yuxu igidlərə hiylə quranda
Gözlər yumulmaya kaş bircə an da!
Hər bir gizli sirri o, baxıb görə,
Yaxşıya, yamana düz qiymət verə.
İnsan əl çəkəydi boş xəyallardan,
Yersiz qovğalardan, qalmaqallardan.
Niyə bircə qarın çörəkçin yalnız
Çəkişək, vuruşaq belə amansız?
Neçün biz dağlara, daşlara düşək?
Bunların səbəbi - bir parça çörək!
Səfərə başlayan müdrik insanlar
Yolda yox, mənzildə rahatlıq umar.
Keçərlər dünyanı tapdalayaraq,
Rahatlıq fikrinə düşməzlər ancaq.
Hamı yol gedənlər, uzaq görənlər
Mənzilə çatana afərin deyər.
Dinclik - asudələr ölkəsindədir,
Bundan başqa nə var - bir əfsanədir.
Yeddi qat yanar od içrə, nəhayət,
Kabablıq ət üçün nədir bu zəhmət?[184]
Neçindir bu zillət, əziyyət bütün?
Hamısı yeməklə geyinmək üçün.
Bizim əmrimizdə olanda bunlar,
Hələ başqa-başqa hesablar da var.

Əzaba qatlaşıb canından keçən
Dənizdən dürr tapar, dağlardan mədən.
Kimsə ruzusunu atlayıb keçməz,
Əndazəylə yeyər ruzunu hər kəs.
Fəqət var dünyada elə insan da
Zəri yerdə saxlar, həsədi canda.
Qızılı torpaqda basdırsan əgər,
Taleyin başına sənin kül ələr.
Yesə çörəyini dostlarla insan,
Onundur var-dövlət, onundur cahan.
Açıb kisəsini rəhmə gələrək,
Bir neçə yoxsula o edər kömək.
Arpaca olsa da vəzndə gövhər,
Ona "Çox samballı daşdır" deyərlər.
Əllərimiz boşdur, yol isə uzaq,
Yoxdur mənzildən də hələ bir soraq.
O qədər xəbərsiz yatma ki, haşa,
Yatmışkən sel gəlib başından aşa.
Yuxusuz, yeməksiz qalma ki, bədən
Süstləşib, yorulub düşər qüvvədən.
Yola çıxan yolçu cövlan edərək,
Çapmasın hər yana gərək dəlitək.
Keşikçi düzdürsün yollar uzunu.
Getsin təhlükəsiz ta ki, yolunu.
Olsun gecə-gündüz işində oyaq,
Yatanı oğrutək ruzgar soyacaq.
Arxaya, qabağa zillənsin gözü,
Onu aldatmasın yadların sözü.
Yola bələd olsa rəhbərlik edən,
Ordu qorxu bilməz çətinliklərdən.
Yollar dağa-daşa salsa da onu,
Dağılmaz başından əsla qoşunu.
Qoşunla yeriyər yağıştək, qartək,
Əyləşər heybətlə o, dəryalartək.
Çatdığı ölkədən bir neçə nəfər
Yedirdib, içirdib ələ gətirər.
Sirr alıb, ənamlar verər o kəsə,





Toxum göyərərmi su verilməsə?
İşini düzəldər bu sayaq asan,
Gərək çətinlikdən bezməsin insan.
Sülh əgər bir başla olsa bərqərar,
Artıq baş kəsməyin nə mənası var?
Yolda qoluzorlu rast gəlsə əgər,
Üstünə yerimək bəla gətirər.
Mümkün deyildirsə qələbə çalmaq,
Nahaqdır qoşunu çətinə salmaq.
İşin düyün düşsə, aça bilməsən,
Səbr elə, özünü nahaq yorma sən.
Hər çətin düyünün bir əlacı var,
Səbrlə, tədriclə açılar onlar.
Adətdir, işlərdə az olmur düyün.
Fəqət öz-özünə açılır bir gün.
Nə qədər yerində söyləsəm sözü,
Məndən artıq bilir, əlbət, şah özü.
Niyyətlə at sürsə şah hansı yana.
Öz əqli rəhbərdir həmişə ona.
Bir kəsə köməkçi olarsa allah,
Heç kəsə ehtiyac duymaz o əsla.
Salamlar gətirsə bir qəlbə mələk,
Onun insan fikri nəyinə gərək?
Padşahın əmrinə eləyib əməl
Yazdımsa bilənlər kimi bir məsəl,
Yalnız ixlasımı elədim izhar,
Onun öz bəxtitək bir rəhbəri var.
Heç kəsim möhtacı deyildir padşah,
Ona köməkçidir əqlilə allah!
Əqli kömək olsun hər işdə ona,
Allah hər işini salsın yoluna!"
Naməni qurtarıb o qoca alım,
Təzimlə elədi padşaha təqdim.
Qəlbi bu namədən şahın şad oldu,
Qüssədən, kədərdən o, azad oldu.

## SOKRATIN NƏSİHƏTNAMƏSİ

Üç gün ötüb keçdi, yenə asiman
Rum-zənci oyunu oynayan zaman
İskəndər buyurdu qoca Sokrata
Vursun üzüyündən muma möhr o da[185],
Yazsın bir qiymətli nəsihətnamə,
Mənası nur saçsın bütün aləmə.
Alim əməl etdi uca fərmana,
Dürlər çıxarmaqçün daldı ümmana[186].
Gümüştək kağıza qara xətt ilə
Zəkanın hökmünü nəqş etdi belə:
"Nəqqaş hansı nəqşə başlasa, gərək
Allahın adına vursun ilk bəzək.
Hamıya köməkdir böyük yaradan,
Onun möhtacıdır bütün bu cahan."
Allahın mədhini yetirib sona,
Bağladı sözünü şahın adına:
"Ey şah, bu örtülü quyuya, gəl, sən
Girmə əqlin, huşun əmr vermədən.
Sən ki, bol gövhərdən yoğurulubsan,
Həyat oyuncaqtək gəlməsin asan!
Bu başdan edirəm səni xəbərdar,
Gücünə güvənmə, yolda pələng var!
Döyüşdə, şənlikdə, - hər yerdə olsan,
Heç zaman ayrılma yaxşı dostlardan.
Əyləncə, eyş-işrət bəzminə düşsən,
İşvəli bir dilbər seç özünə sən.
Məclisdə qüssədən, qəmdən uzaq ol,
Həmişə kefi kök, damağı çağ ol.
Siyasət məclisi qurulsa fəqət,
Orda hər yetənə sən vermə fürsət.
Yanında hərzə söz danışmasınlar,
Səni də hörmətdən salmasın onlar.
Yeməyi heç yemə dəniz kimi tək,
Yediyin olmasın acı, dəniztək[187].
Bulaq ol, çox olsun gəlib içənin,
Dursun qulluğunda kuzələr sənin!





Xörəyi evində gizlətsən, əlbət,
Ondan yetmiş evi basar üfunət.
Vaxtında evindən çıxarsan əgər,
Qapına müşktək ətir səpilər[188].
Nə qədər açmayıb hələ bənövşə,
Qönçəsi pis qoxu verər həmişə.
Saçları açılıb dağılan zaman
Müşk-ənbər qoxusu yayılar ondan.
Acgöz olma, sənin deyil bu saray,
Yalnız bir çörəkdir alacağın pay.
Tək bircə fətirə gəl qane ol sən,
Düşün, günəşdən ki, artıq deyilsən[189].
Allahlıq edərsən nəfsi saxlasan,
Acgözdür öküzlə eşşək hər zaman.
Kimin kın, yeməkdə heyvan nəfsi var
Heyvan sifətində qəbirdən çıxar.
Qiyamət gələndə, əldə tərəzi,
Öküztək, eşşəktək baxar hərəsi.
İnsan sağlam olar az-az yeməkdən,
Uzun ömr eləməz əsla çoxyeyən.
Həddindən ziyadə yesə bir insan,
Gəyirər, pis qoxu gələr ağzından.
Aslantək sən də az yeməyə alış,
Çünki qorxaq olar çox yeyən camış.
Dartıb sürüyərlər tənbəl eşşəyi,
Çünki ölçüsüzdür yeyib içməyi.
Buludtək damcıyla su al dənizdən,
Verəndə bol-bol ver, səxavətlə sən.
Suçu tuluğundan tez-tez su paylar,
Tuluq gah boşalar, gah da ki, dolar.
Yağlıdan, yavandan elə ye ki, sən
Onu asanlıqla həzmə verəsən.
Saxla əndazəni qədərlə, sayla,
Bir az ye, bir az yığ, bir az da payla!
Bu cür yeyib, yığıb paylasan əgər,
Sənə bu dünyada xoşbəxt deyərlər.
Yeməkdə əsasdır cana nuş olmaq,
Onun dadına yox, faydasına bax!

Sirkəni yeyəndə süddən et həzər,
Sirkəylə süd içmək azar törədər.
Uyma eyş-işrətə həddindən artıq,
Yola tədarük gör, bir səfərə çıx!..
Bu nə tənbəllikdir? Giriş bir işə,
Bekarlıq insanı sıxar həmişə!
Özgənin əliylə qazdırma mədən,
Özün bir əl tərpət, əgər dirisən.
Əl-ayaq qulundur, işlətsən, yəqin,
Çıxmazlar heç zaman əmrindən sənin.
Minlərlə xidmətçin olsa da, hökmən,
Özün əl-qolunu heç qoyma işdən.
Sənin əl-ayağın salamətdirsə,
Onların işini xadimlər görsə,
Bunlar da əlindən çıxsa bir zaman,
Sən əlsiz, ayaqsız qalmış olarsan!
Şirinsə birinin dili, söhbəti,
Başqa şey istəmə, bəsdir ülfəti!
Köməyi dəyməyən şirindil insan
Yaxşıdır acıdil əltutanlardan.
Daim şirin dillə yaxşılıq elə,
Nə fayda eləsən acı dil ilə?
Həyalı söz danış, öyrənib səndən
Həyalı danışsın səni dinləyən.
Ağıllı bir işdir yumşaq danışmaq,
Kobudluq axmağa yaraşar ancaq!
Söz özü nə qədər gözəl olsa da,
Onu gözəllikdən salar pis ədə!
Sükut çox yaxşıdır pis danışmaqdan,
Sükutdan olmayıb heç kəs peşiman.
Hər kım qol qoyarsa nalayiq işə,
Dünyada xar olar özü həmişə.
Bir şeyi tapmasan, çalış, səbr elə,
Aldat sən özünü bir ümid ilə!
Yeməkdən yaxşıdır ümid min kərə,
Ümidlə, vədəylə bəslənər zirə.
Quraqlıq olanda, bilmirsən bunu,
Zırəyə verərlər zirə suyunu?[190]





Zirə öz suyuyla yaşayar ancaq,
Dolan qismətinlə sən də o sayaq.
Bulud çiskinindən yatarsa güllər,
Yağış şiddətlənsə, aparar sellər.
Zalimə heç zaman eləmə kömək,
Bir gün sorğu-sual günü gələcək!
Çox da qoşun çəkib susama qana,
Bu, bir kündə olar öz ayağına.
Bu qədər baş kəsib atmaqdan usan,
Bu topla nə qədər oynayacaqsan?
Sənin buludunda çox göz yaşı var,
Daim qılıncından nahaq qan axar.
Qorx ki, boyun vuran qılıncın bir gün
Vurar öz boynunu nahaq qan üçün.
Elə sür kəcavə çəkən dəvəni,
Filin ayağına salmasın səni[191].
Bir gör nə qədər qan tökübsən hədər,
Başlar kəsdiribsən nahaq, nə qədər,
Nə qədər ölkələr edibsən xərab,
Sorsalar, nolacaq verdiyin cavab?
Güllərə dağ çəkmək olmasın peşən,
Yetirməz onları bir də bu gülşən.
Bu harın göy atdan daim et həzər,
O bir əjdahadır, gəlinə bənzər[192].
Qəlbi ülfətsizdir, köksü boşluqdur,
Özünün özündən xəbəri yoxdur.
Bağla torpaq kimi dinclik kəməri[193],
Qoy fələk tələssin, sən asta yeri!
Şahsan, şahin kimi iti uçma sən,
Şiri-pər kimi ol, vüqarlı tərpən!
İti düşüncənin cilovunu çək,
Meşə yollarında çoxdur daş-kəsək.
Dərdə əlac etmək istəsən əgər,
Ləngiyib vaxtını eyləmə hədər.
Günahsızla dava fikrinə düşsən,
Səbr elə, bu işdə tələsmə heç sən.
Canini, oğrunu bağışlama heç,
Başqa təqsirlərdən, günahlardan keç!

Çəkin aşnalıqdan hər bir alçaqla,
Onları özündən uzaqda saxla,
Şah əgər xalq ilə etsə ədavət,
Ağ olar üzünə xalq da, nəhayət!
Etmə tabəənlə çox yumşaq rəftar,
Məlumdur almazı qalay sındırar.
Heç salma altına özgə kilimi,
Öz dərin üstündə yat aslan kimi!
Özündən özünə baramaqurdu
Həm kəfən toxudu, həm də ev qurdu.
Məhrəm olmayandan gözlə özünü,
Dinləmə onların əsla sözünü.
Ömrünü ah-vayla vermə sən bada,
Acizlər ah-vayla yaşar dünyada.
Bu cürə sözlərim çoxdur, ancaq mən,
Demirəm: tapılmaz məndən çox bilən,
Sən özün göylərdən ilham alansan,
Bundan çox söyləsəm, gətirər ziyan.
Sözlərim itisə mənim qılınctək,
İncimə, adətdir qılıncda kəsmək.
Əlində bu iti qılınc ilə şah
Hara qoşun çəksə, basar inşallah!"
Dürlə dolub sandıq tamamə yetdi,
Bunu da bəyənib şah qəbul etdi.

## İSKƏNDƏRİN PEYĞƏMBƏRLİK SƏFƏRİNƏ ÇIXMASI

Yuxudan duraraq bir səhər erkən,
Üzümü günəştək alışdırdım mən.
Sözümün taxtını göyə ucaltdım,
Qəlbimdən atəşə üzərrik atdım.
Mən "Xosrovnamə"ni yazmaqçün rəvan[194],
Bu qoca sərvimi elədim cavan.
Qaldırdım möhrü söz xəzinəsindən,
Orda deşilməmiş dürr qoymadım mən.
Qələmim o qədər saçdı ki, gövhər,
Heç gövhər qalmadı, boşaldı göylər.





Bu zaman bir gözəl içəri girdi,
Qılınc kimi parlaq bir güzgü verdi.
Dedi: "Bu güzgüdə bir bax üzünə,
Çox da məftun olma özün özünə."
Bu parlaq güzgüyə dikdim gözümü,
Gördüm surətimi, gördüm özümü:
Baxanda güzgüdə - o yaşıl bağda
Ağqanad bir qarğa gördüm budaqda.
Yuxudan məhrumdu o nərgiz gözlər,
Sərvimdə görmədim gənclikdən əsər.
Bənövşə üstünü basmış yasəmən,
Öz qızıl gülümü solğun gördüm mən[195].
Sikkəni bu qədər sürtülmüş görcək[196],
Süstləşdim, heyrətdən çırpındı ürək.
Hanı o ayaq ki, quş edə məni,
Hanı əl, dəyişə köhnə nəqşəni.
Xəcalət çəkərək solğun rəngimdən,
Başladım nəvaya öz ahəngimdən.
Qorxdum vaxtsız əcəl üstümü ala,
Çəkdiyim bu naxış natamam qala.
Yuxu göz mülkünü tutana qədər
Dedim ki, bu evi tikim birtəhər.
Bəlkə bir yatağa yetişə əlim,
Ola son mənzilim, axır mənzilim...
Dövrandan baxəbər bir alım yenə
Başladı keçmişin bu cür şərhinə:
"Allahın hökmüylə böyük İskəndər
Vəhy alıb, elə ki, oldu peyğəmbər,
Dövlət divanından pozdu adını,
Zəhmət divanına yazdı adını[197].
Əmr etdi bacını Rum ilə Rusun
Yazsınlar adına İskəndərusun.
Getmədən tərk etdi taxtı oğluna,
Tapşırdı anası göz olsun ona!
Vəsiyyət etməkçün gələrək dilə,
Əziz anasına söylədi belə:
"Gedirəm, bu xalqla et yaxşı rəftar,
Qoy səndən həmişə razı qalsınlar.

Ata tək bu xalqı himayənə al,
Anasan, anatək dərdlərinə qal.
Amandır, dindar ol, göstər ədalət,
Allahın əmrinə elə riayət,
Əmrə əməl edib xeyirə çat sən,
Bu, qat-qat yaxşıdır əmr eləməkdən.
Mən yola çıxmağa duydum zərurət,
Qalır taxtım, tacım sənə əmanət.
Yollarım uzundur, mənzillərim çox,
Bilməm dönəcəyəm geriyə, ya yox.
Elə et qayıtsam əgər səfərdən,
Xəcalət çəkməyək nə mən, nə də sən.
Yox, əgər dönməyim olmasa qismət,
Huşyar ol, xoş gəlsin ta ki, aqibət.
Elə et ki, haqqın məhkəməsindən
Dilin tutulmasın, xəcil olma sən."
Bütün sözlərini deyib İskəndər,
Qoyub taxtı, tacı, elədi səfər.
Əmr etdi bir anda bütün Rum və Şam
Qoşunu önündə cəm olsun tamam.
Fərmanında olan bütün qoşundan
Yol üçün ayırdı yüz min pəhləvan.
Bunlar hər ölkədən seçmə mərdlərdi,
Hərə bir orduya dəyən əsgərdi.
Dörd min yük daşıyan dəvə götürdü,
Onları nizamla yola düzdürdü.
Bisrək cinsindəndi onun min başı[198],
Keçərdi yel kimi o dağı, daşı.
Mini də büxtiydi, nərdi hər biri[199],
Dadlı yeməklərdi bütün yükləri.
Üçüncü mini də cəld naqələrdi[200],
Bəzəyi qızıldı, zərdi, zivərdi.
Dördüncü min isə, nəcib dəvələr,
Hər biri ceyrantək iti yol gedər.
Vardı hər peşədən, hər bir sənətdən
Yanında yüzlərcə mahir işbilən.
Belə tədarüklə qurub növrağı,
Qaldırdı balıqdan Aya bayrağı[201].





O, Məqduniyyədən yola düşərək
İskəndəriyyəyə gəlib çatantək,
Orda o möhtəşəm taxtı ucaldı,
Neçə gün şadlıqla orada qaldı.
Fateh Keyxosrovtək görüb baxtını,
Gedib düz Sərirdə qurdu taxtını.
Əmr edib o uca bir mil düzəltdi.
Başına bir parlaq güzgü bənd etdi.
Güzgüdə bir-aylıq bir məsafədən
Görünür dənizdə hər gəlib, gedən.
Taxtı düşmənlərdən qorumaq üçün
Keşikçi dururdu orda bütün gün.
Güzgü əyan etsə bir sirri əgər,
Gəlib hökmdara bildirərdilər.
Düşmənlər çal-çapa gəlsələr, işdir,
Saray adamları görərdi tədbir.
Olub paytaxtından arxayın, yenə
Şah mindi vüqarla öz köhləninə.
İlk əvvəl yolunu Məğribə saldı.
Misrə gəlib, orda iki gün qaldı.
Sonra çıxıb ordan, qəlbində dilək,
Allahın əmrinə əməl edərək,
Bir xeyli yol gedib, dərələr keçdi.
Ötüb zəmiləri, çölə yetişdi.
Məqdəsdən dəstəylə bir neçə adam
Hakimin zülmünə etməyib davam,
Yolda düzüldülər, o qadir şahdan
Belə dilədilər mərhəmət, aman:
"Pak etdin dünyanı, sən, ey hökmüdar,
Gəl, bu pak evi də paklığa çıxar.
Ucalt bayrağını şəhərimizdə,
Yox et bədxahları, dincələk biz də.
O paklar yurdunda var bir əhrimən,
Allah dostlarıyla düşməndir, düşmən.
Müqəddəs binada itaətkarlar
Olub o zalimin zülmündən bezar.
Tərk edib sitayiş yolunu hakim,
Bütün din əhlinə zülm edir daim.

Başını dik tutub, tökür nahaq qan,
Çoxunun başını kəsib nahaqdan.
Hamımız qorxuruq o əhriməndən,
Divlər qənimisən, dadə yetiş sən!"
İskəndər onları belə görəntək,
O göz yaşlarına rəhm eləyərək,
Əsla incimədı fəryadlarından.
Çatdı məzlumların dadına o an.
Dinləyib onların ah-fəryadını,
Beytülmüqəddəsə sürdü atını.
Dünyanı hasardan qurtarsın deyə,
Beytülmüqəddəsdən başladı səyə.
Orda qoymamaqçün fitnədən əsər
Rumdan düz Məqdəsə gəldi İskəndər.
Bu vaxt hər tərəfdən - dağdan, dərədən
Ədalət səsini eşidib düşmən,
Tədarük görərək döyüşə çıxdı,
Bilmirdi ki, şahın bəxti açıqdı.
İskəndər vuraraq ona şəbxunu,
Yolkəsən ağzının kəsdi yolunu.
Onu zalım görüb, qanını tökdü,
Qüdsün qapısında çarmıxa çəkdi.
Carçılar bir neçə müddət çəkib car,
Elədiyi zülmü bir-bir saydılar,
Dedilər: "Bu evə zülm etsə hər kəs,
Belə aqibətdən qurtara bilməz!"
Pak evi napakdan azad eylədi,
Şadlıq sevənləri o şad eylədi.
O dinclik məkanı asudə oldu,
Nakəsin torpağı göyə sovruldu.
Zalımın zülmünü şah məhv elədi,
Müti olanlara verdi məbədi.
Beytülmüqəddəsi nizama saldı,
Sonra da Məğribə tərəf yol aldı.
Çəkdi Əfrəncəyə qoşunu ordan,
Sonra Əndülüsə oldu o rəvan.
Həm dəvət edərkən, həm hökm edərkən
Əql ilə, ədl ilə iş gördüyündən,





Müdrik bir hökmdar görərək onu,
Hamı qəbul etdi doğru yolunu.
Hamını düz dinə elədi dəvət,
Tikdirdi hər yerdə bir yeni məbəd.
Yenidən qoşunla yola çıxaraq
Dünyanı tutmaqçün ucaltdı bayraq.
Sürətlə keçirdi dağdan, dərədən,
Çəmənlik görəndə salırdı məskən.
Dincəlib bir qədər, oldumu aram,
Yenidən edirdi yoluna davam.
O keçdi çölləri sahilə qədər.
Yetişib dənizə saldı gəmilər.
Üç ay gecə-gündüz üzdü dənizlə,
Ancaq dənizdə ov keçmədi ələ.
Sürətlə gedirdi Məğribə sarı
Yanında qoşunu və yoldaşları.
Keçirdi bir yerdən o başqa yerə,
İnsan yaşamayan cəzirələrə.
Çıxdı qarşısına minlərcə insan,
Cürbəcür canlılar, cürbəcür heyvan,
Ancaq heç yaxın da gəlməyib ona,
Qaçıb dağıldılar hərə bir yana.
Bir xeyli yol gedib İskəndər yenə,
Enişdən qalxdı bir geniş düzənə.
Bu çölün sapsarı qumları vardı,
Yerindən sarı gil tozu qalxardı.
O qumun üstündə atlar çaparkən
Həmişə od-alov qopurdu yerdən.
Başqaymış torpağın tərkibi yəqin,
İçində kükürd də varmış o yerin.
Bir ay o çöllərdə etdilər səfər,
Nəhayət, ordan da ötüb keçdilər.
Çöllər qurtaranda, gördü uzaqdan
İskəndər önündə əngin bir ümman.
Yunanlar Okyanos deyərdi ona[307],
Qəribə gəlirdi dəniz insana.
Dəhşətlə döyürdü ətrafı dalğa,
Yol yoxdu keçməyə burdan uzağa.

Günəş batan zaman bütün dünyada,
Yenə görünürdü həmin dəryada.
Atəşpərəst kimi güdürdü odu,
Odu heç gözündən iraq qoymurdu.
Fələk də heç gecə-gündüz bilmədən
Ona nur saçırdı odlu çeşmədən.
Qürubu dəryada seyr edən zaman
Sanırıq çeşmədə gün olur nihan.
Sanki odlu çeşmə axır dənizə,
Şəfəqli yol kimi görünür bizə.
Axıb çuxurları doldursa sular,
Böyüyə-böyüyə bir dərya olar.
Müəyyəb adlanar çuxura dolsa,
Müəlləq deyilər yer üstə olsa[203].
Baxsaq Mühit adlı böyük dənizə,
Suları müəlləq görünər bizə.
Su qalxıb oyanar günəş batanda,
Günəş də boylanar sular yatanda.
Ucalan günəş də ordan keçərək
Dəniz rənglərindən bürünər ipək.
Günəş endirərsə zirvədən bayraq,
Dalğalar ardında görünər ancaq.
Örtüyə bürünər bir az gedərək,
Çünki yer altından keçsə o gərək[204].
Bilik belə verir bunu nəzərə,
Başqa rəhbər də var yol bilənlərə.
Şah isti görəndə dəniz suyunu,
Çox dərin bir heyrət götürdü onu.
Alimdən soruşdu: "Deyin, bu nədir?
Kimdir gözətçisi, bu nə çeşmədir?"
Alim cavab verdi: "Həmin isti su
Çoxunun abrını tökmüş, doğrusu[205].
Çox olub bu sirri açmağa həvəs.
Kələfin ucunu tapmayıb heç kəs.
Çoxundan bu sirri soruşmuşam mən.
Olmayıb bir doğru cavab söyləyən.
Günəşin seyrini, hərə birtəhər,
Mərkəzdə, ya yerin altında bilər.





Kim bilir, günəş, Ay bu cilvəgahdan
Keçib sonra harda sürürlər dövran?.."
İskəndər kənarda bir az dincəldi,
Sonra yavaş-yavaş sahilə gəldi.
Civələk ağırdı o dənizdə su,
Kəsmişdi yolları bulud ordusu.
Gəmi belə suda üzməzdi asan,
Müşküldür yol getmək rəhbər olmadan.
Soruşdu şah sirri bələdçilərdən:
"Bu yola nə tədbir görməliyəm mən?
Salaq biz gəmini suya nə sayaq?
Yüklə o sahilə mümkünmü çıxmaq?"
Məsləhət görmədi o yolbilənlər,
Dedilər: "Yaramaz bu yerdən səfər.
Olsa yüz bələdçi, yenə də heç kəs
Gəmini bu sudan çıxara bilməz.
Vardır civə rəngli bu qorxunc suda
Qəssasə deyilən bir əjdaha da[206].
Mağaradan çıxan qara tüstütək
Görünər heybətlə hərdən o nəhəng.
Elə dəhşət saçar o qorxunc heyvan,
Uzaqdan görərsə əgər bir insan,
Vahimə içində quruyub ölər...
Kim olar bu qorxunc yollara rəhbər?
Hələ bundan betər: burdan baxanda
Işıqlı bir sahil vardır o yanda.
Rəngbərəng daşlarla doludur hər yan:
Qapqara, sapsarı, gömgöy, al-əlvan!
Hərəsi bir-iki batman qədərdir,
Qızıl sürmə daşlar sanki gövhərdir.
O əlvan daşları görəndə insan
Sevinər fərəhdən, gülər şadlıqdan.
Qəhqəhə çəkərək güldükcə gülər,
O qədər gülər ki, gülməkdən ölər.
Misqaldan az olsa daşın çəkisi,
Oyatmaz insanda o, gülüş hissi!"
Bunları dinləyib şah fikrə getdi,
Adamlar göndərib təcrübə etdi.

Qocanın sözləri düz-doğru çıxdı,
Daşlar çoxlarını torpağa yıxdı.
İskəndər əmr etdi, bir miqdar əsgər
Minib dəvələrə ora getsinlər,
Sarınsın gözləri yetişən zaman,
Yığıb gətirsinlər həmin daşlardan.
Nə qədər bacarsa toplayıb hərə,
Çatsınlar daşları tez dəvələrə.
Bez ilə bürüyüb bərk sarısınlar,
Üstdən də çox qalın şeylər salsınlar.
Daşlarla yükləyib o dəvələri,
Daşlıqda qalmayıb dönsünlər geri.
Şahın adamları dinləyib bunu,
İcra elədilər buyurduğunu.
Ölüm qorxusundan şah ilə ordu
Yel kimi tərk etdi o qorxunc yurdu.
Dəvə sürənlərə padşah əmr etdi,
Yüz dəvə o sarı qumdan yüklətdi.
İmarət tikməyə yararlı olan
Sulu bir çəmənə çatdığı zaman,
Buyurdu, daşları yerə tökdülər,
Onlardan bir böyük bina tikdilər.
Parçaya sarınmış həmin daşlardan
Eləcə sarıqlı qoyub, açmadan,
Onları qaydayla düzüb yığdılar,
Tikdilər qapısız uca bir hasar.
Daşbadam sayağı gözəl qəsrlər,
Hərəsinin hüsnü bir özgə təhər.
O sarı torpaqdan palçıq tutaraq,
Bayırdan çəkdilər hasara suvaq.
Hasar içəridən çılpaq divardı,
Çünki bu pərdədə gizli sirr vardı.
Alimlər bu cürə edir rəvayət:
Aradan keçincə bir xeyli müddət,
Çürüyüb sarğılar töküldü yerə,
Yeddi rəng gövhərlər çıxdı zahirə.
Binalar xaricdən vermirdi ziyan,
Çünki suvaq vardı sarı palçıqdan.





Geyimi soyundu daxildən hasar,
Öldürdü oraya ayaq basanlar.
Ora yetişəndə hər yoldan ötən,
Hasarı içindən görmək istərkən,
Bir qapı axtardı, tapmadı ancaq,
Hasara dırmaşdı kəmənd ataraq.
O hasar daşları bir adam görcək,
Alırdı canını ahənrübatək.
Batmanı adamı öldürsə əgər,
Gör dağtək qalansa nələr törədər?
Deyirlər: qürurlu şahlardan biri
Əfsanə sayaraq belə sözləri,
Bir adam göndərmiş, təcrübə etmiş,
Eşitdiyi sözlər sübuta yetmiş.
Binanı qurtarıb, sonra İskəndər
Dəryadan səhraya elədi səfər.
Altı ay yol getdi sonsuz çöllərdən,
Qoşun təngə gəldi axır səfərdən.
O, fil ayağıyla səhralar keçdi,
Nilin sahilinə gəlib yetişdi.
Çayın mənbəyini istədi görə,
Çıxan olmamışdı o yüksəklərə.
İskəndər çox iti bir hərəkətlə,
Böyük mətanətlə, böyük cürətlə
Dördnala çapırdı çayla yanaşı,
Aşırdı sel kimi o, dağı-daşı.
Dağları, çölləri keçərək getdi,
Nəhayət, dağ-dərə axıra yetdi.
Quru qumluqları keçib ötürdü,
Axırda yamyaşıl bir təpə gördü.
Təpənin ətrafı uca dağlardı,
Minatək yamyaşıl daşları vardı,
Bu daşlar kəsmişdi çıxacaq yolu,
Yol gedən azardı orda sağ-solu.
Minalı dağlardan büllur sütuntək
Şəlalə axırdı yolu kəsərək.
İti daşlar ilə doluydu hər yan,
Yol tapa bilməzdi təpəyə insan.

Bənzərdi tikanlı təpə kirpiyə.
Zillətlə qalxsaydı biri zirvəyə,
Orda unudardı əziyyətləri,
Keçərdi o üzə, dönməzdi geri.
Birisi, ya mini çıxsaydı bura,
Burdan da uçardı o çəmənzara.
Ora neçə nəfər oldusa rəvan,
Olmadı bir nəfər geri qayıdan.
Gedənlər nədənsə salırdı məskən,
Təxtü tac tapırdı orda deyəsən.
Qoşunu etmirdi onlar bir də yad,
Qalırdı onlardan quruca bir ad.
Yığdı alimləri yenə İskəndər,
Bu işə bəlkə bir çarə etsinlər.
Dedilər: "Yaramaz təklikdə getmək,
Oraya çıxanlar cüt olsun gərək.
Birbaşa çıxmaq da ora çətindir.
Yolda dincəlsinlər on addımda bir.
Təpəyə yetişib dayansın onlar.
Sonra tədbirləri işə salsınlar.
Heyrətə düşməsin deyə gözləri,
O üzə tədriclə baxsın hər biri."
Nəticə vermədi bu son tədbir də,
Yığdı alimləri İskəndər bir də.
Düşünüb verdilər belə bir qərar:
"Hünərli, vicdanlı bir şəxs tapsınlar.
Dünyagörmüş olsun, yazmaq bacarsın,
Gedəndə qələmlə kağız aparsın.
Götürsün yanınca əziz oğlunu,
Dərd-qəmdən qorusun övladı onu.
O dağı çıxdıqda oğlu da hər an
Gərək təqib etsin onu arxadan.
O çıxsın, ətəkdə qoysun oğlanı,
Balası zəncirtək saxlar aslanı[207].
Qayıda bilməsə o kişi əgər,
Ordan övladına eləsin xəbər.
İşdir, heyrətindən dili tutulsa,
Danışa bilməsə, qəfil lal olsa,





Yazar, gördüyünü verər oğluna,
Çünki varlığıyla bağlıdır ona."
Həmin sifətlərə malik, cəld, qıvraq
Bir qoca tapdılar soraqlaşaraq.
Yollandı dağlara qocayla cavan,
Sanki balasıyla getdi bir aslan.
O günün sabahı, günorta çağı
Gənc igid qayıdıb gəldi aşağı.
Bükülü naməni möhkəm tutaraq,
Baş əydi padşaha rəngi ağappaq.
Şah alıb oxudu, beləydi yazı:
"Məni bezdirmişdi yolların tozu,
Lap cana gəlmişdim, qorxurdum yaman,
Sanki cəhənnəmdi bu yolda hər yan.
Elə bil həyatın asılır tükdən,
Canından əl üzər bu yolu gedən.
Bu yollar çətindir, incədir tüktək,
Burdan mümkün deyil geriyə dönmək.
Sarp qaya üstünə gəlib çatarkən
Darısqal yollardan təngə gəldim mən.
Baxdıqca keçdiyim qorxunc yollara,
Qəlbim sıxıntıdan gəldi zinhara.
Bu tayın yolları düzdür, hamardır,
Hər yana baxırsan yaşıl bağlardır,
Boldur gül-çiçəyi, suyu, meyvəsi,
Gəlir hər tərəfdən quşların səsi,
Havası tərtəmiz, qəşəngdir hər yan,
Belə yurd arzular allahdan insan.
Havası tərtəmiz, ətir qoxulu,
Gözəl torpaqları çeşməli, sulu,
Çeşmələr, bulaqlar verib əl-ələ,
Bunlardan böyük çay gəlib əmələ.
Bu yanda bəzəkli gözəl bir həyat,
O yanda azğınlıq, düşgünlük, fəryad.
O tərəf - cəhənnəm, bu tərəf - gülşən,
Dönməz cəhənnəmə heç kəs behiştdən.
Bir də ki, gəlmişik gör hardan-hara,
Baxıram keçdiyim qorxunc yollara,

Belə gözəl yerdən kim dönər geri,
Keçər o dəhşətli qorxunc yerləri?
Mən getdim, salamət olsun görüm şah,
Mən şadam, sizi də şad etsin allah!"
Şah gizli sirlərdən oldu xəbərdar,
Qoşunu tez etdi o yerdən kənar.
Heç kəsə deməd oxuduğunu,
Qorxdu ki, hamısı tərk edər onu.
Şah razı olmadı orda qalmağa,
Əmr etdi, qoşunu çəkdilər sağa.
Durub dincəlmədən düzəldi yola,
Daha düşünmürdü heç bir şey əsla!
Qum kimi sərf edib bollu xəzinə,
Səhradan əzabla qayıtdı yenə.
Yol - qumluq, dərdi də - hədsizdi qumtək,
Gedirdi qüssədən ahlar çəkərək.
Səf çəkib tutmuşdu düşmənlər yolu,
Doluydu vəhşiylə yolun sağ-solu.
Ancaq şaha sarı onlar cumanda
Qaranlıq basırdı yolu bir anda.
Şah rüxsət vermədən, bir qədəm onlar
Çıxa bilməzdilər zülmətdən kənar.
Birisi çıxsaydı əgər fərmandan,
Olardı durduğu yer ona zindan.
Dilini bilirdi rast gəlsəydi kim,
Heç lazım deyildi ona mütərcim.
Onların dilində eləyib xitab,
Verirdi hərəyə layiqli cavab.
O, tozlu yollarla səfər edirdi,
Zamanı arxada qoyub gedirdi.
Bu yolda heç nəyə meyl etməyərək,
Qəlblərdən tozları silirdi yeltək.
Dostların könlünü o şad edirdi,
Yadlara həqiqi din öyrədirdi.
Qorxunc səhralardan tufantək keçdi,
Bir div ovlağına gəlib yetişdi.
Sanki od düşmüşdü bu yerdə çölə,
Səhra danışırdı alov diliylə:





Bol qızıl veribdir bura yaradan,
Ağacdan, otdansa yoxdu bir nişan.
Qızıl mədənini İskəndər görçək,
Sevindi bir qızıl tapan uşaqtək.
Bir qədər yol gedib, atını çapdı,
Cənnəttək bir gözəl düşərgə tapdı.
Ağacları qızıl bir bağdı abad,
Burda taca, taxta çatmışdı Şəddad.
Ölkələr fatehi girdi içəri,
Qızıldan sapsarı gördü hər yeri.
Meyvəylə doluydu bütün ağaclar.
Ləl idi, dürr idi verdikləri bar.
Alma, nar doluydu hər tərəf, hər yan,
Hamısı qızıldan, parlaq yaqutdan.
Gümüşü narınclar, qızıl türüncələr,
Adam inanmırdı saldıqca nəzər.
Baharı cəvahir, yeri kimyatək,
Zümrüddü, mərcandı hər ot, hər çiçək.
Büsat içindəydi o zinətli bağ,
Burda gövhərdəndi yanan hər çıraq.
İnsan biçimində qalxıb ucalan
İki heykəl vardı orda qızıldan.
Qızıl olduğunu bilməsə əgər,
Onlardan qorxardı yaxın görənlər.
Orda saf büllurdan vardı bir hovuz,
Xalis gümüşdəndi içindəki buz.
Orda saf əqiqdən balıqlar vardı,
Seyrinə dalanlar heyran qalardı.
Uca bir saraya malikdi gülşən,
Bir daşı qızıldan, biri gümüşdən.
Şah ayaq basanda həmin saraya
Bir cənnət qəsdinə yetişdi guya.
Şah qəsrin içini seyr eləyərkən
Ətəyi yırtıldı yağan gövhərdən.
Əqiqdən bir köşk də ziynətdi bağa,
Gövhər içindəydi başdan ayağa.
Onun qızıldan bir günbəzi vardı,
Günəştək bərq vurub par-par yanardı,

Üstündə müşk ilə ənbər tozundan
Başqa heç bir tozdan yox idi nişan.
Göyün günbəzinə girən mələktək,
İskəndər o köşkə girdi sevincək.
Gördü əqiqdən bir parlaq məqbərə
Ki, kafur qoxusu saçır hər yerə.
Mina naxışlıdır orda dər-divar,
Mina yazılı bir yaqut lövhə var.
Üstündə həkk olmuş: "Ey bura girən
Qüdrətli qəhrəman, oxu, bil ki, sən:
Şəddaddır bu qəbrin içində yatan,
Bu bağı, bağçanı odur yaradan.
Həyalı, ədəbli ol burda ancaq,
Fikrindən keçməsin niqabı açmaq.
Çalış, gizli qalsın bizim sirrimiz.
Kimsənin sirrini açmamışıq biz.
Gəl, bizim şərəfə hörmət elə sən,
Bu torpaq sənə də olacaq məskən.
Qəbrin günbəzini bu yerdə yatan
Hərçənd tikmişsə də sərt, qara daşdan,
Nəhayət, süratlə dolanan fələk
Tozlara çevirib yelə verəcək.
Bədəni qarışqa yemi olacaq,
Başı da at nalı altında torpaq.
Doğrudur, çalışıb hərə birtəhər
Öz qəbri üstündə sütun tikdirər,
Ancaq belə gəlib hər şeyin sonu,
Yel göyə sovurar onun tozunu.
Şəddadın cəsədi, kim bilir, haçaq
Hansı at nalına tapdaq olacaq?
Bu məzar içindən dağıtma tozu,
Torpaqda yaxşıdır torpaq, doğrusu.
Bədəni axtarma, toz etdi ruzgar,
Təkcə bu günbəzdir ondan yadigar.
Gəl, toxunma bizə, baxıb ibrət al.
Bax, öz bu gününü sən də yada sal!
Özünə güvənmə ki, bəxtiyarsan,
Kim olsan, düşün ki, insansan, insan!





Bu xəzinə, saray sənindir yalnız,
Sənin əmrindədir başla tacımız.
Açıqdır üzünə bütün xəzinə,
Bu, yetər ordunun yol zəhmətinə.
Apar, sənin olsun xəzinə, amma
Bizim qəbrimizə əsla toxunma!.."
İskəndər mənalı lövhəni görcək,
Heyrətdən donaraq qaldı lövhətək.
Xətləri su kimi rəvan oxudu,
Ağlayıb gözündən tökdü xeyli su.
Məzarın önündə duran hökmüdar
Axıtdı gözündən sel kimi yaşlar.
Dəymədi orada bircə gövhərə,
Çıxıb hazırlaşdı yenə səfərə.
Getdi qılıncına baş əyən bağdan,
Dərməyib bir meyvə heç bir budaqdan.
Baxdı, o, bağdakı bu cah-cəlala,
Bildi ki, illəri salıbdır yola.
Xəzinə gördünsə dünyalar qədər,
Nə özü götürdü, nə də bir nəfər.
Sərvətlə doluydu o keçdiyi yol,
Saf qızıl-gümüşdü hər tərəf bol-bol.
Yenə də yadına düşdü öz yurdu,
Yenə səfər üçün çölə üz qoydu.
Yolun yarısına çatıb İskəndər
Vəhşilər gördü ki, insana bənzər.
Bunlar çöl əhliydi, qırdan da qara.
Yaşayış yerləri kaha, mağara.
Onlardan soruşdu: "Bu çöllərdən siz
Sərgüzəşt, əfsanə nə bilirsiniz?
Deyin, sizdən başqa varmı yaşayan
Bu çöldə ya əhli, ya vəhşi heyvan?"
Onların cavabı şaha bu oldu:
"Az olur bu çölün suyu, buludu;
Bu susuz səhrada yaşayırıq biz.
Səhranın ovudur yediklərimiz.
Yalnız ovçuluğu etmişik peşə,
Ömrümüz heyvantək keçir həmişə.

Yeyərik nə etsək bu çöldə şikar,
Tüklərdən, dəridən geyərik paltar.
Burada nə atəş, nə də ki, su var,
Odu günəş verir, suyu buludlar.
Işıqlı gündüzlər göyün günəşi
Bizə əvəz edər odu, atəşi.
Şeh düşüb havanı nəm edən zaman
Nəfəslə alırıq suyu havadan.
Bu çöldə belədir məişətimiz,
Belədir işimiz, vəziyyətimiz.
Bir də soruşdunuz, deyək bir qədər
Bu çöldə kimlər var, necə ömr edər?
Bu odlu səhralar dəhşətdir, dəhşət,
Bir quş da uçmağa etməz cəsarət.
Dəstə dəstə vəhşi adamlar yaşar,
Heç kəslə ünsiyyət bağlamaz onlar.
Bir gündə onların getdiyi qədər
Biz getsək, inan ki, iki ay çəkər.
Onlardan birisi düşmüşdü ələ,
Soruşub birtəhər gətirdik dilə:
"Necə edirsiniz susuzluğa tab?"
O bizə nifrətlə vermişdi cavab:
"Su bizə zəhərdir, su içməz heç kəs,
Bizə suyu hava eləyər əvəz.
Ilantək heç kəsə yovuşmarıq biz,
Kərtənkələlərdir yediklərimiz.
Sizdən ki, bir fayda yoxdur bizlərə,
Neçin boyun əyək sizə boş yerə?"
Yemək, yatmaq vaxtı yenə birtəhər
Onlardan gizlincə almışdıq xəbər:
"Bu sonsuz səhranı, susuz çölləri
Gəzib görübsünüz siz çoxdan bəri;
Söyləyin, kim görüb başqa zihəyat?[208]
Varmı bu çöllərdə başqa məxluqat?"
Onlar cavab verib: "Bu çölü, dağı
Axtarıb gəzmişik yaxın-uzağı.
Ahutək biz qaçdıq illər uzunu,
Tapmadıq səhranın ancaq sonunu.





Bizə rast gəlmişdir başqa çöllülər,
Onlardan soruşub tutmuşuq xəbər:
"Görəsən bizlərdən başqa, yaradan
Burda yaratmışmı başqa bir insan?"
Onlar deyiblər ki: "Çox uzaqlarda,
Günəş ziyasına həsrət diyarda
Müşk meşəsi kimi bircə şəhər var,
Orda ağ bədənli insanlar yaşar.
Gözəl, xoşxasiyyət, üzləri gülər,
Onlar beş yüz ildən artıq ömr edər.
Beş yüz yox, lap min il yaşasalar da,
Qocalıq əsəri olmaz onlarda.
O diyar haqqında bunlardan qeyri
Heç kəsin heç şeydən yoxdur xəbəri.
Bizim bu torpaqda hələ də çox var
Heç ayaq dəyməmiş səhralar, dağlar.
Orda göyərtidən, sudan əsər yox,
İsti bərk istidir, soyuq bərk soyuq.
Bir yerdə göyərti bitməsə əgər,
Orda canlı məxluq necə ömr edər?"
Bunlardır eşidib bildiklərimiz,
Yoxdur başqa daha bir xəbərimiz."
Onların halına yanıb İskəndər,
Cürbəcür nemətdən verdi bir qədər.
Qayda-qanun qoydu, ayin öyrətdi,
Onları haqq dinə hidayət etdi.
Düzgün nişanlarla bilməkçin yaqin
Yolunu soruşdu məchul yerlərin
Gördülər İskəndər çox şəfqətlidir,
Insaflı, qayğıkeş, mərhəmətlidir,
Eyləyir onlara ürəkdən kömək.
Dedilər: biz də bir xidmət göstərək
Torpağı od, atəş, küləyi zəhər
Səhradan çıxmağa yol göstərdilər.
İskəndər vaxt-bivaxt, baxmadan yola,
Oradan atını çapdı dördnala.
Qurtardı axır ki, çöllər, səhralar,
Dübarə sahilə çatdı hökmdar.

Dərya kənarında bulaqlar vardı,
Büllurtək suları şırşır axardı,
Bulaqlar başında bir aya qədər
Əzabı dincliklə əvəz etdilər.
Yenidən gəmilər qayırdı onlar,
Mindi gəmilərə bütün qoşunlar.
Bir ayda yol gedib onlar dənizlə,
Gəlib yetişdilər axır mənzilə.
Ulduzlu gecənin od tutub canı,
Sanki əqrəb çalıb xallı ilanı[209].
Cənubdan bir nəsim əsdi bu yerə,
Şadlıq, fərəh verdi yol gedənlərə.
Çeşməli, kölgəli bir yer gördülər,
Bir həftə qalmağa qərar verdilər.
Yolun əzabına tapdılar dərman,
Çıxdı yavaş-yavaş ağrılar candan.

## İSKƏNDƏRİN BAŞA SİTAYIŞ EDƏNLƏR KƏNDİNƏ YETİŞMƏSİ

Müğənni, könlümdə taqət yox səbrə,
Bu gecə nəğmənlə qıl mənə çarə!
Elə bir nəğmə ki, kama yetirsin,
Məni huşsuzluqdan huşa gətirsin!
O gövhər paylayan öz mücrüsündən -
Belə gövhər saçır söz mücrüsündən:
Şah dönüb Məşriqdən mənzilə yetdi,
Atını Cənuba tərəf yönəltdi.
Havanın ən lətif, ən xoş bir çağı,
Oxşayıb sevəndə ruzgar torpağı,
Narıncı ətr ilə sübh oyananda,
Türüncü rənglərlə su boyananda,
Yenə köç yerindən çıxıb səfərə,
Sürdülər atları başqa bir yerə.
Şaha bələdçilər verdilər xəbər
Ki, burdan çıxaraq edərkən səfər,





Yolda behiştək bir kəndə çatacaq,
Hər yanı çəmənlik, hər yanı bulaq.
Orda yaşayanlar haqqı danırlar,
Bütü özlərinə allah sanırlar.
Bəlkə şah onlara edə mərhəmət,
Edə onları da haqq yola dəvət.
Gecənin camına gün axıb doldu,
Yetişib o kəndə şah, aram oldu[210].
Günəş tovuz kimi açdı balü pər,
Lacivərd hilalın üstə səpdi zər.
Qalxdı o cahangir atın belinə,
Zəfər cilovunu aldı əlinə.
Qürurla atını sürdü qabağa,
Sankı Bəhram getdi gur ovlamağa.
Açıldı önündə nurlu bir cahan,
Çiçəkli, çeşməli bağ idi hər yan...
Hər yanı yamyaşıl gözəl bir kənddi,
Kənd demə, elə bil əsil cənnətdi.
Şah gəlib o kəndə çatdığı zaman,
Görmədi pişvaza çıxan bir insan.
Çox idi o kənddə allahlıq edən,
Hamısı uzaqdı dindən, əqildən.
Palçıq bir küp qoyub evinə hərə,
Küncüd yağı töküb həmin küplərə,
Yağla dolu küpə insafsızlıqdan
Onlar salardılar bir nəfər insan.
Üstündən otuz gün, qırx gün keçərkən
Kəsib alardılar başı o küpdən.
Baş dönüb qupquru kəllə olardı,
Bədənsə necə var elə qalardı.
Bu quru kəlləni sanaraq rəhbər,
Ondan alardılar hər şeyi xəbər.
Quru, boş kəlləni çubuqlayaraq,
Hərdən sorardılar ondan bu sayaq:
"Yaxşımı keçəcək bizim gecəmiz?
Nələr görəcəyik sabahkı gün biz?"
Guya bu kəllədə gizlin sirr varmış,
Ondan danışıqtək bir səs çıxarmış,

Deyərmiş sabahkı müqəddəratdan:
Hansı yollar ilə gedəcək cahan.
Baxıb o söyləyən sözə, təbirə,
Yozardı bəxtini hərə bir cürə.
Görüb bu adəti müdrik xilaskar
Dedi ki, bu sirdə bir dıv əli var.
Əmr etdi, kəllələr bütün qırılsın,
Yağla dolu küplər tez sındırılsın.
Ağıllı dəlillər ilə hökmüdar
Batil fikirləri etdi tarmar.
Onları təlqinlə dinpərvər etdi,
Allah və peyğəmbər yolu öyrətdi.
Bir təmiz qəlblini böyük İskəndər
Burada onlara eylədi rəhbər.
Ölkənin işini qaydaya saldı,
Yenə də gethaget səsi ucaldı.
Fərəhlə eləyib ordan hərəkət,
Bir mənzil yol getdi o, sağ-səlamət.
Hökmüdar atına verməzdi aman,
Axıb ulduz kimi keçdi yollardan.
Yollar buruq-buruq, yollar dumanlı,
Uçurum, darısqal, daşlı, tikanlı.
Göründü zirvəsi qılınctək bir dağ,
Əzab-əziyyətdı o dağı aşmaq.
Şah onu seyr etdi başdan-ayağa,
Yol gəzdi birtəhər ora çıxmağa.
Çəkdi ordusunu o dağa sarı,
Hədsiz əziyyətlər yordu onları.
O qədər sərtdi ki, daşlar, həmin gün
Dırnaqdan oldular heyvanlar bütün.
Şah gördü bu daşlar bərkdir poladtək,
Heyvanlar yorulub əldən düşəcək,
Əmr etdi xam gönlə, dəriylə bərk-bərk
Onların dırnağı sarınsın gərək.
Dırnaqlar daşlara dəyməsin deyə,
Möhkəm sarısınlar qalın keçəyə.
Yolda yeriməyə əngəl törədən
Daşları yığsınlar bütün o yerdən.





Yığdılar yollarda nə qədər daş var,
Çala-çuxurları hamarladılar.
Gəlib neçə fərraş şahın yanına,
Ədəblə, hörmətlə baş əydi ona.
Bir ovuc daş verib dedilər: "Bir bax,
Bu daşlar minikdə qoymayıb dırnaq.
Nallardan əzabla çıxarmışıq biz.
Bunlardan dad çəkib miniklərimiz.
Polad çəkiclərlə döydük o ki, var,
Polad sındı, amma sınmadı daşlar.
Şah daşa zəhm ilə bir qılınc çaldı,
Qılınc parçalandı, daş bütöv qaldı.
Hansı bir maddəylə onu sürtdülər,
Qalaydan başqa şey etmədi əsər.
Doğrudan bu daşlar bərkdi, itiydi.
Odur ki, bunlara şah "almaz" dedi.
Toplayıb hamını dedi hökmüdar:
"Tanıyın, qiymətli daşlardır bunlar.
Bunlar kara gələr, yəqin ki, bir gün,
Yığın, təmizləyin yolları bütün!".
Daşları tanıyıb yığsınlar deyə
Nümunə verirdi hər döyüşçüyə.
Əsgərlər bu sözü eşidən zaman
Düşüb axtardılar həmin daşlardan.
Aşağı yuxarı, çox axtardılar,
Ancaq gördülər ki, bu daşdan az var.
Dənizték vüsətli bir dərə vardı,
Dağı dörd tərəfdən o qucaqlardı,
Almazla doluydu o dərin dərə,
Gəlirdi tasdakı sutək nəzərə.
Dərə dəniz kimi gövhər saçandı,
Ancaq ki, balığı onun ilandı.
Qaynaşır ilanlar min-min hər yanda,
Kim görüb ilanı gövhər satanda?
İlanlar onunçün dolub bu yola
Ki, xəznə bir yerdə olur ilanla.
Yolu xəzinənin çətindi yaman,
Yox idi bir nəfər ora yol tapan.

Şah gördü çox-çoxdur mədəndə almaz,
Almazın üstüylə yol getmək olmaz,
Həm də ki, yollarda doludur ilan,
Bir əsgər getməyir ora qorxudan.
Düşündü, axtardı buna bir çara,
Diqqətlə baxanda qayalıqlara,
Gördü ki, qayalar üstünə qonmuş
Caynaqlarında ov çoxlu qaraquş.
Uçuşan quşları görəndə orda,
Öz fikir quşunu uçurtdu o da.
Əmr etdi: kök, arıq, nə olur olsun,
Yığıb gətirsinlər düz min baş qoyun.
Həmin qoyunları kəssinlər onlar,
Ətini doğrayıb parçalasınlar.
Atsınlar o mədən sayılan yerə,
Ət ilə qalanıb dolsun o dərə.
Şahın əmri ilə görüldü tədbir,
Qoyunlar kəsilib soyuldu bir-bir.
Almazlar mədəni sayılan yeri
Ətlə doldurdular atıb leşləri.
Ətə almaz duztək yapışan zaman
Quşlar da uçuşub gəldi hər yandan;
Kababla "duzu" da aldılar onlar,
Qaldı o dərədə yalnız ilanlar.
Qayalar üstünə qonub yedilər,
Hər quşun dalınca getdi on nəfər.
Tökülən almazı onlar yığaraq,
Şahın hüzuruna döndülər qıvraq.
Şah yığdı bir yerə o almazları,
Pislər gömgöy idi, yaxşılar sarı.
Şah ordan aşağı dönüb gələrək
Endi dağdan axan qüdrətli seltək.
Onlar çox sür ətlə endilər dağdan,
Yox idi bir nəfər bələdçi-filan.
Atların nalından odlar yağırdı,
Döşündən tər deyil, qanlar axırdı.
Bir ay yol getdilər onlar bu sayaq,
Qalmadı minikdə salamat dırnaq.





Axır xoşbəxtliklə qurtardı birdən
Qoşun şikayətdən, şah əziyyətdən:
Qoşunu şah daşlıq yerdən çıxartdı,
Həm abad, həm geniş bir yerə çatdı.
O münbit torpaqda yağışdan, qardan
Gömgöy əkinlərlə doluydu hər yan.
Yamyaşıl, şən, göyçək görüb o yurdu,
Qəlbi həsrət ilə ora uçurdu.
Atlar ac, burasa göy otla dolu...
Başları qarışdı, azdılar yolu.
Bir gənc, - əlində bel, ayağı yalın
Durmuşdu zəmidə şır kimi dalğın.
İgiddi, tərifə yox ehtiyacı,
Başına layiqdi Kəyanlar tacı.
Bel sanki əlində qızıl açardı.
Üzündə iş-gücün nişanı vardı.
Beli gah qaldırır, gah endirirdi,
Suyu gah kəsirdi, gah da verirdi.
Şah dəvət eləyib soruşdu ondan:
"Nədəndir torpağa meylin, ey cavan?
Bir gözəl oğlansan, düşüncən də var,
Gözəl iş görməli gözəl insanlar.
Sənə layiq deyil bu çöldə qultək
Əlinə bel alıb rəncbərlik etmək.
Belə gözəl, parlaq gövhərə əsla
Yaraşmaz torpağa qaxılıb qala.
Lap şahlıq verərəm istəsən sənə,
Əl çək bu torpaqdan, qulaq as mənə..."
Ağıllı əkinçi eyləyib xitab,
Verdi padişaha ədəblə cavab:
"Ey dünya alimi, adil hökmüdar,
Sənə ram olmuşdur xanlar, hanlar.
Bir elə iş ver ki, hər peşəkara,
Qoymasın işindən onu avara.
Başqa iş bilmərəm, əkinçiyəm mən,
Padşahlıq eləmək gəlməz əlimdən.
Rəncbərin yatağı daim bərk olar,
Biz yumşaq yataqda olarıq donqar.

Bərkliyə öyrənib vücudum mənim,
Çox yumşaq yatağa dözməz bədənim.
Zəriflik eləsə kobud bədənlər,
Elə bil yapışqan bal olmaq istər!.."
Bu cavab padşahın gəldi xoşuna,
Ürəkdən "Afərin!" söylədi ona.
Sonra da etməkçün onu imtahan
Soruşdu: "Allahın kimdir, ey cavan?
Səni kim qoruyur dünyada şərdən?
De, nəyə etiqad eləyirsən sən?
Kimə qul bilirsən, söylə, özünü?
Tikibsən hansı bir yola gözünü?"
Gənc dedi: "Ey haqdan xəbərlər verən,
Peyğəmbərlik edib düz yol göstərən!
Səninlə bir yolun yolçusuyam mən,
Mənim də qibləmdir sənin öz qiblən.
Dağları, daşları, çağlayanları,
Göyləri bəzəyən kəhkaşanları
Yaradan allaha mən gecə-gündüz
Səcdəylə sürtürəm bu torpağa üz.
Bu qaşı, bu gözü odur nəqş edən,
Özümdən xəbərsiz mənə bəxş edən.
Daha neçə nemət mənə göndərmiş,
Onun yüzdə biri min fayda vermiş.
Mənim də borcümdur ona şükr etmək,
Allahı tanıyan şükr edə gərək.
Sən bir peyğəmbərsən, mən allaha qul,
Odur ki, edirəm dinini qəbul.
Mən səni əvvəldən görüb yuxuda,
Sayəndə dirildim balıqtək suda.
İndi, sən qarşımda zühur edəndə,
Əmrinə həmişə hazıram mən də.
Dünya yetirməmiş səənintək insan,
Səni tək yaratmış böyük yaradan.
Aləmdə şadlığın mayəsi sənsən,
Dünyanı hifz etdin öz səddinlə sən!"
Şahların başçısı olan İskəndər
Həmin xoşxasiyyət gəncə bir qədər





"Afərin!" söyləyib öpdü alnından,
Allahın adını eylədi bəyan.
Ona bağışladı şahanə xələt,
Allahın dinilə tapdı o qüdrət.
Bu güllü, çiçəkli gülşən ölkədə,
Çəmənli, bulaqlı bu şən ölkədə
Qoşunla birlikdə şah bir gün qaldı,
Hamı rahatlanıb dincini aldı.
Bu yeddi xalvarlıq təbli çaldıran
Xoruza əmr edib verdirəndə ban[21],
Yola hazırlaşdı yenə İskəndər,
Tədarük gördülər, başlandı səfər.
Xeyli uzaqlaşıb həmin ölkədən,
Başqa bir mənzildə saldılar məskən.
Bu ölkə cənnəttək gözəl bir yerdi,
Torpağı əkinsiz məhsul verərdi.
Ağaclı, çiçəkli gözəl diyardı,
Hər yanda şahanə saraylar vardı.
Ancaq torpağını basmışdı sular,
Çürüyüb solmuşdu orda hər nə var.
Şah sordu: "Bu yerdə kimlər hakimdir?
Bu hansı ölkədir? Sahibi kimdir?
Bunun əkinçisi, öküzü hanı?
Hanı xış sürəni, cilov tutanı?"
Yerlilərdən biri təzim eylədi,
Şaha əhvalatı belə söylədi:
"Qəlbə fərəh verir bu gözəl diyar,
Onun bərəkətli zəmiləri var.
Burda əkin əksən vaxtında əgər,
Məhsulu ən azı birə min verər.
Ancaq zülm əlindən gəlib zavala,
Düşüb bu faydasız, bəhrəsiz hala.
Adil olsa idi burda hökmüran,
Kənd abad olardı, kənddə də - insan.
Bu yer ədalətə görə verər bar,
Zülmdən zavala gəlib məhv olar.
Bir yerdə insafdan olmasa nişan,
Quruyar istidən, çürüyər sudan.

Bu yerdə zülm olsa bir arpa qədər,
Arpanı, buğdanı yel, sel məhv edər.
Bu yerin çox incə tərəzisi var,
Bircə arpa onu əyərək pozar."
İskəndər bildi ki, bu su, bu torpaq
Zülmdən xaraba qalıb bu sayaq,
Ədli bərpa etdi, kənd oldu abad,
Qoydu adını da: İskəndərabad.
Bir qanun qoydu ki, o kənddə heç kəs
Muzdurun haqqını verməyə bilməz.
Hər kəs verməlidir malına zəkat,
Ora xərac üçün gəlməsin barat.
Heç bir tövcü yığan ora gəlməsin...
Belə hökmüdara yüz min afərin!

## İSKƏNDƏRİN QƏNDƏHAR BÜTXANƏSİNƏ YETİŞMƏSİ

Müğənni, mizrab vur, gəlsin dilə saz,
Çünki bu işimiz sazsız saz olmaz!
Bu saz yar olarsa əgər bir kəsə,
Gələr onun qəlbi eşqə, həvəsə.
Səfalı bir gündə, ilk bahar çağı
Seyr etmək nə xoşdur bağçanı, bağı.
Bənövşə gətirə bahardan soraq,
Nərgiz əllərində qaldıra çıraq,
Quşların qanları gəldikcə cuşə,
Qəlbləri naləylə gələ xüruşə.
Sərv altda qırqovul quşuna bənzər
Düzülə rəngarəng qızıl qədəhlər,
Çöllərdə ceyranlar başlaya rəqsə,
Ceyran quzuları verə səs-səsə.
Güllər büsat qura çay sahilində,
Şirindil bülbüllər ola sazəndə;
Qumrunun səsilə gülün nəsimi
Uyuşa ülfətlə iki dost kimi...
Belə bir fəsildə ən sevimli şey





Rudun ahəngidir, bir də gülgün mey...
Çala badam gözlü bir türk nəğməkar,
Simlərin üstünə töküla saçlar.
O simlər dəyəndə nazlı əllərə,
Qırılıb qarışa ipək tellərə.
Sən nəğmə qoşasan oynaq rəng ilə,
O da cavab verə sənə çəng ilə.
Ondan öpüş ola, səndən qəzəllər,
Biri innab kimi, digəri şəkər...
Tutiyə dönübsən, ey şad könül, sən,
Yadına Hindistan düşüb deyəsən!..[214]
Dağların döşünü bəzədi reyhan,
Otlar yamyaşıldır, güllər al-əlvan.
Marallar gül-çiçək içinə batdı,
Səsləri dağ-daşı, çölü oyatdı.
Tikanlar yerini verdi güllərə,
Qarışdı bənövşə müşkə, ənbərə.
Ənbər almaq üçün o xumar nərgiz
Başını qaldırdı yerdən çarəsiz...
Rum ilə İranın böyük sərdarı
Abad bir ölkəyə saldı güzarı.
Hindistan mülkünə yetişdi yenə,
Elə bil xoş nəsim əsdi gülşənə.
Ordan da Məşriqə qaldırdı bayraq,
Bir ay dağdan, daşdan aşdı çaparaq.
Yolları cəhənnəm istisi sardı,
Gündən balığın da beli qızardı[215].
Yaşıllıq içində gördü bir şəhər,
Ona Fərruxbehişt deyirlər türklər.
Gördü orda gözəl bir bütxana var,
Qoymuşlar adını onun Qəndəhar.
Yığılıb bütüzlü gözəl sənəmlər,
Hərəsi bir bütə sitayiş eylər.
Qızıldan bütlərdir baxsan hər yana,
Xəznəyə çevrilib sanki bütxana.
Nəzər sal heykəlin başında taca,
Ucalıb sarayın tağı boyunca.
Gövhərdir bütlərin parlaq gözləri.

Şamtək şölələnib yanır hər biri.
O qədər gövhərlə bəzənib bu bağ,
Sanki yanır orda gecə min çıraq.
Şah dedi: "Heykəlin tozu tökülsün,
Qızılı, gövhəri, nə var sökülsün."
Bütə bu fərmandan gəlsə də ziyan,
Xalqın xeyrinəydi, əlbəttə, fərman.
Orda bir canlı büt vardı, gözəldi,
İşvəylə o şahın yanına gəldi.
Əyilib süpürdü saçıyla yeri
Şahı alqışlayıb düzdü sözləri:
"Ey Şərqdən Qərbədək bütün dünyanı
Fəth edən ən adil dünya sultanı!
Dünyaya nur saçar, ucadır tacın,
Qızıla, gövhərə yox ehtiyacın.
Belə nəql edirlər düzdanışanlar:
Bu bütün qəribə bir dastanı var.
Şah əgər icazə versə, könüldən
O köhnə dastanı danışaram mən."
Padişah buyurdu: o gözəl dilbər
Yaqut sandığından saçsın saf gövhər[214]
Qaraxal gözəlin dodağı qaçdı,
Sanki büllur çeşmə sərin su saçdı,
Dualar söyləyib eylədi bəyan:
"Bu yaşıl budaqlı, bu zərli eyvan
Bir zaman deyildi hələ bütxana,
Bir günbəzi vardı yarımvirana.
Səhradan buraya uçdu iki quş,
Hərə dımdıyində bir gövhər tutmuş,
Səadət gətirən humay quşutək
Qondular üstünə günbəzi görcək.
Şəhər əhlı buna təəccüb etdi.
Quşları tədbirlə tutmağa getdi.
Tədbir baş tutmadı, keçdi bir qədər,
Quşlar gövhərləri atıb getdilər.
Şəhər böyükləri düşdülər işə,
Gövhərlər onları saldı təşvişə.
Fikir, mübahisə artdı, çoxaldı,





Ağıllı məsləhət qələbə çaldı.
Qət etdi şəhərin başbilənləri:
Məbədə versinlər o cüt gövhəri.
Bir büt düzəltdilər, bədəni zərdən,
Hər iki gözü də parlaq gövhərdən.
Quşların bəxşişi - o gövhərləri
Gərək şah da bizdən almasın geri!
Nur alır gözümüz gündən, gündüzdən,
Rəvamı gözləri gün ala bizdən?[215]
Korları şad edən bir şamı əbəs
Gözü işıqlılar əsla söndürməz.
Qəlbinə dağ çəkmə dul qadınların,
Söndürmə şamını sən də onların."
O şirin dilli büt belə söylədi.
Şah da dilsiz bütü azad eylədi.
Yazıldı o bütün üstə bu sözlər:
"Bura öz möhrünü vurmuş İskəndər."
Qız gördü qoruyur padşah bütləri,
Bundan xoşhal olub o gözəl pəri,
Şaha bir xəzinə göstərdi pünhan.
Onu kim görsəydi qalardı heyran.
Xəznə açarını şah ondan aldı,
Bir qədər payladı, bir qədər qaldı.
Sonra o cənnətdən çıxıb İskəndər
Yenə qoşunuyla eylədi səfər.
Keçərək şoranlıq, daşlıq yerlərdən
Çöllərdə, dağlarda salırdı məskən.
Yollarda təsadüf etdikcə insan,
Başlardı söhbətə o hər bir yandan.
Danışıb onlara allahdan, dindən,
Tutiya verərdi din hikmətindən.
Getmişdi bütün Şərq ölkələrinə,
Yenidən bir daha yönəldi Çinə.
Onun gəlişini eşidən zaman
Layiqli bir büsat bəzədi xaqan.
Şahı dəbdəbəylə etdi istiqbal,
Bürüdü dünyanı dövlət, cah-cəlal.
Təzimlə çıxdı o, şah hüzuruna,

Şah da mehribanlıq göstərdi ona.
Göy küpdə batan gün, sapsarı ipək
Rəngini dəyişib, alanda göy rəng.
Üz-üzə əyləşib iki hökmüdar
Hər yerdən, hər şeydən söhbət açdılar.
Xeyli uzun çəkdi xoş söhbətləri,
Onlar təzələdi köhnə əhdləri.
Padşahın dinini bəyəndi xaqan.
Qanunlar, qaydalar öyrəndi ondan.
Sabah öz möhrünü göstərən zaman
Atəşpərəst oldu hindli Qaraxan[216].
Burdan köç edəydi gərək İskəndər,
Bunu o xaqana elədi xəbər:
Burda xoş keçsə də mənimçün, yenə
Böyük həvəsim var dəniz seyrinə.
Səyahət eləyib yenə dəryanı,
Görüm orda olan yaxşı-yamanı.
Dərin dənizlərdə bir görüm nə var,
Nə sirlər söyləyir qorxunc dalğalar?
Səfərdə yoldaş ol, dayaq ol mənə,
Yoluma nur saçan çıraq ol mənə".
Xaqan bu təklifi qəbul elədi:
"Belə səyahətə çox şadam!" dedi.
Sonra qərar verdi iki hökmüdar:
Əvvəl bir bələdçi yola salsınlar.
Uğurlu talelə üfüq gülüncə
Səhərin başına tac qoydu gecə.
Belə qərar verdi böyük tacidar,
Dostlarla bir yerdə yola çıxsınlar.
Seçdi ordusundan düz on min nəfər
Hər biri şahlığa layiq bir əsgər.
Sonra ehtiyaca nəzər yetirdi,
Nə qədər lazımsa sursat götürdü.
Qoşundan, xəznədən bir hissə qaldı,
Özüsə dəstəylə köç təbli çaldı.
O xanlar xanı da bir bələdçitək
Şaha xidmət etmək, yoldaşlıq etmək
Fikriylə, azuqə alıb bir qədər





Götürdü ox, qılınc və başqa şeylər.
Yanında on min də əsgəri vardı,
Onlar həm ağıllı, həm işgüzardı.
Başlandı bu sayaq Məşriqə səfər,
Yolda saf qızıllar sərf edirdilər.
Sonrasa Cənuba dönüb yenə də,
Çoxlu ov etdilər yol gedə-gedə.
Belə yol getdilər onlar düz qırx gün,
Bir yer tapmadılar dincəlmək üçün.
Göy su kənarına çatdıqda onlar,
Enərək sahildə tutdular qərar.
Ordaca yığılıb məclis quraraq,
Yenə ucaltdılar göylərə bayraq.
Orda eşitdilər bir xoş hekayət,
O sahil haqqında xoş bir rəvayət:
"Günüzlü, ayüzlü pərilər gecə
Çıxırlar dəstəylə ora gizlicə,
Ucadan oxuyub dadlı nəğmələr,
Çalıb oynayırlar səhərə qədər.
O qədər lətifdir, incədir o səs,
Huşunu itirər eşitsə hər kəs.
Beytlər yayılır bəhrdən çölə,
Heç kəs bu bəhrdə yazmayıb hələ[217].
Dağın ətəyində bir neçə saat
Hər gecə qururlar pərilər büsat.
Sübhün nəfəsini onlar duyanda
Batırlar qapqara suya bir anda..."
Şah bunu eşidib belə buyurdu,
İki mil uzağa çəkilsin ordu.
Müşktək ətirli bir gecə, göydən
Ulduzlar gövhərtək nur səpələrkən
Şahın əmri ilə bir gəmi gəldi,
Şah burdan qoşunsuz yola düzəldi.
Sahildə bir xeymə qurdu o sultan,
Gövhər nur saçmağa başladı sudan.
Göründü pərilər, elə bu zaman
Gün bayraq qaldırdı sanki dəryadan.
Saçlar ağ əndama səpələnibdir,

Sanki gümüş üstə müşk ələnibdir.
Tərana oxuyur şövq ilə onlar,
Hər səsdə, nağmədə başqa ahəng var.
İskəndər eşidib o xoş səsləri,
Qanı cuşa gəldi, yandı ciyəri.
Bu həzin nəvadan ağladı bir az,
Sonra gülüb dedi: ağlamaq olmaz.
Bir səsdən gülə, həm ağlaya insan,
Onun qüdrətinə olmazmı heyran?
Şah bütün bunları seyr edib, yenə
Sahildən qayıtdı öz məskəninə.
Bəzədi göyləri ağ Çin ipəyi,
Yer açdı üzündən qara örpəyi[218].
Dedi gəmiçiyə böyük hökmüdar:
"Tez ol, bu dənizə bir gəmi çıxar.
Dalğalı suları seyr eləyim bir,
Var bu pərdələrdə ilahi bir sirr.
Bu iş qorxuludur, anlayıram mən,
Ancaq əl çəkmərəm öz niyyətimdən.
Bunu bir aqildən soruşsan əgər,
Fələk şövq eləyib bu işə, - deyər."
Gəmiçi dinlədi şahın əmrini,
Sahildən dənizə saldı gəmini.
Şah minib gəmiyə gedəndə ordan
Sahildə müntəzir dayandı xaqan.
Ona tapşırdı ki: "Mən qayıtmamış
Tərpənmə yerindən əsla bir qarış!
Geri döndərmərəm əsla yelkəni,
Bəlkə də əcəldir aparan məni...
Sağ dönsəm, çıxaram xəcalətindən,
Dönməsəm, işlərə əncam çəkərsən!"
Deyib, göz yaşını axıtdı seltək,
Yerdə qalanlara vida edərək,
Sürdü gəmisini Çin dənizinə.
Kim görüb ki, dəniz gəmiyə minə![219]
Yoldaşlarından da bir neçə nəfər
Götürdü, birlikdə etdilər səfər.
O İsa nəfəsli ustadlardan da





Birce Bəlinasdı onun yanında...
Çəkildi sahildən ənginliklərə
Sahil görünməyən uzaq bir yerə.
Dəniz dünyasında bir dünya getdi[220],
Hünəri, şöhrəti dünyaya yetdi.
Bir xeyli yol getdi dənizdə gəmi,
Axıntı başladı birdən sel kimi.
Axırdı Mühitə dəniz bu yerdən,
Axırdı, axırdı geri dönmədən.
Mahir dənizçilər düşüb heyrətə,
Bu qorxunc sularda gəlib dəhşətə,
Axır rəhnümədən öyrənib sirri,
Gördülər ki, gərək dönsünlər geri.
Bu zaman uzaqda nurtək parlayan
Kiçik bir cəzirə göründü əyan.
Mühitin selindən qorxaraq onlar
Həmin cəzirədə tutdular qərar.
Bir qoca gəmiçi gələrək dilə
Müdrik padişaha söylədi belə:
"Çatmışıq ən qorxunc, çətin bir yerə,
Bura son mənzildir rəhnüma üzrə.
Gəl, inad eləmə, dəniz suları
Burdan axıb gedir Mühitə sarı.
Əgər bir mənzil də o yana getsək,
Daha mümkün olmaz geriyə dönmək!.."
İskəndər bunları eşidən zaman
Gördü qorxuludur bu yer, doğrudan.
Əmr etdi, burda bir tılsım düzəlsin,
Əliylə işarə eyləyə bilsin.
Görənlər bilsin ki, yol yoxdur burdan,
O yana keçməyib hələ bir insan.
O yerdə misdən bir tılsım tökərək,
Onu qaldırdılar adada yüksək.
Gəmilər gələndə bura uzaqdan,
Tılsım suyu verib əliylə nişan,
Bildirsin ki, burdan keçməyib heç kəs.
Kimsə cəhd etməsin o yana əbəs!
Şahın buyruğundan olub xəbərdar,

Bu yoldan geriyə qayıtsın onlar.
Tilsimə bir daha nəzər saldı şah,
Duydu ki, bu sirri buyurmuş allah.
Alimə dedi ki: "Çəkilən zəhmət
Bu işin xatiri üçünmüş, əlbət!
Bu tilsim üstündə, buna sal nəzər,
Məni bu dənizin Xızrı etdilər."
Allahın əmrilə qadir hökmüran
Salamat qayıtdı o gur axından.
Dənizdə on gün də etdilər səfər,
Yol azdıqlarını sonra bildilər.
Uca bir dağ gördü onlar uzaqdan,
Önündə yol kəsən qorxunc burulğan.
Bir gəmi girdaba düşsəydi əgər,
Hərlənib qalardı hey uzun illər.
Sınıb dağılardı orda, nəhayət,
Ordan çıxmamışdı kimsə səlamət.
O mahir gəmiçi ora yetişcək
Xətt çəkdi gəmiylə suda pərgartək.
Bir dağ ətəyində saldı lövbəri,
Çıxardı sahilə səmişinləri.
Baxıb burulğana, xəyala daldı,
Arvad-uşağını yadına saldı.
Şah sordu: "Nə var ki, qəmgin durubsan?
Üzübsən əlini sankı dünyadan."
Gəmiçi bilirdi iş nə yerdədir,
Bunları şaha da danışdı bir-bir:
"Gəmini bu yerə sürərsə hər kəs
Bu qorxunc girdabdan qurtara bilməz!
"Şir ağzı" deyərlər bu burulğana,
Çünki şir ağzıtək hərisdir qana.
Doğrudur, çox qorxu çəkdik biz müdam,
Ancaq bu təhlükə başqadır tamam.
Bu ona bənzər ki, qızdıra xəstə,
Bir yara da çıxa yaranın üstə.
Qorxuyla keçdiksə o yolu əgər,
Öndəydi təhlükə, öndəydi xətər.
Ölüm ayağıdır indisə bura.





Yağışdan qurtarıb düşdük yağmura.
Bu dağ qılıncından xilas olaq biz,
Quruyla getməkdir ancaq çarəmiz.
O yanda Qeysura gedən bir yol var.
Ordan Çinə sarı uzanır yollar.
Quru yol olsa da nə qədər uzaq,
Dənizlə getməkdən yaxşıdır ancaq."
Söylədi İskəndər orda bir məsəl:
"Uzaqlıq eyb etməz, sağ-salamat gəl!"
Sonra tələb etdi o, alimdən də:
"Müdrik bir insansan, fikir de sən də,
Qüdrətli əqlindən işıq saçılsın,
Gəmiyə qurtuluş yolu açılsın!"
Alim söylədi ki: "Bu yolda müdam
Mən şahın bəxtini rəhbər tutmuşam.
Şah əgər qalarsa burda bir qədər,
Mən qaya üstündə tilsim düzəldər.
Sonra da bir günbəz tikərəm ona,
Bir təbil asaram onun boynuna.
Günbəzin içində durub bir nəfər
Təbili şiddətlə döyərsə əgər,
Gəmi burulğandan çıxar səlamət,
Əvvəlki qaydayla yol gedər rahət!"
Şaha çox qəribə gəldi bu oyun,
İstədi fikrini öyrənsin onun.
Alimə buyurdu fikrində nə var,
Yerinə yetirib eləsin aşkar.
Hər nə lazım isə həmin iş üçün
Verildi alimə o şeylər bütün.
Hünərli alim də durmadan bir dəm
O çətin iş üçün çalışdı möhkəm.
Sərp daşdan bir günbəz tikdi çox yüksək
Ona əfsunlarla vurdu min bəzək.
Misdən bir tilsim də elədi bina,
Asdı bir mis təbil onun boynuna.
Şaha söylədi ki: "Günbəz hazırdır,
Onun tilsimi də, təbli də vardır!
İndi burulğana gəmini salsan,

Salamat çıxacaq o təbli çalsan!"
Mahir gəmiçiyə şah verdi fərman,
Sürsün gəmisini ora qorxmadan.
Gəmi burulğana daxil olantək,
Coşaraq hərləndi bir burulğantək.
Təbil ağacını şah alıb ələ,
Yoxlamaq istəyib, endirdi təblə.
Elə bir dəhşətlə gurladı təbil,
Sanki qanad çaldı göydə Cəbrail.
Gəmi də girdabda qalmayıb bir an,
Tez çıxıb qurtuldu o burulğandan.
Bu sirli hikmətə çox sevinərək,
Şahın üzü güldü yaz günəşitək.
Xilaskar alimə, şad olsun deyə,
Çoxlu mal-xəzinə etdi hədiyyə.
Başqa bir katib də xəritələrdən
Yoxlayıb, danışır həmin o yerdən:
"Babil tərəfdədir həmin burulğan..."
Çətindir iki rəy söylənən zaman.
İki çay bir yerə tökülsə əgər,
Səsi nəğmə kimi qulağa gələr.
Bunu bir alimdən sual elədim:
"Bu təblin səsində nə sirr var?" dedim.
Heyətşünas alim öz biliyilə
Dəlillər gətirib, şərh etdi belə:
"Gəmi burulğana çatdığı zaman
Heybətli bir balıq suyun altından
Bir dairə üzrə daim dövr edir,
Ağır gəmiləri suda hərlədir.
Gəmilər hərlənir dağılanadək,
Qərq olub batanı udur o nəhəng.
Gurlayanda təbil - o qurd dərisi,
Yetişir balığa sehirli səsi.
Balığı sarsıdır bu müdhiş nərə,
Baş vurub o qaçır dərinliklərə.
O balıq qaçanda suları yarır,
Ardınca gəmini çəkib aparır.
Çıxır burulğandan gəmi bu sayaq,





Allah özü bilir düzünü ancaq!"
Tilsimin sirrini bilib hökmüdar,
Dənizə çıxmağa verdi tez qərar.
O dağda dayanmaq istəməyərək,
Tələsik sahilə gəldi sevincək.
Gecənin hindusu bu göy çadırdan
Yeddi rud boyunca ip çəkən zaman[221]
O qorxunc sahildə xof etməyərək,
İp üstə oynadı şah bir hindlitək[222].
Ancaq bilmirdi ki, o təbli çalan
Adamı nə sayaq götürsün ordan.
Yenə kömək oldu bu işdə allah,
Heç kəsi qoymadı qalsın orda şah.
Özgənin gözünə dərman eyləyən
Özünə istərmi dərman özgədən?
Kafur həbbi atar çox qızdırmalı,
Bunsuz yaxşılaşar təbibin halı.
Başqa dərdlilərə kim etsə dərman
Özü sağ-salamat olar hər zaman.
Hünərli gəmiçi cəld tərpənərək,
Atıldı gəmiyə sanki bir nəhəng.
Yelkənin ipini açdı bəndlərdən,
Dora altdan-üstdən bənd idi yelkən.
Yelkəni qaydayla açıb yüksəltdi,
Gəldiyi yollarla qayıdıb getdi.
Qara su üstüylə gəmiylə keçdi,
Əvvəlki sahilə gəlib yetişdi.
Hamı əqlə gəlməz bir sevinc ilə
Çıxdı sağ-səlamət həmin sahilə.
İskəndər dəhşətlə dolu o yoldan
Qayıdıb sahilə çıxdığı zaman
Çəkdiyi əzabdan artıq dincəldi,
Dərd-qəmi unudub özünə gəldi.
O, xeyli qul, dustaq eylədi azad,
Allaha şükr etdi, qəlbi oldu şad.
Çatanda bu xəbər Çin xaqanına
Gəldi gülər üzlə şahın yanına.
Allaha sidq ilə şükr edib yenə.

Səpdi ayağına bol-bol xəzinə.
Onu nəvazişlə qucaqladı şah,
Başına gələndən elədi agah.
Danışdı dəhşətli dəniz selindən,
Qurduğu tilsimin nicat əlindən.
Dənizdə yolunu azdığı zaman
Dəstənin düşdüyü o burulğandan.
Qaçdıqları dağdan, xilas təblindən...
Nəql etdi hər şeyi ona tamamən.
Bütün əhvalatı xaqan dinlədi,
Şahın iqbalına mədhlər dedi:
"Şahların şahına tanrı yar oldu,
Bu xanlar xanı da bəxtiyar oldu.
Buraya gəlməkdə sirr varmış yəqin,
Fələk qüdrətini bilirmiş sənin!
Qarşına yaxşı da çıxsa, yaman da,
Yaxşı bax, bir məqsəd gizlənib onda...
Bu üstüörtülü sirləri isə
Görməz huş sahibi olmayan kimsə.
Ora getməsəydi hökmüdar əgər,
Necə düzələrdi bütün bu işlər?
Əlimə müşküllər açır bu cahan,
Cahanda əbədi qərar tutasan!"
İskəndər dincəlib orda yeddi gün
Yolun əzabını unutdu bütün.
Dünya səfərini yad edib yenə
Keçmişi almadı əsla vecinə.
Ucaldı o gecə yenə köç səsi,
Yollandı qoşunun önçü dəstəsi.
Qlavuz birinci düşdü qabağa[223],
Nallar naxış vurdu daşa, torpağa.
Gövhərlə bəzənmiş əlvan bayraqlar
Çölləri bahartək etdi laləzar.
Qılınclar bəzəkli, qalxanlar qəşəng,
Bəzədi çölləri gültək, çiçəktək.
Sıçradı o dünya şahı yəhərə,
Dünyanın tozunu saçdı göylərə.
Üz qoydu səhraya, gəlib çatantək





Payladı qoşuna mal-dövlət, yemək.
Dünya səfərinə qızışdığından
Qızışmış çöllərlə çapdı durmadan.
On gün biyabanla çapıb getdilər,
Göründü əkinli, abad bir şəhər.
Ağ rəngdə gördülər onlar şəhəri,
Sanki kafurdandı bütün evləri.
Şah sordu: "Kimindir, xaqan, bu şəhər?
Bura xəritədə nə ad vermişlər?"
Bilici bu cürə elədi bəyan:
"Məhrumdur bu şəhər məhsuldan, bardan.
Burda hökm eləyir elə bir padşah
Ki, onu qüdrətdə sanırlar allah.
Qəriblər çəkinir bu məmləkətdən,
Ürəyi nurlular qaçar zülmətdən.
Ancaq qızıl-gümüş burda bol olar,
Başqa şeylərdənsə kasaddır bazar.
Günəş dan yerinə sancanda bayraq
Başlanır dənizdə taraqqataraq.
O dəhşətli nərə, o gurultular
İnsanın qəlbinə vahimə salar.
Dəhşətə gəlməsin deyə, bu yerdə
Körpələr saxlanır zirzəmilərdə.
Səsdən qulağını tutar böyüklər,
Yoxsa onların da ürəyi gedər!"
Bu sözlər şaha çox elədi təsir,
Soruşdu alimdən buna bir tədbir.
Alim cavabında dedi ki: "Ey şah,
Əmr elə, gözünü açanda sabah,
Xoruz banlamamış, qoy səhər erkən
Təbillər vurulsun düşərgələrdən.
Təbil çala-çala təbil oyunu
Oynayıb boğsunlar o gurultunu.
Bu sayaq gün doğub qalxana qədər
Təbil səslərini əksiltməsinlər.
Bu halda dənizdən qopan qorxunc səs
Heç kəsə vahimə, dəhşət gətirməz!"
Şah dedi alimə: "Bu səslər nədən

Eşidəni edir başdan, beyindən.
Ondakı fəryadın nədir səbəbi?
Külək də dinləyir... Aç bu mətləbi!"
Alim cavab verdi: "Bir xatirəm var,
Ustadımdan qalıb mənə yadigar.
Sular qızaranda səhər günəşdən,
Dalğalar od alır sanki atəşdən.
Döş-döşə gələndə dağtək dalğalar
Dənizdə dəhşətli nərələr qopar.
Dərya təndir kimi zəbanə çəkər,
Gurlayıb ətrafa qığılcım tökər!
Başqa bir alim də deyir ki, guya
Civə qarışmışdır həmin o suya.
Günəş suya düşüb qızdıran zaman
hərarət civəni qaldırır sudan.
Günəş ki, axşamlar batıb yox olar,
Dincələr o coşğun civəli sular.
Çırpınan dənizdə, qarışanda şər
Qopar dalğalardan qorxulu səslər!.."
Dünyanın hakimi belə buyurdu:
Şəhərə çatmamış dayansın ordu.
Düşüb dincəlməyə o, qərar verdi,
Burdan da yoluna tədarük gördü.
Şəhər əhalisi tutanda xəbər,
Alver etmək üçün axıb gəldilər.
Burda şəhər üçün hər cür mətah var,
Acıdan, şirindən baxıb aldılar.
Oldu bu alverdən bütün şəhər şad,
Artdı əhalinin qazancı qat-qat.
Şah da öz malından hər müştəriyə
Əvəzsiz, minnətsiz etdi hədiyyə.
Bir az da ayırıb puldan, qızıldan
Başçıya göndərdi sovqat, ərməğan.
Şəhərin başçısı bunu görəntək
Şahın ənamından vəcdə gələrək,
Göndərdi şövqlə o da hər cürə
Xuruşlarla dolu zəngin bir süfrə.
Bişmişdi xuruşlar balıqdan, ətdən.





Vardı o süfrədə hər bir nemətdən.
Gəlib üzr istədi: "Əfv elə bizi.
Verə bilmədik yol azuqənizi.
Azuqə tapılmaz bizim çöllərdə.
İsti havalar var ancaq bu yerdə.
Şah ona şərh etdi öz ayinini,
Zəngin biliyini, doğru dinini.
O da qəbul edib oldu minnətdar,
Haqqı nişan verdi ona hökmüdar.
Şah da bu əməldən çox razı qaldı.
Ona xələt verdi, şad yola saldı...
Qırmızı pərdəni göy yığan zaman
Düşdü qızıl teşti uca damından[224].
Şah öz yoldaşları ilə bərabər
Yatıb dincəldilər səhərə qədər.
Ətirlər saçanda sübhün reyhanı
Yüksəldi dənizin yenə fəğanı.
Sanki dünən düşən teştdir bu təhər
Belə guruldayır indi bu səhər.
Bu qorxunc səsdən şah hövlə gələrək,
Dilləndi gurlayan döyüş təblitək.
Əmr etdi: hərəkət eləsin ordu,
Hər yandan təbillər saldı gurultu.
Onların səsləri dəhşətlər saçdı,
Xoruzun boynundan zəngləri açdı[225].
Bu səslər bürüdü səmanı, yeri,
Bu səslər batırdı başqa səsləri.
Təbillər dünyaya hay-küy salaraq
Gurladı nahara qədər bu sayaq.
Səsdən bütün şəhər cuşə gələrək
Dəydi bir-birinə məhşər günütək.
Axışdı buraya həm pir, həm cavan,
Dəccalın təbliydi sanki çalınan[226].
Dənizin səsini batırdı bu səs,
Buna çox təəccüb elədi hər kəs.
Gün qalxıb olanda günorta çağı,
Şah yenə qaldırdı səfər bayrağı.
Şaha təzim edən ərlər, qadınlar

Ona dedilər ki: "Bir arzumuz var:
Bəlkə qorxunc səsli bu təbildən sən
Birini burada qoyub gedəsən?
Ta ki, ucaldıqca onun gur səsi
Boğula dənizin qorxunc nərəsi!"
Vida eyləyəndə böyük hökmüdar,
Bəxş etdi bir neçə təbil yadigar.
O gündən şəhərdə, tezdən hər səhər,
Təbil çaldırmağı adət etdilər.
Şah da bu adəti etdirib davam
Təbil çaldırardı sübh çağı müdam.
Onlar yol getdilər bir aya qədər,
Abad Çin mülkünə gəlib yetdilər.
Gəlib ordugaha çatdı hökmüdar,
Fələyi görəndə yenə xoşrəftar,
Çəkildi düz bir ay istirahətə,
Başladı ləzzətlə eyşə, işrətə...

## İSKƏNDƏRİN ŞİMALA ÇATMASI VƏ YƏCUC SƏDDİNİ BAĞLAMASI

Müğənni, ürəyim düşübdür dara,
Bu dərdə sazınla sən eylə çara!
Könlüm cuşə gəlib qəmdən, qüssədən,
Sazının telilə ram et onu sən!
Günəş öz evinə edəndə şitab
İstidən aslanlar oldular kabab[227].
Gücü, hərarəti artdı anbaan,
Çirki, rütubəti sildi havadan.
Qarsıldı bitkinin yaşıl yarpağı,
Saraldı lalənin qızıl yarpağı.
Bürkü səhralara od-alov saldı,
Meyvələrin ağzı açıla qaldı.
Bülbül çöldən dağa eylədi səfər,
Səsləndi qürbətdə qərib nəğmələr.
Qızdı yay gününün isti nəfəsi,
Çalı quşlarının kəsildi səsi.





Günəşi göylərdə dolanan zaman
Sancıb saraltmadı əqrəbtək xəzan.
Tüstülənən bir teşt vardı əlində,
Gəzib od saçırdı o, Zəngdə, Çində.
Yırtırdı aslantək itı caynağı
Gah öküz sağrısı, gah gur dırnağı[228].
Yayın ən şiddətli, isti çağında,
Daş muma dönəndə gün qabağında
İskəndər gözündən qovub yuxunu,
İstədi Xırxıza çəksin qoşunu.
Şah vida eylədi Çin xaqanına,
Xəzinə, var-dövlət bəxş etdi ona.
Yola rəvan oldu, Çini tərk etdi,
Qoşunu səhraya doğru yönəltdi.
Bəxtinin təblini çaldırıb yenə,
Yetişdi Məşriqdən Şimal həddinə.
Keçdi o, çöllərdən, axan qumlardan,
Nə uçan quş gördü, nə də bir insan.
Qarşıda parlayan düzənlik vardı,
Qumları nur saçar, par-par yanardı.
Bələdçi dedi ki: "Burda gördüyün
Qumlar başdan-başa gümüşdür bütün.
Burdan sən o qədər götür xəzinə,
Qoşunu salmasın yolda çətinə.
Qoşundan bilməsin bunu bir nəfər,
Ağır yük götürüb əldən düşərlər."
Şahınsa çox idi saf qızılları,
Odur ki, baxmadı gümüşə sarı.
Ancaq ki neyləsin, güc gəldi tamah,
Bir neçə dəvəni yüklətdi padşah.
Yel kimi keçsə də yolu çaparaq,
Qalxmırdı havaya nə toz, nə torpaq.
Bir həftə qonmadı toz paltarlara.
Çünki başdan-başa gümüşdü ora.
Deyərdin bu yerlər iki hissəydi:
Torpağı gümüşdü, suyu civəydi.
Nə gümüş üstündə dincəlmək olar,
Nə civə su kimi içməyə yarar.

O yer tutulmuşdu belə bir dərdə,
Çökmüşdü torpağa qara bir pərdə.
Harda ki, içməli bir çeşmə vardı,
İçində su ilə civə qaynardı.
Su civə üstündə tutmuşdu qərar,
Ordan cürətlə su içirdi onlar.
Çalxalanmasaydı əgər çeşmələr
Civədən görməzdi heç kimsə zərər.
Çeşmələr bulanıb qaynaşan zaman
Heç kimsə əyilib içməzdi ondan.
Bilməyib içsəydi bir adam əgər,
Onu öldürərdi sudakı zəhər.
Şah bunu biləndə, tez verdi fərman:
Hamı ayıq olsun su içən zaman!
Hər kim axar sudan istəsə içmək
Onu ehtiyatla durultsun gərək.
Bir ay yol getdilər onlar bu sayaq,
Öldü susuzluqdan bir çoxu ancaq.
Gümüşlü çöllərdən keçərək yenə
Gəlib yetişdilər vətənlərinə.
Düşdülər torpağa yorğun, natəvan,
Torpaqda dincələr torpaqdan olan.
Gördülər qarşıda bir düşərgə var,
Zülmətdə günəştək par-par parıldar.
Qabaq-qarşı duran dağda bir qala
Tutmuşdu başını göyə vüqarla.
Qala arxasında bir dağ da vardı,
Belində kəməri sarp qayalardı.
Orda peyğəmbərə etməyib beyət,
Bir tayfa yaşardı sakit, səlamət.
Onlar ilham alıb böyük tanrıdan.
Özləri olmuşdu allahtanıyan.
Onlar İskəndəri pak sifət görcək
Qəbul elədilər bir peyğəmbərtək.
Bilikli, adil bir hökmdar kimi
Qəlbləri bəzədi onun təlimi.
İskəndər onlara haqqı göstərdi,
Din, bilik, mərifət, - çox şeylər verdi.





Şahı mərhəmətli, qayğıkeş görcək
Açıb dərdlərini umdular kömək:
"Ey qəlbi şəfqətli aqil hökmüran
Müti qullarına, gəl, ol pasiban!
Bu dağdan o yana vardır bir diyar,
Sonsuz bir səhradır, sərt qayalıqlar.
Oranı yəcuclar etmişlər məskən,
İnsana bənzərlər, divdirlər əslən!
Şirtək almazcaynaq, sərt, dəmirürək,
Hamısı xaindir yırtıcı qurdtək.
Təpədən dırnağa tükləri biz-biz,
Yoxdur üzlərində burundan bir iz,
Boyları bir qarış, yeməkləri çox
İstidən, soyuqdan qorxuları yox;
Dişdən, dırnaqdan da - yırtıcı heyvan.
Qana hərisdirlər onlar hər zaman.
Yeyinlikdə üstün gələrlər yelə,
Poladı deşərlər dırnaqlar ilə.
Yeməkdə, içməkdə naşükürdürlər,
Allahı tanımaz orda bir nəfər
Dünyada bu qədər yeməli şey var,
Ancaq ki, ot-ələf yeyərlər-onlar.
Yeyərlər, yatarlar, iş-güc bilməzlər,
Mini doğulanda bircəsi ölər.
Onların yerində bir cür ot bitər,
Verər istiottək çox tünd dənələr.
Hər gecə-gündüzdə ondan bir azca
Yeyərək yatarlar elə ordaca.
Bir xırman başqa ot versən də əgər,
Yeyərlər, yenə də doymaq bilməzlər.
Ayla Gün səmada üz-üzə gəlcək
Onlar qaynaşarlar xırda qurdlartək.
Nə düşsə, qorxusuz tutub yeyərlər
Bu sayaq, Ay yarı olana qədər.
Göydə Ay kiçilib olanda yarı
Azalar bir qədər iştahaları.
Qara buludlardan ildə bir kərə
Böyük bir əjdaha düşər o yerə;

Yaman yekə olur həmin o heyvan.
Yəcuclar doyunca yeyərlər ondan.
Yıxılıb qalarlar, bir aya qədər
Sərxoştək yatarlar, heç nə yeməzlər.
Köklə otdan başqa bilməzlər yemək.
Xəstəlik görməzlər ölən günədək.
Bir nəfər ölərsə onlardan əgər,
Hamısı yığışıb ölünü yeyər,
Şoran torpaqlarda nə murdar qalar.
Nə də ölülərə qazılar məzar.
Yaxşı cəhəti də budur: o torpaq
Məzardan xalidir, murdardan uzaq!
Arabir hücumla talayıb bizi,
Xaraba qoyarlar evlərimizi.
Qoyun-quzumuzu aparıb onlar.
Yeyərlər nə qədər azuqəmiz var.
Bu itsifətlərdən qorxduğu qədər
Canavardan qorxmaz bizim sürülər.
Bizləri qırmaqçın edərlər qovğa,
Didərgin salarlar yurddan uzağa.
Biz uca dağlara qaçıb qorxudan
Quştək ağaclarda salarıq məkan.
Ancaq ayaqları süstdür bir qədər,
Ardımızca dağa çıxa bilməzlər.
Bu böyük bəlanı bizdən əgər sən
Dəf etsən, çox böyük savab edərsən!"
İskəndər bildi ki, zordur yəcuclar,
Yəqin hər birində bir fil gücü var.
Bir sədd ucaltdı ki, orda poladdan,
Olmaz həşrə qədər onu dağıdan.
Ona uca bəxti köməklik etdi.
Tikilib qurtardı İskəndər səddi.
Dönüb bir şəhərə gəldi şah ordan,
Axtarıb tapmadı orda bir insan.
Yenə səfərinə davam etdi şah,
Köçməyə başladı ordan qərargah.
Bu işdən keçəndə bir xeyli müddət,
Bir ay dağlar, çöllər aşıb, nəhayət,





Gözəl bir mənzildə məskən saldılar,
Bu yerdən hamısı məmnun qaldılar.
Bir yol töhfəsitək böyük hökmüran
Göstərdi qoşuna şəhri uzaqdan.
Başqa cürə idi burda təbiət,
Su ilə, əkinlə tapmışdı ziynət.
Hasarsız, divarsız bağlardı hər yan,
Bol-bol sürü vardı, yoxdu bir çoban.
Qoşundan birisi tər meyvələrə
Əlini uzadıb istədi dərə,
Həmin meyvələrdən birini dərcək
Bədəni qıc olub qaldı kamantək.
Başqa bir atlı da qoyun tutanda
Onu bərk qızdırma tutdu bir anda.
İskəndər: "Bax, bunlar ibrətdir", deyə,
Əlini vurmadı orda heç nəyə.
Qoşuna əmr edib şah dedi: "Heç kəs
Özgənin bağına toxuna bilməz!"
Tələsik gedərək ordan bir qədər,
O axar-baxarlı yerdən keçdilər,
Cənnəttək, nemətı bol-bol, firavan
Bir şəhər gördülər onlar uzaqdan.
Gəlib darvazaya çatdı İskəndər,
Gördü ki, qapıdan yoxdur bir əsər.
Müdrik qocalarla girdi şəhərə,
Baş vurdu onlarla burda hər yerə,
Gördü çox bəzəkli, dolu dükanlar,
Ancaq nə qapısı, nə qıfılı var.
Nəcib şəhər əhli onu görəntək
Çıxdı qarşısına təzim edərək.
Gətirdilər qəsrə bir mehman kimi,
Saray ziynətliydi asiman kimi.
Süfrə bəzədilər, büsat qurdular,
Özləri xidmətdə hazır durdular.
Pərəstiş etdilər o mehmanlara,
Əhsən qonaqsevən bu insanlara!
Süfrəni bəyəndi böyük hökmüdar,
Onlar fərəhlənib çox şad oldular.

İskəndər soruşdu: "Nə üçün sizlər
Qorxu bilməzsiniz heç zərrə qədər?
Neçün burda belə arxayınlıq var?
Neçün qıfılsızdır burda qapılar?
Yoxdur heç bir bağda keşikçi, bağban,
Neçin sürünüzü güdməz bir çoban?
Çobansız sürülər nədir bir belə,
Baxdıqca yayılıb düzənə, çölə?
Belə arxayınlıq, laqeydlik nədir?
Sizin inamınız, deyin, kimədir?"
Ədalət yurdunun ağsaqqalları
Bir də mədh eləyib o hökmüdarı
Dedilər: "Başına tac qoyan allah
Ömrünü payidar eləsin, ey şah!
İşində haqq sənə havadar olsun,
Şöhrətli adına hünər yar olsun!
Bizim güzəranı sordu hökmüran,
Buyurub dinləsin, biz edək bəyan:
Doğrusu budur ki, bizlər qədimdən
Bu dağı, bu çölü etmişik məskən.
Fağır bir tayfayıq, həm də dinpərvər,
Düzlükdən keçmərik əsla tük qədər.
Əyri dolanmaqla yoxdur işimiz,
Düzlükdən başqa yol tanımırıq biz.
Əyrilik yoluna çəkmişik hasar,
Düzlüklə olmuşuq əzabdan kənar.
Yalan gətirmərik biz dilimizə,
Əyri yuxular da görünməz bizə.
Faydasız etmərik heç sorğu-sual,
Çünki allaha da xoş getməz bu hal.
Allahdan nə gəlsə, edərik şükür,
Çünki narazılıq naşükürlükdür.
Biz razı qalarıq nə gəlsə həqdən,
Düşmənlik edərmi pərəstiş edən?
Acizin dərdinə edərik çara,
Xilas eyləyərik düşərsə dara.
Bizim aramızda, bilsək ki, əgər,





Birinə bir işdə yetişib zərər,
Biz öz kisəmizdən onu ödərik,
Verib mayasını təmin edərik.
Bizdə bərabərdir hamının varı,
Bərabər bölərik bütün malları.
Bizdə artıq deyil heç kəsdən heç kəs,
Bizdə ağlayana heç kimsə gülməz.
Oğrudan qorxmarıq, biz nə şəhərdə
Keşikçi qoyarıq, nə də çöllərdə.
Oğurluq eləməz bizdə bir nəfər,
Oğurlaya bilməz bizdən özgələr.
Nə zəncir, nə qıfıl görər qapılar,
Gözətçisiz otlar bizim mal-davar.
Bizim uşaqları böyüdər allah,
Naxıra şir, pələng toxunmaz əsla.
Bizim bir qoyuna dəysə canavar,
Ordaca gəbərib yerində qalar.
Kim dərsə bir sünbül bizim əkindən,
Qəfil bir ox dəyər düz ürəyindən.
Biz əkin zamanı səpərək dəni,
Haqqa tapşırarıq sonra əkini.
Altı ay olarıq əkindən uzaq,
Bir də biçin vaxtı gələrik ancaq.
Bizim bərəkətli münbit zəmilər
Düz birə yeddi yüz məhsul yetirər.
Bir, yaxud yüz belə işi bacarsaq,
Allaha təvəkkül elərik ancaq.
Bizi hifz eləyən allahdır, allah,
Biz yalnız allaha gətirrik pənah.
Xəbərçilik bilməz bir nəfərimiz,
Özgənin eyvana göz yumarıq biz.
Birini qəzəbli, acıqlı görsək,
Ona məsləhətlə elərik kömək.
Heç kəsi pis yola əsla çəkmərik,
Fitnə axtarmarıq, qan da tökmərik.
Dərdlinin dərdinə olarıq şərik,
Şad olsa, onunla şadlıq eylərik.

Qızıla, gümüşə aldanmaz heç kəs,
Bunlar bizim yerdə bir şeyə dəyməz.
Xəsislik bilmərik dünyada bizlər,
Zorla şey almarıq bir arpa qədər.
Bizdən qaçmaz əsla vəhşi heyvanlar,
Verməriк onlara əziyyət, azar.
Ehtiyac olanda gur, cüyür, ceyran
Özləri axışıb girər qapıdan.
Ovlamaq istəsək onlardan əgər,
Ovlarıq ehtiyac duyulan qədər.
Lazım olmayanı biz nahaq yerə
Qırmarıq, ziynətdir onlar çöllərə.
Nə öküz, nə eşşək kimi yeyərik,
Nə də ağzımızı möhürləyərik.
Süfrəyə hər cürə nemət düzsələr,
Yeyərik, gözümüz qalana qədər.
Bizdə cavanlardan ölüm uzaqdır,
Ölüm çox yaşamış qocaya haqdır.
Ölüyə biz əsla saxlamarıq yas,
Bilirik bu, dərdə bir çarə olmaz.
Üzə deyilməyən bir sözü heç kəs.
Bizlərdə qaydadır, daldada deməz.
Kim nə cür dolanır, danışmarıq biz,
Kimsənin işinə qarışmarıq biz.
Naşükür deyilik qismətimizə,
Razıyıq qəzadan nə gəlsə bizə.
Allahın lütf edib verdiyi şeyə
Deməriк: "Bu hardan? Bu belə niyə?"
Bizimlə birlikdə o adam yaşar
Ki, ola bizimtək təmiz, pəhrizkar.
Tutduğumuz yoldan çıxsa bir insan.
Kim olsa, qovarıq öz aramızdan..."
İskəndər bu qayda-qanunu görcək
Duruxub dayandı divanələrtək.
Çünki belə şeyi nə görmüş, nə də
Oxumuş idi bir xosrovnamədə...





Öz-özünə dedi: "Arifsən əgər,
Qoy sənə bir ibrət olsun bu sirlər.
Dünyanı gəzmərəm mən, daha bəsdir,
Hər ovlaqda bir tor qurmaq əbəsdir.
Bütün bildiklərim qalsın bir yana,
Bunların söhbəti bəs elər mana.
Elə bil dünyanı o pərvərdigar
Bu mərd insanlarçün etmiş bərqərar.
Bunlar şövkət vermiş aləmə, yəqin
Sütunu bunlardır bütün aləmin.
Düz yaşayış yolu budursa əgər,
İnsan bunlardırsa, bəs nəyik bizlər?
Bizi haqq göndərib çölə, dənizə,
Qəsdi göstərməkmiş bunları bizə.
Vəhşi adətlərə eyləyib nifrət,
Öyrənək bunlardan ayin, mərifət,
Bunları əvvəldən görsəydim əgər,
Dünyanı bu qədər gəzməzdim hədər.
Tapardım özümə dağda bir kaha,
İbadət eylərdim orda allaha.
Bunlartək asudə ömr edərdim mən,
Dinim də olardı həmin bu dindən!.."
İskəndər görəndə onları dindar,
Peyğəmbərliyini etmədi izhar.
Görəndə onları əməlisaleh,
Xəzinə bəxş etdi o böyük fateh.
Qayıtdı geriyə ordan fərəhlə,
Qoşunu dəniztək yönəltdi çölə.
Bayraqlar qaldırdı rum ipəyindən,
Al6 xara geyındi sankı çöl-çəmən!
Tutdu qarışqatək qoşun hər yanı -
Dərəni, təpəni, düzü, ormanı...
Hara iz saldısa atının nalı
Sildi o yerlərdən dərdi, məlalı.

## İSKƏNDƏRİN RUMA QAYITMASI

Müğənni, şövqlə ucalt səsini,
Aç yenə gövhərlər xəzinəsini!
Bu bağlı qapıya kim salsa açar,
Gizlin xəzinədə dürr, gövhər tapar.
Meyvənin xoş ətri basanda bağı
Kəndlilər unudar evi, otağı.
Meyvələr çoxalar, bağlar varlanar,
Belə bir bolluqdan yer vüqarlanar.
Fərəhdən sevinib güləndə püstə
Xurma baxıb ondan bir busə istər.
Ləl ilə bəzənmiş bir tac kimi nar,
Uzaqdan çıraqtək alışıb yanar.
Göz vurub qızarmış alma edər naz,
Çəkər gərdənin turunc işvəbaz.
Tənəklər şərabdan nəşələnərək
Sarmaşar almaya, nara sərxoştək.
Bürüyüb bağları var ağacları,
Cüt məmələr kimi görünür barı.
Əncir yeyən quşlar oğrutək pünhan
Asılar ağacın budaqlarından.
Badam sevən torpaq yağ almaq üçün
Soyar qabığını badamın bütün.
İstəyər, innab da gəlib həvəsə,
O dilsiz-ağızsız fındıqdan busə.
Ağaclar şənliklə qaldıraraq baş
İnnabdan, fındıqdan verərlər şabaş.
Qarapapaq üzüm sərxoşluğundan
Dolar barmağına saçını nihan.
Qabaqlar sazlarlar şadlıqçün rudu,
Heyva boğazından tutar armudu.
Daşınar şərabçın dolu səbətlər,
Səbət daşıyanın üzü-gözü tər.
Salxımlar sıxılar bağda başabaş,
Axışar küplərə şirəsi birbaş.
Südəmər körpələr necə qığıldar,
Küplər də dolduqca elə uğuldar.





Toy-bayram edirkən dünya bu zaman
İskəndər uzaqdı bu toy-bayramdan.
Qatıb bir-birinə gecə-gündüzü,
Üzürdü dənizi, keçirdi düzü.
O, bir çox ölkəni xoşluqla, zorla
Dardan çıxarmışdı geniş bir yola.
Ömrün piyaləsi artıq dolmuşdu,
Onun özünə də yol dar olmuşdu.
Dünyada hamıya iki qapı var,
Birindən girənlər birindən çıxar.
Bu yeddi budaqlı, altı cəhətli,
Dövrəsi, meydanı, yeri vüsətli
Sərvdən ucaldı bir qiyabi səs:
"Daha fatehlikdən əl çək, bəsdir, bəs![229]
Bəsdir, bu dünyanı gəzməkdən əl çək.
Daha ilk mənzilə dönəsən gərək!
İskəndər sözünü yazanda katib
Yalnız beşcə hərflə ifadə edib.
Beş hərfə müvafiq etdin beş səfər[230],
Suları, dağları keçdiyin yetər!
Pəncəni bu dünya işlərindən çək.
Qayıt öz evinə, get, beş ayadək
Yunan torpağına dönməlisən sən!"
Ayıldı İskəndər sanki məstlikdən.
Qorxuyla, dəhşətlə dinlədi bunu,
Çəkdi öz atının tez cilovunu.
Məhrəm dostlarına açıb bu sirri,
Ordan Ruma sarı qayıtdı geri.
Dərədən, təpədən, dənizdən, dağdan
Keçərək, yol getdi daha durmadan.
Yerin o başından Kirmana yetdi,
Ordan Kirmanşaha yol aldı getdi.
Sonra da Babilə gəlib, İskəndər
Ordan Ruma tərəf elədi səfər.
Yolda Zur şəhrinə gəlib çatanda
Pozuldu səhhəti şahın bir anda.
Onun can köhləni daha yoruldu,
Taqətdən düşərək yolgetməz oldu.

Ruma çatmaq üçün xeyli can atdı,
Əl-ayaq süstləşdi, qalmadı imkan.
Sandı ki, içibdir zəhərlənmiş su,
Həmin o zəhərin təsiridir bu.
Onu əldən saldı qorxu, vahimə,
Əlacsız dərd imiş bu dərd, sən demə!
Vəzirin yanına - Yunanıstana
Bir qasid göndərdi, söyləsin ona:
"Çaparaq yanıma gəlsən əgər sən
Son dəfə üzümü görə bilərsən.
Yaxşı işbacaran alimlərdən də
Yüz ya əlli nəfər gətir gələndə!"
O qasid yetişib dedi vəzirə,
Vəzir əl atsa da hər bir tədbirə,
Çarələr heç bir kara gəlmədi,
Bir ümid işığı görə bilmədi.
Yığıb alimləri Rumdan, Yunandan
Oldu hökmüdarın yanına rəvan.
Birbaşa o, şahın yanına gəldi,
Bu görüş heç də xoş görüş deyildi.
Gördü: şah taqətsiz uzanıb yerdə.
Əlac mümkün deyil düşdüyü dərdə.
Diz çökdü, üzündə qüssə, duman, çən,
Yoxladı nəbzini öpüb əlindən.
Nəbzin vurmasına elədi diqqət,
Tapdı xəstəlikdən neçə əlamət.
Buyurdu: nə qədər vardısa imkan
Axtarıb tapsınlar bu dərdə dərman.
Dərmanın olsa da lap abi-həyat,
Əcəlin çatanda yoxdur bir nicat!
Artıq hökmüdarın işi bitmişdi,
Əbədi dincəlmək vaxtı yetmişdi.
Əmanət aldığı mayəni yenə
Gərək qaytaraydı tələb edənə.
Onu əridirdi indi bu cahan
Ki, zəri ayırsın qara torpaqdan.
Daha can köhləni asta gedirdi,
Gedər-gəlməz yola səfər edirdi.





Şamtək tərk edirdi nurlu aləmi
Suda qənd, odda mum əriyən kimi.
Bir külək söndürdü yanan çırağı,
Bağda ağaclardan tökdü yarpağı,
Sərvdə yaşıl bir budaq qoymadı,
Sındı qırqovulun qolu, qanadı.
Müşk ətirli olan əlvan gül-çiçək
Solub səpələndi yerə xəzəltək.
Ayı yəhərləyən həmin İskəndər
Ölüm yatağına baş qoyub inlər...[232]

## İSKƏNDƏRIN VƏSİYYƏTİ

Müğənni, bir quşsan - vaxtı düz bilən,
De görək: nə qədər keçmiş gecədən?
Nədənsə gecikib quşların səsi,
Çal, suğdi quşunun gəlsin naləsi[233].
Əsdi xəzan yeli, payız yetişdi,
Bağların əhvalı tamam dəyişdi.
Küləklər taladı bağçanı, bağı,
Söndü al güllərin yanar çırağı.
Arxlar kənarında otlar sapsarı,
Töküldü reyhanın şux yarpaqları.
Sanki ağaclıqda odlar qalandı,
Əlvan yarpaqları alışdı, yandı.
Gördü bazarını kəndli pərişan,
Bağın qapısını bağladı bağban.
Şahlar hovuzuna axan saf sular
Soyuqdan, ayazdan tamam dondular.
Çeşməsiz, çiçəksiz bağ şad olarmı?
Hasarsız, barısız abad olarmı?
Hanı saqi, badə, o məclis hanı?
Bura vəhşilərin olmuş məkanı!
Kəsilmiş nəğməsi ötən quşların,
Dolaşır qıçına xəzəl ruzgarın.
Seyrə gələnlər də bağı tərk etmiş,
Müğlər də çəməndən ayrılıb getmiş.

Yeyəylə sürtülmüş günəşin tacı,
Yeyətək dən-dəndir suların saçı.
Bağı tərk eləyib getmiş gözəllər,
Nə bülbül səsi var, nə güldən əsər...
Tikanlar dağ çəkib gülün köksünə,
Bəzəksiz, cəh-cəhsiz qalıb bağ yenə.
Belə sərt bir xəzan çökəndə bağa
Başladı o Kəyan sərvi solmağa...
Şahlıqın şah sərvi-İskəndəri də
Axır saldı dövran sağalmaz dərdə.
Çovğuntək soyutdu şahın nəfəsi,
Çoxdu bu dünyada qəmi, qüssəsi.
Özülü çökərsə bəxtin, dövlətin,
Səhhətə zəiflik üz verər yəqin!
İllərlə dünyanı uçub seyr edən
Quşun qol-qanadı qırıldı birdən.
Uca sərv yıxıldı, şux lalə soldu,
Qırqovul şahinin şikarı oldu.
Ordu həkimləri, şəhər ə yanı
Aldılar araya o hökmüranı.
Bəlkə də bir əlac tapalar ona;
Şərbətlər qatıldı dava-dərmana.
Nəbzı, qarurəsi olundu təhlil[234],
Nə çarə, gedən can qayıdan deyil!
Əlac eləsə də təbib nə qədər,
Ömür tükənibsə, nə fayda verər?
Çox səy göstərdilər çarə etməkçün,
Gedəni qaytarmaq olmadı mümkün.
Tədbirlə gəlmədi o gövhər ələ,
Necə sədd çəkəsən əsən bir yelə?
Əcəl yetişəndə tapıb bəhanə
İnsana min əzab verər zəmanə.
Ruzgardan o qədər inciyər insan
Özü ölümünü istər allahdan.
Əl atmadıqları tədbir qalmadı,
Rəylərdən bir fayda hasil olmadı.
Çırağın əcəli çatıbsa əgər,
Ona öz yağı da yetirər zərər.





Çürümüş bir meyvə ağacda durmaz,
Düşəcək, tərpənsə budaqda bir az.
Ən mahir, ən ustad təbib heç zaman
Tapa bilməmişdir ölümə dərman.
Göyün hesabına bələd olanlar
Saldılar hesaba göydə hər nə var.
Onun taleyini gördülər nursuz,
Ondan uzaqdaydı bəxt açan ulduz.
Heç elə bir ulduz yoxdu ki, onun
Göstərmiş olaydı ömrünü uzun.
Taleyi səmada bəd görən zaman
Münəccim özü də əsdi qorxudan.
Önündə aynaya baxdı İskəndər.
Baxdı, vücuduna yetirdi nəzər,
Gördü ki, bədəni tüktək incəlib,
Qaçmaq istəyən can dodağa gəlib.
Nə qəlbdə qüvvə var, nə canda taqət,
Əyilmiş əvvəlki o sərv qamət.
O öz ölümünü gözüylə görcək,
Özü öz halına ağladı şamtək.
Yaxın dostlarını dəvət elədi,
Ürək sözlərini onlara dedi:
"Gəmim dar girdaba düşdü, a dostlar,
Ölüm ağzı açıq nəhəngtək durar.
Köçmək vaxtı gəldi bu düşərgədən,
Başqa bir ovlağa getməliyəm mən.
Bu fələk mənimlə xoşrəftar oldu,
Dağda, daşda mənə pərəstar oldu.
İndi düşmən oldu o haqq-sayda,
Dəyişdi rəftarı Günəş də, Ay da.
Ruzgar gözlərimdə çənə bürünür,
Bu dardan çıxmağım müşkül görünür.
Nə çarə qılım ki, oldum dərdmənd,
Bu fələk tacıma atıbdır kəmənd.
Hardadır, çatdırın xəzinədara,
Bəlkə rüşvət verib məni qurtara.
Mənim od qılıncla qoşunum hanı?
Qovsun canımdakı bu qızdırmanı.

Ən qorxunc divləri tutub ram edən,
Təxti-tac sahibi İskəndərəm mən!
Qılınca qurşandım, kəmər bağladım,
Bütün qulaqlara çatmışdır adım.
Zəhərli qılıncla tufan edib mən
Tozlar qaldırmışam Bəhri-Qülzümdən[235].
Böyüdüb çoxunu etdim hökmüran,
Çox qoyun almışam qurdlar ağzından.
Çox-çox sınıqları mən calamışam,
Çox-çox bütövləri parçalamışam.
Zülmü ədalətlə eyləyib əvəz,
Müşküllər həll edim hesaba gəlməz.
Qünnücdən Qülzümə oldum hökmüran,
Şimşək qılıncımı gördü Qıyrəvan[236].
O qılınc dönübdür indi zəncirə,
Ömrümü tor kimi salıbdır girə.
Çox dağlar, dənizlər keçmişəm, heç kəs
Dünyanı mənimtək seyr edə bilməz.
Hökmüdar Daraya qarşı çıxıb mən
Başını torpağa sərdim bəxtimdən.
Mən o qatil Furun boynunu vurdum,
Çipalın yerində Çində oturdum,
Qabildən, Habildən alıb intiqam,
Nasıkdən Mənsəkə yollar açmışam.
Yudum məcusluğu dünya üzündən,
Rus dənizində də od qaladım mən[237].
Cəmşidtək təxtlərə çıxdım - ucaldım,
Firidun xəzinə yığdı, mən aldım.
Yıxdım daxmasını - evini Adın,
Qəsrini hünərlə açdım Şəddadın.
Hətta Sərəndibə gedib çıxaraq,
Adəmin izinə basdım mən ayaq[238].
Rüstəmin bəxtindən mən soraq verdim,
Keyxosrov təxtindən xəbər gətirdim.
Məşriqdən Məğribə at səyirdərək
Yəcuclar səddini ucaltdım dağtək.
Adəmtək Qüdsüdə elədim məskən,
Kəbə halqəsinə əl yetirdim mən.





Bir məşəl ucaltdım qatı zülmətdən,
Zülmün qapısını taxtalatdım mən!
Aldığım adları nahaq almadım,
Atmadım qəflətdə tək bircə addım.
Mən hansı bir yerə etdimsə səfər
Ədalətlə bilik qazandı ellər.
Sarp daşı əridən isti havalar
Sağlam bədənimlə etdi xoş rəftar.
İndisə bu pərqu yataqda bitab
Yatıram, xəstəlik verir min əzab.
Balınca baş qoydum zəifliyimdən,
Yatağa düşərmi sağlam bir bədən?
Dünyanı qapqara gördüm gəzərək -
Qara qumdan tutmuş qara suyadək.
"Nə gördün?" deyərək sorsalar əgər,
Deyərəm: sanki heç etmədim səfər.
Dünyanı görmədən torpağa girən
Birgünlük körpəyə bənzəyirəm mən.
Dünyanı başabaş gəzmişəm özüm,
Hələ ki, dünyadan doymayıb gözüm...
Otuz altı deyil, lap otuz min il
Yaşasam, cavabım bu olardı, bil!
Mənə sirlərini açdı asiman,
Çox şeylər söylədim Günəşdən, Aydan.
Qədr-qiymət qoydum müdrik insana,
Şükürlər eylədim mən yaradana.
Ömrümü qəflətlə vurmadım başa,
Ağılla, hünərlə mən doldum yaşa.
Bütün biliklərdən dərsimi aldım,
Ölümün əlində, heyf aciz qaldım.
Çox azğın zalımı çəksəm də dara,
Bu namərd ölümə tapmadım çara.
Bir ölümdən başqa hər bir müşkülə
Mümkündür birtəhər çarə edilə.
Hanı yollarına qızıl səpdiyim
Dərin düşüncəli yüzlərcə həkim?
Torpağı qızıla çevirin yenə,
Gəlin, əlac edin şahın dərdinə.

Hardadır Ərəstu - tapa bir dərman,
Məni biliyilə qurtara dardan?
Hanı əfsun bilən həkim Bəlinas?
Gəlib İskəndəri eləyə xilas.
Hanı bəs Əflatun, o təmiz insan?
Mənim bu dərdimə eləyə dərman.
Hardadır o böyük bilici Valis?
Desin bu mərəzə nə oldu bais.
Çağırın Sokratı, bəlkə əql ilə
Bu bağlı qapını o aça bilə.
Hürmüzə göndərin durmadan xəbər.
Bəlkə ürək verə şaha birtəhər.
Gedin, Fərfuryusu edin xəbərdar,
Bəlkə bu dərdimə o əlac tapar.
Bu sözü bir daha eylədi təkrar:
"Etsə, əlac edər tək pərvərdigar!
Bəlkə rəhm eləyib qurtara məni,
Qurtara bu dərdli, yazıq bədəni.
Əlimdən tutan yox, yox salan yada,
Heç kəs tək qalmasınməntək dünyada!
Mənə belə cəza verərkən fələk,
Nə lazım səs salıb fəryad eləmək?
İçindən çıxdığım torpağın yenə
Axtarıb baş qoyum pak sinəsinə.
Ölüm girdabına düşməmiş, gərək
Suya qalxan tutam ləngiməyərək[239].
Çılpaq doğulmuşam çünki anadan,
Məni soyundurun dəfn edən zaman.
Yüküm yüngül idi doğulanda mən,
Yenə yüngül gedim burdan gedərkən.
Bir quş dağa qonub qalxarsa əgər,
Dağa nə artırıb-əksildə bilər?
Mən də bir quş idim, ölkəmsə - bir dağ.
Gedərsəm, bu dünya yasa batacaq?
Məntək çoxun doğub öldürmüş dünya.
Nifrətə layiqdir bu qozbel dayə[240].
Çoxuna mərhəmət, lütf eyləmişəm,
Görən də olubdur əlimdən sitəm.





Zalim olmuşamsa, əfv edin məni,
Mən də öldürmüşəm çox zülm edəni!
Tabutum torpağa olanda təslim,
Pak ruhum paklara qovuşar mənim.
Başa kül sovurmaq əvəzində siz
Mənimçün allaha dua ediniz!.."
Bunları söyləyib, almadı cavab,
Yenə yatağına sərildi bitab...

## İSKƏNDƏRİN ANASINA MƏKTUB YAZMASI

Müğənni, rudunu bir dindir barı,
Yada sal nəğmənlə o yatmışları!
Mənim dərdimə qal, sazımı sazla,
Bəlkə rahat yatım o xoş avazla!..
Gülə hücum etsə payız ruzgarı
Körpəykən quruyar tər budaqları.
Ölüm bir bəladır, çarə edilməz,
Onun çarəsini tapmayıb heç kəs.
Əcəl qızdırması yetişən zaman
Qalar həkimdən də əlacı pünhan.
Gecə köçüb getdi, ağladı şəbnəm,
Günəş şəfəq saçıb güləndə aləm
Artdı İskəndərin ahü naləsi,
Ucaldı çalınan zənglərin səsi.
Hər dərdə yüz çarə bilən Ərəstu
Bu dərdin önündə çarəsiz durdu.
Şahın sağaltmağa tapmayıb əlac,
Özünü görərək əlaca möhtac,
Şaha söylədi ki: "Ey şəfəqli şam,
Şahlar nur alıbdır şöləndən müdam!
Qalıbdır dərdinə həkimlər naçar,
Üzünü allaha çevirib yalvar.
Hələ haqlamamış coşğun sel bizi,
Niyə dəyişmədik öz yerimizi?
Bu şərab qədəhdən aşıb daşmadan,
Nə üçün ölmədim, çıxmadı bu can?

Diləram: bir tükün əsməsin sənin,
Bir tükün əskilsə ölərəm, yəqin!
Ancaq bir şərbətdir bu ölüm, gərək
Qoca da, cavan da, - hamımız içək!
Nə deyə bilərəm: iç bu badəni!
Çünki bihuş edər içəndə səni;
Nə də almaq olar qədəhi səndən,
Çünki şah bəzmində ədəbliyəm mən!
Əfsuslar olsun ki, bu nurlu çıraq,-
Qurtarıbdır yağı, - xamuş olacaq.
Ancaq yağsızlığın qalma dərdinə,
Bəlkə yağ yetişdi, oyandı yenə..."
İskəndər dedi ki: "Bu sözdən əl çək,
Əcəli yetəndə insan öləcək!
Əmrimdə deyildir dövr edən göylər,
Əlimdə deyildir Günəş, Ay, Ülkər...
Bir ovuc torpaqla bir qətrə suyam,
Bunlardan yoğrulub əzəldən mayam.
Haqqın sayəsində böyüdüm, artdım,
Nəhayət, elə bir rütbəyə çatdım
Ki, Şərqdən Qərbədək gəzdim hər yanı,
Keçirdim əlimə bütün dünyanı.
O zaman cahana bir şah idim mən,
Canımda can vardı, sağlamdı bədən.
İndi ki, zəiflik üz verdi cana,
Gərək səfər edəm başqa cahana.
Məğrurluq meylinə uyma ki, heyhat,
Dolmaz bu quyuya o abi-həyat!
Susuza eyləməz cəhənnəm əlac,
Sən o dörd çeşməli behiştdən söz aç[241].
Yalvarıb allaha, eylə ibadət,
Bəlkə o eyləyə mənə mərhəmət..."
Günəş köçüb getdi, qaraldı dünya,
O şahlar şahı da getdi yuxuya.
Qorxunc əjdahatək gecə qapqara,
Qatı bir qaranlıq çökdü yollara.
Daş qəlbli bir gecə, dəhşətli zülmət,
Zülmətdə kim görmüş şəfqət, mərhəmət?





İşləri düyünə salan ulduzlar
Sanki dodağına vurmuşdu mismar.
Bu oğru fələk də, oğrular tutan
Ay da qır küpünə düşmüşdü çoxdan.
Qapqara tüstüyə bürünmüş dünya,
Tüklə cəhənnəmdən asılmış guya.
Sanki ərimişdi şah səhərədək
İyirmi yeddinci gecəki aytək[242].
Anası yadına düşdü, İskəndər
Sarsıldı, ürəkdən oldu mükəddər.
Buyurdu, hüzura ağıllı, zirək
Rumlu katiblərdən biri gələrək,
Qələmi qapqara hislə doldurub,
Əziz anasına yazsın bir məktub.
Ana dili kimi şirin dil ilə
Ona and verərək başlasın belə:
"Anacan, sən məni eyləyəndə yad
Sıxma ürəyini, qoparma fəryad!"
Hər kim oxusaydı bu yazılanı
Qapqara görərdi bütün dünyanı.
Katib qələmini çərtdi qurtardı,
Ucuyla fələyin bağrını yardı.
Vərəqə əbiri yaydıqca qəşəng,
Kağız dönüb oldu müşkin bir ipək[243].
Yazanda o zərif mənalı sözü
Katibin heyrətdən qaraldı gözü
İnsanın gözünə işıq bəxş edən
Tanrının adına o yazdı əhsən:
"Bir olan allaha hamı möhtacdır,
Hamının dərdinə tək o əlacdır!"
Böyük yaradanı gətirib dilə
Katib məktubunu başladı belə:
"Məndən - İskəndərdən bu namə getsin,
Dörd yox, bircə olan anama yetsin[244].
Anacan, qətrəyə döndüsə çeşmə,
Su qabı suda da sınar, qəm çəkmə!
Ağacdan düşdüsə bir qızıl alma,
Narıncətək rövnəqdən düşüb saralma!

Soldu, sarı-gülün getdi növrağı,
Qalsın qızıl gülün yaşıl budağı.
Anacan, bu sözə inanmıram mən:
Məhəbbət könüldə çox olur dildən.
Eşidib od tutar sinəndə ürək
Ki, şahlar gülünü aparıb külək.
Yanma, bəslədiyin balan qayıtmaz,
Əlini o yanan ürəyinə bas!
Zaman etsin səni bu oddan kənar,
Sənə səbir versin o pərvərdigar!
Səni and verirəm əmdiyim südə,
O şirin laylaya, o ilk öyüdə,
Dünyadan gənc getmiş bir övladına,
Ağlayan ananın o fəryadına,
Dinə əməl edən pak insanlara,
Dünyanı yaradan pərvərdigara,
Qanun-qayda qoyan hər peyğəmbərə,
Cənnətdə əbədi ömr edənlərə,
Torpağın altında həbs olanlara,
Behişt gülzarından zövq alanlara.
Bütün canlılara can verən cana,
Qəmdən nicat verən, can qurtarana,
Səxa dənizinin coşğunluğuna,
Vücudu yaradan haqq buyruğuna,
Adların fövqündə dayanan ada,
O nəqşə ki, ziynət verir vücuda,
Yeddi qat ucalan göy pərgarına,
Yeddi ulduzun da pak adlarına,
Allahı sevənin mərifətinə,
Şüur sahibinin fərasətinə,
Elmdən nurlanıb yanan hər şama,
Mərhəmət sahibi fazil adama,
Elə bir başa ki, bəxtə nur saçıb,
Elə ayağa ki, düz yollar açıb,
Pakizə fikirli, o saf ərənə,
Müşküllər açana, nicat verənə,
Dərdə qalanların pak niyyətinə,
Azad insanların xoş adətinə,





Yoxsulları sevən comərd sultana,
Sultantək gözü tox, yoxsul insana,
Sübhün gül-çiçəklə gülüşməsinə,
Gözlənməz təamın xoş düşməsinə,
Bidarın munisi səhər çağına,
Ağlar qəriblərin pak torpağına,
Yazıq məhbusların dərdi-dilinə,
Müqəddəs mehrabın nur qəndilinə,
Təşnə bir tifilin süd həsrətinə,
Naümid qocanın zəlalətinə,
Xəstə qəriblərin intizarına,
Döyülmüş yetimin göz yaşlarına,
Dərd-qəmdən guşəyə çəkilənlərə,
Şaxtadan dırnağı tökülənlərə,
Dərdlinin çarəsiz oyaqlığına,
Çarəsiz qalanın yazıqlığına,
Əzabdan sonrakı asudəliyə,
Pak, təmiz sevgiyə - aludəliyə,
Əqlin zəfərinə, ülviyyətinə,
Gizli ibadətin qüdsiyyətinə,
Şüura yol açan sözə, dastana,
Bəşər karvanını çəkən sarvana,
İnsanı içindən yeyən dərdlərə,
Qəddini pünhanı əyən dərdlərə,
Dözümsüz adamda səbrə, qüdrətə,
Gözəlin üzündə həya, ismətə,
Ümidsiz çəkilən son fəqanlara,
Dadına heç kimsə çatmayanlara,
Dinpərvər adamda olan inama,
Peyğəmbərə gələn vəhyə, ilhama,
Bütün insanların o son yoluna,
Hamıya əl tutub kömək olana,
İnsanı son yola salan qapıya,
Bizi ağuşuna alan qapıya,
Üzünü axtaran baxışlarıma,
Səsini eşitmək intizarıma,
Mənə bəslədiyin sonsuz həsrətə,
Düşdüyüm bu dərdə, bu fəlakətə,

Həmişə, hər yerdə dada çatana,
Can verib can alan o yaradana...
Anacan, bu məktub gəlib çatarkən
Çatıb qaşlarını kədərlənmə sən!
Bu dünya fanidir, əbəs ağlama,
Mənimçün yas tutma, qara bağlama!
Dünyanın əzəldən axırı budur,
Əyilmə ələmdən, mətanətlə dur!
Dünya bir kimsəyə qalmışsa əgər,
Səni də qoy üzsün bu dərd, bu kədər.
Ancaq bu dünyanı fani görəndə
Başqaları kimi toxtaq ol sən də!
Yox, əgər bunlara baxmayaraq sən
Mənimçün yasxana qurmaq istəsən,
Əvvəlcə şahanə bir məclis düzəlt,
Gözəl yeməklərdən bir süfrə bəzət,
Çağır qonaqlığa xalqı hər nə var,
Bütün gələnləri elə xəbərdar:
Təbrdə adamı yoxsa hər kəsin,
Buyursun süfrəyə, doyunca yesin!..
Əgər yemiş olsa onlardan biri,
Sən də ye dünyada acı qəmləri.
Heç kim o süfrəyə əl uzatmasa,
Sən də unut qəmi, heç batma yasa!
- Oğlum ölüb, - deyə çəkmə heç məlal.
Gəl, öz işlərinin qeydinəcə qal.
İkiqat uzun da olsaydı ömrüm,
Axır yenə bir gün vardı bu ölüm.
Ən uzun ömür də kifayət deyil,
Nə fərqi, yaşadın otuz, ya yüz il?
Behiştə getməkdən qorxarmı insan,
Mınlərlə açar var, yol da çırağban.
Əbədi bir taxtə yiyələnərkən
Nə üçün razılıq eləməyim mən?
Yerində toz yoxdur, göyündə duman,
Niyə at sürməsin oraya insan?
Əlimdə qalmadı bu saxta saray,
Siz də səbr eləyin, salmayın haray!





Şəbdizim sıçradı çaydan o taya,
Məndən salam olsun dosta, aşnaya[245].
Bizi azad etdi zindandan fələk,
Hamı azad olsun görüm bizimtək!.."
Məktubu yazdırıb o, yola saldı,
Özü də cənnətə sarı yol aldı.
Gecəni sübh etdi dərdlə, əzabla,
Keçdi bütün günü min iztirabla.
Gecə öz təxtini yüklədi filə,
Yer saldı donunu göylərtək nilə[246].
Gün tutdu üzünü qüruba sarı,
Qaraldı üfüqdə qızıl saçları.
Aciz ulduzların əli büküldü,
Gümüş dırnaqları bir bir töküldü.
Şahın ağır-ağır yumuldu gözü,
Cırmaq-cırmaq oldu qəmərin üzü.
Bir örpək toxuyub gecə saçından,
Torpağın başına örtdü asiman.
Zənəbin ağzından alaraq zəhər,
Ayın boğazına onu tökdülər[247].
Başının üstündə görcək əcəli,
Şahın öz canından üzüldü əli.
Əsəbdən sıxıldı damarda qanı,
Bir anda sustaldı bədəni, canı.
Ölüm gözündəki qaranı aldı,
Səhərtək ağ üzü soldu, saraldı.
Candan bizar olub, canından keçdi.
Canını tapşırmaq vaxtı yetişdi.
Quş elə tez uçdu öz yuvasına
Sürətdə baxış da çatmadı ona.
Dünyada nə qədər bilicilər var,
Bu gizli işlərdən deyil xəbərdar.
Bunun çarəsini bir bilən varsa,
Özünə bir çarə edər bacarsa.
Köçüb bu dünyadan getdi İskəndər,
Ona ən yüksəkdə təxt düzəltdilər.
Dünyada min cürə yaxşılıq etdi,
Özüsə dünyadan incimiş getdi.

Həyat səhnəsində o düşdü dərdə.
Nəhayət, üzünə çəkildi pərdə.
Dolanıb görmüşdü o bir çox yeri,
Başqa bir yerəydi indi səfəri.
Hayana getsəydi böyük İskəndər,
Oradan verərdi hamıya xəbər.
Soraq gətirən yox bu son yolundan,
Nə üçün bir xəbər gəlmədi ondan?
Yoxsa, elə yerdir o yer ki, hər kəs
Getsə, qayıtmağa yol tapa bilməz?
Bunun da hikməti açılsaydı bir,
Pərdənin dalında qalmazdı heç sirr..
İskəndər bənzərdi yaşıl yarpağa,
Kəyan ağacından düşdü torpağa.
Açıldı belindən qızıl kəməri,
Zərrin bir beşikdə düzəldi yeri.
Tabutun içinə kafur səpdilər,
Çölünə düzüldü cəvahir, gövhər.
O qədər yayıldı ətrin səfası,
Çatdı Cudi dağa səxa dalğası[248].
Qərq edib kəfəni müşk ilə uda,
Qoydular nəşini qızıl tabuta.
Bir bədən gümüştək ağarıb solsa.
Nə fayda tabutu qızıldan olsa?
Şahın öz rəyincə verildi qərar,
Qoyuldu bir əli tabutdan kənar.
Ovcuna torpaq da töküb bir qədər,
Sonra hər tərəfə car çəkdirdilər:
"Görün yeddi ölkə hakimi olan
İskəndər dünyadan köçdüyü zaman
O saysız-hesabsız xəzinələrdən
Bir ovuc torpaqdır əlində gedən!
Sizin də dünyadan gedərkən ancaq
Payınız bir ovuc torpaq olacaq!..."
Şəhri Zurdan Misrə yola saldılar,
Hiylədən uzaqdır çünki o diyar.
İskəndəriyyəni etdilər vətən,
Onu taxta üstə atdılar taxtdan.





Kimə dağ çəkməmiş vəfasız cahan?
Kimdir bu kitabı bütün oxuyan?
Bu dəfə dəyişdi sarayda bəxtı,
Torpağın altında quruldu taxtı.
Dünyada olmamış əzəldən bəri
Əsla mehribanlıq, dostluq əsəri!
Aldı öz qoynuna o şahı məzar,
Daxmanı bağlayıb döndü adamlar.
Bu dünya çoxuna məqam bəxş edər,
Saxlamaz o yerdə axıra qədər.
Ömrü sona çatdı saysız insanın,
Hesabı bitmədi yenə dünyanın.
Nə bir qurtaran var ipdən boynunu,
Nə də bir tapan var ipin ucunu.
Əbəsdir, bu sirrə sərf etmə ömür,
Susmaqdan başqa bir əlac görünmür.
Dünyaya dərindən yetirsən nəzər,
Görərsən insanlar çəkibdir nələr!..
Dünyanın ki sonu əbəsmiş, əbəs,
Bu qədər sitəmə, əzaba dəyməz!
Bu lacivərd tağda nə gördük axır?
Onun sütunundan qan seli axır.
Bu sütunun odu Günəşdir, Aydır,
Gəl, o qəndilləri daş atıb sındır.
Ondakı qızılı rəngə aldanma,
Oddan qızarmışdır, sən qızıl sanma!
Bizimlə uyuşmaz əsla göy saray,
Bizim qəsdimizdə durmuş Günəş, Ay.
Bizimlə dost olmaz saxta cadugər,
Üzdə gülər bizə, dalda öldürər.
Guya məlhəm qoyar sağalsın yaran,
Ancaq yara vurar sənə arxadan.
Balıqtək dünyadan sən uzaq olsan,
Qurtarar zirehin səni qılıncdan!
Tufan başlayarsa almağa qisas
Balıqtək üzənlər əsla qərq olmaz.
İpək karxanası bil bu dünyanı,
Bir yanı sudursa, oddur bir yanı[249].

Orada hərlənən çox tağalaq var,
Biri boşalanda o biri dolar.
Dünyanın sirrini boşdur axtarmaq,
Üstü tüstü-duman, altı toz-torpaq.
Bu tozdan, tüstüdən görünür hər an
Çarpışır, vuruşur yerlə asiman!
Sazişə gəlsəydi göylə yer əgər,
Bizi yer üzündən süpürməzdilər...
Nizamı, gəl qurtar axır sözünü,
Qorxutma özgəni, nə də özünü.
Sultanın bəzminə gedəndə mehman
Yolun yarısında olma peşiman.
Eşit sözlərini huşu-guş ilə,
Acı badəsini alıb nuş elə!
İskəndər bu camdan murada çatıb,
İçib o badəni, əbədi yatıb.
Sultan sağlığına kim içsə şərab,
Nuş olsun, içənlər olsun feyziyab!

## İSKƏNDƏRİN MƏKTUBUNUN ANASINA ÇATMASI

Müğənni, bu gecə çəngini saz et,
Məni bu dar yolda qəmdən xilas et!
Bəlkə genişlənsin, açılsın yolum,
Köçüm bu daşlıqdan, asudə olum...
Fəsillər içində qış gələn zaman
Narın yağış səpər yerə buluddan
Tozdan xəstələnmiş dünyaya fələk
Sankı dərman verər rəhmə gələrək!
Geniş səmaların sərin şəbnəmi
Qurtarar istidən bütün aləmi.
Susamış otlara bağçada, bağda
Xırdaca buzlardan pay verər şaxta.
Hamıya bəxşişlər paylayan bağlar





Tamam müflis olub möhnətdə qalar.
Dünən reyhan suyu satanlar bütün
Şərab doldurarlar küplərə bu gün.
Qaynayır kəndlinin evində küplər,
Kəndlilər kətan yox, yun paltar geyər.
Ceyran göbəyindən müşk saçılar,
Kabablı, noğullu süfrə açılar.
Şahlar kef məclisi qurub bu zaman
İçərlər İskəndər içən şərabdan.
Gör, qəlbdə nə vardı, dilim nə dedi,
Bu çərxi-fələyin oyunu nədi?
Ruma gəlib çatdı bu qara xəbər:
"Getdi bu dünyadan böyük İskəndər".
Tayfa başçıları yığılıb dedi:
Cahan sahibsizdir, başsızdır indi.
Hər kim barıgaha töhfə yollasa,
Gərək təqdim etsin İskəndərusa.
Örtdü qara qanad Rumu sərasər,
Bürüdü ölkəni sankı zəncilər[250].
Çatanda hamını batırdı qəmə,
Şahın anasına yazdığı namə.
Oxuyub məktubu ana ağladı,
Matəmə büründü, qara bağladı.
Baxdıqca oğlunun bu məktubuna,
Tumarıək qıvrılıb açıldı ana[251].
Qəlbi yas tutsa da bu möhnətindən,
Çıxmadı o şahın vəsiyyətindən;
"Oğlumun qoy ruhu şad olsun!" dedi,
Onun andlarına əməl elədi...
Bir an kəsilmədi ahı, fəryadı,
Tez getdi dünyadan, o da qalmadı!
Qara taleyinə əlvida etdi,
Onun da həyatı bu cürə bitdi.

## ATASININ VƏFATINDA İSKƏNDƏRUSUN NALƏ ETMƏSİ

Müğənni, qəlb açan o sazın ilə
Bu odlu dərdimə bir əlac eylə!
O nurlu nəğmənlə könlümü bəzə,
Bu qəmli gecədən çıxar gündüzə!..
İskəndərdən sonra İskəndərus da
Qovğa eləmədi taxtü-tac üstə.
Şahların içində heç onun qədər
Yoxdu şah olmağa layiq bir nəfər.
Beş günlük dünyaya tamah salmadı,
O uca mənsəbə mayil olmadı.
Güldən ayrı düşmüş şeyda bülbültək
Ahü zar eylədi gecə sübhədək.
Sanki anasını bir bala ceyran
Kabab olmuş gördü oyanan zaman.
Ordu böyükləri çox etdilər cəhd,
Bəlkə qəbul etsin tacı vəliəhd.
Açsınlar önündə xəzinələri,
Tutsun atasının tutduğu yeri.
Yoxdu şahzadənin şahlıq məqsədi,
O, ancaq ibadət etmək istədi.
Üzr ilə onlara dedi ki: "Gedin,
Təxtı başqasına həvalə edin.
Atamın yerində məclis qurmaram,
Badəni etmişəm özümə haram.
Dünya işlərindən əl çəkmişəm mən.
Yoxdur bu kələfin ucunu görən.
İnana bilməzdim, böyük hökmüran
Belə gənc yaşında gedə dünyadan.
Tərk edib sarayı, keçə təxtindən,
Darısqal daxmanı eyləyə məskən.
Bu dünya əhlini tərk edib daha
Mən üz tutacağam yalnız allaha.
Sütunu sarsılmış titrək körpünün
Üstündə bərk durmaq olarmı mümkün?
Atamdan artıq ki, olmayacağam,





Ölüb-getmədimi elə bir adam?
Onuntək tədbirli ola bilmərəm.
Cahanı fəth edib ala bilmərəm.
Atama nə verdi o güc, o qüdrət
Ki, ola məndə də mənsəbə rəğbət?
Bu yeddi qatlı çərx tüğyan eylədi,
Atamın təxtini viran eylədi.
Mən də təxtü tacı ataraq oda,
Kəyanlar təxtini qoydum tabuta!
Sadə adamları azad görüncə,
Çəkildim özüm də azad bir küncə.
Çoxunu aldatmış gümüş həvəsi,
Axırda yırtılıb zərdən kisəsi!
Dolmuş bir qədəhi doldursan yenə,
İçəndə dağılar o, üz-gözünə.
Bir yer ki, deyildir əbədi məskən,
Gərək "Get!" deməmiş özün gedəsən.
Şahlıq arzusundan uzaqdır könlüm,
Çünki qarşımdadır amansız ölüm.
Bu dar mağarada hörümçəklərtək
Nə qədər ovlayım qarışqa, milçək?
Qayalar içində məbəd taparam,
Orda keçirərəm ömrümü müdam.
Dünyanın çirkini təmizlərəm mən
Gözümün yaşilə öz ürəyimdən.
Dünya işlərindən əl çəkib bütün,
Tədarük görərəm axirət üçün.
Quşlartək az dənə edib qənaət,
Edərəm allaha dağda ibadət.
Köçməyin növbəsi yetişən zaman
Div girsən pərinin qoy qapısından!
Axirət xovfundan qorxum var məgər?
Asan ömr eləyən çətin can verər.
Atamtək məni də məzara atın,
Bir ovuc torpağı torpağa qatın!
Düşünsən əcəlin nə olduğunu
Daha cəsarətlə gözlərsən onu.
Ölüm əzabını dərk eləməsən

Çox çətin açarsan o qapını sən..."
Gedib bir kahada o tutdu məqam,
Dünya işlərini unutdu tamam.
Yalnız eyləyirdi haqqa ibadət,
Ölümə yaxındı bu yol, bu adət.
Bundan ibrət götür sən də, ey cavan,
Məbada çıxasan ata yolundan!
Çünki bu dünyada hiyləgər fələk
Çox işlər görür ki, çətindir demək,
Quyuya nahaqdan çox Yusif salmış,
Çox mənəm deyəndən intiqam almış!

## ƏRƏSTUNUN RUZGARININ SONU

Müğənni, yorubdur bəm səslər məni,
Zil üstə qaldır sən indi naləni!
Bəlkə o zil səsin ucalan zaman
Qurtara ürəyim bu ahü zardan.
Açdı ayağından İskəndər bəndi,
Göylər qalasına atdı kəməndi.
Onun sarayının filosofları
Üz tutdu o gedən mənzilə sarı.
Ərəstu görəndə batıb afitab,
Bağladı üzünə buluddan niqab,
Qaralar geyindi, matəm saxladı,
Səfər boxçasını o da bağladı.
Onun uca sərvi soldu, saraldı,
Başının üstünü xəstəlik aldı.
Eşidib ustadlı, şagirdli - kim var.
Yığıldı başına o yunanlılar.
Gördülər ki, yolu yaxşı tanıyan
Ərəstu yoluna tək olur rəvan.
O huş sahibinə sual verdilər,
Göyün sirlərindən tutdular xəbər:





"De, nədən yaranıb uca asiman
Ki, bəşər xəyalı uzaqdır ondan?"
Səfərə tələsən xəstə Ərəstu:
"Allah yaxşı bilir, - söylədi - bunu.
Şərh edib bir xeyli zamandan bəri,
Sanırdım, bilirəm mən bu sirləri.
İndi acizliklə burdan köçərkən
Gördüm ki, heç bir şey bilmirmişəm mən.
Dünya filosofu adlandıraraq,
Məni rəsədbilən sayırlar nahaq.
Yazdım bildiyimi "Cahanmədxəl"ə[illegible],
Bəzədim, süslədim onu elm ilə.
Göyün, ulduzların sirri haqqında
Çox şeylər kəşf edib göstərdim onda.
İndi, doğrusunu söyləsəm əgər,
Boş şeydir o köhnə rəsədnamələr.
And olsun allaha, mən də bilmərrə
Bilmirəm doludur, boşdur bu süfrə!"
Ərəstu bu qədər söyləyə bildi,
Söz bura çatanda nitqi kəsildi.
Yağ tamam qurtardı yanar çırağdan,
Əmr etdi bir alma dərsinlər bağdan.
O gözəl almanı qoxlar-qoxlamaz
Canı rahatlandı, dincəldi bir az.
Fələyin hökmüylə gəlib zamanı,
Nəfəsi tutulub çıxanda canı,
Gülərək dedi ki: "Siz olun agah,
Köçürəm, qarşımda açılır sabah.
Bu canı pak allah vermişdi mənə.
Pak olan allaha qaytardım yenə..."
Bunu deyib susdu bir ah çəkərək,
Onun da tozunu sovurdu fələk.
Atdı o almanı yoldaşlarına.
Göz yumdu bu əzab, qəm dəryasına...

## HÜRMÜZÜN RUZGARININ SONU

Müğənni, ruh verən sazını bir al,
Bizə ürək açan xoş bir hava çal!
Bülbültək naləndən sərxoş olaraq,
Bəlkə bu nalədən, qəmdən qurtaraq!..
Hürmüz də bu dərin dəryaya çatdı,
Ovun da gəmisi ümmanda batdı.
Dənizə qərq olcaq fəryad elədi:
"Yükü yüngül olan xoşbəxtdir,- dedi, -
Gəmidə artıq yük nəyə gərəkdir?
O ki, bir gün suya töküləcəkdir!
Bu dünya əzəldən vəhşətxanədir,
Göyərən hər otun işi nalədir.
Dağların damını örtüb qalın qar,
Dəniz quyusuna dolub yağışlar.
Yarandı ceyranlar ovlayan insan,
Qulanlar, ceyranlar qaçdılar ondan.
Mən də bir ahuyam, düşmüşəm bu gün
Amansız toruna zalım ölümün.
Bu yolda köməkçim olacaq allah,
Yoxdur ondan başqa heç kimə pənah!
Bu fanı dünyadan köçən zaman siz,
Ancaq bir allaha üz döndəriniz".
Deyərək bir şirin yuxuya getdi,
Sözü nə uzadaq, o, vəfat etdi...

## ƏFLATUNUN RUZGARININ SONU

Müğənni bir şirin nəğmə söylə sən,
Bu ki, ilk ricamız deyildir səndən!
Sübh çağı dinləyib sənin səsini,
Unudaq dünyanın ah-naləsini!
Əflatun söylədi köçüb gedərkən:
"Olacaq hamıya torpaq son məskən.
Deyirlər: mən uzun ömür sürmüşəm,
Rumda ən yaşlı bir dünya görmüşəm.
Ölüm pərdəsinə mən yol tapanda





Başqa pərdələrdən döndüm cahanda.
Bir körpə uşağa bənzərəm mən də
Ki, qaçar beşiyə yuxu gələndə.
Vücudu yatmağa sövq edər onu,
Yuxu necə gəlir, heç bilməz bunu.
Su ilə torpaqdan, od ilə yeldən,
Bu zidd ünsürlərdən əmələ gələn
Dünyada düzlükdən olarmı nişan,
Belə kəc bir yerdə qalarmı insan?
Bünövrəsi əyri qoyulan evin
Bir gün dörd divarı uçacaq, yəqin!
Yaşım yüz on üçü keçmişsə əgər,
Halım on yaşlı bir uşağa bənzər.
Qocayam, ancaq ki, o gənc yaşımda
Olan arzularım oynar başımda..."
Bu xoş arzulardan bir az keçəntək
Onun da fərşini yığdırdı fələk...

## VALİSİN RUZGARININ SONU

Müğənni, bir nəğmə de, qəşəng olsun,
Mənim fəryadımla həmahəng olsun!
Bəlkə də ruhlanıb sənin nəğməndən
Yeddi çay üstündən keçə bilim mən...
Valisin gözünü yuxu tutanda
Ömrünün gəmisi qaldı tufanda.
Dostları eşidib gəldi haraya,
Fələktək aldılar onu araya.
Xəstəlik getdikcə elədi şiddət,
Zəiflik qoymadı bədəndə taqət.
Bəxtini göylərdə yoxlayan zaman
Gördü bəxt ulduzu uzaqdır ondan.
Ulduz ədalətdən çıxmışdı kənar,
Ona zülm etməyə vermişdi qərar.
Ordakı dostlara eyləyib xitab,
O da öz ömründən verdi haqq-hesab:
"Xatircəm olmayın, - deyirəm ki, mən -
Qara zınqırovlu yeddi hindlidən[1]"

Bizə xoş bəxt verən bu ulduzlardır,
Ancaq pislikdə də əlləri vardır.
Nəhs dövrə başlasa ulduzlar əgər,
Bu dövrə zalimlik dövrü gətirər.
Zülmün zəmanəsi olmamış tamam
Dünyada yetişməz adil bir adam.
Qayıtsa yenidən o yeddi ülkər
Şad olar o zaman yenə xoşbəxtlər.
Dönüş nöqtəsinə gedib çatmadan
Yazdı yazımızı amansız zaman..."
Allahın adıyla bitirdi sözü,
Yumuldu dodağı, yumuldu gözü...

## BƏLİNASIN RUZGARININ SONU

Müğənni, bu köhnə pərdədə yekə
Hüzünlü, qəmli bir hava çal mənə!
Qəlbim də səs versin o nalələrə,
Şəbnəmtək göz yaşım çilənsin yerə!
Dövrü Bəlinasın axıra yetdi,
O da ariflərə belə ərz etdi:
"Vaxt çatıb, köçümü mən çatım gərək
Başqa bir aləmi arzular ürək.
Bu palçıq daxmada yaşardım əvvəl,
Mən getdim, yerimdə qaldı bir heykəl.
Yeddi heykəlinə bu fələyin mən
Əsla baş əymərəm səmimi qəlbdən!
Mən göydən də uca bir hökmüdaram,
İstəsəm hər evə girib-çıxaram.
Budaqda gül olub açaram bəzən,
İstəsəm tovuztək uçaram bəzən.
Pəritək kimsəyə olmadan əyan,
İstəsəm uçaram hər yerə nihan.
Mənim uçuşlarım sığmaz zamana,
Öpərəm mən onu getsəm hər yana.





İstəsəm göyləri ayaqlaram mən,
Daşın içini də eylərəm məskən.
Səhralar, dənizlər qarşımı almaz,
Çöldə Xızr olaram, dənizdə İlyas.
Gəlib mənzilimə əgər baxsanız,
Hər şey yerindədir, mən yoxam yalnız.
Uçaram göylərə - o son məskənə,
Yerdə nə qalarsa dəxli yox mənə!..."
Bunları astaca tərənnüm etdi,
O da gedənlərin ardınca getdi.
Son qoydu dünyanın əzablarına,
Dostlarla bir ölmək xoşdur insana...

## FƏRFURIYUSUN RUZGARININ SONU

Müğənni, çal, sənə heyran olum mən,
Ayrılım bu vaxtsız mürgüləməkdən!
Bəlkə nəğmələrin ola mənə yar,
Nə yatam, nə görəm qorxunc röyalar!
Fərfurıyus köçmək əmrini aldı,
Dəvəni yükləyib, təblini çaldı.
Dedi dostlarına: "Bu bəzəkli bağ
Reyhan ətirlidir, gözəldir, ancaq
Fanidir, o bir gün gedəcək bada.
Cəhənnəm olsa da, behişt olsa da!
Bizə bilikdəndir hər qorxu, bəla,
Yolbilən arxayın düzəlməz yola!
Qozbel olar bütün vay qayıranlar,
Dərzinin paltarı yamaqlı olar!
Yağ satanın qabı yağlı görünər,
Evində yağ olmaz bir zərrə qədər!
Xəzinə yükünü çəkərsə hər kəs,
Ömründə dərd-qəmdən dincələ bilməz!"
Pərgarı nəqşədən üzüldü, bu dəm
Onun da ömrünə çəkildi qələm...[54]

## SOKRATIN RUZGARININ SONU

Müğənni, çal rudu, gəl, dadıma çat,
Məni bu amansız yuxudan oyat!
Bəlkə rudun səsi axar çay kimi
Soyutsun susamış yanar qəlbimi!
Vaxt çatdı, Sokrat da düzəldi yola,
Əcəlin önünə çapdı dördnala.
Deyirlər: gizlicə düzəldib zəhər,
Özündən xəbərsiz ona verdilər.
Bundan xəstələnib səfər edərkən
Bir şadlıq nərəsi çəkdi ürəkdən,
Dedi ki: "Çatarsa vaxtı ölümün,
Ona çarə etmək deyildir mümkün!
Bu solğun balışa dünyada bir-bir
Hamı baş qoyaraq, dincələcəkdir!"
Yüksəklik aşiqi o quş durmadan,
Gördülər, uçacaq indi bu tordan.
Dedilər Sokrata: "Canın bədəndən
Çıxanda, ey alim, bilirsən ki, sən
Gedəcək əlindən hər iqtidarın,
De, harda qazılsın sənin məzarın?"
Gülərək söylədi onlara ustad:
"Burdan gedənləri etməyin heç yad.
Mənimçün nə fərqi burdakı yerin?
Harda istəsəniz orda yer verin.
Ona da bir yuxu tufanı çatdı,
Bəxtinin yelkəni sularda batdı.
Ordakı zirəklər bildi o saat
Nə dedi onlara o böyük ustad.





## NİZAMİNİN RUZGARININ SONU

Müğənni, çal görək bir "Ramişi-can"[235],
Açılsın ürəyim o xoş havadan!
Xosrov məclisində Barbət çalantək
Çal bir-bir nəğməni, birdən yüzədək!
Bu dastan yazılıb qurtaran kimi
Köçmək xəyalına düşdü Nizami.
Çox çəkməz, o çatar öz arzusuna,
Ömrünün kitabı yetişər sona.
Altmış üç yaşından altı ay qədər
Keçmişkən, istədi eləsin səfər.
Keçmiş alimlərdən danışdı bütün,
O da onlar kimi yatacaq bir gün.
Yığdı dostlarını edərkən səfər,
Verdi köçəcəyi yollardan xəbər.
Gülərək söylədi ki: "Ümidim var,
Keçər günahımdan o pərvərdigar!
Bizimçün çəkməyin boş yerə zəhmət,
Siz qalın, bizləri gözləyir cənnət!
Belə danışarkən getdi yuxuya,
Heç oyaq deyilmiş dünyada guya.

## MƏLİK İZZƏDDİNİN MƏDHİ

Müğənni, o "Ramış" havasını çal,
Şadlıq məqamıdır, qurtardı məlal!
Rudunla bir dəsgah çalasan gərək,
Çaldıqca uzana şahın ömrütək!
Aqil adamları aldı ruzigar,
Qaldı şahımıza ağıl yadigar.
Şaha kömək olsun həmişə xoş bəxt,
Onunla bəzənsin daim tacü təxt!
Məlik İzzəddinə bu çərxi-dövran
Qüdrət kəməndini bəxş etmiş çoxdan.
Odur yeddi ulduz sirrini açan,
Odur səkkizinci qərana sultan[236].
Kəsra-Key bəzmində o tutub qərar,

Olub Fırduntək xoşbəxt hökmüdar!
Dodağı dünyanın həyat şərbəti,
Ondandır göylərin rəngi, ziynəti.
O qədər şirindir söz bulaqları,
Səsinin quludur öz qulaqları.
Hər səhər bəzəkli bir məclis qurar,
Orada Keyqubad kimi oturar.
Gələr ölkələrin bir çox alimi
Arılar pətəyə yığışan kimi.
Çox bilən alimlər göstərib hünər,
Biliyi azların dərsini verər.
Vardır hər guşədə gövhər tapanlar,
Oddan su almağı bacarar onlar.
Mələk xislətlidir şahın vəziri,
Behiştə açardır hər bir tədbiri.
Şah - Məlik şah kimi səxavətlidir.
Vəziri nizamtək ləyaqətlidir.
O, hökmran şahdır indi dövrana,
Vəzir də ikinci Nizamdır ona.
Alimlər gətirmiş hər bir diyardan,
Yaratmış onlara hər cürə imkan.
Şərabı içərlər şən, güllər kimi,
Məstkən ayıqdırlar bülbüllər kimi.
Hamı yarımhuşyar, şah yarımayıq,
Hamı dildən iti, şah əliaçıq!
Kimdə var bu məclis padişahlardan?
O həm şahdır, həm də Cahanpəhləvan.
Bu bir məclisdir ki, qovqadan uzaq,
Ona layiq olar bu naməm ancaq.
Bununla seyr etsin şah göyü, yeri,
Dağları, daşları, göy dənizləri!
Hərdən at oynadıb çıxsın meydana,
Gah da hücum çəksin Həbəşistana.
Heç yerə getmədən aqil hökmüdar,
Görər öz gözüylə dünyada nə var.
İstəsə şah üçün bu kitab yəqin
Açar qapısını yeddi ölkənin.
Onunla məclisi şahın şad olar.





Onda bu dünyanın təsvirləri var.
Keyxosrov bəzminin varisi sənsən,
Təxtü tac dayağı zoruna əhsən!
Cahanı göstərən bu cama baxsan,
Könlündən keçəni verəcək nişan.
Xəlvətdə yazılmış belə bir əsər
Şaha şahzadəlik müjdəsi verər.
Elə bir qapını açdı bu açar
Ki, ora dəniztək gövhərlər saçar.
Səhər ağ təxtinə çıxandan bəri
Heç bir tac görməyib belə gövhəri.
Mən ki, söz açmışam əvvəl beşikdən,
Körpəni görəndə heyrət etmə sən.
Bu şadlıq günündə sən bir məclis qur,
Yerin dövrəsinə göytək kəmər vur.
Nolaydı, bəxtim yol verəydi mənə,
Gələydim şahın o cənnət bəzminə.
Bəlkə o məclisin mərhəmətindən
Açaydım işimdən düyünləri mən.
Qolumda, qıçımda qalmamış taqət
Ki, gəlib behişti edəm ziyarət.
Müqəddəs behiştə can getsin gərək,
Cəsədi oraya niyə göndərək?
Dəryamdan iki dürr olubdur əyan[257],
Onlardır üzümü mənim ağardan:
Biri Məryəm kimi ismətli pəri,
İsanın nurilə parlar o biri.
Birinin çöhrəsi Aytək münəvvər,
Birinin ürəyi güntək nur çilər.
Müqbil, İqbal adlı iki hindli qul
Göndərdim hüzura, olaydı məqbul[258].
Gəldi hər ikisi şah xidmətinə,
Məsəldir, yaqutu saxlar xəzinə.
Qızını mehrlə köçürər ana,
Qardaş duvaq salar onun başına[259].
Hüzura göndərdim bu gəlini mən,
Qardaşı tutmuşdur onun əlindən[260].
Canımı yollayıb bir peşkəş kimi,

Qoşmuşam mən ona ciyərparəmi[261],
Onu sən geriyə qaytaran zaman
Lütfün artıq olsun umduğumuzdan!
Sözümü burada çatdırdım sona,
Nə qiymət lazımdır, özün ver ona!..

## KİTABIN SONU

Gövhərlər olanda mədəndə aşkar
Dünyanı bürüdü gövhər alanlar.
Gövhərə olsa da hamı müştəri,
Gövhər tanıyanlar alar gövhəri.
Daşın göbəyindən çıxardım gövhər,
Əlimdə tərəzi dursam da əgər,
Sanma ki, düşmüşəm dövlət eşqinə,
Mənə gərək deyil əsla xəzinə!
İstəyim budur ki, o sahibdövlət
Versin əməyimə layiq bir qiymət.
Məni düşündürmür azla çox fikri,
Çünki qohum deyil Ayla Müştəri.
Gəzirəm elə bir sərraf insanı
Ki, məğmun etməsin gövhər satanı.
Div kimi dağların köksünü yarmaq,
Vəhşi heyvan kimi nərə qoparmaq,
Açmaq xəzinəyə axan selləri,
Dənizə tullamaq dürrü, gövhəri
Min dəfə yaxşıdır, asandır, inan,
Nadan adamlara şer oxumaqdan!..
Söz hər şeydən əvvəl dinləyən istər,
Alıcı olmasa, tanınmaz gövhər.
Mənim gövhərşünas bir müştərim var,
Həm gövhərşünasdır, həm də lütfkar.
Ancaq, xəbər tutub daş hərisləri
Saldılar dalımca neçə nəfəri.
Bu parlaq ləlimi almaqçün ələ
Mənə daş yağdırıb deyirlər belə:
"O parlaq gövhəri, gəl, bizə ver sən,
Verməsən, bu bağdan köç etməlisən!"





Hirsləndim onların bu rəftarından,
Bu cürə qarışıq, pis bazarından.
Dedim: "Gövhər üçün edərlərmi cəng?
Nəğmə gözəl olar olsa həmahəng[262].
Dərya sevdasıdır, keç öz dürründən,
Gücün nəyə çatır onu söylə sən.
Dənizlə alverə çıxarsa biri,
Gərək dərya qədər ola gövhəri.
Dəryayla alverin dərya nəfi var,
Dəryanı dəryayla satın alarlar.
Bir səsin dünyanı tutsa şöhrəti,
Gərək dünya qədər ola vüsəti.
Pozğunluq olarsa ahəngdə əgər,
O səs hara çatar, necə yüksələr?
Bir söz ki, rəng verir gülə, gülşənə,
Hikmətli cavabdır başa düşənə.
Yaxşı tanıyıram mən hər yetəni,
Kəmər oğrusuyla tac bəxş edəni...
Bunları deməkdən qəsdim, yaxşı bil,
Əsla yoxsulluqdan şikayət deyil!
Deməm pis keçir günüm, həyatım,
Ancaq yorulmuşdur azacıq atım.
Süfrəmdə bir parça çörək tapılar,
Amma səhhətimdən şikayətim var.
İnsanın bədəni olmasa möhkəm,
Yazarkən süstləşər əlində qələm.
Saz olsa qarğanın əgər bədəni,
O, Bəsti ənciri bilər hər dəni[263].
Düzdür, yaşım ötüb, əsir dizlərim,
Rövnəqdən düşməmiş ancaq sözlərim.
Hələ çox solmayıb göy sərvim mənim,
Hələ dirıbaşdır bu ağ köhlənim.
Hələ haqq gözləyən, qədirbilənlər
Əllicə beytimə yüz qızıl verər.
Bəxtimdən, zəmanə eyləyir kömək,
Kisəmə dürr verir, taxtıma ipək.
Ancaq bir arzu da keçir qəlbimdən,
Aslanlar ovuna kəmənd atım mən,

Şir kimi doyaram qanıyla ovun,
Leşini qoy yesin tülkülər onun.
Əti aparırsa pişik qazandan,
Nə çıxar, qarı hey qoparsın fəğan!
Fələyin zərləri əyri atması,
Dünyanın oyuna xələl qatması
Altmışa çatdırdı yaşımı mənim,
Düşməmiş qüvvədən ancaq bədənim.
Sanıram yenə də on yaşındayam,
Hələ də divlərin savaşındayam.
Keçənlər keçibdir çöllərdə yeltək,
Qalanlar da belə gəlib keçəcək.
Ömrün hesabını düşünsən əgər,
Quyuya sallamış dolçaya bənzər.
Bir dolça quyudan su çıxarmasa,
Nə xeyri, uzunmuş ipi, ya qısa?
Getdim, bu dastanda qoyub qəlbimi,
Gərək oxunmasın əyləncə kimi.
Dinləyən halını duysun dərindən,
O da getməlidir bu köç yerindən!
Bizi nə düşünsün, nə yada salsın,
Özünün, dostların qeydinə qalsın.
Mən də oturmuşdum bir gün, dünyada
Olub keçənləri salırdım yada.
Ölənlərin qəmi qəlbimə doldu,
Gözlərimin yaşı dönüb sel oldu.
Suda batanlardan bir nəfər gecə
Yuxuma girərək dedi gizlicə:
"Sən özün bizimlə bir yerdə ikən
Bizim dərdimizi nahaq çəkirsən.
İndi ki, gedirsən bu karvan ilə,
Sən öz dərdini çək, fikrini elə!"
Bu dünya mənasız göründü mənə,
Düşdüm o gecədən səfər fikrinə.
Çünki təşviş etməz ayıq bir insan
Bu çıraqsöndürən dəli ruzgardan.
Mən şərab küpünə düşərsəm, nə qəm,
Meylə al boyanmış libas geyərəm!





Tapa bilməsəm də qulan kababı,
Çəkmirəm toxluq ya aclıq əzabı.
Yoxsa da içməyə dadlı bir şərbət,
Şirin xəyallardan alaram ləzzət!
Qurtarıb tükənsə yağdanda yağım,
Nə olar, qoy sönsün bu can çırağım.
Səsim çıxmasa da təbiltək əgər,
Dözərəm təbiltək yağsa zərbələr.
Sındırsa sərvimi zamanın yeli,
Sağaldar yaramı şahın öz əli.
Xudaya, sən özün bu saf gövhəri,
Bu, hünər bağında yetmiş bəhəri,
Yetimdir, dünyada qoru hər zaman,
Gecəli-gündüzlü dərddən, bəladan.
Bu dəri dastanım yetişdi sona,
Yaxşı fal, xoş tale yar oldu ona.
Şahın adı kimi o Məsud olsun,
Şah da bu dastanla qoy Mahmud olsun[264].
İlk dəfə bu dürrü mən sapa düzdüm,
Tale ümmanında fərəhlə üzdüm.
İqbalı xoşlara yazdığım əsər,
Təəccüb etməyin məqbulsa əgər.
Nəzər salan zaman şah bu dastana
Qoy əqli, zəkası yar olsun ona!
Ucalsın adıyla onun bu kitab,
O da bu kitabdan olsun feyziyab!
Nizami aləmə bir də səs salsın,
Adı bu əsərlə əbədi qalsın!
Bunun adı kimi olsun bəxtəvər,
Dolandıqca dövran, keçdikcə illər!

# İZAHLAR

[1] *Yeddi qat içində nə var binadan,*
*Min alqış ona ki, odur Yaradan.*

Yeddi qat - Şərq əsatirində göyün yeddi təbəqədən ibarət olduğu təsəvvür edilir.

[2] *Heç bir kəs torpağa dil verə bilməz,*
*Naxış vura bilməz suya da heç kəs.*

Heç kim torpağı danışdıra bilməmiş və heç kim suya naxış sala bilməmişdir. Təkcə Allah torpaqdan nitq sahibi olan insan yaratmış və bir damcı suya (nütfəyə) insanın surətini nəqş etmişdir.

[3] *Səni ümid ilə hey axtarmaqda*
*Kimisi qarada, kimisi ağda.*

Səni hər kəs qaranlıq gecədə, işıqlı gündüzdə, kimi yerdə, kimi göydə axtarıb tapmaq istəyir.

[4] *Köhnə hekayəti çatdırdım sona,*
*Başlasın təzə söz indi cövlana.*

Bundan əvvəlki hekayəni - "İskəndərnamə"nin birinci hissəsini Şərəfnamə"ni yazıb bitirdim, indi də onun ikinci hissəsini - "İqbalnamə"niyazmağa başlamışam.

[5] *Saldın ilk sözümü Sən dildən-dilə,*
*Bu son addımı da yetir mənzilə.*

"Şərəfnamə"də müvəffəqiyyətimi və şöhrətimi təmin etdin, indi "İqbalnamə"ni də o cür başa çatdırmağa mənə yol göstər, yardım et.

[6] *Onun taxtı idi bütün bu əflak,*
*Başının müqəddəs tacıydı "lövlak".*

Həqiqətdə Məhəmmədin taxt-tacı yox idisə də, mənən o həm taxt, həm tac sahibi idi.

Quranda "Lövlökə ma xələqqü-l-əflak" ("Əgər sən olmasaydın, göyləri yaratmazdım") ayəsinin ixtisar edilmiş variantıdır. Güya bu sözləri Allah Məhəmmədə müraciətlə demişdir.

[7] *Parlayıb nur saçdı bu kainata,*
*Bənzərdi Zülmətda abi-heyata.*

Məhəmməd cəhalət qaranlığında olan dünyaya öz mərifəti ilə işıq saçdı. Onun dünyada varlığı əsatirə görə Zülmətdə olan dirilik suyuna (abi-həyata) bənzədilir.





[8] *Uca qalxmasaydı ərşin tağından,*
*Kimdi kainatın sirrini açan?*

Ərşin tağı - burada Məhəmmədin, dini əfsanədə deyildiyi kimi qalxdığı "merac"dır ki, göyün yeddinci təbəqəsi sayılır.

Beytin mənası: Məhəmməd göylərin ən yüksək qatından uca qalxdığı üçün kainatın sirlərini açdı.

[9] *Cənnətdən torpağa gəldisə Adəm,*
*O qoydu torpaqdan cənnətə qədəm.*

Dini əfsanəyə görə, birinci peyğəmbər olan Adəm Allahın əmrindən çıxdığı üçün cənnətdən çıxarılıb dünyaya atılmışdı.

Beytin mənası: Məhəmməd Adəm peyğəmbərdən də yüksəkdir. Adəm cənnətdən çıxarılıb yerə qovulduğu halda, Məhəmməd yerdən cənnətə getmişdir. Burada Məhəmmədin behişti görməsinə işarə edilir.

[10] *Aytək çıxdı Yusif quyudan əgər,*
*Nur saçdı quyudan o, Aya qədər.*

Yusif quyudan Ay kimi bayıra çıxdısa, Məhəmməd merac gecəsi yerdən Ayın üstünə, ərşə çıxdı və hər yeri öz nuruna qərq etdi.

[11] *Xızra abi-həyat oldusa qismət,*
*Həyat çeşməsindən keçdi Məhəmməd.*

Əgər Xızır Zülmata gedib dirilik suyuna çatdısa, Məhəmməd merac gecəsi daha yüksək məqama çatdı.

[12] *Yunisi uddusa balıq bir zaman,*
*Ona səcdə etdi balıqla ilan.*

Yunis - dini rəvayətə görə, qədim yəhudilərin peyğəmbərlərindəndir. Uydurduğu möcüzə yalan çıxdığı üçün qaçıb Dəclə kənarına gəlmiş, gəmiyə minmiş, günahkar olduğundan gəmi onu aparmamışdır; Yunisi suya atmışlar. Bir böyük balıq onu udmuş, o da balığın qarnında tövbə və dua etmiş, Allah duasını qəbul etmiş, bir müddət sonra balıq onu kənara buraxmışdır.

İkinci misrada Nizami Məhəmmədin möcüzələrindən birinə işarə edir. Dini əfsanəyə görə, Məhəmmədin möcüzələrindən biri də güya heyvanları dilə gətirməsi olmuşdur. Guya balıq və ilan da ona ram olub dilə gəlmiş, onun peyğəmbərliyini təsdiq etmişdir.

[13] *Davuddan yadigar tək bir zireh var,*
*Məhəmməd yüz zireh qoyub yadigar.*

Davud peyğəmbər öləndən sonra ondan insanlara yadigar kimi zireh qayırmaq bacarığı qalmışdı. Məhəmmədin təlimi isə yüz zirehə bərabərdir.

[14] *İsanın beşiyi göyə qovuşdu,*
*Məhəmmədsə özü göylərə uçdu.*

Məhəmməd peyğəmbərin meracına işarədir.

[15] *Tur dağı Musaya oldusa eyvan,*
*Məhəmmədin qəsri yarandı nurdan.*

Musa Allahdan vəhy almaq üçün "Turi-Sina" dağına çıxmışdısa, Məhəmməd nurdan yaranmış qəsrdə Allahla söhbət edirdi.

[16] *Gəlinimdə olan şuxluq, təravət*
*Peykərşünaslara eylər kifayət.*

Gəlinim- burada əsərim, yəni "İqbalnamə"ni, peykərşünas isə sənəti,gözəlliyi qiymətləndirən deməkdir.

[17] *Kürədən çıxanda güzgü bərq vurar,*
*Fəqət sınan zaman zirehə yarar.*

Qədimdə güzgünü pardaxlanmış dəmirdən qayırardılar. Güzgü qırıldıqda ondan zireh də düzəltmək olurdu.

Beytin mənası: gənclikdə insanın üzü güzgü kimi parlaq və saf olur, amma qocalanda üz qırışır, zireh kimi çin-çin olur.

[18] *Zülmətə bürünmüş keşikçixana,*
*Həmlə eləmişdir fil pasibana.*

Keşikçixana - dünya, fil - gecə, pasiban - Günəş mənasını verir. Yəni gecə gəlmiş, hər tərəfi qaranlıq basmışdır.

[19] *Bir ahu balası doğmuşdur çəmən,*
*Müşk-ənbər saçmada öz göbəyindən.*

Ahu - ulduz, çəmən - göy mənasındadır. Ahunun göbəyindən qara müşk düşən kimi göydən yerə qaranlıq çökməkdədir, yəni - gecədir.

[20] *Dürr üçün qəvvastək suya batırdım,*
*Gah seçib götürür, gah da atırdım.*

Nızami "İqbalnamə"ni yazarkən yeni surətlər, incə mənalar, gözəl ifadələr tapmasını qəvvasın dənizdən dürr çıxarmasına oxşadır.

[21] *Fələyin köhləni olub təngnəfəs...*
*Vaxtın sürətlə keçməsinə işarədir.*

[22] *Daxmada gecənin hörüklərindən,*
*Yeddi rəng ipəklər toxuyuram mən.*

Bu dar evimdə gecənin mənə verdiyi ilhamla rəngarəng surətlər, sözlər yaradıb, əsərimi yazıram.

[23] *Bu laciverd küpdən mən də İsatək*
*İplər çıxarıram hər an rəngbərəng.*

Dini əfsanəyə görə, İsanın peyğəmbərliyinə ən əvvəl inanan on iki boyaqçı olmuşdur. Bunlar İsadan möcüzə istəmişlər. İsa da guya boyaqçılara boyamaq üçün verilmiş bütün əşyanı bir küpə tökmüş və bunları eyni küpdən hər kəsin istədiyi rəngdə çıxarmışdır.





Bu beytdə: laciverd küp - göy, səma; rəngbərəng iplər isə - müxtəlif surətlər və müxtəlif mənalar ifadə edən misralar, beytlər deməkdir.

[24] *Onda Müştərini görərək hər an,*
*Vurar üzüyünə Ütarid nişan.*

Nizami özünü Ütaridə - katibə, Xoylu İmadı isə xoşbəxtlik gətirən Müştəri ulduzuna bənzədir. Münəccimlərin fikrincə, Müştəri xoş tale göstərən ulduzların ən böyüyüdür, Ütarid isə göylərin katibidir.

Beytin mənası: Müştəri Ütaridə xoşbəxtlik nəzərini salan kimi Ütarid bu səadəti möhürləmək üçün katiblik üzüyünü barmağına keçirir. Keçmişdə şahların katibi onların möhürünü özündə saxlardı ki, yazılanları möhürləsin.

[25] *Məgər neçə uşaq tutar bir mama?*
*Bir ağac nə qədər yetirər xurma?*

Burada Nizami özünü mamaya və bar verən ağaca, yaratdığı misraları və beytləri uşaq və xurmaya bənzədir. Yəni bir şair bir gecədə nə qədər şeir yazar.

[26] *Yuxusuz, ac-susuz qalıb o gecə,*
*Bu mavi dəryada üzürdüm təkcə.*

Mavi dərya ilham mənasındadır. Yəni bu yuxusuz çalışdığım gecədə fikrim ilham dənizində söz inciləri toplamaq üçün üzməkdədir.

[27] *Gecə gecə deyil, dibsiz bir quyu,*
*Ayı da, günü də udmuşdu suyu.*

Ayın görünmədiyi gecə, yəni tamam qaranlıq olan gecə el arasında qədimdən bəri qaranlıq quyuya bənzədilir, güya Ay və Günəş bu quyuya düşmüşdür.

[28] *Atdığım kəməndlə, şahın bəxtindən*
*Əmlik ceyranları ovlamışam mən.*

Şahın dövlətindən ilham kəməndini ələ alaraq xəyalımın çəmənində mənə ceyranları ovlamışam - gözəl beytlər yaratmışam.

[29] *Əngin dənizlərə mən tor atmışam,*
*Bu torla növbənöv balıq tutmuşam.*

Xəyalımın dənizinə tor ataraq, çoxlu təzə fikirlər tapmışam, rəngarəng beytlər yaratmışam.

[30] Vuraşır önümdə Çin ilə Həbəş.

Çin - ağ kağız, Həbəş isə kağız üzərində qara xətlər, yazılar deməkdir.

[31] *Qızışıb coşduqca beynim şərabdan,*
*Gəldi səxavətə söz də bu zaman.*

Şərab şairin ilhamı, təbi mənasındadır. Nizami ömründə şərab içmədiyini başqa beytlərində də bildirmişdir. Məsələn:

Sən mey iç, gətirmə heç bir bəhanə,
Ağzım möhürlüdür, üz vurma mənə.

Bu fikri nizamişünaslar da təstiq edirlər.

Beytin mənası: mənəvi şərabım - təbim coşduqca sözlər, fikirlər də beynimdə coşub daşır.

32 *İlham buludlarım çəkdi nərələr,*
*Gövhərşünaslara yağdırdı gövhər.*

İlhamım cuşa gəldi, sənəti sevənlər üçün yağış kimi dürlər yağdırdım.

33 *Taleyim açıldı, oldum bəxtəvər,*
*Zöhrə dəf göndərdi, Müştəri dəftər.*

Zöhrə ulduzu Yaxın Şərqin klassik şairlərinin əsərlərində göylərin çalğıçısı sayılır. Zöhrənin dəfi buna işarədir.

Kosmoqrafiya Müştəri ulduzu üzərində qara xətlər olduğunu göstərir. Müştərinin bu xətlərini qədimdə yazı saymışlar. Müştərinin dəftəri ifadəsi də buna işarədir.

İkinci tərəfdən, Müştərinin Zöhrə ilə bir bürcdə qarşılaşması, qədim astroloqların fikrincə, xoşbəxtlik əlamətidir.

Bu beytdə Zöhrənin dəfi - əyləncəli, zövq verən şeirlər, Müştərinin dəftəri isə, xoşbəxtlik kitabı demekdir ki, bu da "İqbalnamə"yə işarədir. Nizami demək istəyir ki, bu kitabda həm zövq, sevinc, həm də səadət yolunu tapmaq olar.

34 *Neçə vaxt ağ rəngə laciverd qatdım,*
*Bitdi "Şərəfnamə", murada çatdım.*

Ağ rəng - kağıza, laciverd isə mürəkkəbə işarədir. Nizami ağ rəngi laciverdə qatdım deməklə, əsərlərini yazmasından bəhs edir.

35 *Gör əvvəl nə ekdim, gör bitdi nələr,*
*Sınığı bu sayaq bitişdirərlər.*

Şair "İqbalnamə"nı yazmaqla və onu "Şərəfnamə" ilə bitişdirməklə, "İskəndərname" kimi bütöv bir əsərin meydana çıxdığını göstərir. Beytdə sınıq sözü "Şərəfhamə"nin mövzuca yarımçıqlığına işarədir ki, "İqbalnamə" bunu tamamlayır.

36 *Bilmirəm bu qədər füsunkar sözlər*
*Babil quyusundan çıxır nə təhər?*

Əsatirə görə, qədim Babil şəhərində dərin bir quyu var imiş ki, oradan asılmış Harut və Marut adında sehrbaz mələklər də quyudan çıxa bilməzlərmiş. Nizami burada öz şeirlərinin o quyudan çıxa biləcək dərəcədə qüvvətli caduya, yəni təsirə malik olduğunu söyləyir.





37 *Zöhrəyə o "Zənd"i kimlər öyrətdi,*
*Oxuyub Harutu tamam bənd etdi?*

Əsatirə görə, guya Zöhrə ulduzu çox gözəl oxumağı ilə Harutu cəzb etmiş, Harut da ona qovuşmaq üçün sehrbazlığa başlamış və sehrbazlıq etdiyinə görə cəzalandırılaraq quyudan başı üstə asılmışdır.

"Zənd" - atəşpərəstlərin peyğəmbəri Zərdüştün kitabının adıdır. Buna "Zənd-Avesta" da deyilir. Nizami isə təbini "Zənd" oxuyan Zöhrəyə, şeirlərini də Zöhrənin cəzbedici nəğmələrinə bənzədir.

38 *Sehirli nəğməmdən Zərdüşt xar oldu,*
*Söndü çox "Zənd"lərin alovu, odu.*

Yəni mənim sehrə - qüvvətə malik sözlərimin müqabilində Zərdüştün sözləri kölgədə qaldı, çox "Zənd"lər rövnəqdən düşdü.

39 *Dəryaya dürr saçsın qətrə buradan,*
*Qoy xurma daşısın Bəsrə buradan.*

Məlumdur ki, qətrə dəryada sədəfin ağzına düşüb, dürr olar. Nizami deyir ki, qətrələr məndən dəryalara dürr saça bilər, yəni mən sözlərdən dürr yaradan bir şairəm.

İkinci misra Bəsrənin bol və əla xurma yeri olduğuna işarədər. Nizami özünün Bəsrə xurmasından da şirin və bol sözlər yaratdığını söyləyir.

40 *Bu altıkünc tağda bir buludam mən,*
*Səpərəm hər yana su ciyərimdən.*

Mən bu altıcəhətli (sağı, solu, önü, arxası, yuxarısı, aşağısı olan) aləmdə elə bir sənətkaram ki, sözlərimin şöhrəti hər yana gedib çatır.

41 *Bitkitək pay alıb hamı suyumdan,*
*Yağışım sərvlər becərir hər an.*

Mənim əsərimdən ilham alan şairlər damcı ilə bitən otlara bənzərlər, onlar mənim böyük bəhrələr verən sənətimə möhtacdırlar.

42 *Kölgətək işıqdan kim çəksə zərər,*
*Əlbəttə, həmişə ondan çəkinər.*
*Çeşməmdən feyziyab olsa da çoxu,*
*Getmir gözlərinə həsəddən yuxu.*

Bu beytlərdə Nizami özünu işığa və onun poetik istedadına həsəd aparan şairləri kölgəyə bənzədir.

43 *Mənim meyxanamdan içərlər şərab...*
*Yəni mənim əsərlərimdən istifadə edərlər.*

Bu feyzi onunçün qazandım ki, mən

44 *Əsla su içmədim yad bir çeşmədən.*

Mən özgəyə göz dikmədən öz əməyimlə belə bir dərəcəyə çatdım.

45 *Xəlvətdə poladdan sildim ki, pası,*
*Yaqut rəngi alsın onun aynası.*

Bu və başqa beytlərdə Nizami öz yaradıcılığının tamamilə orijinal olduğunu, heç kəsi təqlid etmədiyini və heç kəsdən söz almadığını göstərir və deyir ki, mən zəhmət və əziyyətimlə öz yaradıcılıq xəyalımı güzgü kimi parlatdım.

46 *Hələ can almamış əcəl turactək:*
*"Dad, məni tutdular!" - çığırıb dad çək.*

Dad, məni tutdular! - Turacın oxumasına, təqlid yolu ilə düzəldilmiş ifadəyə işarədir.

47 *Fələk - yeddibaşlı qorxunc əjdaha,*
*Bircə zərbə vursa, məhv oldım daha.*

Əsatirə görə, güya göy əjdahası olan fələk Ayı udurmuş, həm də onun tutulmasına səbəb olurmuş.

48 *Xəlbirə bənzəyən teştdir asiman,*
*Sən bir xəlbir torpaq, o da bir teşt qan.*

Birinci misra ulduzlarla dolu göyə işarədir, İkinci misrada isə insan bir ovuc torpağa, çərxi-fələk isə məhv olmuşların qanı ilə dolmuş bir teştə bənzədilir.

49 *Bu göy rəngli küpün çox hiyləsi var,*
*İçindən görərsən yüz cür rəng çıxar.*

Göy rəngli küp - fələk, səma deməkdir. Beytin mənası: bu fələk cadularla, füsunlarla doludur, ondan yüz növ hiylə baş verir.

50 *Küpə bir cadugər minər, deyərlər,*
*Bu küpə minmişdir yüz min cadugər.*

Əfsanələrə görə, küpə bircə cadugər minir, amma göyün küpünə bax ki, üstündə yüz minlərlə cadugər və sehrbaz, yəni bədbəxtlik və nəhslik ulduzları dolaşır.

51 *Tülkütək geydirər qırmızı papaq,*
*Sonra qara itə yedirdər ancaq.*

"Dərzı tülkü" adlı Azərbaycan nağılına işarədir. Yəni bu çərxi-fələk bu gün bir adama qırmızı tülkü dərisindən papaq geydirsə, sabah onu tülkü kimi qara itlərə yem edər; bu gün güldürər, sabah ağladar.

52 Nədir dörd yol üstə məskən düzəltmək?

Dörd yol - dörd ünsürdən, yəni su, od, torpaq və havadan ibarət dünya deməkdir. Mənası: nə vaxta qədər bu keşməkeşli dünyada yaşayacağı?

53 *Dörd balış qeydindən qurtaranda biz,*
*Asudə yatanq səssiz-səmirsiz.*

Dörd balış - yenə də dörd ünsürdən ibarət olan dünya deməkdir. Yəni yalnız öləndən sonra asudə olmaq mümkündür.





54 *Hər pərdədə yalnız o adam çalar*
*Ki, ola pərdədən yaxşı xəbərdar.*

Musiqidə işlənən pərdə sözü burada məcazi mənadadır. Beytdə deyilir ki, həyatın qanun-qaydalarını bilməyən, onlarla hesablaşmayan adam daim çətinliklərə rast gələr.

55 *Belə dörd müxtəlif yol ayrıcından,*
*Çıxmaram, ya qoca olum, ya cavan.*

Dörd müxtəlif yol - sağa, sola, irəli, geri gedən yollar, dünyəvi həyatın yollarıdır. Yəni cavan da, qoca da olsam, bu bir-birinə zidd yollardan keçməyə məcburam.

56 *Dəniz dalğalanıb gələrsə feyzə,*
*Sədəfdən dürr alıb çıxardar üzə.*

Padşahın səxavəti dəniz kimi hərəkətə gəlsə, mənim təbimdən də dürr kimi sözlər çıxar.

57 *Bir şəhər yaratsam, baxtım olsa yar,*
*Kim olsun bəs ona sonra şəhriyar?*

Nizami əsərini bir şəhərə bənzədib deyir ki, onu tikib qurtarsam, yəni "İqbalnamə"ni müvəffəqiyyətlə yazıb başa çatdırsam, ona sahib çıxan, onun "şəhriyarı" kim olar?

58 *Qoyma qoca şaha gənc üstün gələ,*
*Şiraye Pərvizi öldürdü belə.*

Nizaminin "Xosrov və Şirin" poemasında Pərviz öz sağlığında şahlığı oğlu Şirayəyə vermiş, onu həddindən artıq yüksəltmişdir. Şiruyə də yolunu azıb atası Xorsov Pərvizi öldürmüşdür.

59 *Qocaman ağaca mişar çəkmə sən,*
*Zöhhak bunun üçün düşdü taxtından.*

Qocaman ağac sözlərinden Pişdadiyan sülaləsinin guya yeddi yüz il padşahlıq etmiş dördüncü şahı Cəmşid nəzərdə tutulur. Zöhhak onu taxtdan saldığı üçün öz taxt-tacını itirdi.

60 *Çoxları istədi "İqbalnamə"ni,*
*Tək ona həsr etdim mən bu naməni.*

Namə sözü "İqbalnamə"yə, ona sözü isə İzzəddin Məsuda işarədir. İzzəddin Məsud - Nurəddin Arslan şahın oğlu, Məsul atabəylərinin yeddinci hökmdarı olmuş, 1218-ci ilə qədər hakimiyyət sürmüşdür. Nizami "İskəndərnamə"də bir neçə dəfə İzzəddin Məsudun adını çəkmiş, "İqbalnamə"ni də ona ithaf etmiş və oğlu Məhəmməd vasitəsilə əsəri Məsula göndərmişdir. Onun hakimiyyətdə olduğu dövr (1214-1218) nəzərə alındıqda, görünür ki, Nizaminin vəfatı bizim qəbul etdiyimiz 1209-cu ildən sonra olmuşdur.

61 *Deyirlər o xoruz banlar hər səhər,*
*Yerdəki xoruzlar ona səs verər.*

Nizami özünü guya göydə yaşayan və hər səhər ilk banlayan xoruza, o biri şairləri isə onu təqlid edərək, yerdə banlayan xoruzlara bənzədir.

62 *Bir ov vurubsansa, çıxar meydana,*
*Bir əsər yazmısansa, ortaya qoy.*

63 Vurabsan qızıla şah sikkəsini.

Pulun üstündə şahın adı həkk edilən kimi sən də bu qızıl kimi əsərin ("İqbalnamə"nin) üstünə şahın adını yazmısan, əsəri ona ithaf etmisən.

64 *Almış fərmanını Mahmudilərdən,*
*Həsəbi, nəsəbi Davudilərdən.*

Mahmud - Sultan Mahmud Qəznəvi və ya Səbuktəkin Qəznəvilər dövlətinin banisidir. 997-ci ildən 1030-cu ilə qədər hakimiyyət sürmüşdür. Mahmudilər Mahmud nəsli, sülaləsi deməkdir. Davud - Selcuq hökmdarlarından Qılınc Arslanın böyük qardaşı idi. Məlikşah Səlcuqinin fərmanı ilə 20 il hakimiyyətdə olmuş, 1107-ci ildə ölmüşdür. Şair İzzəddin Məsudun Səlcuq sülaləsindən olan Qılınc Arslanın böyük qardaşı Davud ibn-Süleymanla əsil-nəsəbcə bağlı olduğunu göstərir.

65 *Tünd şərab qədəhə tökülsə əgər,*
*Lal laciverdə şəbxun eyləyər.*

Lal - qırmızı şərab, laciverd isə tünd göy rəngli qədəh mənasında işlənmişdir. Lal laciverdə şəbxun (basqın) eyləyər - yəni qırmızı şərab göy qədəhin rəngini dəyişdirər.

66 Fəzada uçarsa əgər üqabı..

Üqab - qaraquş, ulduz adı.

67 *Ayı göydə fətir eləyib güman,*
*Çoxları quyuya düşüblər, inan.*

Şair Ayın quyu suyunda əks olunan şəklini fətirə, şahın çöhrəsini isə həmin şəklə oxşadır; şaha təmənna ilə yanaşanlar Ayın quyudakı şəklini fətir bilib ona can atanlar kimi özlərini fəlakətə salırlar.

68 *Mələyə bənzəyər divlər kənardan,*
*Div zülmətdən törər, mələksə nurdan.*

Əsatirə görə, div qaranlıqdan, mələk isə nurdan yaranmışdır.

69 *Neçün Bişkin demiş ona bu dövran?*
*O ki, mehribandır bütün şahlardan.*
*Bişkin kəlməsini dürüst yazsalar,*
*Ona layiq bir ad Keypişin olar.*

Bişkin - sözünün lüğəvi mənası çox kinli deməkdir. Nizami bu ləqəbin





əsərdə mədh edilən şahın xasiyyətinə uyğun olmadığını bildirir və deyir ki, onun kini deyil, Əksinə, mehribanlığı bütün şahlardan artıqdır. Buna görə də şair Bişkin (yaxud Pişkin) sözünün hərflərinin yerini deyişməklə, onu Keypişin şəklinə salır və bu adı şaha daha layiq bilir; çünki Keypişin İranın əfsanəvi padşahı və Keylər sülaləsinin birinci şahı olan Keyqubadın oğlu Keykavusun adıdır.

70 *Qopdu bir zəlzələ, göyü oynatdı,*
*Şəhərlər dağılıb yerlərə batdı.*

XII əsrdə Azərbaycanda və o cümlədən, Gəncədə bir neçə zəlzələ olmuşdur. Bunların ən böyüyü 1139-cu il zəlzələsidir ki, rəvayətə görə, bu vaxt Gəncədə 230 minə qədər adam həlak olmuşdur. Kəpəz dağı zirvəsinin çökməsi nəticəsində Göygölün əmələ gəlməsinə səbəb olan bu dəhşətli zəlzələni Nizami həyəcanla təsvir edir.

71 *Surun gur səsindən balıq qorxaraq*
*Atıldı öküzdən bir xeyli uzaq.*

Sur - buynuzdan qayrılan iri çalğı borusudur. Əsatirə görə, guya yer öküzün, öküz də balığın üstündə durmuşdur. Beytin mənası: surun, yəni zəlzələ vaxtı qopan gurultunun səsi o qədər güclü oldu ki, yer kürəsini titrətdi, balıq öküzün altından sıçrayıb uzağa düşdü.

72 *Yusiflər gözünə sanki batdı mil,*
*Sanki aşıb-daşıb Misri basdı Nil.*

Nizami burada Gəncəni əfsanəvi gözəl Yusifə və Misrə bənzədir. Mil Yusifin gözünü kor və Nil Misri viran etdiyi kimi zəlzələ də Gəncəni viran etmişdir.

73 *Bircə sap gövhəri sağ gördü səhər,*
*O düzdü yenidən saplara gövhər.*

Gəncənin zəlzələdən sonra şah tərəfindən bərpasına işarədir.

74 *Yeddi firuzəli bu qəsrdə sən*
*Haqqa, ədalətə vüsət vermisən.*

Yeddi firuzəli qəsr - yeddi göy təbəqəsini bildirir; məcazi mənada isə dünyaya işarədir. Yəni sən bu dar dünyanı hünərin və ədalətinlə genişləndirdin

75 *Bir qədəh mey verir sənə Nizami,*
*Gərək nuş edəsən Keykavus kimi.*
*Bu tusi qədəhlə Mahmuda bildir*
*"Şahnamə"nin qədri, qiyməti nədir!*

Bir qədəh mey dedikdə, "İqbalnamə" nəzərdə tutulur. Şair deyir ki, gərək bu qədəhdəki meyi nuş edib, ona qiymət vərəsən. Başqa sözlə, bu tusi qədəhlə, yeni Firdovsi Tusinin "Şahnamə"si qiymətində olan bu əsərə layiqli qiymət verməklə, Sultan Mahmuda bildirəsən ki, şairin qədrini necə bilərlər

76 *İki xəzinənin varisi, hökmən,*
*Səxavətdə sənsən, söz deməkdə mən.*

İki xəzinə - Sultan Mahmudun xəzinəsi ilə Firdovsinin "Şahnamə" əsərini bildirir. Nizami deyir ki, "Şahnamə" şairinin varisi mənəm, Mahmud xəzinəsinin varisi sən. Məndən böyük əsər yazmaq, səndən böyük səxavət göstərmək...

77 *Borc əgər vaxtında ödənilməsə,*
*Qaydadır: varisdən çatar varisə.*

Rəvayətə görə, Sultan Mahmud Firdovsiyə "Şahnamə"ni yazdırmış, lakin vəd etdiyi mükafatı verməmişdir. Nizami şaha deyir ki, Firdovsinin varisi mənəm. Mahmud xəzinəsinin varisi sən. Qanun-qaydaya görə ödənilməmiş borcu bu varis o varisə verməlidir.

78 *O gövhər kanını yox edib ruzgar,*
*Bircə "İntiyaxis" qalıb yadigar.*

"İntiyaxis" - İskəndərdən sonra İranda hakimiyyət sürmüş sultanlar nəslindən birinin adıdır. Bu söz eyni zamanda həmin hökmdarların adına yazılmış bir kitabdır ki, Nizami burada qalıb yadigar dedikdə, onu nəzərə alır.

79 *Yoxsa ram papaqlı bir türk nə sayaq*
*Çinə, Hindistana basardı ayaq?*

Rum papaqlı türk sözləri ilə Hindistanı alıb, Çini özünə tabe etmiş olan İskəndər Zülqərneyn nəzərdə tutulur.

80 *Əfsunda Harutu vurub keçənlər,*
*Necə əfsun quran, necə cadugər.*

İskəndər Zülqerneyn öz yanında Harutdan da mahir cadugərlər aparırdı.

81 *Madam ki, o ramı ipək bir rəngmiş,*
*İçdən belə çirkin, üzdən qəşəngmiş,*
*Gümüş məcməyidə gərək biz nahaq,*
*Bir qara ud kimi coşub daşmayaq.*

Rum çeşnili ipək - üzdən gözəl naxışlı, astardansa çirkin olur. Bu ipəyin astar tərəfini açıb eybini göstərmək lazım olmadığı kimi, biz də bu gümüş məcməyidə, yəni bu göy altında (məcazı: bu dünyada) yaxşı qoxu verməyən qara ud kimi yanaraq eybimizi üzə çıxarmayaq (ud ağacı yanarkən xoş qoxu verir, amma qara ud, əksinə, yandıqda yaxşı iy vermir).

82 *"...Ud, söyüd külüylə yoxsa gözəllər*
*Dişini ağardıb bizə gülərlər..."*

Keçmişdə ud və söyüd ağaclarını yandırıb külü ilə diş yuyarlarmış. Dişini ağardıb ifadəsi həm həqiqi mənada, həm də gülmək mənasında işlənmişdir. Nizami deyir ki, qara ud yananda külü ilə diş yuduqlan kimi, biz də coşub-daşsaq, eyblərimizi üzə çıxararıq və xalq gülüb bizə istehza edər.





83 *"İki qərn sahibi" qoymuş namını,*
*Çünki Şərqdən, Qərbdən almış kamını.*

Ərəb dilində qərn sözü Şərq ve Qərb mənasında da işlənir. İskəndər Zülqemeynə "İki qərn sahibi" ləqəbini ona görə vermişlər ki, o, Şərqi də, Qərbi də fəth etmişdir.

84 *Deyirlər ki, qoşa hörüyü varmış,*
*Onu kürəyinə daim atarmış.*

Qərn - sözü saç mənasında da işlənir. Guya İskəndər saçını başının dalında iki dəstədə hörüb burumuş, buna görə ona Zülqərneyn - iki hörüklü deyirmişlər.

85 *Deyirlər görübmüş bir belə röya,*
*Gündən iki qərni alıbmış guya.*

İskəndər yuxuda görübmüş ki, Şərqi və Qərbi Günəşin əlindən almış, iki qərn sahibi olmuş, buna görə ona Zülqəmeyn adını vermişlər.

86 *Başqa rəvayətdə deyirlər yenə:*
*İskəndər yaşamış iki qərinə.*

Qərinə - sözü həm əsr, həm də əsrin üçdə biri mənasında işlənir. İskəndərin yeni eradan qabaq 356-cı ilin payızında doğulduğu və 13 iyun 323-cü ildə, yəni otuz üç yaşında öldüyü məlumdur. Demək, bu rəvayət uydurmadır.

87 *İskəndər bilmişlər o gündən bəri*
*Buynuzlu çəkilmiş mələkələri,*
*Odur ki, şübhəyə düşmüş ərəblər,*
*"Zülqərneyn" ləqəbi almış İskəndər.*

Əbu-Məşər - adı Ömər, atasının adı Məhəmməd Bəlxlidir. Ən məşhur münəccimlərdən olmuşdur. Riyaziyyat və astronomiya sahəsində əsrinin ən böyük alimi sayılır. 886-cı ildə ölmüşdür. "Üluf" onun məşhur əsərlərindən biridir. O, "Üluf" kitabında yazır ki, İskəndər öləndən sonra yunanlar onun surətini çəkmişlər. Həmin surətin sağ və solunda iki mələk şəkli də rəsm etmişlər. Surətin üstündə iki buynuz şəkli olmuşdur. Guya İskəndər Allah tərəfindən yaradılıb yerə göndərilmiş, bu mələklər də onun sağ-solunda qarovulçusudurlar. Sonra həmin şəkil ərəblərin əlinə keçmiş, onlar buynuzlu mələyi İskəndər bilib, ona "Zülqərneyn" (ikibuynuzlu) adını vermişlər. İskəndər sikkəsi üstündə buynuzlu büt şəklinin həkk edildiyi də məlumdur.

88 *Dürdən taca bənzər qınları varmış,*
*İki qulağına o qın taxarmış.*

İskəndərin qulaqları çox uzun imiş, onları gizlətmək üçün o, tacının yanlarında buynuza oxşar iki balaca qın qayırtdırıbmış, tacını qoyanda qulaqlarını o qınların içinə salırmış.

89 *Sevdi çinli türkü, könlu şad oldu,*
*Qəmlər hindusundan o, azad oldu.*

Türk - sözü gözəl mənasında da işlənir. Burada Çində yaşayan türk gözəli nəzərdə tutulur. Hindu sözü qaralıq, qəm, kədər rəmzi kimi alınır. Beytin mənası: Arşimed o ağ çinli türk gözəli ilə o qədər zövqə dalmışdı ki, qəmin, kədərin qaralığı onun qəlbini tərk etmişdi.

90 *Dik servi əyərək taqətdən saldı*

Qızı sağlamlıq, gənclik və gözəllikdən məhrum etdi.

91 *Rüzgar ona görə dəyişir hər an:*
*Törəyib dörd ana, yeddi atadan.*

Dörd ana - maddi aləmin əsasını təşkil edən dörd ünsür (su, od, torpaq, hava), yaxud dörd cəhət (şərq, qərb, cənub, şimal); yeddi ata isə astrologiyaya görə göyün yeddi təbəqəsi deməkdir. Beytin mənası: dünya və insanın həyatı ona görə durmadan dəyişilir ki, birbirinə zidd müxtəlif maddə və qüvvələrdən əmələ gəlmişdir.

92 *Arşimides rumlu alimin mumdan,*
*Balı çəkdiyini gördüyü zaman...*

Rumlu alim - yunan filosofu Ərəstuya işarədir.

Beytin mənası: Arşimides Ərəstunun, balı mumdan ayıran kimi o qızın gözəlliyini soldurduğunu gördükdə...

93 *Uca sərv bir daha yarpaq açaraq,*
*Dikəldi, yenə də atdı qol-budaq.*

O sərvboylu kənizin əvvəlki gözəlliyi qayıdıb yerinə gəldi.

94 *Rüxü qoymuş idi Ayı piyada,*
*"Atı" mat qoymuşdu "şahı" dünyada.*

Nizami bu beytdə öz fikrini obrazlı ifadə etmək üçün şahmat oyunu tərmınlərındən istifadə edir. Birinci misrada rüx sözünü şair eyni zamanda iki mənada işlədir. Rüx - farsca üz və piyada (şahmat fiquru) mənasını verir. Misra gözəlin hüsnü ayı piyada qoymuşdu mənasındadır.

Beytin mənası: parlaq üzü Ayın işığının yolunu bağlamışdı və onun gözəlliyinə şahlar mat (heyran) qalmışdılar.

95 *"Şirin"in halvasın qurtaranda mən,*
*Bir halvaçalanım getdi evimdən.*

"Şirin" - "Xosrov və Şirin" əsəri, halvaçalanım - arvadım mənasındadır. Beytin mənası: "Xosrov və Şirin" əsərimi yazıb bitirdikdə, öz Şirinimi Afaqımı itirdim.

96 *"Leyli" xəznəsinə çəkərkən hasar,*
*Orda da bir Gövhər eylədim nisar.*





*Bu toyu çatdırıb mən nəhayətə,*
*Təzə bir gəlin də verdim cənnətə.*

"Leyli və Məcnun" əsərini yazıb sona çatdıranda da ikinci arvadım öldü. Nizaminin ikinci arvadının adı, bizcə, Gövhər olmuşdur. Yuxarıdakı beytlərin ikinci misrasındakı Gövhər sözü buna işarədir və iki mənada işlənmişdir.

Üçüncü və dördüncü misralardan məlum olur ki, şair "İqbalnaməni yazıb qurtaranda üçüncü arvadı da vəfat etmişdir.

97 *Neçə gözəl dərdi sinəmdə ikən,*
*Rum-rus dastanını necə yazım mən?*

Rum-rus dastanı burada "İskəndərnamə"yə işarədir. Rum dastanı -İskəndər Ruminin dastanını, rus dastanı isə İskəndərin ruslarla bir sıra müharibələrini bildirir ki, bunlar "Şərəfnamə"də təsvir edilmişdir.

98 *Hamıya məlumdur, əhli-Xorasan*
*Bağdadda fənd ilə yaşayar asan.*

Abbasilər dövründə, səkkizinci əsrdə Xorasan hakimlərinin (Əbu Müslüm Xorasanının, Bəni-Tahir dövlətinin banisi Tahirin və b.) Bağdad xəlifələri ilə diplomatik əlaqələrinə və xəlifələri aldatmalarına işarədir.

99 Darülxilafət - xilafət mərkəzi, paytaxt.

100 *Yox, əgər görsəniz yalançıyam mən,*
*Baş məndən, teşt ilə qılınc da sizdən.*

Gördünüz ki, mən sizi aldadıram, başımı teşt içində kəsin.
(Keçmişdə məhkum olanların başını teşt içində kəsmək cəza formalarından biri olmuşdur).

101 *İskəndər bir xəbər aldı Yunandan:*
*Olub xəzinəyə Mariyə ilan.*

Şərq əfsanələrinə görə, guya hər gizli xəzinə üstündə bir ilan yaşayıb onu qoruyarmış.

102 *Mən qalxıb gizləndim dərhal bir küncdə,*
*Fikrin gah tikanda, gah da türüncdə,*

Mənim ürəyimdə bir tərəfdən arvad-uşaq dərdi və ölüm qorxusu, digər tərəfdən də xəzinə qazanmaq, varlanmaq arzusu vardı.

103 *Döndüm bir mədənə o xəzinədən,*
*Dənizək varlandım bir gecədə mən.*

Mədəndə qiymətli daşlar, dənizdə dürr, inci və s. bol olduğu kimi, mən də eləcə varlandım.

104 *Şahı sarsıtmışdı bu söz, bu söhbət,*
*O gövhər satana etdi mərhəmət.*

Gövhər satan ifadəsində bu əhvalatı danışan çörəkçi nəzərdə tutulur.

105 *Düz pərdədə əyri çaldıqlarından*
*Pərdənin dalında oldular nihan.*

Doğru sözləri inkar edib yanlış yol ilə getdikləri üçün tələf oldular.

106 *O sərv meşəsində gördü ki, ancaq*
*Yetmişi qurayub, biri qalıb sağ.*

Sərv meşəsi burada alimlər məclisi deməkdir. Yəni bunların yetmişi də ölmüş, bir Hürmüz sağ qalmışdı.

107 *Təblini çaldıqca təbilçi yeyin,*
*Qızışdı havası soyuq gecənin.*
*Naümid olanda o qara qarğa*
*Ağ xoruz başladı xoş dil açmağa.*
*Çıxdı Rum taxtına İskəndər erkən,*
*Dili od, dimağı mumdu deyəsən.*
*Təblini çaldıqca təbilçi: - Günəş doğduqca...*

Qara qarğa - qaranlıq gecə, ağ xoruz - gündüz deməkdir. İkinci beytin birinci misrasının mənası: gece keçdi, səhər açıldı, dan yeri ağardı.

İkinci beytin ikinci misrasının mənası: İskəndərin dili kəsərli, ağlı isə elmi, fəlsəfəni mənimsəmək üçün hər nəqşi asanlıqla qəbul edən mum kimi yumşaq idi.

108 *Bir küpün içində gizləndi bir gün.*
*Axtardı səsini bu yeddi küpün.*

Əflatun bir küpün içinə girib yeddi fələyin, kainatın səsini axtardı.

109 *Ərğənun təkmilə yetdiyi zaman*
*Süni ud çox yaxşı oldu xam uddan.*

Ərğənün zahirən pianoya bənzəyən bir musiqi alətidir. Ud həm simli musiqi aləti, həm də Hindistanda bitən və yanarkən xoş qoxu verən ağac adıdır. İkinci misrada süni ud - musiqi alətinə, xam ud isə ağaca işarədir.

Yəni çalman musiqi dinləyənləri çox ruhlandırır. Bunun təsiri yanan xoş qoxulu udun təsirindən daha yaxşı idi.

110 *Bu xəbər bürüdü bütün cahanı*
*Ki, yaqut paylayır o yaqut kanı.*

Yaqut kanı sözlərində elm və hikmət sahibi olan Əflatun nəzərdə tutulur. Yəni hər tərəfə xəbər yayıldı ki, Əflatun gözəl musiqi aləti yaratmışdır.

111 *Şahın sarayına çatdı bu xəbər*
*Ki, Zöhrə Harutla bəhsə giriblər.*

Harut əfsanəvi sehirbazdır. Güya o, Zöhrə ulduzuna aşiq imiş və ona çatmaq üçün mahir cadugər olmuşdur. Burada Əflatun adamı sehirləyən musiqi aləti yaratdığı üçün Haruta bənzədilir. Zöhrə də əsatirdə göyün musiqiçisi sayılır.





Yəni saraya xəbər çatdı ki, Əflatun Harut kimi Zöhrə ilə çalğı meydanında deyişməkdədir.

112 *Birinci havanı çalanda yenə*
*Baş qoyub yatdılar Məndəl xəttinə.*

Məndəl xətti - sehirbazların və cadugərlərin öz dövrələrinə çəkdikləri tilsimli xəttə deyilir.

Yəni musiqi o qədər təsirli idi ki, dinləyənlər sehirlənmiş kimi bihuş olmuşdular.

113 *Qayıdıb üzüklə qurdu min kələk.*
*Necə ki, ulduzla oynayır fələk.*

Fələk göydəki ulduzlarla cürbəcür hadisələr törətdiyi kimi çoban da barmağındakı üzüyün qaşını oynatmaqla min kələk qururdu.

114 *Bəlkə ilham alıb sazın telindən,*
*Ruma ipək həşyə nəqş eləyim mən.*

Bəlkə bu ipək telli sazın musiqisi ilə ilhama gələrək Rum tarixini, ipəyini gözəl naxışlarla bəzəyim, İskəndər Rumi haqqında gözəl bir əsər yazım.

115 *Bir də ki, xəbər var: qoy gəlsin Sokrat,*
*Tərkibdə, ixlatda o böyük ustad.*

Tərkib və ixlat sözləri köhnə elmi istilahlardır. İxlat - qədim nəzəriyyəyə görə orqanizmdə olan dörd ünsürdür: qan, səfra, qara öd və bəlğəm. Tərkib bu ünsürlərin birləşmə qayda və nisbətləridir.

Beytdə Sokrat bu əməliyyatın böyük bilicisi kimi göstərilir.

116 *İnsanın belə bir xasiyyəti var:*
*İraq gəzənləri çox yada salar.*

İraq gəzən sözləri ilə Sokrat nəzərdə tutulur.

117 Getməmək üçün də vardır çox dəlil, Hara oynamağa gedib Cəbrail?

Sokrat özünü Cəbrail ilə müqayisə edib. Cəbrail kimi hər kiçik iş üçün yerindən tərpənməməyi, ağır oturub-durmağı özünə layiq bilir.

118 *Səhnənin gümbəzi düz olsa əgər,*
*Köklənməmiş tel də gözəl səslənər.*

Evin sahibi (İskəndərə işarədir) düz adam olsa, evindən çıxan söhbət də xoş olar.

119 *O, dürr süfrəsindən örtüyü açdı,*
*Şahın ətəyinə dürr-gövhər saçdı.*

Xidmətçi Sokratın dəyərli, hakimanə sözlərini açıb İskəndərə söylədi.

120 Ancaq bu süfrədən doymayır gözün.

Süfrə sözü burada dünyanın mal-dövləti mənasında işlənmişdir.

121 *Sokrat verdi ona gümüştək cavab,*
*Dedi ki: "Qulağa tökülməz simab!"*

Sımab - civə. Yəni Sokrat ona gümüş kimi parlaq və təmiz cavab verərək dedi ki, qəflət civəsini üz qulağından çıxart, bu haqq sözü eşit.

122 *Dəmiri aynatək parladan insan*
*Pası silməlidir öz vicdanından.*

Özgələrə tərbiyə verən özü mənən təmiz, yüksək olmalıdır.

123 Olmaz hər zəncidən bir Xacə Müqbil.

Xacə Müqbil - Hüseyn Cavid "Xəyyam" pyesində buna Xacə Nizam deyir. Məşhur "Siyasətnamə" kitabının müəllifi Nizamülmülkdür. Bu bir çox dillərə, o cümlədən Azərbaycan dilinə Rəhim Sultanov tərəfindən tərcümə edilmişdir. Səlcuq padşahlarından Alp Arslanla oğlu Məlikşahın baş vəziri olmuşdur.

124 *Qara olsan əgər, söyüd kimi yan,*
*Zəncinin dişini odur ağardan.*

Zəncilər dişlərini söyüd kömürü ilə yuyarlarmış.

125 *Dirilik suyunu Zülmətda sanan*
*Alimlər o hökmü çıxarıb burdan.*

Əsatirə görə, dirilik suyu Zülmatda, yəni qaranlıq dünyadadır. Nizami demək istəyir ki, qara zəncidə işıqlı, fərəhli rah olduğunu görən alimlər dirilik suyunun qaranlıqda, Zülmatda olduğunu düşünmüşlər.

Bundan o zamankı fəlsəfi əqidəyə görə, "həqiqət qaranlıqdadır" nəticəsini də çıxarmaq olar.

126 *Bir idrak nurani olarsa əgər,*
*Bu tutqun günbəzə qalxıb yüksələr.*

İdrak işıqlı, güclü olarsa, əlçatmaz göyləri də dərk edə bilər.

127 *Günəşin nuruna yedəkçi ol sən,*
*Səni tərk etsə də düşmə ümiddən.*
*Günəşin nuru - həqiqət, doğruluq.*

Yəni sən həmişə həqiqətdən, doğruluqdan yapış. O səni bir müddət tərk etsə də, ümidsiz olma. Burada Nizami həqiqət və mərifət günəşini kəcavədə gedən bir gözələ bənzədir.

128 *İndi sən bir düşün, nə dərgahdasan,*
*Gör necə, hansı bir seyrəngahdasan?*

Nizami Sokratın dili ilə padşahın sarayını elm və mərifət rütbəsi ilə müqayisə edir və elmi, mərifəti daha yüksək tutur.

129 *Bilik ayinilə İskəndər yenə*
*Çıxdı öz möhtəşəm şahlıq taxtına.*

Bilik ayini ifadəsində İskəndərin təşkil etdiyi elmi məclislər nəzərdə tutulur.





130 *Eşitcək buyurdu ona İskəndər*
*Ki, muği Günəşə tez yetirsinlər.*

Muğ - atəşpərəstə, Günəş - şaha işarədir.

131 *Ədəblə, ərkanla o muğ eyildi,*
*Atəşin önünə təzimlə gəldi.*

Atəş sözündə İskəndər nəzərdə tutulur. Məlumdur ki, atəşpərəstlər - muğlar oda sitayiş edirlər.

132 *Növbə o hindliyə yetişən vaxtda*
*Təzə gül açıldı köhnə budaqda.*

Təzə gül - eşidilməmiş dəyərli sözlər deməkdir, köhnə budaq - qoca hindli alimdir.

133 *Nurdan bəzək vurdu fələk bağına,*
*Dürdən sırğa asdı yer qulağına.*

Onun söylədiyi sözlər kainatın sirlərini işıqlandıran, izah edən və dünyanın, insanların qulağına sırğa olacaq qədər dəyərli, mənalı sözlər idi.

134 *Pərvanə zülmətdə yanan çırağa*
*Uçantək gəlmişəm mən də bu bağa.*

Yanan çıraq - İskəndər, bu bağ - İskəndərin sarayı mənasında işlənmişdir. Yəni mən İskəndərin yanına və onun sarayına böyük məhəbbətlə gəlmişəm.

135 Özü gizlindədir, nişanı aşkar?

Nişan - dünya, aləm deməkdir. Yəni Yaradan özü görünmür, lakin yaratdığı aləm göz qabağındadır.

136 *Allahı xəyalda olmaz axtarmaq,*
*Xəyaldan doğan şey divlərdir ancaq.*

Xəyal yalnız yaradılmış şeyləri təsəvvür edə bilər, Yaradanı təsəvvür edə bilməz.

137 *Haqqı tanımaqçın bəsdir bir nişanı,*
*Bura yetişdinmi, daha dur, dayan!*

Haqqın varlığına dəlil olan bir nişandan - bu gördüyümüz aləmdən o yana getməyək, bu maddi aləmdən başqa şey axtarmayaq.

138 *Bu yerdən, bu göydən kənar çıxma sən,*
*Yoxsa sərиştəni lap itirərsən.*

Bu gördüyümüz kainatdan başqa bir aləm axtarmaq fikrinə düşsək, doğru yoldan çıxarıq, səhv edərik.

139 *Bizə yeddi hüdud çəkmişdir fələk,*
*Onlardan kənara çıxmayaq gərək.*

Yeddi hüdud sözündə sehirbazların dövrələrinə çəkdikləri tilsimli xətlər nəzərdə tutulur.

Beytın mənası: insan bu dünyada yeddi tilsim içində yaşayan kimidir, bu aləmdən kənara çıxmağa, bu aləmdən başqa bir aləm axtarmağa çalışmamalıdır.

140 Qılınc, teşt gözləyir kənar çıxanı.

Kim bu aləmdən kənara çıxmaq istəsə (Allahı axtarmaq fikrinə düşsə) onu ölüm gözləyir.

141 *Bu uca barigah - uca bir hasar,*
*İçində əsirdir bütün xəyallar.*

Uca barıgah və uca hasar - maddi aləm, kainat deməkdir. Yəni bütün bizim fikirlərimiz, xəyallarımız içində yaşadığımız bu varlıqla hüdudlanmışdır.

142 *Yuxuda gördüyün canlı, ya cansız*
*Sənin öz şamının odudur yalnız.*

Yuxuda gördüklərın fövqəladə bir şey deyil, onlar sənin öz fikir-xəyalının məhsuludur.

143 Gövhəri almazla deşərək dedi...

Yəni sözlərini almaz kimi kəskin və parlaq mənalarla birləşdirib danışmağa başladı.

144 *Rumipərəst hindli doymaq bilmədi,*
*Öz hind qılıncını çəkərək dedi.*

Rumıpərəst - yəni Yunandan, Rumdan (burada isə rumlu İskəndərdən) xoşu gələn deməkdir. Hind qılıncını çəkərək - yəni qılınc kimi kəskin dili ilə danışmağa başlayaraq...

145 Hindli bu şərabdan məst olub qaldı...

Burada şərab İskəndərin sözləri deməkdir. Yəni: İskəndərin dedikləri hindlini heyran etdı.

146 Bu küpdə olan rəng yalnız bircədir.

Bu küpdə - bu dünyada deməkdir. Misranın mənası: bu dünya üçün bütün insanlar bərabərdir.

147 *Valislə Əflatun, bir də Fərfuryus -*
*Heyrandı bunlara o rühulqüdüs.*

Rühulqüdüs - İskəndər nəzərdə tutulur.

148 *Qoy açsın bu sirri ağlın açarı:*
*Necə çiçək açmış yerin baharı?*

İnsan öyrənməli, bilməlidir ki, bu dünya necə yaranmışdır.

149 *Padişah beləcə dürlər saçdı,*
*Bağlı xəzinənin ağzını açdı.*

İskəndər öz mənalı sözləri ilə mübahisə açdı və filosoflar söhbətə başladılar.





150 *Bunlar andırırdı müşkü, kafuru,*
*Yarısı mayedi, yarısı quru.*

Kafurun təbiətindəki nəmlik və müşkün təbiətindəki quruluq, eyni zamanda, kafurun ağlığı ilə - yer, torpaq nəzərdə tutulur.

151 *Hürmüz də əl atdı qıfıla san,*
*Zənciri çeynədi əqlin açarı.*

Bəhs olunan mövzu barədə fikir demək növbəsi Hürmüz çatanda o da məsələni öz anladığı kimi dərindən izah etməyə başladı.

152 *Mayedən doğurmaq - yaratmaq deyil,*
*Kəndxuda başqadır, xuda başqa, bil!*
*Bir kəs ki, əql ona ad verib: Qadir,*
*Özü bildiyini özü xəlq edir.*

Hazır bir maddədən - mayedən bir şey yaratmaq qüdrət, allahlıq deyildir. Şərt odur ki, yoxdan, heç nedən bir şey yaradasan; allahlıq budur. Bu qüdrətə ancaq Allah malikdir.

153 *Bu zidd qüvvələri bir yerə qatdı,*
*Ağıllı, hünərli insan yaratdı.*

Zidd qüvvələr - bir-birinə zidd keyfiyyətlərə malik olan dörd ünsür (su, od, torpaq, hava) deməkdir.

Yəni Allah insanı bu dörd ziddiyyətli maddədən yaratdı.

154 Hər camı ayrıca alıb nuş etdı.

İskəndər bəhsdə iştirak edən hər filosofun sözlərinə ayrı-ayrı, diqqətlə qulaq asdı.

155 *Nizami, bu qapı açar götürməz,*
*İlk nəqş bağlananda görməyib heç kəs.*

Nizami, kainatın - varlığın bu əsrarına ağıl çatmaz, yaradılışın başlanğıcını heç kəs görməmişdir, əzəl nəqşini oxumaq mümkün deyil.

156 *Bu gizli sözləri, fikirləri sən*
*Neçin lal dillərə isnad edirsen?*

Lal dillər - özü ölüb getmiş filosoflara işarədır.

157 *Yemə çörəyini yad süfrələrdə,*
*Öz süfrən üstünə gəl çəkmə pərdə.*

Lal dillər ifadəsində olduğu kimi burada da guya Xızır Nizamiyə öz sözlərini ölüb getmiş filosoflara isnad etməməyi söyləyir.

158 *Mərhəmət umarlar qara torpaqdan,*
*Torpaqdan yaxşıdır ancaq sağ insan.*

Nizami öz dövründəki hakimlərin əsil elmə qiymət vermədiklərindən və ölüləri dirilərdən üstün tutduqlarından şikayətlənir, diriləri daha çox sevmək lazım gəldiyini söyleyir.

159 *Hoqqabaz torpaqda sehirbazlıq var,*
*Həm möhrə oğurlar, həm də oynadar.*

Burada və bundan aşağıdakı misralarda Nizami torpağın sehrbazlığını, yəni onun ölü bədənləri quru xəzəlləri udub, təkrar canlı heyvanlar, yaşıl otlar, nəbatat şəklində meydana çıxartdığını söyləyir.

160 *İstədi çalışıb sirləri örtən*
*Yeddi qat sürməni silsin tamamən.*

İskəndər kainatın sirlərini kəşf etməyə çalışdı, həqiqəti örtən yeddi qat sürmə rəngli, dumanlı göy pərdələrini açıb axtardığını tapmaq istədi.

161 *Qərbdə bir tayfa var, özü köçəri,*
*Nasikdir adları, yoxdur dinləri.*
*Şərqdə bir tayfa var, xislətdə mələk,*
*Onlara layiqdir Mənsək ad vermək.*

Nasik - ümumi mənasında abid, zahid, Allaha ibadət edən, xüsusi mənada isə mifik bir tayfadır ki, güya Qərbdə heç bir dinə bağlanmayaraq və heç bir ibadətgaha malik olmayaraq çöllərdə yaşamışdır.

Mənsək - ibadət yeri, dini ayinlərin icra olunduğu yer. Burada isə ibadət və pərəstiş olunmağa layiq, mələk xislətli tayfa mənasında işlənmişdir.

162 *Nasikdən Mənsəkə çək qoşunları,*
*Keç sonra Habıldən Qabilə sən.*

Ordunu qərbdən şərqə çək, sonra da cənubdan şimala tərəf apar.

Qabil və Habil - dini əfsanələrə görə Adəmin oğlanlarıdırlar. Guya qısqanclıq və paxıllıq nəticəsində Qabil Habili öldürmüş, sonra peşman olmuşdur. Bu dünyada insanın ilk cinayəti hesab edilir.

Şərq əsatirində guya Habilin nəsli cənubda, Qabilin nəsli isə şimalda imiş.

163 İşıq bəxş edərsən sən də o şəxsə,
Sən də o adama ədalət göstərib yaxşılıq edərsən.

164 Sən də qaranlıqdan bir pay ver ona,
Sən də o adama zülm elə, cəza ver, yamanlıq et.

165 *Allah tərəfindən gəlmiş mükəmməl*
*O "Sifri-əzəm"dən başqa üç gözəl*
*Nəsihətnamə də keçirdi ələ...*

Sifr - kitab; "Sifri-əzəm" - Tövratın beş cildindən böyüyü. Üç nəsihətnamə Ərəstunun, Əflatunun və Sokratın "Nəsihətnamə"ləri. İskəndər "Sifri-əzəm"dən və bu nəsihətnamələrdən öz işlərində rəhbərlik göstərən əsərlər kimi istifadə edərmiş.

166 O, bir gün çıxaraq öz ac taxtinə...
Ac taxtinə - fil sümüyündən qayrılmış taxtə.





167 *Mədəndən gövhərlər çıxarmaq üçün...*
*Ağıllı fikirlər, gözəl tədbirlər söyləmək üçün.*

168 *Diltək itiləyib qələmi, yenə*
*Qamışdan qend səpdi kağız üstünə.*

Qamışdan qənd səpdi - yəni qamış qələmlə qiymətli, şirin sözlər yazdı. Burada eyni zamanda şəkər qamışına işarə edilir.

169 *Naqqaya qonşudur sədəf dəryada,*
*Qılınc yox, dürr verir şaha dünyada.*

Sədəf dənizdə nəhənglə bir yerdə olur. Lakin o, tacları bəzəyən incilər verdiyi halda, nəhəngin belində qılınca bənzər tikanlar olur.

170 *Qardaşın qanını alma qardaşdan,*
*Tamam ayrı şeydir çünki südlə qan.*

Qardaş qardaşla ana südünə şerik olurlar; amma qan - cinayət işlərində onlar şərik deyillər. Birisi bir günaha batıbsa, onun cəzasını o birinə vermək olmaz.

171 *Paslanıb kəsməsə qılıncın əgər,*
*Qızıl ver, daşları dəmirə döndər.*

Qılıncın pas tutsa, onunla bir iş görə bilməsən, qızıl ver ki, daş kimi bərk olan düşməni dəmir kimi əridib yumşaldasan.

172 *Xalqın məclisində mütrübtək şad ol,*
*Sərvsən, kibrdən, çalış, azad ol.*

Öz şəxsi mənfəətini güdmə, xalq ilə birgə şad ol. Belə olmasın ki, xalq şad olanda sən kədərə batasan; lovğalıqdan, dikbaşlıqdan uzaqlaş.

173 *Bəzəmə üzünü sən reyhansayaq,*
*Özgənin əlində ol nurlu çıraq.*

Gül-çiçək kimi üzünü bəzəmə, çıraq kimi ol ki, yanaraq başqasına fayda verəsən.

174 *Qızıl ya sahibi xoşdur? - Sorma sən.*
*Düyün bənddən pisdir, bənd də düyündən.*

Qızıl sahibi qızıl kisəsinə vurulmuş bir düyün kimi, qızıl isə sahibinin ayaqlarına vurulmuş bənd kimidir. Hər ikisi pisdir.

175 *Geniş ətəkli ol, çünki meyvələr*
*Geniş ətəklərə daha çox düşür.*

Səxavətli, əliaçıq ol ki, özün də səxavət və əliaçıqlıq görəsən, ruhun bol olsun.

176 *Həmişə düz gedən piyada əsgər*
*Vəzir olan kimi əyri yol gedir.*

Bəzi adamların yüksək vəzifə və rütbəyə çatdıqları zaman lovğalanıb

yollarından azmalarını Nizami şahmat fiqurlarının hərəkətləri ilə müqayisə edir. Məlum olduğu kimi, şahmatda əsgər (piyada) yalnız düz istiqamətdə hərəkət edə bilər. Lakin o, taxtanın son xanasına çatdıqda vəzir olur və bu zaman yana da (əyri yola da) hərəkət edə bilir.

177 Bəd gündə ulduzdan olma bədgüman.

Yaman vəziyyətə düşəndə bədbin olma, ümidsizliyə qapılıb taleyin uğursuzluğundan şikayətlənmə.

178 *Göyə atılan daş yerə tez düşər,*
*Bu qısa müddətdə işlər dəyişər.*

Pis vəziyyət çox tez - bir daşın göyə atılıb yerə düşməsi müddətində dəyişib yaxşılaşa bilər.

179 *Çalış ki, kirpiyin olsun almaztək,*
*Ayıq ol, ölkənin keşiyini çək.*

180 *Oyanıb qalxanda Günəş yuxudan,*
*Müşkə kafur səpdi sanki asiman.*

Müşk - qara, kafur-ağ, yəni səhər Günəş doğanda müşkə kafur səpilən kimi oldu hava işıqlandı.

181 *Əsildir, yüksəkdir o da gövhərtək,*
*Özünü həmişə qorusun gərək.*

Şah nəcabət əhlidir, onun vücudu gövhər kimi qiymətlidir, buna görə də xətərə düşə bilər. Deməli, o özünü, əsil-nəsəbini həmişə mühafizə etməlidir.

182 *Dünya tikanlıdır, kirpiyik biz də,*
*İynə var, tikan var xislətimizdə.*

Dünyanı nahaq yerə pisləməliyik, çünki əgər dünyanın üstü zülm tikanları ilə doludursa, bizim də təbiətimiz kirpi kimi tikanlıdır, demək, ikimiz də - dünya da, biz də bir-birimizə bənzəyirik.

183 *İki qarı qızın başladı bəhsi,*
*Dünyanı götürdü onların səsi.*

Bizim dünyanı pisləməyimiz iki bədxasiyyət, qarımış qızın bir-birini pisləməyinə bənzər.

184 *Yeddi qat yanar od içrə, nəhayət,*
*Kabablıq ət üçün nədir bu zəhmət?*

Yeddi qat yanar od - dünya deməkdir. Yəni bu kəşməkeşli, mərəkəli dünyada bu qədər arzu və ehtirasa əsir olmaq nə üçündür?

185 *Üç gün ötüb keçdi, yenə asiman,*
*Rum-zənci oyunu oynayan zaman.*
*İskəndər buyurdu qoca Sokrata*
*Vursun üzüyündən muma möhr o da.*





Rum-zənci oyunu - burada rum (rumlu) - ağ, zənci isə - qara mənasında işlənmişdir. Asimanın rum-zənci oyunu oynaması - səhərlə axşamın, gündüzlə gecənin bir-birini izləməsini bildirir.

Mənası: üçüncü gün səhər olanda İskəndər əmr etdi ki, Sokrat öz bilik üzüyünün möhrünü onun mum kimi hər naxışı qəbul edən istedadlı ağlına vursun, onun üçün nəsihətnamə düzəltsin.

186 Dürlər çıxarmaqçün daldı ümmana.

Sokrat İskəndərə gözəl, mənalı nəsihətlər vermək üçün fikrə getdi.

187 *Yeməyi heç yemə deniz kimi tək,*
*Yediyin olmasın acı, dəniztək.*

Dəniz suyu acı olur. Güya acılıq ona görədir ki, dəniz hər şeyi özbaşına təklikdə udur.

Beytin mənası: xudbin və xəsis olma, yeməyi tək yemə. Belə etsən, yediyin nuş olmaz, ağzın daha gəlməz.

188 *Vaxtında evindən çıxarsan əgər,*
*Qapına müşktək ətir səpilər.*

Bundan əvvəlki beytdən də aydın olur ki, xəsislik edib yeməyi evində saxlasan, onun üfunəti çox evlərə yayılacaq. Əliaçıq olub onu qonşulara versən, onların məhəbbətini qazanarsan, haqqında yaxşı sözlər yayılar.

189 *Tək bircə fətirə, gəl, qane ol sən,*
*Düşün, Günəşdən ki, artıq deyilsən.*

Burada fətir yuvarlaq Günəş qürsü ilə müqayisə edilir. Yəni dünyada acgöz olma, bir çörəklə kifayətlən, düşün ki, parlaq Günəş də bir qürs (dairə) ilə kifayətlənir.

190 *Quraqlıq olanda, bilmirsən bunu,*
*Zirəyə verərlər zirə suyunu?*

Rəvayətə görə, guya zirə bitkisinə su verilmir. Quraqlıq vaxtı: zirə - sənə su verəcəyəm, - deyən sahibinin vədilə, ümidlə yaşayır. Buna görə də zirə suyu ifadəsi aldadıcı, yalançı vəd və ümid mənasını daşıyır.

191 *Elə sür kəcavə çəkən dəvəni,*
*Filin ayağına salmasın səni.*

Az qan tök, az zülm elə, işini elə ehtiyatla apar ki, şahlığın bərbad olmasın: dəvə (ədalət, qanun) səni filin (xalqın, rəiyyətin) ayağı altına salıb pay-mal etməsin.

192 *Bu harın göy atdan daim et həzər,*
*O bir əjdahadır, gəlinə bənzər.*

Burada harın göy at - fələk, asiman mənasındadır. Yəni bu dünyanın gərdişi aldadıcıdır, əslində o, kinli bir əjdahadır, lakin zahirdən gözəl bir gəlinə bənzər.

[193] Bağla torpaq kimi dinclik kəməri.

Sokratın dilindən deyilən bu sözlər yerin sabit, hərəkətsiz olması barədə idealist fəlsəfi nəzəriyyəyə işarədir.

[194] Mən "Xosrovnaməni" yazmaqçün rəvan...

"Xosrovnamə" - "İqbalnamə" (yaxud "Xirədnamə") deməkdir. Xosrov - böyük Şah. Əsər İskəndərə həsr edildiyi üçün onu "Xosrovnamə" də adlandırmaq olar.

[195] *Yuxudan məhrumdu o nərgiz gözlər,*
*Sərvimdə görmədim gənclikdən əsər.*
*Bənövşə üstünü basmış yasəmən,*
*Öz qızılgülümü solğun gördüm mən.*

Şair öz bədəninin üzvlərini müxtəlif bitkilərə bənzədir: nərgiz - gözəl, sərv boy, qamət; bənövşə üstünü basmış yasəmən - yəni saçlar ağarmışdır.

Qızılgülün solğun gördüm - al yanaqlarımı, üzümü solub-saralmış gördüm. Demək, daha qocalmışam.

[196] Sikkəni bu qədər sürtülmüş görcək...

Sifətimi rövnəqdən düşmüş görəndə...

[197] *Dövlət divanından pozdu adım,*
*Zəhmət divanına yazdı adım.*

Dövlət divanı - hakimiyyət mövqeyi, şahlıq; zəhmət divanı - peyğəmbərlik.

[198] Bısrək - güclü dəvə, qıvraq və tez yeriyən olur.

[199] Büxtı - Xorasan dəvəsi.

[200] Naqə - dişi dəvə.

[201] Qaldırdı balıqdan Aya bayrağı.

İskəndər bayrağını qaldırıb yola düşdü.

[202] Yunanlar Okyanos deyərdi ona.

Nizami Okyanos sözünü bilavasitə yunancadan götürmüşdür.

[203] Müəyyəb - eybəcər. Müəlləq - asılı, asılmış.

[204] *Örtüyə bürünər bir az gedərək,*
*Çunki yer altından keçsin o gərək.*

Guya Günəş əvvəl dənizdən keçdiyi üçün onun ipək sularına bürünər, sonra da yerin altından keçdiyi üçün yerin örtüyünü örtər.

[205] *Alim cavab verdi: "Həmin İsti su*
*Çoxunun abrını tökmüş, doğrusu".*

Bu sirri çox adamlar gəzib axtarmış, tapa bilmədikləri üçün biabır olmuşlar.

[206] *Vardır civə rəngli bu qorxunc suda*
*Qəssasə deyilən bir ajdaha da*

Qəssasə - bir cins mifik, dəhşətli dəniz nəhəngi.





[207] *O çıxsın, ətəkdə qoysun oğlanı,*
*Balası zəncirtək saxlar aslanı.*

Aslan üçün balası zəncir kimidir: balası harada olsa, özü də orada olmalıdır. Burada atanın öz övladına məhəbbətinin qüdrətindən söhbət gedir.

[208] Ziyəhat - diri, yaşayan.

[209] *Ulduzlu gecənin od tutub canı,*
*Sanki əqrəb çalıb xallı ilanı*

Nizami yay gecəsindəki səmanı xallı ilana, ulduzların sayrışmasını isə əqrəb vurmuş ilanın hərarətdən çırpınmasına oxşadır.

[210] *Gecənin camına gün axıb doldu*
*Gün batıb axşam oldu.*

[211] *Bu yeddi xalvarlıq təbli çaldıran*
*Xoruza əmr edib verdirəndə ban...*

Yeddi xalvarlıq təbli çaldıran - yeddi təbəqəli göyləri işıqlandıran günəş deməkdir.

Beytin mənası: səhər olub Günəş doğanda, xoruzlar banlayanda...

[212] *Tutiyə dönübsən, ey şad könül, sən,*
*Yadına Hindistan düşüb deyəsən...*

Tutuquşu əsasən isti ölkələrdə, xüsusən, Hindistanda yaşayır. Oradan başqa ölkələrə aparılan tutuquşu daima öz vətənini arzularmış. Bu beytdə şair öz qəlbini tutuquşuna, eşq və gənclik dövrünü Hindistana bənzədir.

Beytin mənası: tutuquşu Hindistana uçmaq istədiyi kimi, könlüm də gəncləşmək, sevinmək istəyir.

[213] *Yolları cəhənnəm istisi sardı,*
*Gündən balığın da beli qızardı.*

Hava Günəşdən o qədər qızmışdı ki, istilikdən (məlum əfsanəyə görə) yerin altında olan balıq da qızardı.

[214] *Padişah buyurdu: o gözəl dilbər*
*Yaqut sandığından saçsın saf gövhər.*

İskəndər əmr etdi ki, o gözəl qız yaqut kimi qırmızı dodaqlarını (ağzını) açıb gövhər kimi sözlər söyləsin.

[215] *Nur alır gözümüz gündən, gündüzdən,*
*Rəvamı gözləri gün ala bizdən?*

Bütün gözlər Günəşdən nur aldığı halda Günəş (yəni İskəndər) necə bizim gözümüzü bizdən uzaqlaşdırar? Burada gözümüzü sözü, haqqında söhbət gedən bütün, heykəlin üzündəki iki parlaq gövhəri bildirir.

216 *Sabah öz möhrünü göstərən zaman*
*Atəşpərəst oldu hindli Qaraxan.*

İkinci gün günəş çıxanda hindli Qaraxan atəşpərəst oldu - gecənin gündüzlə əvəz olunmasına işarədir.

217 *Beytlər yayılır bəhrdən çölə,*
*Heç kəs bu bəhrdə yazmayıb hələ.*

Burada birinci misrada bəhr sözü dənizi, ikinci misrada əruz vəzninin bəhrini bildirir.

Yəni bu dənizdən sahilə elə xoş nəğmələr yayılır ki, bunlan heç bir şair heç bir bəhrdə (vəzndə) deməmişdir.

218 *Bəzədi göyləri ağ Çin ipəyi,*
*Yer açdı üzündən qara örpəyi.*

Ağ Çin ipəyi - burada Günəşin işığı, qara örpək- gecənin zülməti mənasında işlənmişdir.

Beytin mənası: Günəş çıxdı, yerin üstündən qaranlıq çəkildi.

219 Kim görüb ki, dəniz gəmiyə minə!

Burada dəniz (dərya) sözü gəmiyə minib gedən İskəndərə işarədir.

220 Dəniz dünyasında bir dünya getdi.

Bu misrada ikinci dünya sözü İskəndəri bildirir.

221 *Gecənin hindusu bu göy çadırdan*
*Yeddi rud boyunca ip çəkən zaman...*

Rud - nəhr, böyük çay; yeddi rud - yeddi iqlim-dünya, aləm... Hindu qaranlıq; çadır - səma. Burada çay dünya çadırının ipinə bənzədilir.

222 İp üstə oynadı şah bir hindlitək...

Şah ip kimi incə və təhlükəli bir yol ilə getdi.

223 Qılavuz - yol göstərən, bələdçi.

224 *Qırmızı pərdəni göy yığan zaman*
*Düşdü qızıl təşti uca damından.*

Günəş özü təştə, işığı isə qırmızı pərdəyə oxşadılır. Beytin mənası: axşam olanda Günəş qızıl təşt kimi göydən enir.

225 *Onların səsləri dəhşətlər saçdı,*
*Xoruzun boynundan zəngləri açdı.*

Xoruzun boynundan zəngləri açdı - xoruzun banlamasına son verdi. Səhər açılarkən təbil səsləri xoruzların səsini batırdı.

226 Dəccal

Dəccahın təbliydi sanki çalman. Xristiyanlarda İsanın düşməni, müsəlmanlarda Məhəmmədin düşməni; yalançı Mehdi; guya qiyamətdə təbilini çalıb zühur edəcək.





227 *Günəş öz evinə edəndə şitab*
*İstidən aslanlar oldular kabab.*

Günəşin evi - astronomiyada Aslan bürcü (Əsəd bürcü) deməkdir. Beytin mənası: Günəş Aslan bürcünə girəndə - yayın ən isti vaxtı gələndə meşədəki aslanlar da istidən bişdilər.

228 *Günəşi göylərdə dolanan zaman*
*Sancıb saraltmadı əqrəbtək xəzan.*
*Tüstülənən bir teşt vardı əlində,*
*Gəzib od saçırdı o, Zəngdə, Çində.*
*Yırtırdı aslantək iti çaynağı*
*Gah Öküz sağrısı, gah gur dırnağı.*

Əqrəb sözü burada Əqrəb bürcü mənasındadır. Astronomiyaya görə, Günəş Əqrəb bürcünə girəndə havalar soyumağa, qış yaxpınlaşmağa başlayır. Aslan sözü də Aslan bürcünü bildirir. Günəş bu bürcə girəndə havalar çox isti olur. Zəng və Çin sözləri burada ekvatora yaxın isti ölkələri bildirir. Sancıb saraltmadı əqrəbtək xəzan - yəni hələ payız girməmişdi.

Bəytlərin mənası: yay fəsli idi, günəş çox yandırıcı idi, hər çıxanda yerə od saçırdı, hərarəti ilə öküzlərin sağrısını və dağ eşşəyinin (gurun) dırnaqlarını yandırdı.

229 *Bu yeddi budaqlı, altı cəhətli,*
*Dövrəsi, meydanı, yeri vüsətli*
*Sərvdən ucaldı qaibanə səs:*
*"Daha fatehlikdən əl çək, bəsdir, bəs!"*

Burada sərv - dünya, maddi aləm deməkdir; altı cəhət - sağ, sol, ön, arxa, üst, alt - aləmin altı cəhəti; yeddi budaq isə - yeddi fələk, yeddi qat asiman deməkdir.

230 *İskəndər sözünü yazanda katib*
*Yalnız beşcə hərflə ifadə edib*
*Beş hərfə müvafiq etdin beş səfər...*

İskəndər sözü ərəb əlifbası beş hərflə yazılır. Beş səfər dedikdə, Nizami İskəndərin Misir, İran, Hindistan, Rus və Çin səfərlərinə işarə edir.

231 *Əmanət aldığı mayəni yenə*
*Gərək qaytaraydı tələb edənə.*

Maye burada dörd ünsür mənasındadır. Yəni vücudunu müvəqqəti təşkil edən ünsürləri geri qaytarmalısan - torpağı torpağa, odu oda suyu suya, havanı havaya tapşırmalısan.

232 *Ayı yəhərləyən həmin İskəndər*
*Ölüm yatağına baş əyib inlər.*

Ayı yəhərləyən - şöhrəti göylərdə gəzən. Yəni: şan-şövkəti bütün dünyaya yayılmış İskəndər başını yerə qoyub ölüm yatağında can verirdi.

233 *Nədənsə gecikib quşların səsi,*
*Çal, suğdi quşunun gəlsin naləsi.*

Suğd - qədimdə Səmərqəndin yaxınlığında bir şəhər olmuş ki, orada yaxşı musiqi aləti qayırarlarmış. Suğdi quşu - məcazi mənada simli musiqi alətini rübabı bildirir.

Beytin mənası: səhər quşunun, xoruzun səsi gəlmir. Müğənni, sən suğdi quşunu - rübabı çal, kədərli nəğmə yayılsın.

234 Nəbzi, qarurəsi olundu təhlil.

Qarurə - sidıyı təhlil etmək üçün işlənən qab, cihaz. Yəni xəstəliyinin səbəbi axtarıldı, öyrənildi.

235 Bəhri-Qülzüm - Qırmızı dəniz.

236 *Qünnücdən Qülzümə oldum hökmüran,*
*Şimşək qılıncımı gördü Qiyrəvan.*

Qünnüc - Hindistanda ən qədim şəhərlərdən biridir ki, vaxtilə bir hind dövlətinin mərkəzi olmuşdur. Qülzüm - Qırmızı dəniz sahilində Suveyş kanalının yaxınlığında şəhər. Qiyrəvan - Afrikada Tunis məmləkətində məşhur bir şəhər olmuşdur.

Beytin mənası: Şərqdən qərbə qədər bütün ölkələri fəth etmişdim.

237 *Yudum məcusluğu dünya üzündən,*
*Rus dənizində də od qaladım mən.*

Məcusluq - atəşpərəstlik, zərdüştilik.

Tarixdən məlumdur ki, İskəndər zərdüştiliyə düşmən olmuş, atəşkədələri yıxıb məhv etmişdir.

İkinci mısrada Nizami İskəndərin ruslarla müharibələrini nəzərə alır ki, bu müharibələri o, "Şərəfnamə"də təsvir etmişdir.

238 *Hətta Sərəndibə gedib çıxaraq*
*Adəmin izinə basdım mən ayaq.*

Sərəndib - Seylon adasının hindcədə adıdır.

Əfsanəyə görə, guya Adəm cənnətdən qovulduqda Sərəndib adasına atılmışdır.

239 *Ölüm girdabına düşməmiş, gərək*
*Suya qalxan tutam ləngiməyərək.*

Günəş batanda onun qürsü su üzərində qalxana bənzəyir, batarkən bu qalxan suyun üstündə işıq kimi yayılır. İskəndər burada - girdaba düşməmişdən qabaq qalxanı suyun üstünə tutmalıyam, yəni ölüm yaxınlaşanda təslim olub tərk-silah etməliyəm, - deyir.





240 Nifrətə layiqdir bu qozbel dayə.

Qozbel dayə - burada qoca dünya deməkdir.

241 *Susuza eyləməz cəhənnəm əlac,*
*Sən o dörd çeşməli behiştdən söz aç.*

Dini etiqada görə, cənnətdə kövsər, səlsəbil, təhur və təslim adında dörd bulaq və ya arx var. Nizami onlara işarə edir.

242 *Sanki ərimişdi şah səhərədək*
*İyirmi yeddinci gecəki aytək.*

Hicri tarixlə ayın iyirmi yeddisində Ay qaralmağa və görünməməyə başlayır. Nizami burada İskəndərin ömrünün sonunu yavaş-yavaş incələn və sönən Ayla müqayisə edir.

243 *Vərəqə əbiri yaydıqca qəşəng,*
*Kağız dönüb oldu müşkin bir ipək.*

Əbir - ənbərin ikinci adıdır; balinaya bənzəyən və Hind okeanı sahillərinə yaxın yerlərdə olan bir balığın qanından çıxan ətirli maddədir, xoş qoxusu mühafizə olunsun deyə onu ipəyə büküb saxlarlar.

Burada İskəndərin anasına yazdığı sözlər ənbərə, o sözlərin yazıldığı kağız isə ipəyə bənzədilir.

244 *Məndən - İskəndərdən bu namə getsin,*
*Dörd yox, bircə olan anama yetsin.*

Burada dörd ana - dörd ünsür (su, od, torpaq, hava) deməkdir ki, qədim təsəvvürə görə insan vücudu da bunlardan ibarətdir.

Beytin mənası: məktubum təbiət hadisələrinə məruz qalmayıb öz doğma anama yetişsin.

245 *Şəbdizim sıçradı çaydan o taya,*
*Məndən salam olsun dosta, aşnaya.*

Yəni ömrüm bitdi, dostlara əlvida!

246 *Gecə öz təxtini yüklədi filə,*
*Yer saldı donunu göylərək nilə.*

Fil - zülmət mənasını verir.

Birinci misranın mənası: gecə tamamilə qaranlıqlaşdı. Nil - Hindistanda və Yəməndə bitən bir bitkidən əldə edilən tünd mavi boyadır. İkinci misranın mənası: dünya İskəndərin ölümü ilə matəmə batdı.

247 *Zənəbin ağzından alaraq zəhər,*
*Ayın boğazına onu tökdülər.*

Zənəb - quyruqlu ulduz.

Astrologiyaya görə, Ay Zənəb üqdəsində uğursuzluğa düçardır. Buna görə Zənəb üqdəsi ayın boğazında zəhərdir.

Beytin mənası: ay Zənəb nöqtəsinə çatanda artıq gözə görünmür, batır

[248] Çatdı Gudi dağa səxa dalğası

Cudı - Mesopotamiyada yüksək bir dağın adıdır.

[249] *İpək karxanası bil bu dünyanı,*
*Bir yanı sudursa, oddur bir yanı.*

İpək karxanasında barama qozasını ocaq üstündəki suda həll edib ipək qayırırlar. Mənası: dünya od ilə su arasındadır, ziddiyyətlərlə doludur. Örtdü qara qanad Rumu sərasər, Bürüdü ölkəni sanki zəncilər.

[250] Bürüdü ölkəni sankı zəncilər.

Ədəbiyyatda məcazi mənada rum - ağ, zəng və zənci - qara deməkdir. Beytin mənası: İskəndərin ölümü münasibətilə bütün məmləkət yasa batdı. Sankı qara ağa hücum elədi, ağ adamlar qara geyindi.

[251] *Baxdıqca oğlunun bu məktubuna,*
*Tumartək qıvrılıb açıldı ana.*

Tumar - qədim zamanlarda burulub bağlanan məktub və ümumiyyətlə, yazılı uzun kağızlardır.

Beytin mənası: İskəndərin anası oğlunun son məktubunu oxuyarkən iztırabdan tumar kimi açılıb büküldü.

[252] "Cahanmədxəl - Ərəstunun əsərinin adıdır.

[253] *Xatircəm olmayın, - deyirəm ki, mən*
*Qara zınqırovlu yeddi hindlidən.*

Qədimdə şahlar hindlilərdən gecə damda zınqırovlu keşikçi qoyarlarmış.

Burada Nizami fələyin yeddi damında (göy təbəqələrində) Günəş sistemini təşkil edən yeddi ulduzu yeddi hindliyə bənzədir. Mənası: taleyin uğurlu olmasına bel bağlamayın.

[254] *Pərgarı nəqşədən üzüldu bu dəm*
*Onun da ömrünə çəkildi qələm.*

Pərgar sözü burada dil, nəqşə - dildən çıxan sözlər mənasında işlənmişdir.

Beytin mənası: Fərfuriyus sözlərini deyib qurtaranda onun da ömrü tamam oldu.

[255] "Ramışı-can" - İran klassik musiqi havalarından birisinin adı.

[256] *Odur yeddi ulduz sirini açan,*
*Odur səkkizinci qərana sultan.*

Qəran - min il deməkdir. Səkkizinci qəran - səkkizinci minillik. Köhnə tarixçilər tarixi Adəmdən başlayırdılar. Nizaminin dövründə guya Adəmin cənnətdən yerə atılmasından səkkiz min il keçirmiş.

Nizami burada "İqbalnamə"ni ithaf etdiyi İzzəddin Məsudit tərif edib deyir ki, Günəş sisteminin yeddi ulduzunun sirrini bilən və səkkizinci minilliyin şahı olan odur.





[257] Dəryamdan iki dürr olubdur əyan.

İki dürr sözləri ilə "İqbalnamə" poeması və Nizaminin oğlu Məhəmməd nəzərdə tutulur.

[258] *Müqbil, İqbal adlı iki hindli qul*
*Göndərdim hüzura, olaydı məqbul.*

İqbal - "İqbalnamə" əsərinə, Müqbil - Nizaminin oğlu Məhəmmədə işarədir. Eyni zamanda iqbal - bəxt, müqbil - xoşbəxt deməkdir. Lakin müqbil sözü həm də qul mənasında işlənir. Beləliklə, burada "İqbalnamə"nin Məhəmməd vasitəsi ilə şaha göndərilməsi ifadə olunur.

[259] *Qızını mehrlə köçürər ana,*
*Qardaş duvaq salar onun başına.*

Qız - "İqbalnamə"nı, qardaş isə - əsəri şaha aparan Məhəmmədi bildirir.

Yəni ana qızını təmiz, bakirə olaraq köçürür və belə qızın da duvağını özgələr yox, məhz qardaşı başına saldığı kimi, mən də əsərimi başqası ilə yox, öz oğlumla yollayıram.

[260] *Hüzura göndərdim bu gəlini mən,*
*Qardaşı tutmuşdur onun əlindən.*

Bu beyt də əsərin Məhəmməd tərəfindən arxayınlıqla mühafizə edilib bakirə bir gəlin kimi sahibinə çatdırılmasını bildirir.

[261] *Canımı yollayıb bir peşkəş kimi.*
*Qoşmuşam mən ona ciyərparəmi.*

Burada yenə canımı - "İqbalnamə"mi, ciyərparəmi isə oğlumu deməkdir.

[262] *Dedim: "Gövhər üçün edərlərmi cəng?*
*Nəğmə gözəl olar, olsa həmahəng".*

Əsərimi tələb edənlərə dedim ki, dürr satıb almaq müharibə etmək deyil; burada zor işə keçməz. Nəğmə o zaman bəyənilər ki, o, musiqi ilə həmahəng ola; belə qiymətli əsəri yalnız sənəti başa düşən şəxs qiymətləndirə bilər.

[263] *Saz olsa qarğanın əgər bədəni,*
*O, Bəstiənciri bilər hər dəni.*

Bəsti - Xorasan vilayətində bir şəhərdir ki, gözələnciri ilə məşhurdur, qarğa da çox əncir yeyən olur.

Beytin mənası: qarğanın canı sağlam olsa, hər əlinə düşən dən ona Bəsti ənciri kimi dadlı gələr. Səhhətin möhkəmliyi insanı bir çox qayğıdan azad edər.

[264] *Şahın adı kimi o, Məsud olsun.*
*Şah da bu dastanla qoy Mahmud olsun.*

Burada Nizami "İqbalnamə"ni Firdovsinin "Şahnamə"sı ilə, İzzəddin Məsudu da Sultan Mahmud Qəznəvi ilə müqayisə edir.

# MÜNDƏRİCAT

NİZAMİ GƏNCƏVİ

# İSKƏNDƏRNAMƏ


**Naşir: Hidayət ƏSGƏROV**

Kompyuter yığıcıları: *Bəsti Cəfərova*
*Aygün Məmmədova*

Texniki redaktor: *Aynur ƏSGƏRLİ*

Kompyuter səhifələyicisi: *Rafael QASIMOV*

Çapa imzalanmışdır: 26.07.2011
Kağız formatı: 70x100 1/16
H/n həcmi: 41,5 ç.v.
Sifariş: 140
Sayı: 200

